**Elmi redaktoru:**
Məhərrəm Qasımlı,
*filologiya elmləri doktoru, professor*

**Rəyçi:**
Seyran Kazımoğlu,
*filologiya elmləri namizədi*



**Vərağa Almasov. İmam Hüseyn aşiqi Füzuli.**
***Bakı 2016, "Bestpack" mətbəəsi, 668 səh.***

*"Füzuli Leyli–Məcnun"unun mahiyyəti", "Peyğəmbər aşiqi Füzuli" və "Həzrəti Əli aşiqi Füzuli" monoqrafiyalarından sonra işıq üzü görən bu kitab Vərağa Almasovun qan ağlayan Füzuli qələminin harayına səs verən, göz yaşları ilə suvardığı al-əlvan bir söz-sənət bağçasıdır. Zəngin faktoloji bilgilərə söykənən və dərin filoloji təhlil üzərində qurulan bu monoqrafik tədqiqat son illərin özünün elmi-nəzəri çəkisi ilə seçilən sanballı füzulişünaslıq araşdırmaları sırasında öncül yer tutmağa layiqdir.*

*Müəllif uzun illər apardığı axtarışları yüksək nəzəri və elmi-kütləvi üslubların vəhdətində səmimi bir imamhüseynsevər və füzulisevər kimi qələmə almağı bacardığından kitab bu gün hər baxımdan böyük ehtiyac duyduğumuz mənəvi kamillik və saf bəndəlik zirvəsi olan Kərbəla şəhidlərinin əziz xatirəsinə alqış, pak ruhuna dua kimi səslənməkdə, amansız yağıların çəkmələri altında inim-inim inləyən ata-ana məzarlarımızı biryolluq əzəli-əbədi dincliyə qovuşdurmaq üçün vətən oğullarını vahid amal və məslək uğrunda səfərbər etməkdədir. Kütləvi səciyyə daşımasına baxmayaraq, monoqrafiya ictimai və humanitar elm sahələri üzrə bütün mütəxəssislər və ali məktəblərin çoxsaylı müəllim və tələbə heyəti üçün önəmli və dəyərli bir qaynaqdır.*

*Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş Üzrə Dövlət Komitəsinin 24 dekabr 2015-ci il tarixli, DK-1151/Ə nömrəli qərarına əsasən çap edilmişdir.*

İSBN: 978-9952-469-01-1



# GİRİŞ

Rəsulullahdan (s) və Həzrət Əlidən (ə) sonra bəşəriyyətin üçüncü ən kamil şəxsiyyəti olan İmam Hüseyn (ə) adı, sözü, işi, əzmkarlığı, mübarizəsi, cihadı, sərkərdəliyi, rəhbərliyi və şəhidliyi ilə dini və ictimai mənsubiyyətindən asılı olmayaraq hər bir qeyrət və ləyaqət sahibinin, hər bir mərd və azadlıqsevər insanın öyündüyü sıxıntılı anlarında ən yaxın sirdaşı bilib ürəyinin dərdini söylədiyi söykək və güvənc yeridir. Allah kəlamının başlıca prinsiplərini qanı ilə tarix səhifəsinə yazan bu əsl Allah bəndəsi qucağında böyüyüb boya-başa çatdığı pak ağuşların namusunu gözləmiş, təəssübünü çəkmiş, həmişə o ulu din böyüklərinə layiq varis olmuşdur. Odur ki, onun alıb-verdiyi hər bir nəfəsdə Quran ayə-ayə, İslam müddəa-müddəa, iman cüz-cüz, Rəsulullah (s) baxış-baxış, Həzrət Əli (ə) addım-addım, xanım Fatimeyi-Zəhra (s.ə) nəfəs-nəfəs, İmam Həsən (ə) də öyüd-öyüd canlanmaqda, çaldığı hər qılıncda, vurduğu hər zərbədə, buyurduğu hər kəlamda, çəkdiyi hər ahda, axıtdığı hər yaşda, göstərdiyi hər qayğıda yenidən dirilərək yeni həyat kəsb etməkdədir. Deməli, İmam Hüseynin (ə) 680-ci il oktyabr ayının 10-da Kərbəlada yaratdığı həmasə, əslində, elə Peyğəmbərin (s), Həzrət Əlinin (ə), İmam Həsənin (ə) həmasəsi, bütövlükdə bəşəriyyətin, sivilizasiyanın insanlıq adına, haqq-ədalət adına, ən nəhayət, Allah adına qazandığı əzəli-əbədi qalibiyyətdir. Qətiyyən ötəri deyildir ki, dini dinindən, peyğəmbəri peyğəmbərindən olmayan mütəfəkkirlər İmam Hüseyn (ə) şəxsiyyətinə, Kərbəla vaqeəsinə ictimai-tarixi





qiymət verməyə çalışmış, lakin onların istər sözləri, istərsə də həmin sözlərdə çatdırmaq istədikləri məna və fikirlər İmam Hüseyn (ə) hərəkatının misilsiz miqyas genişliyi önündə aciz qalmışdır. Bununla belə, o ulu din böyüyünün həyat və fəaliyyəti, əqidə və məramnaməsi haqqında az da olsa anlayış yarada biləcəyindən həmin kəlamların bir neçəsini örnək olaraq veririk:

"İmam Hüseynin qiyam etməkdə məqsədi öz dünyəvi istəklərinə çatmaq idisə, mən başa düşə bilmirəm ki, niyə bacıları, qardaşları və uşaqları da bu hadisədə iştirak etmişlər? Ağıl belə hökm edir ki, o, yalnız İslam yolunda bu fədakarlığı etmişdir" *(Çarlz Dikkens – ingilis yazıçısı).*

Və ya: "Görəsən, elə bir şəxs tapılarmı ki, Kərbəla hadisəsini eşidəndə ürəyi qanla, kədərlə dolmaya? Hətta qeyri-müsəlmanlar da İslam bayrağı altında həyata keçən bu müharibənin pak ruhunu inkar etməyi bacarmazlar" *(Edvard Braun – tarixçi).*

Yaxud: "Müsəlmanların bir millət kimi mövcudluğu İmam Hüseynin şəhadətinə bağlıdır. Ona görə ki, Hüseyn eşqi ilə yanan hər bir şəxs heç vaxt zilləti, köləliyi qəbul etməz" *(Marbini – şərqşünas-alman filosofu).*

Yaxud: "Mən İmam Hüseynin (ə) – İslamın o böyük şəhidinin həyatını diqqətlə oxumuşam və kifayət qədər Kərbəla tarixinin səhifələrinə diqqət yetirmişəm. Mənə aydın olub ki, əgər Hindistan azad bir ölkə olmaq istəyirsə, gərək İmam Hüseyndən (ə) örnək alıb onun yolu ilə getsin" *(Mahatma Qandi – Hindistan dövlət xadimi).*

İndi ictimaiyyət arasında hicri-qəməri təqviminin əvvəlində – məhərrəm və səfər aylarında Kərbəla şəhidləri və İmam Hüseyn üçün uzunmüddətli yas saxlanılmasına münasibət birmənalı deyil. Əlbəttə, məsələnin ruhi-psixoloji tərəfinin olmasını da danmaq olmaz. Ancaq elə bu tərəfin də nəzərə alındığı mürəkkəb ictimai mədəni münasibətlər kompleksində götürdükdə problemin, əslində, çox sadə olduğu ortaya çıxır.





Bunu görməməyə isə səmimi olmamaq mane olur. Belə ki, bəzi birtərəfli düşüncə sahibləri nəyin bahasına olursa-olsun Kərbəla vaqeəsinin, İmam Hüseyn hərəkatının ictimai mahiyyətinə, fəlsəfi siqlətinə, dini önəminə və mənəvi-əxlaqi çəkisinə kölgə salmaq istəyirlər. Halbuki özlərini saf və duru İslamın tərəfdarları sayan belələri İslamiyyətin daşıdığı həqiqi humanizm prinsiplərini, Rəsulullahın təməlini atdığı əsl insanlıq məktəbinin qayda-qanunlarını bilərəkdən ötəri, keçəri və çürük iddialara qurban verir, batil, saxta yanaşmalarla göz boyayırlar.

İngilis yazıçısı Çarlz Dikkensin yuxarıda verdiyimiz sözləri belələrinin tendensiyalı mövqeyini birdəfəlik alt-üst etməkdədir. Gəlin bir də oxuyaq: "İmam Hüseynin qiyam etməkdə məqsədi öz dünyəvi istəklərinə çatmaq idisə, mən başa düşə bilmirəm ki, niyə bacıları, qardaşları və uşaqları da bu hadisədə iştirak etmişlər?"

Göründüyü kimi, saf və duru "İslam" daşını başlarına vurub "sələfi" – özlərini həqiqi müsəlman və əsl peyğəmbər varisi adlandıranların başa düşməkdə guya çətinlik çəkdikləri mətləbi xristian bir ədib necə də dəqiq, aydın, birmənalı qavramış və qavratmışdır. Belə ki, o, çox doğru olaraq, İmam Hüseyn hərəkatını "qiyam" adlandırır, bunun qətiyyən dünyəvi, yəni utilitar, maddi istəklər olmadığını qeyd edir, ailə-məişət faktorunun şüurlu surətdə Kərbəla vaqeəsinə tətbiq olunduğunu önə çəkir.

Ədib davam edir: "Ağıl belə hökm edir ki, o, yalnız İslam yolunda bu fədakarlığı etmişdir". Ədib tamamilə rasional mövqe tutur, sağlam mühakiməyə söykənir, bitkin və yetkin elmi-nəzəri yanaşma yolu ilə gedir və "Ağıl belə hökm edir" deyir. O, Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının yalnız İslam yolunda edilmiş fədakarlıq olduğunu ayrıca vurğulamaqla özünün lakonik, ancaq lakonik olduğu qədər də dərin kəlamını olduqca doğru və obyektiv qənaətlə yekunlaşdırır.





Tarixçi Edvard Braun isə Kərbəla vaqeəsinin daha çox faciəvi qatına enməyə çalışmışdır. Belə ki, o, "Görəsən, elə bir şəxs tapılarmı" deyə başladığı sözlərini ümumbəşəri əhvali-ruhiyyəyə kökləməklə Kərbəla vaqeəsinin cahanşümul tərəfini önə çəkmiş, daşıdığı beynəlxalq məzmunu vurğulamışdır. Əgər biz Kərbəla şəhidlərinə uzunmüddətli yas saxlamaqla razılaşmayan sıravi müsəlmanlar haqqında ona bilgi verə bilsəydik, xristian Edvard Braun, yəqin ki, çox təəccüblənərdi.

"Görəsən, elə bir şəxs tapılarmı ki, Kərbəla hadisəsini eşidəndə ürəyi qanla, kədərlə dolmaya?" sualında təkcə matəmdən danışılmır. Sualın tonu da göstərir ki, tarixçini dərindən düşündürən hərəkatın ictimai önəmidir. Odur ki, baş verməsi ilə bəşəriyyətin sonuncu dinini qoruyub saxlayan və bununla da tarixin dönüm nöqtələrindən birinə çevrilən hadisənin miqyas genişliyidir. O məhz buna görə belə bəşəri kədər hissi keçirir. Əgər belə olmasaydı, E.Braun sözlərini qeyri-adi səslənən qayğıkeşliklə bitirməzdi: "Hətta qeyri-müsəlmanlar da İslam bayrağı altında həyata keçən bu müharibənin pak ruhunu inkar etməyi bacarmazlar".

Göründüyü kimi, Kərbəla vaqeəsini "pak ruhlu müharibə" adlandıran E.Braun sanki kimlərinsə nə vaxtsa Kərbəla şəhidlərinə qarşı qərəzli olacağını, onlara kin bəsləyəcəyini sövq-təbii hiss etmişdir.

Ancaq alman filosofu Marbini məsələyə ictimai-siyasi baxımdan yanaşmış və Kərbəla vaqeəsini daha çox dövlətçilik yönündə dəyərləndirmişdir. O, müsəlmanların bir millət kimi mövcudluğundan danışarkən ümmət faktoru ilə yanaşı, dövlətçiliklə bağlı quruculuq işlərini də nəzərdə tutmaya bilməzdi. Çünki filosof İmam Hüseyn (ə) şəhadətini aparıcı və həlledici amil kimi göstərir və "Ona görə ki, Hüseyn eşqi ilə yanan hər bir şəxs heç vaxt zilləti, köləliyi qəbul etməz" nəticəsini çıxarır. Bu, kiminsə nə barədəsə gəldiyi bəsit qənaət yox, tam elmi əsaslara söykənən sosial bir müddəadır. Görməmək olmaz ki, Marbininin zillətin, köləliyin qəbuledilməzliyini bilavasitə İmam Hüseyn hərəkatı ilə



bağlamasının arxasında elə İmam Hüseynin dahiyanə kəlamı durur: “Şərəflə ölmək zillətlə yaşamaqdan qat-qat xeyirlidir!”

Ən nəhayət, Marbininin sözlərinin Hindistanın dövlət xadimi Mahatma Qandinin sözləri ilə birbaşa səsləşməsi filosofun gəldiyi qənaətdə nə qədər haqlı olduğunu təsdiq edir.

Bəllidir ki, Hindistan 1947-ci ilədək Böyük Britaniyanın müstəmləkəsi olmuş və ingilis imperialistləri hind xalqının müstəqillik uğrunda apardığı azadlıq mübarizəsini dəfələrlə bələyindəcə boğmuşlar. Ən nəhayət, tarix Mahatma Qandini cəfakeş hind xalqına bəxş etmiş və o, bəşəriyyətin ovaxtaqədərki ictimai-siyasi və idraki-fəlsəfi irsinə söykənərək, doğma xalqının illərcə çəkən möhnətinə son qoyaraq Hindistanı beynəlxalq imperializmin əsarət torundan birdəfəlik xilas etmişdir. Yuxarıda verdiyimiz sözləri bu siyasət nəhənginin kimdən ilham aldığını, hansı hərəkatın tarixi təcrübəsindən barındığını birmənalı surətdə təsdiq edir. “İslamın o böyük şəhidi” və “Kərbəla tarixinin səhifələri” ifadələri M.Qandinin Kərbəla vaqeəsində və İmam Hüseyn hərəkatında lider və ideologiya tarazlığına verdiyi önəmi göstərdiyi kimi, “Mənə aydın olub ki, əgər Hindistan azad bir ölkə olmaq istəyirsə, gərək İmam Hüseyndən (ə) örnək alıb onun yolu ilə getsin!” cümləsi bəhs mövzusu olan bu hadisəyə dair çox dəqiq siyasi qiymət olaraq son dərəcə orijinal bir yanaşma biçimini ortaya qoyur. Heç şübhəsiz, M.Qandinin bu sözləri nəzəri politologiya üçün dəyərli olmaqla yanaşı, dünyanın aparıcı siyasi mərkəzləri üçün də əməli-təcrübi mahiyyət qazanan və mürəkkəb beynəlxalq münasibətlərə aydınlıq gətirə bilən parlaq bir mayakdır. Murdar və idbar erməni çəkmələri altında inim-inim inləyən torpaqlarımızın yeganə qurtuluş yolu işıqlı İmam Hüseyn hərəkatının göstərdiyi yolla getməkdir.

* * *

Füzuli qələminin Kərbəla vaqeəsi ilə yaratdığı xariqələri lazımınca duyub qavramaqdan ötrü, heç şübhəsiz, onun bütün varlığı ilə vurulduğu İmam Hüseynin (ə) ömür yolu haqqında,





həyat və fəaliyyətinin qanunauyğun yekunu olan Kərbəla vaqeəsi barəsində ilkin bilgi sahibi olmaq gərəkdir. Əlbəttə, bu yöndəki bilgilər vaxt ötdükcə təbəddülata uğramış, bu, yaxud başqa məzhəb və təriqətin sui-istifadəsinə məruz qalaraq, əslindən, ilkin qaynağından uzaqlaşıb bir xeyli saflığını itirmişdir. Buna baxmayaraq, mütəxəssislər uzun illərin gərgin və yorucu zəhməti bahasına belə bilgiləri əsaslı surətdə saf-çürük edərək, İmam Hüseynin (ə) ömür yolu və Kərbəla vaqeəsi haqqında nisbətən doğru-düzgün təsəvvür verə biləcək dini, tarixi və hərbi məlumatları bərpa etmişlər. Biz də tərəfkeşlik etmədən həmin məlumatları ümumiləşdirərək xülasə edirik.

* * *

Üçüncü məsum İmam Hüseyn ibn Əli (ə) hicri-qəməri 4-cü ildə şaban ayının 3-ü (və ya 4-ü) Mədinə şəhərində dünyaya göz açmışdır. Atası Həzrət Əli ibn Əbu Talib (ə) və anası Həzrət Peyğəmbərin (s) qızı xanım Fatimeyi-Zəhradır (s.ə). O, bu səadətli ailənin ikinci övladı olmuşdur. Məşhur ləqəbi Seyyidü-ş-şühəda və künyəsi Əba Əbdillahdır.

Həyatı boyu zülm və haqsızlığa qarşı mübarizə aparan İmam Hüseyn ibn Əli (ə) şücaət və azad insan örnəyi kimi tanınmaqdadır.

Hüseyn ibn Əli (ə) uşaqlıq çağlarını babası Peyğəmbərin (s) ağuşunda keçirmiş və 6 yaşında ikən babası vəfat etmişdir. Yeniyetməlik və gənclik illəri atası Həzrət Əlinin (ə) 25 il "sükut" və 5 il xəlifəlik dövrünə təsadüf etmişdir. O, atasının xəlifəliyi dövründə qarşıya çıxan çətinliklərin həllində fəal iştirak etmişdir. Atasının vəfatından sonra (hicri-qəməri 40-cı il) qardaşı Həsən ibn Əlinin (ə) imamlığı dövründə siyasi və ictimai səhnələrdə onunla çiyin-çiyinə fəaliyyət göstərmiş, mübarizə aparmışdır. Qardaşı İmam Həsənin (ə) vəfatından sonra (hicri 50-ci il) imam olan Hüseyn ibn Əli (ə) on il müddətində Müaviyə ibn Əbu Süfyanın qəsbkar hakimiyyətinə qarşı mübarizə aparmış və Müaviyənin ölümündən sonra





hakimiyyət başına gələn Yezid ibn Müaviyəyə qarşı qiyam edərək hicri-qəməri 61-ci il məhərrəm ayının 10-da Kərbəla çölündə şəhid edilmişdir.

**1. İmam Hüseyn (ə) Cəməl və Siffeyn döyüşlərində**

İmam Hüseyn (ə) atasının xəlifəliyi dövründə ictimai-siyasi səhnələrdə daim atasının yanında olmuş və onun tapşırıqlarını yerinə yetirmişdir. O, atasının hakimiyyəti dövründə baş vermiş hər üç döyüşdə fədakarlıqla vuruşmuşdur.

Cəməl döyüşündə qoşunun sol cinahına başçılıq etmək İmam Hüseynin (ə) öhdəsində olmuşdur.

Siffeyn döyüşündə o öz alovlu çıxışları ilə döyüşçülərə mübarizlik ruhu aşılamaq və onları din pərdəsi arxasında gizlənən din düşmənlərinə qarşı döyüşə ayağa qaldırmaqla yanaşı, döyüş meydanının ön xəttində vuruşmuşdur. Əbu Musa Əşəri ilə Əmr As arasında gedən danışıqlarda da İmam Hüseyn (ə) öz atası tərəfdən danışıqlara nəzarət edən əsas şahidlərdən biri olmuşdur.

**2. İmam Hüseyn (ə) qardaşı İmam Həsənin (ə) imamlığı dövründə**

O, atasının vəfatından sonra zəmanənin imamı olan İmam Həsənin (ə) ən yaxın və fədakar köməkçisi olmuşdur.

İmam Həsənin (ə) qoşunu Şama tərəf hərəkət etdiyi zaman o, qardaşından bir an belə ayrılmamış və Müaviyə İmam Həsənə (ə) sülh sazişi təklif etdikdə İmam Həsən (ə) qardaşı Hüseyni (ə) və Abdullah ibn Cəfəri çağırıb bu təklif barədə onlarla məsləhətləşmişdir. Nəhayət, qardaşı İmam Həsən (ə) Müaviyə ilə sülh sazişi bağladıqdan sonra onunla birgə Mədinəyə qayıtmışdır.

## Aşura qiyamının səbəbləri və mahiyyəti

İmam Hüseyn (ə) qiyamının meydana gəlməsində müxtəlif səbəblər rol oynamışdır.

Aşağıda qeyd olunan üç amil İmam Hüseyn (ə) qiyamının meydana gəlməsində əsas amillər hesab olunur:

1. İmam Hüseyndən (ə) özü üçün beyət istəyən Yezidin rədd cavabı alması və buna görə onun İmam Hüseynə (ə) təzyiq göstərməsi;



2. Kufə camaatının İmam Hüseyni (ə) Kufəyə dəvət etməsi;
3. "Yaxşı işlərə dəvət və pis işlərdən çəkindirmə" prinsipi; belə ki, İmam Hüseyn (ə) Mədinədən məhz bu şüarla hərəkət etmişdi.

İndi isə yuxarıda sadalanan amilləri araşdırmaqla onların ayrı-ayrılıqda bu qiyamdakı roluna və hər bir amil baxımından İmam Hüseyn (ə) qiyamının kəsb etdiyi mahiyyətə nəzər salaq.

**1. Yezidə beyət etməkdən imtina**

Zaman etibarilə İmam Hüseyn (ə) qiyamının başlanma səbəbi Yezidin ondan beyət istəməsi və İmam Hüseynin (ə) ona beyətdən imtina etməsi olmuşdur.

Tarixi faktlara istinadən 60-cı hicri ili rəcəb ayının15-də Müaviyə öldükdən sonra özünü müsəlmanların xəlifəsi elan edən Yezid Mədinənin valisi Vəlid ibn Ütbə ibn Əbu Süfyana məktub yazıb bildirir ki, İmam Hüseyndən (ə) onun üçün təcili olaraq beyət alsın. Vəlid məktubu alan kimi İmam Hüseyni (ə) çağırtdırıb məsələni ortaya qoyur. Hələ Müaviyənin sağlığında Yezidin vəliəhdliyinə qarşı çıxan İmam Hüseyn (ə), sözsüz ki, beyət etməkdən imtina edir. Çünki Yezidə beyət etmək təkcə onun kimi alçaq və ləyaqətsiz birinin hakimiyyətini tanımaq deyildi, həm də Müaviyənin İslam xilafətində yaratdığı bidəti və yeniliyi – şahənşahlıq rejimini təsdiqləmək demək idi.

Mədinənin hakimi İmam Hüseynə (ə) təzyiq etsə də, o, müqavimət göstərir. Lakin bu təzyiqlərin artması İmam Hüseyni (ə) rəcəb ayının 28-də öz ailəsi və bəni-Haşimdən olan bir dəstə ilə birlikdə Mədinəni Məkkə istiqamətində tərk etməyə vadar edir və onlar şaban ayının 3-ü Məkkəyə yetişirlər. İmam Hüseynin İslam torpağındakı şəhərlər arasından məhz Məkkəni seçməsinin səbəbi oranın "əmin-amanlıq məkanı" olması idi. Bundan da əlavə, qarşıdan həcc mərasimi gəlirdi. Tezliklə Beytullah zəvvarları Məkkəyə axışacaq və bu zaman İmam Hüseyn (ə) öz məqsədini və mövqeyini müxtəlif şəhərlərdən gələn müsəlmanlara açıqlaya biləcəkdi.





İmam Hüseynin (ə) qiyamı bu amil baxımından, bir növ, "imtina etmək və tabe olmamaq" mahiyyəti daşıyır, başqa sözlə desək, onun bu hərəkəti şəriətə zidd bir tələbə tabe olmamaq idi. Çünki Yezid ondan zorla beyət istəyirdi və İmam Hüseyn (ə) də bu istəyə tabe olmurdu. Hər halda Kufə əhli İmam Hüseyni (ə) öz şəhərlərinə dəvət etməzdən əvvəl o həzrət Yezidin tələbinə tabe olmamış və ona göstərilən təzyiqlər səbəbilə Mədinəni tərk etmişdi. Yəni əgər Kufə əhli onu çağırmasaydı belə, İmam Hüseyn (ə) onsuz da Yezidə beyət etməyəcəkdi.

**2. Kufəlilərin dəvəti**

Mədinəni tərk edən İmam Hüseyn (ə) şaban ayının 3-də Məkkəyə çatıb orada yerləşdi və Yezid hökumətinin əsl mahiyyətini ifşa etməyə başladı. İmam Hüseynin (ə) Yezidə beyətdən imtina etməsi və onun Məkkəyə köçməsi xəbəri İraqa çatdı. Təxminən 20 il öncə Həzrət Əlinin (ə) ədalətli hakimiyyətini, onun təlimlərini, yetimlərə və başsız qalmış ailələrə mərhəmət və nəvazişini hələ də xatırlayan Kufə əhli qərara gəldi ki, onlar da Yezidin xəlifəliyinə qarşı çıxıb İmam Hüseyni (ə) Kufəyə dəvət etsinlər və bir başçı kimi ona tabe olsunlar.

Aparılan müzakirələrdən sonra Kufə şiələrinin başçıları, o cümlədən Süleyman ibn Sürəd, Müseyyib ibn Nəcəbə, Rüfaə ibn Şəddadi Bəcəli və Həbib ibn Məzahir İmam Hüseynə (ə) məktub yazıb ondan İraqa gəlməsini və onlara rəhbərlik etməsini istədilər. İlk məktub Hicrətin 60-cı ili ramazan ayının 10-da İmam Hüseynə (ə) çatdı.

Hər gün Kufənin müxtəlif dəstələri tərəfindən İmam Hüseynə (ə) saysız məktublar gəlirdi. Hətta bir gün ərzində Kufədən 6 yüz məktub gəldiyi qeydə alınıb. Tarixçilər İmam Hüseynin (ə) aldığı məktubların ümumi sayının 12 minə çatdığını qeyd etmişlər. Məktubların axınını və Kufə camaatının təkidlərini görən İmam Hüseyn (ə) onların dəvətini qəbul etməyi özünə vəzifə bildi. Buna görə də əmisi



oğlu Müslim ibn Əqili Kufənin vəziyyətini öyrənmək üçün oraya yolladı. Əgər o, xəbər göndərsəydi ki, həqiqətən Kufə camaatı öz sözünün üstündə durmağa hazırdır, bu vaxt İmam Hüseyn (ə) oraya yola düşəcəkdi.

Göründüyü kimi, bu amil baxımından İmam Hüseyn (ə) qiyamının mahiyyəti, bir növ, İraq camaatı ilə həmkarlıqdır. Yuxarıda qeyd edildiyi kimi, İmam Hüseyn (ə) Yezidə beyətdən imtina etdiyi və bu səbəbdən ona təzyiq göstərildiyi üçün artıq Mədinəni tərk etmiş və Məkkəyə gəlmişdi. Yəni o, üzərinə düşən vəzifəni yerinə yetirmişdi. Ancaq Kufə camaatının dəvəti məsələyə yeni bir yön verdi və İmam Hüseyn (ə) üçün başqa bir məsuliyyət ortaya çıxartdı. Sanki İmam Hüseyn (ə) bu qənaətə gəldi ki, əgər Kufə camaatı belə bir şövq və təkidlə onu dəvət edirsə, onda oraya getməlidir. Əgər sözlərinə əməl edərlərsə, çox yaxşı, yox, əgər əməl etməzlərsə, onda yenə də Məkkəyə geri dönər, ya da başqa bir məntəqəyə gedər.

Deməli, İmam Hüseyn (ə) Kufə camaatının dəvətinə görə Yezidə beyətdən imtina etməmişdi. Hətta əgər Kufə camaatı məktub göndərib İmam Hüseyni (ə) dəvət etməsəydi və Yezid bütün yer üzünü İmam Hüseynə (ə) dar etsəydi belə, yenə də o, Yezidə beyət etməyəcəkdi.

### 3. “Yaxşı işlərə dəvət etmək və pis işlərdən çəkindirmək” prinsipi

İmam Hüseyn (ə) elə başlanğıcda Mədinəni məhz “yaxşı işlərə dəvət və pis işlərdən çəkindirmək” şüarı ilə tərk etmişdi. Deməli, məsələ təkcə bu deyildi ki, Yezid hökuməti İmam Hüseyndən (ə) beyət tələb etmiş və o da qiyam etmişdi. Xeyr, əgər İmam Hüseyndən (ə) beyət istənilməsəydi belə, o, yenə qiyam edəcəkdi.

Bu da məlumdur ki, İmam Hüseyn (ə) sırf Kufə camaatı onu dəvət etdiyinə görə qiyam etməmişdi. Bir qədər öncə qeyd edildiyi kimi, İmam Hüseyn (ə) beyətdən imtina etdikdən təxminən ay yarım sonra Kufə camaatının məktubları gəlməyə başlamışdı.





Bu amil baxımından İmam Hüseyn (ə) qiyamı İslama zidd olan hökumətə qarşı yönəlmiş etiraz və hücum mahiyyəti daşıyır. İmam Hüseynin (ə) məntiqi bu idi ki, müsəlman ictimaiyyətini fəsad bürümüş və hakimiyyət fəsad mənbəyinə çevrilmişdir, bunun üçün də o, Allah qarşısındakı vəzifəsini yerinə yetirməli və ayağa qalxmalıdır.

* * *

Bəli, qeyd edilən hər üç amil İmam Hüseyn (ə) qiyamında rol oynamış, onların hər biri ayrı-ayrılıqda İmam Hüseyn (ə) üçün bir məsuliyyət və vəzifə icad etmişdi. Bu üç amil qarşısında da İmam Hüseynin (ə) mövqeyi fərqli şəkildə dəyərləndirilir.

"Birinci amil baxımından İmam Hüseyn (ə) özünü müdafiə edən bir fərd mövqeyindədir. Çünki ondan zorla beyət istənilir və o da bundan imtina edir.

İkinci amil baxımından İmam Hüseyn (ə) bir həmkar mövqeyindədir. Çünki Kufə camaatı onu həmkarlığa dəvət edir.

Üçüncü amil baxımından isə İmam Hüseyn (ə) bir hücumçudur. Çünki İmam Hüseyndən (ə) beyət istənilməsəydi belə, o yenə də ayağa qalxıb bu hökuməti qeyri-islami hökumət adlandıracaqdı"[1].

* * *

Müaviyə öz vəfatına yaxın Yezidə belə vəsiyyət etmişdi: "Oğlum, Hicaz camaatından muğayat ol, çünki sənin əsil-nəsəbin, nəslin onlardandır. Onlardan biri sənin yanına gəlsə, ona bəxşiş ver. İraq camaatına qarşı da diqqətli ol. Səndən hər gün bir valini işdən çıxarmağını istəsələr belə, işdən çıxar, çünki bir valini işdən çıxarmaq üstünə yüz min qılıncın çəkilməsindən daha yaxşıdır.

Müsibətin kimin başına gələcəyini bilmək olmaz. Suriya camaatına da mehriban ol. Onları özünə sirdaşa çevir. Sənə

.................................

[1] *Mehdi Pişvayi. Məsum insanların (ə) tarixi, səh. 80-81*



düşmənindən hər hansı bir təhlükə gələrsə, onu şamlıların əli ilə dəf et. Ancaq dərhal onları öz yurdlarına göndər ki, başqa yerlərdə məskunlaşmasınlar. Yoxsa xasiyyətlərini dəyişərlər.

Sənin əleyhinə çıxa biləcək üç nəfərdən qorxuram; onlar Hüseyn bin Əli, Abdullah bin Zübeyr və Abdullah bin Ömərdir. Belə düşünürəm ki, Hüseyn bin Əli barəsində Allah sənə kifayət edəcəkdir. Abdullah bin Zübeyrə gəlincə, o, kinli bir bəladır, tülkütək hiyləgərdir, əlinə fürsət düşər-düşməz üzərinə atılmağa hazır bir düşməndir, odur ki, əlinə keçdiyi təqdirdə ona aman vermə! Ömərin oğluna gəldikdə isə, bil ki, təqva onu susdurub. Əgər sən onu öz axirəti ilə baş-başa buraxsan, o da səni sərbəst buraxar”[2].

Göründüyü kimi, bu vəsiyyətnamə Müaviyənin bütün hiyləgər təbiətini açıb göstərir. Belə ki, o, əgər Hicaz camaatını əsil-nəsəb baxımından önə çəkirsə, İraq əhalisini də idarəedicilik yönündə dəyərləndirməyi unutmur. Ancaq bunların hamısından daha maraqlı cəhət vəsiyyətnamədəki “müsibətin kimin başına gələcəyini bilmək olmaz” cümləsidir. Çünki bu cümlə istər-istəməz Müaviyəyə süni bir müdriklik donu geydirir, sonralar onun allahcıl, təqvalı bir şəxs kimi qələmə verilməsi üçün dini-tarixi zəmin hazırlayır.

Müaviyənin suriyalılarla bağlı tövsiyəsi isə qətiyyən təəccüb doğurmur. Axı o, 40 ilə yaxın onların arasında yaşamış, suriyalılar içərisində nüfuz qazanmış, özünün çirkin niyyətlərinin çoxunu onların əli ilə həyata keçirmişdi.

Şəxsiyyətlərlə bağlı tövsiyələri isə Müaviyənin daxili siyasətində ictimai cəhətlərlə yanaşı, fərdi mövqeyi də diqqətdən kənarda qoymadığını göstərir. Abdullah bin Zübeyrə və Abdullah bin Ömərə verdiyi xasiyyətnamə özünün ziddiyyəti ilə asanlıqla başadüşüləndir, ancaq İmam Hüseynlə (ə) bağlı sözləri anlaşılmazdır. Əgər həmin sözləri hərbi yürüşə təhrik olaraq götürsək, onda belə çıxır ki, Müaviyə, sadəcə olaraq,

................................

[2] *Təbəri. Tarix, III cild, səh. 263-269*



tövsiyəsinə diplomatik hiyləgərlik donu geydirmişdir. Yox, hərgah bu sözləri "Vəziyyəti o günün şərtlərinə uyğun olaraq dəyərləndirərsən" çağırışı hesab etsək, onda belə çıxır ki, Yezid atasının rəyini nəzərə almadan Kərbəla vaqeəsi ilə bağlı müstəqil siyasət yeritmişdir. Bu isə onun fərdi keyfiyyətləri ilə bir araya sığmadığından qeyri-məqbuldur.

* * *

Ənənəvi İslam tarixində Kərbəla vaqeəsi daha çox Əməvilər dövrünün qiyamlarından biri kimi dəyərləndirilir. Günümüzün informasiya şəbəkəsindən boylandıqda bunun bilərəkdən güdülən ictimai-siyasi məqsəd və tendensiyalı münasibət olduğu dərhal bilinir. Bununla belə, hadisənin dini-tarixi və ictimai-mənəvi mahiyyətini bütünlüklə ört-basdır etmək, özündə birləşdirdiyi müsbət gücü gizlətmək sonadək mümkün olmamışdır. Aşağıdakı qeydlərdəki dağınıqlığın başlıca səbəbi, zənnimizcə, burada axtarılmalıdır. "Hüseyn min atlı ilə gələn Hürr bin Yezidlə qarşılaşdı. Hürrü oraya Husayn bin Nümeyr və Übeydullah göndərmişdi. Hüseyn "onu dəvət edən şəxslərin öz sözlərindən döndüyü təqdirdə geriyə qayıtmağa hazır olduğunu" söyləsə də, Hürr bununla razılaşmadı, əksinə, bildirdi ki, o, Hüseyni ibn Ziyadın hüzuruna aparmaq üçün tapşırıq almışdır.

Sonra hər iki dəstə bir müddət yanaşı irəliləyərək düşərgə saldı. Hüseyn bəlağətli bir xütbə oxuyaraq Əməvilərin zülmündən danışdı, onların cəmiyyətdə törətdikləri ictimai eybəcərlikləri açıb göstərdi. Hürr Hüseynə: "Açıq-aşkar bəyan edirəm ki, əgər döyüşsən, mütləq öldürüləcəksən", – deyə cavab verdi. Hüseyn isə belə buyurdu: "Sən məni ölümlə hədələyirsənmi? Yoxsa siz məni öldürməyə cəsarət edəcəksinizmi?" Yenə də yollarına davam etdilər. Yolda Hürrə ibn Ziyaddan məktub gəldi. Məktubda Hürrə göstəriş verilirdi ki, Hüseyni dar bir yerdə sıxışdırıb susuzluğa məruz qoysun.

Qafilə Əqr adlanan yerdə mənzil etdi. Bu zaman hicri-qəməri tarixlə məhərrəm ayının 2-si, miladi ilə isə oktyabrın 2-si idi.



Ömər bin Səd bin Əbu Vəqqas 4 min atlı ilə Kufədən gəldi və Hüseynə Yezidə beyət etməsini təklif etdi. O, ibn Ziyadın göstərişi ilə Hüseynin qafiləsinin su götürməsinin qarşısını aldı.

Hüseyn Ömər bin Sədə üç təklif etdi: geriyə qayıtmasına izin verilsin; ucqar sərhədlərin birinə kafirlərlə cihad üçün göndərilsin; Yezidin yanına aparılsın.

Hər üç təklif rədd edilərək, yalnız Yezidə beyət etməsi tələb olundu. Bu zaman artıq Hüseyn Kərbəlada idi.

Kufəlilərin bir qismi hədə-qorxu, bir qismi də mal-mülk vədəsi ilə fikrindən daşındırılmışdı.

"Hüseyn qadınlı-kişili 72 nəfərdən ibarət olan ailəsi ilə birlikdə sağ qalmaq uğrunda deyil, qatillərinin adlarını qiyamətədək ümumbəşəri lənət hədəfinə çevirmək və özlərinin qanlı şəhadətləri ilə tarix səhifələrində bir bayraq kimi ucalmaq üçün iztirab silahına sarılmışdı. Qarşı tərəfdə 4 min qəddar və qaniçən, ov görmüş canavar kimi, o məsumların üzərinə həmlə etməyə hazırlaşmışdı"[3].

Kərbəla döyüşünün təfərrüatı A.Ağırakçanın "Əməvilər dönəmində qiyamlar"[4] kitabında verilmişdir.

"Hicri-qəməri 10 məhərrəm 610-cu, yaxud miladi 10 oktyabr 680-ci ildə Hüseynin qafiləsi Kərbəlada mühasirəyə salındı. Adamlarını sərbəst buraxmasına baxmayaraq, onlar Hüseyni tərk edib getmədilər. Hüseynin 32-si atlı, 40-ı piyada olmaqla 72 adamı var idi. O, Allaha dua etdi və kufəli əsgərlər önündə bəlağətli bir xütbə oxudu.

Bu zaman Hürr bir neçə adamı ilə birlikdə Hüseynin qoşununun sırasına keçdi.

Döyüş öncə təkbətək mübarizə şəklində gedirdi. Hüseyn qoşununun sıra nəfərlərinin çoxu öz rəqiblərini məğlub edirdi. İşi belə görən Ömər bin Səd öz ordusuna küll halında döyüşmək əmrini verdi və uzaqdan ox atmaqla Hüseyn qoşununun əksəriyyətini şəhid etdilər.

..................................

[3] *Əbdürrəhman Şərəf. Übdətü-l-qisas, İstanbul, h.-q. 1315, səh. 205*

[4] *A.Ağırakça. Əməvilər dönəmində qiyamlar, İstanbul, 1994, səh. 73-110*



Bir çox adamı Hüseynin qarşısında özünü fəda elədi. İbn Əsirin bildirdiyinə görə, axırda Malik bin Müseyr qılıncı ilə Hüseynin başını vurdu. Hüseynin övladları da oxlarla öldürüldü. Şimr 10 nəfərlə Hüseynin üstünə gəldi. Sinan bin Ənəs ən-Nəhai də onların içərisində idi. Zura bin Şərik Hüseynin sol əlinə qılınc zərbəsi endirdi və çiynini də yaraladı. Sinan bin Ənəs yıxılıb durmaqda olan Hüseynə mizrağını sapladı. Havli bin Yezidə "başını kəs" deməsinə baxmayaraq, Sinan özü Hüseynin başını kəsdi.

Hüseynin əmlakı yağmalandı. Hətta qadınların üst-başındakı zinət əşyalarını da qəsb etdilər.

Hüseynin cəsədində 33 mizraq, 34 qılınc yarası var idi. Əli Zeynəlabidindən başqa Hüseynin bütün övladları, qardaşları və qardaşı balaları qətlə yetirildi.

Hüseynin mübarək başı ibn Ziyadın hüzuruna, Kərbəla düşərgəsindəki qadın və uşaqlar isə öncə Kufəyə, sonra da Şama – Yezidin sarayına aparılmışdı.

Şama gətirilən Hüseynin qafiləsi olduqca pərişan idi. Yezidin "Hüseyni öldürməsəydiniz də, mən itaətinizdən razı qalardım" dediyi bildirilir"[5].

"Aşurada Kərbəlada Hüseynlə birlikdə qətlə yetirilən şəxslərin sayının 86 olduğu bildirilir. Onların hərəsində Həsənin övladlarından Abdullah, Qasim, Əbu-Bəkr, Həsənlə Hüseynin qardaşları Abbas, Abdullah, Cəfər, Osman, Muhəmməd bin Əli, həmçinin Cəfər bin Əbu Talibin övladları və nəvələri Muhəmməd bin Abdullah bin Cəfər, Övn bin Abdullah bin Cəfər, Əlinin qardaşı Əqil bin Əbu Talibin övladları Abdullah bin Əqil, Abdullah bin Müslüm bin Əqil də vardı[6].

...Qətlə yetirildiyi zaman Hüseyn 55 yaşında olmuşdur[7]. Bu səpkili bilgilər əsasında, adətən, tarixçilər aşağıdakı nəticələri

.................................

[5] *Təbəri. Tarix, III cild, səh. 303-337. İbn Əsir. Əl-kamil, IV cild, səh. 49-94*

[6] *İbn Əsir. Əl-kamil, IV cild, səh. 91*

[7] *Məsudi. Muruc, III cild, səh.71; Nuri Ünlü. İslam tarixi, 3 clddə, I cild, səh.170-173*



çıxarırlar: "Müaviyə bin Əbu Süfyan sağlığında Müğəyrə bin Şöbənin tövsiyəsi və məsləhəti ilə oğlu Yezid üçün beyət almış və bununla da onu Məhəmməd ümmətinin başına bəla etmişdir. Tarixin üzqaralığıdır ki, eyni şəkildə dövlət və hökumətlərini qorumağa məcbur olduqlarını və özlərinə qarşı üsyan edən şəxslərə edilməsi lazım gələni etdiklərini bildirmişlər.

Hüseynin Kərbəlada şəhid edilməsi İslam dünyasının İran, Məkkə və Mədinə bölgələrində üsyanlara yol açdığı kimi, Əməvi məmurlarını çıxmaqla, əhalinin böyük əksəriyyətini dərindən kədərləndirmiş və xəcalət hissinə bürümüşdür. Dalğa-dalğa böyüyən bu düşmənlik II Müaviyə, Mərvan və Əbdül Məlik dövrlərində də müsəlman dünyasını qan və atəş içərisində buraxmışdır.

Abdullah bin Zübeyr Hüseynin vəfatını eşidər-eşitməz Məkkədə Hüseynin qatillərinə lənət etmişdir"[8].

Bəzi tendensiyalı yanaşmalarına baxmayaraq, bu bilgilər bütövlükdə Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) hərəkatı haqqında, İmam Hüseynin (ə) əlçatmaz-ünyetməz şəxsiyyəti barəsində bir xeyli anlayış yaradır. "Müaviyənin oğlu olmaqdan başqa heç bir məziyyəti olmayan Yezid kimi bir şəxs iş başına gətirilmiş, qan tökməklə məqsədinə yetmək istəyənlər ortaya çıxmış, Səd bin Əbu Vəqqas kimi bir imanlı şəxsin Ömər kimi bir oğlu Hüseynin qarşısına çıxmış və insafsız ağasına xidmət edən bir köpək misalı Əhli-beytə zülm etmişdir.

Mindən çox olan kufəli əsgərlər sayı çox az olan Hüseynin adamlarına qarşı daha mülayim davranaraq onları əsir götürüb Kufəyə apara bilərdilər"[9].

"Əməvilərin və tərəfdarlarının bu hadisəyə münasibətilə digər məzhəb, təriqət və cərəyanların münasibəti çox fərqlidir. Əməvilərə və tərəfdarlarına görə, onlar qanuni iqtidar, müsəlmanların beyətini almış hakimiyyət və xilafətdirlər.

[8] *Yenə orada, səh. 173*

[9] *Yenə orada, səh. 172-173*



Peyğəmbərin belə nəvə-nəticələri olmalarına baxmayaraq, Həzrət Əliyə qarşı çıxıb mübarizə apardıqları kimi, oğluna qarşı da mübarizə aparmaqda haqlıdırlar”[10].

Görmək çətin deyildir ki, iki zidd mövqedə duran mənbədən gətirdiyimiz açıqlamalar Kərbəla vaqeəsinin və İmam Hüseyn şəxsiyyətinin həqiqi mahiyyətinə dair əslində yetərincə vahid müstəviyə çıxaraq nisbətən yaxın qayə çevrəsində birləşə bilir. Odur ki, əsrlərin qalın toz qatı altında qalan saralmış vərəqləri daha bundan da artıq ələk-vələk etməyə, bundan da çox çək-çevirə salmağa lüzum qalmır. Bir də ki, Füzuli “Hədiqə”sinin özü istər Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) hərəkatı, istərsə də hər bir Kərbəla şəhidi haqqında kifayət qədər dəqiq və aydın informasiyaya malikdir. Odur ki, gəlin vaxt itirmədən elə Füzuli qələminin cızdığı Kərbəla çevrəsinin sirrinə, sehrinə qapılaq, könlümüzü bələdçisi Füzuli ruhu olan Kərbəla səyahətinə çıxaraq.

* * *

İmam Hüseynin (ə) ömür yolu və Kərbəla vaqeəsi əsasında az-çox təsəvvür əldə etdikdən sonra ecazkar Füzuli qələminin min bir naxış vurmaqla araya-ərsəyə gətirdiyi “Hədiqətü-s-süəda” barəsində danışmaq olar.

“Hədiqətü-s-süəda”əsərinin yazılma tarixi bəlli deyildir. Əsərin özündə bu barədə maddeyi-tarix yoxdur.Ancaq əsərin ruhu, məzmunu, müəyyən qeyd və işarələri təsdiq edir ki, Füzuli bu sənət abidəsini qoca çağlarında yazıb bitirmişdir. Füzuli əsərin sonunda gətirdiyi münacatda “Hədiqətü-s-süəda”nı Türkiyə sultanı Sultan Süleyman Qanuninin (1494-1566) generallarından Məhəmməd paşanın sifarişi ilə qələmə aldığını bildirmişdir: “Bu nüsxeyi-dilpəzir onun hüsni-işarəti-şərifi ilə səmti-təhrir bulmuş və onun lütfü ehtimamilə müstəidi-səadət təstir olmuş”. İngilis alimi Ç.Rio Füzulinin adını çəkdiyi

..................................

[10] *Yenə orada, səh.173*



Məhəmməd paşanın 1549-1554-cü illər arasında Bağdadda vəzifə başında olan Sivas miri-miranı Baltaçı Məhəmməd paşa olduğunu göstərmişdir. Türk alimi A.Qaraxana görə isə, Füzuli öz əsərini Məhəmməd paşanın Bağdadda olduğu illərdə yazmışdır. Ancaq doktor Güngör "Hədiqətü-s-süəda"nın ən əski əlyazmasının 1547-ci ildə yazıldığını əsas tutaraq onun yazılma tarixinin Baltaçı Məhəmməd paşanın dövrünə aid olduğunu inkar edir. Araşdırıcının fikrincə, Füzuli öz əsərini daha öncə yaza bilərdi. Burada adıçəkilən Məhəmməd paşa da Baltaçı Məhəmməd paşa deyildir. Çox ehtimal ki, o, 1545-1547-ci illərdə Bağdadda yaşamış Əlhac Sufi Məhəmməd paşadır. Füzulinin "Hədiqətü-s-süəda" əsəri ənənəvi-müştərək bir mövzuda yazılmışdır. Şərq ədəbiyyatı və folklorunda ən əski çağlardan çox yayılan və dəb şəklini alan mövzulardan biri də Kərbəla vaqeəsidir ki, Füzulinin də məhz bu süjet əsasında yeni bir əsər yazması təsadüfi deyildir. Qəm-kədərli mövzularda yazılmış əsəri oxuyan və ya dinləyən oxucu öz dərdini unudaraq təskinlik tapır, dərdə dalaraq öz faciəsini bir anlığa yaddan çıxarırdı. Kərbəla hadisəsi dərd əlindən ürəyi çatlayan insanı ovundurur, ona mənəvi qida verirdi. Çünki Kərbəla vaqeəsi nə qədər dini bir hadisə olsa da, onun məntiqi mənası, ruhu yenidir, dünyəvi və bəşəri səciyyəsi ilə ölməzdir. Burada əksini tapan şəhidlik eşqi, məslək və etiqad uğrunda mübarizə motivi həmişə yenidir, heç zaman köhnəlmir. İnsanın mənəvi və cismani köləliyə üsyanı, etirazı və bu yolda hətta öz həyatını qurban verməsi, şəhid olması ən yüksək və şərəfli insanlıq amili kimi göstərilir. Bu əqidə və məslək döyüşü ona görə həmişə yaşayır ki, onun əsasında mənəvi paklıq, ruhi müqəddəslik, insani gözəllik və əzəmət vardır. Allah yolunda aparılan ruhani-mənəvi və cismani qovğa və çarpışmalar Allahın özü kimi əbədi və ülvidir[11].

.................................

[11] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 7-8*





Bəllidir ki, Füzuli "Hədiqə"sinin özülünü fars ədibi Hüseyn Vaiz Kaşifinin "Rövzətü-ş-şühəda" ("Şəhidlər bağçası") əsəri təşkil edir. Daha dəqiqi budur ki, Füzuli "Hədiqə"si "Rövzətü-ş-şühəda"nın tərcüməsindən ibarətdir. Odur ki, "Hədiqətü-s-süəda"dakı mülahizə və müddəaların, qeyd və şərtlərin hamısını birmənalı surətdə Füzulinin adına yazmaq, Füzuli dühasının məhsulu saymaq insafdan, ədalətdən uzaq olardı. Unutmayaq ki, hər iki ədib İmam Hüseyn (ə) aşiqi olmuş, Kərbəla şəhidlərinin eşqi ilə yanıb-yaxılmışdır. Yenə də unutmayaq ki, orta əsrlərdə milli mənsubiyyət anlayışı bu gün bizim başa düşdüyümüz şəkildə olmamış, ədiblər özlərini əsla "xalq, millət" bölgüsü üzrə önə çəkməmişlər. Əksinə, onlar İslamdan, Qurandan, Peyğəmbərdən (s) gələn bir ümmət həmrəyliyi içərisində olmuş, "Allah dərgahında ən çox hörməti olanınız Allahdan ən çox çəkinəninizdir" *("Hücurat", 13)**, "Ərəbin əcəmdən təqvalılıqdan başqa heç bir üstünlüyü yoxdur" (Həzrət Muhəmməd (s)) demişlər.

Monoqrafiyada "Hədiqətü-s-süəda"ya daxil olmayan əsərlərdən biri də "Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən" misralı qəzəldir. Qəzəl, adətən, Füzulinin vəsiyyəti hesab olunur. Doğrudur, bir çox böyük füzulişünaslar, məsələn, Əli Nihad Tərlan qəzəli nə Füzulinin vəsiyyəti kimi götürmüş, nə də onu İmam Hüseynlə (ə) əlaqələndirmişdir[12]. Lakin monoqrafiyanın "Qəbri danlaq daşları ilə ucaldılan şair" fəslində göstərdiyimiz tarixi-ədəbi və dini-mənəvi dəlillər, zənnimizcə, qəzəlin İmam Hüseyn (ə) eşqində deyildiyini kifayət qədər sübuta yetirir.

Belə kitablar, adətən, iki qabaqcıl ictimai şüur formasının – dinlə ədəbiyyatın üzvi vəhdətindən doğur. Bu vəhdət isə kökləri çox əski çağlara – insanlığın dansöküləninə, tarixin

.................................

* *"Qurani-Kərim"dən burada və aşağıda verilən iqtibaslar akademiklər Z.Bünyadovla V.Məmmədəliyevin tərcüməsinin 1992-ci il nəşrindən götürülmüşdür*

[12] *Tərlan Ə.N. Füzuli divanının şərhi, 3 clddə, II cild, səh. 524-526*



alatoranlığına gedib çıxan iki qocaman sirdaşın bir-birinə pıçıldadığı köhnə, çox köhnə həqiqətlərin ruhi-psixoloji, mənəvi-əxlaqi, xəlqi-mədəni, bədii-estetik və etik-didaktik dərki üzərində qurulmuş insan və onun son dərəcə mürəkkəb mənəviyyatı haqqında, insanın ikili təbiəti barəsində çeşidli söz-sənət incəliklərinin təbiət, şəxsiyyət və cəmiyyətlə bağlı çoxyönlü mənalandırılmasına və səciyyələndirilməsinə yönəldilmişdir.

* * *

Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) şəxsiyyətinin Füzuli yaradıcılığındakı parlaq bədii ifadəsinə daha dərindən bələd olmaqdan ötrü bu cəhətlərin Füzuliyəqədərki ədəbiyyatda əksini tapan işlənmə məqamlarına da nəzər salmaq yaxşı olardı.

Hər şeydən öncə bunu bilmək gərəkdir ki, Yaxın və Orta Şərq xalqlarının ədəbiyyatında Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) şəxsiyyəti daha çox XIII-XVI əsrlərdə ayrıca mövzu kimi işlənməyə başlamış, aydın və dəqiq dini-tarixi, ictimai-fəlsəfi və bədii-estetik çalarlar qazanaraq, müstəqilləşməklə hərtərəfli vüsət almışdır. Odur ki, Xaqani, Nizami, Sədi, Hafiz kimi dühaların irsində bu yöndə ayrıca nümunə axtarmaq istər tarixi planda, istərsə də sırf ədəbi-bədii aspektdə yersizdir. Həmin sənətkarlardan, uzaqbaşı, Həzrət Əli (ə) və Əhli-beyt barəsində qeydlər gözləmək olar. Ancaq bunu qətiyyən həmin dühaların ədalətsizliyə yol verib, haqqı nahaqa qurban verməsi hesab etmək olmaz. Çünki onların yaşadığı dövr, mənsub olduqları mühit, əsərlərini şərtləndirən ictimai-tarixi situasiya və içərisində olduqları konkret vəziyyət bunu, sadəcə olaraq, imkansız edirdi. Bununla belə, hər bir dövr, mühit, şərait və vəziyyət üçün müəyyən istisnalar, müstəsna hallar həmişə mövcuddur.

Yaradıcılığı da ömür yolu kimi mürəkkəb olan Nəsiminin əsərləri bu baxımdan səciyyəvidir. Məqsədimiz problemi köklü surətdə qoyub həll etmək olmadığından indiki halda





şairin yalnız bir şeiri – *"Ya Hüseyn ibni Əli!"* qəsidəsi ətrafında mühakimə yürütməklə kifayətlənirik:

Nuri-çeşmi-övliyasən, ya Hüseyn ibni Əli!
Dürri-taci-ətqiyasən, ya Hüseyn ibni Əli!
Məxzəni-əxlaqü-lütfü mənbəi-hər möcüzat,
Mədəni-cudü-səxasən, ya Hüseyn ibni Əli!
Sənsən işraq eyləyən sübhi-əzəldə aləmi,
Nuri-"Şəms"i və-z-"Züha"sən, ya Hüseyn ibni Əli!
Həm şəriət, həm təriqət, həm həqiqət, mərifət
Səndədir, müşkülgüşasən, ya Hüseyn ibni Əli!
Meyvəyi-bağı-nübüvvətsən, güli-bağı-Həbib,
Nuri-eyni Müstəfasən, ya Hüseyn ibni Əli!
Teyyübü-tahir kim, ol Xeyrənnisanin fəxridir,
Gövhəri-Xeyrənnisasən, ya Hüseyn ibni Əli!
Bir sədəfdəndir iki dürri-yetimi-bibəha,
Çün Həsən ehsanliqasən, ya Hüseyn ibni Əli!
Çünki "dünya ticni-mömin" dedi fəxri-kainat,
Arifi ibrətsimasən, ya Hüseyn ibni Əli!
Bunca fəzlü-elmü-hüsni-nəsl ilə zi heyfü-ah
Əhli-zülmə mübtəlasən, ya Hüseyn ibni Əli!
Sənsən ol məzlumü-həm məsum, mərhumü-səid
Kim, şəhidi-Kərbəlasən, ya Hüseyn ibni Əli!
Dini dünyayə verib, qəsdin qılan bidinlərin
Kordular, yarın cəzasən, ya Hüseyn ibni Əli!
...Zərreyi-mehrin həvasinə düşən aşiqləri,
Haşa ki, məhrum qoyasən, ya Hüseyn ibni Əli!
Canü-dildən dərvişin könlü sənin mehrinlədir,
Şölədən ayurmayasən, ya Hüseyn ibni Əli!
Çün Nəsimi mədh edib mədhin, ümid edir bu gün,
Yarın anı qurtarasən, ya Hüseyn ibni Əli![13]

*(Sən övliyaların gözünün işığısan, ey Əli oğlu Hüseyn! Ey Əli oğlu Hüseyn, təqvalıların tacının incisi sənsən!*

[13] *Nəsimi. Əsərləri, 3 clddə, III cild, Bakı, 1973, səh. 156-158*



*Sən əxlaq və mərhəmət qaynağı, hər cür möcüzə və kəramətin başlanğıcısan, əliaçıqlıq və səxavət mədəni yalnız səndədir, ya Əli oğlu Hüseyn!*

*Ey Əli oğlu Hüseyn, yaranışın ilk sübh çağı kainatı nurlandıran yeganə şəxsiyyət sən oldun. "Şəms" və "Züha" surələrinin nuru yalnız səndə təcəlla etməkdədir.*

*Şəriət, təriqət, mərifət və həqiqət mərhələlərinin qət edilərək, kamil şəxsiyyət olmaq yolunu bütün aydınlığı və genişliyi ilə yalnız sən bilirsən, odur ki, bütün çətinliklərin yeganə həlledicisi elə sən özünsən!*

*Peyğəmbərlik bağının meyvəsi, Allah dostunun çəmənliyində bitmiş ətirli qızılgül və Mustafanın gözünün nurusan!*

*O "Qadınlar xeyirlisi"nin gözəl və pak fəxri olan Xeyrə-n-nisa incisi sənsən!*

*Tayı-bərabəri olmayan iki dürri-yetimin sədəfi birdir, odur ki, sən də, İmam Həsən kimi, daima ehsan nümayiş etdirən misilsiz bir simasan.*

*Kainatın fəxri "dünya mömin üçün zindandır" buyurduğundan sən bir ibrət güzgüsü olan arif şəxsiyyətsən. Ancaq hayıf olduğuna görə ah çəkməkdən başqa ayrı çarəmiz yoxdur ki, sən bu qədər fəzilət, elm və soy-nəsil gözəlliyinə malik ola-ola zülmkarların əzab-əziyyətlərinə tuş gəlmisən.*

*Sən məzlumluqla məsumluğu, qətlə yetirilməklə xoşbəxtliyi özündə birləşdirdiyindən Kərbəla şəhidi kimi ən uca bir dərəcəni əldə edə bildin.*

*Dinlərini dünyaya sataraq sənin qəsdinə duran dinsiz-imansızlar mənən kordurlar; əgər belə olmasaydı, onlar sabah – Qiyamət günündə Allah-taalanın mükafat və cəza verərkən sənə bəslənilən münasibəti nəzərə alacağını bilərdilər.*

*Sənə bəslədikləri zərrəcə eşqin sevdasına düşən aşiqləri, Allah eləməsin ki, şəfaət nemətindən məhrum qoyasan!*

*Yolunda sıravi bir dərviş olan bu şairin könlü, bədəni və ruhu sənin məhəbbətinlə nəfəs alır. Odur ki, ey Əli oğlu Hüseyn, onun səndən umduğu sənin bircə mehriban və hərarətli baxışındır.*





*Nəsimi sənin mədhini mədh etdiyi, səni öyənləri öydüyü üçün bu gün bütün varlığı ilə ümidvardır ki, sən sabah Allahın izni ilə onu cəhənnəm odunun əzabından xilas edəcəksən!).*

Göründüyü kimi, Nəsimi qələminin İmam Hüseyn şəxsiyyətinin işıqlandırmadığı bir cəhəti qalmamışdır. Belə nümunələr Nəsiminin vəfatından 100-150 il sonra yaradıcılığa başlayan Füzuliyə bəlli olmaya bilməzdi. Deməli, bu səpkili örnəklər bir orta əsr azərbaycanlısı olan Füzulinin dünyaduyumuna ciddi təsir göstərmiş, dünyagörüşünün formalaşmasında aparıcı amillər sırasında yer almışdır. Yəqin, elə buna görədir ki, Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilə bağlı dini-tarixi keyfiyyətlər vaxt ötdükcə xəlqi-mədəni müstəviyə keçərək milli-mənəvi yön almış, əsrlər keçdikcə nəinki azalmamış, əksinə, düz xətt üzrə zəngin və dolğun bir inkişaf yolu keçərək XIX yüzillik ədəbiyyatının Qasım bəy Zakir, Seyid Əzim Şirvani, Heyran xanım Dünbüli, Xurşudbanu Natəvan kimi öncül simalarının yüksək səviyyəli əsərlərindən keçmiş ənənələrlə yanaşı, maarifçilik, xəlqilik, demokratikləşmə kimi orijinal və novator əlamətlər kəsb etmişdir. Ötəri deyildir ki, milli-mənəvi kimliyində Şərq ənənələrini Avropa dəyərləri ilə birləşdirən Abbasqulu ağa Bakıxanov hələ Qumri Dərbəndidən 50 il öncə Kərbəla vaqeəsi haqqında "Riyazü-l-Qüds" ("Müqəddəs bağça") adlı parlaq bir əsər meydana gətirmişdir.

Bütün bunlar tam əminliklə söyləməyə əsas verir ki, Füzulinin "Hədiqətü-s-süəda" kimi köklü əsər yazıb-yaratması üçün möhkəm ictimai-mədəni zəmin olmuş və bu zəmində Nəsimi qələmi də öz layiqli töhfələrini vermişdir.

* * *

Ən nəhayət, kitabın quruluşundan danışaq. Sözün düzü, bu kitabı sırf elmi-nəzəri xarakter daşıyan monoqrafiya kimi görmək istərdik. Ancaq mövzunun aktuallığı, geniş kütlələr üçün gərəkliyi bizi monoqrafik tədqiqatı saxlamaqla yanaşı, kitabın struktur və kompozisiyasında müəyyən dəyişikliklər aparmağa sövq etdi və buna görə də kitab bir çox hallarda nəzəri yönümünü dəyişərək, kütləvi və təcrübi səciyyə qazanmış





oldu. Ancaq biz bunu qətiyyən itki hesab etmirik. Onsuz da hər bir elmi işin son nəticəsi onun praktik önəmində, nəzəri məna-məzmun çevrəsində birləşdirdiyi qəliz mətləblərin sadə mexanizmlərlə həyata tətbiq edilməsindədir. Biz də yazı prosesində bu tərəfə ağırlıq saldıq. Belə ki, "Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri" kimi fəlsəfi siqlətli bəhsi yüyrək el dilində qələmə almağa çalışdıq, Kərbəla vaqeəsi və Füzuli irsi ilə bağlı başlıca açar sözlər haqqında yığcam, çevik və işlək, ensiklopedik və lüğəvi bilgi verməyə çalışdıq. Düşünürük ki, *zülm, müsibət, səbir, şükür, ədalət, ağıl* kimi sözlərin lüğəvi və istilahi mənaları haqqında, dini, fəlsəfi, tarixi və ədəbi-bədii, mövzu, məzmun, məfkurə və üslub incəlikləri barəsində verilmiş bilgilər yararlı olub, imamhüseynsevər oxucularımızın əlindən tutacaq, İmam Hüseyn (ə) şəxsiyyətinin əlçatmazlığını, ünyetməzliyini, İmam Hüseyn (ə) hərəkatının məğzini, mahiyyətini qavramaqda və Kərbəla vaqeəsinin ağrı-acısını, şəhidlərin ruhi-mənəvi iztirablarını, daxili dünyasını duymaqda onlara yaxından kömək edəcəkdir.

Əlbəttə, diqqətli, səriştəli və qayğıkeş oxucu monoqrafiyanın *"Peyğəmbər aşiqi Füzuli"* və *"Həzrəti Əli aşiqi Füzuli"* kitablarının təbii davamı olduğunu dərhal duyacaqdır. Axı Rəsulullah (s) İslamın qurucusudursa, Həzrət Əli (ə) ilə İmam Hüseyn (ə) də onu öz əziz canları bahasına, öz qanları ilə tarix səhnəsinə çıxaran, yayıb genişləndirən, möhkəmləndirən, bu yolda şəhidlik kimi ən uca mərtəbəyə yüksələn nadir şəxsiyyətlərdir. Başqa sözlə, bu kitabla Əhli-beytin üç misilsiz halqası haqqında olan Füzuli sözünə, Füzuli sənətinə səyahət bitmiş və "Allah aşiqi Füzuli" monoqrafiyası üçün yol açılmış olur. Ulu Yaradanın bitib-tükənməyən rəhmət, şəfqət, inayət, mərhəmət və rəğbətindən yeganə diləyimiz həmin kitabı da yazıb həqiqi Allah bəndələrinin mühakiməsinə təqdim etmək, ictimaiyyətin ixtiyarına verməkdir. Qoy bu şərəfli işdə bizə Rəsulullahın (s), Həzrət Əlinin (ə) və İmam Hüseynin (ə) ruhları duaçı olsun. Qoy Allah-taala bütün haqq-ədalət mübarizləri kimi, Kərbəla şəhidlərinin də pak qanlarını yerdə qoymayıb, əziz xatirələrini əbədi eləsin.





# I. KƏRBƏLA VAQEƏSİNƏ VƏ FÜZULİ SƏNƏTİNƏ AÇAR SÖZLƏR

İmam Hüseyn hərəkatı özünün məqsəd və vəzifələrinə görə, məzmun və mündəricəsi etibarilə ictimai-dini çəkisi baxımından o qədər geniş və tutumlu hadisədir ki, ayrıca arxetipə malik olmadan, xüsusi hazırlıq işi aparmadan onun mahiyyət və əhəmiyyətini sonadək qavramaq olmaz. Odur ki, ədibin ürək qanı ilə yazdığı Kərbəlalı sətirləri, ruhu ilə qidalandırdığı şəhid simalarını yalnız "Hədiqətü-s-süəda" boyu səpələnən aparıcı və həlledici söz və ifadələrə dair ilkin yığcam bilgi əldə etməklə oxuyub başa düşmək olar. *Zülm, məzlum, zülmət, müsibət, haqq-nahaq, ibadət, nəfs, insan kamalı, dini-mənqəbəvi anlayış, eşq* belə söz və ifadələrdəndir.

Bu söz və ifadələrə dair ilkin bilgi verilərkən onların lüğəvi mənaları göstərilmiş, terminoloji məzmun, mahiyyət və əhəmiyyəti qeyd edilmiş, Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı baxımından ala biləcəkləri ayrıca anlam çalarlarının diqqətdən qıraqda qalmamasına fikir verilmişdir. Ancaq bu zaman yersiz təfərrüatlardan qaçılmış, gərəksiz məzhəb və təriqət təlqin və təmrinlərinə toxunulmamış, ümumiyyətlə, tendensiyalı münasibətə yer verilməmişdir. Bununla belə, unutmaq olmaz ki, Füzuli bütün varlığı ilə Əhli-beyt aşiqi olmuş, dünyagörüşü və dünyaduyumu etibarilə sırf şiə



şairi kimi yazıb-yaratmışdır. Qətiyyən təsadüfi hal deyildir ki, XX əsrin 50-ci illərində Türkiyədə buraxılmış "İslam ensiklopedisi"ndə Əbdülbaqi Gölpinarlı, Fuad Köprülü kimi tanınmış mütəxəssislər Füzulinin şiəliyini ayrıca konsepsiya olaraq təsbit etmişlər. Şairin fəlsəfi traktatı olan "Mətlə'ül-etiqad"dakı müddəalar da bu yöndədir. Ən nəhayət, deyilməmiş qalmasın ki, burada toxunulmayan açar sözlər monoqrafiyanın müvafiq fəsillərində mütləq veriləcəkdir.

## ZÜLM

Bu anlayış bütövlükdə əsərin ideya-bədii istiqaməti ilə yaxından bağlıdır. Çünki Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının məğzini qeyri-legitim olan Yezid hakimiyyətinin törətdiyi tayı-bərabəri olmayan ictimai zülm təşkil edir. Odur ki, əsərin istər fikri axarını və bədii tutumunu qavramaq, istərsə də müəllifinin İmam Hüseyn hərəkatına dair görüşlərini üzə çıxarmaq üçün bu anlayış üzərində ayrıca dayanmaq, sözün lüğəvi və istilahi anlamları, Qurani-Kərimdəki və hədislərdəki işlənmə məqamları, habelə mənəvi-idraki qatları haqqında yığcam bilgi vermək qaçılmazdır. "Zülm" sözü "zaləmə" kökündən məsdər olub, qaim isimdir. Bu kökün əsl məsdəri "zalim" sözüdür. İbn Fariz (ölümü h.-q. 395/m. 1004) "Mucəmu'-l-məqayisi-l-lüğət" *("Ərəb dilinin müqayisəli toplusu")* kitabında "zaləmə"nin iki kök anlamının olduğunu bildirir. Onlardan biri "zülm", digəri "zülmət"dir[14]. "Zülmət" işığın və nurun ziddidir. "Zülm" isə "bir şeyi öz yerindən götürüb başqa yerə qoymaq" anlamındadır. Bununla yanaşı, bəzi lüğətlərdə "zülm" istilahının "cəbr, həddi aşmaq, nöqsan törətmək, doğru yoldan azmaq" kimi mənaları da göstərilir[15].

..................................

[14] *İbn Fariz. Mucəmu'-l-məqayisi-l-lüğət, III cild, Qahirə, 1368, səh. 468*

[15] *Qaragöz İ. Qurana görə zülm açısından Allah və insan, İstanbul, 1996, səh. 58*





Qədim ərəbcədə "zülm" sözü "qadağan etmək, əngəl olmaq" mənalarında da olmuşdur. "Əz-zaləmətu" ifadəsi vaxtilə "haqq sahiblərinin haqqına mane olan" anlamını da bildirmişdir.

Anlayış Qurani-Kərimdə olduqca geniş əksini tapmışdır. Belə ki, "zülm" sözünün özü və törəmələri 58 surədə və 266 ayədə 289 dəfə, "zülmət" sözü və törəmələri isə 15 surədə və 24 ayədə 26 dəfə işlədilmişdir[16].

Anlayışın Qurani-Kərimdəki işlənmə məqamları baxımından belə bir incəlik diqqəti çəkir ki, "zülm" "küfr"dən daha genişdir. Çünki hər kafir zalımdır, lakin hər zalım kafir deyildir. Odur ki, "zülm" sözü anlamca daha genişdir.

Rəşid Riza yazır: "Qurani-Kərimdə "küfr" bir yerdə də olsa danlaq, məzəmmət bildirmədən sırf öz lüğəvi mənasında işlədilmişdir. Bu, "Hədid" surəsinin 20-ci ayəsindəki "Kəməsəli ğaysin 'əcəbə-l-kuffarə nəbətuhu" *(eynən elə bir ağaca bənzər ki, bitirdiyi ot əkinçilərin xoşuna gələr)* cümləsində işlənən "əl-kuffar" sözüdür ki, burada bu söz "əkinçilər" anlamındadır. Halbuki "zülm" sözü Quranda əsla mədh yerində (müsbət mənada) işlədilməmişdir".

"Zülm" anlayışının Qurani-Kərimdəki başlıca işlənmə məqamlarını belə ümumiləşdirmək olar: Quran nazil edilməmişdən qabaq ərəb dilində "zülm" sözü insanlar, insan-əşya, insan-heyvan və əşyaların öz arasındakı mənfi münasibətin ifadəsi üçün işlədilmişdir. Ancaq insanın Allaha və nəfsinə qarşı zülmü bəhs mövzusuna çevrilməmişdir.

Quranda işlənən 289 "zülm" sözündən biri bağın zülm etməməsi, 43-ü Allahın zülm etməməsi, 2-si insanların Allaha zülm edə bilməməsi, biri bütləri sındırdığına görə müşriklərin İbrahim Peyğəmbərə söylədikləri "zalım" sözü, 11-i insanlara zərər vermə, 27-si möminlərin günah səciyyəli hər cür əməl və davranışları, 195-i kafirlərin şirk, nifaq, üsyan, küfr kimi hər cür batil inanc və günah olan hərəkətləri, 9-u kafir və mömininin İlahi iradə ilə ziddiyyət təşkil edən əməlləri ilə bağlıdır.

..................................

[16] *Yenə orada, səh. 121*



İnsan fəaliyyəti ilə bağlı olan Qurandakı 243 "zülm" istilahının 195-i – 80,5 faizi büsbütün kafirlərə aiddir. Kafir və möminlərin mənfi işlərini və insanlara zərər verməlırini bildirən "zülm"ləri də saydıqda, bu, 215 istilah, yəni 89,7 faiz edir. Odur ki, Quran "zülm" istilahı ilə şirk, küfr, nifaq, ayələri və peyğəmbərləri təkzib etmək kimi bütün növləri ilə küfrü və kafirləri bildirməkdədir"[17].

# Müsibət

Bu söz, əslində, dərin və geniş məna-məzmun şəbəkəsinə malikdir. "Müsibət" – "səvabə" kökündən "əsabə" feilinin ismi failidir. "Əsabə" "isabət etmək, dəymək, üzərinə bəla enmək", "savabə" isə "enmək, hədəfə dəymək, üzərinə düşmək" anlamına gəlir. "Müsibət" isə "fəlakət, ani olaraq gələn bəla, sıxıntı, xoşa gəlməyən şeylər, hədəfə dəyən mərmi kimi insana şiddətlə toxunan hadisə və fəlakətlərdir".

Mömini kədərləndirən hər şey müsibət sayılır. Yanan şam söndükdə Peyğəmbərimiz istirca etmiş, yəni "İnna li-l-lahi və inna ileyhi raciun" *("Biz Allahın bəndəsiyik və yenə Ona sarı qayıdacağıq") ("Bəqərə", 156)* söyləmişdir. Bundan sonra ondan "Məgər bu bir müsibətdirmi ki, istirca etdiniz?" – deyə soruşulmuş, o da "Bəli, mömini kədərləndirən və ona əziyyət verən hər şey müsibətdir" buyurmuşdur.

"Müsibət" sözü daha çox "şər"i bildirir. "Müsibət" dedikdə, ağla ilk gələn şey şərdir. Ancaq bir müsibətdə xeyir də, şər də ola bilər. Bəzən bizim üçün şər olan başqası üçün xeyir, xeyir olan da şər ola bilər. Bu vəziyyət şəxs, cəmiyyət, zaman və məkana görə dəyişir[18].

Bundan başqa, bizim xeyir zənn etdiyimiz şər, şər zənn etdiyimiz də xeyir ola bilər. Allah bu barədə belə

---

[17] *Yenə orada, səh. 275*

[18] *Qaragöz İ. Qurana görə müsibətlər açısından insan və toplum, II nəşr, səh. 18-19*





buyurmaqdadır: "(Allahın düşmənlərinə qarşı) döyüş (cihad) xoşunuza gəlmədiyi halda sizə vacib edildi. Bəzən xoşlamadığımız bir şey sizin üçün zərərli ola bilər. (Onu) Allah bilir, siz bilməzsiniz" *("Bəqərə", 216)*. Alim anlayışın müxtəlif tərəflərini işıqlandırır, məfhumu çeşidli qatlara ayırır. Məsələn, o, "Yer kürəsinə üz verən müsibətlər" kimi geniş bəhsi, "insanın başına gələn və canı ilə bağlı olan" müsibətləri təfsilatlı, təfərrüatlı bölümlər, mərhələlər üzrə araşdırır. Səd ibn Əbu Vəqqasdan (ölümü h.-q. 55/m. 674) gətirilən hədis səciyyəvidir: "Peyğəmbər bir gün Aliyə adlanan Mədinənin yüksək tərəflərindəki kəndlərdən gəldi. Müaviyə oğulları məscidinə gedib içəri girdi və orada iki rükət namaz qıldı. Biz də onunla birlikdə namaz qıldıq. Peyğəmbər Allaha bir xeyli dua etdi. Sonra bizə sarı çevrildi və belə buyurdu: "Mən Rəbbimdən üç şey istədim. Onların ikisini mənə verdi, ancaq birini mənə qadağan etdi.

Mən Rəbbimdən ümmətimi qıtlıqla həlak etməməsini istədim. Rəbbim bunu mənə ehsan buyurdu. Mən ondan ümmətimi suda boğmaqla həlak etməməsini istədim, Rəbbim mənə bunu da verdi. Mən Rəbbimdən ümmətimin arasında fikir ayrılığına düşərək müharibə baş verməməsini istədim, ancaq Rəbbim mənim bu istəyimi qəbul etmədi"[19]. Əsərdə insanın dininə gələn müsibətlər də araşdırılır və Rəsulullahın bu barədə bir neçə buyuruğu verilir: "Dinini itirməyi çıxandan sonra heç bir bəndə gözlərini itirməkdən daha ağır bir müsibətə düçar olmamışdır". Yaxud: "Bir dəm də Allaha şərik qərar verməkdən daha ağır bir müsibətə mübtəla olmamışdır. Allaha şərik qərar verməkdən sonra isə onun ən ağır müsibəti gözlərini itirməsidir".

İslam dininə görə, dünyəvi müsibətlərin ən ağırı iki gözün itirilməsidir. Lakin dinini, imanını itirən şəxs hər iki dünyada kor olar (Bax: *"Hud", 24; "Taha", 124; "Ğafir", 58; "İsra", 72),* cəhənnəmə gedər *("Nisa", 56; "Kəhf", 29)*.

.................................

[19] *Yenə orada, səh. 22*





Kitabda mükafat və cəza baxımından da müsibətlər öyrənilir. Belə ki, kafirlərin və asi möminlərin düçar olduqları müsibətlərlə yanaşı *("Şura", 30)*, müttəqilərin də üzləşdikləri çətinliklər səciyyələndirilir. Bəs müttəqi kimdir? Müttəqi iman gətirərək buyuruq və qadağaları gözləyən, Allaha qarşı çıxmaqdan çəkinib özünü İlahi əzabdan qoruyan şəxsdir. Onlar xəstəlik və müsibətlərə məruz qaldıqda Allaha həmd və şükür etdikləri üçün başlarına gəlmiş müsibətlər Tanrı qatındakı mənəvi dəyərlərinin yüksəlməsinə yol açır.

"Abdullah ibn Məsud (ölümü h.-q. 32/m. 652) belə nəql edir: "Bir dəfə Peyğəmbər torpaq, yaxud qum üstündə dəyənəklə bir kvadrat çəkdi. Sonra başlanğıcı kvadratın ortasında olan və onun xaricinə uzanan bir cızıq cızdı. Sonra həmin xəttin ortasından bu ortadakı xətti kəsən bir neçə kiçik xətt keçirdi. Sonra Peyğəmbər bu xətləri izah etdi: "Bu kvadratın ortasındakı uzun xətt insandır, bu kvadrat da əcəldir, hər tərəfdən insanı bürümüşdür, həmin kvadrat xaricində uzanan xətt isə insanın əməlidir, o kiçik xətlər isə insana üz verən afətlərdir. İndi insana bu afət oxu çaşaraq toxunmazsa, o biri afət oxu isabət edər, o da çaşarsa, nəhayət, əcəl deyilən təbii ölüm onu yaxalar".

Kitabda müsibətin gəlmə səbəbləri üzərində də dayanılır və qəti nəqli dəlillər əsasında göstərilir ki, "istər kafir, istərsə də mömin kim olur-olsun, malına, canına, övladına, maddi və mənəvi, sözlə, yaxud işlə, xoşa gəlməyən acı bir hadisə, bəla, fəlakət, müsibət çarparsa, o, ancaq Allahın izniylədir" *("Təğabun", 11; "Ali-İmran", 145, 166-167; "Mücadilə", 10)*[20].

İslam rəhbərinin aşağıdakı sözü məsələnin bu yönünə bir qədər də aydınlıq gətirir: "Möminin işi necə də qəribədir! Həqiqətən onun hər işi xeyirdir. Bu halı mömindən başqa heç bir şəxsdə görə bilməzsən. Onu sevindirən bir şey olarsa, şükür edər. Bu isə ondan ötrü bir xeyir olar. Ona zərər verən bir şey üz verərsə, səbir edər. Bu da onun üçün xeyrə çevrilər".

---

[20] *Yenə orada, səh. 27-28*



Rəsulullahın namazlardan sonra oxuduğu dua da bu baxımdan önəmlidir: “Allahım, Sənin verdiyinə mane olan yox, vermədiyini də verən yox! Sənin dərgahında varlı şəxsin var-dövləti faydasızdır. Yalnız Sənə itaət olan əməlin faydası var”[21].

Bu hədis “Yunus” və “Fatir” surələrinin 107-ci və 2-ci ayələrinin məzmununa uyğundur.

Əsərdə müsibətin gəlməsində insanın roluna da toxunulur, onun yanlış davranış və pis əməllərinin bəhs mövzusu olan məsələ baxımından təsiri gözdən keçirilir və göstərilir ki, Quranın bir çox ayələrində Allah-taala insanların başına gələn müsibətlərin onların öz əlləri ilə törətdikləri əməllərə görə ortaya çıxdığını bildirməkdədir (Bax: *“Zumer”, 48, 51; “Ənam”, 129; “Əraf”, 96; “Tövbə”, 95; “Casiyyə”, 14; “Ğafir”, 17; “Nisa”, 62; “Rum”, 36; “Qəsas”, 47; “Maidə”, 49)*[22].

Ancaq məsələnin bu tərəfi ilə bağlı başlıca mülahizələr mübarək “Şura” surəsinin 30-cu ayəsi çevrəsində cərəyan edir. Əbu Musanın (ölümü h.-q. 50/m.670) bildirdiyinə görə, Peyğəmbər həmin ilahi bəyanatı belə açıqlamışdır: “Hər hansı bir bəndəyə üz vermiş az və ya çox fəlakət yalnız onun günahına görədir. Allah isə günahların çoxunu bağışlayır”. O deyir ki, Rəsulullah bu sözləri buyurub, “Başınıza gələn müsibətlər öz əllərinizlə qazandığınız əməllər üzündəndir. Allah isə günahlarınızın çoxunu bağışlayır” ayəsini *(“Şura”, 30)* oxudu.

Həsən əl-Bəsri (ölümü h.-q. 110/m.728) bu ayə nazil olduqda Peyğəmbərin belə buyurduğunu bildirir: “Nəfsim yədi-qüdrətində olan Allaha and içirəm ki, insanın ayağının sürüşməsi, bir ağac parçasının ayağını yaralaması, damarını siyirməsi həmişə öz günahı üzündəndir. Allah isə günahlarınızın çoxunu bağışlayır”.

Əl-Bəğavinin (ölümü h.-q. 516/m.1122) rəvayətinə görə, Həzrət Əli belə buyurur: “Allahın Kitabındakı ən fəzilətli ayəni sizə xəbər verimmi? O ayəni Peyğəmbər mənə söylədi

[21] *Yenə orada, səh. 42*

[22] *Yenə orada, səh. 46*





və buyurdu ki, “başınıza gələn müsibətlər öz əllərinizlə qazandığınız əməllər üzündəndir. Allah isə günahlarınızın çoxunu bağışlayır” ayəsidir. Ya Əli, gəl həmin ayəni sənin üçün təfsir edim: “Sizə dünyada xəstəlik, cəza, bəla və bunun kimi digər şeylər – sizə çatan müsibətlər yalnız öz əməllərinizin qazandığı günahlar ucbatındandır. Allah dünyada cəzasını verdiyi günaha axirətdə ikinci dəfə cəza verməz, O, çox Kərimdir; dünyada əfv etdiyi bir günaha axirətdə cəza verməz, O, çox Həlimdir”.

Həsən Bəsri danışır: “Səhabələrdən biri cahiliyyət dövründə yenicə tanış olduğu qadınla qarşılaşdı. O, onunla bir müddət danışdı, sonra ayrıldılar. Ancaq səhabə qadına baxa-baxa gedirdi. Elə bu zaman əli bir yerə dəydi və yaralandı. O, birbaşa Peyğəmbərin yanına gəlib əhvalatı ona danışdı. Peyğəmbər “Allah bir bəndəsi üçün xeyir dilədikdə onun günahının cəzasını tez-tələsik dünyada verər” buyurdu”.

Alim əsərinə belə yekun vurur:

1. İnsanlara əzab və sıxıntı verən hər şey müsibətdir.
2. Bütün müsibətlər ancaq Allahın təqdiri və izni ilə meydana gəlir.
3. Allah müsibətləri bəndələrin etdiyi günah və xətaların səbəbilə, yaxud onların mənəvi dəyərlərini artırmaq və ya suçlarından keçmək, yaxud da bəndənin öz əməli ilə çata bilməyəcəyi bir mərtəbəyə onu çatdırmaq üçün verir.
4. Müsibətlər insanlar üçün bir sınaqdır.
5. Müsibətlərdə insanların bilə bilməyəcəyi hikmətlər vardır.
6. İnsanlar müsibətlərə səbir, nemətlərə şükür etməlidirlər.
7. Müsibətlər insanların günahlarına kəffarə olur və onların mənəvi dərəcələrinin artmasına yol açır.
8. İnsan öz əməli ilə çata bilməyəcəyi bir məqama, müsibətə səbir etməklə çatır.
9. Hər kəs dua etməklə, sədəqə verməklə müsibətdən qorunmağa çalışmalıdır.
10. Bəşər övladı müsibətdən qurtulmaq üçün maddi-mənəvi hər cür çıxış yolu, çarə axtarmalıdır.



## “İbadət” və “kamillik” anlayışlarının əlaqəsi

“İbadət” və “kamillik” anlayışlarının əlaqəsi

İbn Farisin (ölümü h.-q. 395/m. 1004) *“Mucəmi-miqayisə-l-lüğəti” (“Dilin müqayisəli toplusu”)* kitabına əsasən, “ibadət” sözü başlanğıcını iki zidd semantik yuvadan götürüb, bir yandan təvazökarlıq, bir yandan da “şiddət” anlamına gəlir. Bu ikilik sözün bütün inkişaf mərhələlərində, o sıradan da Qurani-Kərimdə özünü göstərir; belə ki, birinci babın məsdərləri olan “ibadət”, “ubudət” və “ubudiyyət” “sitayiş etmək, təvazökar olmaq, Allahcıl olmaq” kimi müsbət anlamlarla yanaşı, “həbs etmək, qadağa qoymaq, uzaqlaşdırmaq” kimi mənfi anlamları da bildirir.

Bu mənzərə Qurani-Kərimdə də belədir. Belə ki, Müqəddəs Kitabımızda “ibadət” sözü 256 dəfə işlənmişdir ki, bunun yalnız 182-si müsbət məzmunda olub, Allah *(“Nisa”, 36; “Həcc”, 77; “Zariyat”, 36)* və peyğəmbərlər *(“Vəhl”, 36; “İsra”, 3; “Məryəm”, 2; “Sad”, 41)* kimi tamamilə müqəddəs anlayışları bildirir, yerdə qalan 74 hal isə *şeytan, tağut, tamah* kimi mənfi məfhumlarla bağlıdır *(“Zumər”, 17; “Yasin”, 60).*

“İbadət” və “kamillik” anlayışları Qurani-Kərimdə ayrıca bir mövzu, məzmun və məfkurə mənzərəsi əmələ gətirməkdədir. Aşağıdakı qeydlər bu mənzərənin genişliyi və əlvanlığı ilə bağlı aydın anlayış yarada bilər:

a) Allah mükəlləf məxluqları yalnız özünə ibadət etsinlər deyə yaratmışdır *(“Zariyat”, 56);*

b) Peyğəmbərlər Allaha ibadət etməyə çağırmaq üçün göndərilmişlər *(“Nəhl”, 36);*

c) Allaha ibadət dəvəti hər cür irqi, milli, ictimai məhdudluqdan uzaq olub, büsbütün ümumbəşəri səciyyə daşıyır *(“Bəqərə”, 21);*

d) Bu dəvətdən məqsəd təqvalığı (pəhrizkarlığı, Allahdan çəkinib pis əməllərdən uzaqlaşmağı, Allahı lazımınca dərk edib, Ona layiq olan şəkildə yaşamağı) aşılamaqdır *(“Bəqərə”, 283);*





e) İbadət halı bütünlükdə səmimiyyət üzərində qurulmalıdır *(“Zumər”, 2);*
ə) Bu hal yalnız Allahın razılığını əldə etməyə yönəldilməlidir *(“Nisa”, 36);*
f) İbadət çağırışı möminlərə xitabən də gəldiyindən *(“Həcc”, 77)* dünyəvi və üxrəvi səadətə təkan verəcək kamillik zirvəsi kimi qavranılmaldır;
g) Son olaraq, “ibadət” anlayışı daimi diqqət mərkəzində saxlanılmalıdır, ona görə ki, Ulu Yaradan Şanlı Kitabında Nuh *(“İsra”, 3),* Əyyub *(“Sad”, 44)* və Zəkəriyya *(“Məryəm”, 2)* kimi peyğəmbərləri, deməli, həm də ən kamil şəxsiyyətləri Özünün ən istəkli bəndələri olaraq anmış, ibadəti onların ən ali məziyyəti tək göstərmişdir.

“Kəmalə” kökündən gələn sözlərin başlıca məna-məzmun tutumu belədir: “Tam olmaq, hər şeyi yerli-yerində olmaq”, “bir işi tam və kamil surətdə yerinə yetirmək, tamamlamaq, bitirmək” (*“Maidə”, 3), “*bir şeyin yetkinləşib kamillik həddinə çatması”; “əlavə, tamamlayıcı”, “tam, mütləq, kamil”, “tərkib hissələri tam və kamil olan şey”, “xeyir və şər baxımından kamil şəxs”, “bütün”.

Qurani-Kərimə görə, hər kəs duyğu və düşüncələrindən tutmuş söz və davranışlarınadək ömrünün hər bir anını ilahi sınaq bilməli *(“Hud”, 7; “Kəhf”, 7; “Mülk”, 2)* və *(“Ənam”, 165; “Yunis”, 13-14; “Hədid”, 7)* bir an belə unutmamalıdır. Müxtəlif dövrlərdə müxtəlif vəziyyət və şəraitlərdə söylənilmiş aşağıdakı mülahizələri də məhz bu çərçivədə dəyərləndirmək gərəkdir:

1. “İnsan nəfsində Allahın və aləmin formaları birləşir. İlahi Mahiyyət Özünün bütün Adları və Sifətləri ilə yalnız insanda Öz əksini tapır... Biz Allahı təsəvvür etmək imkanı yaradan sifətlərik. Bizim varlığımız Onun varlığının təsdiqi deməkdir. Bizim varlığımız üçün Allah vacibdirsə, Onun mövcudluğu üçün də bizim varlığımız gərəkdir”[23].

................................

[23] *İbn Ərəbi. İslam ensiklopedisi, cüz 51, İstanbul, 1951, səh.1003*





2. "Kamil insan İlahi Sifətlərin aynası, Haqqın kamil sifətidir. İlahi təcəlli ilk növbədə kamil insanda Öz təzahürünü tapır. Kamil insan "mən"ini yox etmiş, içində Allahın yaşadığı, Allahın sözləri ilə danışan, Allahın lazım bildiyi əməli icra edən bir Tanrı rəhmətidir. Kamil insan kəlamı Allah kəlamıdır ki, biz eşidirik"[24].
3. Təsəvvüfi təsəvvürlərə görə, "Arifin işıqlı ürəyi" – İlahi Nurun, Həqiqət Camalının və Əzəli Məşuqun (Allahın (c.c)) təcəlla yeri, bütün açılmaz sirlərin əks olunduğu güzgü, cismani və mənəvi aləm arasında vasitə, ən nəhayət, qeybin inikasıdır. Belə işıqlı ürəyə həqiqət axtarışına çıxan seyri-süluk əhli malik olur. Onlar bu yolla (ruhlarını cilalayaraq) qəlblərini kamillik dərəcəsinə çatdırırlar ki, bunun sayəsində də İlahi Nur onlarda təcəlli etmiş olur. Ən nəhayət, bu İlahi Təcəlla yeri Eşq Cövhərinin və (İlahi) Camalın sandıqçasına çevrilir.

Nəcməddin Razi *"Mirsadi-e-Ubbad"* kitabında yazır: "İnsan bədənində ürəyin yeri Ərşin kainatdakı yeri kimidir. Belə ki, Ərş Rəhmani Sifətin istivasının təzahürü və aləmi-kübra (böyük aləmdirsə), yəni makromühitdirsə, ürək də aləmi-suğrada (kiçik aləmdə), yəni mikromühitdə ruhani zühur mənbəyidir. Ərşin könüldən bir fərqi də bundadır ki, onun Rəhmani Sifətinin istivasının zühuruna şüuru yoxdur və o, tərəqqi qabiliyyətindən məhrumdur. Ürəyin isə şüuru vardır və o, inkişafetmə səciyyəsinə malikdir"[25].

Yeri gəlmişkən deyək ki, "könül" və "şüur" məfhumlarının bu ənənəvi izahla qırılmaz tellərlə bağlı olması Qurani-Kərimdən irəli gəlir. Belə ki, *qəlb, fuad, sədr* kimi kəlmələrlə Müqəddəs Kitabımızda geniş və əlvan təmrin və riyazət şəbəkəsi anlayışı bir ayədə də "əql" məfhumu ilə üzvi qovuşuqluqda təqdim olunur: "Məgər onlar (peyğəmbərləri yalançı hesab edən kafirlər) yer üzündə gəzib dolaşmırlarmı

[24] *Pürnamdar T. Dastan-e Peyəmbəran, Tehran, h.-ş. 1369, səh. 294*

[25] *Səduq Hüseyn Məhəmmədzadə. Şərhe-qəzəlhaye-Saib Təbrizi, Tehran, I cild, 1370, səh. 9-10*





ki, düşünən qəlbləri (bəsirət gözləri), eşidən qulaqları olsun? Həqiqətən, gözlər kor olmaz, lakin sinələrdəki ürəklər (qəlb gözü) kor olar. (Kafirlər keçmiş ümmətlərin başına gələn müsibətləri zahiri gözləri ilə görsələr də, qəlb gözü ilə görüb onlardan heç bir ibrət almazlar)" (*"Həcc", 46).*

# Səbir

Səmavi və müqəddəs kitabların sonuncusu olan əzəmətli və şərafətli Quranın İslam dininin məfkurəvi və əməli keyfiyyətlərini özündə birləşdirməsi "səbir" anlayışının Müqəddəs Kitabımızda son dərəcə geniş və rəngarəng şəkildə işlənməsini tələb edir. Bu, tamamilə təbiidir. Çünki İslamiyyət həyat dinidir. Qurani-Kərim ovaxtaqədərki ərəb dilinin bütün danışıq ləhcələrini sabit bir qrammatik normaya salmışdır. Həyatın bir çox sahələri ilə birbaşa bağlı olduğundan "səbir" anlayışı da odövrkü ərəb dilində çox işlək olmuşdur. Bunu sözün bugünə gəlib çatmış lüğəvi təzahürləri də sübuta yetirir. Belə ki, aşağıda verəcəyimiz misallardan bu təzahürlər bütün aydınlığı və genişliyi ilə anlaşılacaqdır.

*Sabəra, sabran* – bir şəxsi bir şeydən uzaqlaşdırmaq.

*Sabəra, sabran sabəratan bihi* – vəkil olmaq, vəkil vermək.

*Əsbəra* – yeməyin acılaşması.

*Sabbəra* – səbrə dəvət etmək, səbirdə üstün gəlmək; özünü səbir etməyə məcbur etmək; hər hansı bir işdə məsafənin üzə çıxması; toplanmaq[26].

Göründüyü kimi, "səbir" sözü həyatın bütün sahələri ilə üzvi qovuşuqluq içərisindədir. Belə ki, sözün "bir şeydən uzaqlaşdırmaq" anlamı bir dərəcədə anlayışın mənfi planda işlədilməsinə dəlalət edirsə, "vəkil olmaq" mənası onun ictimai amil kimi cəmiyyət içərisindəki müsbət mövqeyindən soraq verir.

[26] *Mövlud Sarı. Əl-Məvalid, ərəbcə-türkcə lüğət, İstanbul, 1982, səh. 854*





Yaxud "yeməyin acılaşması" anlamı sözün məişətdə əlaqəsini göstərirsə, "səbrə dəvət etmək" mənası yüksək əxlaqi keyfiyyətlər aşıladığından dərin etik məzmun bildirir.

Və ya "səbirdə üstün gəlmək" anlamı dözüm və dəyanətin ictimai-əxlaqi müstəvidəki zərurətini bildirirsə, "özünü səbrə məcbur etmək" mənaca fərdin öz nəfsani istəkləri üzərində ardıcıl əxlaqi təmrinlər aparması kimi xüsusi mənəviyyat məsələsi ilə də bağlı olduğunu göstərir.

"Səbir" sözünün lüğəvi anlamlarının genişliyini göstərən bir cəhət də çox halda leksemin Qurani-Kərimdə müxtəlif ismi və feili formalarda əksini tapmasıdır. Belə ki, söz Kitabımızda daha çox aşağıdakı şəkillərdə işlənir: "sabəra" *("Əhqaf", 35),* "sabərtum" *("Rəd", 24; "Nəhl", 126),* "sabərnə" *("İbrahim", 21; "Furqan", 42),* "sabəru" *("Ənam", 34; "Əraf", 137; "Hud", 11),* "təsbiru" *("Kəhf", 68),* "ətəsbirunə" *("Furqan", 20),* "nəsbiru" *("Bəqərə", 61),* "lənəsbirannə" *("İbrahim", 12)* və s.

Bu misallardan başqa Quranda daha 16 şəkli var. Bu isə o deməkdir ki, "səbir" sözü ilə Müqəddəs Kitabımız həm mürəkkəb insan münasibətlərini əhatə edir, həm dərin mənəvi-psixoloji mətləblərə toxunur. Gətirilən örnəklərin zahiri mənaları belə bunu aydın göstərir. Bu örnəklərin birincisi üçüncü şəxsin təkində (sabəra), ikincisi ikinci şəxsin cəmində (sabərtum), üçüncüsü birinci şəxsin cəmində (sabərnə), dördüncüsü üçüncü şəxsin cəmindədir (sabəru). "Ətəsbirunə" ("Dözə biləcəksinizmi?") və "lənəsbirannə" ("Əlbəttə, mütləq dözəcəyik!") şəkilləri şəxs əvəzlikləri ilə məhdudlaşmayıb, yüksək iradi keyfiyyətlərin ifadəsinə və təlqininə xidmət edir. Peyğəmbərlərin özlərini inkar edənlərə verdikləri cavabı əks etdirən aşağıdakı ayə buna parlaq örnəkdir: "Allah sizə yollarımızı göstərdiyi halda biz nə üçün ona təvəkkül etməməliyik? Bizə verdiyiniz bütün əziyyətlərə, əlbəttə, dözəcəyik. Təvəkkül edənlər də yalnız Allaha təvəkkül etsinlər!" *("İbrahim", 12).*

"Səbir" sözünün lüğəvi miqyas genişliyini göstərən başqa bir cəhət də budur ki, leksem Quranda təsəvvürəgəlməyəcək



qədər rəngarəng və əlvan semantikaya – məna və üslub çalarlarına malikdir. Ötəri deyildir ki, bu cəhət lüğətlərdə də hərtərəfli surətdə təsbit edilmişdir. Məsələn, "sabran, sabəratan bihi" variantı Allahın Peyğəmbərə xitabını və Həzrət Muhəmmədin (s) batini şühud məqamına aid olan "Kəhf" surəsinin 28-ci ayəsində bu cür əksini tapır: "Səhər-axşam Rəbbinizin rizasını diləyərək, Ona ibadət edənlərlə birlikdə özünü səbirli apar!"

Bu deyilənlər bütün aydınlığı və genişliyi ilə göstərir ki, "səbir" sözü lüğəvi anlam baxımından istər tarixi cəhətdən, istər məfkurəvi zənginlik etibarilə, istərsə də bağlı olduğu ad və motivlərin, anlayış və mətləblərin daşıyıcısı kimi həm Quranaqədərki ərəb dilində, həm Müqəddəs Kitabımızın özündə, həm də ərəbcənin sonrakı inkişaf mərhələlərində çox fəal olmuş, yüksək işlənmə tezliyi nümayiş edtirmiş və morfologiyaya (söz yaradıcılığına) böyük təsir göstərmişdir.

Quran ayələri və Həzrət Muhəmmədin (s) hədisləri ilə yanaşı, Həzrət Əlinin (ə) də səbir haqqında olduqca dərin məzmunlu sözləri bizə gəlib çatmışdır; məs.: "Səbir iki cürdür: biri bəyənmədiyin şeyə səbir etmək, digəri isə sevdiyin şeyə səbir etmək"[27], "Həya və səbir kimi iman yoxdur"[28], "Səbir qəm-qüssə miqdarında verilir. Müsibət zamanı əlini dizinə vuran şəxsin savabı puç olar"[29], "Möminin sevinci üzündə, kədəri isə qəlbindədir. Sinəsi hər şeydən genişdir, nəfsi hər şeydən xardır (təvazökarlığı çoxdur); itaətsizlikdən zəhləsi gedir, riza və gözəgirənliyə nifrət edir. Kədəri uzun, səy və təlaşı yüksəkdir. Dinməzliyi çox, vaxtı (itaət və bəndəliyə) məşğul, ağlına şükür edən və (bəla və çətinliklərdə) çox səbirlidir"[30].

İmam Əli (ə) Siffeyn döyüşündən qayıtdıqdan sonra Hazirin adlı yaşayış məntəqəsində oğlu İmam Həsənə (ə) bir

[27] *"Nəhcül-bəlağə", Hikmətli kəlamlar, 52*

[28] *Yenə orada, 109*

[29] *Yenə orada, 136*

[30] *Yenə orada, 325*





vəsiyyət yazır. Bu vəsiyyətin də özülündə "səbir" anlayışı durur: "Özünü xoşagəlməz işlərə səbir etməyə adət etdir. Haqq yolda səbirli olmaq necə də gözəl xasiyyətdir"[31].

"Nəhcül-bəlağə"də daha sonra oxuyuruq: "Bəla və çətinliyə səbirli olun, əl və qılınclarınızı dillərinizin istəklərində işə salmayın"[32], "Səbirli və təmkinli olun. Çünki səbrin imana nisbəti başın bədənə nisbəti kimidir. Başsız bədəndə, eləcə də səbirsiz imanda xeyir yoxdur"[33], "Səbirliliyin nicat vermədiyi kəsi dözümsüzlük məhv edər"[34], "Səbirli şəxsin səbrliliyindən ilk xeyir və əvəz budur ki, xalq nadan və səbirsiz onun yardımçısı olur"[35], "Səbir (eyibləri) örtən pərdədir. Ağıl (pis işlərə əmr edən nəfsi) kəsən qılıncdır. Belə isə xasiyyətinin eyiblərini səbirliliklə ört və nəfsini və şəhvətini ağılla öldür"[36].

**Yunus Peyğəmbər və səbir**

"Səbir" anlayışının peyğəmbərlik tarixi ilə bağlılığı baxımından Yunus Peyğəmbərin qissəsi xeyli maraq doğurur. Ümumiyyətlə, Yunus Peyğəmbərin qissəsini başqa peyğəmbərlərin qissəsindən əsaslı surətdə fərqləndirən cəhət odur ki, burada peyğəmbər nisbətən səbirsiz, ümməti isə əksinə, daha dözümlü görünür. Əlbəttə, bu, bir tərəfdən müstəsna haldır, digər tərəfdən də buna peyğəmbərin tarixində rəngarəngliyin əlaməti tək baxmaq lazımdır. Çünki həyat son dərəcə mürəkkəb olduğuna görə hadisələrin həmişə bir istiqamətdə – yəni həmişə peyğəmbərlərin haqlı çıxması ilə inkişaf edəcəyini gözləmək həyatilikdən uzaq olardı.

Yunus Peyğəmbərin "səbir" anlayışı ilə bağlılığı bütövlükdə qissənin (hekayənin) ümumi məzmunundan anlaşılır. Yunus Peyğəmbərin sərgüzəşti Quranda yalnız "Saffət" surəsində

---

[31] *"Nəhcül-bəlağə", Məktub, 31*

[32] *"Nəhcül-bəlağə", Xütbə, 232*

[33] *"Nəhcül-bəlağə", Hikmətli kəlamlar, 79*

[34] *Yenə orada, 180*

[35] *Yenə orada, 197*

[36] *Yenə orada, 416*





təfsilatı ilə verilmişdir. Həmin hekayədən bizə məlum olur ki, bir zaman Yunus Peyğəmbər əhalinin azğınlığı üzündən adam və yüklə dolu gəmiyə qaçmışdır. Yunus gəmiyə mindikdən sonra gəmi tərpənməmiş, sərnişinlər "Yəqin ki, içərinizdə ağasından qaçan kölə vardır" demişdilər. Kölənin kim olduğunu bilmək üçün püşk atmış və o, Yunus Peyğəmbərə düşmüşdü. Yunus özünü dənizə atmağa məcbur olmuşdu. Yunus Peyğəmbər Allahın izni olmadan əhalisini tərk edib getdiyinə görə özünü qınayaraq dənizə atarkən balıq (balina) onu udmuşdu. Nəhayət, xəstə olduğu halda Allah-taala onu boş bir yerə sahilə atmışdı. Son olaraq Yunus Peyğəmbərə yüz mindən artıq əhali iman gətirmişdi. Odur ki, Allah onlara bu xeyirxah əməllərinin müqabilində gün-güzəran vermişdi *("Saffət", 139-148)*.

Bu təfərrüatdan aydın görünür ki, Yunus Peyğəmbər əhalisinin şıltaqlığına lazımınca dözməmiş, Əyyub və Yaqub peyğəmbərlərdən fərqli olaraq, səbirsizlik etmişdir ki, bu da Allahın dərgahında xoş qarşılanmamışdır. Doğrudur, həm burada, həm də Yunus Peyğəmbərin hekayəsində toxunulan başqa ayələrdə onun səbirsizliyi tam açıq surətdə bildirilməmişdir. Lakin o bu mənaya gəlmir ki, əhvalatın içərisində Yunus Peyğəmbərin səbirsizliyi motivi yoxdur. Bunu açıq bildirməməsini yalnız Yunusun peyğəmbərliyinə Allahın hörməti kimi başa düşmək gərəkdir. Bu, "Ənbiya" surəsinin 87-ci ayəsində qabarıq şəkildə duyulmaqdadır: "Zün-Nunu (balıq sahibi Yunusu) da xatırla. Bir zaman o, (küfr etməkdə həddi aşan ümmətə qarşı) qəzəblənərək çıxıb getmiş və onu möhnətə düçar etməyəcəyimizi güman etmişdi. Amma sonra qaranlıqlar içərisində (balığın içərisində) "(Pərvərdigara), Səndən başqa heç bir Tanrı yoxdur. Sən pak və müqəddəssən. Mən isə həqiqətən zalimlərdən olmuşam" deyə dua etmişdi" *("Ənbiya", 87)*.

Göründüyü kimi, ayədəki "onu möhnətə düçar etməməyimizi güman etmişdi" ifadəsi Yunus Peyğəmbərlə bağlı ən azı səbirsizlik məzmununu ifadə edir.





Beləliklə, aydın olur ki, Qurani-Kərimdə "peyğəmbərlik" və "səbir" anlayışlarının bağlılığı heç də həmişə yüksək olmayıb, düz xətt üzrə inkişaf etməmiş həyatın tələblərinə cavab verən mürəkkəb bir quruluşda da təqdim edilmişdir.

**Həzrət Muhəmməd (s) və səbir**

"Peyğəmbərlik" və "səbir" anlayışlarının keçdiyi böyük tarixi yol İslam Peyğəmbərinin bütün bəşəriyyətə örnək təşkil edə biləcək, son dərəcə böyük mənaya malik həyat və mübarizəsində öz zirvəsinə çatmışdı. Bu zirvə "səbir" məfhumuna verdiyi istər mövzu, istər məzmun, istərsə də məfkurə genişliyi, yenilik baxımından elə bir ucalıqdadır ki, o ucalığı yalnız Ulu Yaradan əzəli-əbədi təqdiri ilə qərarlaşdıra bilər. Allah Qurani-Kərimdə bir neçə yerdə Həzrət Peyğəmbərə (s) səbirli olmağı tövsiyə edir. Məsələn, "Hud" surəsinin 115-ci ayəsində oxuyuruq: "Səbir et. Allah yaxşı işlər görənlərin mükafatını zay etməz".

Ayədən bəlli olan ilk cəhət səbir etməyin yaxşılara xas bir keyfiyyət olmasıdır. O, hər şeydən əvvəl onu göstərir ki, Peyğəmbərin cövhərini İlahi Mənşədən qaynaqlanan xalis bir yaxşılıq təşkil edir. Bu cəhəti peyğəmbərlik və risalət istiqamətində dəyərləndirdikdə, belə bir ali keyfiyyətə nail olduqda Həzrət Peyğəmbərin (s) səbirli olmasının mühüm bir amil olduğu aydınlaşır. Allahın yaxşı iş görənlərin mükafatını zay etməyəcəyinə dair hökmü isə bütün yaxşılıqların mayasında və mahiyyətində səbrin dayandığını sübuta yetirir.

Başqa bir ayədə də Allah Peyğəmbərə səbirli olmağı tövsiyə edir: "Səbir et. Sənin səbir etməyin Allahın köməyilədir. Onlardan (müşriklərdən) ötrü kədərlənmə və qurduqları hiylələrə görə ürəyini qısma" *("Nəhl", 127).*

Göründüyü kimi, əvvəlki ayədən fərqli olaraq, burada səbirli olmaq tövsiyəsinin ilahi mahiyyəti önə çəkilir. "İnna Billa" ifadəsi burada "biiznillah" məzmununu ifadə edir. Lakin ayənin əhatə dairəsi daha genişdir. Ona görə ki, ayəyə görə, səbir etməli olan Həzrət Peyğəmbər (s) bir tərəfdən Məkkə



müşriklərinin, yaxud Mədinə münafiqlərinin (ikiüzlülərin) və ya xarici bədxahların olduqları cürbəcür hiylələr qarşısında etdikləri insanlıqdan son dərəcə kənar olan çirkin əməllər müqabilində, həmçinin atdıqları müxtəlif böhtanlar önündə dözüm gətirməli, digər tərəfdən də yenicə formalaşmaqda olan azsaylı müsəlman tərəfdarlarını parlaq bir örnək təşkil etməklə onları idarə etməli idi. Heç şübhəsiz, bütün bunlar mənşəyi Allahdan olan bir ilahi yardımdan kənarda ola bilməzdi.

Allahın Peyğəmbərə səbirli olmağı tövsiyə etdiyi ayələr içərisində "Hud" surəsinin 49-cu ayəsi özünəməxsusluğu ilə fərqlənir: "Bunlar sənə vəhy etdiyimiz qeyb xəbərlərindəndir. Bundan qabaq onları nə sən, nə də ümmətin bilirdi. Səbir et. Həqiqətən, aqibət Allahdan qorxub pis əməllərdən qaçanlarındır".

Bu ayədə Həzrət Peyğəmbərə (s) edilən səbirli olma tövsiyəsi əvvəlki iki ayədən əsaslı surətdə fərqlənir. Belə ki, burada Həzrət Peyğəmbərin (s) dözüm və dəyanəti Allahın ona vəhy etdiyi keçmiş xalqların azğınlığı müqabilində özündən əvvəlki peyğəmbərlərin göstərdikləri mərdanəliyin davamı kimi anlaşılır.

1. Lakin ayənin mahiyyətini təşkil edən başlıca xüsusiyyət Həzrət Peyğəmbərin səbirlilik keyfiyyətinin burada vəhy, təqva (pəhrizkarlıq), qeyb, axirət kimi ən müxtəlif motivlərlə bağlı olmasıdır. Əgər tarixilik motivini bura əlavə etsək, ayənin ümumi məzmununun nə dərəcədə geniş olduğu aydınlaşır. "Bunlar (bu əhvalatlar) sənə vəhy etdiyimiz (vəhylə bildirdiyimiz) qeyb xəbərlərindəndir" cümləsi surənin 25-ci ayəsindən burayadək anladılan Nuh Peyğəmbərin hekayəsinə yekun kimi səslənirsə, "Bundan qabaq onları nə sən, nə də ümmətin bilirdi" cümləsi vəhy baxımından tarixi bilgilərin real həyatla üzvi qovuşuqda qazandığı ali iradi rəhbərlik məqamından soraq verir. Ən nəhayət, "(Ya Peyğəmbərim! Müşriklərin və kafirlərin əzab-əziyyətinə) səbir et. Həqiqətən, (gözəl) aqibət müttəqilərindir!" cümləsinin ayənin sonunda gəlməsi bütün bunların səbir körfəzindən keçərək təqva



sahilinə yan alan ağır bir həyat gəmisinin VII yüzillikdə bəşəriyyətin taleyini Qiyamətədək həll edə bilmək üçün qoyduğu dönməz qayda-qanunları məhz Həzrət Peyğəmbər (s) kimi bir simanın timsalında formalaşan və İlahi Mənşədən nəşət edən əzəmətli bir dəyanətlə ola biləcəyini göstərir.

Nəzərdən keçirilən bu ayələrdən anlaşılır ki, Həzrət Peyğəmbərin (s) səbirlilik keyfiyyəti Qurani-Kərimdən, sözün həqiqi mənasında, qırmızı bir xətt kimi keçərək aparıcı yer tutmaqdadır.

Elm, peyğəmbərlik, imamlıq

## Elm, peyğəmbərlik, imamlıq

Ərəb dilində "bir şeyə işarət etmək", "nişan qoyma" anlamlarına gələn "aləmə" kökü olduqca işlək olub, həyatın ən müxtəlif sahələri ilə bağlı söz və ifadələri bildirir. Bu kökdən başlanğıc götürən onlarca dil vahidi aşağıdakı mənaları verir:

1. Bir şeyin həqiqətini qavramaq;
2. Məlumatlılıq baxımından yarışmaq;
3. Mədəniyyətli olmaq;
4. Hər hansı bir şeyi möhkəmlətmək;
5. Zəkalı və zirək şəxs;
6. Yol tapmağa vasitə olan iz;
7. Yəqinlik;
8. Cəhalətin ziddi;
9. Mərifət;
10. Nə üçün?
11. Zireh.

Heç şübhəsiz, lüğəvi çevrəsi belə geniş olan "elm" sözü islami bir istilah kimi qat-qat çox və rəngarəng məna-məzmun şəbəkəsi əmələ gətirməyə bilməzdi. Yalnız bunu deyək ki, "elm" sözü və ondan törənən isim və sifətlər Qurani-Kərimdə 750 və ya 769 dəfə işlənmişdir. "Hikmət", "kitab"





kimi sözlərdən “anlama, fərqinə varma, ağlını işlətmə” kimi istilahlardan törənən yüzlərcə isim, sifət və feil buraya daxil deyildir. Bu söz və istilahların əks mənalarını da göz önünə gətirdikdə Qurani-Kərimin elmə verdiyi önəmi yalnız heyrətlə qarşılamaq olar.

Bəllidir ki, ilahiyyatçılar Qurani-Kərimin özündə bu Müqəddəs Kitaba ad sayıla biləcək çoxsaylı söz və deyimlər müəyyənləşdirmişlər. Bunların içərisində birbaşa elmlə bağlananları da az deyildir.

Məsələn:

1. “Ümmü-l-kitab” *(“Ali-İmran”, 7)*
2. “Bürhan” *(“Nisa”, 174)*
3. “Bəyan” *(“Ali-İmran”, 138)*
4. “Bəyyinə” *(“Ənam”, 157)*
5. “Tibyan” *(“Nəhl”, 89)*
6. “Təfsil” *(“Yusif, 111)*
7. “Quran” *(“Bəqərə”, 185)*
8. “Kitab” (*“Bəqərə”, 2)*
9. “Əl-kitəbül-hakim” *(“Yunis”, 1; “Loğman”, 2)*

Bu adlar sırasında “Hukum” (hikmət) və “Elm” adları xüsusi çəkiyə malikdir. Hər iki ad bir ayədə əksini tapmışdır: “(Ya Məhəmməd!) beləliklə, Quranı ərəbcə bir hökm olaraq (insanlar arasında onunla hökm etmək üçün) nazil etdik. Əgər sənə (vəhylə) gələn elmdən (Qurandan) sonra kafirlərin nəfslərinin istəklərinə (puç arzularına) uysan, səni Allahın əzabından qoruyan və qurtaran olmaz!” *(“Rəd”, 37)*.

Ən nəhayət qeyd olunmalıdır ki, “elm” anlayışı Qurani-Kərimdə bu, yaxud başqa ölçüdə Rəsulullaha da bağlanmaqla, onun əlçatmaz-ünyetməz məziyyətlərinin də ilahi və insani qaynağı yerində göstərilməkdədir. Belə ki, Allah mələklərin bilmədiklərini *(“Bəqərə”, 32)* bəşər övladının bilə biləcəyini buyurub *(“Bəqərə”, 33)*. İnsana nitq *(“Rəhman”, 4)* və qələm *(“Ələq”, 4)* nemətlərini vermişsə, bunu ilk növbədə axırzaman Peyğəmbərinin Öz qatındakı ayrıcalığına görə etmişdir; belə olmasaydı, Nuh Nəbinin qissəsinin sonunda “bunlar



(bu əhvalatlar) sənə vəhy etdiyimiz qeyb xəbərlərindəndir. Bundan qabaq onları nə sən, nə də ümmətin bilirdi...” *(“Hud”, 49)* buyurmasına baxmayaraq, dəfələrlə Həzrət Muhəmmədi (s) bəşəriyyətin ən böyük müəllimi, ilahi təlimatçısı kimi səciyyələndirməzdi *(“Bəqərə”, 129, 151; “Ali-İmran”, 164; “Cümə”, 2* və s.).

Və ya Ulu Yaradan öz Peyğəmbərinə duanın sirlərini açarkən elm sahəsini də önə çəkməzdi: “...(Ey Peyğəmbərim!) Cəbrayıl tərəfindən sənə tamam-kamal vəhy olunmadan əvvəl Quranı oxumağa tələsmə və: “Pərvərdigara! Mənim elmimi artır!” – de” *(“Taha”, 114).*

Bu yığcam bilgilər belə Rəsulullahın (s) tarix səhnəsindəki əvəzolunmaz yerini, onun başqa məziyyətləri ilə yanaşı, İlahi Qüdrət və Hikmətdən qaynaqlanan elminə də söykəndiyini, elmliyin Həzrət Muhəmməd (s) şəxsiyyətinin ayrılmaz tərkib hissəsi olduğunu və bunun o ulu din böyüyünün hər bir sözündə və işində qabarıq biçimdə göründüyünü danılmaz surətdə göstərir.

Möcüzə, peyğəmbərlik, imamlıq

## Möcüzə, peyğəmbərlik, imamlıq

Möcüzə göstərmək peyğəmbərliyin ən aydın göstəricilərindən olub, çox müxtəlif yerlərdə bəhs mövzusu edilmişdir. Musa Peyğəmbərin 9 möcüzəsinin olması Qurani-Kərimdə xəbər verilmişdir *(“Nəml”, 12; “İsra”, 101).*

1) Əsa; 2) Günəş kimi parlayan yəde-beyza; 3) Çəyirtkə və digər həşərat; 4) Qurbağa; 5) Qan; 6) Qıtlıq; 7) Daşların arasından fəvvarə vurub çıxan su; 8) Dənizin yarılması; 9) Tur dağının qaldırılıb İsrail oğullarının başlarının üstündə saxlanılması.

İsa Peyğəmbərin də bir neçə möcüzəsi Qurani-Kərimdə göstərilir: “(Ya Muhəmməd), xatırla ki, o gün (Qiyamət günü) Allah İsaya belə buyuracaq: ...o zaman sən Mənim iznimlə



palçıqdan quşa bənzər bir şey düzəldib onu üfürürdün, o da Mənim iznimlə quş olurdu. Sən Mənim iznimlə anadangəlmə kora və cüzamlı xəstəyə şəfa verir və Mənim iznimlə ölüləri qəbirdən çıxarıb dirildirdin...” *(“Maidə”, 110).*

Rəsulullaha (s) gəldikdə isə, göstərmək gərəkdir ki, Siyəri-Nəbi kitablarında onun da onlarca möcüzəsi vardır. Məsələn: barmaqları arasından su axması, miqdarı az olan azuqənin yüzlərcə adama bəs edə biləcək qədər artması, ağacların olduqları yerdən torpağı yara-yara gələrək önündə əyilib “Əssəlamu əleykə” deyə ona təzim etməsi, üzərində xütbə oxuduğu kötüyün yeni minbər düzəldildiyinə görə onun ayrılığına dözməyərək inim-inim inildəməsi və s. Ancaq Füzulinin də “Mətləü-l-etiqad”da yazdığı kimi, həmin möcüzələr də öncəki peyğəmbərlərin möcüzələri tək tarix səhnəsində iz buraxmadığı halda, Qurani-Kərim İslam rəhbərinin ən böyük peyğəmbərlik əlaməti olaraq Qiyamətədək qalacaqdır. Bu danılmaz gerçəklik səmavi və müqəddəs kitabların sonuncusunda da əksini tapmışdır *(“Ənkəbut”, 50-51).*

## Şəriət

“Şəriət” anlayışı açıq-aydın şəkildə Qurani-Kərimdə iki yerdə işlənmişdir: “Alə şəriətin” təbiri ilə “Casiyə” surəsinin 18-ci ayəsində (“Sonra səni də dində şəriət sahibi etdik, sən ona tabe ol və (haqqı) bilməyənlərin nəfslərindən gələn istəklərə uyma!); “Şirəti” təbiri ilə də “Maidə” surəsinin 48-ci ayəsində (“...Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik”).

“Şəriət” anlayışının müsəlman mədəniyyəti zəminində kəsb etdiyi əxlaqi-fəlsəfi və ruhi-mənəvi zənginliklərə dair azacıq da olsa təsəvvür oyatmaqdan ötrü kütləvi təfsirlərin birindən məfhumla bağlı xülasəyə göz gəzdirək: “...Ərəbcədə “şəriət” insanların irmaqlardan və buna bənzər yerlərdən su gətirmək üçün getdikləri yerdir. Din şəriəti də bu anlamdadır. Çünki insanlar onun vasitəsilə Allahın əmrlərinə, rəhmətinə və yaxınlığına qovuşurlar”.





Raqib isə belə demişdir ki, “şər”, əslində, məsdərdir, sonra açıq və geniş yolu özündə birləşdirən bu kəlmə “şira” və “şəriət” şəklini alaraq dində ilahi yol üçün istiarətək (bənzətmə) işlədilmişdir.

Bəziləri dini qayda-qanunlara “şəriət” deyilməsinin su yolu üzərində qurulan bir bənzətmədən irəli gəldiyini söyləmişlər. Belə ki, bu yolda həqiqət və doğruluq üzrə gedən şəxs həm doyar, həm də təmizlənər. “Doymaq”dan məqsəd bir çox filosofların “içərdim, ancaq doymazdım; Allahı tanıdığım zaman isə içmədən də doydum” şəklindəki səciyyələndirməsidir. “Təmizlənmək”dən məqsəd isə “evlərinizdə vüqarla oturun (yəni evlərinizi şəriətin, şəri hökmlərin alınmaz qalasına çevirin). İlkin cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın. Namaz qılın, zəkat verin, Allaha və Rəsuluna itaət edin, siz ey (Peyğəmbərin) ev əhli! Allah sizdən çirkinliyi yox etmək və sizi tərtəmiz, pak etmək istər!” *(“Əhzab”, 33)* ayəsindəki mənadır.

## Ədalət, peyğəmbərlik, imamlıq

Ədalət, peyğəmbərlik, imamlıq

“Ədalət” anlayışı ərəblərin istər təfəkküründə, istərsə də cəmiyyət həyatında tarixən geniş yer tutmuşdur. Ərəb dilində bu məfhumun dedikcə çoxşaxəli və çoxqatlı məna-məzmun şəbəkəsi əmələ gətirməsi də elə bundan irəli gəlir. Təsadüfi deyildir ki, “adələ” və “qəsəta” köklü onlarca kəlmə ərəbcədə yüzlərcə anlam bildirib, ən müxtəlif mətləb və fikirləri əhatə edir. Məsələn, “adələ” kökü “adil olmaq, insaf eləmək, doğru olmaq, eyni cür davranmaq, düzəltmək, doğrultmaq” kimi müsbət anlayışlarla yanaşı, “yoldan azmaq, şirk qoşmaq” *(“Ənam”, 1), “*zülm etmək, azmaq” kimi mənfi anlamların da daşıyıcısı yerində çıxış edir.

Bu hal “qəsəta” köklü kəlmələrə də aiddir. Belə ki, bu kökdən düzələn sözlərin içərisində müsbət mənalıları da



vardır (məsələn, "hakimin adil olması", "ədalətli hərəkət etmək", "bir şeyi aralarında ədalətli şəkildə bölüşdürmək"), mənfi mənalıları da (məsələn, "ədalətdən uzaqlaşmaq", "zülm etmək", "ailəsinin gündəlik dolanışığını məhdudlaşdırmaq"). Odur ki, hər iki kökdən gələn kəlmələr arasında ən müxtəlif keyfiyyətləri özündə birləşdirən sözlər də mövcuddur; məsələn: "adələ" kökü – *yol azmaq, bir müşkül işə uğrayaraq onu edib-etməyəcəyində tərəddüd etmək, müstəhəbbi, qiymət, misil, bacanaq;* "qəsəta" kökü – *boynun quruması, heyvanın ayaqlarının dik qalxması və sümüklərinin zəiflikdən dəyənək kimi quru olması, borcu kreditləşdirmək, miqdar, tərəzi, hissə, nəsib ("Ənbiya", 47), Hindistanda bitən və dərmantək işlədilən bir bitki kökü (əl-qustu), əyriqıç və s.*

Belə olan surətdə, bəllidir ki, Ərəb yarımadasında yaranıb, tezliklə bütün bəşəriyyətin dininə çevrilmiş İslamiyyət də "ədalət" anlayışına xüsusi diqqət yetirəcək, məfhumun ictimai-siyasi, iqtisadi-mədəni və əxlaqi-mənəvi mahiyyətinə dair dəqiq, aydın və birmənalı müddəa və qənaətlər formalaşdırılacaqdı. Mövzumuz Rəsulullahın (s) misilsiz ədalətindən olduğu üçün burada Qurani-Kərimdən birbaşa İslam Peyğəmbərinə müraciətlə verilmiş buyuruqların bir neçəsini xatırlatmaqla kifayətlənirik: "Ey iman gətirənlər! Allah qarşısında (borcunu yerinə yetirməklə) sabitqədəm və ədalətli şahidlər olun. Hər hansı bir camaata qarşı olan kininiz sizi ədalətsizliyə sövq etməsin. Ədalətli olun. Bu, təqvaya daha yaxındır. Allahdan qorxun. Allah etdiklərinizdən xəbərdardır!" *("Maidə", 8).*

Yaxud: "Onlar yalana qulaq asanlar və haram yeyənlərdir. Əgər yanına gəlsələr, aralarında hökm et və onlardan üz çevir. Əgər aralarında hökm etsən, ədalətli hökm et. Allah ədalət sahiblərini sevər!" *("Maidə", 42).*

Və ya: "Allah sizə əmanətləri öz sahiblərinə qaytarmanızı və insanlar arasında hökm etdiyiniz zaman ədalətlə hökm etmənizi əmr edir. Həqiqətən Allahın bununla (belə bir tapşırıqla) sizə verdiyi öyüd necə də gözəldir! Əlbəttə, Allah hər şeyi eşidən və görəndir!" *("Nisa", 58)* və s.





Salam

# Salam

"Salam" anlayışı İslam dinində ən müxtəlif etiqadi, ibadi və əxlaqi cəhətləri özündə birləşdirən və geniş əhatə dairəsi olan anlayışlardan biridir. Bu anlayış Qurani-Kərimdə "təhiyyə" və "salam" sözləri ilə təmsil edilir. Hər iki söz mövzu, məzmun və məfkurə baxımından olduqca tutumludur.

"Hayəyə" kökündən gələn "təhiyyə" kəliməsinin, demək olar ki, bütün anlamlarında "yaşarılıq, canlılıq" məzmunu dərhal duyulur. Belə ki, ərəb dilində "canlı olmaq, daima inkişaf etmək" anlamına gələn bu kökdən başlanğıc götürən "diriltmək", "alovu körükləyərək gurlaşdırmaq", "gecəni oyaq keçirmək", "Allahın bir yerdə bitki bitirməsi", "gedib bir yeri münbit görmək", "birinə salam vermək", "bir-birinə dua etmək", "uşağı bəsləmək", "əsiri sağ buraxıb öldürməmək", "bolluq, məhsuldarlıq", "yağış", "tövbə", "həyat", "kiçik qəbilə", "məhəllə", "vicdanlı", "ilan", "şir", "mikrob" (əl-muhəyyə), "üz, çöhrə", "qaç" (hayyəyə) kimi ən müxtəlif leksik və semantik keyfiyyətlər məhz bu kök çevrəsində qərar tapmışdır. Tutumluluq baxımından"təhiyyə"dən bir qədər geri qalmasına baxmayaraq, "salam" sözü də "yaşarılıq, canlılıq" bildirməsi etibarilə seçilir; məsələn, "dərini sələm ağacı ilə qaşımaq", "sülhə girmək" (*"əsləmə"* – bu anlam Quranda vardır: *"Bəqərə", 208*), "səhhətini etiraf etmək", "salamatlıq", "vay, aman, heyrət, nə qədər gözəl", "ayaq və əl barmaqlarının sümükləri", "müharibəsiz əsir götürmək", "bədəni yumşaq və lətafətli olan qadın" (əs-səlimətu), "ölümlə çarpışan yaralı" və s.

Böyük olan Allahımız Qurani-Kərimdə salamlaşmağın həyatın bütün sahələrindəki işlənmə məqamlarına dair dəqiq, aydın və birmənalı nümunələr (normativlər) vermişdir. Belə ki, bu nümunələr adi məişətdən *("Nisa", 86)* tutmuş yüksək əxlaqi səviyyəyədək *("Nur", 61),* cahillikdən *("Furqan",*





*63)* tutmuş Peyğəmbərin möminləri sevindirməsinədək *("Ənam", 54)* ümumbəşəri bir məzmuna malikdir. Bu cəhətlər Rəsulullahdan (s) günümüzə çatmış mötəbər hədislərdə də əksini tapmışdır; məsələn, "İman gətirmədikcə cənnətə girə bilməzsiniz. Bir-birinizi sevmədikcə tam mənası ilə iman etmiş sayılmazsınız. Bir-birinizi sevməyiniz üçün Mən sizə yol göstərimmi? Aranızda salamı yayın!"[37]

Və ya: "Beş şey vardır ki, müsəlmanın digər bir müsəlman qardaşına bunları yerinə yetirməsi vacibdir. Bunlar salamı alıb, cavab vermək, asqırana dua etmək, dəvəti qəbul etmək, xəstə ziyarətinə getmək və cənazənin dəfnində iştirak etməkdir"[38].

Yaxud: "Abdullah ibn Əmrin rəvayətinə görə, bir şəxs Rəsulullahdan (s) "İslamın ən xeyirli işi hansıdır?" deyə soruşduqda o, "Yemək yedizdirərsən, tanıdığına və tanımadığına salam verərsən" şəklində cavab vermişdir"[39].

Rəsulullah (s) hətta salamlaşmağın ədəbini (qaydalarını) belə göstərmişdir. Belə ki, Buxarinin[40] və Müslümün[41] rəvayət etdikləri bir hədisdən öyrəndiyimizə görə, minik üstündə gedən piyadaya, piyada oturana, sayı az olanlar çox olanlara və kiçik böyüyə salam verər.

Mürtəza

## Mürtəza

"Mürtəza" (razı qalınmış) sözünün Həzrət Əlinin (ə) ləqəblərindən birinə çevrilməzi prosesi isə lüğəvi yöndə bu köklü leksemlərin ilahi razılıq məzmununa yatımlı olması, məs.: "təslim, müti, dost, sevimli", istilahi yöndə də "Bəqərə" və "Maidə" surələrinin, müvafiq olaraq, 207 və 3-cü ayələrinin Həzrət Əlinin (ə) həyat və fəaliyyəti ilə bağlı tarixi bilgilər

[37] *Müslüm. Səhih, 1, 74*

[38] *Buxari. Səhih, 2, 70; Müslüm. Səhih, 4, 1704*

[39] *Buxari. Səhih, 1, 8, 9, 13, 128; Müslüm. Səhih, 1, 65*

[40] *Səhih, 8, 127*

[41] *Səhih, 4, 1703*





əsasında təfsir edilməsi üzərində formalaşmışdır: "İnsanların eləsi də vardır ki, (Həzrət Əli kimi) Allahın razılığını qazanmaq yolunda (Allah rizası üçün) öz canını fəda edər. Allah öz bəndələrinə qarşı çox mehribandır!" *("Bəqərə", 207).* "…(Qədri-Xummda Həzrət Əlini (ə) Həzrət Muhəmmədin (s) vəsisi, canişini təyin buyurub) Bu gün dinimizi tamamlayıb mükəmməl etdim, sizə olan nemətimi (Məkkənin fəthi, İslamın mövqeyinin möhkəmlənməsi, cahiliyyət dövrünün bir sıra zərərli adətlərinin aradan qaldırılması və i.) başa çatdırdım və bir din kimi sizin üçün İslamı bəyənib seçdim" *("Maidə", 3).*

Göründüyü kimi, bu ilahi bəyanatların birincisi "mərzati" – *razılıq*, ikincisi də "raziyə minhu" – *kifayətlənmək* anlamlarını istər lüğəvi, istərsə də istilahi baxımdan başlıca mehvər olaraq qəbul edərək, onlara möhkəm islami məzmun yükləmişdir. Beləliklə, hər iki ayənin Əhli-beytyönümlü açıqlamaları "Mürtəza" sözünün Həzrət Əlinin (ə) məşhur adı və ləqəbi kimi formalaşıb geniş yayılmasında həlledici islami istinadgah olmuşdur.

## Şükür

Ərəb dilində "şəkərə" köklü sözlər daha çox "yaxşılıq edənin və nemət verənin qədir-qiymətini bilib, bunu insanlara izhar etmək", "yaxşılıq edəni və nemət verəni öymək" anlamlarında işlənir.

Ancaq sözün yaranma tarixini izlədikdə onun başlanğıcda bəzi məişət hadisələrini də bildirdiyi ortaya çıxır. Məsələn, "şəkər" eyni kökdən dördüncü babın məsdəri olub, "heyvan döşünün südlü olması", "kök heyvan", "xəsis bir adamın əliaçıq bir şəxsə çevrilməsi" və "ağacın dibindən əlavə fidanların cücərməsi" kimi ilkin ibtidai anlamları da ifadə etmişdir[42].

[42] *Qaragöz İ. Qurana görə insana verilən dəyər və görəv, İstanbul, 1996, səh. 126*





Sözün inkişaf zirvəsi Qurani-Kərimdədir. Belə ki, bu köklü sözlər Müqəddəs Kitabımızda ayrıca semantik səciyyə qazanmış, hətta iman anlamına belə yaxınlaşmışdır[43].

Bəlli ənənəvi təsəvvürlərə görə, Allaha şükür üç yolla edilir: qəlblə, dillə və üzvlərlə. Həzrət Muhəmməd (s) şükrü daha çox qəlblə bağlamışdır. Belə ki, o, Ömər ibn Xəttabın"Hansı malı qazanmaq?" şəklindəki sualına belə cavab vermişdir: "Sizin hər hansı biriniz şükür edən qəlb, zikr edən dil və imanınıza yardım edən möminə zövcə əldə etsin!"[44]

Ancaq alimlərin çoxu "bəndələrimizdən layiqincə şükür edən azdır" *("Səbə", 13)* ayəsinə söykənib üzvlərlə şükür etməyin çətin və daha məsuliyyətli olması fikrinə tərəfdar çıxmışdır. Odur ki, müsəlman ilahiyyatçılar şükürlə bağlı mənəvi-əxlaqi proseslərə yön verməkdən ötrü beş təmrin müəyyənləşdirmişlər. Onlar bunlardır:

1. Şükür edənin Şükür Edilənə boyun əyməsi, yalvarıb-yaxarması və Onun qarşısında təvazökar olması.
2. Şükür edənin Şükür Ediləni səmimi bir qəlblə sevməsi.
3. Onun verdiyi nemətləri gizlətməyib etiraf etməsi.
4. Onu öyməsi.
5. Neməti onu Verənin bəyənmədiyi yerlərdə işlətməməsi.

Heç şübhəsiz, bütün bu göstərişlər birbaşa Qurani-Kərimdən qaynaqlanır. Ötəri deyildir ki, "şükür" anlayışı Müqəddəs Kitabımızda 10-a yaxın işlənmə məqamı ilə ayrıca bir xətt təşkil edir. Məsələn, anlayış "şakir" və "şəkər" şəklində 6 yerdə Allahın sifəti, 19 yerdə isə insana aid əlamət olaraq əksini tapmışdır[45].

Bu köklü sözlərin Qurani-Kərimdəki işlənmə məqamlarını belə xülasə etmək olar:

1. İnsanın Allaha təşəkkürü[46]. Bu, nemətləri verənin Allah olduğunu bilib etiraf etmək müddəası üzərində qurulmuşdur *("Nisa", 147; "Nəhl", 14; "Qəsas", 73; "Loğman", 31)*.

...................................

[43] *Yenə orada, səh. 130*

[44] *İbn Macə. Nikah, 5*

[45] *Yenə orada, səh. 131*

[46] *Yenə orada, səh. 144-152*





2. İman gətirmək. Qurani-Kərimdə “şükür” sözü “iman” mənasında da işləkdir *(“İbrahim”, 7; “Zümər”, 7; “Dəhr”, 3).*
3. Tövhid. Belə ki, “Ənkəbut” surəsinin 17-ci ayəsində “ibadət” və “şükür” istilahları üzvi vəhdət təşkil edir.
4. Dində möhkəm olmaq, sabitqədəmlik (Bax: *“Ali-İmran”, 44*).
5. İtaət. Aşağıdakı ayələrdə şükür mənşəli sözlər bu və ya başqa ölçüdə itaət məzmunu almaqdadır *(“Ənfal”, 26; “Nəhl”, 120; “Ənbiya”, 80; “Həcc”, 36; “Muminun”, 78; “Səcdə”, 9; “Nəml”, 19-404; “Əraf”, 144-189; “Mülk”, 23).*
6. Saleh əməl *(“Furqan”, 62).*
7. Allaha qarşı çıxmaqdan çəkinmək *(“Ali-İmran”, 123).*
8. Axirət üçün hazırlıq görmək *(“Ali-İmran”, 145).*
9. İlahi bəyanatları qavrayıb həyata keçirmək *(“Maidə”, 89; “Fussilət”, 33; “Əraf”, 58; “İbrahim”, 50)*[47].

## Fələk

Fələk

“Fələkə” kökü ərəbcənin əski qaynaqlarından olub, ən müxtəlif qaynaqları özündə birləşdirir. Belə ki, bu kökdən törəmiş sözlər içərisində astronomiya-astrologiyayönümlü leksik vahidlər aparıcı yer tutur. Məs.: *münəccimlik etmək, planet, orbit, özündə ulduzların hərəkət etdiyi səma təbəqəsi, astronomiya, astronom.*

Bu köklü sözlər sırasında “yumruluq, dəyirmilik” əlaməti özünün semantik çalarları ilə diqqəti çəkir: məs.: *yumru qum təpəsi; yumru və hərəkətli dalğa; qızın döşünün yumru olması.*

“Fələkə” kökündən gələn sözlərdə cinsi məzmun qatı da aydın duyulur; məs.: *yatağı hazırlamaq; dişi itin erkək iti istəməsi.*

.................................

[47] *Daməğani. Qamusu-l-Quran, Beyrut, 1976, səh. 139-141. Qaragöz İ. Qurana görə insana verilən dəyər və görəv, İstanbul, 1996, səh. 257-258*





Bunlardan başqa, "gəmi", "israr etmək" kimi mənalar da "fələkə" köklü leksemlərin əhatə dairəsinə aiddir.

Göründüyü kimi, bu kök olduqca məhsuldar olub, həyatın ən müxtəlif sahələrini özünün spesifik məna-məzmun çevrəsində birləşdirməkdədir. Odur ki, belə geniş söz və deyim şəbəkəsi əmələ gətirmiş bu söz təkcə ərəb ədəbiyyatında yox, Yaxın və Orta Şərq xalqlarının da poeziyasında yüksək işlənmə tezliyi nümayiş etdirmiş, nəinki ədiblər, hətta filosoflar üçün belə çox incə fikirlərin ifadəsində əlverişli və çevik bir dil-üslub amili və bədii vasitə təşkil etmişdir.

# Haqq

Klassik ədəbiyyatda ən müxtəlif mövzu, məzmun və məfkurə keyfiyyətləri qazanmış "haqq" sözü orta əsrlər müsəlman mədəniyyətinin ən tutumlu deyimləri sırasındadır. Sözün Qurani-Kərimdəki işlənmə məqamlarına göz gəzdirsək, bu barədə aydın anlayış əldə etmiş olarıq.

"Haqq" sözü lüğəvi baxımdan "inkarı məsləhət görülməyən, sübuta yetirilmiş şey", "doğru, doğruluq", "ədalət", "hikmət, hikmətə müvafiq surətdə verilmiş hökm", "vacib (vəzifə), lazım", "ahəng, uyğunluq", "pay, hissə", "xislət", "qismət", "mövcudluq" deməkdir. Söz Qurani-Kərimin 221-ci ayəsində müxtəlif anlamlarda işlənmişdir; məs.: Quran *("Yunus", 32),* peyğəmbərlik *("Qəsas", 48),* İslam *("Bəqərə", 109),* ədalət *("Nisa", 170),* tövhid *("Əraf", 89),* doğru, gerçək *("Qəsas", 75),* lazımlılıq *("Yunus", 4),* ehtiyac *("Əhqaf", 18),* mal *("Hud", 79),* nəsib *("Bəqərə", 282),* bəyan *("Əraf", 24-25),* zəkat *("Bəqərə", 71),* sədəqə *("Ənam", 141),* lazım olduğu kimi *("İsra", 26),* vəhy *("Bəqərə", 121),* əzab *("Ənfal", 5),* günah *("Hicr", 64),* batilin ziddi *("İsra", 81),* doğru xəbər *("Ali-İmran", 60),* Kəbənin qiblə elan edilməsi *("Bəqərə", 247)*[48].

Doğrudur, bu anlamların çoxu bu və ya başqa ölçüdə Həzrət Əli (ə) ilə bağlanıla bilər. Ancaq özlüyündə bəllidir ki,

.................................

[48] *Tərlan Ə.N. Füzuli divanının şərhi, 3 cilddə, I cild, səh.12*





bu anlamların hər birinin başlanğıc yeri olan "Allah" mənası daha önəmlidir.

Məhəmməd Füzuli dünya ədəbiyyatının ən böyük simalarından biridir. Onun irsi yaşarı və daimidir. Odur ki, hər bir nəsil ona öz münasibətini bildirir. Elmi təfəkkür yeniləşdikcə bu ölməz irs daha geniş ədəbi-nəzəri araşdırmalara qaynaq olur. Bu baxımdan "Füzuli və din" məsələsi bu gün hərzamankından daha çox önəm qazanır. Bu məsələ və onunla bağlı ayrı-ayrı cəhətlər indiyədək düzgün öyrənilməmişdir. Bunun yerinə isə dövrün ideoloji baxışlarına uyğunlaşdırılan, Füzuli yaradıcılığını olduğu kimi çatdırmayan, ona görə də elmilikdən uzaq olan bir çox fikirlər söylənilmişdir. Şairin əsərlərindəki dini-mənqəbəvi anlayışlar (dini-mənqəbəvi anlayış termini ilə İslamla bağlı bütün məfhumlar və tarixi məlumatlar nəzərdə tutulur), müsəlman dünyagörüşü ilə bağlı cəhətlər hərdən bədii yaradıcılıqdakı ziddiyyət, hərdən orta yüzilliklər sənətkarının dar baxışları, hərdən də quru zahidlik göstəriciləri kimi qələmə verilmişdir. Belə yanlış yanaşmaya görə şairin ölməz irsi hələ də layiq olduğu həqiqi elmi-nəzəri qiymətini almamışdır.

Yaxın və Orta Şərq xalqlarının ədəbi-bədii sərvəti, dünya ədəbiyyatşünaslığının ardıcıl elmi-nəzəri irəliləyişi göstərir ki, müsəlmanlığı qəbul etmiş xalqların istər ictimai təfəkküründə, istərsə də bədii yaradıcılığında İslam dininin etiqad, ibadət və əxlaqla bağlı baxışları dərin iz buraxmış, böyük təsir gücü olan amilə çevrilmişdir. Bu mənada Azərbaycan türklərinin ədəbiyyatı müsəlman mədəniyyətinin ayrılmaz bir parçasıdır. Odur ki, onun islami bir ədəbiyyat olması danılmaz tarixi gerçəklikdir. Azərbaycan ədəbiyyatının islamiliyi təkcə Xaqani, Nizami, Nəsimi, Füzuli, S.Təbrizi kimi simaların qələmindən çıxan yazılı örnəklərdə yox, "Kitabi-Dədə Qorqud", "Divani-Lüğəti-t-Türk", "Koroğlu" kimi xəlqi-mədəni abidələrdə də bütün aydınlığı və genişliyi ilə özünü göstərməkdədir. Odur ki, Füzuli irsinin dinlə əlaqəsini təkcə klassik kitab üslubu ilə bağlamaq olmaz. Bunu yalnız şairin yaşayıb-yaratdığı çevrə ilə şərh etmək



də özünü doğrultmazdı. Bu, Füzulinin keçirdiyi həyat tərzi, yeniyetməlikdən görüb-götürdüyü adət-ənənələr, duyub qavradığı örnək-davranış ölçüləri ilə də qırılmaz tellərlə bağlıdır. Odur ki, orta yüzilliklərdə Azərbaycan ədəbiyyatının cövhərini təşkil edən Füzuli irsinə bütün varlığı ilə müsəlman bir sənətkarın yaratdığı islami səciyyəli əsərlərin toplusu kimi yanaşılmalıdır. Ötəri deyildir ki, mərhum türk alimi Əli Nihad Tərlan şairin əsərlərinə doğru-düzgün təhlil verməkdən ötrü onun müsəlman olaraq hüviyyətini bilməyin qaçılmazlığını ayrıca göstərir[49].

"Füzuli və din" məsələsini gərəyincə düzgün və aydın açıqlamaqdan ötrü şairin fərdi dindarlıq səciyyəsini, dini-mənqəbəvi anlayışların yaradıcılığında tutduğu yeri çox yığcam biçimdə olsa da aydınlaşdırmaq qaçılmazdır.

İslami yaşayış biçimi Füzulinin ömrünə-gününə hopduğundan etiqad, ibadət və əxlaqla bağlı ən çeşidli anlayışlar da şairin bütün yaradıcılığını çulğalamışdır. Belə ki, sənətkarın "Hədiqətü-s-süəda" *("Xoşbəxtlər bağçası")* "Hədisi-ərbəin" ("40 hədisin tərcüməsi") kimi dini əsərləri olduğu və töhvidnamə, münacat, nət, meracnamə ilə başlamayan heç bir iri əsəri olmadığı kimi, bir neçə dini-mənqəbəvi anlayışın yer almadığı qəzəl, qitə, rübai və qəsidəsi də yoxdur. Bunu görümlü biçimdə izləməkdən ötrü şairin "Türkcə divan"ı ilə "Leyli–Məcnun" məsnəvisini dini-mənqəbəvi anlayışların Füzuli yaradıcılığındakı yeri və bədii ifadə yolları baxımından ümumiləşdirilmiş şəkildə gözdən keçirmək gərəkdir. Ona görə ki, onlar Füzuli irsinin iki say-seçmə məhsulu olub, şairin yaradıcılığının səciyyəvi ideya-bədii cizgilərini özündə birləşdirir, dini-mənqəbəvi anlayışların çeşidli və çoxyönlü işlənməsi ilə seçilir. Divanda qəzəl, qitə, rübai biçimində olan dini mövzulu şeirlər, "Leyli–Məcnun"da əsər boyu səpələnmiş Allah (c.c), Həzrət

................................

[49] *Almasov V. Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları ("Türkcə divan" və "Leyli–Məcnun" məsnəvisi üzrə), Azərbaycan Milli Elmlər Akademiyasının əsaslı kitabxanası, Bakı, 1994, səh. 215-223*



Muhəmməd (s), İslamla bağlı anlayışlar “Füzuli və din” məsələsinin açıqlanılmasından ötrü geniş mənbədir. Hər iki qaynaq dini-mənqəbəvi anlayışların məzmun və forma, janr və üslub, ideya və bədii cizgilərini sonadək açmaq üçün olduqca yararlıdır. O biri yandan “Divan” da, “Leyli–Məcnun” da Füzuli ömrünün yetkin çağında araya-ərsəyə gəldiyindən sənətkarın dini görüşlərinin aydın və tutarlı açıqlamaları da daha çox burada axtarılmalıdır. “Divan” və “Leyli–Məcnun”dakı ayrı-ayrı beyt və parçaların Füzulinin dini-fəlsəfi görüşlərinin nəzəri açıqlaması olan “Mətləü-l-etiqad” *(“İnanışın başlanğıcı”)* traktatı ilə yaxından səsləşməsi də bu fikri gücləndirir. Bu da Füzuli və din məsələsinin “Divan”la “Leyli–Məcnun” üzrə öyrənilməsinin başqa bir elmi-nəzəri əsası kimi diqqəti çəkir.

Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları baxımından bu nəticələr çıxarıla bilər:

1. Dini-mənqəbəvi anlayışlar Füzuli dünyagörüşünün başlıca daşıyıcılarındandır. Məs.:

   *Yox məndə bir əməl sənə şayəstə, ah, əgər*
   *Ə’malimə görə verə ədlin cəza mana.*

   Bu beytdə Tanrıya layiq əməl və ilahi ədalət anlayışları Füzulinin hər bir insanın bu dünyada etdiyi günahlara görə axirətdə cəza alacağına dərin inam bəslədiyindən soraq verir.
2. Dini-mənqəbəvi anlayışlar Füzuli yaradıcılığında başlıca mövzu ola bilir. Misal üçün, “Divan”dakı “Ya mən əhatə...” sözləri ilə başlayan və “Peyda” rədifli münacatların, “Leyli–Məcnun”dakı “Bu, şükufeyi-gülzari-tövhiddir...” başlıqlı fəslin başlıca mövzusu Tanrı təkliyi anlayışıdır.
3. Dini-mənqəbəvi anlayışlar Füzuli yaradıcılığında aparıcı ideya səviyyəsinə də yüksəlir. Tanrının qüdrət və hikmətinin, tək hakim qüvvə olmasının bədii ifadəsinə



qulluq edən "peyda" rədifli və "həmdi bihədd dəmbədəm ol məbdə'i-əşyaya kim" misralı münacatlar buna misaldır. Bu fikir Leyli ilə Məcnunun münacatlarında da aparıcı yer tutur.

4. Dini-mənqəbəvi anlayışlar Füzuli şeirinin məzmunu üçün münbit mənbələrdəndir. Bu, özünü belə anlayışların başlıca mövzu və ideya olduğu örnəklərdə daha qabarıq göstərir. Misal üçün, Tanrı təkliyi mövzusunda olub, Tanrının qüdrət və hikmətinin tərənnümü üçün yazılmış, "Peyda" rədifli münacatın məzmunu "Tanrı zatı", "ilahi əməl", "Tanrı mərhəməti", "ilahi elm", "peyğəmbərlik" məfhumlarının *dəniz, göy, yer, gözəllik* bədii yaradıcılıq məfhumları üzərində mənalandırılmasını özündə birləşdirir. "Sana" rədifli nətdə isə Həzrət Muhəmmədin (s) üstünlüklərinin bədii ifadəsinə yönəldilmiş merac, Quran, Muhəmməd elmi, Cəbrayıl, sonuncu Peyğəmbər olma, şəfaət, Muhəmməd mərhəməti kimi anlayışlar əsərin məzmununa məfkurəvi və bədii əsatiri genişlik vermişdir. Bununla yanaşı, Füzulinin dini mövzuda olmayan əsərlərinin məzmununda da dini-mənqəbəvi anlayışlar geniş yer tutur. "Leyli–Məcnun" məsnəvisinin Məcnun fəsillərindən hər biri buna parlaq misaldır.
5. Dini-mənqəbəvi anlayışlar Füzuli əsərlərində süjetin formalaşmasında önəmli yer tutur. "Ey vücudi-kamilin əsrari-hikmət məsdəri" misralı münacatda *Tanrı hikməti, tale, məhşər və təqva* məfhumlarının"Leyli–Məcnun" məsnəvisinin "Bu, Zeydin Leyli ilə Məcnunu röyasında gördüyüdür" fəslində *ziyarət, cənnət, səbir* və *paklıq* anlayışlarının süjetə yön verməsini buna misal göstərmək olar.
6. Dini-mənqəbəvi anlayışlar Füzulinin istər dini, istərsə də başqa mövzulu əsərlərində bədii ifadə vasitələrinin yaranmasında işlək və çevikdir. Misal üçün, "Əşrəqət min fələki-l-bəhcəti-şəmsül və biha" misralı nətin:





*Necə təqrir edəyin vəsfini bir şahin kim,*
*Ona vəssaf ola "Yasin"ü müərrif "Taha", –*

beytində şəxsləndirmə, "Peyda" rədifli münacatın:

*Cahan əhlinə ta əsrari-elmin qalmaya məxfi,*
*Qılıbdur hikmətin küffar içində ənbiya peyda, –*

beytində təzad, "Ey vücudin əsəri xilqəti-əşya səbəbi" misralı nətin:

*Əzmi-çərx etdi Məsiha ki, bula Meracin,*
*Yetmədi mənzili-məqsudə təriqi-tələbi, –*

beytində təlmih, "Leyli–Məcnun"un "Kəbə" fəslinin:

*Qıl məndə binayi-eşqi daim,*
*Manəndi-əsasi-Kə'bə qaim! –*

beytində bənzətmə dini-mənqəbəvi anlayışlarla yaradılmışdır.

7. Dini-mənqəbəvi anlayışlar Füzuli üslubuna genişlik və əlvanlıq verir. Misal üçün, "Bu, sərdəftəri-ənbiyanın kitabi-övsafindən bir vərəqdir..." başlıqlı fəsildə Adəm Peyğəmbərlə bağlı bir islami əsatirə üz tutulması, "Bu, Məcnunin sidq ilə münacat etdiyidir..." və "Bu, İbn Səlamdan sonra Leylinin macərasıdır..." başlıqlı fəsillərin İbrahim Peyğəmbərlə bağlı bir Quran qissəsinə *("Ənam", 75-79)* yaxın səpkidə qurulması "Leyli–Məcnun" məsnəvisinin bədii genişliyini və üslub əlvanlığını artırmışdır.
8. Dini-mənqəbəvi anlayışlar Füzuli əsərlərində surətlərin mənəvi simalarının açılmasında önəmli yer tutur. Misal üçün, "Bu, Zeydin Leyli ilə Məcnunu röyasında gördüyüdür" fəslindən Leyli ilə Məcnunun səbirli və pak olduqlarına görə əbədi cənnət xoşbəxtliyinə



çatdırıldıqları aydın olur. Burada "səbir" və "paklıq" məfhumları büsbütün islami səciyyə daşıyıb Leyli ilə Məcnunun mənəvi yetkinliklərinin başlıca göstəriciləri tək önə çəkilir.

9. Dini-mənqəbəvi anlayışlar Füzuli ilə yaratdığı surətlərin dünyaduyumlarında və mənəviyyatlarındakı yaxınlığın göstəricilərindəndir. "Leyli–Məcnun" məsnəvisində "Münacat" fəsli ilə Leyli və Məcnunun münacatlarının Tanrı təkliyinə, sonsuz Tanrı gücünə inamı, Tanrı təqdirinin sözsüz mənimsənilməsi, bəndəlik özünüdərki, nemətlər üçün şükür etmə, Tanrı mərhəmətinə sığınma, mənəvi dəyərlərin dünyapərəstlikdən üstünlüyü, ilahi yaradılışın mahiyyətcə yetkinliyi və gözəlliyi kimi bir sıra islami anlayış və motivlər baxımından səsləşməsi buna tutarlı bir misaldır[50].

Bu nəticələr İslam dininin inanış, ibadət və əxlaqla bağlı anlayışlarının Füzuli yaradıcılığında geniş yer tutduğunu və əlvan-bədii cizgilər qazandığını sübuta yetirir. "Divan"dan və "Leyli–Məcnun"dan araşdırmaya çəkilmiş örnəklərin təhlilindən şairin tövhidnamə, münacat, nət, meracnamə kimi dini şeir növlərinin də böyük ustası olduğu, uca məqsəd və fikirlərini bu sahədə də yüksək sənətkarlıqla qələmə aldığı aydın olur. Məsələnin füzulişünaslıqda ilk dəfə ayrıca araşdırılması Füzuli irsinin müsəlman mədəniyyətinin ayrılmaz bir parçası olduğunu, şairin yaradıcılığının dini dünyagörüşündən və islami təfəkkür tərzində ayrılıqda götürülərək öyrənilməsinin həqiqi elmi-nəzəri təhlillə bir araya sığmadığını danılmaz biçimdə təsdiq edir. Odur ki, şairin heç bir əsərini dini məsələlərdən təcrid edərək öyrənmək olmaz. Azərbaycan və dünya füzulişünaslığı irəlilədikcə "Füzuli və din" problemi dərindən öyrəniləcək, bu yöndə əldə ediləcək uğurlar ədəbiyyatşünaslıq elminin inkişafında aparıcı yer tutacaqdır.

..................................

[50] *Almasov V. Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları ("Türkcə divan" və "Leyli–Məcnun" məsnəvisi üzrə), Azərbaycan Milli Elmlər Akademiyasının əsaslı kitabxanası, Bakı, 1994, səh. 215-223*





# FÜZULİNİN İMAM HÜSEYN HƏRƏKATINA DAİR GÖRÜŞLƏRİ

Rəsulullahdan (s) və Əliyyən Vəliyullahdan (ə) sonra bəşəriyyətin üçüncü ən kamil şəxsiyyəti olan İmam Hüseyn (ə) özünün ömür yolu, həyat və fəaliyyəti, mübarizə əzmi, əqidə dönməzliyi ilə hər bir insaflı insan oğlunun dərin sayğı duyduğu, tükənməz sevgi bəslədiyi, əlçatmaz-ünyetməz bir din böyüyüdür. Onun adını əbədiləşdirən ən gərəkli çağda tarix səhnəsinə çıxıb özünün kəskin və kəsərli rəhbər sözünü deməsi, olmazın əzab-əziyyətlərə qatlaşmaq və zəmanəsinin zalımlarına meydan oxumaqla zülmə, haqsızlığa sinə gərməsidir. Yeddinci yüzillikdə tarixin dönüm nöqtəsini təşkil edən Kərbəla vaqeəsinin ictimai-siyasi, dini-məfkurəvi, mənəvi-əxlaqi və etik-estetik məğzi, heç şübhəsiz, əsrlər boyu dünyanın ən öndə gələn dövlət xadimlərini, elm adamlarını, ədib və filosoflarını dərindən-dərinə düşündürmüş, idrakları məşğul etmiş, çeşidli mübahisələr doğurmuşdur. Lakin heç bir cərəyan heç vaxt bu hadisənin cahanşümul mahiyyətini məzhəb və təriqət qəlibinə sala bilməmiş, həmişə onun miqyas genişliyi önündə baş əymişdir.

Çox mürəkkəb şəraitdə ortaya çıxan Kərbəla vaqeəsi dəyərləri təhrif edilən, mahiyyəti dəyişdirilən İslam dininə yeni həyat verdi, unudulmaqda olan uca prinsipləri yenidən bütün sahələrdə bərqərar etdi.

İstər bütövlükdə İmam Hüseyn hərəkatının məğzini, istərsə də Füzulinin həmin hərəkata münasibətini obyektiv şəkildə



öyrənməkdən ötrü imamət məfhumu da, bu məfhumun dini-ictimai təbiəti də bəhs mövzusu edilməlidir.

Ümumiyyətlə, peyğəmbərlərin gəlişindəki məqsəd, yaxud vücudunun zərurəti haqda deyilənlər imamlara da aiddir.

Xacə Nəsirəddin Tusi "Təcridu-l-etiqad" kitabının "Nübüvvət" fəslində peyğəmbərlərin besətinin səbəbini açıqlayarkən 9 səbəb qeyd etmişdir. Biz burada onları qısaca nəzərdən keçirəcək və görəcəyik ki, onların çoxu məsum imamlara da şamildir.

1. Əqli mərifətin nəqli yolla qüvvətləndirilməsi. Belə ki, insan əql qüvvəsilə bir çox nəzəri və əməli həqiqətləri dərk etsə də, bəzən qəlbində şübhələr baş qaldırır. Bu isə bir şeyə inam və imanın qarşısını alır. Amma əqlin hökmləri ilahi və məsum rəhbərlərin bəyanı ilə təsdiq edildikdə bütün maneələr aradan qalxır, insan qəlbən rahatlıq tapır və hər hansı işə meyli artır.
2. Bəzən insan bir sıra işlərdən çəkinir və qorxur ki, onun əməli Allahın istəyinə əks olsun. İlahi rəhbərlərin icazəsi ilə bu qorxu aradan qalxır.
3. İnsanın bütün əməl və rəftarları "əql yaxşı-pisi dərk edir" ölçüsünə yerləşmir. Çox olar ki, əql bir işin yaxşı, yaxud pis olduğunu dərk etməsin. Yaxşını pisdən ayırd etmək üçün ilahi rəhbərlərə ehtiyac duyulur.
4. İnsan ilahi rəhbərlər olmadan, yalnız öz düşüncəsi ilə xeyir-ziyanını dərk etməyə qadir deyildir.
5. İnsan ictimai bir varlıq olduğundan fərdlər bir-biri ilə həmkarlıq və bir-birinə kömək etmədən həyatın problemlərini həll etməyə qadir deyillər. Şübhəsiz, bütün fərdlərin hüquqlarını qoruyan, onları düzgün istiqamətləndirən qanunlar olmadan ictimai ədalət bərpa olunmayacaq, istənilən nəticə əldə edilməyəcək. Bu qanunları tam mənada düzgün ayırd və icra edə bilən kəs yalnız agah, pak, məsum ilahi rəhbərlər ola bilər.
6. İnsanlar kamilliyi dərk etmək, elm və maarifə yiyələnib fəzilətlər qazanmaq baxımından bir-birindən fərqlənirlər;



bəziləri buna tam qadir, bəziləri isə acizdirlər. İlahi rəhbərlər birinci qrupa təkan verir, ikinci qrupa kömək edirlər ki, hər ikisi mümkün kamala çatsın.
7. Ümumiyyətlə, insan həyatı elm, sənət və digər sahələrlə sıx əlaqədardır. İlahi rəhbərlər isə onların inkişafında çox güclü mühərrikdirlər.
8. İnsanlar öz əxlaqi səciyyələri ilə bir-birindən fərqlənirlər. Onların düzgün təlim-tərbiyəsində pak və məsum kəslərə ehtiyac vardır.
9. İlahi rəhbərlər itaətlə bağlı savab və mükafat, günahla bağlı cəza və əzabdan tam agahdırlar. Onların əməllərin aqibəti ilə bağlı xəbərdarlıqları hər hansı vəzifənin düzgün yerinə yetirilməsində güclü amil sayılır.

İmamət məqamı nübüvvətin davamı olduğu üçün qeyd edilən səbəblərin çoxu məsumlara da aiddir.

Qurani-Kərimdə bütün bunlar, hətta onların ən üstün üç qismi ixtisarla verilmişdir: "təlim", "tərbiyə" və "ədalətin icrası". Bir çox ayədə onlara toxunulmuş və bir ayədə İslam Peyğəmbərinin (s) besət fəlsəfəsi belə bildirilmişdir:

هُوَ الَّذِي بَعَثَ فِي الْأُمِّيِّينَ رَسُولًا مِّنْهُمْ يَتْلُو عَلَيْهِمْ آيَاتِهِ وَيُزَكِّيهِمْ وَيُعَلِّمُهُمُ الْكِتَابَ وَالْحِكْمَةَ وَإِن كَانُوا مِن قَبْلُ لَفِي ضَلَالٍ مُّبِينٍ

"Yazıb-oxumaq bilməyən ərəblər arasından onların özlərindən olan bir Peyğəmbər göndərən Odur! Bu Peyğəmbər onlara Allahın ayələrini oxuyar, onları saflaşdırar, onlara kitab və hikmət öyrədər. Hərçənd, əvvəllər açıq-aşkar azğın yolda idilər!"

Bu ayədə Peyğəmbər (s) və imamların ən mühüm vəzifəsi olan "təlim" və "tərbiyə" məsələsinə işarə edilmişdir.

Başqa bir ayədə buyurulur:

لَقَدْ أَرْسَلْنَا رُسُلَنَا بِالْبَيِّنَاتِ وَأَنزَلْنَا مَعَهُمُ الْكِتَابَ وَالْمِيزَانَ لِيَقُومَ النَّاسُ بِالْقِسْطِ

"Həqiqətən, Biz peyğəmbərlərimizi açıq-aşkar dəlillərlə göndərdik, onlarla birlikdə (səmavi) kitab və tərəzi (haqqı batildən ayırd edən ədalətli qanunlar) nazil etdik ki, insanlar ədaləti bərqərar etsinlər".





Bu ayədə düzgün təlim-tərbiyə üçün zəmin yaradan ictimai ədalət məsələsinə toxunulmuşdur.

Adətən, hakim təbəqə mövqe qazanmaq, yaxud bir qrupun mənafeyinə xidmət fikrində olduğu üçün kütlənin mənafeyini bu yolda qurban verir. Yalnız pak və ilahi rəhbərlər bəşərin hüquq və mənafelərini yetərincə müdafiə etmişlər. Qeyri-ilahi rəhbərlər haqq-ədaləti qorusa da, cəmiyyəti istənilən kamala doğru yönəltsə də, müəyyən işlərin dəqiq ayırd edilməsində gücsüzdürlər. Onlar yalnız səthi fərqləri ayırd edə bilirlər. Bu isə böyük əhəmiyyət kəsb etmir. Bu işin öhdəsindən yalnız Allahın sonsuz elm dəryasına bağlı ilahi rəhbərlər gələ bilir.

Yer kürəsinin az qala yarısına 70 il hökmranlıq edən marksizm ibrətamiz bir təcrübə idi. Marksizmin əsaslarını möhkəmləndirmək üçün geniş təbliğat vasitələrindən istifadə edilsə, bu yolda çoxsaylı qəzet və jurnallar çap olunsa, cəmiyyətin problemlərinin həlli, ictimai ədalətin təmini, bəşəriyyətin təkamülü, tarix və ictimai elmlərin düzgün təlimi üçün marksizm yeganə yol sayılsa, müxaliflər müxtəlif yollarla sıradan çıxarılsa da, bu ideyanın məhsulu diktatura və süqutdan başqa bir şey olmadı. Hətta onların bir çox mütəfəkkir və alimləri bu ideologiyanın əsaslarının səhv olduğunu etiraf etdilər!

Bəlkə də bu qədər mütəfəkkirlərin, alimlərin, təhsil ocaqları və universitetlərin müdafiə etdiyi məktəbin axırda puç olması tarixin misli görünməmiş hadisəsidir. Kim zəmanət verə bilər ki, gələcəkdə insan təfəkküründən doğan digər ictimai və etiqadi məktəblər belə bir taleyə düçar olmayacaq?! Beləcə, Allah tərəfindən hər bir xəta və səhvdən uzaq olduğuna zəmanət verilən peyğəmbər və məsum rəhbərlərin məktəbi bir daha öz zəruriliyini göstərir.

Bir sözlə, bəşəriyyəti kamal və səadətə çatdırmaq istəyən Mütəal Allah haqq yola hidayət üçün vəhy qüvvəsi və ismət məqamına malik peyğəmbərlər göndərdiyi kimi, onlardan sonra bu yolu davam etdirəcək məsum canişinlər də təyin



etmişdir. Şübhəsiz, həmin canişinlər olmadan bu məqsəd həyata keçəsi deyildir. Çünki:

1. İnsan əqli bütün kamal, səadət və tərəqqi yollarını müstəqil olaraq ayırd etməyə qadir deyil.
2. Peyğəmbərin vəfatından sonra, mümkündür ki, din müxtəlif təhriflərə məruz qalsın. Deməli, Allahın dinini azğın kəslərin təhrifi, nadanların müdaxiləsi, nəfsə uyanların təfsirindən qorumaq üçün məsum və ilahi rəhbərlərə ehtiyac duyulur.

Bu məsələ "Üsuli-kafi" kitabında İmam Sadiqdən (ə) nəql olunan məşhur bir hədisdə belə açıqlanır:

اِنَّ فِينا اَهْلَ الْبَيْتِ فِى كُلِّ خَلَفٍ عُدوُلاً يَنْفُونَ عَنْهُ تَحْرِيفُ الْغالِينَ، وَانْتِحالُ الْمُبْطِلِينَ، وَتَأوِيلُ الْجاهِلِينَ!

"Hər bir nəsildə biz Əhli-beytdən ədalətli bir şəxs ifrata varanların təhrifini, bidətini, batil əlini və nadanların iftiralarını ondan (İslamdan) uzaqlaşdıracaq!" (Burada məsum imam nəzərdə tutulur).

İmam Əli (ə) dərin mənalı kəlamlarından birində bu nöqtəyə işarə edərək buyurmuşdur: "İlahi! Doğrudan da yer üzü heç vaxt Allahın dəlil və nişanələrini batildən qoruyan aşkar, ya gizli ilahi höccətsiz qalmayacaqdır!"

3. İnsanların yaranış məqsədinə uyğun ilahi hökumətin təşkil olunması yalnız məsumların vasitəsilə mümkündür. Tarixdən göründüyü kimi, dinsiz hökumətlər həmişə fərd, yaxud qrupun mənafeyinə xidmət etmişdir. Təcrübədə sübut olunmuşdur ki, "demokratiya", "bəşər hüquqları" və "xalq hakimiyyəti" kimi şüarlar asanlıqla kələk və müəyyən məqsədlər üçün vasitəyə çevrilir. Belə vasitələrlə hər hansı bir məqsəd üstüörtülü şəkildə xalqa yüklənilir.

Həqiqətdə bu üç əsas – haqq yolun ayırd edilməsi, peyğəmbər mirasının qorunması və ədalətli hökumət qurulması məsum imamın vücudunun fəlsəfəsini təşkil edir.





* * *

Bu məsələ ilə əlaqədar mövzumuzu İmam Rzadan (ə) imamətin fəlsəfəsi barədə nəql olunan bir hədis, eləcə də Əmirəlmöminin Əlinin (ə) "Nəhcül-bəlağə"də buyurduğu bir kəlamla sona yetiririk.

İmam Rza (ə) Mərvdə olarkən cümə günü Came məscidində camaatın qarşısında bir sıra məsələlərə toxunur. O cümlədən buyurur:

اِنَّ الْاِمامَةَ هِیَ مَنْزِلَةُ الْاَنْبِیاء، وارِثُ الْاَوصِیاء، اِنَّ الْاِمامَة خِلافَةُ اللهِ وَخِلافَةُ الرَّسوُلِ... اَلْاِمامُ اَلْبَدْرُ الْمُنیرُ، وَالسِّراجُ الزّاهِرُ، وَالنُّورُ السّاطِعُ، وَالنَّجْمُ الْهادِی فِی غَیاهِبِ الدّجی... اَلْاِمامُ اَلماءُ الْعَذبُ عَلی الظَّمّاء وَالدّالُّ عَلی الْهُدی، وَالمُنْجِی مِنَ الرَّدی... اَلْاِمامُ السَّحابُ الْماطِرُ، وَالْغَیثُ الْهاطِلُ، وَالشَّمْسُ الْمُضِیئَة... اَلْاِمامُ امینُ اللهِ فِی خَلْقِهِ، وَحُجَّتُهُ عَلی عِبادِهِ، وَخَلِیفَتُهُ فِی بِلادِهِ... نِظامُ الدِّینِ، وَعِزُّالْمُسْلِمِینَ، وَغَیْضُ الْمُنافِقِینَ، وَبوارُالْکافِرِینَ

"Şübhəsiz, imamət peyğəmbərlərin məqamı və vəsilərin irsidir. İmamət Allahın nümayəndəliyi, Peyğəmbərin (s) xilafəti və canişinliyidir... İmam parlaq ay, işıqlı çıraq, şölələnən nur, zülmət və qaranlıqda hidayət ulduzu və süqutda xilaskardır... İmam yağış dolu bərəkətli bulud, ardıcıl (dirilik) yağış və parlaq günəşdir... İmam yaranmışlar arasında Allahın əmri, bəndələri üzərində Onun höccəti və canişinidir... İmamın vücudu ilə din nizamlanır, müsəlmanlar izzət qazanır, münafiqlər qeyzdən yanır və kafirlər həlakətə yetir".

Əmirəlmöminin Əli (ə) qısa bir kəlamla imamət həqiqətini açıqlayaraq buyurmuşdur: "Müsəlmanların işlərində imamın mövqeyi təsbeh dənələrini bir-birinin kənarında nizamla yığan ipə bənzəyir. Əgər ip qırılsa, onlar dağılar ətrafa (imam olmasa, cəmiyyət bir-birinə dəyər, nizam-intizam pozular) və heç vaxt onları bir yerə yığıb nizamlamaq olmaz!"[51]

.................................

[51] *Şirazi M. İmamət haqqın dili ilə, tərcümə edəni Rza Şükurov, Bakı, 2010, səh. 22-28*





Bu qeydlər Füzulinin imamətə dair görüşləri ilə uyğundur[52].

Kərbəla vaqeəsi, İmam Hüseyn hərəkatı VII yüzillikdə ovaxtaqədərki bəşər mədəniyyətinin, dünya sivilizasiyasının obyektiv tarixi təzahürü kimi meydana çıxmışdır. Dünya ədəbiyyatının ən qabaqcıl simalarından olan Məhəmməd Füzuli də istər özünün fərdi dünya görüşü, istərsə də ictimai mövqeyi baxımından bu ulu din böyüyünə bəslədiyi məhəbbətlə böyüyüb boya-başa çatmış, hər an onun əziz adına sığınmış, dindar və vətəndaş kimi səmimi bir imam hüseynsevər olmuşdur. Bu, şairin tərcümeyi-halından da görünür. Belə ki, "Füzulinin anadan olduğu yer qəti şəkildə müəyyənləşdirilməmişdir. Onun "Füzuli Bağdadi" adı ilə məşhur olmasına söykənənlər şairin Bağdadda doğulduğunu qeyd etmişlər. Eyni zamanda, Füzulinin Hillədə, Kərbəlada doğulması qənaətində olanlar da az deyil, lakin şairin öz əsərlərinə, xüsusilə farsca divanının müqəddiməsinə əsasən demək olar ki, Məhəmməd Süleyman oğlu Füzuli Kərbəlada doğulmuş, Bağdadda təhsilini davam etdirmiş, bir müddət Nəcəfdə Əmirəlmöminin Əli əleyhissalamın türbəsində, sonra Kərbəlada İmam Hüseynin türbəsində mücavir (pir və ya məscid xidmətçisi) olmuş, vəfat etdikdə, vəsiyyətinə görə, İmam Hüseyn türbəsi civarında dəfn edilmişdir"[53].

Göründüyü kimi, Füzuli–İmam Hüseyn (ə) bağlılığı tərcümeyi-hal faktı olub, şairin keçdiyi ömür-gün yolunun lap əvvəlindən başlanır. Milli filologiya geniş faktoloji bilgilərə söykənərək çox doğru qeyd edir ki, "Füzuli Kərbəla şəhidlərinə rəngi, ruhu heç zaman soluxmayan möhtəşəm bir abidə ucaltmışdır. Son mənzili də Kərbəla şəhidlərinin ulusu – İmam Hüseyn (ə) türbəsi oldu. Ruhu həmişə əziz tutduğu şəhidlərin ruhu ilə calaşdı, torpağı şəhid qanı ilə suvarılmış torpağa qarışdı. Azərbaycan-türk şairi Füzuli bu gün Kərbəlada bütün

[52] *Almasov V. Həzrəti Əli aşiqi Füzuli, Bakı, 2010, səh. 26-57*

[53] *Məmmədzadə H. Füzuli əsərlərinin yeni nəşri, Füzuli. Əsərləri, 6 cilddə, VI cild, Bakı, 1996, səh.16*







*İmam Əli (ə)-ın müqəddəs məzarı. İraq. Nəcəf şəhəri*

dünya müsəlmanlarının səcdə (sayğı və güvənc – **V.A.**) yeri olan İmam Hüseyn türbəsində uyuyur"[54].

Yaxud: "Mütəfəkkir bir şair olan Füzuliyə "Hədiqətü-s-süəda" nı yaratmaqda Kərbəla mühiti də az təsir göstərməmişdir. Bu mühit Füzuli kimi bir dühanın qələmindən çıxan yeni bir türk məqtəlini çoxdan gözləyirdi. Bu mənəvi ehtiyacı nəzərə alan şair qədim dini dastanı öz yaradıcılıq süzgəcindən keçirərək onun dolğun, təravətli örnəyini yaradır, əski etiqad və iman mübarizəsini parlaq boyalarla bəzəyərək özünəməxsus bir şəkildə canlandırır"[55].

Bu qeydlər Füzuli–İmam Hüseyn (ə) bağlılığının tərcümeyi-halla bitmədiyini göstərir. Əksinə, bu qeydlər göstərir ki, bu əlaqə ilk növbədə üzvi və dəruni bir ruhi-mənəvi özülə söykənir, şairin ictimai-mədəni kimliyini, ədəbi simasını və bədii-estetik dünyaduyumunu formalaşdıran aparıcı amillərdən birini təşkil edir. Şairin Qurani-Kərimi, Peyğəmbər hədislərini, Həzrət Əli (ə) "Nəhcül-bəlağə"sini dərindən

[54] *Rüstəmova A. Məhəmməd Füzuli, Azərbaycan ədəbiyyatı tarixi, 6 clddə, III cild, Bakı, 2009, səh. 390*

[55] *Səfərli Ə. Ön söz, Füzuli. Əsərləri, VI cild, Bakı, 2005, səh.7*



bilməsi sırf müsəlman həyat tərzi keçirməsi, etiqadca cəfəri məzhəbindən, şiə olması bu bağlılıq üçün sarsılmaz dini-məfkurəvi bünövrə yerində durur.

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri özünü bir neçə qatda və yöndə göstərir. Belə ki, şair yerinə görə son dərəcə açıq danışır, yerinə görə sözaltı söz deyir, yerinə görə də nəqli dəlilləri – ayə, hədis, xəbər və mənqəbələri köməyə çağırır, onların daşıdığı fəlsəfi-estetik və dini-didaktik məzmunu qabağa verir. Odur ki, sənətkarın bu səpkili qeydləri gah sənədli oçerk təsiri bağışlayır, gah publisistik ton kəsb edir, gah da bədiilik donu geyir. Ötəri deyildir ki, milli ədəbiyyatşünaslıq "Hədiqətü-s-süəda"nı belə qeydlərin toplusu sayır, onun bütün bu tərəfləri özündə birləşdirdiyini göstərir. Möhsün Nağısoylunun müşahidəsinə görə, Ə.Səfərli Füzulinin nəsr əsərləri haqqındakı son araşdırmasında[56] "Hədiqətü-s-süəda"nı bədii nəsr tariximizdə roman janırının ilk nümunəsi" kimi dəyərləndirir. "Hədiqətü-s-süəda"dakı hadisələr tarixi səciyyə daşıdığı və ilkin qaynaqlara əsaslandığı üçün əsəri sənədli tarixi-bədii roman kimi də dəyərləndirmək olar[57].

* * *

Füzulinin İmam Hüseyn hərəkatından son dərəcə açıq danışmasına əsərin "Xatimə"sində Əhli-beyt əsirlərinin Şama aparılmasının təsviri zamanı rast gəlirik. Bölüm belə başlanır: "Hikməti-baliğeyi-rəbbani binayi-mükəvvənat və qürdrəti-kamileyi-müsəvviri-əşkali-mövcudat böylə iqtiza qılmış ki, bünyeyi-vücudi-bəşər məzhəri-cəmi'i-sifat olub, gah ətvari-sütudələri-ə'mali-zəmimələrinə qalib düşüb, rif'əti-iqtidarləri məlayikədən ə'la ola və gah əf'ali-qəbihələri

.................................

[56] *Səfərli Ə. Azərbaycan dini-bədii və satirik nəsrinin banisi Məhəmməd Füzuli – 500, Bakı, 2000, səh.3-64*

[57] *Nağısoylu M. Füzulinin "Hədiqətü-s-süəda" əsəri, Bakı, 2002, səh.66*





əxlaqi-həmidələrinə fayiq olub, rütbeyi-e'tibarların İblisdən ədna qıla. Və bə'zi ərbabi-həqayiq ki, aləmi-kövnü fəsada insani-kəbir demiş, bu mə'naya mütəzəmmindir ki, surəti-aləm həmişə mütənəvve' və mütələvvindir. Gah məsnədi-xilafətdə xüləfayi-ədalətşüar və səlatini-rə'fətdisar istiqrar bulub ərbabi-küfrü tüğyan məqhur olub və gah səriri-əyalətdə müluki-cəfapişə və hükkami-sitəməndişə mütəməkkin olub, əshabi-əqlü imanı məğbunü məxzul qılur. Ol cümlədəndir Yezidin əyyami-istiqlali-hökuməti ki, cəmi'i-əf'ali-zəmi-məyə came' olub, cəhanı darülfəsad etmişdi və Hüseyni-məzlumun zəmani-istilayi-möhnəti ki, təmamiyi-əxlaqi-kə-riməyə məzhər vaqe' olub, aləmi-surətdə müsibətü məlalı kəmala yetmişdi. Bilmək gərək ki, dövri-Adəmdən Xatəmi-Ənbiyayadək cəmi'i-ə'sarü ənsarda təmamiyi-əfradi-insana vaqe' olan əsnafi-bəliyyatı cəm' etsələr, Kərbəla müsibətinin bindən birinə bərabər olmaz. Və e'tiqad etmək gərək ki, sayiri-bəliyyatın eyni vaqieyi-Kərbəlanun təsəvvürüncə həqiqət əhlinə əsər qılmaz"[58].

*(Yaradılış binasının əsasını qoyan Xaliqin hikməti və bütün mövcudatın təsvirini verən rəssamın qüdrəti belə lazım bilmişdir ki, başər vücudunun əlamətləri cəm olub, gah bəyənilmiş cəhətləri digər cinayətlərinə üstün gəlməklə məqamları məlaikdən uca ola, gah da pis əməlləri gözəl əxlaqlarına faiq gəlib rütbələri İblisdən aşağı enə. Aləm həmişə surət etibar ilə dəyişkən və əlvan olduğundan bəzi həqaiq də yanılaraq, aləmə insan demişlər, bu səbəbdəndir ki, gah xilafət məsnədində ədalətli bir sultan qalib gələrək küfr və tüğyan əhlini qəhr edir, gah da zülm və cəfanı özünə peşə qılmış bir zalım hakimiyyətə keçib, iman əhlini zəlalətə salır. Yezidin hakimiyyəti bu sonuncuya aiddir ki, o öz ətrafına zalım və caniləri yığaraq dünyanı fəsad yuvasına çevirmişdir. Hüseyni-məzlumun da möhnəti bu idi ki, o, bütün gözəl əxlaqa sahib olmaqla bərabər, aləmi-surətdə ağır müsibətlərlə*

.................................

[58] *Füzuli. Əsərləri, VI cild, səh.339*





*kamalə yetmişdi. Bilmək gərəkdir ki, Adəmdən Xatəmi-Ənbiyaya qədər cəmi-insana üz verən bəla və müsibəti toplasalar, Kərbəla müsibətinin mindən birinə tay ola bilməz. Və etiqad etmək gərəkdir ki, Kərbəla vaqeəsinin eyni olan digər bəlaların heç biri həqiqət əhlinə bu qədər təsir etməz).*

Göründüyü kimi, parça büsbütün ictimai-siyasi və mədəni mühitin dəyərləndirilməsi üzərində qurulmuşdur. Bu dəyərləndirmədə diqqəti çəkən ilk cəhət müəllifin öz mülahizələrini metafizik səpkidə söyləyib onları ilahi başlanğıca bağlaması, Allahın qüdrət və hikmətini yeganə təkanverici amil hesab etməsidir. Bu baxımdan parça "Mətlə'ü-l-etiqad"ın başlanğıcı ilə yaxından səsləşir: "Mümkünatı yaratmaq feyzi ilə şərəfləndirən, onları Öz Varlığının vacibliyinə sübut göstərən Kimsəyə həmd edirəm ki, O, insanı dinin ehkam və qaydalarını anlaması ilə mümkünat içərisindən seçib ayırmış və insanlar içindən peyğəmbərləri öz bəxşiş xəzinələrinin açarları olan dəlillərlə insanlara elçi göndərmiş, peyğəmbərlərdən bizim Peyğəmbəri (s) seçərək, onun gəlməsi ilə aləmlərə göndərdiyi vəhyə son qoymuş, bizi isə ona itaət etmək şərəfi ilə başqa ümmətlərdən seçmiş və bizimlə mələkləri onun şahidləri etmişdir. Uşaqlıqların səhifələrində bədən üzvlərinin şəklini və hissələrinin surətini çəkən kimsəyə şükür edirəm ki, O, onları nəfslər, ağıllar, duyğular və qüvvələrin mərkəzinə çevirmiş Adəmə adları öyrətdiyi kimi, onların iliyinədək ruh aşılamışdır"[59].

Göründüyü kimi, "Hədiqətü-s-süəda"da "Yaradılış binasının əsasını qoyan Xaliqin hikməti və bütün mövcudatın təsvirini verən rəssamın qüdrəti" səciyyəsi "Mətlə'ü-l-etiqad"da fəlsəfi traktatın tələblərinə uyğun olaraq geniş miqyasda mənalandırılır. Əgər traktatın iki cümləlik bu girişinə müxtəsər nəzər salsaq, orada 20-dən çox dini-fəlsəfi mətləbin yığcam biçimdə əksini tapdığını görərik: "varlığın vacib və mümkünat" deyə iki yerə bölünməsi, xilqət, ilahi yaradıcılıq

.................................

[59] *Füzuli. Əsərləri, beş cilddə, V cild, Bakı, 1985, səh. 86*



feyzi, bəndəlik şərəfi, Alaha həmd, insan şüuru, peyğəmbərlik, Tanrı mərhəməti, vəhy, sonuncu Peyğəmbər olma, itaət, ibadət, ümmət, insan-mələk münasibəti, ilkin yaradılış, nəfs, ağıl, duyğu və qüvvə tarazlığı, Adəm Peyğəmbər, ruh və s.

Araşdırdığımız parçanın "bəşər vücudunun əlamətləri cəm olub, gah bəyənilmiş cəhətləri digər cinayətlərinə üstün gəlməklə məqamları məlaikdən uca ola, gah da pis əməlləri gözəl əxlaqlarına faiq gəlib rütbələri İblisdən aşağı enə" şəklindəki bölümünü heç vəchlə cəbrilik yönümündə anlamaq olmaz. Ona görə ki, "Mətlə'ü-l-etiqad"da Füzuli cəbrilərlə əşərilərin başlıca mübahisə predmetləri olan qəza və qədər, Tanrı təqdiri probleminə aydınlıq gətirir və mötəzililərin mövqeyini təqdir edir. Belədə həmin parçanın üst qatına aldanaraq onu qətiyyən faili-muxtarlığın ziddi saya bilmərik.

Bəs niyə Füzuli məsələni belə qoymuşdur? Oradan başlayaq ki, "Hədiqətü-s-süəda" ilk növbədə bədii əsərdir və Füzuli də qarşısına qoyduğu yaradıcılıq istəyinə uyğun olaraq hər bir məsələni, hər şeydən öncə, estetik baxımdan qiymətləndirməlidir. Belə qiymətləndirmə isə prosesləri vəhdətdə götürüb küll halında dəyərləndirməyi, həyat həqiqətlərinin fərdi və ictimai münasibətlər sisteminin alt qatına enməyi tələb edir. "Hədiqətü-s-süəda"dakı bəyənilmiş cəhətlər və digər "cinayətlər", "pis əməl" və "gözəl əxlaq" ziddiyyətləri, "mələk-İblis" müqayisəsi İslamiyyətin "mürəkkəb insan" konsepsiyasına uyğundur. Mübarək "Tin" surəsinin 4-6-cı ayələri bu konsepsiyanın dəlilidir. Lakin əsərdən gətirilən mətnin ardında şair tədricən sözü cəmiyyət hadisələri, ictimai subyektlər üstünə gətirərək deyir ki, "aləm həmişə surət etibarilə dəyişkən və əlvan olduğundan bəzi həqaiq də yanılaraq aləmə "böyük insan" demişlər".

*Ey könül, aləmə aldanma, sənə rəng verir,*
*Xakdur ki, anı gəh lə'l qılır, gah xəzəf, –*

beyti səpkisində olan "Aləmin həmişə surət etibarilə dəyişkən və əlvan olması" fikrini Füzulinin təbii-fiziki prosesləri





danması kimi başa düşmək olmaz. Əksinə, bu fikirlə o, İmam Hüseynin (ə) Aşura günündə oxuduğu xütbədəkinə oxşar bir mövqe ortaya qoymuşdur. O ulu din böyüyümüz həmin xütbəsində belə buyurur: “(Dünya) haldan-hala salmaqla insanları öz ixtiyarında saxlayır, idarə edir. Aldanmış o kəsdir ki, dünya onu aldadıb. Azğın və bədbəxt o kəsdir ki, dünya onu fitnə-fəsada salıb. Bu dunya sizi aldatmasın! Çünki o, ona arxalananların ümidini hər yerdən üzər və kim dünyada bir şeyə tamah salsa, dünya onun tamah saldığını xəyala çevirər, puça çıxarar”.

“Leyli–Məcnun” məsnəvisindəki Tanrıya yalvarış da bu tendensiyanın bədii ifadəsi təsiri bağışlayır. Çox güman ki, Füzuli aşağıdakı misraların ruhunu ağası İmam Hüseynin yuxarıdakı parlaq müddəa və qənaətlərindən yoğurmuşdur:

*Rahi-tələbində biqəraræm,*
*Əmma tələbimdə şərmisarəm.*
*Doğru yola getmədim, nə hasil?!*
*Bir mənzilə yetmədim, nə hasil?!*
*Hər ərsədə hər əsər ki gördüm,*
*“Sənsən!” deyub ol əsəd, yügürdüm.*
*Çün verdi xəyal ona xəmu-piç,*
*Mən münsəhil oldum, ol əsər hiç!*

Zənnimizcə, “surət etibarilə” ifadəsinə xüsusi diqqət yetirməliyik, çünki bu, Füzulinin hadisələrin məğzində əslində vahid qüvvə dayanması qənaətində olduğunu göstərir. “Hədiqətü-s-süəda”nın “İbtilayi-Əyyub” fəslindəki bir şeirdən bu, çox açıq görünür:

*Birdürür məsdəri-cəlalü cəmal,*
*Bil bilür qəhrü lütfü əhli-kəmal.*
*Gərçi əhvali-müxtəlif çox olur,*
*Birdir əsli-həqayiqi-əhval!*





"Bəzi həqaiq də yanılaraq aləmə "böyük insan" demişlər" nəticəsinə səbəb yerində duran yuxarıdakı fikir Kərbəla vaqeəsinə ikili baxışa işarə olmaqla yanaşı, cəmiyyətin yaradıcı və qurucu ruhda tərbiyəsinə hesablanmış ideya kimi də diqqəti çəkir. Bu isə o deməkdir ki, Kərbəla vaqeəsi kimi tarixin dönüm nöqtəsini təşkil edən ağır və taleyüklü hadisələri doğru-düzgün qiymətləndirməyi bacarmayan filosof və sosioloqların səhv addımları Füzulinin gözündən qaçmamışdır. Şair burada nə qədər yumşaq danışsa da, rəyini, münasibətini kifayət qədər aydın çatdıra bilmişdir. Heç şübhəsiz, onun bu mövqeyi simasız salnaməçilərə və saray məddahlarına qarşı yönəldilmişdir. Ötəri deyildir ki, bu gün də qatı cinayətkar olan Yezidə "əmirəlmöminin" deyərək haqq qazandıranlar tapılır, guya onun İmam Hüseyn (ə) və tərəfdarlarının qətlindən xəbərsiz olduğu iddia edilir. Əlixan Musayevin "İmam Hüseyn" kitabında bu murdar və idbar insanlıq düşməni haqqında ədalətli xəlifə kimi danışılması, hər vəchlə ona bəraət qazandırılması, hakimiyyətinin legitimliyinin sübutuna çalışılması, bütün bunlar üçün dəridən-qabıqdan çıxılması bu qəbildəndir. Füzuli olduqca doğru mövqe tutaraq "İblisdən aşağı enən", "fəsad yuvası olan" Yezidi "ədalətli xəlifə" adlandıranlarla nəinki barışmamış, hətta bunu bəşəriyyətə atılmış ən böyük böhtan saymısdır. Parçanın ardı şairin mövqeyi ilə bağlı daha aydın anlayış əldə etməyə imkan verir. Belə ki, "zülm və cəfanı özünə peşə qılmış bir zalımın hakimiyyətə keçib iman əhlini zəlalətə salması" müşahidəsi son nəticədə Yezid hakimiyyəti haqqında qəti qənaətə gətirib çixarır: "O öz ətrafına zalım və caniləri yığaraq dünyanı fəsad yuvasına çevirmişdi".

Yezidin öz vəziri Sərxunla məsləhətləşməsi və Sərxunun ona Übeydullah ibn Ziyadı Kufəyə vali göndərməyi təklif etməsi yuxarıda hansı zalım və canilərdən danışıldığını göstərir: "Sitəmkar və bədkirdar Yezidin dövlət əyanları bir gün cəm olub onu hiylə ilə fəsad yoluna yönəltdilər və



başa saldılar ki, əgər istəyirsən hakimiyyətin uzunmüddətli və nizamlı olsun, atan Müaviyənin zamanında beyətə xilaf çıxanları beyətə gətir. Beyətə boyun qoymasalar, onların izini-tozunu yer üzündən götür ki, sənə müxalifət edib hökumətin qanunlarını pozmasınlar.

O, bu uğursuz nəsihəti qəbul edib Mədinə hakiminə bu məzmunda məktub yazdırdı: "Haqlı yolla yer üzünün xəlifəsi olan və xilafət məsnədində müstəqil İslam imarəti quran Müaviyə bin Əbu Süfyan dünyadan gedib. İndi hökumət işlərinin icrası mənə yetişib. Lazımdır ki, böyüklü-kiçikli, varlı-kasıb, hər növ bəni-adəm məni imam və xəlifə bilib itaətimdən boyun qaçırmayalar. İndi ki sən Mədinə valisi Vəlid bin Ütbəsən, gərəkdir ki, o diyarda olan böyüklərdən və əşrafdan, xüsusilə atamın zamanında mənə beyət etməkdən boyun qaçırmış adamlardan mənim üçün beyət alasan. Əgər qəbul etməsələr, onları qətlə yetirib başlarını Şama göndərəsən və mənim lütfümə ümidvar olasan!"[60]

Göründüyü kimi, bu təsvir yuxarıdakı ümumi səciyyələndirmənin xüsusi bədii açıqlamasıdır. Deməli, Füzulinin gözündə Yezid əldə oyuncaq olan yelbeyin hökmdar yox, əksinə, zalım və caniləri öz ətrafına yığan və bununla da dünyanı fəsad yuvasına döndərən, zülm və cəfanı özünə peşə qılmış zalım hökmdardır.

Araşdırdığımız parçada İmam Hüseyn (ə) şəxsiyyətindən və Kərbəla şəhidlərindən isə heyranlıqla danışılır. Onlardan təkcə müqəddəsat kimi deyil, cəmiyyətin mübariz fəal təbəqəsi kimi də söz açılır və bununla da onların ictimai fəaliyyətinə və tarixi xidmətinə, həqiqi siyasi-fəlsəfi qiymət verilmiş olur.

"Filvaqe' Kərbəla bir büq'eyi-şərifdir ki, canibi-Həqdən anda rütbəyi-ehtirami-xanədani-risalət və tə'zimi-dudmani-nübüvvət kəmala yetmiş və həqiqəti-zülmi-əşqiya və səbri-övliyada olan əsrari-hikmət zühura yetmiş. Zəhi bədbəxtlər ki anın kibi büq'eyi-şərifdə mahi-məhərrəm ki müqəddəmi-

[60] *Füzuli. Kərbəla vaqiəsi, səh. 14-15*



şühuri-mədari-aləmdir və ruzi-cüm'ə ki sayir əyyamdan ehtiramla müqəddimədir və vəqti-zöhr ki zəmani-iqəmətasari-Rəsuli-mükərrəmdir hörməti-Rəsulullahı riayət qılmayub övladına sitəm rəva gördülər və Həzrəti-Vacibülvücudun səbrin kəndülərinə nüsrət təsəvvür edüb vacibüt-tə'zim olan cəmaəta ihanət yetürdilər. Çün bu mahi-mübarəkdə Əhli-beyti-risalət nəhayəti-məlalət bulmuşlar və qayəti-iztirabla mütəfərriqü pərişan olmuşlar, lacərəm tərki-sürur qılub təriqeyi-matəm rəayət edənlərə şərəfi-intisabi-Əhli-beyti-risalət müqərrərdir və məlalətlərinə şərik olanlara səvablarla şirkət müyəssərdir"[61].

*(Həqiqətən Kərbəla bir şərəfli yerdir ki, orada Allah tərəfindən peyğəmbərlik xanədanının böyük hörməti tamamlanmış, bir tərədən quldurların zülmünün mahiyyəti, bir tərəfdən də övliyaların səbrindəki hikmət sirləri ortaya çıxmışdır. Sən bir bədbəxtlərə bax ki, onun kimi şərəfli bir yerdə, fəsilləri dövr etdirən ayların başı olan məhərrəm ayında, başqa günlərdən daha ehtiramlı olan cümə günündə və Rəsuli-Əkrəmin cəlalla camaat namazı qıldığı günorta vaxtı İslam rəhbərinin hörmətini saxlamayıb zülmü övladlarına rəva gördülər və ən vacib varlıq olan Allah-taalanın hikmətlə səbir etməsinin nadancasına öz xeyirlərinə olduğunu düşünüb, təzimi qaçılmaz olan Əhli-beytə xəyanət etdilər. Bu mübarək ayda Peyğəmbər Əhli-beyti sonsuz dərd-kədərə büründüyü və bitib-tükənməz iztirablarla pərən-pərən düşdüyü üçün əhlibeytsevərlərin, həqiqi dindarların və vicdanlı insanların şadlıqdan uzaq duraraq onlar üçün matəm saxlamağın qaydalarını gözləyənlərə Peyğəmbər Əhli-beytinin şərəf payından bir pay vardır və onların kədərinə ortaq olanlar bu böyük savabda iştirak etmiş kimidir və ləyaqətli qismət sahibidir).*

Bu hissə bizə İmam Hüseyn (ə) şəxsiyyəti və Kərbəla şəhidləri barəsində aşağıdakı başlıca qənaətləri çatdırır:

.................................

[61] *Füzuli. Əsərləri, VI cild, səh.339-340*





1. Ağır müsibətlər İmam Hüseyn (ə) üçün kamillik amili olmuşdur.
2. Kərbəla müsibəti məfkurə və fəaliyyət baxımından, peyğəmbərlər də daxil olmaqla, bütün bəşəriyyətin ən ağır sınağıdır.
3. Kərbəla vaqeəsi belə hadisələrin hamısından daha təsirlidir.
4. Bu təsiri həqiqət əhli, yəni arif kimsələr daha çox qavrayırlar.

* * *

Füzuli əsərin başqa yerlərində də Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatından açıq danışır. Məsələn, "Hədiqətü-s-süəda"nın "Həzrəti-sultan Hüseynin Mədinədən Məkkəyə təvəccöh etdigin bəyan edər" başlıqlı yeddinci babı belə başlanır: "Bu nüsxeyi-namı ki müsaidəti-xameyi-siyəhruzigari-əşkbarla zühura gəlür və bu nameyi-girami ki müavinəti-kilki-sərgəşteyi-biqərardan təhrir alur, zəfərnameyi-sultani-Kərbəla Hüseyn ibn Əliyyi-Mürtəzadür ki, dərd meydanından ələmi-ahi-cigərsuz çəkub və mərdümi-dideyi-namdidədən qanlar töküb, cəm'iyyəti-cüyuşi-bəliyyati-mövfurə və ictimai-əsakiri-məsaibi-qeyri-məhsurə ilə təsxiri-məmaliki-əltafi-sübhani etmiş və fəthi-əqalimi-'əvatifi-İlahi qılub, səltənəti-səriri təqdirdə dərəceyi-kəmalə yetmiş"[62].

*(Göz yaşı axıdan qara rüzgarlı qələmin razılığı ilə ortaya çıxan bu məşhur nüsxə və dözümsüz dövranın yazısının yardımı ilə düzüb-qoşulan bu əziz əsər Kərbəla sultanı olan Hüseyn ibni Əliyyi-Mürtəzanın zəfərnaməsidir. Çünki o, dərd meydanında ciyər yandıran ahdan bir bayraq ucaltmış və yaşla dolu gözünün bəbəyindən qan-yaş axıtmışdır. O, bu yolla Sübhan Allahın mərhəmət məmləkətlərini qazanmış və İlahi Şəfqət iqlimlərinə qovuşmuşdur. Bu da onu qəza və qədərin taxt-tacında möhkəm surətdə bərqərar etmişdir).*

.................................

[62] *Füzuli. Əsərləri, VI clddə, VI cild, Bakı, 2005, səh. 192*





“Hədiqətü-s-süəda”nın babları, Nizami “Sirlər xəzinəsi”nin məqalətləri kimi, iki hissədən ibarətdir. Birinci hissə nəzəri səciyyə daşıdığı halda, ikinci hissədə orada irəli sürülmüş fikirlərə uyğun hekayətlər verilir. Odur ki, babın başlanğıcı Füzulinin estetik kredosunu əks etdirir. Ona görə ki, burada əsər boyu səpələnmiş ideyaların, əsərə yön verən islami müddəaların məğzi yığcam biçimdə açıqlanır. Onları belə ümumiləşdirmək olar:

**1. “Sultani-Kərbəla”.** İlk baxışdan çox sadə bir deyim olan bu ifadə ilə Füzuli, əslində, İmam Hüseyni islami dəyərlər toplusunun ən layiqli daşıyıcısı, mənəviyyat aləminin ən yetkin və bitkin zirvəsi kimi təqdim edir. Məqtəllərdə ara-sıra nəzərə çarpan bəzi ştrixlər bunun tarixi və ədəbi baxımdan əsaslı olduğunu göstərir. Məsələn, belə bir epizod danışırlar ki, Tasuadan Aşuraya keçən gecə İmam Hüseyn vaxtilə məktub yazıb onu Kufəyə çağıran, amma indi qılınc götürüb qanını tökmək istəyən yüzlərlə şəxsin imza atdığı kağızları yandırmışdır. Bunun səbəbini soruşanlara o, belə cavab verir: “Doğrudur, indi onlar mənimlə düşmənçilik edirlər. Ancaq unutmayın ki, mən onların da imamıyam. İstəmirəm ki,



*İmam Əli (ə)-ın müqəddəs məzarı. İraq. Nəcəf şəhəri*



yazdıqları məktublar Yezidin adamlarının əlinə düşüb onlara zərər versin".

Zənnimizcə, ətraflı izahata ehtiyac duyulmur. Belə alicənablığı yalnız sultani-Kərbəla – Tanrı qatında böyük dəyəri olan əlçatmaz-ünyetməz bir saf mənəviyyat sahibi, igidlik və şəhidlik məktəbinin ən kamil ustadı edə bilərdi!

**2. "Hüseyn ibni Əliyyi-Mürtəza":** Bu tərkib ilk növbədə tarixi təyindir. Ancaq tərkibin bədii-estetik yükü tarixi yükündən geri qalmır. Çünki İmam Hüseyn hərəkatı mahiyyətcə Həzrət Muhəmməd (s) və İmam Əli (ə) dünyagörüşünün, Peyğəmbər və Əli idarə üsulunun, Peyğəmbər (s) və Əli (ə) ədalətinin qanunauyğun davamıdır. İmam Hüseyn ağanın aşağıdakı sözləri bunun bariz təzahürüdür: "Camaat, mən sizi babamın və atamın getdiyi haqq yola qaytarmaq istəyirəm". Ötəri deyildir ki, qaynaqlar Həzrət Muhəmmədin (s) və İmam Əlinin (ə) Kərbəla vaqeəsinin baş verəcəyini onillərlə öncədən xəbər verdiyini bildirir. Həzrət Muhəmmədin (s) bu barədəki hədislərindən çox nümunə vermişik. Odur ki, indi İmam Əlinin (ə) məsələ ilə öncəgörmələrindən iki nümunə veririk: "Şəyban ibn Məhzəm bildirir ki, Həzrət Əli (ə) bir səfər zamanı Kərbəlaya çatdıqda belə buyurdu: "Bu yerdə elə şəhidlər qətlə yetiriləcəkdir ki, Bədr şəhidlərindən başqa onlara bərabər şəhid yoxdur".

Yaxud Hərsəmə bin Süleym bildirir: "Həzrət Əli ilə Siffeynə gedəndə Kərbəladan keçirdik. O, orada namaz qıldı, torpaqdan bir ovuc götütüb ətrini sinəsinə çəkdi və buyurdu: "Alqış sənə, ey torpaq, Qiyamət günü səndən elə insanlar dirilib qalxacaqdır ki, hesab-kitabsız cənnətə gedəcəklər!"

Göründüyü kimi, hər iki xəbər Kərbəla vaqeəsini bütün göstəriciləri ilə haqq işi uğrunda aparılan Həzrət Muhəmmədin (s) və İmam Əlinin (ə) başçılığı ilə aparılan Bədr, Uhud, Xəndək, Cəməl, Siffeyn, Nəhrivan kimi tarixi müharibələrin təbii və qanunauyğun davamı olaraq səciyyələndirir.





**“Zəfərnamə”:** Bəlkə də Füzuli məqtəli “Zəfərnamə” adlandıran yeganə ədibdir. Əslində, bu hal onun İmam Hüseyn hərəkatına verdiyi yüksək ictimai-siyasi qiymətdir. Çünki elegiya olan bir əsərin “Zəfərnamə” adlandırılması ilk növbədə ardıcıl, dönməz və sistemli bir dindar və vətəndaş münasibətinin, parlaq və aydın bir müəllif qayəsinin, səmimi bir imamhüseynsevər ədibin könül səsidir. Əsərin müxtəlif yerlərində İmam Hüseyn (ə) və Yezidin əlvan və rəngarəng boyalarla tutuşdurulması məhz buna xidmət edir; məs.: “Və müsibətnameyi-Yezidi-pürcəfadür ki, şəbistani-(qəflətdə) təhriki-həvayi-nəfslə, çirağı-tövfiqi-sə’adəti intifa bulmuş və seyli-Nili-zəxarifi-dünyayla binayi-imanü İslami viran olmuş”[63].

*(Cəfakar Yezidin törətdiyi müsibətlərin toplusudur ki, qafillik məclisində nəfsani istəklərin təsiri ilə xoşbəxtlik çırağının uğuru sönmüş və dünyanın seltək axan maddiyyat cilvələrinin “Nil”i ilə iman və İslam evi xaraba qalmışdır).*

“Filvaqe, əbdanından müfariqət edən ərvaha müşahideyi-əhvali-dünya mümkün olsa və nüfusi-insaniyyə inhilali-bədəndən sonra ümuri-dünyaya ettila’ bulsa, məlumdur ki, Həzrəti-Hüseyni-Əli çəkdügi cəfalərdən hasil etdügi sə’adətlə zəman-zəman məhzuz olub tərvici-məzar və tə’zimi-övlad və təksiri-mənaqibü mədayihdən Qiyamətədək nə miqdar təməttö’ olur və Yezidi-pəlid etdügi əməl cəzasın görüb, ləhzə-ləhzə təcəddüdi-lə’nət və tə’əddüdi-ənva’i-ihanət və təsərrö’i-zəhri-məzəmmətdən nə bəlalarla mütəəllim olur”[64].

*(Doğrudan da bədənlərindən ayrılmış ruhlara dünya hadisələrini müşahidə imkanı versə və insanın mənəviyyat qapıları bədən çürüdükdən sonra işlərin gedişindən xəbər tutsa, bəlli olar ki, Əli oğlu Hüseyn həzrətləri çəkdiyi cəfalardan əldə etdiyi səadətlə zaman-zaman həzz alaraq, mübarək məzarının günü-gündən şan-şövkət qazanması, övladlarının hörmətinin durmadan artması və barəsində*

.................................

[63] *Füzuli. Əsərləri, VI cild, Bakı, 2005, səh. 192-193*

[64] *Füzuli. Əsərləri, VI cild, Bakı, 2005, səh. 192-193*





*söylənilən xatirə və tərifin anbaan çoxalması nəticəsində Qiyamətədək bir gör nə qədər savaba çatır.*

*Ancaq murdar və idbar Yezid etdiyi əməllərin cəzasını görüb, hər an özünə oxunan lənətlərin təzələnməsi, ünvanına yönəldilən cürbəcür nifrət hisslərinin genişlənməsi və danlaq zəhərinin iti axını nəticəsində necə ağır ilahi əzablara düçar olur).*

İqtibasdakı ifadələr Yezidin özünün və başçılıq etdiyi hakimiyyətin mənfur simasını bütün çılpaqlığı ilə açıb göstərir. Bunun müqabilində İmam Hüseyn ilə bağlı deyimlər onun işıqlı portretini açıq cızır. Bütün bunlar Füzulinin Kərbəla şəhidlərinin şəninə ucaltdığı məqtəli "Zəfərnamə" adlandırmasına əsas verir.

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşlərinin ifadəsi olan daha bir parçaya diqqət yetirək: "Həqqa ki, Hüseyni-şəhidün zikri-vaqieyi-şəhadəti-mövcibi-təcdidi-kəmali-ixlasu e'tiqad olmağın eyni-ibadətdür və məzlumi-Kərbəlanın təkrari-vəqaye'i-müsibəti baisi-tənbihi-əhli-qəflət olduğu səbəbdən kəmali-səadətdür"[65].

*(Doğrudan da şəhid Hüseynin şəhidlik əhvalatının zikri xalisliyi və əqidəni bitkinləşdirdiyindən ibadət qədər önəmlidir və Kərbəla məzlumunun müsibətinin incəliklərinin dönə-dönə deyilib açıqlanılması qafillər üçün danlaq olduğuna görə ən böyük dini-dünyəvi xoşbəxtlikdir).*

Buradan anlaşıldığına görə, Füzuli İmam Hüseynin (ə) və tərəfdarlarının üzləşdiyi təsəvvürəgəlməz faciəni qələmə almağı özü üçün böyük bir şərəf bilir. Çünki bu, "qəflət yuxusunda olanları oyadar", onları əzəli-əbədi haqq işi uğrunda dönməz əqidə və iman mübarizinə çevirər. Belədə zülmə, haqsızlığa qarşı mübarizlik, ədalətsizliyə etiraz şüurlu məsuliyyət doğuraraq cəmiyyətin ən passiv təbəqələrini belə hərəkətə gətirər. Deməli, Füzuli tarixin dönüm nöqtələrindən

.................................

[65] *Füzuli. Əsərləri, VI cild, Bakı, 2005, səh. 193*





biri saydığı İmam Hüseyn hərkatına ilk növbədə ictimai-siyasi və iqtisadi-mədəni tərəqqinin, mənəvi-əxlaqi kamilliyin hərəkətəgətirici və istiqamətverici stimulu kimi baxır.

* * *

Ədibin İmam Hüseyn hərəkatına dair açıq şəkildə görüş bildirməsindən danışarkən "Kəznu-l-Qəraib" *("Qəribə hadisə və əhvalatlar xəzinəsi")* kitabından gətirdiyi bir epizoddan dərhal sonra birbaşa oxuculara üz tutması da diqqəti çəkir: "Ey əzizlər, məlaikeyi-asiman və vühuşi-ərz rəva görmədilər ki, bir qətrə əşki rəvan ola. Aya, anlar ki rüxsarın qərqeyi-xunab etdilər, nə cavab verərlər?"[66]

Bu müraciət Kərbəla şəhidlərinin qatillərinə yönəldilmiş böyük ittiham aktı kimi səslənir. Belə ki, Füzuli burada bir yandan çoxsaylı imamhüseynsevərlərə üz tutaraq onların həssas yerlərinə toxunmaqla vicdanlarını oyatmaq, şüurlarını ayıltmaq istəyirsə, o biri yandan göyün mələkləri və yerin vəhşiləri kimi iki uc nöqtəni bir araya gətirməklə bəşəri bir yanaşma biçimi ortaya qoyur.

İmam Hüseyn hərəkatına verilən ictimai-siyasi və sosioloji-fəlsəfi qiymət kimi bu, diqqəti çəkir ki, müraciətdə Hüseynin bir qətrə göz yaşına dözməyən göyün mələkləri ilə yerin vəhşiləri Hüseyni (ə) al qanına qəltan edən insanlardan üstün tutulur, dəyərli sayılır.

Ən nəhayət, "Bəs onu al qanına qəltan edənlər nə cavab verəcəklər" sualı öz ritorik səviyyəsini saxlamaqla yanaşı, ictimai cavabdehlik duyğusu və siyasi məsuliyyət hissi kimi dərin sosial məzmuna da malik olmaqla, Füzulinin İmam Hüseyn hərəkatına dair görüşlərinə bədii əsərdən qat-qat yüksəkdə duran bir yön verir ki, bu da təkcə şairin ədəbi irsi üçün yox, bütövlükdə Şərq ədəbiyyatı üçün orijinal keyfiyyətdir. Bu keyfiyyət prinsipcə bu gün də aktualdır və

..................................

[66] *Füzuli. Əsərləri, VI cild, Bakı, 2005, səh. 200*





bizi əhatə edən mürəkkəb ictimai-siyasi mühit içərisində hadisələri qiymətləndirməkdə tarazlı bir ölçüdür.

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri içərisində obrazlı şəkildə irəli sürülmüş fikirlər də vardır. Belə ki, "Hədiqətü-s-süəda"nın 7-10-cu bablarında bilavasitə əsərin baş qəhrəmanı İmam Hüseyndən bəhs olunur. Əsərin bu 4 babı həcmcə ilk 6 babından çoxdur. Həmin babların hər birində Kərbəla müsibəti ilə birbaşa bağlı olan və ustalıqla əlaqələndirilən hadisələrdən bəhs olunur"[67].

9-cu babda belə bir yer vardır: "Həqiqətən Kərbəla vaqeəsinin hərarəti elə bir ürəkyandıran atəşdir ki, əgər bir şöləsinin şərhini kargahi-qəza mühərriri bir günəş qələmi ilə yer üzünə yazsa, onun hərarətindən bütün torpaq cuşə gələr və onun buxarı asimanın təndirində Həməl və Hutu yandırar"[68].

Obrazın deyim tərzi, təmtəraqlı və təntənəli dil parçaya dünyagörüş kimi baxmağa əngəl törətmir, əksinə, müəllif münasibətinin təsir gücünü bir az da artırmış olur:

1. **"Ürəkyandıran atəş".** Kərbəla vaqeəsinin hərarətini "ürəkyandıran atəş"ə bənzətməsi Füzulinin İmam Hüseyn hərəkatına ilk növbədə mənəviyyat bəhsi kimi yanaşdığını göstərir. Belə ki, "kargahi-qəza mühərriri" – ilahi təqdir nizamlayıcısı, "günəş qələmi", "asimanın təndiri", "Həməl və Hut" obrazları özlərinin leksik vəzifələri ilə yanaşı, ictimai-siyasi və mənəvi-əxlaqi funksiyalarla da yüklənərək geniş məna-məzmun şəbəkəsi əmələ gətirmişlər. Bu isə "ürəkyandıran atəş" obrazını Yezid hakimiyyətinin törətdiyi tayı-bərabəri olmayan haqsızlığın, gözgörəsi ədalətsizliyin və açıq ictimai zülmün daşıyıcısına çevirir.

..................................

[67] *Nağısoylu M. Füzulinin "Hədiqətü-s-süəda" əsəri, Bakı, 2002, səh. 67*

[68] *Füzuli. Kərbəla vaqiəsi, səh. 51*





2. **“Bütün torpaq cuşa gələr”.** Burada Füzuli bütün torpaq dedikdə, yer üzünü nəzərdə tutur. Bununla şair Kərbəla vaqeəsinin genişliyinə işarə etmiş olur. O demək istəyir ki, İmam Hüseynin özünün və tərəfdarlarının başına gətirilmiş müsibət və fəlakətin az qismi bütün dünyaya çatdırıla bilsə, bu, bütövlükdə bəşəriyyəti möhkəm silkələr, ictimai-siyasi fəallığı artırar, üsyan və qiyamlar əmələ gətirər, silsiləvi inqilablar törədər. Ancaq “kargahi-qəza mühərriri”nin, yəni ilahi təqdirin və ictimai inkişaf qanunauyğunluqlarının həyata keçməsi üçün münbit zəmin olmadığından, əlverişli şərait yetişmədiyindən bu, hələ ki baş tutmur. Kərbəla vaqeəsindən 5-6 il keçər-keçməz şəhidlərin intiqamını almaq üçün kiçik silahlı dəstələrin yaranması bu müşahidənin doğruluğunu göstərir.
3. **“Kərbəla vaqeəsinin hərarətinin buxarı asimanın təndirində Həməl və Hutu yandırar”.** Füzuli bununla demək istəyir ki, kimliyindın asılı olmayaraq, heç kəs, heç bir ictimai dairə İlahi Ədalətin cəza mexanizmindən, esxotoloji aqibətdən, Tanrı qəzəbindən qurtula bilməz. Burada İslamın ilahi intiqam ideyasının, qisas konsepsiyasının, cihad fəlsəfəsinin təsiri aydın görünür.

* * *

Bu geniş iqtibaslar Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri baxımından olduqca dolğun və tutumlu olub, şairin Kərbəla vaqeəsinin bədii həlli və qoyuluşu yönündə var gücü ilə çalışdığını, öz sənətkarlıq imkanlarını sonadək səfərbər etdiyini, vətəndaş, dindar və ədib kimi imamın şəxsiyyəti qarşısında bütün varlığı ilə baş əydiyini, ürəyinin bütün telləri ilə qail olduğu imamını bədii sözün gücü ilə tanıtmağı, sevdirməyi qarşısına məqsəd qoyduğunu sübuta yetirir. Sənətkarın imamətlə bağlı mövqeyinin ayrılmaz tərkib hissəsi





olan bu görüşlər ayrıca düşüncə şəbəkəsi təşkil edə biləcək qədər genişdir. Odur ki, bu, yaxud başqa bir qeydi, şairin məsələ ilə bağlı son sözünü məsələnin Füzuli irsindəki sonuncu təzahürü saymaq olmaz. XVI əsrdə Azərbaycan türklərinin ictimai-mədəni inkişafının tamamilə təbii tarixi təzahürü kimi meydana çıxmış Füzuli irsi ən müxtəlif aspektlərdə öyrənildikcə başqa cəhətlərlə yanaşı, şairin dünyagörüşünün Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilə bağlı tərəfləri də köklü biçimdə və daha dərindən araşdırılacaq, dəqiq, aydın və birmənalı elmi-nəzəri qənaətlərə gəlinəcək, kəsərli və obyektiv nəticələr çıxarılacaqdır.

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşlərinin önəmli bölümünü də din böyüklərinin Kərbəla vaqeəsi haqqındakı hədislərindən əsərdə verdiyi iqtibaslarda axtarmaq gərəkdir. Bu, ona görə gərəklidir ki, şair Peyğəmbərin və imamların sözlərini misal gətirdikcə sanki şövqə gəlmiş, özü üçün möhkəm arxa tapmışcasına daha ürəklə qələmə sarılmış və cizgilərini cızdığı portret-obrazların ruhi-psixoloji aləminə daha dərindən nüfuz edə bilmişdir.

Ancaq daha maraqlısı budur ki, əsl imamhüseynsevər olan Füzuli burada bitərəf qala bilməmiş, zahiri qaydaları bir tərəfə, kənara qoyub şəxsi iradəsini ortaya ataraq tendensiyalı şiə münasibətini bildirmişdir.

“Filvaqe’, təəmmül etdikdə münasib görünür hədisi-səhih müqtəzasincə səfineyi-Nuha Əhli-beyti-risalət. Zira həvayi-nəfsi-əshabi-inadla dəryayi-məsayib mütəlatim olduqda və səhrayi-Kərbəlayi tufani-bəla əhatə qıldıqda hər kim Əhli-beytə daxil idi, bəlayi-mə’siyətdən nəcat buldu və hər kim xaric idi, həlak oldu”[69].

*(Doğrudan da dərindən düşündükdə, birmənalı surətdə aydın olur ki, Rəsulullahın doğru-düzgün sözünə uyğun olaraq*

.................................

[69] *Füzuli. Əsərləri, VI cild, səh. 42*



*həqiqi Nuh gəmisi əslində Peyğəmbər Əhli-beytidir. Ona görə ki, inadcıl, davakar səhabələrin nəfsi istəkləri nəticəsində müsibət və fəlakətlər dənizi coşub-daşdığı və Kərbəla səhrasını bəla tufanı bürüdüyü zaman Əhli-beytə daxil olan kimsələr günahkarlıq bataqlığından qurtuldu, ancaq Əhli-beytə daxil olmayan kəslər həlak oldular).*

Doğrudur, əsərin müvafiq hissələrini araşdırdığımız zaman biz belə islami bilgilər üzərində ayrıca dayanacağıq. Ancaq indiki halda yuxarıda irəli sürdüyümüz mülahizənin tətbiqi üçün bu səpkili bir-iki örnəyə ehtiyac duyuruq.

**1.** "Uyunür-Riza"da Hüseyn ibn Əlidən nəql olunur ki, bir gün Cəddimin xidmətindəydim. Əbi ibni Kəb də orada idi. Həzrət Rəsul (s) buyurdu ki, "mərhəba və həyyən bikə ya Əba Əbdillahi, ya zəynəs-səmavati vəl ərzi", yəni, ey Əbdillahın babası, ey göylərin və yerin zinəti, sənin həyatına and olsun!

Əbi ibni Kəb dedi: "Ya Rəsulullah, asimanü zəmində səndən qeyri zinət varmı?"

Həzrət Rəsul (s) buyurdu: "Ya ibni Kəb, Allaha and olsun, Hüseyn həqq mərkəzinin bəzəyi, kainat səhifəsinin zinətidir. Onun ismi-şərifi ərşin uğurlu lövhəsində hidayət çırağı ilə yazılmışdır"[70].

Oradan başlayaq ki, şərqşünaslıq elminin yekdil qənaətinə görə, müqəddəslərin özləri haqqında olan hədisləri nəql etmələri qətiyyən qeyri-etik səciyyə daşımır, əksinə, tarixi dəqiqlik baxımından daha mötəbər hesab olunur. Odur ki, Füzulinin burada həm mənbəni göstərməsi, həm də bilavasitə İmam Hüseynin özünün iştirakının bildirilməsi hədisi nəqli və əqli baxımdan bir az da önəmli edir.

Hədisin İmam Hüseyn şəxsiyyətinin qiymətləndirilməsi ilə bağlı bilgilərinə gəldikdə isə, aşağıdakı cəhətlər önə çəkilə bilər:

**a) Həzrət Məhəmmədin İmam Hüseynin həyatına and içməsi**. Ən əski çağlardan üzü bəri and içmək ulu tutulmuş,

................................

[70] *Füzuli. Kərbəla vaqiəsi, səh. 10-11*



ən müxtəlif təbii-fiziki və ruhi-mənəvi məfhumlar and yeri olmuşdur. Qurani-Kərimdə olan andlar İslamın bu barədə ayrıca konsepsiyaya malik olduğunu göstərir. Belə ki, Ulu Yaradan Şanlı Kitabında 20-si maddi və 20-si də mənəvi olmaqla 40 anlayışa and içir. Allah-taala onları Özünün qüdrət və hikmətinə inandırmaq üçün vasitəyə çevirir. Əgər hədisdə Həzrət Muhəmməd İmam Hüseynin həyatına and içirsə, Müqəddəs Kitabımızda Rəbbimiz "Lə əmrukə" deyərək Həzrət Mühəmmədin ömrünə and içir *("Hicr", 82)*. Dini elmləri çox gözəl bilən Seyid Əzim Şirvani bütün varlığını bürümüş Peyğəmbər sevgisini dilə gətirəndə bu sarsılmaz dəlili bədii gözəlliyə çevirmişdir:

*Ey qoyan başinə izzətlə "Lə əmruk"dən tac,*
*Şahsan, feyzinə məcmuəye-aləm möhtac!*[71]

*(Ey Allahın "sənin ömrünə and olsun" kəlamı başının tacı olan Peyğəmbər, sən bütün peyğəmbərlərin hökmdarısan. Odur ki, bütövlükdə bəşəriyyət sənin tükənməz ruhi-mənəvi gücünə, hamıya yetə biləcək qədər bol və geniş olan şəfaət səlahiyyətinə, hər kəsə və hər şeyə bəxş etdiyin sonsuz zövq mənbəyinə ehtiyac duyur).*

Hədisin bir bölümünü ərəbcə verməklə Füzuli məsələnin önəmini vurğulamış, irəli sürdüyü mülahizəni tarixi-linqvistik baxımdan əsaslandırmışdır.

b) **Həzrət Muhəmmədin (s) gözündə İmam Hüseyn (ə) göylərin və yerin zinətidir.** Əgər Qurani-Kərimə görə Rəsulullahın əsla həva və həvəslə danışmadığını *("Nəcm", 3-4)* nəzərə alsaq, onda gərək bu qiymətin Allahdan gəldiyini qəbul edək. Belədə, "Ya zəynəs-səmavati vəl ərzi" xitabı Rəsulullahın hələ müraciət ədatında belə bu ulu din böyüyünə olduqca yüksək qiymət verdiyini ortaya çıxarır. Digər tərəfdən, səhabələrin bu ali qiyməti qavramaqda

..................................

[71] *Şirvani Seyid Əzim. Əsərləri, üç clddə, I cild*



çətinlik çəkdiyinin hədisdə qabardılması ötəri deyildir. Çünki müsəlmanlar Peyğəmbəri öz canlarından da artıq sevməlidirlər *("Əhzab", 6)*. Bunu səhabələr də bilməmiş deyildi. Ancaq hədisdən görünür ki, onlar bu ilahi və islami göstərişi lazımınca və layiqincə həzm edə bilməmişdilər. Bunun alt qatında bir yandan əski bədəvi dünyagörüşünün hələ silinməmiş izləri dururdusa, o biri yandan Əhli-beytə duyduqları qısqanclıq hissləri dayanırdı. Odur ki, "Əbi ibn Kəbin "Ya Rəsulullah, asimani-zəmində səndən qeyri bir zinət varmı?" deyə açıq-aşkar təəccüblənməsi tamamilə təbii görünür. Yəqin, elə buna görədir ki, Həzrət Muhəmməd (s) səhabənin sualına geniş cavab verir, İmam Hüseyni nəinki "göylərin və yerin zinəti" kimi, hətta "haqq mərkəzinin bəzəyi, kainat səhifəsinin zinəti" kimi səciyyələndirir, onun ismi-şərifinin ərşin uğurlu lövhəsində hidayət çırağı ilə yazıldığını bildirir.

"Bəzək, zinət" anlayışı isə İslamda az önəm daşımır. Çünki Allah-taala bəndələrinə hər bir ibadət yerinə getdikdə özlərinə bəzək vurmalarını *("Əraf", 31)* tapşırır, yer üzündə olanların hamısını insanları sınamaq üçün onların zinəti qərar verdiyini *("Kəhf", 7)* bildirir. Odur ki, İmam Hüseyn haqqındakı bu qiymət məhz bu baxımdan dəyərləndirilməli, yalnız belə ali Peyğəmbər ölçüləri ilə dərk edilməlidir. Çünki yalnız bu zaman o ulu din böyüyünün əlçatmaz-ünyetməz məziyyətləri az-çox anlaşıla bilər.

**c) "Haqq mərkəzinin bəzəyi"**. Yuxarıdakı qeydlərin bu təyini bir xeyli açmasına baxmayaraq, yenə də bir neçə söz deməyə ehtiyac duyulur. Çünki istər qrammatik struktur, istərsə də sözaltı dini işarələr düzümü Həzrət Muhəmmədin (s) bu ifadə ilə İmam Hüseynin (ə) Tanrı qatında ayrıcalığını, müstəsna yerini önə çəkdiyini düşünməyə əsas verir.





“Kainat səhifəsinin zinəti” epiteti də o ulu din böyüyünün nümunəvi ucalığının göstəricisi kimi qavranılır.

d) **İmam Hüseynin (ə) şərəfli adının ərşin uğurlu lövhəsində hidayət çırağı ilə yazılması.** İnci sözlərinin birində Həzrət Muhəmmədin (s) İmam hüseyni (ə) “hidayət çırağı” adlandırdığı bəllidir. Ancaq bu bəlli bilgini eyni mülahizənin müxtəlif formalarda ifadəsindən daha çox burada sırf ilahi sferada götürülən dəqiq dini səciyyələndirmə olaraq başa düşmək gərəkdir. Bu isə İmam Hüseynin (ə) ərş, Kürsü, Lövhi-Məhfuz, qələm, cənnət kimi ən ali anlayışlarla bir tutulması deməkdir.

Beləliklə, aydın olur ki, gətirilən hədis özünün bütün göstəriciləri üzrə bitkin olub, İslamın bu ulu din böyüyü ilə bağlı münasibətini birmənalı surətdə aydın bildirməkdə, habelə şairin məmduhuna yanaşma biçiminin dərin sayğı və sevgi üzərində qurulduğunu göstərməkdədir.

**2.** “İbnül-Həsən Əbi Əvaidə istinad edərək nəql edir: Həzrət Rəsul buyurmuşdur ki, Həsən və Hüseyn ərşin iki sırğasıdır. O zaman ki Allah-taala behiştə xələti-xilqət verdi və buyurdu ki, sən gərək miskinlərin məskəni olasan, behişt dilə gələrək dedi ki, ya Rəbb, səbəb nədir ki, məni miskinlərə və dərvişlərə məkan edirsən? Nida gəldi ki, bu səadətə razı deyilmisən ki, ərkanının (dayağını) Həsən və Hüseynlə bəzəyim? Behişt o müjdəyə cavab olaraq dedi: “Rəzəytu, rəzəytu”, yəni qəbul etdim, qəbul etdirdim”[72].

İlahiyyatşünaslıqda *rical* adlanan bir elm sahəsi var. Bu sahədə çalışan mütəxəssislərin məqsədi İslam rəhbərinin və Əhli-beyt imamlarının dilindən söylənilən hədis və xəbərlərin doğruluq dərəcəsini müəyyənləşdirməkdir. Füzulinin də burada verdiyi hədisi sənəd-sübutla əsərə gətirməsi onun istər müqəddəsata, istərsə də din böyüklərinin bir-birinə aid münasibətinə çox həssas yanaşdığını göstərir.

.................................

[72] *Füzuli. Kərbəla vaqiəsi, səh.11*



Hədisin özü isə bir neçə cəhətdən diqqəti çəkir. Məsələn, Rəsulullah (s) İmam Həsəni (ə) və İmam Hüseyni (ə) “ərşin iki sırğası” adlandırmaqla özlərinin həyat və fəaliyyətləri ilə onların hər bir məzhəb və təriqətdən qat-qat yuxarıda durduqlarına işarə etmiş və beləliklə də ümmətinə həqiqi islami mahiyyəti çatdırmışdır. Çünki Abdullah ibn Abbasın “yüksək idarə mərkəzi” adlandırdığı “ərş” olduqca böyük və müqəddəs anlayışdır. Bu anlayış Qurani-Kərimdə yalnız Kürsü, Lövhi-Məhfuz və qələm kimi birbaşa Uca Tanrı qatı ilə bağlı olan əlahiddə anlayışlarla birlikdə bəhs mövzusu edilir.

Ancaq hədisdən anlaşıldığına görə, İslam rəhbəri “Həsən və Hüseyn ərşin iki sırğasıdır” hökmünü birtərəfli şəkildə yox, möhkəm surətdə əsaslandırılmış müddəa kimi qavradır. Hədisin geniş olması buradan irəli gəlir. Belə ki, Peyğəmbər ardıcıl olaraq cənnət, cənnətin yaradılışı, miskinlik, dərvişlik, cənnətin danışması, ilahi müjdə kimi ən müxtəlif məfhumları hədisə gətirmiş və bu yolla da hər iki din böyüyünün ucalığına dair dəqiq, aydın və tutumlu bir anlayış yaratmışdır.

Digər tərəfdən, hədisin Allahla cənnət arasında yüyrək mükalimə üzərində qurulması bir yandan şairə ideyanı bədii çevikliklə təmin etməyə imkan vermişdirsə, o biri yandan məsələnin məğzinin dini-fəlsəfi müstəvidə çox geniş olması fikrinin oxuculara çatmasını asanlaşdırmışdır. Ən nəhayət, Qurani-Kərimdə haqqında 246 ayə gəlmiş cənnət kimi önəmli bir anlayışın İmam Hüseynlə (ə) bağlı razılıq dilə gətirməsi “dünya axirətin əkin tarlasıdır” düşüncəsi yönündə Kərbəla vaqeəsinə münasibətin müsəlmanın başlıca dindarlıq cəhətlərindən birini təşkil etməsi qənaətinin hədisdə aparıcı yer tutduğunu göstərir. Yüzlərlə hədis içərisindən məhz belə bir nümunəni əsərinin başına keçirməsi isə şairin bu məsələdə hansı ölçüdə ardıcıl olmasından soraq verir.

**3.** “Rəvayətdir ki, Həzrət Rəsul (s) o məsumu uşaqlıq vaxtında qucağına alıb üzünü onun üzünə sürtdüyü zaman uşaqda Həzrətə qarşı o qədər istək yarandı ki, uşağın bədənindən bir damla sidik Peyğəmbərin ətəyinə düşdü. Ümmü-l-Fəzl bu



vəziyyəti görüb pərişan oldu və cəld onu Həzrətin qucağından götürəndə uşaq ağlamağa başladı. Həzrəti-Rəsul (s) buyurdu: "Ey Ümmü-l-Fəzl, nə üçün mənim cigərguşəmi ağlatdın, bir qətrəni bir az su ilə yumaq mümkündür, ancaq bu məzlumun ağlamağından mənim qəlbimdə yaranmış kədəri dərya ilə də yuyub aparmaq olmaz!" Bu vaxt Cəbrail nazil olub buyurdu: "Ya Rəsulullah, sən bu Hüseynin bir qətrə göz yaşı axıtmasından kədərlənirsən, bəs Kərbəlada hər yarasından bir qan çeşməsinin axdığını görsən halın necə olar?" Həzrət Rəsul (s) kədərləndi və göz yaşları tökdü"[73].

Hədisin Kərbəla vaqeəsi ilə və İmam Hüseyn (ə) şəxsiyyəti baxımından üzdə olan cəhəti Peyğəmbər və İmam Hüseyn arasındakı baba-nəvə məhəbbətidir. Düzdür, bunun özü də hər hansı bir ölçü ilə qiymətləndirmə aparmaq üçün kifayətdir. Ancaq bu məhəbbətin hədisin alt qatında ayrıca bir ictimai yön və xüsusi bir estetik məzmun qazandığını görməmək olmur. Belə ki, hədisdə Füzulinin də diqqətini çəkmiş, Allah-taalanın, Cəbrayılın və Həzrət Muhəmmədin (s) İmam Hüseyn (ə) şəxsiyyətinə verdiyi son dərəcə böyük önəm aparıcı xətt təşkil edir. Peyğəmbərin üzünü İmam Hüseynin üzünə sürtməsi, İmam Hüseyndə Peyğəmbərə qarşı böyük istək yaranması, Rəsulullahın (s) zahiri şəriət hökmlərini vasvasılıqla gözləyən Ümmü-l-Fəzli danlaması, ən nəhayət, İslam rəhbərinin Kərbəla şəhidləri üçün onillərlə öncədən göz yaşı axıtması bu xəttin aydın görünən danılmaz cizgiləridir:

Ey əhli-kin, nəbivü vəli busəgahını
Xunabi-nab qərqəsi etmək rəvamıdur?
Qət'i təəllüq eyləmək Ali Rəsuldan
"Biz ümmətiz" deyənlərə şərti-vəfamıdur?"[74]

.................................

[73] *Yenə orada, səh.6-7*

[74] *Füzuli. Kərbəla vaqeəsi, səh. 12*





*(Siz ey ürəyində Peyğəmbərə və onun Əhli-beytinə dərin kin bəsləyən vicdandan üzaq kimsənələr, Rəsulullahın (s) və Əliyyən Vəliyullahın (ə) öpüşlərə qərq etdiyi yeri (İmam Hüseyn ağanın mübarək boğazını) durmadan axan təzə isti qan çeşməsinə döndərmək rəvamıdır? Peyğəmbər balalarından üz döndərmək "Biz Məhəmməd ümmətiyik" deyənlərin əhdə sadiqliklərinin göstəricisidirmi?).*

Bəllidir ki, "Hədiqətü-s-süəda" "ruzigarın göz yaşı tökən qələmi ilə zühura gələn hekayət"dir. Göz yaşı əsərdə həm anlayış, həm predmet, həm motiv, həm münasibət tərzi, həm də bədii vasitə yerində çıxış etməkdədir. Deməli, göz yaşının əsərdə yeri olduqca genişdir. Deməli, yuxarıdakı hədis başqa xüsusiyyətləri ilə yanaşı, şairin göz yaşını əsərin leytmotivinə çevirməsini əsaslandırmaq baxımından da sarsılmaz bir nəqli dəlildir. İslami qaynaqlar isə belə dəlillərlə doludur.

**4.** "Rəvayətdir ki, bir gün Həzrət Rəsul (s) səhabə ilə bir küçədən keçərkən bir dəstə uşaq gördülər. Həzrət o dəstənin içindən bir uşağı yanına çağırıb əlindən öpdü və ona xeyli nəvaziş göstərdi. Səhabələr sual etdilər ki, ya Rəsulullah, sənin lütf göstərdiyin tifil hansı hünərin sahibidir ki, onu belə əzizləyirsən? Həzrət Rəsul buyurdu: "Bu uşaq bir gün mənim Hüseynimlə oynar, onun ayağının torpağını gözlərinə sürtərdi. O gündən bu uşağa məhəbbətim var və ata-anasına da qiyamətdə şəfi olaram!"

Bu hədis isə uşaq, səhabə, Peyğəmbərin (s) xüsusi diqqəti, İmam Hüseynə (ə) məxsusi rəğbət, Qiyamət günü şəfaət kimi orijinal cəhətlərlə zəngindir. Odur ki, Füzuli hədisdən dərhal sonra incə bir şeir parçası verir:

Əsəri-xidməti-Hüseyni-Əli
Səbəbi-dövləti-səadətdir.
Rəhi-eşqində tərki-can etmək
Mövcibi-rütbeyi-şəhadətdir![75]

.................................

[75] *Füzuli. Kərbəla vaqiəsi, səh. 9-10*





*(Əli oğlu Hüseynin qulluğunda durmaq xoşbəxtlik sərmayəsinin başlıca səbəbidir. Onun eşqi yolunda candan keçmək şəhidlik rütbəsini qazanmağı qaçılmaz edər).*

**5.** "Bir gün Cəbrayıl əleyhissəlam Həzrət Rəsulun (s) xidmətinə gələndə gördü ki, Hüseyn onun qucağındadır və Həzrət onun mübarək yanağından öpüb nəvaziş göstərir... Təsadüfən Həzrət Hüseynin lətif gərdənində həmayil ipindən bir iz qalmışdı... Cəbrayıl əleyhissəlam buyurdu: "Ya Rəsulullah, dəşti-Kərbəladə bu məzlumun mübarək başını o ipin saldığı izin yerindən kəsib ona əzablar verərlər"... Cəbrayıl əleyhissəlam bunu deyib Kərbəla səmtinə üz tutdu və yerdən bir ovuc torpaq götürüb Həzrət Rəsula verdi ki, bu torpaq Kərbəla torpağındandır və Hüseynin qanı ilə rəngin olacaqdır".

Bir qədər əsatiri səciyyə daşımasına baxmayaraq, bu hədis də bir neçə orijinal cəhətə malikdir. İmam Hüseynin (ə) zərif boynu, boyunbağı izi, Kərbəlada İmam Hüseynin başının kəsilməsinin təfsilatla bildirilməsi və onun əzablara məruz qoyulacağının qabaqcadan xəbər verilməsi, Kərbəla torpağının İmam Hüseynin (ə) qanı ilə qızaracağı belə cəhətlərdəndir. Bütün bunlar oxucunun gözləri qarşısında geniş üfüqlər açdığından şairə də öz qəhrəmanlarının faciəsini daha yaxşı təsvir və tərənnüm etmək üçün qol-qanad verir. Hədisin iki şeirlə müşayiət olunması bunu sübut edir.

Kərbəla dəştinün avarələrin yad qılub,
Əxtəri-əşk töküb gərdişi-gərdun ağlar!
Çərxdən "ağlama, zalim" deyü, ey qafil kim,
Çərx bu vaqeədə cümlədən əfzun ağlar![76]

*(Fələyin dövranı belə Kərbəla çölündə yerlərindən, yurdlarından didərgin salınanları yada salaraq ulduz kimi parlaq göz yaşı inciləri axıtmaqla ağlayar. Odur ki, sən ey*

................................

[76] *Füzuli. Kərbəla vaqiəsi, səh. 9*





*dünyanın get-gəlindən xəbərsiz olan kimsələr, gəl fələyə "ey zülmkar, özün törətdiyin faciəyə özün niyə ağlayırsan ki?!" demə, çünki fələk bu faciə üçün hamıdan çox ağlayır).*

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşlərinin bir qismi də, heç şübhəsiz, onun poeziyasında axtarılmalıdır. Belə ki, bir-birindən əlvan və dolğun poetik vasitələr və obrazlı deyimlər arasından dini-mənəvi, əxlaqi-fəlsəfi və etik-didaktik düşüncələri ayırd etmək yuxarıdakı mətnlərə baxanda bir qədər çətindir. Ancaq misraların fikri axarına və bədii tutumuna köklənər-köklənməz şairin bilavasitə dünyagörüşündən qaynaqlanan fikirlərinin bədii donu dərhal yırtılır və onların Kərbəla vaqeəsi ilə bağlı təbii təbiəti bütün çılpaqlığı ilə görünür; məs.:

Mahi-məhərrəm oldu, məsərrət həramdur,
Matəm bu gün şəriətə bir ehtiramdur.

*(Məhərrəm ayı gəldiyi üçün şadyanalıq artıq haram hökmündədir. Çünki İmam Hüseynə və tərəfdarlarına yas saxlamaq bu günlərdə şəriətə hörmət göstərmək əlamətidir).*

Sanki şair məhərrəm ayını zərfə, İmam Hüseyn (ə) və tərəfdarlarına saxlanılan təziyəni də həmin zərfi dolduran mənaya bənzətmək istəyərək deyir ki, özünün etiqad, ibadət və əxlaq səviyyəsini yoxlamağı arzulayan hər kəs Kərbəla vaqeəsinə bəslədiyi münasibəti başlıca ölçü götürməli, imanının kamilliyini məhz bu kriteriya ilə ölçməlidir. Əgər belə olmasaydı, şair həmin şeirin bu bəndini:

Şad olmasın bu vaqeədən şad olan könül,
Bir də məlalü qüssədən azad olan könül! –

kimi kəskin və kəsərli bir qarğışla, nifrinlə bitirməzdi.

Başqa bir misal:

Təcdidi-matəmi-şühəda nəf'isiz deyil,
Ğəflətsərayi-dəhrdə tənbihi amdur!





*(Kərbəla şəhidlərinə saxlanılan yasın hər il təzələnməsi və durmadan vüsət alması əbəs deyil. Çünki bu, dünyanın qəflət sarayında hamı üçün olan ümumi bir danlaq daşıyıcısı və ibrət dərsidir).*

Göründüyü kimi, beytin əsasında yuxarıda toxunduğumuz "məzlumi-Kərbəlanın müsibət vaqeəsini təkrar eləmək qəflət yuxusunda olanları oyatdığı üçün kəmali-səadətdir" mülahizəsi durur.

Füzuli lirikası belə parlaq incilərlə doludur. Biz onların çoxunu ayrıca təhlilə çəkəcəyimizdən burada bu örnəklərlə kifayətlənirik.

* * *

Füzulinin İmam Hüseyn hərəkatına dair görüşlərinin bir qismi də onun "Hədiqətü-s-süəda"dakı ədəbi-bədii qeydlərində əksini tapmışdır. Əsərin "Dibaçə"sində oxuyuruq: "Bütün çağlarda məclis və yığıncaqlarda Kərbəla vaqeəsi və şəhidlərin müsibəti ərəbin şərəfli adamları və əcəmin böyükləri tərəfindən söylənilir. Ancaq aləmin tərkibi və bəşəriyyətin böyük bir hissəsi olan türklər kitabların səhifələrinin artıq sətirləri kimi məclislər səfindən kənarda qalıb həqiqətlərin idrakından faydalanmaqdan məhrum qalırdılar. Bu səbəbdən matəm macərası işarə ilə mən zəlilə hücum etdi və əli ilə yaxamdan tutaraq dedi ki, Kərbəla şahının nemətinin süfrəsində böyüyən vurğun Füzuli! Nola ki yeni tərzdə yaradan olasan və comərdlik tutub türkcə bir məqtəl yaradasan ki, fəsihlər (gözəl danışanlar) türk dilində dinləyərək fayda tapalar və məzmunu anlayaraq, ərəb və əcəm dillərinə möhtac olmayalar"[77].

Göründüyü kimi, bu qeydlər ədəbi-mədəni və bədii-estetik səciyyə daşımaqla yanaşı, dini-fəlsəfi və etik-didaktik məzmundan da, sosial və siyasi xarakterdən də məhrum deyildir; məs.:

**1. Kərbəla vaqeəsinin və şəhidlərin müsibətinin zaman-məkan məhdudiyyətini tanımamasının önə çəkilməsi**. Bu

[77] *Füzuli. Əsərləri, VI cild, Ön söz, səh.5*





cəhət istər sırf islami baxımdan, istərsə də mənəvi-əxlaqi müstəvidə olduqca önəmlidir. Ona görə ki, Füzuli "məclis və yığıncaq" dedikdə heç də təkcə matəm mərasimlərini nəzərdə tutmur, əksinə, elitanın və ziyalıların məsələyə baxışından danışır. "Şərəfli adamlar" və "böyüklər" ifadələri bundan soraq verir. Bu isə İmam Hüseyn (ə) hərəkatının Füzuli dövründə artıq cəmiyyətin bütün təbəqələrində mənimsənildiyini sübuta yetirir. Əsərin sarayın yüksək ədəbi dilində yazılmasının səbəbi də budur.

**2. Dil məhdudluğunun Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının təbliği önündə maneə olması.** Təəssüflər olsun ki, Füzuli irsindəki xəlqi milli notlar, türkçülük qeydləri indiyədək yalnız dilçilik sferasında oxunduğundan onların dini-mənəvi qatı gözdən qaçaraq özlərində birləşdirdikəri çoxsaylı, ümumbəşəri prinsiplər diqqətdən qıraqda qalmışdır. Zənnimizcə, "aləmin tərkibi və bəşəriyyətin böyük bir hissəsi olan türklər" dedikdə Füzuli öz doğma soy-kökü ilə yanaşı, Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının əsl mahiyyətindən xəbərsiz qalmış yüz minlərlə insanı, geniş xalq kütlələrini göz önünə gətirirdi. Özü də şair bunu qabarıq verməkdən ötrü olduqca dəqiq bir bənzətmə tapmışdır. O deyir: "Aləmin tərkibi və bəşəriyyətin böyük bir hissəsi olan türklər kitabların səhifələrinin artıq sətirləri kimi məclislər səfindən kənarda qalıb, həqiqətlərin idrakından faydalanmaqdan məhrum qalırdılar".

Diqqət yetirək: "kitabların səhifələrinin artıq sətirləri", yəni ortabab katiblərin istədikləri cızmaqaranı etməyə icazə verildiyi gərəksiz və önəmsiz haşiyə. Bir az da açıq desək, qeyri-məhsuldar əkin yeri.

Məgər burada şairin milliyyətcə türk olan imamhüseynsevərlərə qarşı aparılan mənfur ayrı-seçkilik siyasətinə qəti etirazı duyulmurmu? Əsərin önündəki və sonundakı şeir parçalarını daha çox bu yöndə oxuyub qavramaq gərəkdir;





məs.:

Ya Rəbb, rəhi-eşqində bəni şeyda qıl,
Əhkami-ibadətin bana icra qıl.
Nəzzareyi-sün'ündə gözüm bina qıl,
Övsafi-həbibində dilim güya qıl[78].

Zənnimizcə, sonuncu misrada Füzuli Allaha həm də İmam Hüseyni (ə) imamhüseynsevər türklərin dilində daha yaxşı öyə bilməsi üçün yalvarır.

Ey feyzrəsani-ərəbü türkü əcəm,
Qıldun ərəbi əfsəhi-əhli-aləm,
Etdün füsəhayi-əcəmi İsadəm,
Bən türkzəbandan iltifat eyləmə kəm[79].

Azacıq diqqət yetirsək, aydınca görərik ki, Füzuli dil müxtəlifliyini də özünün qüdrət və hikmət nişanələri sırasında qavradan Ulu Yaradanın *("Rum", 22)* millətlər arasında fərq qoymadığı fikrindədir. Yoxsa o, "feyzirəsan"lıqda – ilahi yardımda ərəb, fars və türkü bir cərgəyə düzməzdi. "Ey üqdəguşayi-əcəmü türkü ərəb" və "Mən gözəl bir süfrə açdım sözdən əhli-aləmə" misralı rübai və qitədə də eyni motivin olması bu məsələdə şairin son dərəcə möhkəm mövqe tutduğunu göstərir.

**3. Həyat həqiqətlərinin doğru-düzgün təqdimi.** Dünyanın böyük mütəfəkkirlərinin hamısı kimi, Füzuli də Kərbəla vaqeəsini, heç şübhəsiz, tarixin dönüm nöqtələrindən biri hesab etməkdədir. Deməli, o, "kitabların səhifələrinin artıq sətirləri kimi məclislər səfindən kənarda qalıb həqiqətlərin idrakından faydalanmaqdan məhrum olan" türk imamhüseynsevərlərə

---

[78] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 25*

[79] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 31*



Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının məğzini, əsl dəyərini və həqiqi məqsədini çatdırmağı nəzərdə tuturdu. Bu, təxminən, "Kərbəla qəhrəmanı İmam Hüseynin (ə) müsibət vaqeəsini təkrar eləmək qəflət yuxusunda olanları oyatdığı üçün ən böyük xoşbəxtlikdir" səpkili bir fikirdir. Belə fikirlər:

Etmək gərək əhli-feyzi-biniş,
Təhqiqi-vücudi-afəriniş, –

səpkili beytlərə səpələnmişdir.

**4. "Kərbəla şahının nemətinin süfrəsində böyüyən Füzuli".** "Matəm macərası işarə ilə mən zəlilə hücum etdi və əli ilə yaxamdan tutaraq dedi ki, Kərbəla şahının nemətinin süfrəsində böyüyən vurğun Füzuli! Nola ki, yeni tərzdə yaradan olasan..." deyən Füzulinin, görəsən, əsas niyyəti nədir?

Bu suala doğru cavab verməkdən ötrü tərcümeyi-hal səciyyəli bilgiləri ictimai məzmunlu cəhətlərdən ayırd etmək gərəkdir. Məsələn, aşağıdakı qeydlər daha çox avtobioqrafik yöndədir: "Onun uzun illər Nəcəfdə Həzrət Əli (ə) türbəsində xidmət etdiyi məlumdur. Qitələrinin birində fəaliyyətinin bu yönümünə işarə edərək yazırdı:

Ruzi yeyənik Ali-Rəsulun qapısında,
Bir ömrdür olmuş bizə bu ruzi müqərrər.
Bu ruzi yolu bizlərə bağlanmamış əsla,
Layiq bizik aləmdə belə ruziyə yeksər!

Qitədəki "bir ömrdür" ifadəsinə nəzər yetirməli. Nəcəf ziyarətinə təşrif gətirmiş Hindistan hakimlərindən Nizamü-l-mülkə təqdim etdiyi qəsidədə isə Füzuli hətta bu müqəddəs ocaqdakı xidmət illərini belə dəqiqliklə göstərir və bu xidmətdə həyatının böyük bir qismini qoyub, "qəddini əydiyini" bildirir:





Sərvərim, məddahi-şahi-övliyayəm, qəlbdən
Əlli il söz söylədim, etdim bu dildə ərzi-hal,
Bu müqəddəs dərgaha sadiqliyə var şahidim,
Qəddim olmuşdur bu dərgahdə mənim çün hərfi-“dal”!

Nəzərimizcə, son misrada mübaliğə olmuş olsa da, həqiqət də vardır və bir də iqtibasdakı “əlli il” rəqəmi də az söz demir”[80].

Aşağıdakı qeydlər isə daha çox ictimai məzmuna malikdir: “Mütəfəkkir bir şair olan Füzuliyə “Hədiqətü-s-süəda”nı yaratmaqda Kərbəla mühiti də az təsir göstərməmişdir. Bu mühit Füzuli kimi bir dühanın qələmindən çıxan yeni bir türk məqtəlini çoxdan gözləyirdi. Bu mənəvi ehtiyacı nəzərə alan şair qədim dini dastanı öz yaradıcılıq süzgəcindən keçirərək onun dolğun, təravətli bədii örnəyini yaradır, əski etiqad və iman mübarizəsini parlaq boyalarla bəzəyərək özünəməxsus bir şəkildə canlandırır”[81].

Və ya: Füzuli “Hədiqətü-s-süəda”da təsvir etdiyi haqq aşiqləri içərisində İmam Hüseynin təsvirinə daha geniş yer vermişdir. Çünki Kərbəla vaqeəsi yüksək dövlət məqamı üçün yox, İslamın əslinə qayıdışı, insaniyyətin yüksək dərəcələrə çatması, ədalət, azadlıq, eləcə də zülmün kökünün kəsilməsi üçün idi. İmam Hüseyn (ə) zillət, alçaqlıq və zülmə boyun əyməyin insaniyyətə zidd bir hərəkət olduğunu müsəlman dünyasına çatdırmaq üçün üsyan etdi və bu yolda şəhid oldu. Füzuli İmam Hüseyn hərəkatının fəlsəfəsini açıqlayaraq yazırdı:

Zillət ilə ləzzəti olmaz həyatın, dustlar,
Nəqdi-can sərf eyləyib dünyada kam almaq gərək.
Əcz ilə dönmək ədudən səhldir, himmət tutub,
Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək[82].

.................................

[80] *Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, III cild, səh.388-389*

[81] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 7*

[82] *Füzuli. Kərbəla vaqiəsi, səh.59*





Sanki bugünümüz üçün deyilmiş bu misralarda Füzuli bədxah qonşularımızın – ermənilərin torpaqlarımıza olan təcavüzünə və törətdikləri vəhşiliklərə etiraz səsini ucaldaraq xalqımıza üz tutur, onu mübarizəyə, igidliyə, intiqama səsləyir.

Əsərdə insanın mənəvi və cismani köləliyə üsyanı və bu yolda öz canını belə qurban verməsi ən yüksək və ali məqam kimi göstərilir. İmam Hüseynin bu əqidə və məslək uğrunda mübarizəsi ona görə ölməzdir ki, onun əsasında mənəvi paklıq, gözəllik və əzəmət durur.

Füzulinin "Hədiqətü-s-süəda" əsərini yazmaqda məqsədi İmam Hüseyn (ə) və onun tərəfdarlarının İslamın nicatı üçün göstərdikləri fədakarlıq və şücaəti alqışlamaq, İslamda ən böyük məqamlardan sayılan şəhadətə ədəbi bir abidə qoymaq idi və o, bu işin öhdəsindən layiqincə gəlmişdi"[83].

Yaxud: "Şairin Nəcəfdə İmam Hüseyn (ə) türbəsində çalışdığı da bizə mühüm məqamları andırır – onun Muhəmməd (s) dininin müqəddəsliyinə sidq-ürəkdən bağlı iman yiyəsi olduğuna şəhadət verir. Füzuli yaradıcılığında ən qədim dövrlərdən onun yaşayıb-yaratdığı çağlara qədər sürəkli zaman dönəmlərində ərsəyə çıxan bir-birindən fərqli elmi-fəlsəfi-irfani problemlərin və dini etiqad və məramların – atəşpərəstlik, zərdüştilik, məzrəkilik və s. bu kimi ideoloji təsisat və axınların, musəvilik və isəviliyin İslam və islami təmayül və cərəyanların həyat, yaradılış, ilk təkan, Xaliq, insan və onun vəzifələri, olum və ölüm haqqında düşüncə və baxışlarına şairin mütəfəkkir-mövlana-filosof kimi münasibəti öz aydın təzahürünü tapır"[84].

Göründüyü kimi, tərcümeyi-hal səciyyəli bilgilər və ictimai məzmunlu cəhətlər şairin ömür yolunda qırılmaz bağlılıq, üzvi qovuşuqluq içində olub, onu dininə, mənsəbinə möhkəm

.................................

[83] *Mirzəyev A. Azərbaycan bədii tərcümə tarixində Füzuli mərhələsi, filologiya üzrə elmlər doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı, Bakı, 2012, səh.27-28*

[84] *Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, III cild, səh.389-390*





qail olan qızğın imamhüseynsevər kimi tanıdır. Belədə ustalıqla canlandırdığı "Matəm macərası" obrazı şairin sənətkarlığını göstərməklə yanaşı, qarşısına qoyduğu uca yaradıcılıq istəklərindən də soraq verir.

Digər tərəfdən, sənətkarın özünü "Kərbəla şahının nemətinin süfrəsində böyüyən Füzuli" kimi təqdim etməsi bir yandan əslən kərbəlalı olmasından duyduğu böyük qürur hissinə işarədirsə, o biri yandan din və məzhəb bədxahlarının "bostanına atdığı ağır daş"dır.

Füzulinin əslən kərbəlalı olması ilə iftixar etməsi dillər əzbəridir; məs.:

Çun xake-Kərbəla, Fozuli, məqame-mən,
Nəzməm be hər koca ke rəsəd, hormətəş rəvast.
Zər nist, sim nist, qohər nist, lə'l nist,
Xakəst şe're-bənde vəli xake-Kərbəlast![85]

*(Ey Füzuli, məskənim çün Kərbəladır, şeirimin*
*Şöhrəti hər yerdə vardır, xəlq onun müştaqidir.*
*Nə qızıldır, nə gümüş, nə ləlü nə mirvaridir,*
*Sadə torpaqdırsa, lakin Kərbəla torpağidir).*

Din və məzhəb bədxahlarına verdiyi çoxsaylı və kəsərli cavablara isə:

Mənə "pis" söylədisə bir pis adam, incimədim,
Məni, Allaha şükür, yaxşı bu dünya tanıyır.
Mənim haqqımda onun fikri nə təsir edəcək,
Elə bir qövmə ki, ondan məni əla tanıyır?! –

qitəsini misal göstərə bilərik.

................................

[85] *Nağısoylu M. Füzulinin "Hədiqətü-s-süəda" əsəri, səh.67-68*



Ən nəhayət, “Kərbəla şahının nemətinin süfrəsində böyüyən Füzuli” tərkibini təkcə maddi və müstəqil mənada, yəni ancaq ərazi-coğrafi, təhsil-tədris və iş, vəzifə aktı kimi yox, daha çox ruhi-psixoloji sferada – dini-mənəvi müstəvidə başa düşməliyik. Belədə ömrünün ahıl çağlarında hansısa amillərlə bağlı şairin incidilməsini, ovqafdan aldığı azacıq təqaüdün kəsilməsini qabartmağa qətiyyən lüzum yoxdur. Halbuki ədəbiyyatşünaslarımız belə cəhətləri önə çəkməyə meyillidirlər; məs.: “Burada (Nəcəfdə – **V.A.**) – “Ətəbatü-l-Aliyə”də – Həzrət Əli (ə) türbəsində çalışmışdır... Lakin həyatının qürub çağlarında haqsızlığa tuş gələrək, “Ətəba”da tutduğu vəzifədən uzaqlaşdırılan şair son illərini yenə də təvəllüd tapdığı şəhərdə – Kərbəlada keçirmiş və orada vəfat etmişdir”[86].

Dərindən araşdırıldığı təqdirdə Füzulinin Nəcəfdən Kərbəlaya köçməsinin daha obyektiv səbəbləri ortaya çıxa bilər. Məsələn, ortaya çıxa bilər ki, əgər Ərəb İraqının dini dairələri şairi sıxışdırırmışsa, bəs onda niyə onun Kərbəlada yenidən dini qurumda – İmam Hüseyn (ə) türbəsində çalışmasına razılıq vermişlər? Əlbəttə, “Şikayətnamə” Füzuli qələminin parlaq bir örnəyidir. Çağdaş filologiya tamamilə doğru olaraq onu satirik bədii nəsrimizin ilk nümunəsi sayır[87]. Ancaq nəzərə alınmalıdır ki, “Şikayətnamə”nin üzərində qurulduğu həyat həqiqəti dini qurumlarla yox, siyasi dairələrlə, ictimai idarə üsulu ilə, daha dəqiq desək, ortabab məmurlarla bağlı idi. Odur ki, Füzulinin ovqaf idarəsi ilə konfliktini dini zəminlə əlaqələndirmək obyektivlikdən uzaq olardı.

**5. Novatorluq istəyi.** “Matəm macərası” obrazının Füzuliyə dediyi “nə olar ki yeni tərzdə yaradan olasan” sözləri şairin müraciət etdiyi mövzuya əsaslı surətdə yenilik

.................................

[86] *Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, III cild, səh. 390*

[87] *Səfərli Ə. Azərbaycan dini-bədii və satirik nəsrinin banisi Məhəmməd Füzuli–500, Bakı, 2000, səh. 3-64*



gətirmək istədiyini, onu bütün göstəricilər üzrə bitkin və yetkin bir əsər kimi işləməyi qarşısına məqsəd qoyduğunu göstərir. Şairin "çoxlu kitablardan aldığı məlumat və xallarla onu dolğunlaşdırması" cəhdi də buradan irəli gəlir.

Ötəri deyildir ki, bu xüsusiyyət filoloji fikrimizin diqqətini çəkmiş, çağdaş ədəbiyyatşünaslarımızın aparıcı simaları buna aydın münasibət bildirmişlər; məs.: "Füzulinin ənənəvi-dini vaqeəni dəyişdirməyə, təbii məcrasından çıxarmağa mənəvi səlahiyyəti olmasa da, çıxış yolu tapmış, öz yüksək istedadı və sənətkarlıq qüdrəti ilə əski dini macəraları öz zəmanəsi ilə yaxından bağlamışdır. Tarixi olayları əks etdirən şair çağdaşları üçün önəmli olan nəticələr çıxararaq, mövzuya müasirlik ruhu aşılamış, özünün dediyi kimi, çoxlu kitablardan aldığı məlumat və xallarla onu dolğunlaşdırmışdır"[88].

Alim özünün obyektiv müşahidəsini türk mütəxəssislərinin qeydləri ilə bir qədər də möhkəmləndirir: "Türk alimi Ş.Güngörün fikrincə, "Hədiqətü-s-süəda" yazıldığı illərdən bugünə qədər türk ədəbiyyatında çox diqqət görən, oxunan əsərlərin başlıcalarından biridir. Füzuli kimi bir dühanın qələmindən çıxan, coşqun bir sevgi və lirizm ilə yazılan bu məqtəl həm sünni, həm şiə müsəlman türklər tərəfindən sevgiylə, hörmətlə qarşılanmış, oxunmuş, dinlənmiş, hətta bəzi şəxslər tərəfindən əzbərlənmişdir. İstər milli, istərsə də şəxsi fəlakət anında insanlar Ənbiyanın və Əhli-beytin çəkdikləri bəlaları dinləyib öz dərdlərini unutmuşlar"[89].

Alimin Füzulinin "yeni tərzdə yaradan olma" cəhdi ilə bağlı qeydləri olduqca genişdir; məs.: "Səfəvi-qızılbaşların şiəliyi hakim məzhəb qəbul etməsindən sonra Azərbaycanda da matəm mərasimləri çox artdı. Mərasimlərdə isə ən çox "Hədiqətü-s-süəda" oxunardı. Bu mərasimlər çox vaxt iki ay çəkərdi. Sonralar isə məhərrəmin on günü təziyə adı ilə mərasim keçirilməsi bir ənənə şəklini aldı"[90].

[88] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 11*

[89] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 14*

[90] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 15*





Yaxud: "Dini əfsanə və rəvayətlərdən faydalanan Füzuli Adəm Peyğəmbərdən başlamış İmam Hüseynə qədər olan peyğəmbərlik və imamət tarixini izləyərək öz ruhi təlatümlərini, habelə böyük bir şair və mütəfəkkir kimi islami əqidə və düşüncələrini canlandırır. İslamın saflığı və şərəfi yolunda aparılan döyüşləri bəşəriyyətin öz mənəvi təbəddülat və yüksəlişinin təzahürü kimi mənalandırır və bütün müsəlmanları da İslamın dəyər və gözəlliklərini qorumağa, hifz etməyə səsləyir.

Böyük düşüncə və duyğular sahibi Füzuli "Hədiqətü-s-süəda" əsərində şəriət qapısından keçərkən təriqət aləminə də nəzər salır, ilahi məhəbbət və gözəlliyi duyub dərk etməyi də inam və məslək yolçuluğunun təzahürü kimi səciyyələndirir"[91].

Göründüyü kimi, professor şairin "yeni tərzdə yaradan olma" istəyindən irəli gələn bir neçə incəliyi peşəkarcasına müəyyənləşdirmişdir. Doğrudur, alimin "...Füzulinin ənənəvi-dini vaqeəni dəyişdirməyə, təbii məcrasından çıxarmağa mənəvi səlahiyyəti olmasa da" deyə qeydlərinə başlaması etiraz doğurur. Çünki istər-istəməz düşünməli olursan: axı Füzuli niyə vaqeəni dəyişdirməli, təbii məcrasından çıxarmalı idi? O heç belə səlahiyyətə malik olmağı arzulamazdı da! Ancaq sovet təfəkkür tərzinin üstündən hələ çox keçmədiyini nəzərə aldıqda alimin səmimiliyinə inanaraq, fikrini bir qədər dəqiq çatdırmadığını düşünürsən.

Prof. Ə.Səfərlinin Füzulinin İmam Hüseyn (ə) hərəkatına dair görüşləri baxımından da önəmli olan mülahizələrini belə ümumiləşdirə bilərik:

- Füzulinin əski dini macəraları öz zəmanəsi ilə yaxından "bağlaması".
- Şairin tarixi "olaylar"dan "çağdaşları üçün önəmli nəticələr çıxarması".
- Ədibin "mövzuya müasirlik ruhu aşılaması".

.................................

[91] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 20*



- Füzulinin azərbaycançılıqla bağlı vətəndaşlıq mövqeyini müəyyənləşdirməsi.
- Dini mərasimlərin xəlqi-milli səciyyə qazanmasının etnoqrafik dərkini vurğulaması.
- Sənətkarın "Peyğəmbərlik və imamət tarixi" əsasında ruhi-psixoloji enerjisini, özünün spesifik "İslami əqidə və düşüncələrini canlandırmasını önə çəkməsi".
- Alim çox yerdə müşahidə aparır ki, Kərbəla vaqeəsi Füzulinin gözündə "İslamın saflığı və şərəfi yolunda aparılan döyüş"dür və "bəşəriyyətin yüksəlişinin təzahürlərindən, amillərindən" biridir.
- Professorun fikrincə, ədib "bütün müsəlmanları İslamın dəyər və gözəlliklərini qorumağa səsləməkdədir".
- Alim "Hədiqətü-s-süədа" əsərinin alt qatında təsəvvüfi-irfani notların da olduğunu vurğulayır.

Göründüyü kimi, alimin zərgər dəqiqliyi ilə ortaya çıxardığı bu nəzəri qənaətlər sənətkarın novatorluğunu və ciddi qayələrini göstərməklə yanaşı, İmam Hüseyn (ə) hərəkatına çevik və işlək bir ictimai hərəkətəgətirici və istiqamətverici institut kimi baxdığını da, Kərbəla vaqeəsini tarixin dönüm nöqtələrindən biri saydığını da əsaslı surətdə sübuta yetirir. Mərhum prof. Azadə Rüstəmovanın qeydləri də bunun artıq füzulişünaslıq elminin qəti mövqeyinə, nəzəri tendensiyasına çevrildiyini göstərir: "Füzuli Kərbəla şəhidlərinə rəngi, ruhu heç zaman soluxmayan möhtəşəm bir abidə ucaltmışdır. Son mənzili də Kərbəla şəhidlərinin ulusu – İmam Hüseyn (ə) türbəsi oldu. Ruhu həmişə əziz tutduğu şəhidlərin ruhu ilə calaşdı, torpağı şəhid qanı ilə suvarılmış torpağa qarışdı. Azərbaycan-türk şairi Füzuli bu gün Kərbəlada bütün dünya müsəlmanlarının səcdə (ziyarət – **V.A.**) yeri olan İmam Hüseyn (ə) türbəsində uyuyur"[92].

.................................

[92] *Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, III cild, səh. 390*



Yaxud: "Ülvi ilahi amal uğrunda şəhidlik, paklıq, saflıq və gözəllik mücəssəməsi kimi "Hədiqətü-s-süəda" yarandığı gündən türk dünyasının munis əsəri olmuş, məzhəb və təriqət hüdudları tanımadan hər bir türk tərəfindən sevgilərlə qarşılanmışdır və bu sevgiyə, bu munisliyə, bu məhəbbətə əgər bir tərəfdən əsərin mövzusu səbəb olmuşsa, o biri tərəfdən Füzuli sənətinin ilahi gözəlliyi onu şərtləndirmişdir"[93].

Ən nəhayət, deyilməmiş qalmasın ki, məsələ XX yüzilliyin başlanğıcında ziyalılarımızın diqqətini çəkmişdir. Firidun bəy Köçərlinin aşağıdakı sözləri buna danılmaz dəlildir: "Bu vaxta kimi füsəhayi-türk və əcəmdə bir kəs belə xoş ibarəli və şirin ləhcəli və gözəl şivəli əsər vücuda gətirməyibdir desək, səhv etmiş olmarıq"[94].

1. **Faydalılıq əmsalı.** Adətən, iqtisadi göstərici sayılan bu istilah humanitar sahəyə də aiddir. Odur ki, matəm macərası obrazının şairə söylədiyi sözlər, əslində, Füzulinin yüksək estetik kredosundan soraq verir.

Zənnimizcə, obrazın "comərdlik tutmaq" çağırışının da əsasında faydalılıq əmsalı amili, Füzulinin coşub-daşan həyat eşqi və yaradıcılıq ilhamı dayanır. Çünki Füzuli bununla "Türkcə məqtəl yaratma"ğın son dərəcə gərgin və yorucu bir yaradıcılıq prosesi olaraq böyük zəhmət və dönməz əmək tələb etməsinə işarə vurmuşdur. Şairin ana dilinin ozamankı durumu – ədəbi dilin çətinliyi ilə bağlı çoxsaylı bədii-nəzəri düşüncələri məhz bunun göstəricisidir. Elə əsərin özündən misal çəkək. Şair "matəm macərası" obrazının fədakarlıq çağırışına belə cavab verir: "Bu həqir və fəqir ki bu nəsihəti eşitdi və bu xidmətin məhz səadət olmağını gerçək bildim, bacarığın yoxluğu və maddi çətinlikdən qorxmadan tərtibinə rəğbət qıldım. Əgərçi türk ibarələrində vaqeənin söyləməsi çətindir. Çünki əksər sözləri və ibarələri ağırdır. Amma ümidim

[93] *Yenə orada, səh. 426*

[94] *Yenə orada, səh. 425*



var ki, övliya hümməti sayəsində mən bu işin öhdəsindən uğurla gələm”[95].

Göründüyü kimi, şair sırf xəlqi-milli sferada belə qail olduğu dininə güvənir, müqəddəslərin ruhlarına sığınır, onlardan gələcək yardımla uğur qazanacağına inanır. Odur ki, xəlqi-milli qatı unutmamaq şərtilə mətndəki comərdlik çağırışını daha çox faydalılıq əmsalı faktoru ilə bağlamaq lazım gəlir.

Mətndə bu yöndə üzərində durulmasına ehtiyac duyulan ikinci işarə “fəsihlər” obrazıdır. Maraqlıdır ki, şair onları “türk dilində dinləyici” yerində təqdim edir. Bu:

Qəzəl de ki, məşhuri-dövran ola,
Oxumaq da, yazmaq da asan ola, –

səpkili bir yanaşma biçimi ilə üst-üstə düşür. Şairin onların “tapacağı fayda”nı “türk dilində dinləyicilik”lə bağlamasının alt qatında “Hədiqətü-s-süəda”nı bəzmi bir əsər kimi nəzərdə tutduğunu, onu ilk növbədə yüksək dairələrin ali məclislərində oxunmaq üçün yazdığını anlayırıq. “Məzmunu anlayaraq, ərəb və əcəm dillərinə möhtac olmayalar” sözləri də məhz bunu göstərir.

Ən nəhayət, mətndəki “məzmun” terminінə də bu yöndə baxaq. Əlbəttə, bu termin sırf ədəbiyyatşünaslıq aspektində araşdırıla bilər. Ancaq indiki halda qoyub həll etməyə çalışdığımız məsələ – faydalılıq əmsalı baxımından yanaşdıqda, görməmək olmaz ki, Füzuli “anlaşıqlı məzmun” dedikdə ilk növbədə Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının türkün açıq ana dilində son dərəcə aydın və parlaq bir biçimdə çatdırılmasını, insanların qanına, canına hopdurulmasını, dünyagörüşlərin formalaşmasında aparıcı

.................................

[95] *Füzuli, Əsərləri, 6 cilddə, VI cild, səh. 6*



yer tutan ictimai-mədəni faktora çevrilməsini, geniş kütlələr tərəfindən yüksək səviyyədə mənimsənilməsini nəzərdə tutmuşdur.

Bu deyilənlər danılmaz biçimdə sübuta yetirir ki, "Hədiqətü-s-süəda"nın başlanğıcındakı zahirən giriş səciyyəli qeydlər, əslində, dərin bir batini mahiyyətə malik olub, sənətkar tərəfindən fundamental və monumental bir problem kimi qoyularaq həll edilmiş, köklü prinsip və müddəalar, qəti mülahizə və qənaətlər şəklində açıqlanmışdır. Odur ki, yuxarıda çıxarılmış nəticələrin hər biri malik olduqları başqa xüsusiyyətlərlə yanaşı, Füzulinin İmam Hüseyn (ə) hərəkatına dair görüşləri baxımından da dəqiq və birmənalı qavranılmaqda tamamilə haqlıdır.

* * *

Beləliklə, aydın olur ki, Füzulinin İmam Hüseyn (ə) hərəkatına dair görüşləri həm nominativ surətdə – açıq nəzəri şəkildə, həm islami bilgilərin çoxsaylı iqtibasları biçimində, həm də Kərbəla vaqeəsinin təsvir və tərənnümünə ayrılan poetik nümunələrdə çoxqatlı və çoxşaxəli olaraq əksini tapmışdır. Nəzərilik və bədiilik dərəcəsindən asılı olmayaraq, bu görüşlər dərin estetik məzmunda olub böyük fəlsəfi siqlətə malikdir və orta əsr azərbaycanlısının dünyaduyumu və dünyagörüşünü formalaşdıran aparıcı faktorlardan biridir. Bu isə İmam Hüseyn (ə) hərəkatının və Kərbəla vaqeəsinin qətiyyən ərəb tarixi ilə məhdudlaşmadığını, əksinə, Yaxın və Orta Şərq xalqlarının şanlı tarixi keçmişinin və ortaq dini-mənəvi dəyərlərinin ayrılmaz, qopmaz bir parçasına çevrildiyini, deməli, orta əsr azərbaycanlısının xəlqi-milli kimliyində də İmam Hüseyndən (ə) və Kərbəla vaqeəsindən bir qığılcım, bir işartı, bir köz olduğunu göstərir.



# QƏBRİ DANLAQ DAŞLARI İLƏ UCALDILAN ŞAİR

Çağdaş Azərbaycan cəmiyyətində dini dəyərlər son illərədək layiqli yerini tutmadığından "Füzuli və din" problemi də həqiqi elmi-nəzəri qiymətini almamışdır. Buna görə də, əslində, islami müddəaların tərənnümü üçün yazılmış onlarla şeir kimi, Füzuli lirikasının ən parlaq nümunələri sırasında yer alan "Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən" misralı qəzəl-nət də hələ ki yüksək səviyyəli ədəbi təhlilini gözləməkdədir. Halbuki şeirin İmam Hüseynin şəninə yazıldığı hər bir təcrübəli filoloqa bəllidir. Məsələn, bu sətirlərin müəllifinin 1994-cü il may ayının 15-də AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunda keçirilən "Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları" ("Türkcə divan" və "Leyli–Məcnun" məsnəvisi üzrə") mövzusundakı namizədlik dissertasiyasının müdafiəsində mərhum filologiya elmləri doktoru Cənnət xanım Nağıyeva opponent kimi etdiyi çıxışına bu qəzəl-nətin "Füzuli və din" probleminin həllində açar yerində durduğunu önə çəkmişdir. Cənnət xanımın titrək səslə söylədiyi sözlər indi də yadımdadır: "Füzuli əsərlərini hər dəfə təkrarən oxuyarkən yeni-yeni cəhətlər aşkarlanır. Hər bir dövrün təfəkkürü baxımından araşdırırkən ədəbi-nəzəri tədqiqlərə zəngin qaynaq olur. Həmin cəhətlərdən biri də "Füzuli və din" məsələsidir.



Məlumdur ki, Füzulinin Allah-taalanın qüdrətinə, böyüklüyünə Muhəmməd salavatullaha, İmam Əliyə (ə), Əhli-beytə sidq-dillə etiqadı olmuşdur. O, bütün əsərlərində dinimizə münasibətini bildirmişdir. Xüsusilə Kərbəla hadisəsi şairin böyük qəlbini kövrəltmiş, o, etiqad uğrunda, məslək uğrunda şəhidliyi xoşbəxtlik saymışdır. Elə ona görə də Hüseyn Vaiz Kaşifidən fərqli olaraq, əsərini "Rövzətü-ş-şühəda" deyil, "Hədiqətü-s-süəda" ("Xoşbəxtlər bağçası") adlandırmışdır. Bir qəzəlində:

Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən
Ki, məlum ola dərd əhlinə qəbrim ol əlamətdən.
Məzarim üzrə qoymun mil, əgər kuyində can versəm,
Qoyun bir sayə düşsün qəbrimə ol sərviqamətdən! –

deyərək İmam Hüseynin qəbri yanında basdırılmasını arzulamışdır. Bütün bunlara baxmayaraq, Füzuli yaradıcılığında bu aşkar cəhətlər təhrif edilmiş, xalqa olduğu kimi çatdırılmamışdır. Füzuli əsərlərinin məzmununu, forma, bədii üslub xüsusiyyətlərini təhrif etmədən xalqa çatdırmaq füzulişünaslıqda həlli vacib məsələlərdəndir. Bu baxımdan Vərağa Qənbər oğlu Almasovun filologiya elmləri namizədi elmi dərəcəsi almaq üçün təqdim etdiyi dissertasiya işi aktualdır və günün tələbinə tam cavab verən bir mövzunun tədqiqinə həsr edilmişdir".

Yeri gəlmişkən deyim ki, mərhum akademik Bəkir Nəbiyevin sədrliyi ilə keçən həmin iclasda çağdaş filologiya elmimizin akademik Kamal Talıbzadə, prof. Qafar Kəndli, prof. Azadə Rüstəmova, prof. Əliyar Səfərli, f.e.ü.f.d. Şamil Salmanov kimi aparıcı nümayəndələri iştirak etmiş, "Ədəbiyyat və din", "Din və mənəviyyat", "Mənəviyyat və əxlaq", "Əxlaq və təfəkkür", "İctimai şüur formalarının cəmiyyətə təsiri" kimi köklü problemlərlə bağlı bir sıra dərin mülahizələr söyləmişlər. Həmin mülahizələr öz filoloji və faktoloji sanbalı ilə indi də dəyərlidir.





O da yadımdadır ki, mən hövsələsizlik edib Əliyar müəllimin sözünü kəsərək onunla mübahisəyə girişəndə Bəkir müəllim mənə: "Vərağa, burada sualı dissertanta verirlər ha!" deyərək, iclasın gərgin ab-havasına xoş bir ovqat gətirdi. İndi yalnız saralmış protokol vərəqlərində qalan, əslində isə çağdaş təfəkkürümüzə yön verə biləcək o çıxışlar haqqında qismət olacağı təqdirdə "Ömrümün dönüm nöqtəsi" başlıqlı bir kitab yazmağı düşünürəm.

* * *

Şeirin İmam Hüseyn (ə) haqqında olmasını göstərən bir neçə cəhət var. Belə ki, şeir qəzəl şəkli üçün bir o qədər də əlamətdar olmayan kəskin tərzdə başlanır; məs.: "Ucaldın qəbrim, ey bidərdlər!", "Məzarim üzrə qoymun mil!"

Göründüyü kimi, bu tərkiblər açıq etiraz tonundadır. Bu etiraz "Görən saətdə ol qamət qiyamin, qıymadım canə" və "Qiyamətdə hesabı olmayanlardandır ol ğafil" misralarında da duyulur. Ancaq yuxarıdakı tərkiblərdən fərqli olaraq, onlar özünətəlqin və özünütənqid olub, nisbətən fərdi psixoloji məzmun daşıyır.

Digər tərəfdən, şeirdə lirik "mən"in duyğu və düşüncələri həzin tonda da verilir; məs.: "qəbrim", "səngi-məlamətdən", "dərd əhlinə", "məzarım üzrə qoymun mil", "əgər kuyində can versəm", "ol sərvi-qamətdən" və s.

Şeirin İmam Hüseynlə (ə) bağlılığını sübuta yetirən üçüncü cəhət dini-tarixi bilgilərin beytlərarası məna-məzmun rabitəsində üstüörtülü biçimdə və alt qatda da olsa özünü büruzə verməsidir. Mətlənin ikinci misrasında qəbrin itməsinə və təhlükəli anlarda müqəddəslərin məzarlarının gizli saxlanılmasına işarə vurulmasını (Ki, məlum ola dərd əhlinə qəbrim ol əlamətdən), İmam Hüseyn şəxsiyyətinin hər cür maddiyyatdan üstün tutulmasını (Qoyun bir sayə düşsün qəbrimə ol sərvi-qamətdən), Kərbəla vaqeəsinin xatırladılmasını (Ol qamət qiyamı) buna danılmaz dəlil saymaq olar.



Bu mənada şeirin sonuncu misrasının (Fərağət olmayan yerdə səfər yeydir iqamətdən) Füzulinin İmam Hüseyni Kufə səfərindən çəkindirməyə çalışanlara etirazı kimi səslənməsi də ayrıca diqqəti çəkir. Buradan anlaşıldığına görə, şair həmin cəhdləri tarixi xəta saymışdır.

Digər tərəfdən, misra özünün fikri axarı və bədii tutumu ilə o ulu din böyüyünün xütbə, məktub və kəlamları ilə də yaxından səsləşir. Bütün bunlar şeirin İmam Hüseynin (ə) əlçatmaz-ünyetməz məziyyətlərinin tərənnümü üçün yazıldığını möhkəm surətdə təsdiq edir.

* * *

Şeir saf mənəviyyatdan və gözəl əxlaqdan uzaq kimsələrə xitabla başlanır:

Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən
Ki, məlum ola dərd əhlinə qəbrim ol əlamətdən![96]

*(Ey dərdsizlər, mənim qəbrimin üstünü danlaq daşları ilə ucaldın, qoy dərdlilər qəbrimi bu nişanla tapsınlar).*

"Ey bidərdlər" xitabı təkcə nətlərdə yox, bütün şeir boyu şairin böyük bəşəri kədərindən doğan daxili haray kimi səslənir. Füzuli demək istəyir ki, siz ey yüksək mənəvi-əxlaqi dəyərlərdən xəbərsiz olub, insan kamalının yüksəlişi uğrunda aparılan əzəli-əbədi mübarizədən qıraqda qalan nadan və cahillər, məni o qədər danlayın ki, hətta qəbrimin üstü də həmin danlaq daşlarından götürülsün. Belədə mənim sədaqətli mübarizə yoldaşlarım olan aşiq və arif kimsələr mənim tənha və qərib məzarımın yerini daha tez tapa bilərlər.

Mətlənin ideya-bədii xüsusiyyətlərini bütün aydınlığı və genişliyi ilə üzə çıxarmaqdan ötrü öncə "bidərdlər–dərd əhli" təzadına işıq salınmalıdır. Çünki bu təzad təkcə bədii ifadə vasitəsi olmayıb, dərin mənəvi ziddiyyətlərdən soraq verən parlaq bir obrazlılıqdır.

[96] *Füzuli. Əsərləri, 5 cilddə, I cild, Bakı, 1958, səh. 263*





*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. İraq. Kərbəla şəhəri*

Azərbaycan füzulişünaslığının hələ ötən əsrin 60-70-ci illərində apardığı köklü araşdırmalar danılmaz biçimdə sübuta yetirir ki, "bidərdlər" deyimi kütləvi məişət aktı olmaqdan çıxıb ictimai, siyasi və mənəvi-əxlaqi qatlara malik kəskin və kəsərli bir dini-fəlsəfi və bədii-estetik dərkin ifadəsidir[97]. Yuxarıda da göstərdiyimiz kimi, şair bu deyimlə laqeyd adamları, ətrafında baş verən hadisə və əhvalatlara qarşı gözləmə mövqeyi tutanları, cəmiyyətin müxtəlif təbəqələrində gedən proseslərə yabançı olanları, bir sözlə, yalnız öz şəxsi mənafelərini güdən simasız adamları nəzərdə tutur. Ulu Füzulinin ən layiqli davamçısı olan böyük Sabir necə də gözəl demişdir:

İdrakdır müsibətə mizan, əvət, əvət!
İdraksizlərin ola bilməz müsibəti!

Ümumiyyətlə, göstərmək gərəkdir ki, "bidərdlər" qədim və zəngin Azərbaycan poeziyasının aparıcı motivlərindən olmuş,

[97] *Cəfərov M. Füzuli düşünür; Əlioğlu M. Füzuli kədəri; Mirəhmədov Ə. Yüz min dərdin şairi; Yazıçılar, talelər, əsərlər, Bakı, 1978*



bu obrazın keçirdiyi ruhi-psixoloji hallar bir ictimai subyekt kimi cəmiyyətdəki mövqeləri, ayrı-ayrı təbəqələrə təsirləri, naqisliklərinin fərdi və ictimai zərərləri ədib və filosofları həmişə dərindən düşündürmüşdür. XII əsr intibahının Xaqani–Nizami zirvəsi, XIV əsr yüksəlişinin Nəsimi təzahürü, XVI əsr mədəniyyətinin Füzuli ucalığı, ən nəhayət, XVII-XVIII əsrlərin Qövsi, Saib, Vidadi və Vaqif mərhələləri bu mürəkkəb obraza min bir çalar vurmuşdur.

Quran məntiqində *bidərdlər–dərd əhli* təzadının, deməli, həm də həyati ziddiyyətin əsasında bir tərəfdə qatı və barışmaz mövqelər (məs.: "Onlar Allahın nurunu (İslam dinini) ağızları (öz iftiraları və şər sözləri) ilə söndürmək istəyirlər. Allah isə, – kafirlərin xoşuna gəlməsə belə, – Öz nurunu (Öz dinini) tamamlayacaq. Müşriklərin xoşuna gəlməsə də, İslamın bütün dinlərdən üstün olduğunu göstərmək üçün Öz Peyğəmbərini doğru yolu göstərən rəhbərlə (Quranla) və haqq dinlə göndərən Odur!" *("Səff", 8-9),* bir tərəfdə də yumşaq və mülayim əkslikler dayanır. Deməli, qatı və barışmaz mövqelərin prototiplərini kafir və müşriklər, yumşaq və mülayim əksliklərinkini də mürəkkəb və gərgin daxili aləmə malik dəyişkən fikirli tərəddüdkar insanlar təşkil edir. Müqəddəs Kitabımızdan hər iki tərəfi təmsil edən çoxsaylı iqtibaslar gətirmək mümkündür.

Mətlədə *bidərdlər–dərd əhli* təzadını "səngi-məlamət" (danlaq daşları) ifadəsi birləşdirir. Ancaq orta əsrlər poeziyasında müqəyyəd deyimə çevrilərək daşlaşmış bu ifadə (xatırla: "Səngi-məlamət ilə çəkin çevrəmə həsar, Əşkim fənaya verməsin əhli-səlaməti!") burada ənənəvi anlamından daha çox mənəvi ictimai yükə malik kəsərli işarə yerində olduğundan o, təzadın bədii çəkisini artıraraq onu kolliziya səviyyəsinə qaldırır. Belə ki, şair "daş" sözünün müstəqim və məcazi anlamlarını mənəvi-ictimai qovşaqda qovuşdurmaqla özünün lirik "mən"inin etirazının əsasında eybəcərliklərlə dolu sıxıcı mühitin, boğucu çevrənin durduğuna işarə vurur. Bu baxımdan həmin işarə atasının onu Kəbəyə apararkən Məcnunun çılğın etiraz notlarını andırır:



Çoxdur bəni-adəm içrə bidad,
Et könlümü vəhşət ilə mö´tad!
Bir mülkdə ver mənə qərari
Kim, yetməyə adəmi-ğübari!

Mətlənin alt qatında əksini tapmış başlıca fikir budur ki, İmam Hüseynin (ə) pak məzarı yüz minlərlə azadlıqsevərin tapınağı olduğundan onun aşağı tərəfində yerləşdiriləcək Füzulinin qəbri də o ulu din böyüyünün cahanşümul şöhrəti hesabına heç vaxt itib-batmayacaq, həmişə ziyarət olunacaqdır. Deməli, şair "Bidərdlərin səngi-məlaməti dərd əhli üçün əlamətdir" deyərkən nadan və cahillərin tənəli sözlərinin aşiq və ariflər üçün əslində hərəkətəgətirici və istiqamətverici bir stimul olduğunu nəzərə çarpdırmaq istəmişdir. Bu isə siqlətli və böyük mənəvi ictimai yüklü bir ideya kimi sarsılmaz islami söykənəcəyə malik yetkin və bitkin bir dünyagörüşdən irəli gəlməkdədir.

* * *

Təkcə mətləni yox, bütövlükdə şeiri hərtərəfli dərk etməkdən ötrü ilk iki beytdə işlək və çevik olan qəbir anlayışı üzərində ayrıca dayanmaq gərəkdir.

"Qabəra" əski ərəbcənin məhsuldar kökləri sırasındadır. Belə ki, bu kökdən törənmiş sözlər semantik baxımdan tutumlu olub, bir çox həyat həqiqətlərini əhatə edir. *"Ölünü dəfn etmək, kimin üçünsə qəbir yeri hazırlamaq, məzar yeri göstərmək, məzar yeri vermək, qəbir, məzar, qəbiristan, dərin çuxur yer"* kimi ənənəvi anlamlarla yanaşı, bu köklü leksemlər *"bir dəstəyə ölüləri dəfn etmək üçün təhvil vermək" ("Abəsə", 21), "içində ov olan toru dartıb çıxarmaq üçün toplaşmış adamlar, ovçunun gecə işığı, tez bar gətirən xurma ağacı, öd ağacında olan çürük yer"* kimi müxtəlif mənaları da bildirir.

Bu kök Qurani-Kərimdə fəaldır; məs.: əqbərahu *("Abəsə", 21),* qəbrihi *("Tövbə", 84),* əl-qubur *("Həcc", 7; "Fatir", 22; "Mümtəhinə", 13; "İnfitar", 4; "Adiyyat", 9),* məqabir *("Təkasur", 2).*





Əgər bu ilahi bəyanatları qısaca nəzərdən keçirsək, İslamiyyətin "qəbir" anlayışına münasibətilə bağlı aydın bilgi alarıq.

Quran üslubu dinimizin bu məfhuma həyatın ayrılmaz bir parçası olaraq baxdığını göstərir; məs.: "(Bu təkəbbür onda haradandır? Allah) onu hansı şeydən yaratdı? (Allah onu bir qətrə dəyərsiz) nütfədən yaratdı, ona biçim verdi. Sonra onun üçün (ana bətnindən çıxış) yolunu asanlaşdırdı. Sonra onu öldürüb qəbrə qoydu. Sonra da istədiyi vaxt onu diriləcəkdir. Xeyr, (insan Allahın) ona buyurduğunu hələ yerinə yetirməmişdir. İnsan hələ bir yeməyinə baxsın! (Görsün ki, ona necə ruzi verdik)" *("Abəsə", 18-24)*.

Göründüyü kimi, bu ayələrdə bilavasitə ilahi məşiyyətin (Tanrı iradəsi) təzahürü kimi qavradılan "Sonra onu öldürüb qəbrə qoydu" *("Abəsə", 23)* cümləsi Allah, yaradılış, Tanrı gücü, canvermə, ölüm, Bərzəx, ricət, həşrtək köklü islami məsələlərlə üzvi qovuşuqluqda olub, real predmet yerində çıxış edir.

Aşağıdakı ayələrdə bu anlayış bir yandan Tanrı gücü və peyğəmbərlik müstəvilərində əyani vəsait və təsirli vasitə olaraq önə çəkilirsə, o biri yandan əmlak hərisliyi əsil-nəsəb iftixarı kimi mənəvi əxlaqi eybəcərliklərin fərdi və ictimai ifşası yönündə bəhs mövzusuna çevrilir. "Dirilər və ölülər eyni deyillər. Şübhəsiz ki, Allah dilədiyinə (ayələrini) eşitdirər. Sən isə (ya Peyğəmbər!) qəbirlərdə olanlara (haqqı) eşitdirən deyilsən!" *("Fatir", 22)*.

"(Ey qafil insan, mal-dövlət, oğul-uşaq və qohum-əqrəba) çoxluğu ilə öyünmək sizi (Allaha ibadət etməkdən, axirət üçün çalışmaqdan) yayındırdı. O vaxta qədər ki, qəbirləri ziyarət etdiniz (Ölüb getdiniz və ya ölüm anınıza kimi belə idiniz, yaxud fəxr etmək üçün qohumlarınızın qəbrini saymağa getdiniz)" *("Təkasur", 1-2)*.

Bəzi üzdəniraq təriqət mübəlliğləri bu ilahi bəyanatları özlərinin çirkin niyyətlərinə alət edib, dinimizin inam-inanc sistemini sarsıtmağa çalışırlar. Belə ki, onlar ayələrin dil-



üslub xüsusiyyətlərini, məfkurəvi yönünü və semiotikasını – tarixi şəraitlə bağlı işarələr düzümünü bir yana qoyub, bir neçə söz və ifadəni təcrid edilmiş vəziyyətdə götürməklə Müqəddəs Kitabımızda qəbir ziyarətinin pislənildiyini iddia edirlər. Halbuki "Fatir" surəsindəki ayənin çox səmimi və sadə bir məqsədi var: "Dünya axirətin əkin tarlasıdır" (Həzrət Muhəmməd (s)). Başqa sözlə, əzəli-əbədi axirət həyatı üçün yalnız bu dünyada diri olmaqla ardıcıl surətdə fəaliyyət göstərmək yolu ilə savab əldə edilə bilər. Belədə üzdəniraq təriqət mübəlliğlərinin söykəndikləri "sən qəbirdə olanlara eşitdirən deyilsən" cümləsi, əslində, "dirilər-ölülər" müqayisəsinin təbii-fiziki dəlillərindən biri olaraq ortaya çıxır.

Bu yanlış yanaşma "qəbirləri ziyarət etdiyiniz vaxta kimi" *("Təkasur", 2)* cümləsinə verilən açıqlamalarda da özünü göstərir. Halbuki surənin ilk ayəsinin məzmunu içərisində bu cümlə qafillik, əmlak hərisliyi, qohumbazlıq, tayfa təəssübkeşliyi, əsil-nəsəb iftixarı, məsuliyyətsizliyin ifşasına yönəldilmişdir.

Ən nəhayət, "qəbir" anlayışının Qurani-Kərimdə ibadət, dua, cənazə namazı, axirətə inam kimi köklü islami prinsiplərlə yanaşı durması üzdəniraq təriqət mübəlliğlərinə ən tutarlı cavabdır: "Onlardan (münafiqlərdən) ölən heç bir kəsin namazını heç bir vaxt qılma! Qəbrinin başında dayanma! Çünki onlar Allahı və onun Peyğəmbərini dandılar və fasiq olaraq öldülər" *("Tövbə", 84)*.

Göründüyü kimi, ayədə münafiqlik fasiqlik sayılır və İslam rəhbərinə möminlərin layiq olduğu cənazə namazı və qəbir ziyarəti kimi önəmli ritualların belələrinə aid edilməsi qadağan olunur, çünki onlar əsl müsəlman və həqiqi Allah bəndəsi olaraq vəfat etməmişlər. Axı Allah-taala özü buyurur: "Ey iman gətirənlər, Allahdan lazımi qədər çəkinin və yalnız müsəlman olaraq can verin!" *("Ali-İmran", 102)*.

Deməli, İslam dininə görə, qəbir ziyarəti cənazə namazı qədər önəmli ayindir.



Bu məfhum Qurani-Kərimdə kafirlərin ifşasına yönəldilir. “Ey iman gətirənlər, Allahın qəzəbinə gəlmiş qövmlə bir dostluq eməyin! Kafirlər qəbiristan əhlindən (ölülərin Qiyamət günü diriləcəyindən) ümidlərini üzdükləri kimi, onlar da axirətdən (axirətdə Allahın mərhəmətindən) ümidlərini üzmüşlər” *(“Mümtəhinnə”, 13).*

Göründüyü kimi, ayədə qəbir ziyarəti həşr (yenidən dirilmə) ideyasını əvəz etdiyindən dinimizin başlıca prinsiplərindən birini təşkil edən Allaha ümid bəsləməyin və ilahi mərhəmətin göstəricisi yerindədir.

Bu anlayış Müqəddəs Kitabımızda İslamın cövhəri olan Qiyamət məsələsi ilə də üzvi vəhdətdə əksini tapmışdır: “Qiyamət günü mütləq gələcəkdir. Ona heç bir şəkk-şübhə yoxdur və Allah qəbirlərdə olanları dirildəcəkdir” *(“Həcc”, 7).*

Burada qeyb xəbəri yerində dayanan və ilahi xəbərdarlıq səciyyəsi daşıyan bəhs mövzusu məfhum aşağıdakı ayələrdə Qiyamətin bariz təzahürləri sırasında müşahidə edilir: “Qəbirlər çevriləcəyi zaman” *(“İnfitar”, 4),* “Məgər o bilmirmi ki qəbirlərdə olanlar (dirildilib) çıxarılacağı zaman…” *(“Adiyyat”, 9).*

Beləliklə, aydın olur ki, qəbir ziyarəti müddəası Qurani-Kərimdə çoxqatlı və çoxşaxəli biçimdə işlənmiş və islami etiqad, ibadət və əxlaqla bağlı bir-birindən dolğun və tutumlu mövzu, məzmun, üslub və məfkurə xüsusiyyətləri qazanmışdır.

Müddəanın Müqəddəs Kitabımızda aldığı bu genişlik sonrakı islami qaynaqlarda da özünü göstərir. Məsələn, Həzrət Muhəmməd (s) inci sözlərinin birində belə buyurur: “Vəfat edən şəxsi üç şey izləyər: ailəsi, malı, əməli. Onlardan ikisi qayıdar, biri qalar. Qayıdanlar ailəsi ilə malı, qalan isə əməlidir!”

Göründüyü kimi, bu lakonik kəlamda həqiqi Allah bəndəsinin əsl siması əks etdirilmiş, ailə, mal-mülk və əməl arasındakı islami bağlılıq çox sadə və səmimi bir biçimdə səciyyələndirilmişdir. Ona görə ki, dinimizin böyük önəm



verdiyi ailə və əmlak məsələləri bu inci hədisdə əməl kateqoriyasının elementi yox, komponenti – ayrılmaz tərkib hissəsi kimi qavradılmaqla Allahın bəndəsindən tələb etdiyi yüksək insani dəyərlərin daşıyıcıları yerində çıxış etməkdədir.

Həzrət Əlinin (ə) "Qəbir əməllər sandığıdır" kəlamı da məhz bu yöndədir. Bu ulu din böyüyü də ayrı-ayrı xütbə, məktub və hikmətli kəlamlarında qəbir ziyarəti ilə bağlı dəqiq, aydın və birmənalı fikirlər söyləmiş, problemin bir çox cəhətlərini Allah, kainat, təbiət, yaradılış, mürəkkəb insan mənəviyyatı, tərbiyə və mühit kimi köklü məsələlərin qoyuluşu və həlli yönündə dini-fəlsəfi baxımdan dərindən açıqlamışdır; məs.: "…Onlar qəbir evinin dəhşətini qorxduqlarından daha dəhşətli, nişanələrini isə eşitdiklərindən daha böyük görərlər. Bu iki sonluq onlar üçün uzanar; baxmayaraq ki, izləri, əsərləri itmişdir, əhvallarından bir xəbər yoxdur. Ancaq bəsirət gözü onları görür və əql qulağı səslərini eşidir.

Onlar dilsiz-ağılsız – danışıq üzvlərindən faydalanmadan danışır və deyirlər ki, gülər üzümüz büzüşdü, yaş bədənlərimiz çürüdü, çürümə libasını geyindik və qəbrin darısqallığına qısıldıq. Belə ki, bədənlərimizin gözəlliyi aradan getdi, üzümüzün təravəti korlandı, dəhşət yurdunda qalmağımız uzun çəkdi, dərd-qəmdən baş açmadıq, darlıqdan genişliyə yol tapmadıq.

Əgər sən onların təsvirlərini zehnində canlandıra bilsən, yaxud pərdə arxasında səndən gizli qalanlar sənin üçün aşkar edilsə, onda görərsən ki, qulaqları qurd-quşun yuva salması ilə necə kar olmuş, gözlərinə torpaqdan sürmə çəkilərək kor olmuş, ağızlarında tutar dili tutmaz olmuş, qəlbləri öyünməkdən qalaraq sakitləşmiş, (bədənlərinin) hər üzvünə yeni bir mür düşərək onu korlamış, onun xarab olub aradan getməsinə yol açmışdır. O üzvlər indi təhlükələr qarşısında özünü müdafiə edə bilməyən əsgərlərə çevrilmişlər. Özünü qorumağa nə əl, fəryad qoparmağa nə ürək qalıb! Görərsən ki, qəm-qüssədən ürəklər yorulmuş, gözlərə tikan batmışdır. Torpaq neçə-neçə gözəl-göyçək, xoşsima insanları kamına



çəkmişdir. (Halbuki) onlar dünyada naz-nemət içində şad-xürrəm yaşayır, hüzn və qəmli çağlarında belə özlərini birtəhər şadlandırırdılar ki, xoş günləri qara günə dönməsin”[98].

Həzrət Əli (ə) dühasının parıltı və işıltılarının bərq vurduğu bu sözlərdə mürəkkəb insan mənəviyyatı tərbiyə və mühit müstəvisində götürülərək, ilahi qüdrət və hikmətin bariz təzahür formaları olaraq qavradılmaqla axirət həyatı dünya həyatının bütünlüklə təbii davamı və qanunauyğun nəticəsi kimi səciyyələndirilir. Belə ki, xütbədə duyğu ilə düşüncə (qorxu ilə eşitmə, maddiyyatla mənəviyyat, ölülərin izləri, əsərləri və vəziyyətləri ilə dirilərin bəsirət gözlərinə, qəlb bulaqlarına təsir göstərməsi), ən nəhayət, inam-inanc sisteminin verdiyi əmin-amanlıq hissi ilə tərəddüdkar psixi gərginlik duyğusu qırılmaz bağlılıq içindədir.

Heç şübhəsiz, qail olduğu dinin belə böyük önəm verdiyi bir anlayış şairin təxəyyül dünyasında bir kənara qısılaraq tək-tənha qala bilməzdi. Füzuli irsinin qəbir ziyarəti motivləri ilə zəngin olması elə buradan irəli gəlir; məs.:

Tərəşşüh qəbrimin daşindən etmiş çeşmimin yaşi,
Xəyal eylər görən kim, lə’ldəndir qəbrimin daşi[99].

*(Göz yaşlarım qəbir daşlarıma çıxdığından görənlər qəbir daşlarımın incidən olduğunu düşünürlər).*

Qəbrim daşına kim, ğəm odundan zəbanədir,
Tə’n oxun atma kim, xətəri çox nişanədir.

*(Qəm-kədər odu ilə alışıb-yanan qəbrimin daşlarına danlaq oxlarını (sözlərini) yönəltmə, çünki bu hərəkətin qorxulu olması özlüyündə açıq-aşkardır).*

................................

98 *“Nəhcül-bəlağə”, mövzular üzrə*

99 *Füzuli. Əsərləri, 5 cilddə, I cild, səh. 316*





İlətsəm xəncərin şövqini qəbrə, hər bəhar olğac
Olur səbzə yerinə xaki-qəbrimdən əyan xəncər.

*(Əgər mən sənin xəncər kimi baxışlarının od-alovunu (şövqünü) qəbrimə çatdıra bilsəm, hər gələn baharda qəbrimin torpağından kol-kos yerinə xəncər göyərər).*

Ümid var ki, dutduqca mülki-ruh nizam,
Ümid var ki, tapdıqca əhdi-ömr mürur,
Müruri-ömri sənayi-Rəsul ilən keçürəm,
Öləndə edəm onu ərməğani-əhli-ğübur.

*(Ruh mülkünün axarı və ömür əhdinin gedişi davam etdikcə ümidim vardır ki, bütün ömrümü Peyğəmbərin duası ilə keçirəm və vəfat etdikdə onu qəbiristan əhlinə hədiyyə edəm).*

Qanlı kəfənimdir al pərdə,
Mən gurdəyəm, nəinki ərdə (Leylinin dilindəndir).

Göründüyü kimi, qəzəl, qəsidə və məsnəvidən götürülmüş bu parçalarda "qəbir" anlayışı həyatın qopmaz, ayrılmaz tərkib hissəsi kimi təkcə dini baxımdan yox, estetik və fəlsəfi baxımdan da tərənnüm olunur. Belə ki, birinci misalda göz yaşı üzərində mənalandırılan məfhum ikinci misalda "İgidi qılınc yarası yox, söz yarası öldürər" düşüncəsi yönündə bəşəri kədərin ifadəsinə yönəldilmişdir. Örnəkdəki "tən oxu"nun araşdırdığımız şeirdəki "səngi-məlamət"lə üst-üstə düşməsi isə göz qabağındadır.

Peyğəmbərə (s) müraciətlə deyilmiş üçüncü misalda *xəncər* kimi kəsici alət *şövq, bahar, səbzə* kimi incə anlayışlarla qırılmaz bağlılıqda qavradıldığından ilk baxışda həyatdan uzaq görünən qəbir Füzuli qələminin sehri ilə qaynar həyat bulağına çevrilir, bir əkin tarlası, bir çəmənlik təsiri bağışlayır.

Dördüncü örnək bilavasitə Həzrət Muhəmmədlə (s) bağlı olduğundan bəlli anlayış geniş spektrdə– ümidlilik, quruculuq,



intizamlılıq, sadiqlik, dili duvaqlı olmaq və hədiyyələşmənin əhatəsində olub, olduqca aydın bir obraza çevrilir.

"Ər evi, gor evi" atalar sözü üzərində qurulmuş sonuncu nümunədə isə qəbir söykəndiyi folklor vahidinin təbiətinə uyğun olaraq, bir qədər yarıyumoristik planda verildiyindən anlayışın buradakı bədii inikası orijinallığı ilə seçilir. Qırmızı pərdənin qanlı kəfənə bənzədilməsi ən qəmgin çağında da Leylinin nikbin türk təbiətini qoruyub saxladığını göstərir. Ancaq bu, surətin yüksək bəşəri kədərinin ifadəsinə qətiyyən mane olmur.

Bu misallar bir daha sübuta yetirir ki, İmam Hüseynin (ə) şəninə yazılmış şeirin ilk iki beytinin ümumi məzmununda "qəbir" anlayışının aparıcı motiv olması tamamilə təbii olub, Füzuli sənətinə xas incə bir özünəməxsusluqdur.

Bütün bu bilgiləri mətlənin ümumi məzmununa pərçim etdikdə lirik "mən"in özünün axirət evinin üstünün "danlaq daşları ilə götürülməsini" diləməsinin qətiyyən ötəri bədiiyyat elementi deyil, şairin keçdiyi ömür yolundan və qail olduğu inam-inad sistemindən qaynaqlanan dəruni ruhi-mənəvi ehtiyac olduğu ortaya çıxır. Bəllidir ki, Füzuli ömrünün böyük bir bölümünü Kərbəlada keçirmiş, İmam Hüseyn türbəsində xidmət etmiş, xüddam, mücavir, şəmərdan kimi kiçik dini rütbələr daşımışdır. Deməli, mətlə şairin Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) soraqlı çoxsaylı şeirlərindən, sənətkarın həyat tərzinin aydın əlamətlərindən biri kimi meydana çıxmışdır.

Qəzəl-nət İmam Hüseyn (ə) şəxsiyyətinin lirik "mən"in həzin duyğu və düşüncələri fonunda tərənnümü ilə davam edir:

Məzarım üzrə qoymun mil, əgər kuyində can versəm,
Qoyun bir sayə düşsün qəbrimə ol sərvi-qamətdən!

*(Əgər mən onun qucağında (türbəsində) vəfat etsəm, yəni lütf göstərib məni orada dəfn etsəniz, mənim qəbrimin*





*üzərində başdaşı qoymayın və bununla da o sərvi-qamətin, o ucaboylu imamın qəbrimin üstünə kölgə salması üçün şərait yaradın).*

Beytdə aşağıdakı fikirlər vardır:

1. İmam Hüseyn türbəsində xidmət etmək Füzulinin həyat amalı və sənət qayəsidir.
2. Bu ulu din böyüyünün dəfn olunduğu yer adi bir məkan olmaqdan çıxıb müqəddəsləşmişdir.
3. Bu müqəddəs məkan islami göstərici kimi nəinki bu dünyada, hətta axirət həyatında da müəyyən təsirə, məsələn, Bərzəx aləmində və Qiyamət günündə şəfaət səlahiyyətinə malikdir.
4. Qəbrin üstündə başdaşı qoyulması XVI əsrdə dəfn adət-ənənəsi olaraq formalaşmışdı.
5. Füzuli ömrü boyu İmam Hüseyn türbəsində çalışmaq istəmişdir.
6. İmam Hüseynin məzarının aşağı tərəfində dəfn olunmaq Füzulinin ən böyük diləyi olmuşdur.

Əlbəttə, bu fikirlərin hər biri ilə bağlı ayrıca danışmaq olar. Ancaq yersiz təkrardan qaçmaq üçün onlar haqqında ümumi şəkildə mühakimə yürütməli oluruq.

İmam Hüseyn (ə) türbəsində xüddamlıq Füzuli və Füzuli irsinin cövhəridir. Şair fürsət tapar-tapmaz Kərbəlada doğulmasından, ömrünü orada keçirməsindən böyük iftixar hissi ilə danışır, bunu özü üçün şərəf bilir və qoynuna aldığı şəhidlərə görə Kərbəlanı yaşadığı və bağlı olduğu başqa şəhərlərdən qat-qat üstün tutur, bütün müsəlman dünyasının tapınağına çevrilmiş Məkkə, Mədinə belə Kərbəlanın yanında şairin gözlərinə sönük görünür: "Hədiqətü-s-süəda"da İmam Hüseynin (ə) Məkkədən ayrılmasının yanğı ilə təsvir olunmasının bir səbəbi də, yəqin ki, elə budur:

"Tədricən Məkkə imarətləri görünməyə başladı. Məkkə əyanları bu gəlişdən xəbər tutub imamı təntənə ilə qarşılayaraq gətirərkən Kəbə binasının hücrələri Zəmzəmin zümzüməsilə belə təkəllüm etdi:





Mərhəba, ey məsnədarayi-səriri-izzü cah,
Mərhəba, ey şahi-qüdsi-mülkü ruhanisipah.
Mərhəba, ey ərseyi-imanə əhkamın rəvan,
Mərhəba, ey hövzeyi-İslamə iqbalın pənah.
Qibləgahi-Kəbə didari-şərifindir sənin,
Gərçi xaki-Kəbədir əhli-cəhana qibləgah".[100]

*(Ey ucalıq və şərəf taxtını bəzəyən şəxsiyyət, salam olsun sənə! Salam olsun sənə, ey cəmiyyət və dövləti ruhani ordudan ibarət olan müqəddəs ölkənin hökmdarı! Sən ey şəri göstərişləri iman meydanında at oynadan kamil insan, salam olsun sənə! Salam olsun sənə, ey uğurlu taleyi, şərəfli ömür yolu İslamın yayıldığı hər yerdə ümid və güvənc yerinə çevrilən müdrik din böyüyü! Kəbə torpağı bütün insanların yeganə qibləgahı ola-ola Kəbə evinin özü səni görməyi özü üçün böyük şərəf sayır).*

Yaxud özünü Kufə səfərindən çəkindirənlərə və Məkkəni tərk etməməyə çağıranlara İmam Hüseyn (ə) belə cavab verir:

Qanda kim, eyləsəm məqam, bənə
Fitnə həmdəm, bəla mülazimdir.
Hərəmi-Kəbəni bəlalərlə
Mübtəla eyləmək nə lazimdir?!.[101]

*(Qərar tutduğum hər yerdə mənim dostum fitnə-fəsad, keşikçim də əzab-əziyyətdir. Odur ki, mən müqəddəs Kəbə evinin bəlalara tuş gəlməsinə heç vaxt yol vermərəm).*

Və yaxud İmam Məkkə əhalisi ilə vidalaşdıqda Kəbə evi özünün bütün varlığı ilə kədərə bürünür:

Xaneyi-Kəbə urdu köksünə daş,
Çahi-Zəmzəm axıtdı gözdən yaş!

.................................

[100] *Füzuli. Kərbəla vaqiəsi, səh. 23*

[101] *Yenə orada, səh. 54*







*Məscidül-həram. Müqəddəs Kəbə evi. Səudiyyə Ərəbistanı. Məkkə şəhəri*

Xaki-paki-xatireyi-Bətha
Zərrə-zərrə o minib səməndi-səba,
Ol Şahənşahə oldular həmvar,
Çıxdı çərxi-bərinə gərdi-sipah![102]

*(Kəbə evi İmam Hüseyndən (ə) ayrıldığına görə qara daşı zərblə sinəsinə vurdu. Zəmzəm quyusu həsrətlə gözündən yaş axıtdı. Məkkənin möhtərəm şəxslərinin ayaqlarının altından çıxan toz-torpaq zərrəbəzərrə səba yelinin atına minərək o hökmdara yol yoldaşı oldu, yəni bir yerədək onu ötürdü. Bu elə təntənəli oldu ki, yola salanlar ordusunun qopardığı toz-torpaq uca göylərədək yüksəldi).*

Göründüyü kimi, bu parçaların hamısı İmam Hüseynin (ə) müqəddəs Məkkə şəhərindən üstünlüyü fikrinin bədii ifadəsinə xidmət edir. Ancaq burada ehtiyatlı olub, əsərdə iki müqəddəsin bir-birinə qarşı qoyulduğunu düşünməkdən qaçmaq gərəkdir. Çünki bu müqayisə həyat ziddiyyəti olmadığından təzad da olmayıb, yalnız incə bir estetik təqdimatdır və birmənalı

.................................

[102] *Yenə orada, səh. 56*



surətdə Əhli-beyt əqidəsinin ümumbəşərilik ideyasının daha yaxşı çatdırılmasına yönəldilmişdir. Ötəri deyildir ki, İmam Hüseyn zilhiccə ayının 10-da kəsilməli olan həcc qurbanını iki gün tez kəsib, şəriət hökmlərini zahirən pozmaq hesabına olsa belə Məkkə şəhərini və Kəbə evini yersiz qan-qadadan və artıq söz-söhbətdən uzaqda saxlamış və bununla da onların müqəddəsliyini qorumuşdur. Halbuki xəlifə Yezid İmam Hüseyni (ə) müqəddəs Kəbə evində qətlə yetirmək üçün göstəriş vermişdi.

Bütün bu deyilənlərdən aydın olur ki, dindar və vətəndaş kimi Füzulinin gözündə Kərbəla bir yanadır, Məkkə və Mədinə, Nəcəf, Hillə və Bağdad bir yana! Kərbəlanı Kərbəla edən, ona dərin dini-fəlsəfi siqlət yükləyən, böyük ictimai-siyasi önəm qazandıran isə İmam Hüseyn hərəkatıdır:

Gərbəlayi-Kərbəla ol şah qədrin arturub,
Xəlqdən mümtaz ona vermiş ülüvvi-istidar!
Kərbəla həm ol Şəhi-mə’sumidən rif’ət bulub,
Xəlqə olmuş qədr ilə mənzuri-eyni-e’tibar!

Şairin uzun illər və gərgin axtarışlar bahasına Kərbəla şəhidləri haqqında ayrıca əsər yazması bu məsələdə onun necə ardıcıl olduğunu, əlçatmaz-ünyetməz İmam Hüseyn şəxsiyyətinə hansı ölçüdə önəm verdiyini, son olaraq Kərbəla vaqeəsini saf və duru İslamın ən gur çeşməsi bildiyini və o müqəddəs məkanı Yer kürəsinin mənəvi mərkəzi saydığını göstərir. Beytdəki ikinci dərəcəli sözlərin (hər bir mətndə ikinci dərəcəli sözlərin olması tamamilə təbii qrammatik qanundur) bu ali məqsədə qulluq etməsinin səbəbi də burada axtarılmalıdır. “Başdaşı” anlamına gələn “mil” sözü beytdəki belə leksemlərdəndir.

XVI yüzillikdə Ərəb İraqında başdaşı qoyulması istər islami baxımdan, istərsə də sırf etnoqrafik ailə-məişət aktı kimi artıq formalaşmışdı. Belədə “Məzarım üstə qoymun mil!” deməklə lirik “mən”, əslində, oturuşmuş bir adət-ənənəyə qarşı çıxırdı.





Düzdür, “Müsəlmanın qəbri torpaqla bir olmalı və az müddətə itməlidir” şəklindəki bəlli hökm bunun islami özülü kimi şairə kömək edirdi. Ancaq istər hökmün Qurani-Kərimdə birbaşa yer almaması, istərsə də XVI əsr Ərəb İraqında dini mühitin kifayət qədər mühafizəkar olması etirazı hissediləcək dərəcədə yumşaldırdı. Bəs bu işdə Füzuli kimə və nəyə güvənirdi?

Beytin fikri axarı və bədii tutumu göstərir ki, bu işdə Füzuli ilk növbədə İmam Hüseyn şəxsiyyətinin böyüklüyünə güvənir, onun Əhli-beytin say-seçmə nümayəndəsi olaraq qazandığı əlçatmaz-ünyetməz məziyyətlərə söykənirdi. Başqa sözlə, şair demək istəyirdi ki, belə böyük müqəddəsin pak məzarının kölgəsinin mənim kimi sadə bir şəxsin qəbrinin üstünə düşməsinin qarşısını ala biləcək hər hansı bir şey, o sıradan da başdaşı mənə gərək deyil. Axı beytdə “sayə” sözü ilə verilən o kölgə qətiyyən adi fiziki əlamət yox, o ulu din böyüyünün Qiyamət günündə malik olacağı geniş şəfaət səlahiyyətidir.

Füzulinin də mənsub olduğu şiəlikdə peyğəmbərlərlə yanaşı, imamlar da geniş şəfaət səlahiyyətinə malikdirlər. Odur ki, burada təftişçilik mövqeyi tutub, konkret tarixi situasiyalarda formalaşıb daşlaşmış təsəvvür və görüşləri bu, yaxud başqa baxımdan ələk-vələk eləməyə, kimisə nədəsə suçlu çıxarmağa can atmağa əsla lüzum yoxdur. Unutmayaq ki, tədqiqatçı araşdırdığı əsərə daha çox müəllifin gözü ilə baxmalı, onun təhlilini ilk növbədə sənətkarın dünyagörüşünün üzərində qurmalıdır. “Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri” bölümündə çıxarılan nəticələr, gəlinən qənaətlər birmənalı surətdə sübuta yetirir ki, imamların şəfaət səlahiyyətinə inanmaq şiəliyin aparıcı və həlledici şərtləri sırasındadır və bu məzhəbin ideoloji əsaslarından birini təşkil etməkdədir. “Hədiqətü-s-süəda”dakı bir parça bunu daha açıq əks etdirir. “Və bu dəxi əxbari-mö´təbərdəndir ki, Həzrəti-Hüseyn ruzi-qiyamət ərseyi-Ərəsatə çehreyi-xuna-ludlə gəlüb münacat edər ki: “Rəbbi, şəfi´əni mən bəka əla müsibət”, yəni “İlahi, rüxsəti-şəfaət ver



bana anlar üçün ki, əşkbar olmuşlar və bu tə´ziyətimdə Əhli-beytümə təşəbbüh etmişlər"[103].

*(Bu da etibarlı xəbərlərdəndir ki, Qiyamət günündə Hüseyn həzrətləri məhşər səhrasında qana bulaşmış (qəmgin və tutqun bir çöhrədə Tanrıya yalvarar ki, ya Rəbb, başıma gətirilən müsibətə görə göz yaşı axıtmış və bu matəmdə özlərini mənim arxada ağlar qoyub getdiyim əhli-əyalıma bənzətmiş şəxslərə şəfaət etməyə – onlar üçün Səndən əfv diləməyə mənə izin ver!).*

Göründüyü kimi, dərəcə baxımından ayədən və hədisdən sonra gələn "xəbər" səciyyəli dini bilgi üzərində qurulmuş bu mətn özünün bütün göstəriciləri ilə imamların şəfaət səlahiyyətinin motivləşdirilməsinə xidmət etməklə müəllifin dünyagörüşünü və mənəvi aləmini əks etdirir, islami-fəlsəfi və bədii-estetik mövqeyini göstərir.

Bununla yanaşı, beytin ideya-bədii cizgiləri onun məna-məzmun tutumunda başqa fikirlərin də ola biləcəyini düşünməyə yol açır. Məsələn, çox asanlıqla düşünmək olar ki, Füzuli burada qəbiristanlıqda baş alıb gedən təmtərağın, dəbdəbənin islami baxımdan yersiz və yanlış olmasına da işarə vurur. Yaxud uzaq və zəif bir ehtimal kimi də olsa, kimsə düşünə bilər ki, təhlükəli hallarda təqiyyə etməkdən ötrü müqəddəslərin məzarları bir müddət gizlədilməli olduqda sıravi adamların qətiyyən hər hansı bir ictimai maraq doğurmayan qəbirləri müqəddəs məzarların itib-batmaması, sonradan asanlıqla tapılıb müəyyənləşdirilməsi üçün bir nişanə ola bilər. Əlbəttə, belə birtərəfli yozum elmi-nəzəri təfəkkürün yox, uzaqbaşı, həvəskar düşüncənin məhsulu sayılmalıdır. Ancaq müqəddəslər haqqında olduğundan və Füzuli sözü ilə bağlandığından belə birtərəfli mülahizələrin də üzərindən sükutla keçilməməlidir.

Belə hipotezlər beyti nəinki ağırlaşdırmır, əksinə, onun fikri axarına itilik, bədii tutumuna dərinlik verir, oxucunun

.................................

[103] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, Bakı, 2005, səh. 51*



İmam Hüseyn sevgisi ilə coşub-daşan könlünü oxşayır, dağınıq duyğu və düşüncələrini cəmləşdirir. Çünki bu ulu din böyüyünün başı bəlalar çəkmiş türbəsi-məqbərəsi əsrlər boyu neçə-neçə haramzadənin, qaniçənin yuxusuna haram qatmış, zülmkarların qorxulu kabusuna çevrilmiş, məzlumların yeganə ümid və güvənc yeri olmuş, yüz minlərlə zəvvarın ardı-arası kəsilməyən axınına uğramışdır. Bu aydın gerçəkliyin işığında o pak məzarın müxtəlif məzhəb və təriqətlərlə fəlsəfi cərəyanların dərin ehtiramını qazanması, ululuq, böyüklük rəmzi olması bütünlüklə təbiidir.

* * *

İlk iki beytin ümumi məzmununda İmam Hüseynin (ə) şəfaət səlahiyyəti daha çox qəbir əzabı və Bərzəx aləmi ilə bağlı olduğundan bu haqdakı islami bilgilərə toxunmadan bütövlükdə şeir barəsində aydın anlayış əldə etmək olmaz.

Bizə gəlib çatmış çoxsaylı səhih hədislərdən İslamiyyətdə qəbir əzabının mücərrəd yox, ictimai-estetik, mənəvi-əxlaqi və ruhi-psixoloji prinsiplərə söykənən və mürəkkəb inam-inanc sistemi üzərində qurulan konkret bir anlayış olduğu ortaya çıxır. “Qəbir dünya sığınacaqlarının sonuncusu, axirət mənzillərinin ilki olub, ya cənnət bağlarından bir bağ, ya da cəhənnəm çuxurlarından bir çuxurdur” buyuran Rəsulullah (s) ilahi mükafat və cəzanın gündəlik insan fəaliyyətinin nəticəsi olduğunu önə çəkmişdir. Dinimizin köklü prinsiplərindən olan sonuncu Peyğəmbərə inamla bağlı aşağıdakı hədislər buna möhkəm dəlildir: “Allah bəndəsi qəbrə qoyulduğu və ölü sahibləri qayıdıb getdiyi zaman (onlar gedərkən ölü ayaq səslərini aydın eşidir) onun yanına iki mələk gəlir. Onlar ölünü oturdur və “Sən Muhəmməd adlı o kimsə haqqında nə bilirsən?” deyə soruşurlar. O mömin bəndə “Mən onun Allahın bəndəsi və Peyğəmbəri olduğuna şəhadət verirəm” deyir. Bu zaman mələklər deyirlər: “Ey mömin, cəhənnəmdəki yerinə bax! Allah bu əzab yerini sənin üçün bir cənnət məqamı ilə əvəz etdi” (Hədisin ravisi Ənəs bin Malikdir).



Yaxud: “Dünyadan kafir və ya münafiq kimi gedən kimsə isə mələklərin həmin sualına “Mən Muhəmməd haqqında bir şey bilmirəm. Mən, sadəcə olaraq, insanların onunla bağlı dedikləri sözləri eşidir və onlara baxıb, mən də bu sözləri təkrar edirdim” deyə cavab verir. Bu iki mələk ona deyir: “Kaş ki sən nə eşidəydin, nə də onları təkrar edəydin!” Sonra bu kafirin, yaxud münafiqin iki qulağı arasına dəmir bir toppuzla vururlar. O bu zərbədən elə şiddətlə fəryada gəlir ki, bu fəryadı insü cindən başqa ölüyə yaxın olan hər bir şey eşidir”.

İlahiyyatçıların zənnincə, ölünün fəryadını insan və cinlərin eşitməməsi ona görədir ki, hələ yer üzündə imtahan davam edir və əgər onlar eşitsəydilər, insanların hamısı kor-koranə iman gətirərdi ki, bu da ilahi ədalətlə düz gəlməzdi.

Hədislərdə qəbir əzabının ilahi ədalətin tərkib hissəsi olduğu ayrıca qeyd edilir. Məsələn, Ayişənin bildirdiyinə görə, bir yəhudi qadın onun yanına gəlib öncə qəbir əzabından söz salmış, sonra “Allah səni qəbir əzabından qorusun” deyə dua etmişdir. Ayişə Peyğəmbərdən qəbir əzabı haqqında soruşmuş, o da “Bəli, qəbir əzabı haqdır, vardır” buyurmuşdur. Ayişə deyir: “Mən bundan sonra Peyğəmbərin elə bir namazını görmədim ki, qəbir əzabından Allaha sığınmağı tərk etsin”.

Hədislər içərisində qəbir əzabının, Bərzəx aləminin və Qiyamət gününün təfərrüat və təfsilatları da bəhs mövzusuna çevrilməkdədir. Aşağıdakı Peyğəmbər sözləri bu qəbilli hədislərdəndir: “Bir insanın ruhu bədənindən çıxdıqda bir nida gələr ki, ey bəşər övladı, sənmi dünyanı tərk etdin, dünyamı səni? Sənmi dünyanı cəm etdin, dünyamı səni? Sənmi dünyanı öldürdün, dünyamı səni?”

Cənazəni yumağa başlayanda üç nida gələr: “Hanı sənin qüvvətli vücudun? Səni nə zəiflətdi? Hanı sənin gözəl nitqin? Səni nə susdurdu? Hanı sənin sevimli dostların? Səni niyə tərk edib getdilər?!”

Cənazə kəfənə tutulduqda daha bir nida gələr: “Yola azuqəsiz çıxma, bu səfərin qayıtmağı yoxdur, qalacağın yer əzab mələkləri ilə doludur!” Tabuta qoyulduqda bir nida



da gələr: "Allahın rizasını qazanmısansa, xoş sənin halına! Böyüklük və səadət sənindir! Yox, əgər Allahın qəzəbini qazanmısansa, vay halına!"

Cənazə məzarın yanına gətirildikdə bir nida da gələr: "Ey insan oğlu, dünyada ikən qəbir aləmi üçün nə hazırladın? Bu qaranlıq məzar üçün necə bir nur gətirdin? Mal-dövlətindən və şan-şöhrətindən nə gətirdin? Bu bomboş qəbri döşəmək və zinətləndirmək üçün nə gətirdin?!"

Cənazəni məzara qoyduqları zaman qəbir bir nida edər: "Dalımca danışırdın, indi isə qarnımda sükuta dalmısan!"

Nəhayət, dəfn bitib hamı dağılışandan sonra Allahdan nida gələr: "Ey Mənim bəndəm, tək-tənha qaldın, səni bu qaranlıq məzarda tək qoyub getdilər. Halbuki bunlar sənin dostların, qardaşların, övladın, ən əziz adamların idi. Heç birinin sənə xeyri dəymədi. Ey bəndəm, sən Mənə asi oldun, əmrimə itaət etmədin. Heç bu gününü düşünmədin?!"

Əgər vəfat etmiş kimsə dünyadan imanla getmişsə, söz yox ki, Allah onu əfvindən məhrum etməz və buyurar ki, ey mömin bəndəm, səni məzarda yalqız qoymaq şənimə yaraşmaz! İzzətü-cəlalıma and olsun, sənə elə bir mərhəmət edim ki, dostların çaşıb qalsın! Sənə elə bir şəfqət göstərim ki, ata-ananın övladına olan şəfqətindən artıq olsun!"

Allah öz mərhəməti ilə həmin bəndənin bütün günahlarını bağışlar və onun qəbri cənnət bağçasına çevrilib, cənnət huriləri və nemətləri ilə dolar".

Klassik İslam alimləri ayə və hədislər əsasında qəbir əzabı ilə bağlı bir sıra fikirlər söyləmişlər. Məsələn, İmam Rəbbani belə deyir: "Ölülərin halı dünyadakı dirilərin həyatı kimi deyil. Belə ki, dünya işlərinin nizamı üçün buradakı həyatda həm hiss, həm də istək və iradə ilə hərəkət qaçılmazdır. Qəbir aləmində ölülərin əzab və ağrı duyması üçün hissiyyat kifayətdir.

Qəbirdə ruhun bədənə bağlanması diri ikən bağlılığın yarısı qədərdir. Məhz buna görə ölülər əzabı duyduqları halda



hərəkət edə bilməzlər. ...Qəbir əzabı yuxugörmə kimi deyil. Qəbir əzabı əzabın təcəssümü, göstərilməsi yox, əzabın məhz özüdür. Qəbir əzabı axirət əzablarındandır. Belə ki, axirət əzablarının bir qığılcımı dünyaya düşsə, hər şeyi yandırıb məhv edər".

Başqa bir məşhur İslam alimi imam Siyuti isə belə deyir: "Ruh öz cəsədinə mahiyyətini bilmədiyimiz bir surətdə bağlıdır. Onlar arasındakı bu rabitə dünya həyatındakı əlaqələr şəklində deyil. Bu, yuxu görən şəxsin yuxuda gördüyü şeylərlə bağlılığına bənzər bir haldır. Ancaq ruhların öz cəsədlərinə və başqa şeylərə bağlılığı yuxu görənin yuxuda gördüklərinə bağlılığından qat-qat qüvvətlidir. Belə ki, ruhların öz cəsədlərinə təsir göstərmələrinə, onları idarə etmələrinə və onlarla birlikdə qəbirdə olmalarına izin verilmişdir. Meyit qəbirdən çıxarılıb başqa bir qəbrə qoyularsa, ruhun bədənlə əlaqəsi pozulmaz. Belə ki, bədən çürüyüb torpaq maddələrinə – suya və qaza çevrildikdə belə bu rabitə davam edir".

Görünür, belə geniş dini təsəvvürlərə görədir ki, orta əsr ilahiyyatşünasları qəbir əzabına səbəb ola biləcək halları ayrıca sadalamışlar. Əbu Leys Səmərqəndinin aşağıdakı qeydi bu baxımdan bir xeyli səciyyəvidir: "Qəbir əzabından qurtulmaq istəyən kimsə namaza davam etməli, sədəqə verməli, Quran oxumalı, Allaha çox təsbih deməli, xainlik, dedi-qodu və üzərinə idrar sıçratmaqdan çəkinməlidir".

Bütün bu nəqli və əqli dəlillər inkarolunmaz surətdə sübuta yetirir ki, dinimizin etiqadi əsasları sırasında yer alan qəbir əzabı geniş və tutumlu ibadi və əxlaqi cəhətlərə malik olub, çoxqatlı və çoxşaxəli anlayışlar şəbəkəsidir. Odur ki, bu bilgiləri qətiyyən əski əsatir örnəyi saymaq olmaz. Ona görə ki, bu mifik qat özbaşına quru yerdə yaranmamış, əksinə, Azərbaycan türklərinin kökü bəşəriyyətin dansökülənınə gedib çıxan ictimai-mədəni arxetip üzərində bərqərar olmuş, bu zaman qədim adət-ənənələr İslamiyyətin aparıcı prinsiplərinə uyğunlaşdırılmış, bu yeni dini məzmun əsrlər ötdükcə xüsusi həyat tərzi kimi formalaşmışdır. Odur ki, qəbir əzabı ilə



bağlı bilgilərə ikinci dərəcəli anlayışlar kimi baxmaq olmaz. Əksinə, Rəsulullah (s) və Əliyyən Vəliyullahın (ə) yuxarıda verilmiş inci sözlərindən də göründüyü kimi, İslamiyyət qəbir əzabı, Bərzəx aləmi və Qiyamət gününü həyatın təbii davamı və qanunauyğun nəticəsi hesab edir.

Bu bilgiləri beytin fikri axarına qovuşdurduqda şeirin ilk iki beytində Füzulinin İmam Hüseynin (ə) şəfaət səlahiyyətinə bütün varlığı ilə inandığı, İmam Hüseyn türbəsində ömrü boyu xidmət etməyin onun böyük diləyinə çevrildiyi, İmam Hüseyn şəxsiyyətini yüksək insani dəyər və əlçatmaz-ünyetməz, dini-dünyəvi məziyyətlərin timsalı kimi gördüyü, ən nəhayət, vəfat etdiyi günün ilk gecəsində özünə ağa, mövla bildiyi bu ulu din böyüyünün mütləq başının üstünə gəlib ağır qəbir sorğu-sualında ona kömək edəcəyinə dərin ümid bəslədiyi anlaşılır.

Beyti bədii baxımdan mətlədən fərqləndirən başlıca cəhət təsvir elementlərinin çoxluğudur. “Mil” (lüğətdə: *başdaşı,* burada: *maneə*), “kuy” (lüğətdə: *məhəllə, küçə,* burada: *İmam Hüseynin türbəsi*), “can versəm” (lüğətdə: *vəfat etsəm,* burada: *ləyaqətlə xidmət göstərə bilsəm*), “sayə” (lüğətdə: *kölgə,* burada: *İmam Hüseynin şəfaəti*), “ol sərvi-qamət” (lüğətdə: *qədd-qamətli, gözəl,* burada: *peyğəmbərlər və imamlar arasında müstəsna yeri olan ulu din böyüyü*) ifadələri yalnız güclü bədii ifadə vasitələri olmayıb, həm də dərin məna-məzmun komponentləri kimi vahid bir bədii kompozisiya əmələ gətirmişdir. Bu isə bir yandan miqyas genişliyi yaratmaqla oxucunun gözləri önündə qanlı Kərbəla səhrasının bir-birindən fəci səhnələrini canlandırır, bir yandan da aşılanan ideyaya ekspressivlik və emosionallıq verir.

* * *

Klassik Şərq poeziyası daha çox rəmzlər, simvollar, alleqoriya, obrazlar, sözaltı deyimlər, bədii fiqur, üstüörtülü struktur və kompozisiyalar üzərində qurulmuşdur. Belədə mövzu, məzmun, məfkurə, fabula, süjet xətti bir-birindən ayrı





elementlər olmayıb, qəzəlin, qəsidənin, rübainin, müxəmməsin tərkibində biri o birini bitkinləşdirən və yetkinləşdirən komponentlər kimi iştirak edir, ədibin duyğu və düşüncələrini reallıqla xəyal, konkretliklə mücərrədlik, məchulluqla aydınlıq arasında əsatirliklə gerçəkliyin qovşağında qovuşdurur. Araşdırdığımız qəzəl-nət də bu baxımdan istisna təşkil etmir. Odur ki, ona yalnız quru mədhiyyə, ancaq sırf məddahlıq nümunəsi olaraq birtərəfli yanaşma biçimi kimi baxsaq, o özünün sirli-sehrli aləminə bizi yaxın buraxmayacaq, malik olduğu qəribəlikləri və incəlikləri heç vaxt sonadək bizə açmayacaqdır. Əksinə, biz səbirli olub, beyt-beyt, misra-misra, ifadə-ifadə onun nazını çəksək, onda o da şəhdini-şirəsini, tamını-duzunu bütün aydınlığı və genişliyi ilə bizə dadızdıracaqdır:

Görən saətdə ol qamət qiyamin, qıymadım canə,
Qiyamət həm gələ, qurtulmayam mən bu nədamətdən!

*(Mən o qədd-qamətlinin ayaq üstə şax durmasını görəndə canıma qıymadığım üçün qiyamət də qopsa, qorxuram ki, mən bu peşmançılığın iztirabından qurtula bilməyəm).*

Beytdən aşağıdakı fikirləri çıxarmaq mümkündür:

1. İmam Hüseyn hərəkatının həqiqi mahiyyətindən xəbərdar ola-ola ona qoşulmamaq günahdır, cinayətdir.
2. İmam Hüseyn hərəkatına qoşulmaq böyük fədakarlıq tələb edir.
3. İmam Hüseyn hərəkatı önəm və dəyər baxımından İslamiyyətin başlıca ibadət növü olan namaz qədər zəruridir.
4. Odur ki, Axirətdə istər namaz qılmamaq, istərsə də İmam Hüseyn hərəkatına qoşulmamaq üstündə cəza almaq qaçılmazdır.
5. Bunu bilən, ancaq yerinə yetirməyən hər bir vicdanlı şəxsin peşmançılıq keçirib iztiraba düşməsi təbiidir.
6. Ən nəhayət, bütün bunlar qətiyyən VII əsrlə və Ərəb İraqı ilə məhdudlaşmayan ümumbəşəri prinsiplərdir.



Əlbəttə, bu fikirlərin beytdən ələgəlmə ölçüsü bir deyil. Olsun ki, onların biri o birinə baxanda bir qədər az əsaslandırılsın. Amma mühüm olan budur ki, bu fikirlərin hamısı bilavasitə şeirin bətnindən doğur və şairin onlarca başqa əsərində əks-səda verir. Odur ki, bizim borcumuz onların hər birini Füzulinin Kərbəla vaqeəsi və İmam Hüseyn dünyasının könlümüzə düşən parıltı və işıltıları hesab etməkdir.

"İmam Hüseyn hərəkatının həqiqi mahiyyətindən xəbərdar ola-ola ona qoşulmamaq günahdır, cinayətdir" fikrinin beytdəki başlıca daşıyıcısını müəyyənləşdirməkdən ötrü mətndə bilavasitə Kərbəla vaqeəsinə aid olan sözü, yaxud ifadəni tapmaq gərəkdir.

İlk iki beyt və 4-cü beytlə üzvi vəhdətdə götürdükdə "ol qamət qiyami" tərkibi araşdırdığımız mətnin birbaşa Kərbəla vaqeəsinə aid olan yeridir. Razılaşmamaq olmaz ki, tərkib hər hansı bir lirik şeirin içərisində o böyüklükdəki tarixi hadisənin verilə biləcəyi ən lakonik ifadədir. Çünki "ol qamət qiyami" tərkibi bir yandan klassik – kitab üslubu üçün səciyyəvi olan "qamət" sözü ilə yaradılmış obrazlılıq nəticəsində bu ulu din böyüyünün həm aydın zahiri görkəmini, həm də o görkəmdə tamamlanan batini gözəlliyini əks etdirir. Bir yandan da "qiyam" sözü ilə verilən işarə ilə Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının geniş miqyasına dair aydın anlayış təqdim edir. Əgər biz istər "qamət" və "qiyam" sözlərini ayrılıqda, istərsə də "ol qamət qiyami" tərkibini bütövlükdə götürüb, bütünlüklə Kərbəla vaqeəsinə və İmam Hüseyn hərəkatına həsr olunmuş "Hədiqətü-s-süəda"ya tətbiq etsək, nəzərdə tutulan hər bir müddəa və qənaəti istənilən yöndə əsaslandıra bilərik. Məsələn, əsərə "qamət" sözünün özündə birləşdirdiyi anlam çalarları baxımından göz gəzdirsək, aşağıdakı parçanın araşdırdığımız beytlə yaxından səsləşdiyinin şahidi olarıq: "İbnu-l-Həsən Əbi Əvaidə istinad edərək nəql edir: Həzrət Rəsul buyurmuşdur ki, Həsən və Hüseyn ərşin iki sırğasıdır.



O zaman ki Allah-taala behiştə xələti-xilqət (yaradılış libası) verdi və buyurdu ki, sən gərək miskinlərin məskəni olasan, behişt dilə gələrək dedi ki, ya Rəbb, səbəb nədir ki, məni miskinlərə və dərvişlərə məkan edirsən? Nida gəldi ki, bu səadətə razı deyilmisən ki, ərkanını (dayağını) Həsən (ə) və Hüseynlə (ə) bəzəyim? Behişt o müjdəyə cavab olaraq dedi: "Rəzəytu, rəzəytu", yəni qəbul etdim, qəbul etdirdim!"

Göründüyü kimi, hədisdə cənnət canlı varlıq kimi göstərilir ki, İmam Həsənlə birlikdə İmam Hüseyn də onun iki sırğasından biri tək qavranılır. Bu isə bütün başqa keyfiyyətləri ilə yanaşı, parlaq və dərin bir estetik çalara da malikdir. Çünki təzəgəlini sırğa bəzədiyi kimi, cənnəti də Füzulinin bütün varlığı ilə qail olduğu ikinci və üçüncü imamlar gözəlləşdirir. Ancaq hədisin məzmunundan bunun zahiri görkəmlə məhdudlaşmayıb, batini səciyyə də qazandığı anlaşılır. Çünki cənnət öz Xaliqi ilə uzun-uzadı sual-cavabdan sonra özünə bəxş edilmiş ilahi nemətlərin – hər iki imamın əsl dəyərinə vaqif olur və bunları qoynunda yer verəcək kimsələr üçün meyar, ölçü vahidi olaraq qəbul edir. Cənnətin dilindən verilən razılıq sözlərinin birbaşa ərəb dilində əsərə gətirilməsi Füzulinin bu yöndəki qətiyyətini sübuta yetirir.

Ən nəhayət, hədisin parlaq bir poetik inci ilə tamamlanması din və ədəbiyyatı iki ictimai şüur forması olaraq bir araya gətirdiyindən ayrıca bir zövq və həzz qaynağına çevrilir:

Asimani-qədrü kani-lütfü baği-elmdən
İki əxtər, iki gövhər, iki sərv olmuş əyan!
Cümleyi-xəlqi-cahandan bula bilməz bir bədəl,
Bu birinə ol birindən qeyri əqli-xürdədan![104]

*(Qədir-qiymət səmasından, mərhəmət mədənindən və elm-mərifət bağından iki ulduz, iki inci və iki sərv əmələ gəlmişdir.*

.................................

[104] *Füzuli. Kərbəla vaqiəsi, səh.11*





*Əgər dünyanın bütün ağıl-kamal sahibləri bir araya gəlib, onlardan hansının daha üstün olmasını təyin etmək istəsələr, əsla bacarmazlar və son nəticədə birini yalnız o biri ilə əvəz edə bilərlər).*

Göründüyü kimi, “Qədir-qiymət səmasının ulduzu, mərhəmət dənizinin incisi və elm bağının sərvi” obrazlılıqları İmam Həsənlə (ə) yanaşı, İmam Hüseynin (ə) də zahiri və batini bütövlüyünü, maddi və mənəvi çəkisini olduqca aydın bir dildə əks etdirir və oxucunun gözləri önündə Kərbəla vaqeəsinin estetik təzahürünü yaradır.

Belə örnəklərin sayını artırmaq da olar. Ancaq gətirilmiş nümunə də əsaslı surətdə sübuta yetirir ki, araşdırdığımız beytdəki “qamət” sözü yerində işlənmiş sərrast deyimdir və məmduhun, öyülənin zahiri və batini gözəlliyini vəhdətdə ifadə edə bilir.

“Ol qamət qiyami” tərkibinin İmam Hüseynin (ə) mənəvi əxlaqi üstünlükləri ilə bağlı aydın anlayış almaqdan ötrü kifayət etməsinə gəlincə, əsərin çox yeri bunu təsdiq edə bilər. Məsələn, Abdullah ibn Zübeyrlə Mədinə valisi Vəlid ibn Ütbənin Daru-l-İmarəyə dəvətini müzakirə edərkən İmam Hüseyn deyir:

Haşalillah kim, mələk fərmanbəri-şeytan ola!
Əhli-ismət tabe´i-aludeyi-isyan ola!
Qanda caizdür bu kim, viran olub bünyadi-şər´,
Əhli-iman olmayan mö´minlərə sultan ola?[105]

*(Allah eləməsin ki, mələk şeytanın nökərinə çevrilsin, məsum şəxs də Allaha üsyan çirkabına bulaşanların yolu ilə getsin! Axı hansı məzhəb qəbul edər ki, imansız birisi möminlərə sultan olmaqla şəriətin özülünü sarsıtsın?!).*

[105] *Yenə orada, səh.16*



Öyülənin yüksək insani keyfiyyətlərini hətta düşmənlər də təsdiq edirlər. Məsələn, Mərvan İmam Hüseynin (ə) gəlməyəcəyini dedikdə Vəlid "Hüseyn ibn Əli yalançı və qəddar deyil. "Gələrəm" deyibsə, əlbəttə gələcək" deyir. Şair Vəlidin fikrini şeirlə də verir:

Güli-bustani-vəfadür Hüseyn,
Düri-dürci-sidqü səfadür Hüseyn.
Cigərguşeyi-Həzrəti-Fatimə,
Süruri-dili-Mustəfadür Hüseyn.[106]

*(Hüseyn vəfa bostanının qızılgülüdür, Hüseyn doğruluq və ilahi zövq sədəfindəki incidir, Hüseyn Fatimə həzrətlərinin ciyərinin bir parçası və seçilmiş sonuncu Peyğəmbərin könlünün şadlığıdır).*

Başqa bir misal: "Müslüm ibn Əqil imamın hökmi-şərifinə uyğun olaraq elə həmin gün yola düşdü. Bir mənzil yol qət etməmişdi ki, Müslümün sağ tərəfindən bir səyyad çıxdı, əlindəki ovun başını kəsdi..."[107]

Füzuli Müslümün dilindən aşağıdakı şeiri verməklə öz məmduhunun uca sifətlərini bir daha sevə-sevə öyür:

Ey cəmalın mətlə´i-xurşidi-iqbalım mənim,
Gün yüzündəndir mübarək müttəsil falım mənim.
Dövləti-zövqi-vüsalındur məni xoşhal edən,
Bilməzəm səndən cüda düşsəm nolur halım mənim?[108]

*(Ey üzü tale günəşimin başlanğıcı olan, mən həmişə sənin gün üzünə baxmaqla uğurlu fal aça bilmişəm. Məni sevindirən yeganə şey hər an səninlə görüşə bilməyimin gətirdiyi xoşbəxtlikdir. Odur ki, səndən ayrı düşdüyüm təqdirdə halımın necə olacağının fikrini çəkirəm).*

..................................

[106] *Yenə orada*

[107] *Füzuli. Kərbəla vaqiəsi, səh. 25*

[108] *Yenə orada, səh. 26*





Göründüyü kimi, "Hədiqətü-s-süəda" İmam Hüseynin (ə) yüksək mənəvi əxlaqi gözəlliklərinin tərənnümü ilə doludur. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Füzuli əsərini təkcə qanlı səhnələr, fəci mənzərələr üçün yox, daha çox məmduhunun əlçatmaz-ünyetməz məziyyətlərinin tərənnümü, örnək davranışlarının təsviri və parlaq əməllərinin bədii təcəssümü üçün yazmış, yüz minlərlə imamhüseynsevərin daxili tələbatını ödəmək üçün qələmə almışdır.

* * *

Qəzəl-nətin 3-cü beytində əksini tapmış ikinci fikir belədir: İmam Hüseyn hərəkatına qoşulmaq insandan şəhidlik zirvəsinə ucala biləcək qədər fədakarlıq tələb edir. "Qıymadım canə" ifadəsində verilmiş bu fikir bütövlükdə Füzuli irsi üçün əlamətdar ideyadır. Belə ki, şair nəinki lirikasında, hətta epik əsərlərində belə fədakarlıq motivlərini sevə-sevə işləmiş, məsələnin fərdi və ictimai qatlarına vararaq onun bədii həllinə can atmışdır. Bu barədə aydın anlayış əldə etməkdən ötrü Leylinin Məcnunla İbn Səlamı tutuşdurmasını anmaq yetər:

Cananəsi üçün ol dilər can,
Öz canı üçün dilər bu canan!

*(Məcnun canı cananına vermək üçün can sahibi olmaq istəyir. İbn Səlam isə cananın gəlib canına, bədəninə qulluq etməsi hayındadır).*

Əgər Füzuli lirikasının ən işlək və çevik motivini müəyyənləşdirmək istəsək, tərəddüdsüz demək olar ki, bu, "can-canan"qarşılaşdırmasıdır.

Aşiq oldur kim, qılır canın fəda cananinə,
Meyli-canan etməsin hər kim ki qıymaz caninə.

Canini cananə verməkdir kəmali-aşiqin,
Verməyən can e´tiraf etmək gərək nöqsaninə.





...Hiç kim canan üçün can verməyə laf etməsin
Kim, gəlibdir bu sifət ancaq Füzuli şaninə.

Canı kim canani üçün sevsə, cananın sevər,
Canı üçün kim ki cananın sevər, canın sevər.

“Keç” rədifli qəzəl isə büsbütün bu qarşılaşdırma üzərində qurulmuşdur:

Ey könül, yari istə, candan keç,
Səri-kuyin gözət, cahandan keç!
Ya təmə´ kəs həyati-zövqindən,
Ya ləbi-lə´li-dilsitandan keç.
Etibar etmə mülki-dünyayə,
Etibari-ülüvvi-şandan keç.
Əhli-dünyanın olmaz axirəti,
Gər bunu istər isən, andan keç!
Məskənin bəzmgahi-vəhdətdir,
Ey Füzuli, bu xakdandan keç!

*(Ey könül, sevgilini istəyirsənsə, həm bədənindən, həm də ruhundan imtina et, yalnız onun qərar tutduğu yerə yönəl, bütün dünyanı ayağının altına al! Ya zövqlə ömür-gün keçirməkdən əl çəkməli, ya da yalnız könül dünyasına xitab edən inci dodaqlardan, onların arasından süzülüb gələn və dirilik suyuna bərabər olan ilahi sözlərdən keç! Dünya evinə güvənmə, onun zahirən uca görünən, ancaq əslində dedikcə alçaq olan şan-şövkətindən uzaqlaş! Dünyasevərlər axirəti qazana bilməzlər. Əgər sən axirət əbədiliyini diləyirsənsə, onda dünyadan keç! Ey Füzuli, sənin əzəli-əbədi yurdun Tanrı qatında qurulmuş vəhdət məclisi ola-ola axı sən niyə bu toz-torpaq qabından keçə bilmirsən?!).*

Əgər dini mövzunu örnəklərlə tutuşdurmalı olsaq, onda gərək:





Kim versə can yolunda, bulur xaki-məqdəmin!
Guya ki, xaki-rahinədir nəqdi-can bəha! –

beytini yada salaq. Şair mübarək "Bəqərə", "Ali-İmran" və "Tövbə" surələrinin müvafiq surətdə 154, 169-170 və 111-ci ayələri üzərində qurduğu bu beytdə İslamın şəhidlik konsepsiyasını açaraq demək istəyir ki, Allah yolunda canından keçən şəxs ən böyük ilahi lütfə çatır, çünki bu lütfü əldə etməyin ən aşağı mərtəbəsi insanın öz əziz və şirin canından keçməsidir.

Ancaq həqiqət naminə deməliyik ki, "Görən saatdə ol qamət qiyamın, qıymadım canə! Qiyamət həm gələ, qurtulmayam mən bu nədamətdən!" beytinə Füzuli lirikasındakı ən oxşar beyt "Rəhrəvi-irfanə bəsdir sağərü saqi dəlil" misralı qəzəldədir:

Cənnətə, zahid bilir, can vermədən yetməz, vəli
Canə qıymaz, öz təmənnasindədir miskin bəxil!

*(Həqiqi eşq zövqündən xəbərsiz cahil canından keçmədiyi təqdirdə cənnətə qovuşa bilməyəcəyini zahid çox yaxşı bilir, ancaq iş bundadır ki, o miskin və paxıl kimsə özünün maddi maraq dairəsindən çıxmağı bacarmadığından canına qıya bilmir).*

Göründüyü kimi, "canı qıymadan" və "qıymadım canə" ifadələri eyni olduğu kimi, fədakarlıq ideyası da hər iki beytdə üst-üstə düşür. Bəs bu fədakarlığı İmam Hüseynə layiq şəhidlik zirvəsinə doğru aparan uca amal araşdırdığımız beytin hansı qatındadır?

Ənənəvi təhlildə belə bir üsul var: əgər mümkündürsə, mətn daha çox öz xammalı əsasında araşdırılır. Başqa sözlə, faktın özündən çıxış edərək mühakimə yürütmək ən elmi yoldur. Bu yöndə araşdırdığımız beyt nə deyir?

Beytdəki "görən saatdə ol qamət qiyamın" tərkibi və "Qiyamət həm gələ, qurtulmayam mən bu nədamətdən"



misrası birmənalı surətdə Kərbəla vaqeəsinin baş verdiyi çağda İmam Hüseyn hərəkatının mahiyyətinə yaxşı bələd olmasına baxmayaraq, bəzi məhdud duyğu və düşüncələr üzündən bu azadlıq karvanına qoşulmayanlardan soraq verir. Tarixi sənədlər əsasında yazılmış "Hədiqətü-s-süəda"da belə yerlər var. Məs.: "Yol əsnasında həzrət imam bir kürsü üstünə çıxıb həmdü sənadan sonra orduya müraciət edərək buyurdu: "Ey əziz əshablar və ey burada cəm olanlar! Mən müsibət səhrasının səyyahıyam, mən möhnət biyabanının müsafiriyəm, mən qəriblər asimanının ulduzuyam, mən şəhadət yolunun salikiyəm! Mənim xəyalıma dünya ləzzəti gəlməz! Söhbətim hiylədən uzaqdır. Mənim qəlbimdə Haqqın ülfəti var. Heç kəsi dünya nemətləri müjdəsi ilə öz tərəfimə çəkmərəm və mənsəbə yüksəlmək naminə heç kəsə sığınmaram! Bayrağım altında səltənət sevinci təmənnasında olanlar mənim ülfətimdən əl çəksinlər!" Şe´r:

Mən bəla dəryasinə qərq olmağa basdım qədəm,
Gəzməsin girdabvəş çevrəmdə hər canın sevən!
Mən fəna deyrində mənzil tutmağa əzm eylədim,
Durmasun yanımda mülkü qəsrü eyvanın sevən![109]

*(Mən ağır sınaqlar bataqlığında boğulmaq üçün artıq addım atmışam. Odur ki, can-cəsədini bəsləyənlərə burulğantək yan-yörəmdə dolanmağı məsləhət görmürəm! Mən artıq Tanrıya qovuşmaq yolunda müəyyən bir yer qazanmağa niyyət etmişəm, odur ki, mal-mülkünü, ev-eşiyini, dəbdəbəli sarayını sevənlər məndən uzaq dursunlar!).*

Göründüyü kimi, "Bayrağım altında səltənət sevinci təmənnasında olanlar" sözləri ilə məhz beləlinəri nəzərdə tutulmuşdur. İmamın bu açıq və birmənalı təklifinə cavablar, əlbəttə, müxtəlif idi. Məs.: Züheyr ibn Qeys Nəhayinin İmama cavabı müsbət oldu:

.................................

[109] *Füzuli. Kərbəla vaqiəsi, səh. 56-57*



Gəldi ol dəm ki, qılam canımı canana fəda,
Eyləyəm ərzi-məhəbbət, qılam izhari-vəfa![110]

*(Canımı canana qurban vermək anı gəlib çatmışdır. Odur ki, mən gərək indi sevgimi dilə gətirib əhdimə sədaqətimi göstərəm).*

Yaxud Müslüm ibn Əqilin Kufədə qətlə yetirilməsi xəbəri gəldikdə imam onun oradakı övladlarına geriyə qayıdaraq ata yurdunu boş qoymamalarını tövsiyə etdiyi zaman onlar hamılıqla buna etiraz edirlər. Məsələn, Müslümün qızlarından biri belə deyir:

Zillət ilə ləzzəti olmaz həyatın, dustlar,
Nəqdi-can sərf eyləyib dünyada kam almaq gərək!
Əcz ilə dönmək ədudən səhldir, himmət dutub,
Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək!

*(Dostlar, alçaqlıq içərisində keçirilən ömrün mənası olmaz, varını-yoxunu işlədib arzuna-istəyinə çatmaq gərəkdir. Acizliklə düşmən qabağından qaçmaq yüngüllükdür. Odur ki, ya şəhid olmalı, ya da qisasını almalısan!).*

Lakin Abdullah bin Hürr adlı başqa bir şəxs İmam Hüseynin təklifinə mənfi cavab vermiş və ömrünün qalan bölümünü peşmançılıq hissləri ilə keçirmişdir. Füzuli onun bu acınacaqlı durumunu belə qələmə alır:

Zəhi nadan ki şahi-mülki-iman
Ana ərz edə təşrifi-səadət.
Təvəhhüm eyləyib tiği-bəladən
Özündən eyləyə səlbi-səadət[111].

*(Sən bir nadanlıq və cahilliyin dərəcəsini gör ki, iman ölkəsinin hökmdarı ona xoşbəxtlik şərəfinin yolunu göstərdiyi*

---

[110] *Füzuli. Kərbəla vaqiəsi, səh. 58*

[111] *Yenə orada, səh. 60*





*halda, o, bəla qılıncının qorxusundan həmin xoşbəxtliyi özündən uzaqlaşdırsın).*

Ən nəhayət, aşağıdakı parçaya diqqət edək: "Rəvayətdir ki, imamın dəstəsində hələ də dünya malı təmənnası çəkənlərdən qalmışdı və həzrətin sonuncu nidasını eşidib onlar da dağılışdılar. Ona səbati-məhəbbət dəvası edənlər isə fəryad qoparıb fəğana gəldilər ki, ey doğru yolun hadisi, biz sənin xidmətində hidayət yolunun salikləri ikən təəssüflənmə və bir dəm şəhadət səadətindən naümid olduğumuzu rəva görmə!

Şe´r:

Biz bəladən incinib bidaddan vəhm etməriz,
Nəqdi-canın sərfi-canan eyləyən aşiqləriz!
Eşqi-meydanında bidadü bəladən dönməyib,
Raströv salikləriz, sabitqədəm sadiqləriz!"[112]

*(Biz ağır sınaqlardan inciyib zülmdən çəkinmərik. Çünki biz can nəqdini canan yolunda sərf edən həqiqi aşiqlərik. Biz eşq meydanında zülmdən və ağır sınaqlardan üz döndərməyən doğru yollu və ardıcıl sadiqlərik).*

Gətirilən bu örnəklər əsaslı surətdə sübuta yetirir ki, araşdırılan beyt şəhidliyi də əhatə edən fədakarlıq baxımından özünün lirik təbiəti ilə "Hədiqətü-s-süəda"nın epik quruluşundan ayrı deyil. Odur ki, İslamiyyətin fədakarlıq və şəhidlikə bağlı müddəaları bu beytdə məfkurəvi istinadgahdır: *"Bəqərə", 154; "Ali-İmran", 169-170; "Tövbə", 111.*

Fədakarlıq və şəhidliklə bağlı bu Quran mövqeyi İslamın cihad konsepsiyası zəminində bərqərar olmuşdur*: "Bəqərə", 216; "Ənkəbut", 6; "Səff", 4, 10-12.*

"Quranın qardaşı" adlandırılan "Nəhcül-bəlağə"dəki müvafiq hissələr Həzrət Əlinin (ə) bu konsepsiyaya verdiyi töhfə kimi ayrıca diqqəti çəkir.

..................................

[112] *Yenə orada, səh. 61*





Beləliklə, aydın olur ki, şəhidlik zirvəsinə ucala biləcək qədər fədakarlıq ideyası şeirin bu bölümündə İmam Hüseyn hərəkatı ilə üzvi vəhdətdə qovuşdurulmuş və bir çox baxımdan parlaq bir obrazlılıq yaradılmışdır.

* * *

Araşdırdığımız beytin ideyalar qalereyasını zənginləşdirən cəhətlərdən biri mətnin alt qatından belə bir fikrin də boy göstərməsidir ki, İmam Hüseyn hərəkatı önəm və dəyər baxımından İslamiyyətin göstəricisinə çevrilmiş, namaz ibadət növünün rüknlərindən birini təşkil edən qiyama durmaq qədər zəruridir. Şair demək istəyir ki, qiyama durulmadan qılınan namaz Tanrı qatında qəbul edilmədiyi kimi, bu ulu din böyüyü ilə çağdaş ola-ola onun başçılıq etdiyi hərəkata qoşulmamaq da Allah dərgahında günah tərkibli, cəmiyyət içərisində isə cinayət xarakterli əməl sayılır. İmam Hüseynin (ə) "Mən yalnız yaxşılıqlara həvəsləndirib, pisliklərdən çəkindirmək və haqq yoldan azmış camaatı babamın və atamın yaradıb inkişaf etdirdiyi saf və duru İslama (Siyrətə) qaytarmaq üçün qiyam etmişəm" sözləri ideyanı təkcə ideoloji planda yox, Füzulinin sənətkarlıq mövqeyi yönündə də əsaslandırır. Unutmayaq ki, Həzrət Muhəmməd (s) hələ əsl səadətdə (vəhyin gəldiyi 610-632-ci illərdə) İmam Həsənlə (ə) İmam Hüseynin (ə) imamət dövrlərinin fərqlərini göstərmiş, "Mənim bu iki nəvəmin ikisi də imamdır. İstər evdə sakit əyləşsinlər, istərsə də qiyama qalxsınlar" buyurmuşdur. Füzuli lirikasının "qiyam-Qiyamət" qarşılaşdırması üzərində qurulmuş parlaq obrazlılıqlarının yerinə görə İmam Hüseyn hərəkatı ilə də ara-sıra səsləşməsinin istisna edilə bilməyəcəyini nəzərə alsaq, onda bilavasitə İmam Hüseynin (ə) şəninə yazılmış şeirdə bu fikrin yeri bir qədər də möhkəmlənmiş olar.

Araşdırdığımız beyt bu yöndə mətlə ilə də səsləşir. Çünki mətlədəki "Ucaldın qəbrim" hayqırtısı buradakı "Görən saətdə ol qamət-qiyamın qıymadım canə" misrasındakı kecikmiş dünyəvi əməlin bəlkə axirətdə Bərzəx aləmində səhvin,



suçun aradan qaldırılmasına bənzər bir şəkildə bərpasına da cəhd edilə bilər. Bu isə yalnız Füzuli dühasından soraq verən çox incə bir bədiilik örnəyidir və heç şübhəsiz, belə parlaq obrazlılığı yaratmaqda İmam Hüseynin (ə) pak ruhu yardımçı olmuşdur.

* * *

Ən nəhayət, beytin ümumbəşəri prinsip olan İmam Hüseyn hərəkatının zaman-məkan məhdudiyyəti tanımaması ilə bağlı müddəanı özündə birləşdirməsi diqqəti çəkir. Çünki bu müddəa çağdaş düşüncəyə yön verə biləcək qədər işlək və çevik bir mexanizmə malik olduğu kimi, vətənpərvərlik və humanizm yönündə təsirli bir hərəkətəgətirici və istiqamətverici ictimai stimul və mənəvi impulsdur.

Bəs bu mexanizmin məğzi nədir?

Oradan başlayaq ki, Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı yalnız Aşuradan, susuzluqdan, məzlumluqdan, əsir-yesir olmaqdan, ağlayıb-sızlamaqdan ibarət deyil. Bunların heç birinin fərdi və ictimai, etik və estetik, mənəvi və əxlaqi dəyər və önəmini azaltmadan bilmək gərəkdir ki, Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilk növbədə əvvəl də vardı, sonra da var, ilahi qüdrət və hikmətin şəxs, təfəkkür, şəxsiyyət, cəmiyyət və dövlət kateqoriyaları üzərindəki təkrarsız və bənzərsiz nadir təzahürüdür. Başqa sözlə, bu o deməkdir ki, İmam Hüseyn Rəsulullahın vəfatından 50 il sonra bilərəkdən əsl mahiyyətindən uzaqlaşdırılmış, qəsdən ictimai-siyasi tərəfdən təhrif edilmiş İslamı təkcə bir din kimi yox, bütöv tam, ictimai, mədəni orqanizm kimi də labüd məhvdən qurtarmış və beləliklə də, əslində, bütün bəşəriyyəti xilas etmişdir.

İmam Hüseyn (ə) yalnız ox, qılınc, nizə şəhidi olmamışdır. Bu ulu din böyüyü Allah rizası naminə xalqa xidmətin də ölməz timsalına çevrilmişdir. Şəib ibn Əbdürrəhmandan İmam Hüseynin çiyinlərində olan və qılınc, nizə yaralarına oxşamayan bir neçə yara haqqında soruşduqda o, “Bunlar



Hüseyn ibn Əlinin gecələr əlsiz-ayaqsızlara, yetimlərə, yoxsullara, dul qadınlara çatdırdığı içi dolu yemək heybələrinin izidir" deyə cavab vermişdir. Belə tarixi sənədlər onlarladır. Digər tərəfdən, Kərbəlada keçən ağır günlər ailə-məişət mərhələsindən tutmuş ta ictimai münasibətlər müstəvisinədək bəşər tarixinin görmədiyi misilsiz insanlıq məktəbidir. Müəllimi və ilhamçısı İmam Hüseyn (ə) olan bu məktəbin Həzrət Abbas (ə), Əliəkbər ağa (ə), cənab Qasim (ə), Həbib ibn Müzahir, Müslüm ibn Ovsəcə, Əli qızı xanım Zeynəb kimi bütün fənlərdən əla qiymət alan kamil yetirmələri var və Füzuli "Hədiqətü-s-süəda"sı həm ayrı-ayrılıqda, həm də küll halında bunların şərəfinə ucaldılmış monumental bir abidədir.

Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının vətənpərvərlik və humanizm qatlarına gəlincə:

Eyləyib hər yıl cəmi´i-əhli-aləm ittifa,
Şərh edərlər macərayi-Kərbəla əxbarını!
Nə tükənməz qüssədir ki, hərgiz axir olmadı,
Şərhi aciz eylədi əhli-cahanın varını!



*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. (giriş). İraq. Kərbəla şəhəri*



*(Bütün bəşəriyyət hər il bir araya gələrək Kərbəla vaqeəsinin günümüzə gəlib çatmış informasiyasını ən müxtəlif yönlərdə açıqlayar. Ancaq sən bu vaqeənin miqyas genişliyini gör ki, onun haqqındakı köklü araşdırmalar hələ də bitib-tükənməmişdir. Əksinə, bəşəriyyətin elmi-nəzəri resursları onun dərin təhlili qarşısında tamamilə aciz qalmaqdadır).*

Bu yerdə Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı haqqında söylənilmiş bəzi müdrik kəlamları yada salmamaq sadəcə olaraq imkan xaricindədir; məs.: "İmam Hüseynin qiyam etməkdə məqsədi öz dünyəvi istəklərinə çatmaq idisə, mən başa düşə bilmirəm ki, niyə bacıları, qardaşları və uşaqları da bu hadisədə iştirak etmişlər? Ağıl belə hökm edir ki, o, yalnız İslam yolunda bu fədakarlığı etmişdir".

*(Çarlz Dikkens – ingilis yazıçısı)*

Və ya: "Görəsən, elə bir şəxs tapılarmı ki, Kərbəla hadisəsini eşidəndə ürəyi qanla, kədərlə dolmaya? Hətta qeyri-müsəlmanlar da İslam bayrağı altında həyata keçən bu müharibənin pak ruhunu inkar etməyi bacarmazlar".

*(Edvard Braun – tarixçi)*

Və yaxud: "Müsəlmanların bir millət kimi mövcudluğu İmam Hüseynin (ə) şəhadətinə bağlıdır. Ona görə ki, Hüseyn eşqi ilə yanan hər bir şəxs heç vaxt zilləti, köləliyi qəbul etməz".

*(Marbini – alman filosofu)*

Və yaxud: "Mən İmam Hüseynin – İslamın o böyük şəhidinin həyatını diqqətlə oxumuşam və kifayət qədər Kərbəla tarixinin səhifələrinə diqqət yetirmişəm. Mənə aydın olub ki, əgər Hindistan azad bir ölkə olmaq istəyirsə, gərək İmam Hüseyndən örnək alıb onun yolu ilə getsin".

*(Mahatma Qandi – Hindistanın dövlət xadimi)*

Bu deyilənlər danılmaz biçimdə göstərir ki, Füzulinin gözündə Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı malik olduğu ictimai-siyasi və mənəvi-əxlaqi keyfiyyətləri ilə Qiyamətədək zaman-məkan məhdudluğu tanımayan və



Qurani-Kərimin özü qədər qaları olan bir islami qaynaqdır və dünya durduqca bu qaynaq o azadlıq karvanının böyükdən kiçiyədək bütün göstəriciləri üzrə bütün müstəvilərdə özünün qəti sözünü deyəcəkdir.

* * *

3-cü beytdən etibarən şeir ictimai məzmun almışdır. Belə ki, şair İmam Hüseynin mübarizə tarixçəsinin bir sıra məqamlarını lirik növün imkanları çərçivəsində məsuliyyət şüuru zəminində tərənnüm etməyə güc vermişdir. Odur ki, şeirin 4-cü beytində Qiyamət anlayışının önə çəkilib Kərbəla vaqeəsinin və İmam Hüseyn şəxsiyyətinin mənəvi ictimai kontekstində mənalandırılması tamamilə təbiidir:

Qiyamətdə hesabı olmayanlardandır ol ğafil
Ki, fərq eylər firaqin şamini sübhi-Qiyamətdən!

*(Ayrılıq axşamını Qiyamət səhərindən fərqləndirən qafil Qiyamət günündə hesabı olmayan kimsələrdəndir).*

Beyt bizi aşağıdakı fikirlərə aparıb çıxarır:

1. Qəflət həyatın bütün sahələrində ziyanlıdır.
2. Qəflətdən qurtuluş kamil insanın gözündə yüksək insani dəyərlərdən uzaqlaşmaq və Axirət gününə üzüqara gəlməklə eynidir.
3. Böyük günah sahibləri Qiyamət günündə heç sorğu-suala da layiq görülməyəcəklər.
4. Qiyamət günü bəşəriyyətin yekun aktıdır.
5. Axirət həyatı insanın bu dünyadakı əməllərinin qanunauyğun nəticəsidir.
6. Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) hərəkatı özlüyündə kiçik Qiyamətdir.
7. Tasua axşamı Aşura gününün səbəbi, Aşura günü də Tasua axşamının nəticəsidir.
8. Tasua axşamında və ondan öncəki bir neçə gündə İmam Hüseynin (ə) döyüş düşərgəsini tərk edənlər qafil şəxslərdir.



Əlbəttə, bu bölgü şərti xarakter daşıyır. Çünki göstərilən maddələri başqa şəkildə də təsnif etmək olar. Odur ki, biz yalnız son dərəcə böyük önəm kəsb edən cəhətləri önə çəkirik.

Digər tərəfdən, beytdən çıxarılan nəticələrlə bağlı belə bir irad da irəli sürülə bilər ki, 12 sözlük bir mətndən axı necə bu qədər fikir çıxa bilər? Cavab aydındır: Söz Füzuli Sözüdür, bu Füzuli Sözü dünya tarixinin ən böyük hadisələrindən biri haqqındadır, ən nəhayət, gəlinən hər bir qənaətin beytdə konkret daşıyıcıları – atribut və ekvivalentləri mövcuddur.

* * *

Beytin ideyasını "Kərbəla vaqeəsi kiçik Qiyamətdir" qənaəti təşkil edir. Bu qənaət mətnin leksikonunun olduqca sərt olmasından da duyulur. Məqtəllərdə Aşura gününün geniş təsvir olunan dəhşət və vəhşətlərini nəzərə aldıqda, 7 qardaş və 2 oğul itirmiş xanım Zeynəbin iztirablarını düşündükdə, başsız qalmış qız-gəlinlərin yandırılmış çadırlardan ucsuz-bucaqsız səhralara sarı üz qoyduqlarını göz önünə gətirdikdə Kərbəla vaqeəsinin faciəsi tük ürpədir. Bu barədə azacıq təsəvvür oyatmaqdan ötrü Peyğəmbər xanədanının qız-gəlininin xeymələrə İmam Hüseynsiz qayıdan vəfalı Zülcənaha müraciətini anmaq yetər:

Ey səməndi-badpa, billah, qanı ol şəhsuvar?
Nişə ol sərdardən qıldun cüdalıq ixtiyar?
Neylədin ol dürri-şəhvarı ki, tapşurduq sənə?
Qanda saldın, nişə gəlməz, ötdü həddən intizar!
Paybusindən anın məhrum olub, sən ey rikab,
Səxtdilsən kim, gözün olmaz dəmadəm əşkbar!
Dəstbusindən anın düşmüşsən ayrı, ey licam,
Nola toprağa düşüb oldunsa xarü xaksar?![113]

*(Ey yel qanadlı səmənd at, sən Allah, o dəstə başçısı, o igid hanı? Sən axı niyə o sərkərdədən belə tez ayrıldın? Sənə*

[113] *Füzuli. Kərbəla vaqiəsi, səh. 141-142*





*tapşırdığımız o təzə və taysız incini harada itirdin? Harada saldın, niyə gəlməz?Bizim intizarımızın həddi-hüdudu yoxdur! Ey üzəngi, sən onun əlini öpmə səadətindən məhrum ola-ola gör nə qədər daşürəklisən ki, gözlərindən anbaan su axmır. Ey cilov, sənin yerə düşüb toz-torpağa bulaşaraq zəlil olmağında heç bir qəribəlik yoxdur. Axı sən onun əlini öpmə şərəfini itirmisən!).*

* * *

Özlüyündə kiçik Qiyamət olan Kərbəla vaqeəsinin bəndəlik özünüdərkinə, fərdi cavabdehlik duyğusuna, ictimai məsuliyyət şüuruna və islami etiqad, ibadət və əxlaqa təsirinə gəldikdə isə, göstərmək gərəkdir ki, son illərdə aparılmış köklü araşdırmalar nəticəsində bu yöndə təqdirəlayiq elmi-nəzəri qənaətlərə gəlinmişdir. Torpağının dörddə birindən çoxunu itirmiş bir millət üçün isə belə qənaətlər hava-su kimi gərəkdir. Gəlin unutmayaq ki, bu gün dilimizin əzbərinə çevrilmiş:

> Ey şəhid oğlu şəhid, istəmə məndən məqbər,
> Sənə ağuşunu açmış, duruyor Peyğəmbər!

Yaxud:

> Bayraqları bayraq yapan üstündəki qandır,
> Topraq, əgər uğrunda ölən varsa, vatandır! –

səpkili beytlər (Məhmət Akif Ərsoy) istər bilavasitə İmam Hüseyn hərəkatının, istərsə də onun minillik ədəbiyyatımızdakı bədii inikasının təsiri ilə yaranmışdır. Yenə də unutmayaq ki, bu gün Kərbəla şəhidləri dünyanın bütün ölkələrində dərin sayğı və sevgi ilə anılır, onların əziz xatirəsi böyük ehtiramla yad edilir.

* * *





İndi də beytin Tasua axşamı, Aşura günü və İmam Hüseynin (ə) döyüş düşərgəsi ilə bağlı məna-məzmun tutumuna baxaq.

Oradan başlayaq ki, "Firaqın şami və sübhi Qiyamət" ifadələri bilavasitə Tasua axşamı ilə Aşura gününə aiddir. Çünki istər salnamələrdə, istərsə də məqtəllərdə bu barədə aydın bilgilər var. Məs.: "Bir nəfər İmam Cəfəri-Sadiqdən soruşdu: "Biz artıq Aşura haqqında məlumatlıyıq. Bəs Tasua nədir?" O belə cavab verdi: "Tasua Hüseynin mühasirəyə salındığı gündür".

Məqtəllərdə yazıldığına görə, Ömər Səd qoşuna Tasua axşamı hərəkət əmri verdi. Bu vaxt imamı yüngülcə yuxu tutmuşdu. At ayaqlarının səsini eşidən xanım Zeynəb imama bildirdi ki, deyəsən, düşmən hücuma keçmək istəyir. İmam dedi: "İndi Rəsulullahı yuxuda gördüm, o mənə belə buyurdu: "Sən tezliklə bizə tərəf gələcəksən".

Sonra o, Əbülfəzl Abbası 20 atlı ilə düşmənin niyyətini öyrənməyə göndərdi. Həzrət Abbas gəlib bildirdi ki, düşmən döyüşə başlamaq istəyir. İmam dedi: "Onların yanına get və əgər bacarsan, ğudvaya kimi onlardan möhlət al (Məqtəl ədəbiyyatında "ğudva" Aşura gününün sübhünün başlanğıcına deyilir – **V.A.**). Qoy onlar bu gecə bizə möhlət versinlər ki, biz bu gecə də Rəbbimizə namaz qılıb ibadət edək, Ona dua edib, Ondan əfv diləyək. Çünki O yaxşı bilir ki, mən namaz qılmağı, Quran oxumağı, çox dua edib əfv diləməyi sevirəm".

Ravi deyir ki, o gecə xeymələrin yanından keçərkən şahid oldum ki, onlar bal arısının səsinə bənzər bir səslə Allaha yalvarırdılar.

Belə qeydlər "Firaqın şami və sübhi-Qiyamət" ifadələrini Tasua axşamı ilə Aşura gününə işarə saymağa imkan verir. Bundan başqa, şeirin fikri axarı və bədii tutumu da belə düşünməyə sövq edir. Belədə İmam Hüseynin döyüş düşərgəsini tərk edənlər "ol qafil" ifadəsinin əhatə dairəsinə düşür. Deməli, hər üç ifadə bir-birini tamamlayır.

Yenə də məqtəllərdə deyildiyinə görə, Tasua günündə İmam Hüseynin ətrafında 1500-dək silahlı şəxs olub. İmam onların sərbəst olduqlarını bildirdikdən sonra çoxu çıxıb



gedib. Xanım Səkinə (Sukkeynə) deyir ki, bəziləri heç atamla vidalaşmadı da!

Beləliklə, aydın olur ki, beytdən ələ gələn fikirlərin hamısı istər ideoloji bazada, istərsə də bədii-estetik planda özünü doğruldur. Odur ki, bu fikirlər ayrı-ayrılıqda da, küll halında da Kərbəla vaqeəsinin geniş tarixçəsini əhatə edir. Deməli, beyt məmduh rolunun başçılıq etdiyi hərəkat haqqında kifayət qədər yığcam və aydın bilgi verir, bu yolla da imamhüseynsevərlərin duyğularını oyadıb, hisslərini coşdurur, düşüncələrini hərəkətə gətirib, əqidələrinin güclənməsinə yol açır, ən nəhayət, onları həqiqi islami dəyərlərə qovuşdurur.

* * *

İlk 4 beyt son 3 beyt üçün sarsılmaz ideoloji əsas və möhkəm ədəbi zəmin əmələ gətirdiyindən qəzəl-nətin qalan bölümü şeirin ideya-bədii istiqaməti yönündə bir qədər də doğmalaşır:

Təriqi-səbrü tədbiri-səlamət ləzzətin bilmən,
Mənə eşqü məlamət yey gəlir səbrü səlamətdən.

*(Mən səbiretmə yolunun və salamatlıq tədbirinin ləzzətini bilmərəm, eşq və danlaq mənim üçün səbiretmədən və salamatlıqdan yaxşıdır).*

Şair demək istəyir ki, mən elə bir İmam Hüseyn aşiqiyəm ki, yersiz səbir etməklə sağ-salamat qalıb mənasız uzun ömür sürməyin gətirəcəyi həzz barəsində qətiyyən düşünmürəm. Odur ki, İmam Hüseynə bəslədiyim sayğı və sevgi üstündə mənə yönələn danlaq və məzəmmət bu cür puç və dəyərsiz həyatdan qat-qat üstündür.

Beyt əsasında aşağıdakı fikirləri söyləmək mümkündür:

1. Yersiz səbirlilik əsl məhəbbət üçün maneədir.
2. Nəyin bahasına olursa-olsun salamat qalmağa çalışmaq, əslində, həqiqi dindarlığın qarşısını alır.
3. İnsan bunlardan hansını seçməkdə ixtiyar sahibidir.
4. İnsanın doğru yolu seçə bilməsindən ötrü müəyyən təmrin



və təlqinlərə alışması gərəkdir. Bunu isə irfani duyğu və düşüncələrlə yerinə yetirmək daha münasibdir.

5. Ən nəhayət, hər sahədə müqayisə aparmaq məqsədə tez yetişmək üçün optimal variantdır.

Beytdən ələ gələn fikirlərin bir neçəsi səbir anlayışı ilə bağlı olduğundan onları araşdırmamış öncə bu barədə bilgi verək.

* * *

"Yersiz səbirlilik İmam Hüseyn (ə) eşqinə də zərər gətirər" fikrini beytin ümumi məzmununda qavramaq bir elə də çətin deyil. Çünki beyt İslamiyyətin səbir fəlsəfəsindən yersiz dözümlülük hissi aşılamaq üçün sui-istifadənin ifşasına yönəldilmişdir. Kərbəla vaqeəsi isə yaşarı və canlı İslamın qopmaz, ayrılmaz bir parçasıdır.

Digər tərəfdən, beytin başlıca ideya-bədii istiqamətini:

Hər dərdsizdən umma, Füzuli, dəvayi-dərd,
Səbr eylə, kim ki dərd veribdir, dəva verər! –

beytindəki məna-məzmun yönündə götürmək gərəkdir. Ona görə ki, bir qədər alt qatda olsa da, orada da, əslində, səbir anlayışını lazımi ünvannına yönəltməkdən, onun ehtiyat mənbəyindən yerində yararlanmaqdan danışılır. Belə ki, mətlədə:

Səbrim alıb, fələk mənə yüz min bəla verər,
Az olsa bir məta, onu el çox baha verər, –

deyən şair məqtəyədək səbir anlayışının islami yozumunu verir, ayrı-ayrı predmetləri motivə çevirməklə bunu bədii qavrayışa mərhələ-mərhələ təqdim edir. Sadəcə olaraq burada önəmli olan səbrin sərhədini tanıyıb, ondan orta yolla faydalanmağı bacarmaqdır. Bunun ən bariz təzahürü



isə Kərbəla vaqeəsinin rəhbərində özünü göstərir. Döyüşün son anlarında oğlu İmam Zeynəlabidinlə vida səhnəsi bu məfhumun islami dərki baxımından olduqca önəmlidir. İmam ata oğula belə üz tutur:

Gəl ey həmdəm ki, cismimdə vida etməkdədir canım,
Tökər qanlar, anıb firqət bəlasın çeşmi-giryanım.
Mənim müşkül degil halım ki, qürbi-Həqq qılır hasil,
Qəmi-dünya əlindən qurtulur hala giribanım.
Səninçün ağlaram kim, edəcəkdir halını müztər,
Həm ə´da zülmü-cövrü, həm mənim ənduhi-hicranım.[114]

*(Ruhum bədənimdən ayrılmaq üzrədir. Odur ki, ey dost, gəl sonuncu dəfə vidalaşaq. Ağlar gözüm ayrılıq əzablarını anaraq yaş yox, qan axıdır. Tanrıya qovuşduğumdan mənim vəziyyətim qorxulu deyil. Çünki artıq yaxam dünyanın qəm-kədərinin əlindən xilas olur. Mən sənə görə ağlayıram ki, bir yandan düşmənlərin zülm və əzab-əziyyəti, bir yandan da mənim ayrılığım üçün çəkdiyin qüssə səni iztiraba salacaqdır).*

“Ey nuri-didə, təriqi müsabirətdən inhiraf etmə ki, şimeyi-ənbiya və şiveyi-övliyadir. Yəqin ki, bu ibtila bizə nəsib olamaseydi, bizdən sonra zahir olan müsəlmanlara hər bəla nazil olduqda anı mövcibi-qəzəbi-İlahi təsəvvür edüb mə´yus olmaq müqərrər idi. Zəhi səadət ki, bəla bizim mülazimətimizdə məmduhi-əhli-həqiqətdir və vüqui-müsibət mövcibi-təsəlliyi-ətqiyayi-ümmət. Şe´r:

Bəlaya səbr edəlim, cövrə şükrlər qılalım
Ki, bu rəviş tələb əhlinədir təriqi-vüsul!
Cəmiyi-xəlqə bəla ehtiramı vacibdir
Kim, oldu əqrəbi-xüddami-Əhli-beyti-Rəsul.

“Ey cigərguşə, Mədinəyə yetdikdə netə kim, mən sənin səlamını sükkani-əhli-behiştə ilətərəm, sən dəxi bənim səlamımı anda olan əhibbavü əviddayə ərz edəsən”[115].

---

[114] *Füzuli. Kərbəla vaqiəsi, səh.136*

[115] *Füzuli. Əsərləri, VI cild, səh. 331*





*(Ey gözümün işığı, əsla səbir yolundan çıxma. Çünki səbirli olmaq peyğəmbərlərin və övliyaların üsuludur.*

*Əgər bu sınaq bizə nəsib olmasaydı, bizdən sonra gələn müsəlmanlara üz verən hər bir bəlanı onlar ilahi qəzəbin təzahürü sanıb mütləq ruhdan düşərdilər. Nə xoşdur, necə də gözəldir ki, bizim timsalımızda bəla həqiqətsevərlərin öyünc yeridir və müsibətin baş verməsi ümmətin təqvalı adamlarının təsəlli qaynağıdır.*

*Gəl başımıza gəlmiş bəlalara dözüb, bizə edilmiş əzab-əziyyətlərə şükür edək. Axı dilək sahibləri yalnız bu yolla istəklərinə qovuşa bilərlər. Bütün insanlar gərək bəlanın hörmətini saxlasınlar. Çünki Peyğəmbər Əhli-beytinin xadimlərinin ən yaxın köməkçisi məhz bəladır!*

*Ey ciyərimin bir parçası, mən sənin salamını cənnətliklərin idarəedicisinə çatdırdığım kimi, Mədinəyə qayıtdıqda sən də mənim salamımı sevimli dostlara çatdırasan).*

Göründüyü kimi, bu vida səhnəsi büsbütün bir səbir xətti üzərində qurulmuşdur. Bu xətt proseslərin təmkinlə qiymətləndirilməsində İslamın səbir fəlsəfəsinin Kərbəlada yeni bir mahiyyət qazandığını və özünün ən uca zirvəsinə yüksəldiyini göstərir. Bu onu da göstərir ki, dözümlülük və salamatlıq özlüyündə heç bir etik dəyər kəsb etmir. Onlar yalnız bir vasitə olub, Allahın istədiyi yüksək insani keyfiyyətlərə yönəldildikdə və bu yolla müsəlman həyat tərzinin komponentinə çevrildikdə Tanrı qatında dəyər qazanır. Əgər belə olmasa, insan ömrü donuq olub sönük və durğun keçər, mənəviyyat və əxlaqın tutumlu ehtiyat mənbələri lazımınca üzə çıxmaz. “Yey gəlir” ifadəsində əksini tapmış müqayisə üsulu da belə dərin məzmunun açılmasına hesablanmışdır.

Səbir anlayışının beytin ideya-bədii çəkisindəki yeri ilə bağlı Quran bulağından su içən klassiklərimizin bir-birindən dolğun və tutumlu olan sözləri də yada düşür. Belə ki:

Mərd bezendan şərəf arəd bedəst,
Yusef əz in ruy bezendan neşest!





*(Kişi zindanda belə şərəfinin üstünə şərəf gətirər, Yusif elə bunun üçün illərlə zindanda oturdu*) deyən Gəncə şeyxindən...

Artdıqca həyasızlıq olur el-mütəhəmmil
Hər zülmə dözən canları neylərdin, İlahi?!
Məzlumilərin göz yaşı dərya olacaqmış,
Dəryaları, ümmanları neylərdin, İlahi?! –

deyən Şamaxı mirzəsinədək müsəlman mədəniyyəti zəminində yetişib, saf və duru İslamın bədii təbliğatçıları olan hər bir ədibimiz Müqəddəs Kitabımızdakı səbir ayələrinə dərindən bələd olmuş, onları mənsub olduqları xalqın ruhuna hopdurmaq, bütün təbəqələrinə sonuna kimi çatdırmaq eşqi ilə alışıb yanmışlar. Bu yerdə Allahın "Mərhəməti və yardımı olmasa (sonuncu Peyğəmbər olmağına baxmayaraq), heç sən də səbir edə bilməzsən!" *("Nəhl", 127)* ayəsinə güvənib:

Mən necə səbr eyləyim ol Yusifim hicraninə,
Ey əzizan etməyib hicranə Peyğəmbər şəkib! –

deyən Seyid Əzim yada düşür.

Belə örnəklərin sayını istənilən qədər artırmaq olar. Odur ki, Füzulinin dərin və dönməz bir İmam Hüseyn (ə) rəğbətilə yazdığı bu qəzəl-nətin aşiqanə ruhu bir yandan şairin nail olduğu dinin bədii əksidirsə, o biri yandan Kərbəla vaqeəsinin müsəlman həyat tərzinə bəxş etdiyi töhfənin lirik əks-sədasıdır.

"Səbirlilik" və "salamatlıq" anlayışlarının yalnız islami yaşayış biçimini gözləməklə Tanrı qatında dəyər qazanması fikri müsəlman məfkurəsinin hərtərəfli əsaslandırdığı müddəadır. Aşağıdakı ayə bu məsələləri geniş açıqlayan çoxsaylı nəqli dəlillərdən biridir: "Yalnız səbir edənlərə mükafatları onların etdikləri əməllərin daha gözəli ilə veriləcəkdir" *("Nəhl", 96).* Füzuli də "Leyli–Məcnun" məsnəvisinin sonunda özünün baş qəhrəmanlarının cənnət xoşbəxtliyini təsvir edərkən belə sarsılmaz ayələrə söykənmiş





müsəlman həyat tərzinin insanı əzəli-əbədi ilahi nemətə çatdırdığını önə çəkmişdir.

Mələklərin Zeydə verdiyi cavab bunu əyani surətdə nümayiş etdirir:

Bulduq, – dedilər, – riyazi-rizvan,
Bu qövmü xücəstə – hurü ğılman.
Bu iki məhi-xücəstərüxsar
Məcnun ilə Leyliyi-vəfadar.
Çün vadiyi-eşqə girdilər pak,
Ol paklıq ilə oldular xak,
Mənzilləri oldu bağı-rizvan,
Çakərləri oldu hurü ğılman
Çün bunda riza verib qəzayə,
Səbr eylədilər ğəmu bəlayə,
Getdikdə cahani-bivəfadən,
Qurtuldular ol ğəmu bəladən!

Ən nəhayət, göstərmək gərəkdir ki, Kərbəla vaqeəsinə az-çox bələd oxucu beyti asanlıqla bu ulu din böyüyünün monoloqu kimi də qəbul edə bilər. Çünki mətnin sözaltı qatı üsulluca anladır ki, o özünün imamət kamalı ilə Tanrı sınağı və bəndə azadlığı arasındakı sərhədi çox incəliklə gözləmiş, yalnız Allaha təvəkkül etməklə ən mürəkkəb və keşməkeşli hərbi-siyasi təmayüllərin qarşısında duruş gətirə bilmişdir. Beytin məna-məzmun tutumunun genişliyi oxucuya imkan verir ki, o, imamı təpədən-dırnağadək silahlanmış minlərlə düşmən əsgərinin önündə dayanıb alçaldıcı beyət təklifini rədd edən və onu tikə-tikə doğramağa hazır olan qoşun nəfərlərinə Axirətdə üzləşəcəkləri ağır cəzaları xatırladan, onları doğru yola çağıran möhtəşəm vəziyyətdə təsəvvürə gətirsin.

* * *

Bəşər övladı özünü dərk edəndən bəri həyatın məqsədi haqqında, ömrün mənası barədə dərin düşüncələrə dalmış, hissiyyatla idrakın, mənəviyyatla maddiyyatın, batinlə zahirin





fərqlərini götür-qoy etmiş, təbiətin sirlərini açmağa can atmış, ilahi qüdrət və hikmətin nişanələrini qavramağa çalışmışdır. Mədəniyyət, sənət, ədəbiyyat həm də bu əzəli-əbədi qayədən doğmuşdur. Təsadüfi deyildir ki, ötəri həzlər, keçici ləzzətlər böyük ədəbiyyatın daimi mövzusuna çevrilmiş, mürəkkəb insan mənəviyyatının tərənnümü, keşməkeşli ictimai hadisələrin və ailə-məişət əhvalatlarının təsviri şah əsərlərin ideya-bədii istiqamətini şərtləndirmişdir. Bu zaman ədiblərimiz bütün varlıqları ilə bağlandıqları Qurani-Kərim bulağından su içmişlər. Aşağıdakı bir neçə ayə bunun ölməz dəlil-sübutlarıdır: "Allah sizi yaradıb, sonra da (əcəliniz çatanda) öldürəcəkdir. Sizin bir qisminiz ömrün ən rəzil (ixtiyar) çağlarına (80-90 yaşlarına) çatdırılar ki, (vaxtı ilə) bildiyi hər şeyi unudar (insan qocalığın ən düşkün dövründə bildiyini unudar, xasiyyətini dəyişib uşaq kimi olar. Bu, əsasən, kafirlərə aiddir. Lakin Quran oxuyan, oruc tutub namaz qılan, sidq-ürəkdən ibadət edən şəxsin ixtiyar çağında belə ağlı başında olar, uzun ömür onun qiymətini və kəramətini Allah yanında daha da artırar). Həqiqətən Allah hər şeyi bilən və hər şeyə qadirdir" *("Nəhl", 70)*.

Yaxud: "Sizi zəif bir şeydən yaradan, gücsüzlükdən sonra qüvvətli edən, qüvvətli olduqdan sonra (yenidən) taqətsiz və qoca edən Allahdır" *("Rum", 54)*.

Bütün bunları beytin məna-məzmun tutumuna qovuşdurduqda və beyti İmam Hüseynin (ə) monoloqu kimi qəbul etdikdə birinci misra ən gənc Kərbəla igidi olan cənab Qasimə atasının vəsiyyəti ilə yaxından səsləşir. Məqtəllərdə həvəslə işlənən motivə əsasən, İmam Həsən vəfat edərkən hələ Kərbəla vaqeəsindən 10 il öncə oğluna belə üz tutubmuş:

Budur, ey nütfeyi-pakizə, vəsiyyət sənə kim,
Nəqdi-can sərfi qılub, kəsbi-səadət qılasan!
Ləzzəti-ömr səni qılmaya qafil Həqdən,
Kəndünü qabili-iqbali-şəhadət biləsən![116]

[116] *Füzuli. Əsərləri, VI cild, səh. 305*





*(Ey mənim pak nütfəli oğlum, sənə vəsiyyətim budur ki, məqamı çatdıqda canının bütün qüvvəsini sərf etməklə Tanrı qatında dəyəri olan əbədi xoşbəxtlik əldə edəsən. Ancaq diqqətli ol ki, uzun ömür sürmək həvəsi səni Haqdan, Allahdan uzaq salmasın və şəhidlik zirvəsindən məhrum etməsin. Sən gərək hər an özünü şəhidlik meydanına girməyə hazır biləsən).*

Göründüyü kimi, buradakı "ləzzəti-ömr" və araşdırılan beytdəki "ləzzət" ifadələri həm assosiativ yöndə, həm də məfkurəvi baxımdan üzvi bir uyarlıq içindədir. Bu, "həqdən qafil" qeydi ilə "qiyamətdə hesabı olmayanlardan" olan "ol qafil" obrazına da aiddir.

Bu paralellər araşdırdığımız qəzəl-nəti Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı haqqında olan monumental "Hədiqətü-s-süəda"nın lirik bir versiyası saymağa imkan verir. Axı əsərdə mürəkkəb insan mənəviyyatının çoxqatlı və çoxşaxəli dəruni iztirabları, duyğu, hiss, düşüncə və tərəddüdləri hərtərəfli surətdə açılıb göstərilir; məs.: "İbn Ziyad uşaqların (Müslümün balalarının – **V.A.**) zindandan qaçmasından xəbərdar olub, zindanban Məşkuru yanına çağırdı və soruşdu. ...Sonra cəllada buyurdu ki, ona əvvəlcə yüz qamçı vurub, qətlə yetir. Cəllad birinci on qamçını vurarkən Məşkur dedi: "Bismillahir-Rəhmanir-Rəhim". İkinci on qamçı vurulanda dedi: "Ya Rəbb, mənə səbir və təhəmmül ruzi et". Üçüncü on qamçıda dedi: "Ya Rəbb, məni bağışla". Dördüncü on qamçı vurulanda dedi: "Ya Rəbb, mənə Əhli-beytə görə əzab verirlər". Beşinci on qamçıda dedi: "Ya Rəbb, məni Əhli-beytə qovuşdur". Bundan sonra bir ah çəkib huşunu itirdi. Yüz qamçı tamam olanda Məşkur bir içim su istədi. İbn Ziyad dedi: "Su verməyin!" Bir qətrə su verməyib o məzlumun qətlinə əmr edilərkən Ömər ibn Haris şəfaət göstərib onu mənzilinə gətirdi və Məşkur Allahın rəhmətinə vasil oldu"[117].

.................................

[117] *Füzuli. Kərbəla vaqiəsi, səh. 46-47*





Bu deyilənləri yekunlaşdırdıqda beyti belə başa düşməliyik: "İmam Hüseynsiz keçən ömrün heç bir dəyəri yoxdur. Odur ki, mənim onun eşqi ilə hər şeydən keçməyim və buna görə hamının töhmətini götürməyim yersiz dözümdən və mənasız həyatdan qat-qat üstündür".

* * *

Şeir bədii-estetik zirvəsinə, ruhi-psixoloji gərginliyinə 6-cı beytdə çatır:

Təbiət inhirafin gör həvayi-eşqdən təndə,
İlac et düşmədən, saqi, mizacim istiqamətdən.

*(Saqi, eşq havasının bədənimdə əmələ gətirdiyi xəstəlikləri, ruhumda törətdiyi təlatümləri gör və səhhətim zəifləməmiş mənə bir çarə et).*

Şairin "Səhhət və mərəz" kimi tibbi-didaktik, "Rindü zahid" kimi didaktik-etik, "Həfti-cam" kimi etik-fəlsəfi, "Mətləü-l-etiqad" kimi fəlsəfi-ictimai əsərlər yazdığını göz önündə tutmadan beytin ideya-bədii cizgilərini üzə çıxarmaq olmaz. Ona görə ki, burada tibbi, etik, didaktik, psixoloji, fəlsəfi və ictimai mətləblər sənətkarın estetik kredosu prizmasından vahid müstəvidə və eyni qayə ətrafında ustalıqla sintez edilmişdir. Belə ki, əgər "mizac" sözü "immunitet, səhhət, psixika", həmçinin "xislət, xarakter" və "fitrət" kimi anlamlara gəlib daha çox tibbi məzmun bildirirsə, "gör" xitabı mətnin alt qatında "diaqnoz qoy, təşxis et, tap, müəyyənləşdir" deyə həkimə edilən müraciət təsiri bağışlayır.

Yaxud "istiqamət" sözü "təbiilik, gündəlik normal həyat tərzi, möhkəmlik", habelə "əqidə ardıcıllığı" kimi həm ailə-məişət, həm də cəmiyyət məsələləri ilə bağlı assosiativ duyğular doğurur.



Və ya ruhla bədənin birgə fəaliyyəti nəticəsində var olan "tən" (orqanizm) "həvayi-eşq"lə – məhəbbətin yüksək dərəcəsi ilə "təbiət inhirafı"na – təbii-fiziki və biokimyəvi dəyişikliklərə uğrayırsa, bu, birincisi, əski təsəvvürlərdən başlanğıc götürən, insan-təbiət, insan-kainat modelinin, naturalist dünyaduyumunun, ikincisi, ruhun ölməzliyinə dair islami müddəanın, üçüncüsü də fərdin özünüdərki yönündə tarixdən dərs almağın bədii əksidir.

Ancaq beytin açar sözü "saqi"dir. Ona görə ki, o, mətndə xitab yerində dayandığından beytin məzmunu onun alacağı anlam çalarlarından çox asılıdır.

Lüğəvi anlamı "supaylayan" olan bu söz Qurani-Kərimdə mövcuddur; məs.: "Yer üzündə bir-birinə yaxın (qohum) qitələr, (münbit, qeyri-münbit, şirin-şoran, dağlıq-aran yerlər, müxtəlif iqlimli torpaq sahələri), eyni su ilə sulanan üzüm bağları, əkinlər, şaxəli-şaxəsiz xurma ağacları var. Halbuki biz yemək baxımından onların birini digərindən üstün tuturuq. Şübhəsiz ki, bunda da anlayıb dərk edən insanlar üçün (Allahın qüdrətinə və vəhdaniyyətinə dəlalət edən) əlamətlər vardır" *("Ər-r'əd", 4).*

Ayədəki "yusqa bimain vahid" (eyni su ilə sulanan) tərkibindəki "yusqa" sözünün kökü "səqayə"dir. Sonralar sözün leksik tutumu genişlənmiş, bir neçə törəmə anlamı əmələ gəlmişdir. Sözün ən çox yayılmış anlamı isə "şərabpaylayan"dır. Heç şübhəsiz, bu anlam Qurani-Kərimdə "məst etməyən, baş gicəlləndirməyən şərab" *("İnsan", 15-21)* kimi səciyyələndirilən cənnət nemətindən əmələ gəlmiş, vaxt ötdükcə dünyəvi məna da almışdır. Ancaq söz orta əsrlər müsəlman mədəniyyətindən müxtəlif təsəvvüfi-mistik və irfani-fəlsəfi mənalarda işlənə-işlənə cilalanmış və şairlərin bir çox fikirləri üstüörtülü biçimdə vermələri üçün əlverişli bir açar sözə çevrilmişdir.

Füzuli İmam Hüseynin şəninə yazdığı bu şeirdə "saqi" deyərkən kimi nəzərdə tutmuşdur? Şeirin burayadək olan



bölümü "saqi"ni "möhkəm əqidəli din təbliğatçısı"nın obrazı yerində təqdim edir. Öncəki beytlərdəki "dərd əhli" motivi, "qoyun" ədatı, "yey gəlir" qənaəti buradakı "gör" xitabı ilə semantik üslubi və məfkurəvi baxımdan yaxından səsləşdiyi üçün "saqi" obrazı qətiyyən özünü yad hiss etmir.

Lakin şeirin daha dərin təhlili göstərir ki, Füzuli bu sözü bundan da geniş və dərin mənada işlətməli idi. Bu isə yalnız və yalnız İmam Hüseyn şəxsiyyətinin başlıca mənəvi, məfkurəvi qaynağı olan Həzrət Muhəmmədin (s) pak ruhu ola bilərdi. Şairin Həzrət Muhəmmədə (s) olan ərki, ərköyün və aşiqanə münasibəti də bunu söyləməyə imkan verir. Məsələn, "Nə kim, səhifeyi-tədbirə əql edər məstur" misralı qəsidəsində Füzuli:

Bu məsnəb içrə necə məsti-xabi-naz olasan,
İrişdi sübh, gəl aç imdi nərgisi-məxmur.
Fəsad əhli cəhanə buraxdı yüz fəsarat,
Qiyamət oldu, nə yatmaq məcaludur, dur otur!
Zəmanə müntəziri-iqtidayi-əmrindir,
Sözün nə isə, yerit, buyruğun nə isə, buyur! –

deyə kainatın fəxrinə üz tutur.

Yaxud o, İslamın başlıca əlamətlərindən olan sonuncu Peyğəmbərin şəfaət səlahiyyətindən danışarkən:

Gər məndə ola təmam taət,
İzhar nədən bular şəfaət?

Ol qədər zövqi-şəfaət cövhəri-zatindədir
Kim, gəlir ərzi-xəta mə'nidə bir ehsan sana, –

deyə kainatın fəxri ilə incə bir zərifliklə kəsbi-hal edir.

Digər tərəfdən, nəzərə alınmalıdır ki, Kərbəla vaqeəsi Həzrət Mühəmmədlə (s) birbaşa bağlıdır. Belə ki, mötəbər



tarixi sənədlərə görə, Həzrət Muhəmməd (s) bu hadisəni hələ 50 il öncə xəbər vermiş, özünün reyhan qoxulu Hüseyninin ümmətinin zalımlarının əli ilə olmazın müsibətlərə tuş gələcəyini söyləmişdir. Füzuli də əsərdə hadisələrin ən qızğın yerində və surətlərin ən həssas məqamlarının tərənnüm və təsviri zamanı dəfələrlə Həzrət Muhəmməddən (s) söz salmış, onun uca şəxsiyyəti ilə bağlı ən müxtəlif incəliklərə toxunmuşdur:

Tökmək övladi-Rəsulin qanını asan degil,
Ol səbəbdən kim, bu qan hər qanə bənzər qan degil![118]

Yaxud:

Təhqiqi-möhnətü qəmi-ali-əba üçün
Səhrayi-Kərbəlayə güzar eylə, ya Nəbi!
Hali-Hüseynə xaki-məzəllətdə qıl nəzər,
Əndişeyi-qəribi-diyar eylə, ya Nəbi!

Ən nəhayət qeyd edilməlidir ki, Aşura günündə məşhur tarixi nitqində İmam Hüseyn (ə) də özünün və ailəsinin Tanrı qatı ilə bilavasitə bağlı olan pak ruhlarla qorunduğunu, buna görə də xəlifə Yezid kimi murdar və idbar birisinə beyət etməsinin imkan xaricində olduğunu möhkəm nəqli və əqli dəlillərlə dilə gətirir: "Allah və onun Peyğəmbəri pak babalarım, boya-başa çatdığım pak ağuşlar, himayədarım olan ruhlar və qadağanedici qüvvələr bunu (zillətə düşməyi – **V.A.**) mənə qadağan edirlər və onlar əsla şərəfsiz və alçaq insanların qayıdacaqları yeri şərəf və izzət sahiblərinin son məkanlarından üstün etməzlər!"

Son iki beytdə işlək və çevik olan eşq, heç şübhəsiz, İmam Hüseyn (ə) eşqidir. Bu, ulu din böyüyünə bəslənilən dərin saygı və sevgidir. Hər cür "məlamət"ə (danlağa) tuş gəlməkdən, yol

.................................

[118] *Füzuli. Kərbəla vaqiəsi, səh. 139*



yoldaşı olmaqdan çəkinməyən aşiq Rəsulullahın (s) pak ruhuna sığınaraq ondan yardım istəyir ki, barı o hadisə və əhvalatların keşməkeşlərindən heç olmasa lirik "mən"in saf İmam Hüseyn sevgisini qoruyub saxlaya bilsin. İmam Hüseynin Mədinədən çıxarkən İslam rəhbərinin pak məzarına xitabən dediyi sözlərin üstündə necə həssaslıqla əsdiyini gördükdə Füzulinin son iki beytdəki eşqi söz olmaqdan çıxarıb müstəqil obraza çevirdiyinə inanmaya bilmirsən:

Əssəlam, ey asitanın rəşki-firdövsi-bərin
Xakrubi-dərgəhin müjgani-çeşmi-hurü eyn!
Əssalam, ey xadimi-dərgahi-qədrin Cəbrəil,
Midhətin Quranü məddahın İlahi-l-aləmin!
Ya Rəsulullah, mənəm kami-dili-Zəhra, Hüseyn,
Yüz sürüb dərgahına, gəldim diləfkarü həzin!
Ol bənəm ki, ümmətin hifzini əmr etdin bənə,
Ol bənəm ki, gənci-əsrarə bəni qıldın əmin.
Ümməti-zalim bənə izhari-bidad etdilər,
Bikəsəm, biçarəyəm, sənsən bənə ancaq müin![119]

*(Ey qapısı uca, cənnəti qısqandıran böyük kimsə, salam olsun sənə! Sənin qapının süpürgəçisi cənnət hurilərinin kirpikləridir. Ey qədir-qiymətli məqamının xidmətçisi Cəbrayılın özü olan dünyanın ən kamil insanı, salam olsun sənə! Axı öyüldüyün yer Quran, öyücün isə aləmlərin Rəbbinin Özüdür. Ey Allahın elçisi, bax indi səninlə danışan əziz qızın Fatimeyi-Zəhranın ürəyinin istəyi olan Hüseyndir. Mənəm, mən ürəyi incik və ağlar halda pak məzarının önündə üzümü torpağa qoyaraq gəlmişəm. Ümmətinin hər cür azğınlıqdan qorunub saxlanılmasını tapşırdığın şəxs mənəm, özünəməxsus sirlər xəzinəsini əmanət etdiyin yeganə kimsəyəm mən! Ancaq sənin o zalım ümmətinin mənə etmədiyi əzab-əziyyət qalmadı. Kimsəsizəm, çarəsizəm mən, mənə yalnız sənin pak ruhun kömək edə bilər).*

.................................

[119] *Yenə orada, səh. 19*



Araşdırdığımız beytin peyğəmbərlik-imamət vəhdəti baxımından da bədii çəkisi var. Belə ki, Rəsulullahın pak ruhuna müraciətlə deyilmiş "İlac et" xitabının zahiri-tibbi məzmun – müalicəedicilik keyfiyyəti, əslində, İslam rəhbərinin həyata keçirdiyi müsəlman məfkurəsinin cəmiyyət və dövlət səviyyəsində aparılması istənilən köklü dini-ictimai islahat işidir. İmam Hüseyn (ə) də öz hərəkatını belə ali məqsədi gerçəkləşdirməkdən ötrü başlamışdı. O buyururdu: "Mən yalnız haqq yoldan azmış camaatı babamın və atamın haqq quruluşuna doğru yönəltmək üçün ayağa qalxmışam". "Allah Kəbəni insanların qiyam edib (haqqı qoruyub saxlaması üçün) müqəddəs ev etmişdir" *("Maidə", 96)* şərti İmam Hüseynin (ə) öz hərəkatının məqsəd və vəzifələrinə dair direktivində bilavasitə ilahi tapşırığa söykəndiyini göstərir.

* * *

Füzuli, keç səlamət küçəsindən, səbr kuyindən,
Fərağət olmayan yerdə səfər yeydir iqamətdən!

*(Füzuli, artıq salamatlıq küçəsində və səbirlilik məhləsində durmaq vaxtı deyil. Ona görə ki, ruhi dinclik, dini səbat olmayan bir yerdə dayanıb durmaqdansa səfər etmək yaxşıdır).*

Beyt təkcə ənənəvi qəzəl-qəsidə məqtəsi olmayıb, ilk növbədə dəqiq və aydın bir ədəbi qayəsi olan proqram xarakterli bir əsərin təbii yekunudur. Bu, onun leksikonundan da görünür. Məsələn, məqtənin birinci misrası 4-cü beytin bir az başqa şəkildə təkrarıdır. Belə ki, "səlamət küçəsi" və "səbr kuyi" ifadələri ilə "təriqi-səbr" və "tədbiri-səlamət" ifadələri çox baxımdan üst-üstə düşür. Yaxud "yey" (yaxşı, üstün) sözü burada "səfər"i, orada isə "eşqü məlamət"i müqayisənin üstünlük bildirən tərəfinə çevirir. Və ya şairin təxəllüsü şeir boyu səpələnmiş "dərd əhli, məzar, səbir, qıymadım, mən, bu nədamət, tən, mizac" ifadələrinin və onlar vasitəsilə verilən fikirlərin və yaradılan obrazların daşıyıcısı yerində çıxış edir.





Son beytin, deməli həm də bütövlükdə şeirin ideya-bədii istiqaməti “fərağət” və “səfər” sözlərinə yüklənmişdir.

Dərin təhlil Füzulinin “fərağət” sözünü burada “azadlıq, azadəlik” anlamında işlətdiyini göstərir. Bu, Kərbəla vaqeəsinin baş verdiyi ozamankı müsəlman cəmiyyətinin və dövlətinin İslamdan necə uzaqlaşdırılıb batil, puç və çürük Roma, yunan və yəhudi ideologiyaları ilə doldurulmasına və bununla da İslama zərbə vurulmasına edilən etirazdan soraq verir. Belədə “səfər” sözü, birincisi, “fərağət” sözünün alt qatda bildirdiyi Mədinə–Məkkə anlamları ilə bağlılıqda “İmam Hüseyn hərəkatı”, ikincisi, *“Ey Füzuli, istəməz kimsə rizası ilən fəna. Mən ki bundan özgə bilməm çarə, naçar istərəm”* deyən Məcnunun car çəkdiyi son sözü ilə üzvi vəhdətdə “axirət hazırlığı”, üçüncüsü, “tədarük görün, ən yaxşı tədarük isə təqvalı olmaqdır” *(“Bəqərə”, 197)* ayəsi yönündə “fərdi və ictimai cavabdehlik hissi”, “dərin məsuliyyət şüuru içində olmaq” mənalarına gəlir. Füzuli demək istəyir ki, hər bir həqiqi müsəlman saf və duru İslam düşünüşündən irəli gələn dini-ictimai vəzifələrini yerinə yetirməli, bu yöndə İmam Hüseynin yolu ilə getməli, Kərbəla vaqeəsinin tarixi dərslərindən ibrət götürməli, əsl əhlibeytsevər kimi özünü ruhən, mənən saflaşdırmağa can atmalı, bunu mistik təlqin və təmrinlərdən daha çox müsəlman həyat tərzini daxilən mənimsəməklə etməli, fəal və obyektiv dindar və vətəndaş mövqeyi tutmalıdır.

Beləliklə, aydın olur ki, “Müxtəsər türki divan”ındakı “Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən” misralı qəzəl-nəti Füzuli büsbütün İmam Hüseynin şəninə yazmış, milyonlarla imamhüseynsevərin dəruni hissiyyatını və idraki tələbatını ödəməyi qarşısına məqsəd qoymuş və şeirin ideya-bədii istiqamətini bütünlüklə yüksək ədəbi qayəyə tab etdirmiş, istəyinə çatmaq üçün istedad və bacarığının bütün imkanlarını ortaya qoymuş və bu məqsədlə təzad, bənzətmə, istiarə, sarkazm, mübaliğə kimi rəngarəng bədii ifadə vasitələrinə



üz tutmuş, çeşidli mənalandırma və səciyyələndirmələrdən yararlanmaqla uyğun və parlaq obrazlar yaratmış, ən nəhayət, bunların hər birini canlı və yaşarı orqanizmə çevirdiyi əsərinin tərkibində bir-birindən təcrid olunan elementlər kimi yox, əksinə, biri o birini tamamlayan komponentlər kimi vahid müstəvidə – Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilə bağlı bilgilər üzərində eyni qayə ətrafında – İmam Hüseyn şəxsiyyətinin əlçatmaz-ünyetməz məziyyətlərinin tərənnümü yönündə ustalıqla sistemləşdirə bilmişdir ki, bunun nəticəsində də yaşı minilliklərlə ölçülən bədii ədəbiyyatımıza parlaq bir sənət incisi qazandırmışdır.





# “HƏDİQƏ”NİN “DİBAÇƏ”Sİ

Bu, danılmaz bir gerçəklikdir ki, istər klassik, istərsə də müasir müəlliflər əsərlərinin giriş və nəticə hissələrini, adətən, əsər tam hazır olduqdan sonra yazırlar. Şübhəsiz ki, Füzuli də belə etmişdir. Əsərin başlanğıcında yer aldığından şair “Dibaçə”yə ayrıca önəm vermiş, onu imamhüseynsevər oxucunun diqqətini çəkə biləcək bir səpkidə qələmə almağa çalışmışdır. Belədə ədibin İmam Hüseyn (ə) şəxsiyyəti haqqında, Kərbəla vaqeəsinin ictimai-tarixi səbəbləri barəsində, Kərbəla şəhidlərinə münasibətə dair düşüncələrinin “Hədiqətü-s-süəda”nın “Dibaçə”sində iz buraxmadığını düşünmək olmaz.

“Dibaçə”də Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri çoxqatlı və çoxşaxəli şəkildə əksini tapmışdır. Belə ki, Füzuli sözə uzaqdan başlayır. Söhbət Qurani-Kərimdən getdiyinə görə adamın, əslində, buna “uzaq” deməyə də dili gəlmir. Axı bunu kim bilmir ki, İmam Hüseyni (ə), Əhli-beyti, Kərbəla şəhidlərini, xanım Zeynəbi (s.ə) və İmam Zeynəlabidini (ə) o böyüklükdəki faciənin yükünü daşımağa sövq edən başlıca amil məhz Qurani-Kərim, onun siqləti olmuşdur. Qurani-Kərimin sarsılmaz tövhid, ədl, miad, peyğəmbərlik və imamlıq, cihad, şəhidlik kimi siqlətli prinsipləri İmam Hüseyni (ə), Əhli-beyti, xanım Zeynəbi (s.ə) və İmam Zeynəlabidini (ə), həmçinin bütün Kərbəla şəhidlərini canlı, yaşarı, diri Quran etmişdir. Bunu nəzərə



aldıqda Füzulinin mübarək "Bəqərə" surəsinin 155-ci ayəsini ifadə-ifadə açmağa, açıqlamağa çalışması, əsərini bununla başlaması nəinki dini-fəlsəfi müstəvidə, elə sırf bədii-estetik baxımdan da özünü doğruldur. Gəlin "Dibaçə"nin ədəbi təbiətinə xələl gətirmədən, bədii sistemini pozmadan onun özünün çoxqatlı, çoxşaxəli məna-məzmun çevrəsində birləşdirdiyi İmam Hüseyn hərəkatına dair mülahizə və müddəaları, qeyd və fikirləri ümumiləşdirməyə, mülahizə etməyə çalışaq.

**1) Səbir**. "Hədiqətü-s-süəda" boyu qırmızı xətt kimi keçən səbir anlayışı əsərə bab-bab, fikir-fikir yayılmış, əsəri qat-qat, cəhət-cəhət gəzib dolaşmış, qanına, canına hopmuşdur. "Kərbəla vaqeəsinə və Füzuli irsinə açar sözlər" fəslində geniş açıqlanan məfhumun əsərdəki çeşidli işlənmə məqamları göstərilərkən səbirliliyin bir keyfiyyət olaraq fərdi və ictimai mühtəva və mündəricəsi, bunun dini, fəlsəfi və mənəvi tərəfləri də diqqət mərkəzində saxlanılmışdır. Qətiyyən ötəri deyildir ki, Füzuli "Dibaçə"də İmam Hüseyn hərəkatını şərtləndirən ilk amil kimi məhz dözümü, dəyanəti, mətanəti, səbatı götürür. O yazır: "Hər ayinə bu ayəti-kərimə fəhvasindən və bu ibarəti-şərifə imasindən müstəfad olunan oldur ki, ammeyi-übbadə ümumi-bəla şamildür və cəmi'i-ərbabi-səlahü fəsad imtahan üçün "Və lənəbluvənnəkum" həsrinə daxildür. Əmma ol cümlədən məvaqii-məsaibdə daməni-təmkin dutub müztərib olmayanlar və məsadiri-nəvaibdə xatirə təskin verüb izhari-cəzə' qılmayanlər iste'dadi-təşrifi-bəşarət bulmuşlar və müstəhəqqi-tövfiqi-təqərrüb olmuşlar"[120].

*(Bu kərim ayənin məzmunundan və bu şərəfli buyuruğun mənasından hər zaman ələ gələn qənaət budur ki, Tanrı sınağının qeyri-məhdudluğu Allah bəndələrinin hamısına aiddir və əməlisalehmi, fitnə-fəsadçımı olmasından asılı olmayaraq, heç kim imtahan üçün "Sizi sınayarıq" şəklindəki*

[120] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 26*





*ilahi göstərişdən qıraqda qala bilməz. Müsibətlər baş verdikdə təmkinin ətəyindən möhkəm yapışaraq iztirab keçirməyən və fəlakət gəldikdə qəlblərini təsəlli və təskinliyə qovuşduraraq vay-şivən salmayan şəxslər isə xüsusi ilahi müjdəyə layiq görülmüş və Allaha yaxınlıq uğuruna çatdırılmışlar).*

Füzulinin böyüklüyü ondadır ki, orta əsrlərin qəliz nəsr dilində nəzəri surətdə irəli sürdüyü mülahizələri dərhal sadə və aydın el dilində şeirlə də verir:

Talibi vərteyi-məsaibdə
Şərəfi-səbr sərfəraz eylər,
Səbrdür ol məhək ki, möhnətdə
Küfrü imanı imtiyaz eylər.[121]

*(Qarşısına dözümlü olmaq məqsədini qoymuş iradəli şəxs ən ağır müsibətlər zamanı belə səbir şərəfi ilə başıucalıq qazanar. Dözülməz qəm-kədər üz verdikdə imanı küfrdən ayıran başlıca amil, məhək daşı yalnız səbirdir).*

Göründüyü kimi, filosof Füzuli ilə şair Füzuli elə əsərin başlanğıcındaca səbirli olub bir-biri ilə dil tapır. Axı onların İmam Hüseyn (ə) kimi kamil ustadı var. İmam Hüseyn (ə) və tərəfdarları Aşura günündə olmazın əzab-əziyyətlərə qatlaşaraq səbrin özünü belə sınağa çəkdikləri kimi, Füzuli və imamhüseynsevər oxucuları da üzləşdikləri çətinliklərin aradan qaldırılmasında onlardan nümunə götürməyə, onların yolu ilə getməyə niyyət edirlər. Bu isə danılmaz biçimdə göstərir ki, Allahın və onun Peyğəmbərinin (s), imamın, övliyanın, Kərbəla şəhidinin nəzəriyyədən əməliyyəyə doğru pillə-pillə ucalan səbir fəlsəfəsi, səbir nəzəriyyəsi, səbirli həyat tərzi ilə bağlı cızdığı yol Füzuli və oxucuları üçün yeganə qurtuluş yoludur.

**2) Allah eşqi ilə ilahi imtahanın qoşalığı.**

.................................

[121] *Yenə orada*



**3) Peyğəmbər və övliyalarınn bu baxımdan Tanrı qatına hamıdan daha yaxın olması.**

**4) Həzrət Muhəmmədin (s) bu baxımdan bütün peyğəmbərlərdən üstün olması.**

**5) Həzrət Muhəmmədin (s) bütün peyğəmbərlərdən üstünlüyünün onun öz ümmətindən gördüyü əzab-əziyyət amili ilə şərtlənməsi.**

**6) Kərbəla vaqeəsinin və İmam Hüseynin (ə) qətlinin bu əzab-əziyyətlərin zirvəsində durması.**

Monoqrafiyanın həcminə görə yalnız tezis şəklində göstərməyə vadar olduğumuz bu prinsiplərin hər biri ilə bağlı "Dibaçə"də kəsərli, nəqli və əqli dəlillər mövcuddur. Mövzu ilə birbaşa bağlı olmadığından təkcə sonuncu tezisə aid bir qeydi verək. Füzuli yazır: "Bi təkəllüf, ana mütəvəcceh olan müsibət Həzrəti-Rəsulə nisbət kəmali-ihanət və nihayəti-həqarətdir"[122].

*(Heç şübhəsiz, İmam Hüseynə (ə) üz verən müsibət Peyğəmbər həzrətlərinə (s) qarşı böyük bir xəyanət və sonsuz dərəcədə bir təhqirdir).*

Göründüyü kimi, cümlə büsbütün etiraz notları üzərində köklənmişdir. "Bi təkəllüf" – "heç şübhəsiz" qeydi, "Həzrəti-rəsulə nisbət" tamamlığı, "kəmali-ihanət" – "böyük xəyanət" və "nihayəti-həqarət" – "sonsuz dərəcədə təhqir" səciyyələndirmələri göstərir ki, bu etiraz ədibin incə könlünü nifrətlə doldurmuş, bütün bəşəriyyətə saygı və sevgi ilə döyünən qəlbinin həssas tellərini əsəbdən tarıma çəkmişdir.

Şair İmam Hüseyni (ə) hər baxımdan faciəyə düçar edən şəxslərin və mühitin adını çəkməsə də, cümlənin alt qatında onlar özlərinin bütün eybəcərliyi ilə görünür, şairin özü kimi, imamhüseynsevər oxucularının da dərin nifrətini qazanır.

* * *

.................................

[122] *Yenə orada, səh. 28*





Füzuli “Dibaçə”nin önəmli bir bölümünü Kərbəla vaqeəsi və İmam Hüseyn (ə) şəxsiyyəti arasında müxtəlif qaynaqlarda yer alan hədis, xəbər, mənqəbə səpkili bilgi və fikirlərdən örnəklərə ayırmışdır. Mühtəva və mündəricəsindən asılı olmayaraq, həmin qeydlər birmənalı surətdə ədibin İmam Hüseyn hərəkatına dair görüşləri baxımından müstəsna əhəmiyyətə malikdir; məs.:

1. “Həzrəti-imam Yafei “Kitabi-Mir’atü-l-Cinan”də (imam Yafei həzrətləri özünün “Cənnətlər güzgüsü” adlı kitabında – **V.A.**) Həsən Bəsri nəqli ilə ibn əl-Bəzzazdən rəvayət etmiş ki, “Vaqieyi-Kərbəlada Əhli-beytdən on altı nəfər sahibsəadət şərbəti-şəhadət içmişlər ki, zəmanində hər biri biməadil (tayı-bərabəri olmayan – **V.A.**) və əsrində hər biri bimməmasil (oxşarı, bənzəri görülməmiş – **V.A.**) idi”[123].

2. “Və “Məsabihül-qülub”da məzkurdur ki, Kə’ibul-Əxbar bir gün əxbari-sələf nəql edərkən dedi: “Ey qövm, məsaibi-cəmi’i-əzmənəyə vaqif oldum və nəvayibi-məcmu’i-təvaifə ittila’ buldum. Vaqieyi-Kərbəladan əs’əb hadisə mütaliə qılmadım və andan ə’zəm müsibətə müttəle olmadım. Həqqa ki, Həzrəti-Hüseyni-məzlum şəhid olduqda yeddi əflak qan ağladı”. Dedilər: “Ya Əba İshaq, hərgiz əflak qan ağlarmı?” Dedi: “Vəylukum innə qətləl-Hüseyni əmrun əzimun”, yəni, ey bidərdlər, qətli-Hüseyn əmri-əzimdür. Zira ol Həzrət məqbuli-Rəbbülaləmin və cigərguşeyi-Seyyidül-Mürsəlin və fərzəndi-Seyyidi-Övliya və nuri-dideyi-Fatimeyi-Zəhra və yadigari-Həsəni-Müctəba və güzideyi-ali-əbadür. Qəsəm ol Vacibü-l-vücudə ki, Kə’bin ruhi onun qəbzeyi-qüdrətindədür, nəqli-səhihlə təhqiq etmişəm ki, Hüseyni-məzlumun ləqəbin məlaikeyi-asiman Əba Əbdillah əl-məqtul və məlaikeyi-ərz Əba-Əbdillah əl-Məzbuh və məlaikeyi-dərya Hüseyni-şəhid deyüb, ol şəhid olduğu gündən qiyamətədək məlaikeyi-

..................................

[123] *Yenə orada, səh. 28*



səmavidən bir güruh rövzeyi-mübarəkinə mücavir olub əzasinə məşğuldurlar və hər şəbi-cüm'ə yetmiş bin mələk ziyarətinə gəlüb sübhədək əzasinə iştiğal edüb, sübh olduqda hədiyyeyi-səvablə səvame'i-ibadətlərinə müraciət qılurlar"[124].

*("Qəlblərin çırağı" kitabında belə nəql olunur ki, bir gün Kəibül-Əxbar öz tərəflərindən gələn xəbərlərdən danışarkən belə dedi: "Ey camaat, mən bütün dövrlərin böyük müsibətlərini araşdırdım və hər bir xalqın başına gələn ağır fəlakətlərlə bağlı bilgi topladım. Ancaq indiyədək Kərbəla vaqeəsindən də təsiredici hadisə və böyük müsibət görmədim. Doğrudan da məzlum Hüseyn həzrətləri (ə) şəhid olduğu zaman yeddi qat göy qan ağladı".*

*Dinləyənlər etiraz edərək soruşdular: "Ey Əbu İshaq, göylər də heç qan ağlayarmı?" O, belə cavab verdi: "Ay yazıqlar, Hüseynin öldürülməsi böyük məsələdir. Çünki o həzrət aləmlərin Rəbbi olan Allahın dərgahına yaxın şəxsiyyət idi. Digər tərəfdən, o, peyğəmbərlər ağası olan Həzrət Muhəmmədin (s) ciyərinin parası, bütün vəsi və vəlilərin rəhbəri olan Həzrət Əlinin (ə) istəkli övladı, Fatimeyi-Zəhranın (s.ə) göz bəbəyinin işığı, İmam Həsənin (ə) qardaş yadigarı, qısası, şərəfli Peyğəmbər soyunun seçilmiş nümayəndəsidir. Kəbin ruhunun alınması qüdrət əlində olan o Vacib Varlığa and olsun ki, səhih olan hədislərlə araşdırıb dəqiqləşdirmişəm ki, göy mələklərinin dilində məzlum Hüseynin (ə) ləqəbi "qətlə yetirilən Abdullah atası", yer mələklərinin dilində "başı arxadan on iki zərbə ilə kəsilmiş Abdullah atası", dərya mələklərinin dilində də "şəhid Hüseyn"dir. O, şəhid olduğu gündən qiyamətədək bir dəstə göy mələyi onun mübarək məzarının üstünə gələrək həmişə ona əza saxlayır. Hər cümə axşamı yetmiş min mələk İmam Hüseyn (ə) ziyarətinə gələrək sübhədək ona yas saxlamaqla məşğul olar və səhər*

.................................

[124] *Yenə orada, səh. 28-29*



*açılar-açılmaz savablarından əldə etdikləri böyük hədiyyə ilə özlərinin ibadət yerlərinə qayıdarlar”).*

Yenə də monoqrafiyanın həcminə görə digər qaynaqlara toxunmuruq, ancaq damla dənizi əks etdiridiyi kimi, bu iki örnək də Füzuli “Hədiqə”sinin “Dibaçə”sindəki Kərbəla soraqlı dini bilgi və qeydlər barəsində aydın anlayış oyatmaqdadır. Belə ki, əgər bu nümunələrin birincisi sırf tarixi planda olub birbaşa Əhli-beytə aiddirsə, ikincisi emosional planda olub bir neçə əsatiri qeydi də özündə birləşdirir. Ancaq ikinci qaynağı Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri yönündə qiymətli edən o cəhətdir ki, geniş dinləyici auditoriyası ravinin yanıb yaxıla-yaxıla danışdığı və kifayət qədər də əsaslandırdığı İmam Hüseyn (ə) şəxsiyyəti ilə bağlı sözlərə soyuq yanaşır, yad-yabançı münasibət bildirir. Füzuli bunu ört-basdır etmədən qabarıq verməklə bildirmək istəyir ki, İmam Hüseyn hərəkatı nəinki baş verdiyi dövrdə, hətta sonrakı əsrlərdə belə lazımınca qavranılmamış, özünün layiqli ictimai qiymətini almamışdır. Hədisi izləyən şeirin son dərəcə təsirli olması, şairin burada məsələni çox qəti qoyması, zənnimizcə, elə belə daxili yanğının nəticəsidir.

Hökmdür kim, cəmi’i-xəlqi-cəhan,
Məlәkü insü cinnü vəhşü tüyur,
Əqlü nəfsü ənasirü əflak,
Ülivvü süflivü ünasü zükur
Dutalar matəmi-Hüseyni-şəhid,
Edələr ahü nalə ta dəmi-Sur.
Bu müsibətdən olmayan agəh
Ola Əhməd şəfaətindən dur.
Ruzi-Həşr olmaya nəsibi anun
Nəzəri-lütfi-Kirdigari-Qəfur[125].

.................................

[125] *Yenə orada, səh. 29*



*(Dünyadakı bütün varlıqların – mələk, insan, cin, qaçar və uçarların (quşların və vəhşilərin), ağıl, nəfs, dörd ünsür və planetlərin, yuxarı atalarla aşağı anaların, kişilərin və qadınların hamısının şəhid Hüseynə yas saxlamaları və qiyamətədək onun üçün ağlamaları qaçılmazdır. Qoy İmam Hüseyn müsibətindən xəbərsiz olan şəxs axırzaman Peyğəmbərin (s) şəfaətindən birdəfəlik uzaq düşsün! Qoy Ərhəmər-rahimin olan Allahın mərhəmət nəzəri Qiyamət günü ona heç qismət olmasın!).*

Beləliklə, aydın olur ki, "Hədiqətü-s-süəda" elə başlanğıcdan Füzilinin İmam Hüseyn hərəkatına dair görüşlərinin biri o birindən daha sanballı olan təzahürlərini nümayiş etdirir və bu yolla da müəllif imamhüseynsevər oxucusunu əsərin sonrakı fəsillərində təsvir olunacaq, tərənnüm ediləcək, danışılacaq hadisə və əhvalatlara, bunların daha yaxşı dərkinə hazırlayır.





# İMAM HÜSEYN VƏ PEYĞƏMBƏRLƏR

İmamlıq bir dini-ictimai institut kimi hər baxımdan peyğəmbərlik qurumunun qanunauyğun davamıdır. Orta yolu tutub gerçəkliyin gözünün içinə dik baxmağı bacaran ilahiyyatşünasların əksəriyyəti belə düşünür.

Digər tərəfdən, unutmaq olmaz ki, biz İmam Hüseyn şəxsiyyətinə, Kərbəla vaqeəsinə, şəhidlərin xatirəsinə istər-istəməz Füzulinin gözü ilə baxmalı, Füzulinin qəlbi ilə yanaşmalıyıq. Füzulinin gözü isə İmam Hüseyn (ə) və onun tərəfdarları üçün bu gün də qan ağlayır, Füzulinin qəlbi isə Kərbəlanın isti qumları üstündə bu gün də titrəyir. Odur ki, şairin şəhidlərin tükənməz eşqində ucaltdığı söz-sənət qəsrinin hansı pəncərəsindən boylanırıqsa boylanaq, heç fərqi yoxdur, mütləq onun şiə dünyagörüşü, şiə dünyaduyumunu nəzərə almalıyıq. Əgər belə olmasaydı, Füzuli “Hədiqətü-s-süəda”nın ilk babını peyğəmbərlik tarixinin aparıcı simalarına ayırmaz və onların gördükləri böyük işləri İmam Hüseyn şəxsiyyəti və Kərbəla vaqeəsi ilə bağlamazdı. Artıq indi o dövr deyildir ki, Xaqaninin, Nizaminin, Füzulinin, Məsihinin epik əsərlərinin başlanğıcındakı tövhidləri, nətləri, meraciyyələri orta əsrlərin ortodoksal və sxolastik ənənəsinin məcburi təzahürü sayasan. Bu, o ulu könül ərlərinin ruhuna hörmətsizlik olmazmı?!

1988-1994-cü illərdə dissertant kimi Elmlər Akademiyasına gedib-gəldiyim vaxtlar yadıma düşür. İndi də dərin sayğı ilə



xatırlayıram ki, elmi rəhbərim, mərhum prof. Qafar Kəndli "Leyli–Məcnun" məsnəvisinin başlanğıc bölümlərini (mən onları "bəhr" adlandırmışdım, opponentlərimdən biri, filologiya elmləri doktoru mərhum Cənnət xanım Nağıyeva bunu mənə irad tutmuşdu) əsərin məzmunu ilə əlaqələndirməyimi çox bəyənir, bunu sevinclə təqdir edirdi. Ona görə də bir daha qeyd etməyi qaçılmaz bilirik ki, "Hədiqətü-s-süəda"nın başlanğıcında Füzulinin Adəmdən İsayadək bir çox peyğəmbərlərin həyat və fəaliyyətinə üz tutması qətiyyən zahiri etiket qaydalarını gözləməkdən yox, özünün və oxucularının batini və ruhi-mənəvi tələbatını ödəmək istəyindən doğmuşdur. Deməli, İmam Hüseyn şəxsiyyətini və Kərbəla vaqeəsini bütün aydınlığı və genişliyi ilə duyub qavramaqdan ötrü həmin din böyüklərinin bir neçəsinin həyat və fəaliyyətinin İmam Hüseyn hərəkatı ilə bağlı məqamlarına göz gəzdirmək qaçılmaz elmi-nəzəri tələbatdır. Ona görə biz də monoqrafiyanın fəsillərindən birini "Hədiqətü-s-süəda"nın ilk babının bu yöndə araşdırılmasına ayırmışıq.

## İmam Hüseyn (ə) və Nuh Nəbi

İkinci Adəm adlandırıla biləcək qədər qədim dövrlərə gedib çıxan bu ulu din böyüyü əsrlər boyu özünün quruca adı ilə belə bir-birindən əlvan və rəngarəng əsatir, əfsanə və rəvayətlərə qol-qanad vermiş, səmavi və müqəddəs kitabların hamısında köklü prinsiplərin formalaşmasında aparıcı yer tutmuş, sonsuz səbirliliyin, dözüm, dəyanət və mətanətin, əqidə əzmkarlığının rəmzinə çevrilmişdir. Ötəri deyildir ki, Ulu Yaradan Şanlı Kitabında Nuhdan sonrakı bəndələrini onun zürriyyəti (soyu) adlandırmış, onu "şükür edən bəndə"si kimi səciyyələndirmişdir *("İsra", 3)*. Qurani-Kərimin 71-ci surəsi "Nuh" adlanır. 28 ayəlik bu surə adı peyğəmbər adlarından



götürülən digər surələrdən seçilir. Belə ki, surə məlumat və açıqlamalardan çox Nuh Nəbinin monoloqları, Rəbbi ilə etdiyi razü-niyaz üzərində qurulmuşdur.

Digər tərəfdən, bu, diqqəti çəkir ki, Ulu Yaradan Şanlı Kitabında yalnız bu Peyğəmbərin yaşı barəsində dəqiq ifadələrlə söz açmışdır *(“Ənkəbut”, 14).*

Ən nəhayət, deyilməmiş qalmasın ki, mötəbər dini məxəzlərdə Kərbəla vaqeəsi Nuh tufanı ilə də əlaqələndirilməkdədir.

“Nuh tufanı ilə Kərbəla hadisəsinin səsləşməsi halına tarix kitablarında da rast gəlirik. İbn Cərir ət-Təbərinin, İbn əl-Əsirin tarix kitablarında, Çələbinin “Qisasü-l-Ənbiya” əsərində Nuhun gəmisinə pənah gətirənlərin məhərrəm ayının 10-cu günündə – Aşura günü gəmidən çıxdıqları göstərilir. Təbərinin tarixində bu barədə yazılır: “Rəsulullah (s) demişdir: “Nuh gəmiyə rəcəb ayının ilk günündə minmiş və onunla olanlar hamısı oruc tutmuş, gəmi onları altı ay suyun üzərində gəzdirmiş, bu iş məhərrəm ayında sona çatmışdır. Həmin ayın Aşura günündə gəmi Cudi dağında lövbər salıb. Nuh və onunla olan bütün adamlar, heyvanlar uca və qüdrətli Allaha şükür bəlgəsi olaraq oruc tutmuşlar”[126].

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, dinimizin və milli-mənəvi kimliyimizin qızğın təəssübkeşləri sırasında yer alan və əski qaynaqlara yaxşı bələd olan bu qeyrətli xanım alimimiz belə köklü problemləri həmişə diqqət mərkəzində saxlamış, sonrakı tədqiqatlarında da bu yönümü önə çəkmişdir. Uzağa getməyə ehtiyac yoxdur. Onun elə bu monoqrafiyasında Nuh, Yusif, Zəkəriyya və Yəhya peyğəmbərlərlə bağlı diqqətəlayiq qeydlər vardır; məs.: “Nuh Peyğəmbərin hekayəti geniş yayılmış hekayətlərdən biridir. Qurani-Kərimdə dəfələrlə Nuhun başına gələn hadisələrdən danışılır, 28 surədə onun adı çəkilir, Nuhla bağlı əhvalatlara toxunulur. *“Hud”* (25-

[126] *Qasımova A. Füzuli yaradıcılığında Quran rəvayətləri, Bakı, 1995, səh. 19-20*





49), *“Əş-Şüəra”* (105-122), *“Nuh”* (1-27) surələrində Nuhun rəvayəti genişliyi ilə verilir. “Tövrat”da da Nuhla bağlı hekayət ətraflı nəql edilir”[127].

“Qısa məzmunu verilən bu rəvayət İbn əl-Əsirin “Tarixü-l-kamil” (“Mükəmməl tarix” əsəri nəzərdə tutulur – **V.A.**) əsərində zaman keçdikcə şaxələnmiş, ona bir sıra çalarlar vurulmuşdur. İblisin Nuhun gəmisinə girib seldən xilas olması, bir sıra heyvanların (donuzun, pişiyin) yaranması bu qəbildəndir”[128].

“Tarixin səma kitablarının nazil olmasından qabaqkı çağına baxsaq, Nuh rəvayətinin özülündə tarixi rəvayətlərin dayandığını görərik. Beynə-l-Nəhreyn torpağında aparılan qazıntılar bu yerdə uzunmüddətli, qorxunc bir daşqının baş verdiyini sübut edir. Yeri-göyü bürümüş dəhşətlər, daşqınla bağlı bilgilər yer üzünün ən əski sakinlərindən olan şumerlərin əsatiri görüşlərində öz əksini tapıb”[129].

Peyğəmbər Əleyhissalamdan bir hədisdə deyilir: “Hüreyrə deyir: “Rəsulullah demişdir: “Hər bir adəm oğlu Allah-taala qarşısında işlətdiyi günahlarla dayanacaq. Allah-taala öz istəyincə kiminəsə əzab verib, kiminəsə rəhm edəcək, ancaq Yəhya ibn Zəkəriyyadan başqa. Çünki o, bir seyyid tayfasının ağası və saleh peyğəmbər idi”[130].

“Yəhya” sözü “diri olmaq” anlamını verən “hayyə” feilinin indiki gələcək zamanını bildirir. Şeyx Əbu-l-Qasim Cüneyd demişdir: “O, şəhid olduğu üçün bu cür adlanıb, çünki şəhidlər diridirlər”[131].

“Bir sıra dini rəvayətlərdə olduğu kimi, “Hədiqətü-s-süəda”da da Yəhyanın intiqamının Büxtünnəsər tərəfindən alındığı göstərilir. Bu məlumatın tarixi həqiqətə uyğun gəlmədiyini qeyd etmək yerinə düşər. Çünki Büxtünnəsər m.ə.

[127] *Yenə orada, səh. 17*

[128] *Yenə orada, səh. 18*

[129] *Yenə orada, səh. 18-19*

[130] *Yenə orada, səh. 49*

[131] *Yenə orada, səh. 50*





604-561-ci illərdə Babilistanda hökmdarlıq etmiş, Gərdanilər dövlətinin başında dayanmışdır. Hakimiyyəti dövründə Yerusəlimə hücum edib, oranı viran qoyaraq yandırmış, yəhudilərdən xeyli əsir tutub Babilistana aparmışdır. Qurani-Kərimin "İsra" surəsinin 6-cı ayəsində yəhudilərin Allah tərəfindən cəzalandırılmalarına işarə edilir. Büxtünnəsərin Yəhyanın qisasçısı kimi verilməsi ilə aralarında 600 il müddət olan iki hadisə birləşdirilir. Əgər tarixi ardıcıllıq baxımından yanaşsaq, Yəhyanın qisası dünyaya gəlməsindən 600 il öncə alınmış olur"[132].

"Bəzi tarixi faktlar Yusif Peyğəmbərin m.ə. VII yüzillikdə Heksosların hakimiyyəti dövründə çox nüfuzlu bir saray əyanı olmasını açıqlayır"[133].

"Qurani-Kərimdə Yusifin rəvayəti "Əhsəhü-l-qəsas" – "qissələrin ən yaxşısı" adlanmışdır *("Yusif", 3)*. Çələbinin "Qisasü-l-Ənbiya" əsərində rəvayətin bu cür adlanması belə izah edilir: "Bu qissə ona görə "qissələrin ən yaxşısı" adlanıb ki, Quranda onun qədər ibrətamiz, hikmətli fikirlər, möcüzələr, gözəl, lətif sözlər əhatə edən ikinci bir qissə yoxdur".

Bəzən bu rəvayətin "Tövrat"dakı rəvayətlərdən yaxşı olduğu üçün "qissələrin ən yaxşısı" adlandığı güman edilir"[134].

"Bəzən də söylənilir ki, səhabələr Səlman əl-Farsidən onlara "Tövrat"dan bir hekayə söyləməyi xahiş etmiş, bu zaman Peyğəmbərimizə "Yusif" surəsi nazil olmuşdur. Surədəki "qissələrin ən yaxşısı" ifadəsi Qurandakı hekayətlərin "Tövrat"dakı hekayətlərdən daha yaxşı olması anlamını verir"[135].

"Yusif Peyğəmbərin gözəlliyi ilə bağlı Muhəmməd əleyhissalamdan da hədislər söylənilir. Bir hədisdə deyilir: "Yusifə və onun anasına bütün gözəlliklərin yarısı bağışlanılmışdır"[136].

.................................

[132] *Yenə orada, səh. 52*

[133] *Yenə orada, səh. 32*

[134] *Yenə orada, səh. 33*

[135] *Yenə orada, səh. 34*

[136] *Yenə orada, səh. 34*



* * *

"Hədiqətüs-s-süəda"nı başqa məqtəllərdən əsaslı surətdə fərqləndirən başlıca cəhət orada Həzrət İmam Hüseyndən qabaqkı peyğəmbərlərlə bağlı geniş mənqəbələrin olmasıdır. Doğrudur, bu mənqəbələr əsərdə Kərbəla vaqeəsi ilə əlaqələndirilir, ancaq Füzuli bunu mexaniki etməmiş, qissələrin axarına düşərək hadisə və əhvalatları geniş şəkildə təsvir etməkdən çəkinməmişdir. Bəs bu, şairin nəyinə gərək olmuş və əsərə hansı bədii keyfiyyətləri qazandırmışdır?

Hər şeydən öncə deyilməmiş qalmasın ki, qissələri verilən şəxsiyyətlərin hamısı müqəddəslərdir. Deməli, onların mütaliəsi sonrakı səhifələrdə gələcək Kərbəla vaqeəsinin bədii-estetik dərki üçün möhkəm dini-fəlsəfi və ədəbi zəmin yaradır. İkincisi, göstərmək gərəkdir ki, həmin qissələrdə şəxsiyyət və məfkurə probleminin bədii qoyuluşu və həlli öndədir. Bu isə oxucuya məsələni Kərbəla vaqeəsi ilə üzvi vəhdətdə götürməyə imkan verir. Üçüncüsü, unutmayaq ki, bəhs mövzusu olan qissələr bilavasitə Qurandan qaynaqlandığından onlar orta əsr azərbaycanlısına hər barədə yaxşı bəlli idi. Deməli, Füzulinin potensial oxucusu özünə yaxşı bəlli olan bilgi və motivlərin bədii donda təqdiminə çoxdan hazır olduğundan dünyagörüşünün və fantaziyasının imkanları hüdudunda Kərbəla vaqeəsini öncəki peyğəmbər qissələrinin təbii davamı kimi götürməkdə əsla çətinlik çəkməyəcəkdir.

Ən nəhayət, belə bir cəhətin də üzərindən sükutla keçməyək ki, Füzuli peyğəmbərlik tarixinin bədii salnaməsini verməklə imamətin nübüvvət və risalət işinin təkcə dini müstəvidə deyil, ictimai-siyasi həyatda da qanunauyğun davamı olması ideyasını çatdırmış, İmam Hüseyni bu ideyanın ən layiqli təmsilçisi kimi göstərmək istəmişdir. Yəqin, elə buna görədir ki, Həzrət Muhəmməddən (s) qabaqkı peyğəmbərlərin qissələrinin təsviri zamanı Füzuli hətta yeri gəlmədiyi təqdirdə



belə Kərbəla vaqeəsinə toxunur, bəzən isə həmin qissədən çox Kərbəla vaqeəsindən danışır; Nuh Nəbinin əsərin əvvəllərində verilən qissəsi buna ən səciyyəvi misaldır. Bunu görümlü biçimdə izləməkdən ötrü gərək əsərin o bölümünü bütünlükdə gözdən keçirək.

* * *

Bölüm belə başlanır: “Badiyeyi-möhnət bəlakeşlərinin və badeyi-məhəbbət sərxoşlarının biri dəxi Həzrəti-Nuh Nəbidir ki, doqquz yüz il hədəfi-sihami-siyasəti-süfəhayi-qövm oldu və səngdillər cəfasın çəküb səbr qıldı və də’vət etməkdən təqsir etmədi və dəqayiqi-təbliği-əhkami-İlahidə andan təkahül və təkasül zühurə yetmədi. Təzəllümdə məsturdur ki, ol vaze’i-qanuni-şəriət və ol gülzari-rəyahini-kəramətə hər gün səhabi-sitəmdən jaləvar ol miqdar səngi-siyasət yetərdi ki, cismi-lətifi lə’li-abdar kibi daşlar içində itərdi. Əmma yenə Cəbrail hazır olub, ol güli-bağı-risaləti laləvar cameyi-pürxun və ə’zayi parə-parə ilə daşlar içindən çıxarub, pərü balın ə’zasına sürüb, səhhət verüb üzərindən gedərdi və ol Həzrət yenə əncümənarayi-qövm olub kəlimeyi-“Qulu lailahə illəllah” ibarətilə anlara ağazi-də’vət edərdi. Müddəti-ömründə bu təriqi məsluk edüb, üç qərnün qövmi ilə müdara qıldı, əmma gün-gündən qövmün cəfası ana ziyadə oldu. Bir gün bir müdbir bir fərzəndi-napəsəndinə Nuhu göstərüb nəsihət qıldı ki: “Ey fərzənd, bizim təriqimizdə bu şəxsə ihanət eyni-ibadətdir (və izhari-məlamət kəmali-itaətdir qafil) olmayasan və təqsir qılmayasan”. Ol həramzadə ayıtdı: “Ey pedər, olmaya bu vəsiyyət əda olmadan əcəl yetüb bəni bu ibadət səvabindən məhrum edə”. Pəs Həzrəti-Nuha mütəvəccih olub bir daşla cəbini-mübarəkin məcruh edüb məhasini-şərifinə qan rəvan oldu və ol seyli-xunablə dəryayi-bəlayi-tufan təməvvüc edüb Həzrəti-Nuh dua qıldı ki: “Rəbbi inni məğlubun fə’ntəsir”. Navəki-duası hədəfi-icabətə yetüb və əhateyi-tufan aləmi



dutub cəmi'i-müxalif ğərqə oldu, həman Nuh tabe'lərilə qurtuldu. Şe'r:

Seyli-bidadü sitəmdir mənşəi-tufani-Nuh,
Olmasın qafil bəladan əhli-bidadü sitəm.
Xaneyi-zalim gedər seylabə manəndi-hübab,
Dutsa tufan aləmi, məzlumə tufandan nə qəm" [137].

*(Möhnət çölünün bəlasevərlərinin və məhəbbət şərabından sərxoş olanların biri də Həzrət Nuh Nəbidir. O, doqquz yüz il öz qövmünün səfeh adamlarının hikkə, acıq payına hədəf oldu və daşürəklilərindən əzab-əziyyət çəkməsinə baxmayaraq, səbir etdi. Bununla belə, o, Allaha doğru çağırmaqda qüsura yol vermədi və ilahi hökmlərin incəliklə təbliğində qətiyyən səhlənkarlıq və laqeydlik etmədi.*

*Şəriət qanunlarının açıqlayıcısı və kəramət reyhanlarının çəmənliyi olan o (böyük) kimsəyə hər gün zülm buludundan şeh kimi o qədər qəzəb daşları dəyərdi ki, şəffaf bədəni təptəzə inci kimi daşların arasında itib-batardı. Ancaq Cəbrayıl yenə hazır olub, o peyğəmbərlik bağının gülünü lalətək qan libası və tikə-tikə bədən üzvləri ilə daşların içindən çıxarıb, qandallarını yaralarına sürtərək sağaldar və yanından çıxıb gedərdi. O Həzrət yenidən öz qövmünün məclislərini bəzəyərək, "Deyin: "Allahdan başqa Allah yoxdur" şüarı ilə onları bir daha haqqa doğru çağırardı. O, ömür boyu bu (ağır) yolu seçib, üç qərinənin nəsli ilə davranmalı oldu, amma qövmü ona olan əzab-əziyyətini gündən-günə artırmaqdan başqa bir iş görmədi.*

*Bir gün bir bədbəxt özünün bəyənilməz hərəkətlər edən övladına Nuhu göstərərək nəsihət etdi ki, ey oğul, bizim adət-ənənəmizə görə, bu şəxsə əziyyət vermək ibadət hökmündədir, odur ki, nəbadə qafil olub (belə yararlı işdə) qüsura yol verəsən. O haramdan əmələ gələn övlad belə cavab verdi: "Ay ata,*

.................................

[137] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 41-42*



*kaş elə olmasın ki, mən sənin bu vəsiyyətini yerinə yetirməmiş əcəl gəlsin və məni belə (böyük) ibadətin savabından məhrum etsin!"*

*O bu sözləri dedikdən sonra Həzrət Nuha tərəf gedərək, bir daş atmaqla onun mübarək alnını yaralayıb nurani saqqalını qana boyadı və həmin qan seli nəticəsində tufan bəlasının dənizi dalğalanmaqla Həzrət Nuh dua elədi ki, "Ya Rəbb, mən artıq (öz qövmümün içərisində) məğlub oldum, Özün mənə kömək ol!" ("Qəmər", 10). Peyğəmbərin dua oxu təsiretmə hədəfinə çatdığından tufan özünün bütün gücü ilə dünyanı çulğaladı, odur ki, Peyğəmbərin ziddinə gedənlərin hamısı (tufanın yaratdığı sularda) batdı, ancaq yalnız özünə tabe olanlarla birlikdə qurtuldu.*

*Nuh tufanının əsasında zülm və əzab-əziyyətin seltək aləmi başına götürməsidir, odur ki, zalımlar gərək gözlənilməz bəlaların onlara üz verməsindən xəbərsiz olmasınlar. Zalımın evi suyun üzərindəki köpük kimi (bəla) selinə düşüb, bir anda məhv ola bilər. Ancaq dünyanın hər yerini tufan bürüsə də, məzlumun bundan qətiyyən qəmi olmaz").*

Mətnin obrazlılığı Qurani bilgiləri nəinki kölgədə qoymur, əksinə, onların motivə çevrilməsini asanlaşdırır və bununla da oxucunun gözləri qarşısında yığcam və birmənalı bir mənzərə yaratmaqla konkret süjet xəttini formalaşdırır. Məsələn: "biri dəxi" ifadəsi bu bölümü və Nuh Nəbini öncəki və sonrakı bölümlərlə və müqəddəslərlə hiss olunmadan çox incə tellərlə bağlayır. Ulu Yaradan da tez-tez "kəmə" (səndən öncəkilər kimi) ifadəsi ilə keçmişlə indi, indi ilə gələcək arasında belə incə rabitə yaradır *("Bəqərə", 151).* Deməli, bu üsulun ədəbi təbiəti birbaşa Qurani-Kərimdən qaynaqlanmaqdadır.

Yaxud, "doqquz yüz yıl" ifadəsi bilavasitə Qurani bilgi kimi qəhrəmanın çəkdiyi əzab-əziyyətin böyüklüyünü və ağırlığını bircə anda təsəvvürə gətirib, qavramağa yol açır. Müqəddəs Kitabımızda oxuyuruq: "Nuhu da öz tayfasına göndərdik. Onların arasında min ildən əlli il əskik (doqquz yüz əlli il) qaldı. Onları da özləri zülm edərkən tufan yaxaladı" *("Ənkəbut", 14).*



Bəllidir ki, Qurani-Kərimin Nuh Peyğəmbərlə bağlı ən təfsilatlı bilgiləri mübarək “Hud” surəsinin 25-49-cu ayələrindədir. Bundan başqa, Müqəddəs Kitabımızda bu ulu din böyüyünün adını daşıyan ayrıca surə də var. Ancaq “Nuh” adlanmasına baxmayaraq, orada hadisə və əhvalatlar yox, onların Füzulidə və cəmiyyətdə doğurduğu ruhi-psixoloji və mənəvi-əxlaqi hallar öndədir. Füzulinin ustalığı ondadır ki, o, bu iki müxtəlif Qurani üsulu birləşdirərək onların vəhdətini yaratmağa çalışmış və “Hədiqətüs-s-süəda”nın bu bölümündə buna nail olmuşdur.

Əgər yuxarıdakı ifadə və rəqəmlər “Hud” surəsindəki tarixiliyin əlamətidirsə, aşağıdakı obrazlılıq məhz “Nuh” surəsinin mənəvi atmosferindən soraq verməkdədir: “Badiyeyi-möhnət bəlakeşlərinin və badeyi-məhəbbət sərxoşlarının...” *(Möhnət çölünün bəlasevərlərinin və ilahi məhəbbət şərabından sərxoş olanların...).*

*“Nuh”* surəsinin başlanğıcını oxumaq bunu açıq-aşkar göstərər; məs.: “Həqiqətən, biz Nuhu “Qövmünə şiddətli əzab gəlməmişdən əvvəl onları qorxut!” deyə tayfasına peyğəmbər göndərdik. O dedi: “Ey qövmüm, mən sizi açıq-aşkar qorxudanam, Allaha ibadət edin, Ondan qorxun və mənə də itaət edin! O, sizin günahlarınızdan keçər, sizə müəyyən vaxtadək möhlət verər. Allahın müəyyən etdiyi əcəl gəlib çatdıqdasa o, əsla təxirə salınmaz. Kaş biləydiniz!” O dedi: “Ey Rəbbim, mən qövmümü gecə-gündüz dəvət etdim, lakin dəvətim onların qaçmalarını daha da artırmaqdan başqa bir şeyə yaramadı. Sənin onları bağışlamağın üçün mən nə zaman onları dəvət etdimsə, onlar barmaqlarını qulaqlarına tıxadılar, libaslarına büründülər, israr edib durdular və təkəbbür göstərdilər” *(“Nuh”, 1-7).*

Yaxud: “Nuh dedi: “Ey Rəbbim, onlar mənə qarşı çıxdılar və mal-dövləti, oğul-uşağı özlərinə ziyandan başqa bir şey artırmayan şəxslərə (öz kafir başçılarına) tabe oldular” *(“Nuh”, 21)* və s.





Nuh Nəbinin təbliğ və təşviq üsulu və üslubu İmam Hüseynin Kərbəla vaqeəsində həyata keçirdiyi islami irşad metodunun özülünü təşkil edir. Belə ki, İmam Hüseyn də, Nuh Nəbi kimi, yerinə görə Tanrı buyuruqlarını önə çəkir, yerinə görə də hadisə və əhvalatların məntiqi axarından çıxış etməklə obyektiv zərurətə söykənirdi. Bölümdə qəhrəmanın öz əqidəsini inadla və durmadan həyata keçirmə əzminin aparıcı xətti təşkil etməsi bir sənətkar kimi Füzulinin də bu məsələdəki ardıcıllığını göstərir; belə ki, cümlələr bir-birini izlədikcə Nuh Nəbinin ilahi aləm və bəşəri təbiətlə, peyğəmbərlik və sıravi cəmiyyət üzvlüyü ilə, həmçinin fərdilik və ictimailiklə müvazi, tarazlı bir davranış içində olması, bunları eyni qayə ətrafında və vahid müstəvidə həyata keçirməsi bütün aydınlığı və genişliyi ilə göz önündə canlanır.

Ən nəhayət, "müddəti-ömründə bu təriqi məsluk edib, üç qərinin qövmü ilə müdəra qıldı, əmma günü-gündən qövmün cəfası ana ziyadə oldu" cümləsi *"Hud"* və *"Nuh"* surələrindəki uc nöqtələri bir araya gətirib, qəhrəmanın bütöv mənəvi kimliyinə dair aydın anlayış yarada bilir.

Bölümü şərtləndirən cəhətlərdən biri də şairin əsərə etik-didaktik əhvalat əlavə etməsidir. Əhvalatda oğlunu pis yola çəkən atanın "müdəbbir" (bədbəxt) adlandırılması, oğlunun xoşagəlməz işlər görən "fərzəndi-napəsənd" deyə səciyyələndirilməsi, "imanət"in "eyni ibadət" kimi ictimai eybəcərlik yerində əxlaq normasına çevrilməsi əhvalatın prinsipcə təbii sonluğuna qovuşmasını şərtləndirdiyindən Nuh Nəbinin bədduası – qarğışı istər-istəməz ictimailəşir və o ana qədərki bütün bəd əməllərinə görə cəmiyyətin ilahi qəzəbə uğramasına yol açır.

Göründüyü kimi, Füzuli fərdiliklə ictimailiyi ustalıqla qovuşdurduğundan bu qatlar bir-birinin içində olan mürəkkəb həyat həqiqəti olaraq qavranılır və son nəticədə zülmün, haqsızlığın islami ifşasının rəhninə çevrilir. Şeirin də məhz bu yöndə olması Füzulinin bilərəkdən bu nöqtəyə ağırlıq saldığını göstərir.





Nuh Nəbinin qissəsilə Kərbəla vaqeəsi arasındakı ortaq nöqtələrdən biri də zülmə, haqsızlığa bəslənən münasibətdir; belə ki, "seyli-bidadü sitəmdir mənşeyi-tufani-Nuh" misrasının siqləti yalnız zamanın dəyişdiyini, zülm, haqsızlıq baxımından məzmunun eynən qaldığını, başqa sözlə, o dövrdə Nuh Nəbinin üzləşdiyi vəziyyətlə bu gün İmam Hüseynin qarşılaşdığını görümlü biçimdə əks etdirir. Bölümün sonrakı hissəsində Kərbəla vaqeəsi ilə bağlı motivlərin çox olmasının bir səbəbi də elə budur.

Bölüm belə davam edir: "Kənzü-l-Qərayib"də məsturdur ki, zövrəqi-Nuh əyyami-tufanda hər tərəfi seyr edərkən xitteyi-Kərbəlaya irişdikdə Hayiriyyə dedikləri mənzildə mütəhəyyir olub, təvəqqüf edüb hərəkətdən düşdü. Həzrəti-Nuh bu halətə heyrət etdikdə nida gəldi ki: "Ey Nuh, bu ol mənzildir ki, səfineyi-"Məsəlu Əhli-beyti kə-məsəli səfinəti Nuhun" bu mənzildə qərqeyi-girdabi-xun ola və Əhli-beytin əksər əfazilü ə'yanın bu mənzili-daireyi-heyrətə buraxıb sərgərdan qıla. Filvaqe', təəmmül etdikdə münasib görünür hədisi-səhih müqtəzasincə səfineyi-Nuha Əhli-beyti-risalət. Zira həvayi-nəfsi-əshabi-inadla dəryayi-məsayib mütəlatim olduqda və səhrayi-Kərbəlayi-tufani-bəla əhatə qıldıqda hər kim Əhli-beytə daxil idi, bəlayi-mə'siyətdən nəcat buldu və hər kim xaric idi, həlak oldu"[138].

*("Qəribəliklər sirri" adlı kitabda yazıldığına görə, tufan günlərində Nuhun gəmisi dünyanı dörd dövrə vurarkən Kərbəla ətrafına gəlib çatdıqda Hayiriyyə deyilən yerdə heyrət içərisində dayanıb hərəkətdən qaldı. Nuh Nəbi bu vəziyyətdən təəccübləndikdə Allahdan nida gəldi ki: "Ey Nuh, bu o yerdir ki, Həzrət Muhəmmədin (s) buyurduğu "Mənim Əhli-beytim Nuhun gəmisi kimidir" gəmisi (hədisi) gərək bu yerdə qan burulğanına batsın və Əhli-beytin fəzilətli nümayəndələrinin çoxu bu yeri heyrət çevrəsinə salaraq mat-məəttəl qoysun. Doğrudan da dərindən düşündükdə birmənalı surətdə aydın*

.................................

[138] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 42*





*olur ki, Rəsulullahın doğru-düzgün sözünə uyğun olaraq, həqiqi Nuh gəmisi, əslində, Peyğəmbər Əhli-beytidir. Ona görə ki, inadcıl, davakar səhabələrin nəfsi istəkləri nəticəsində müsibət və fəlakətlər dənizi coşub-daşdığı və Kərbəla səhrasını bəla tufanı bürüdüyü zaman Əhli-beytə daxil olan kimsələr günahkarlıq bataqlığından qurtuldu, ancaq Əhli-beytə daxil olmayan kəslər həlak oldular).*

İlk baxışda adama elə gəlir ki, hekayətin ortasına yaxınlaşdıqca ayələrin təsiri azalıb, hədislərin forma və üslub cizgiləri önə çıxır. Doğrudur, bu cəhət var və özlüyündə bütünlüklə də təbiidir. Ancaq burada önə çıxan hədislərin forma və üslubundan çox məzmun və mahiyyətinin Qurani məntiq yönündə qazandığı yardımçı təsir gücüdür, odur ki, bölümün bu yerinə qətiyyən məhdud və qeyri-müəyyən hədis nəqli kimi baxılmamalıdır. Əksinə, əsərin bu hissəsi Nuh tufanı ilə Kərbəla vaqeəsi arasındakı oxşar və fərqli xüsusiyyətlərə dair daha sərrast düşünməkdən ötrü çox əlverişlidir.

Digər tərəfdən, unutmayaq ki, Nuhun gəmisinin "Hayiriyyə" adlı mistik və mifik bir məkanda hərəkətdən düşməsi bədii vasitə olmaqla yanaşı, Kərbəla vaqeəsi kimi böyük və ağır ictimai təzahürlərin zaman-məkan tanımamasına, əslində, əzəli-əbədi bir problem olmasına vurulan işarədir. Şair sanki demək istəyir ki, ilahi həqiqəti yerinə yetirmək yönündə hər iki ulu din böyüyünün qarşısında duran yüksək məqsəd və vəzifə tamamilə eynidir; əgər Nuh Nəbi miladi VII əsrdə yaşasaydı, İmam Hüseyn kimi hərəkət edəcəkdi, yox, hərgah İmam Hüseyn minillərcə öncəki çağların adamı olsaydı, Nuh Nəbinin gördüyü işi görəcəkdi.

Üslub baxımından diqqəti çəkən cəhət budur ki, Füzuli sözü Nuh tufanı üzərindən Kərbəla vaqeəsi üzərinə gətirməkdən ötrü, çağdaş dillə desək, publisistik tona keçib bədii əsərə xas olmayan açıq mühakimə yürüdür; "təəmmül etdikdə" (düşündükdə) şərti quru və durğun şərtilikdən çıxıb, yaradıcı və qurucu mühakiməyə yönəldiyindən bir-birindən çox uzaq olmalarına baxmayaraq, tarixin dönüm nöqtələrini təşkil edən



hər iki hadisənin – Nuh tufanı ilə Kərbəla vaqeəsinin siqləti, ictimai çəkisi dini-mənqəbəvi anlayışlarsız belə kifayət qədər aydın ortaya çıxır. Belədə "Əl-qədr hədisi" kimi bilinən məşhur nəqli-dəlil də məxsusi bir sənəd-sübut xarakteri almaqla bəhs mövzusu olan hadisə və şəxsiyyətləri – Nuh tufanı ilə Kərbəla vaqeəsi, Nuh Nəbi ilə İmam Hüseyni məfkurəvi yöndə birləşdirən, onların əsl mahiyyətini üzə çıxaran və odur ki, ayə qədər önəm qazanan əlahiddə bir islami və tarixi stimula çevrilir.

Parçaya yön verən dini-fəlsəfi və bədii-estetik faktorlardan birini də "nəfs" məfhumu təşkil edir. Bəs bu məfhumun mahiyyətini şərtləndirən başlıca xüsusiyyətlər nədən ibarətdir?

Mətndə "həvayi-nəfsi-əshabi-inad" (inadcıl, höcət adamların nəfslərinin aşıb-daşması) tərkibi yer aldığından biz bu barədə bəhsə "həva" sözündən başlayırıq.

"Havayə" kökündən gələn "həva" sözünün hərfi anlamları belədir: *havalanardı; xoşuna gəldi; əyləndirdi, təsiri altına aldı; meyil, arzu, eşq; nəfs, həva, boşluq, boş*.

Quran leksikonunda "həva" nəfsin arzuya meylidir. Belə ki, o, insanı azdırır *("Qəsas", 50),* mənfiləşdirir *("Əraf", 176),* çaşdırır, qulağı və qəlbi möhürləyir və korlaşdırır *("Casiyə", 21)*.

Bu Qurani bilgilərin işığında "həva" sözü *şəhvət, həvəs, ehtiras* anlamlarını verdiyinə və orta yüzilliklər müsəlman poeziyasında "nəfs"in sinonimi, bəzən də ekvivalenti kimi işləndiyinə görə burada onu nəfs anlamında götürmək olar. "Həbsi-həva" ilə "təriqi-fəna" ifadələrinin klassik şeirdə çox vaxt qarşı-qarşıya durması da belə açıqlamaya yol açır. Nəfs anlayışı geniş dini səciyyə daşıyır. Bu genişlik sözün semantik tutumundan da bilinir. Belə ki, söz "ruh", "ağıl", "insanın nəfsi", "cəsəd", "qan", "əzəmət, izzət", "görüş", "pis göz", "bir şeyin cövhəri", "çalışqanlıq", "işgəncə", "aqibət", "arzu, murad", "eqoizm" kimi müxtəlif mətləblərdən soraq verir. Odur ki, Qurani-Kərimdə nəfs anlayışı leytmotiv yerində olub, azı üçmərhələli mürəkkəb bir məna-məzmun şəbəkəsi əmələ gətirmişdir. Həmin mərhələlər, adətən, belə sıralanır:



1. “Nəfsi-l-əmmarə bi-s-su’i” – pis işləri görməyi əmr edən nəfs *(“Yusif”, 53)*.

2. “Nəfsu-l-ləvvamə” – peşmançılıq nəfsi *(“Qiyamət”, 2)*.

3. “Nəfsu-l-mütməinnə” – arxayın oluna biləcək nəfs *(“Fəcr”, 27)*.

Yeri gəlmişkən belə bir cəhətə aydınlıq gətirək ki, ictimaiyyətdə formalaşmış rəyin əksinə olaraq, Qurani-Kərimdə “nəfs” sözü heç də həmişə sırf mənfi məzmunda verilmir. “Şəms” surəsinin 7-ci ayəsində anlayışın “And olsun insana, yaxud onun nəfsinə və onu yaradıb formalaşdıran Qüvvəyə”, yəni Allaha deyə and içməsi bu fikrin danılmaz nəqli dəlilidir. Odur ki, “tamahkarlıq, əmlak hərisliyi, xudpəsəndlik” kimi sırf neqativ halları birləşdirməkdən ötrü yeri gəldi-gəlmədi “nəfs” sözünü işlətmək, əslində, həm leksik-semantik baxımdan, həm də islami cəhətdən doğru deyildir. Bu zaman həmin halların ifadəsi üçün “tamah” sözü daha münasib olardı.

Digər tərəfdən, nəzərə alınmalıdır ki, təsəvvüf əhli nəfs anlayışının belə zəngin islami məzmununu bir qədər də genişləndirərək, onun anlam çalarını 7-dək – sonsuza kimi artırmışdır.

Bu bilgilər danılmaz biçimdə sübuta yetirir ki, nəfs anlayışı geniş dini-fəlsəfi və mənəvi-əxlaqi, eləcə də ruhi-psixoloji səciyyəyə malikdir. İslamiyyətdəsə o, daha çoxçalarlıdır; başlıca olan da budur ki, müsəlmanın öz tamahına qarşı mübarizə aparması İslamda “böyük cihad” hesab edilir. Bu dəqiq rəy Rəsulullahın (s) aşağıdakı hədisindən qaynaqlanır: “Peyğəmbər buyurdu: “Kiçik cihadı yerinə yetirmiş dəstəyə mərhəba! Sağ olsun, yaşasın belə şəxslər! Ancaq onları (qarşıda daha böyük vəzifə) böyük cihad gözləyir”. Ondan soruşuldu ki, ey Allahın elçisi, böyük cihad nədən ibarətdir? Buyurdu ki, o, (insanın öz tamahı ilə) cihad etməsidir”[139].

..................................

[139] *Vəsailü-ş-şiə, 11-ci cild, səh.122*



Əsərin bu bölümü belə davam edir: "Rəvayətdir ki, Həzrəti-Hüseyn Mədinədən əziməti-Kufə qıldıqda yeddi yaşında bir mə'suməsi olub mürafiqətinə qüdrət bulmamağın Ümm Sələmə xidmətinə qalmışdı və vaqiyeyi-Kərbəlada həzrəti-imam şəhid olduqda bir qurabi-mişkinbal pərü balın qanla rəngin edüb, mütəvəccihi-Mədinə olub, Ümm Sələmə divari-sarayinə qonub bal əfşanlıq edərdi. Ol mə'sumə görüb, fərasətlə Hüseynin şəhadətin mə'lum edüb fəğan qıldı. Ümm Sələmə ayıtdı: "Ey məxdumə, nə vaqe' oldu?" Ol mə'sumə ayıtdı: "Ey əziz, qurab müxbiri-əhvali-Səfineyi-Nuhdur, qaliba bu gün Səfineyi-Əhli-beyt tufani-bəlayi-dünyadan nəcat buldu və mühərriki-həvayi-qürbi-ilahi anları vərteyi-haildən vasili-sahili-nəcat qıldı. Və bu qürab andan gəlür və anlardan xəbər verür". Ümm Sələmə ayıtdı: "Bu vaqeənin bir nişanəsi var". Ol mə'sumə ayıtdı: "Nişanə nədir?" Ümm Sələmə ayıtdı: "Bir gün Həzrəti-Rəsul xəlvətdən dışrə çıxub bir müddət məks edüb müraciət etdi julidəmuy və qubaraludəruy". Dedim: "Ya Rəsulullah, bu küdurətə bais nədir?" Buyurdu ki: "Ey Ümm Sələmə, bu gecə bana İraqda bir məqam göstərdilər ki, ana Kərbəla derlər və ol mənzildə Hüseynin və bə'zi övladının qətlgahını ziyarət etdirdilər və bən ol mənzildən bir miqdar xak alub gəlmişəm". Və mübarək əllərin açub ol toprağı bana təslim etdi və buyurdu ki: "Bu toprağı bir şişədə hifz et. Ol gün ki və'deyi-şəhadət yetər, bu şişədəki əczayi-türab övraqi-gül kibi qan rəngin dutar". Və bən ol toprağı hifz etmişəm"[140].

*(Rəvayət edildiyinə görə, Həzrət Hüseyn Mədinəni Kufə niyyətilə tərk etdikdə yeddi yaşlı bir qız övladı səfərə çıxa bilməyəcək qədər zəif olduğundan Ümmü-s-sələmənin yanında qalmışdı. Kərbəla hadisələri zamanı həzrət imam şəhid olduqda mişk qoxulu bir qarğa qanadlarını qızıl qana boyayıb, Mədinəyə qayıdaraq Ümmü-s-sələmənin evinin divarına qonmuş və canfəşanlıq etmişdi. O zəif qızcığaz bunu gördükdə fərasətlə Hüseynin şəhid olduğunu bilərək ucadan*

.................................

[140] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 42-43*



*ağladı. Ümmü-s-sələmə dedi: "Ey xanım, nə baş verib, sənə nə olub?" O qızcığaz cavab verdi: "Ey əziz xanım, qarğa Nuh gəmisinin vəziyyətindən soraq verən bir əlamətdir; çox güman ki, bu gün Əhli-beyt gəmisi dünyanın bəla tufanından qurtuldu və Allaha yaxınlıq eşqinin hərəkətəgətiricisi onları pərdə arxasından nicat sahilinə çıxardı. Və bu qarğa oradan gəlir və onlardan xəbər verir".*

*Ümmü-s-sələmə dedi: "Bir gün Həzrət Rəsul (s) yatağından qalxaraq bayıra çıxdı və bir qədər fikirli-fikirli gəzişdikdən sonra saçları dağılmış və üz-gözü toz-torpağa bulaşmış bir halda geriyə qayıtdı; soruşdum: "Ya Rəsulullah, bu kədərə səbəb nədir?" Buyurdu ki: "Ey Ümmü-s-sələmə, mənə bu gecə İraqda bir yer göstərdilər ki, ora Kərbəla deyərlər və orada Hüseynin özünün və övladlarından bəzilərinin qətlgahını ziyarət edərlər. Və mən oradan bir qədər torpaq götürüb gəlmişəm". O, bu sözləri dedikdən sonra mübarək əllərini açıb bu torpağı mənə verdi və buyurdu ki, "bu torpağı bir şüşə qabın içərisində qoruyub saxla, şəhidlik vədəsinin yetişdiyi gün bu şüşə qabdakı torpaq zərrələri gül yarpaqları tək qan rəngini alar". Mən də həmin torpağı bugünədək qoruyub saxlamışam").*

Göründüyü üzrə, bölümün bu yerindən etibarən Nuh tufanı ilə bağlı motivlər sürəkli biçimdə Kərbəla vaqeəsi üzərinə keçirilməklə İmam Hüseyn surəti və onunla əlaqədar personajlar önə çıxır; İmam Hüseyn, onun yeddi yaşlı zəif qızı, Ümmü-s-sələmə, Mədinə, Kufə, Kərbəla, Həzrət Muhəmməd (s) obrazlarının durmadan bir-birini izləməsi və bu ardıcıllıq üzərində duran cəlbedici süjet xətti Nuh tufanı motivlərini Kərbəla vaqeəsi fonuna təbiiliklə pərçim edir və bunları eyni qayə ətrafında və vahid müstəvidə qavradır. Bunu görümlü biçimdə izləməkdən ötrü parçada əksini tapmış dini-mənqəbəvi anlayışlara göz gəzdirək.

**1. "Əziməti-Kufə".** "Əzimət" sözü klassik mətnlərdə daha çox iki mənada – "niyyət" və "səfərə çıxmaq" anlamlarında işlənir; sözün burada hər iki anlamı da özünü doğruldur. Çünki



İmam Hüseyn öz hərəkatını Kufə ictimaiyyətinin çoxsaylı dəvət məktubları üzərində qurmuşdu. Odur ki, bu ifadə burada bir yandan bu ulu din böyüyünün məramnaməsinə işarə yerindədirsə, o biri yandan onun həyat və fəaliyyətinin son dövrünü özündə birləşdirən yığcam kod təsiri bağışlayır. "Hədiqətüs-s-süəda"da Kufə şəhərinin və onun əhalisinin geniş təsvirləri, eləcə də İmam Hüseynin oraya nümayəndə göndərdiyi Müslüm ibn Əqilin həmin təsvirlər fonunda boy göstərən portret-obrazı bundan soraq verir. Kufə əhlinin vəfasızlığı gör necə məşhur olmuşdur ki, Kərbəla vaqeəsindən çox keçmədən ərəblər arasında "əl-kufi, lə yufi" (kufəlidə vəfa olmaz) atalar sözü yaranmışdır.

**2. "Ğürabi-mişkinbal".** Kökü əski çağlara gedib çıxan qarğa obrazını belə bir məqtəldə görmək, əslində, gərək qətiyyən təəccüb doğurmasın, çünki Füzuli, hər şeydən öncə, öz xalqının doğma oğlu olan bir sənətkardır, odur ki, orta əsr azərbaycanlısının dünyaduyumunda yer alan hər bir mifik məfhum bu, yaxud başqa ölçüdə onun duyğu və düşüncələrinə də yön vermiş, yazdığı əsərlərin qanına və canına hoparaq, yaratdığı surətlərin milli rəng almasına yol açmışdır. Digər tərəfdən, qarğa obrazı istər Nuh tufanı, istərsə də başqa qissələrlə əlaqədar olaraq ərəb mifologiyasına da keçmiş və islami mətnlərdə az-çox iştirak etmişdir; Qabillə Habilin qissəsi buna misaldır: "(Ya Rəsulum!) Onlara Adəmin iki oğlunun əhvalatını olduğu kimi söylə. Onlar qurban gətirdikləri zaman birinin qurbanı qəbul edilmiş, digərininki isə qəbul olunmamışdı. (Qurbanı qəbul olunmayan Qabil qardaşı Habilə) demişdi: "Səni mütləq öldürəcəyəm!" (Habil ona) belə cavab vermişdi: "Allah yalnız müttəqilərdən (qurban) qəbul edər!" *("Maidə", 27).*

"Hədiqətüs-s-süəda"nın bu bölümünə gəldikdə isə, göstərmək gərəkdir ki, qarğa obrazı burada qadın surətlərinin təhkiyəsində əksini tapır. Folklorun da daha çox qadınların leksikonunda qorunub saxlandığı bəllidir. Üstəlik, İmam Hüseynin Mədinədə qalan qızının yeddi yaşında olması bu



obrazın uşaq təfəkkürü ilə də bağlanıla biləcəyini istisna etmir. Ancaq Ümmü-s-sələmənin işə dərhal müdaxilə edib Rəsulullahla bağlı əhvalat danışması, bilavasitə hədis söyləməsi, konkret əlamət göstərməsi qarğa obrazını sürətlə mətndən çıxarıb unutdurur, əvəzində isə islami inam-inanc sisteminin birmənalı semiotikasını, işarələr düzümünü önə çıxarır.

**3. "Nuh gəmisi və Əhli-beyt gəmisi".** İstər Nuh tufanı, istərsə də Kərbəla vaqeəsi baxımından bölümdəki müqayisə olduqca çəkicidir. Çünki Füzuli burada zahirən biri o birindən nəticə etibarilə çox fərqlənən iki hadisəni eyni qayə yönündə bədii qavrayışa təqdim edir. Belə ki, İmam Hüseynin yeddi yaşlı qızı Ümmü-s-sələmənin sualına verdiyi cavabda "qurab müxbiri-əhvali-Səfineyi-Nuhdur, qaliba, bu gün Səfineyi-Əhli-beyt tufani-bəlayi-dünyadən nəcat buldu..." deyə Nuhun gəmisinin suların çəkilməsiylə quruya çıxmasını Peyğəmbər balalarının "Kərbəla gəmisi"ndə batırılaraq ictimai təzyiq nəticəsində həlak edilməsinə bənzədir, bu isə şairin alt qatda Nuh tərəfdarları üçün dirilik olan bir vəziyyətin İmam Hüseyn tərəfdarlarının gözündə çox sönük bir hal olmasına, əksinə, onların öz əqidələri uğrunda ölümün gözünün içinə dik baxmasına və beləliklə də qanı qılınca qalib etməsinə iti işarəsidir. Belə müqayisə axirət inancını əsərə gətirməklə bölümdə bu qatın bir az da ağırlıq qazanmasını təmin etmiş və bu yolla da qarşıya qoyulan yaradıcılıq istəyinin – İmam Hüseynin Nuh Nəbidən, Kərbəla vaqeəsinin də Nuh tufanından daha kəskin və kəsərli olması ideyasının bədii ifadəsini gücləndirmişdir.

**4. "Mühərriki-həvayi-qürbi-ilahi"**. Qısaca "qürbətən illəllah" (Allaha yaxınlıq) adlandırıla biləcək bu obrazlı deyimlə Füzuli, əslində, ilahi eşqi nəzərdə tutur.

Bu anlam İslam dinində olduqca geniş yerə malikdir; belə ki, Ulu Yaradan Şanlı Kitabında "Möminlərin Allaha məhəbbəti çox güclü olmalıdır" *("Bəqərə", 165)* buyurur. Musa Peyğəmbərə xatırladır ki, "insanların ürəyində sənə



məhəbbət toxumunu cücərdən Mən Özüm olmuşam" *("Taha", 40),* Həzrət Muhəmmədə bəslənilən saygı və sevgini ilahi bağışlanmaya səbəb yerində qavradır *("Ali-İmran", 31)* və s. Bu isə ilahi eşqlə bağlı çoxlu mülahizə və müddəaların yaranmasına və çeşidli mühakimələrin yürüdülməsinə yol açmış, şairlərin müxtəlif obrazlar yaratması üçün möhkəm dini və ədəbi zəmin əmələ gətirmişdir. Məsələn, Həzrət Əli buyurur: "Hər kim bir şeyə aşiq olarsa, bəsirəti kor olar, qəlbi xəstələnər. O, sağlam olmayan gözlə baxar və eşitməyən qulaqla dinləyər, ehtiraslar onun əqlini yırtar, dünya isə qəlbini öldürər"[141].

Eynə-l-qüzzat Miyanəçi deyir: "Allah Leyli eşqini Məcnun təbiəti üçün bir müddət kəcavə qərar verdi ki, o, Leyli eşqilə püxtələşsin, sonra ilahi eşqin yükünü qəbul edə bilsin".

Böyük əxlaq alimi Şeyx Muhəmməd Mehdi Nəraqi "Cami-s-səadət" kitabında eşq barədə yazır: "Eşq varlığın təbiət və xarakterinin sonsuz həzz aldığı şeyə sıx bağlanmasıdır. Bu hal məhəbbətin ən ali zirvəsidir. Bəsit cövhərlər aralarında olan uyğunluğa görə bir-birinə doğru meyil edərək tam ülfət yarada bilirlər. İnsanın təchiz olduğu nəfs bəsit cövhər sayılır. Nəfs günahların çirkabından, dünyaya bağlılığından və ehtirasların buxovlarından xilas olduqca saflaşaraq "Qüds" aləminə ucalır və sonda oranın mərhəm sakininə çevrilir".

Ariflər insanın fəth etdiyi "ilahi xilafət" məqamını "fəna fillah" (Allahda fəna olmaq) adlandırmışlar. Şeyx Əbu Hamid Ğəzali bu barədə deyir: "Fəna fillah" tövhidin dördüncü mərtəbəsidir. Bu mərtəbə "siddiqlər"ə (doğruçulara) məxsusdur ki, onlar varlıq aləmində Allahdan başqa bir şey görmürlər".

Mühyiddin ibn Ərəbi "Tövsiyələr" kitabında deyir: "Allahla öz aranda bütün maneələri qaldır və bil ki, bu arada ən böyük maneə elə sən özünsən!"

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, bu irfani fikir Füzuli lirikasında da mövcuddur:

..................................

141 *Mizanu-l-hikəmə, VI cild, səh.2634*





Səni canan sayıram, çıx bədənimdən, ey can!
Mənü cananım arasında çox olma hail!

"Hail" ərəbcə *pərdə* deməkdir.

İlahi eşqlə bağlı bu kiçik xülasəni Həzrət Əlinin kəlamı ilə başlamışdıq, elə o ulu din böyüyünün kəlamı ilə də bitirək. O öz Məbudu ilə etdiyi münacatların birində belə yalvarıb-yaxarır: "İlahi, Sən mənim sevdiyim kimisən; məni də Öz sevdiklərindən qərar ver!"

Göründüyü üzrə, Qurani-Kərimdən tutmuş qatı sufilərədək dedikcə geniş dairəni əhatə edən bu əlvan fikir toplusu ilahi eşq məfhumunu iman, peyğəmbərlik, Tanrı əfvi, Peyğəmbər sevgisi, bəsirət, qəlb, "Leyli–Məcnun" dastanı, varlığın təbiət və xarakteri, həzzalma, bəsit cövhərlər (ilkin substansiyalar), nəfs, günah, "qüds" aləmi, ariflik, "ilahi xilafət" məqamı, sədaqət kimi ən müxtəlif prizmalardan dəyərləndirməkdə, onun məğzini şərtləndirən çoxsaylı və çoxqatlı dini-fəlsəfi, mənəvi-əxlaqi, ruhi-psixoloji və bədii-estetik faktorlara işıq tutmaqdadır. Füzuli isə "Qurbətən illəllah"ı "Qürbi-ilahi" şəklində verməklə çox vaxt mənfi anlamda işlədilən "həva" sözünə müsbət məzmun yükləyə bilmiş və beləliklə də "mühərrik" (hərəkətəgətirici, istiqamətverici) sözünü bu silsilənin başına keçirməklə ilahi təqdir anlayışını olduqca obrazlı bir biçimdə ifadə etməyə müvəffəq olmuşdur.

**5. "Ziyarət".** Bölümdə Ümmü-s-sələmənin Peyğəmbərin dilindən söylədiyi hədisin içində yer alan bu anlayış sonralar İmam Hüseyn şəxsiyyətinə bəslənilən tükənməz saygı və sevginin simvoluna çevrilmiş, müsəlman aləmində o ulu din böyüyünün həyat və fəaliyyəti ilə bağlı formalaşan çoxqatlı və çoxşaxəli etiqadi, ibadi və əxlaqi ad, bilgi və işarələr sisteminə yön vermişdir.

Ziyarət anlayışı ilə bağlı bilgilər "mənqəbələr" sırasındadır. Belə ki, İslam dininin hər hansı məsələyə necə münasibət bəslədiyini öyrənmək işində tarixilik prinsipinin tətbiqi zamanı mənqəbələr də bir xeyli önəm daşıyır. Bu səpkili yarıtarixi, yarıdini, yarımistik rəvayətlər müqayisəli surətdə



öyrənildikdə əsrlərin toz qatı altında qalmış iman nuru tədricən gün işığına çıxa bilir. Odur ki, bu cür yazılı və şifahi örnəklərə qarşı həssas olmalı, onların üstündən dərhal xətt çəkməkdən çəkinilməlidir.

Belə örnəklər etnoqrafik xarakter də daşıyır. Belə ki, nəinki Kərbəla şəhidlərini ziyarətə gedənlər, hətta ayrı-ayrı zəvvarların belə əzəmətli məqama qovuşması münasibətilə onlara gözaydınlığı verməkdən ötrü gələnlər belə el içində həmişə əziz tutulmuş, böyük xoşbəxtlik qazanmış kimsələr sayılmışlar.

**6. “Kərbəla torpağı”.** Mətndə “Kərbəla”, “xak”, “topraq”, “turab” sözləri bir-birini müxtəlif dillərin leksemləri olmaqla yanaşı, İmam Hüseyn hərəkatının atributları kimi də izləyir. Bu, bir neçə cəhətdən önəmlidir. Əgər bu sıralama bir yandan İmam Hüseyn (ə) – Kərbəla müqayisəsi üçün münbit zəmin yaradırsa, o biri yandan Kərbəla–Məkkə, Kərbəla–Mədinə müqayisələrini aparmağa sövq edir.

İdeologiya və lider, məfkurə və şəxsiyyət probleminin üzərində qurulan İmam Hüseyn–Kərbəla müqayisəsi əsər boyu dəfələrlə müşahidə olunur; məs.:

Gər bəlayi-Kərbəla ol şah qədrin arturub
Xəlqdən mümtaz, ana verdi ülüvvi-iqtidar,
Kərbəla həm ol şəhi-mə’sumdən rəf’ət bulub,
Xəlqə olmuş qədr ilə mənzuri-eyni-e’tibar.[142]

*(Əgər Kərbəla bəlası o şahın (İmam Hüseynin) qədir-qiymətini artıraraq, bütün insanlardan onu fərqləndirməklə ona uca rəhbərlik məqamı vermişdirsə, Kərbəla da o məsum şahdan (İmam Hüseyndən) yüksəklik alıb, insanlar üçün xətir-hörmətli və mötəbər baxış yeri, güvənc mənbəyi olmuşdur).*

Kərbəla–Məkkə, Kərbəla–Mədinə müqayisələri baxımından isə şairin farsca divanındakı məşhur parça daha səciyyəvidir:

.................................

[142] *Füzuli. Əsərləri, VI cild, səh. 241-242*





Çun xake-Kərbəla, Fozuli, məqame-mən,
Nəzməm be hər koca ke rəsəd, hormətəş rəvast.
Zər nist, sim nist, qohər nist, ləl nist;
Xakəst şere-bənde, vəli xake-Kərbəlast!

*(Ey Füzuli, məskənim çün Kərbəladır, şeirimin şöhrəti hər yerdə vardır, xəlq onun müştaqıdır. Nə qızıldır, nə gümüş, nə ləl, nə mirvaridir, sadə torpaqdırsa, lakin Kərbəla torpağıdır).*

Doğrudur, Füzuli bu şeiri sırf sənət müstəvisində demişdir, ancaq şeirin alt qatında şairin Kərbəlaya ilk növbədə din, iman məbədi kimi yanaşdığı aydın görünür. Odur ki, bu yanaşmanı Füzulinin doğum yerinin Kərbəla olması ilə açıqlamaq, əslində, şairin əsl məqsədini sapdırmaq olardı.

Digər tərəfdən, nəzərə alınmalıdır ki, Füzulinin belə isti münasibətinin əsasında daha çox dini faktor – inam-inanc sistemi durur. Çünki Kərbəla Füzulinin gözündə, hər şeydən öncə, qail olduğu Peyğəmbərin və onun Əhli-beytinin, imamların son dərəcədə sayıcı sevgi bəslədiyi yüz minlərcə imamhüseynsevərin tutiya – tapılmaz və mötəbər əşya saydığı bir tapınaqdır. Şiəlikdə namaz qılmağın zəruri komponenti sayılan möhürün Kərbəla torpağından düzəldilməsinə çox böyük önəm verilməsi də buradan irəli gəlir.

Bölümün qalan hissəsində də "Kərbəla torpağı" anlayışınn işlək və çevik olması, zənnimizcə, daha çox Füzulinin dini dünyagörüşü ilə bağlıdır. Ötəri deyildir ki, şair həmin məfhumu motivə çevirərkən hissediləcək qədər dəlil-sübut gətirir, söykəndiyi mənbələri ayrıca gözə çarpdırmağa can atır; məs.: "Və bir rəvayət dəxi Qazi Əyaz kitabi-"Şəfa"dən nəql etmiş ki, Həzrəti-Rəsul Hüseyni-məzlumun qətlindən xəbər verüb zəmini-Kərbəladan ki, ona Təftəf derlərdi, bir qəbzə xak alub Ümm Sələməyə tapşurdu. Və bir rəvayət dəxi İmam Yafei "Mir'atül-cinan"da Ənəs bin Malikdən İmam Hənbəl vasitəsilə nəql edüb məstur etmiş ki, bir gün mələküs-səhab hüceyri-risalətə gəlüb Həzrəti-Hüseyn hazır oldu, qolların Həzrəti-Rəsulun boynuna buraxub mübarək gisularıyla bünyadi-müla'əbə qıldı. Mələküs-səhab ayıtdı: "Ya Rəsulullah, bu pərvərdeyi-ne'mətin olan fərzəndi-



səadətməndini ümməti-bivəfa dəşti-Kərbəlada qətl edələr". Və Kərbəladan bir miqdar xak nümunə üçün Həzrəti-Rəsulə ərz etdi və həzrət anı Ümm Sələməyə təslim etmişdi. Əmri-təqdir ilə Ümm Sələmə ol şişəyi hazır edüb mülahizə qıldıqda gördülər ki, ol xak xunab olmuş və ol nişanə vüqu bulmuş. Çün nişanə ilə Kərbəla vaqeəsinin keyfiyyətin bildilər, ağazi-müsibət qılub əzayə əzimət qıldılar"[143].

*(Daha bir rəvayəti isə Qazi Əyaz "Şəfa" adlı kitabında nəql etmişdir ki, Rəsulullah məzlum Hüseynin qətlindən xəbər verib, Təftəf adlanan Kərbəla torpağından bir ovuc torpaq götürüb Ümmü-s-Sələməyə tapşırdı.*

*İmam Şafeyi də başqa bir rəvayətdə, "Miratü-l-cinan" ("Cənnət güzgüsü") kitabında Ənəs bin Malikdən imam Həmbəli vasitəsilə nəql edərək yazmışdır ki, bir gün bulud mələyi Peyğəmbərin otağına gəldikdə Həzrət Hüseyni orada gördü ki, o, qollarını Rəsulullahın boynuna dolamış və onun mübarək saçları ilə oynayır. Bulud mələyi dedi: "Ya Rəsulullah, sənin ən böyük nemətin olan bu xoşbəxt nəvəni vəfasız ümmət Kərbəla çölündə qətlə yetirər". Və Kərbəladan bir qədər torpağı nümunə olaraq Peyğəmbərə verdi, Peyğəmbər isə onu Ümmü-s-Sələməyə verdi.*

*İlahi təqdir nəticəsində o, şüşə qabı (gedib qoyduğu yerdən) gətirdi, baxdıqda gördülər ki, o torpaq qanlı suya çevrilmiş və həmin əlamət gerçəkləşmişdir. Xüsusi əlamətlə Kərbəla vaqeəsinin baş verdiyini bildikləri üçün müsibətə əyləşib, yas saxlamağa başladılar".*

Ən nəhayət, bölümün özündə birləşdirdiyi dini-mənqəbəvi anlayışların təhlilini davam etdirsək, daha iki məfhumun üzərində dayanmalıyıq:

**7. İmam Hüseyn hərəkatının faciəvi nəticələrinin ayrıca müsibət zikri olması.** Mətndə "Ağazi-müsibət" ifadəsində ümumiləşdirilmiş bu anlayış, əslində, mövzu, məzmun və formaca çox geniş olub, qətiyyən İmam Hüseyn şəxsiyyəti və Əhli-beyt aktı ilə məhdudlaşmır, əksinə, Kərbəla vaqeəsinin daxilində gizlənən etiqadi, ibadi və əxlaqi mətləblərin üzə çıxarılmasına xidmət edən dolğun və tutumlu bir dini-mənəvi

.................................

143 *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 43*



mərasim kimi ortaya çıxır. Bu mərasimin mahiyyətinin Kərbəla vaqeəsindən iki yüz il sonra büveyhilərin İmam Hüseynə matəm saxlanılmasını rəsmiləşdirmələri ilə əlaqəsi yoxdur. Əslində, İmam Hüseyn matəmi faciənin ilk anından bəri bəşəri səciyyə qazanmış, ictimai çəki almış və beləliklə də ümummüsəlman kədərinə çevrilmişdi. Bu gün şiə olmayanların da məhərrəm və səfər aylarında matəm mərasimlərində fəal iştirak etməsi məhz belə ülvi mənəvi istəklərdən doğmaqdadır.

"Hədiqətis-s-süəda" yazıldığı illərdən bugünə qədər türk ədəbiyyatında çox diqqət görən, oxunan əsərlərin başlıcalarından biridir. Bu məqtəl həm sünni, həm şiə müsəlman türkləri tərəfindən sevgi ilə, hörmətlə qarşılanmış, oxunmuş, dinlənilmiş, hətta bəzi şəxslər tərəfindən əzbərlənmişdir. İstər milli, istərsə də şəxsi fəlakət anında insanlar Ənbiyanın və Əhli-beytin çəkdikləri bəlaları dinləyib öz dərdlərini unutmuşlar"[144].

Ötəri deyildir ki, Füzuli "Hədiqətüs-s-süəda"da fürsət tapar-tapmaz Kərbəla vaqeəsinin bu tərəfini önə çəkir, vaqeənin təkcə faciəvi xüsusiyyətlərini yox, dini-fəlsəfi və mənəvi-əxlaqi cəhətlərini də əlvan və təsirli bədii boyalarla qələmə alır:

Eyləyib hər yıl cəmi'i-əhli-aləm ittifaq,
Şərh edərlər macərayi-Kərbəla əxbarını.
Nə tükənməz qissədir kim, hərgiz axır olmadı,
Şərhi aciz eylədi əhli-cəhanın varını! [145]

*(Yer üzündə yaşayan insanlar hər il əl-ələ verərək Kərbəla vaqeəsiylə bağlı bilgiləri açıqlamağa çalışarlar. Ancaq Kərbəla vaqeəsi gör necə tükənməz hadisə və əhvalatlar toplusudur ki, hələ də söz-söhbəti qurtarmır, əksinə, onun açıqlaması bütün dünyanın bacarığını günü-gündən daha çox aciz buraxır).*

.................................

[144] *Füzuli, Əsərləri, VI cild, səh. 14*

[145] *Füzuli. Əsərləri, VI cild, səh. 132*





Burada ictimai tərəflərini verdiyi İmam Hüseyn hərəkatını Füzuli başqa şeirlərdə sırf islami və mənəvi yöndə nəzmə çəkir:

Çeşmə nisbət dəmbədəm pakizətinətlər gözün
Əşkbar eylər məlali-zikri-xaki-Kərbəla.
Ağladırsa Kərbəla torpağı dərd əhlin, nola?
Bu, müqərrərdir ki, daim göz yaşardır tutiya.[146]

*(Kərbəla torpağının anılmasının kədəri fitrətən pak olanların gözünü anbaan bulaqtək sulu, nəmli edər. Kərbəla torpağının dərdliləri ağlatması qətiyyən qəribə deyil, tapılmaz və nadir bir şeyin əldə edilməsinin göz yaşına yol açacağı qaçılmazdır!).*

Ey qılanlar arizuyi-abi-kövsər, dəmbədəm
Təşnə dünyadən gedən Ali-Rəsuli yad edin.
Macərayi-Kərbəla zikrin qılın şamü səhər!
Təbiniz ol zikri-rəfətbəxş ilə mö'tad.

*(Ey Kövsər suyundan içməyi diləyənlər, hər an dünyadan susuz halda getmiş Peyğəmbər balalarını anın! Səhər-axşam, gecə-gündüz Kərbəla vaqeəsinin doğurduğu fəci halları müsibət şəklində deyin, danışın, özünüz də qəmgin olun, başqalarını da qəmgin edin; qoy sizin fitrətiniz, xislətiniz yüksək amallar aşılayan o müsibət zikri nəticəsində İmam Hüseyn hərəkatı və Kərbəla şəhidləri ilə daimi bir ünsiyyət yaratsın!).*

Əhli-beytin yad edib hər ləhzə abi-didəsin,
Zaye olmaz əşk tökmək dideyi-xunbaridən.
Bu müsibət əşkinin hər qətrəsinə ruzi-həşr
Əcridir min bəhri-rəhmətiyzədi-vəbbaridən!

*(Hər an Kərbəlada əsir-yesir olan Peyğəmbər balalarının göz yaşını yada salıb ağlamaq əsla (Tanrı qatında) puça çıxmaz! Çünki Qiyamət günündə bu müsibətə görə tökülən*

---

[146] *Füzuli. Kərbəla vaqiəsi, səh. 51*





*hər bir göz yaşı damlasına Cəbbar (qəzəbli) Allahdan min mərhəmət dənizinin mükafat olaraq verilməsinə şübhə yoxdur).*

Göründüyü üzrə, bu parçaların hamısında sırf islami və mənəvi cəhətlər (fitrətən ilahi yaradılış etibarilə pak olanlar, Tanrı təqdiri (mətndə: "müqərrər"), cənnətdəki Kövsər bulağı, yaxud çayı, Peyğəmbər balaları, Qiyamət günü, ilahi qəzəb) tərənnüm olunur, onlar İmam Hüseyn hərəkatı və Kərbəla vaqeəsi yönündə taysız incilərtək şeir-sənət sapına düzülür və bu yolla da yüz minlərcə imamhüseynsevərin duyğu və düşüncələrini coşduran hərəkətəgətirici və istiqamətverici bədii-estetik faktor kimi poetik mühakimə predmetinə çevrilir.

**8. İmam Hüseyn təziyəsi.** Mətndə "əza" sözündə əksini tapmış bu anlam qətiyyən ənənəvi mənada başa düşülən bəsit yassaxlama, matəm keçirmək olmayıb, dərin kədərin səmimi surətdə büruzə verilməsi, ifadə edilməsi üzərində qurulan və daha çox ictimai səciyyə qazanan təbii bir islami anlayışdır. Bu anlayış göz yaşı, qəhərlənmə, qəmginlik, köksötürmə, rövzədemə, mərsiyəoxuma, sinəvurma, zəncirvurma, vəzetmə kimi müxtəlif məfhumlarla bağlıdır. Doğrudur, ilk baxışda kimsə bunları sadalamağı bəsit və yersiz saya bilər, ancaq unutmamalıyıq ki, Füzuli bütün bunları ömür boyu dərindən-dərinə yaşamış, qanına-canına hopdurmuş, ruhən, qəlbən bağlandığı dinin inam-inanc sisteminin tərkib hissəsi bilmiş və əhatəsində böyüyüb boya-başa çatdığı minlərcə imamhüseynsevərin duyğu və düşüncələrini dilə gətirməyi özü üçün böyük şərəf hesab etmişdir. Araşdırılan bölümün göz yaşlarına köklənmiş bir ağı ilə bitməsi də bunu göstərir:

Ya Rəbb, nə fitnədir ki, xərab etdi aləmi,
Azürdə qıldı ruhi-Rəsuli-mükərrəmi?!

*(Ey Allah, Kərbəla vaqeəsi necə ağır hadisədir ki, təsiri bütün dünya əhlinin əhvalını korladı, çünki bu hadisə (Tanrı qatında) çox mötəbər olan sonuncu Peyğəmbərin ruhunu inicitmişdir!).*





Əyani-ali-Əhmədə gərdun cəfa qılıb,
Əşrafi-Əhli-beytə rəva gördü matəmi?!.

*(Kərbəla vaqeəsini törətməklə fələk (hakim dairələr) şərəfli Peyğəmbər balalarına əzab-əziyyət verərək İmam Hüseynin əziz-giram övladlarına matəm içində qalmağı rəva gördü).*

Va həsrəta ki, buldu xələl seyli-fitnədən
Şər'in mətin binasivü bünyadi-möhkəmi!

*(Minlərcə təəssüflər olsun ki, fitnə-fəsadın seltək axıdılması nəticəsində şəriətin sarsılmaz özülü və möhkəm bünövrəsi titrədi).*

Gülzari-Kərbəlayə dikildi nihali-qəm;
Xoşdur ki, ani eyləyə sirab göz nəmi!

*(Kərbəla çəmənliyinə qəm şitili əkildi, onu yalnız göz yaşı doyurub hasilə yetirə bilər!).*

Göründüyü üzrə, ağı heç də sırf matəm elegiyası olmayıb, dərin ictimai məzmunlu və böyük bəşəri kədər soraqlı bir mərsiyə olmaqla Kərbəla vaqeəsinin, İmam Hüseyn hərəkatının bir çox səbəb və məqsədlərinə işıq tutmaqda, "fitnə", "xərab etdi", "aləm", "buldu xələl", "seyli-fitnə", "şər", "nihali-qəm" kimi ənənəvi, şablon, bir qədər də epiqonçu söz və ifadələrə sosial, siyasi, fəlsəfi, psixoloji, estetik anlam yükləməkdə, beləliklə də onların hər birini əsər boyu bu, yaxud başqa ölçüdə önə çıxan ideyaların atribut və ekvivalentlərinə çevirməkdədir.

Məsələn, "fitnə" sözü ilə "seyli-fitnə" ifadəsi Kərbəla vaqeəsini İslamın köksündə açılmış dərin xəncər yarası kimi qavradırsa, "xərab etdi aləmi" tərkibi İmam Hüseyn hərəkatının dünyanın siyasi səhnəsinə göstərdiyi böyük təsir gücünə, "Şər'in mətin binasivü bünyadi-möhkəmi!" misrası



da dini məzhəb və təriqətlərin pozucu və dağıdıcı fəaliyyətinə işarə kimi anlaşılır.

Beləliklə, aydın olur ki, Füzuli əsərin başlanğıcındaca Nuh Nəbidən danışmaq bəhanəsi ilə, əslində, İmam Hüseyn şəxsiyyətini, Kərbəla vaqeəsini önə çəkmiş, ayə və hədislərə söykənməklə şəhidliyin islami məfkurəsinə bədii işıq salmış və qail olduğu yüksək dini-mənəvi dəyərlərin ölməz mahiyyətini çeşidli fikri bədii səciyyələndirmə və mənalandırmalarla əks etdirmişdir. Odur ki, bölüm özünün ideya-bədii cizgiləri və ədəbi-mədəni məziyyətləri ilə əsərin İmam Hüseyn sayğısı və sevgisi ilə yoğrulmuş ən parlaq yerlərindən biri kimi minlərlə imamhüseynsevərin ruhunu oxşayır və sevilə-sevilə oxunur.

İmam Hüseyn və Yaqub–Yusif peyğəmbərlər

## İmam Hüseyn və Yaqub–Yusif peyğəmbərlər

“Hədiqətü-s-süəda”nın ilk babına daxil olan və Kərbəla vaqeəsi ilə daha artıq bağlanan bölümlərdən biri də “Fəsli ibtilayi-Yaqub əleyhissalam” (“Yaqub Peyğəmbərin müsibəti fəsli”) adlanır. Adının başlıqda çəkilməməsinə baxmayaraq, bölüm, əslində, Yusif Peyğəmbərin sərgüzəşti üzərində qurulmuşdur. Ancaq şair bölümü belə adlandırmaqda haqlıdır. Çünki Yusifin başına gələnlər son nəticədə Yaquba qayıdır, onun ruhi-psixoloji durumunu şərtləndirir.

Başqa analoji bölümlərdən fərqli olaraq, bu hissə bilavasitə Kərbəla vaqeəsi, daha doğrusu, onun baş şəxsiyyəti İmam Hüseynlə bağlı əsl səadətdə baş vermiş əhvalatla bağlanır: “Zümreyi-ərbabi-bəla və firqeyi-əshabi-ənanın biri Yə’qub Nəbi, biri Həzrəti-Yusufu-siddiqdir. Həzrəti-imam Rüknəddin əleyhirrəhmə tərcümeyi-“Sure-yi-Yusif”də böylə təhrir etmiş ki, bir gün şəmseyi-eyva-ni-risalət və dibaçeyi-divani-nübüvvət mütəməkkini-məsnədirahət olub, dəryayi-iltifatın bir kənarində gövhəri-mə’dəni-vəfa Həsəni-Müctəba və bir kənarində sərvi-



cuybari-səxa Hüseyn bin Əliyyi-Murtəza qərar dutub, gah ol gövhər nəzzarəsindən didəyə nur verürdi və gah bu sərvin müşahidəsində sinəyə sürur yetirürdi. Bu halə müqarin Cəbrail, Məliki-Cəlildən gəlüb səlam yetirüb Həsən və Hüseynə işarət qılub ayıtdı: "Ya Rəsulullah, ətuhibbuhuma?" Həzrət buyurdu ki: "Nə'əm əvladuna və əkbaduna". Cəbrail ayıtdı: "Ya Nəbi, məhəbbətləri mütəsavimidir, ya mütəfavitmi?" Həzrəti-Rəsul ayıtdı: "La-fərqə beynəhuma, bir bəhri-mə'arif gövhərləridür və bir fələki-məkarim əxtərləridür". Cəbrail ayıtdı: "Ya Rəsulullah, bu şəhzadənin birin zəhri-cəfa ilə həlak qılub, birinün tiği-bidiriğ ilə bağrın çak edələr". Həzrəti-Rəsul ayıtdı: "Ya əxi mən yəf'əlu haza beynəhuma". Cəbrail ayıtdı: "Ya Rəsulullah, ümməti-bivəfalərin". Həzrəti-Rəsul ayıtdı: "Aya, nə cürmlə məqtul olalar və nə xəyanətlə bu cəfayə istehqaq bulalar?" Cəbrail ayıtdı: "Xəyanətdən müərra və cinayətdən mübərra". Həzrəti-Rəsul kəndusin bu bəlaya məxsus təsəvvür qılub bu cəfadən mütəəllim olduqda Cəbrail ol həzrətün təsəlliyi-xatiri üçün "Yusuf" surəsin nazil etdi ki (nəhnu nəqussu əleykə əhsənəl-qisəsi)"[147].

*(Başıbəlalıların və əzab-əziyyətsevərlərin biri Yaqub Peyğəmbər, biri sədaqətli Yusifdir. Mərhum imam Rüknəddin "Yusif" surəsini tərcümə edərkən belə məlumat verir ki, bir gün peyğəmbərlik eyvanının çətiri və peyğəmbərlik kitabının müqəddiməsi özünün rahatlıq taxtına söykənib mərhəmət dənizinin bir sahilində vəfa mədəninin cövhəri olan Müctəba Həsən və bir sahilində də səxavət arxının sərvi Mürtəza Əli oğlu Hüseyn əyləşmişdi. Peyğəmbər hərdən o inciyə baxmaqla gözünü işıqlandırırdı, hərdən də bu sərvin boy-buxununa diqqət yetirməklə könlünü sevindirirdi. Onlar belə mehribancasına əyləşmişkən Cəbrail cah-cəllallı hökmdar qatından gələrək salam gətirdi, Həsən və Hüseyni göstərib buyurdu: "Ey Tanrının elçisi, sən bunların hər ikisinimi çox istəyirsən?" Həzrət buyurdu ki, "bəli, övladlarımız ciyərimizin bir parçasıdır". Cəbrayıl dedi ki, "onlara*

................................

[147] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.51-52*





*başlədiyin məhəbbət birdir, yoxsa aralarında fərq varmı?" Peyğəmbər həzrətləri cavab verdi: "İkisi arasında heç bir fərq yoxdur. Çünki onlar eyni bir məarif inciləri və eyni bir ehtiramlı fələyin ulduzlarıdır".*

*Cəbrayıl dedi: "Ey Tanrının elçisi, bu şahzadələrin birini cəfa zəhəri ilə həlak edəcəklər, o birinin isə iti qılıncla bağrını yaracaqlar". Peyğəmbər həzrətləri soruşdu: "Ey qardaş, axı bunlara bunu kim edər?" Cəbrayıl cavab verdi: "Ya Rəsulullah, vəfasız ümmətinin bəzi adamları!"*

*Peyğəmbər həzrətləri yenə soruşdu: "Yaxşı, bəs bunlar hansı suçla öldürülərlər və nə kimi cinayət üstündə belə əzab-əziyyətə layiq görülərlər?" Cəbrayıl söylədi: "Onlar günahdan uzaq və cinayətdən təmizdirlər".*

*Peyğəmbər həzrətləri özünü onların yerində hiss edib bu zülmə görə ağladıqda Cəbrayıl o həzrətin könlünü almaq üçün "Yusif" surəsini nazil etdi ki, "biz sənə hekayətlərin ən yaxşısını danışırıq" ("Yusif", 3).*

Müsibəti-Həsənü möhnəti-Hüseyni-şəhid
Dəmi ki, oldu qəməfzayi-təb'i-paki-Rəsul,
Təsəlliyi-dili-paki-Rəsul üçün Həqdən
Bəyani-qisseyi-Yə'qubü Yusif etdi nüzul.

*(Həsənin müsibəti ilə şəhid Hüseynin möhnəti Peyğəmbərin saf, pak əhvalını kədərə bürüdükdə Peyğəmbərin incə qəlbi təsəlli və təskinliyə qovuşsun deyə Tanrı qatından "Yaqub–Yusif" qissəsinin açıqlaması nazil edildi).*

* * *

Əsərin mütaliəsi dərhal göstərir ki, Füzuli bölümü olduqca şövqlə qələmə almış, Yaqub–Yusif, Yusif–qardaşları, Yusif–Züleyxa xətlərinin prozaik və poetik imkanlarını özünün aydın və dəqiq yaradıcılıq istəyi yönündə ustalıqla işlədərək qarşısında açılmış geniş bədii-estetik üfüqlərdə ilham atını çapa bilmişdir. Buna görə də bölümün Kərbəla vaqeəsi ilə əlaqələndirilməyən yerlərində belə səriştəli oxucu üçün kifayət qədər müqayisə yeri qalmaqdadır. Ancaq şair oxucusunu



yormamış, fürsət düşər-düşməz, imkan tapar-tapmaz özü dolğun və tutumlu müqayisələr aparmışdır. “Hədiqətü-s-süəda” boyu özünün çevikliyini və işləkliyini saxlayan su motivi buna parlaq misaldır.

Əsərdə oxuyuruq: “Ol vəqtədək ki, dərəceyi-aftab irtifa’ buldu və həva sineyi-suzani-Yə’qub kibi aləmsuz oldu, atəşi-ətəş cigər və sinəyə hiddəti-hərarət buraxdı və ləhibi-şiddəti-təəttüş xirməni-səbrü qərarın yaxdı.

Pəjmürdə qıldı sərvi-xuramanı qəhti-ab,
Gülbərgə düşdü tabi-hərarətdən iztirab.

Yusuf qayəti-iztirabdən Rubilə ayıtdı: “Ey bəradər, bən sənün xiteyi-himayətində və hövzeyi-hərasətindəyəm, bənim siğəri-sinnimə rəhm et və fəryadimə yet”. Andan iltifat bulmayub Şəm´una ayıtdı: “Ey bəradər, tiği-tüğyani-ətəş riştəyi-həyatım qət’indədür, nola bir qətrə su ilə naireyi-iztirabimə təskin verəsən və validi-büzürgvarım həmrah edən məşrəbədən cani-suzanimə rahət yetürərsən”. Şəm’uni-bimürüvvət ol məşrəbəyi toprağə töküb ana vermədi və ol şirü şəkkəri tirə toprağə rəva gördü, ana layiq görmədi. Netə ki dəşti-Kərbəladə bə’zi bədbəxtlər zülali-Fəratı ki cəmi’i-məxluqə mübah ikən Ali-Mustəfadən qət’ etdilər və təriqi-hidayət zahir ikən rahi-zəlalət dutdular.

Ruzi-rəzmi-Kərbəla rahi-xəta dutmuş Fərat,
Qılmamış Ali-Məhəmməd dərdinin dərmanini!
Ol səbəbdəndir bu kim, üzr ilə dutmuş müttəsil
Eyləyib fəryad xaki-Kərbəla damanini!

Əl-qissə Şəm’un ayıtdı: “Ey Yusuf, qarındaşlarından təvəqqö etdigün qətreyi-ab dəşneyi-tiği-abdardür və təmə’ eylədigün iltifat növki-xəncəri-xunxardur”[148].

*(Günəş ən yüksək zirvəyə qalxdıqda və hava Yaqubun odlu ürəyi kimi aləmi yandırdıqda susuzluq alovu Yusifin ciyərini*

...................................

[148] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.56-57*





*hərarət hiddətinə bürüdü. Və susuzluq şiddətinin nişanələri Yusifin səbir və dözüm xırmanına od vurdu.*

*"Su qəhətliyi xuraman sərvi soldurdu, istilik işığından gül yarpağı iztiraba düşdü".*

*Əzab-əziyyətinin çoxluğundan Yusif Rubilə üz tutmağa məcbur olub dedi: "Ey qardaş, axı mən sənin himayət daldalanacağında və nüfuzun daxilindəyəm, odur ki, sən gəl mənim bu vəziyyətimə mərhəmətlə yanaş və imdadıma çat". Ondan mərhəmət görməyən Yusif Şəmuna belə söylədi: "Ay qardaş, susuzluq tüğyanının od-alovu az qala dirilik qaynağımı kəssin! Sən niyə axı bir damcı su ilə əzab-əziyyət odumu söndürmür, o böyük atamın verdiyi su tuluğundan od içində olan ruhuma dinclik gətirmirsən?"*

*İnsafsız Şəmun isə o tuluqdakı suyu torpağa tökərək ona vermədi və o südü, o şəkəri qara torpağa layiq bildi, ancaq Yusifə rəva görmədi.*

*Necə ki bəzi bədbəxtlər Kərbəla düzündə bütün yaranmışlara mübah ola-ola Fəratın zülal kimi suyunu Peyğəmbər nəslinin üzünə bağladılar və doğruluq yolu açıq-aşkar görünə-görünə azğınlıq yolu ilə getdilər.*

*"Kərbəla döyüşü gedən gün Fərat çayı yanlış yolda olmuşdur. Çünki o, Muhəmməd nəslinin dərdinə dərman etməmişdir! Fərat çayının üzrxahlıq istəyi ilə hər an Kərbəla torpağının ətəyindən yapışaraq daima ah-nalə içində olmasının səbəbi budur!"*

*Xülasə, Şəmun dedi: "Ey Yusif, qardaşlarından umduğun bir damcı su yalnız iti qılıncların nəmi ola bilər və ümid bəslədiyin mərhəmət isə ancaq qanlı xəncərlərin kəsici ucundan başqa bir şey ola bilməz!").*

Göründüyü kimi, su motivi Yusif–qardaşları xəttinin təbii süjet elementi kimi ortaya çıxır. *Atəşi-ətəş, təəttüş, qəhti-ab, bir qətrə su, məşrəb* ifadələri bu elementin leksik daşıyıcılarıdırsa, bütövlükdə mətnin məzmun və üslub cizgiləri həmin məfhumun ideya-bədii keyfiyyətləridir. Ancaq



şair motivin bu çevikliyindən doğan fürsəti fövtə vermir və dərhal sözü Kərbəla vaqeəsi üzərinə gətirir. Bununla bağlı başlıca cəhətləri belə ümumiləşdirə bilərik:

**1. "Dəşti-Kərbəla".** Kərbəla adı gələr-gəlməz imamhüseynsevərlərin yadına su, şəhidlərin çəkdiyi susuzluq düşdüyündən sözün quruca dilə gətirilməsi də bu motivin bədii dərkinə xidmət edir.

**2. "Bəzi bədbəxtlər".** Bu ifadə Kərbəla şəhidlərini sudan məhrum edən üzüqara düşmən ordusunun rəhbərlərini və aparıcı sıra nəfərlərini xatırladır. Bu isə Yusif və qardaşları xəttindəki Rubilə və Şəmuna doğru yönəldilmiş öldürücü sarkazmdır.

**3. "Zülali-Fərat".** Kontekstdən təcrid edilmiş halda götürdükdə, Fərat çayının xüsusi tərkibə malik olan suyuna aid edilə biləcək bu ifadə ilə Füzuli, əslində, ümumiyyətlə suyun həyati önəminə toxunmuş və bunun Kərbəla vaqeəsindəki çəkisinə işarə etmişdir.

**4. "Mübahlıq".** Müsəlman şəriətinin 5 kriteriyasından biri olan bu anlayış halalla haram, müstəhəbbiliklə məkruhluqdan fərqli olan bir anlam – davranış və əməl sərbəstliyi anlamına gəlir ki, bunun mətndəki daşıyıcısı "cəmiyyi-məxluqata mübah ikən" tərkibidir. Füzuli bununla Yezid hakimiyyətinin flora və faunaya, bitki örtüyünə və heyvanlar aləminə belə qoruq-qadağası çatan Fərat suyunu İmam Hüseynin və tərəfdarlarının üzünə bağlamasını kəskin pisləmiş, bu barədəki kəsərli sənətkar sözünü demişdir. Mübarək "Bəqərə" surəsinin 166-cı ayəsinə söykənən "təriqi-hidayət zahir ikən cahi-cəlalət dutdular" şəklindəki dəyərləndirmə emosionallıq xətrinə söylənilmiş bədiilik olmaqla qalmır, əksinə, istər Yaqub–Yusif əhvalatı baxımından, istərsə də Kərbəla vaqeəsi yönündə ilahi hidayət, Tanrı yolgöstəriciliyi bəhsini köklü biçimdə əsərə gətirmiş olur.

Dini-irfani açıqlamalardan da yaxşı bəllidir ki, eyni bir predmet, məsələn, elə suyun özü nemət də ola bilir, niqmət də. "Niqmət" "ağır sınaq, bəla" deməkdir. Nil çayından 12



qol ayrılaraq Musanı və tərəfdarlarını xilas etdiyi halda, həmin qolların dəstəsi ilə birlikdə Fironu məhv etməsi buna səciyyəvi bir misaldır.

**5. "Ruzi-rəzmi-Kərbəla rahi-xəta dutmuş Fərat".** Misra bütün bədii-estetik yükü ilə şirin və həzin obrazlılıq örnəyidir. Çünki burada şair Fəratı bir canlı kimi şəxsləndirir, Aşura günündə onun bağışlanılmaz yanlışlığa yol verdiyini bildirir. Axı o, ali Muhəmməd dərdinə dəva qılmamışdır. Odur ki, Fərat gecə gündüz ah-nalə çəkərək Kərbəla düzünün ətəyindən yapışmış və durmadan ondan bu həlledici məqamda səhvini əfv etməsini diləyir.

Füzuli burada artıq qələmini ecazkar rəssam fırçasına çevirmiş Kərbəla düzünün Fərat çayının, Peyğəmbər övladlarının, şəhidlərin canlı və diri portretini cızmışdır.

Bu qeydlər əsaslı surətdə sübuta yetirir ki, Füzuli "Hədiqətü-s-süəda"nın bu yerində bir daha su motivinin bədii-estetik həllini verməyə müvəffəq olmuşdur.

* * *

Hissənin Kərbəla vaqeəsi ilə üçüncü əlaqəsinə şair Yaqub Peyğəmbərlə Həzrət Muhəmmədin müqayisəsi ilə nail olur: "Aya, əgər Yə'qubi-pərişanruzigar Yusufu-xücəstəxisalı ol zillətlə görsəydi, nolurdu halı və gər Həzrəti-Mustəfa Kərbəlada Hüseynin əhvalinə müşahidə qılsaydı, nə qayətə yetərdi möhnətü məlalı"[149].

*(Əgər zəmanənin gününü qara etdiyi Yaqub naz-nemət içərisində böyüyən istəkli balası, uğurlu xasiyyətli Yusifi düşdüyü zillət içərisində görsəydi, nə günə düşərdi və axırzaman Peyğəmbər gəlib Kərbəlada Hüseynin vəziyyətini müşahidə etmək imkanına malik olsaydı, bilmək olmaz ki, onun qəm-kədəri nə dərəcədə sonsuz olardı).*

Parça təkcə leksemlərinin morfoloji anlamları ilə deyil, dərin semantik çalarları ilə də olduqca yanıqlıdır. Parçanı izləyən şeirin ekspressivliyi də bu yüksək qayəyə xidmət edir:

.................................

[149] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.57*



Təhqiqi-möhnətü qəmi-Ali-Əba üçün,
Səhrayi-Kərbəlaya güzar eylə, ya Nəbi.
Hali-Hüseynə xaki-məzəllətdə qıl nəzər,
Əndişeyi-qəribi-diyar eylə, ya Nəbi[150].

*(Öz əziz-giram övladlarının bitib-tükənməz qəm-kədərini bütün genişliyi ilə üzə çıxarmaqdan ötrü, sən ey Peyğəmbər, yolunu Kərbəla düzündən sal! Ey Peyğəmbər, həmişə qoxladığın o reyhan ətirli Hüseyninin halına bir zəlillik torpağına düşmüş vəziyyətdə də diqqət yetir, o yurdda qərib və köməksiz qalmış Əhli-beyt qayğısına qal. Onlar üçün fikir çək, Allahdan onların daha uca məqamlara çatmasını dilə).*

Zənnimizcə, şeirin leksikonu bir diqqətcillik axarına qovuşmaqdadır. *Təhqiq, güzar eylə, hal, qıl nəzər, əndişə, diyar* ifadələri, hər şeydən öncə, bir axtarış, bir dəqiqləşdirmə əhvali-ruhiyyəsindən soraq verir. Bu isə qətiyyən ötəri deyil. Çünki belə yönəlmə Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilə bağlı uzun illər durmadan aparılan dağıdıcı təhrif təbliğatının puça çıxarılmasına çağırış səciyyəsi daşıyır.

* * *

Bölümlə Kərbəla vaqeəsinin dördüncü əlaqəsi Yusifin Yəhudaya etdiyi vəsiyyətlə bağlıdır. Yusif Yəhudaya belə vəsiyyət edir: “Vəsiyyətim budur ki, validi-büzürgvarım hüzurində məclisi-cəmiyyətünüz in´iqad bulduqda bənim pərişanlığımı fəramuş etməyəsüz və cəhdiniz olduqca ol piri-əzizin könlün yaxub xatirin incitməyəsüz!”[151]

*(Mən sizdən acizanə surətdə bunu xahiş edirəm ki, yenidən əziz atamın başına toplaşdıqda mənim bu kədərli vəziyyətimi unutmayasınız və bacardıqca o əziz qocanın ürəyinə dağ çəkib qəlbini qırmayasınız).*

Füzuli Yusif Peyğəmbərin bu sözlərindən dərhal sonra çox yanıqlı bir şəkildə dilə gəlir: “Allah, Allah! Nə münasibdir bu vəsiyyət ana ki, Həzrəti-Sultani-Kərbəla İmami Zeynəlabidinə

..................................

[150] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.58*

[151] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.61*





vəsiyyət qıldı ki: "Ey fərzəndi-dilbənd (Ey ürəyimin meyvəsi – **V.A.**) səlamımı süləhayi-ümmətə (ümmətin əməlisaleh adamlarına – **V.A.**) yetür və iltimas et ki, hər qanda bir məzlum və bir qərib müşahidə qıldıqda bənim qəribliyim və məzlumluğum yad edələr"[152].

Oradan başlayaq ki, İmam Zeynəlabidin surəti "Hədiqətü-s-süəda"nın aparıcı personajlarından biridir. Bu baxımdan onun İmam Hüseynlə münasibətləri əsərin bir neçə yerində qələmə alınır. Bu, imamlar arasındakı vəsiyyətə də aiddir. Belə ki, İmam Hüseyn şəhidlik zirvəsinə ucalan anlarda belə oğlu və ardıcılı İmam Zeynəlabidinlə birlikdədir. Ancaq o ulu din böyüyünün ardıcılına buradakı vəsiyyəti onuncu babdakı vəsiyyətindən bir xeyli seçilir. İmamın buradakı vəsiyyətini şərtləndirən başlıca cəhətlər bunlardır:

**1. "Salam".** İstisnasız olaraq hər bir xalqın dilində yer alan ümumi anlayışlardan biri, bəlkə də birincisi salamlaşmaqla bağlı söz və ifadələrdir. Bəşəriyyətin qurtuluş yolu olan İslam isə bu kütləvi aktı – məişətdən, əraziçilikdən, ictimai mənsubiyyətdən çıxararaq ona nəinki ümumbəşəri məzmun vermiş, hətta onu Ulu Yaradanın adı ucalığına kimi yüksəltmişdir. Odur ki, bu anlayışın dinimizdəki işlənmə məqamlarını ardıcıl olaraq izləmək fərdi mənafelərin çox vaxt ictimai amallardan yuxarı tutulduğu indiki həssas günlərdə ayrıca bir önəm qazanardı.

Salamlaşmaqla bağlı anlayışlar Qurani-Kərimdə, adətən, "təhiyyə" və "salam" sözləri ilə işlənir. Hər iki söz mövzü, məzmun və məfkurəcə olduqca tutumludur.

"Tayəyə" kökündən törənən "təhiyyə" sözünün, demək olar ki, anlamlarından "yaşarılıq, canlılıq" məzmunu dərhal duyulur. Belə ki, ərəb dilində "canlı olmaq, daima inkişaf etmək" mənasına gələn bu kökdən qaynaqlanan *diriltmək, alovu körükləyərək gurlaşdırmaq, gecəni oyaq keçirmək, Allahın bir yerdə bitki bitirməsi, gedib bir yeri münbit görmək, birinə salam vermək, bir-birinə dua etmək, uşağı bəsləmək, əsiri sağ buraxıb öldürməmək, bolluq, məhsuldarlıq, yağış,*

---

[152] *Yenə orada*



*tövbə, həyat, inkişaf, əbədilik, ölümün ziddi, özündə həyat əlamətləri qalan, kiçik qəbilə, məhəllə, vicdanlı, ilan, şir, mikrob, üz, çöhrə, qaç* kimi ən müxtəlif qrammatik, leksik və semantik keyfiyyətlər məhz bu kök çevrəsində qərar tapmışdır.

Tutumluluq baxımından "təhiyyə"dən bir qədər geri qalmasına baxmayaraq, "salam" sözü də yaşarılıq, canlılıq bildirməsi ilə seçilir. Belə ki, bu sözün də anlamları sırasında bu səpkili mənalar gözə dəyir; məs.: *dərini səlam ağacı ilə qaşımaq, sülhə girmək* (bu məna Qurani-Kərimdə də əksini tapıb: "Əsləmə" *("Bəqərə", 208)), səhhətini etiraf etmək, salamatlıq, vay aman, heyrət, nə qədər gözəl, ayaq və əl barmaqlarının sümükləri, müharibəsiz əsir almaq, bədəni yumşaq və lətif olan qadın, ölümlə çarpışan yaralı, səlam ağacları çox olan yer.*

Qurani-Kərim "salam" anlayışının, demək olar ki, həyatın bütün sahələrindəki işlənmə məqamlarına nümunələr verir. Bu nümunələr dünyadan axirətədək, aqildən cahilə qədər, sıravi bəndədən Peyğəmbərə kimi ən müxtəlif sahələri əhatə edir.

Hər bir sahədə olduğu kimi, salamlaşma prosesində də Qurani-Kərim həm ümumi müddəa və qənaətlər buyurur, həm də onların konkret ifadə üsullarını, təzahür formalarını əyani surətdə göstərir. Belə ki, mübarək *"Nisa"* surəsinin 86-cı ayəsində oxuyuruq: "Sizə salam verildiyi zaman onu daha gözəl alın və ya (eynilə sahibinə) qaytarın! Şübhəsiz, Allah hər şeyi hesaba alandır". Ayənin özündə birləşdirdiyi hikmətləri yetərincə aça bilməkdən ötrü onun leksikonuna diqqət yetirmək kifayətdir. Belə ki, həcmcə kiçik olmasına baxmayaraq, ayədə "salam" anlayışına dəlalət edən üç söz vardır: "Huyyitum, bitəhiyyətin, təhayyə".

Digər tərəfdən, ayədə salamlaşma prosesi adi məişət aktı kimi təqdim olunmur. Əksinə, "biəhdənə" sözü buna ali estetik keyfiyyət aşılayır. Axı "Allah gözəldir və gözəlliyi sevər" *(Həzrət Muhəmməd (s)).*

"Salam vermək, salam almaq müsəlmanlar arasında sevgi və sülh duyğularını artıran gözəl bir vasitədir.



Salam verən şəxs saygı və gözəl niyyətini ifadə etmək üçün qabağa düşdüyünə görə salamı alan kimsə də onun cavabını bir neçə kəlmə sözlə daha geniş verməklə bu gözəl davranışa uyğun hərəkət etməlidir”[153].

Həyat son dərəcə mürəkkəb olduğundan hər bir kəs günün müxtəlif saatlarında müxtəlif əhvali-ruhiyyədə ola bilər. Odur ki, Ulu Yaradan ayədə bəndəsinə hörmət əlaməti olaraq bunu nəzərə alaraq “Au rudduə” hökmü ilə salamın cavabının heç vəchlə təxirə salınmamasını buyurur. Bu, az qala, vacibat səviyyəsinə qaldırılır.

İslam səmasının altıncı parlaq ulduzu olan İmam Cəfəri-Sadiqdən gələn aşağıdakı xəbəri bu yöndə qavramalıyıq: “Mərhəmətli olun və din qardaşlarınıza yaxşılıq edin! Bu, gözəl salam verib, salamı gözəl almaqdan ibarət olsa belə”.

Ən nəhayət, ayənin “Allahın hər şeyin, o cümlədən ilk baxışda adi görünən, amma əslində həyatın cövhərini təşkil edən, xoşrəftarlığın bariz əlaməti sayılan salamlaşmanın da hesabını apardığı”nın ayrıca vurğulanması məsələnin Tanrı qatında dəyər verilən çox önəmli bir əməl olduğunu sübuta yetirir.

Bu bilgilərin işığında baxdıqda İmam Hüseynin İmam Zeynəlabidinə ümmətin əməlisaleh adamlarına elə dar macalda belə salamını çatdırmasının islami mahiyyəti daha yaxşı anlaşılır.

**2. <u>“Süləhayi-ümmət”.</u>** Bəllidir ki, İslamı başqa dinlərdən fərqləndirən başlıca cəhət ümmət fəlsəfəsidir. Təfərrüata varmadan deyə bilərik ki, bu fəlsəfənin kökündə etiqad, ibadət və əxlaq birliyindən doğan vəhdət prinsipi durur. Aşağıdakı ilahi bəyanat bu prinsipi hərbi-siyasi baxımdan da əsaslandırmaqdadır: “(Münafiqlər və yəhudilər) hamılıqla sizə qarşı ancaq möhkəm şəhər və kəndlərdə, yaxud divar arxasında (qala içərisində) olarkən döyüşərlər (başqa şəraitdə sizinlə vuruşmağa cürət etməzlər). Onların öz aralarındakı vuruşmaları və düşmənçilikləri isə çox güclüdür. (Ya Peyğəmbər!) Sən onların əlbir olduqlarını güman edirsən.

.................................

[153] *Qurani-Kərim və türkcə açıqlamalı məalı, səh. 90*





Lakin onların qəlbləri dağınıqdır. Buna səbəb onların ağılsız bir qövm olmalarıdır" *("Həşr", 14)*.

Ancaq Füzuli "süləha" – *salehlər* sözünü işlətməklə cəmiyyətin say-seçmə şəxslərini, kamil şəxsiyyətləri bəhs mövzusuna çevirir və bununla da işarə edir ki, saf İslam əqidəsinin nöqsansız həyata keçirilməsi işi büsbütün onların çiynindədir.

**3. İmam Hüseyn "qərib"liyi və "məzlum"luğu.** Doğrudur, hər iki anlayış bəzən istismar olunmuş, malik olduqları həqiqi islami dəyərlər yanlış yönlərə yozulmuş, bəzi işbazların sui-istifadəsinə tuş gəlmişdir. Ancaq birmənalı surətdə bəllidir ki, İmam Hüseynin "süləhayi-ümmət"ə olan "iltimas"ı qətiyyən miskinlik və mistika yox, əksinə, aydın və dəqiq əqidə fədailiyidir, bu fədailik zamanı cəmiyyət tərəfindən tərk edilib tək-tənha, köməksiz buraxılmasıdır. Parçanın sonundakı şeir isə bu səpkili bir çox cəhətləri əhatə edir:

Ey qılanlar arizuyi-abi-Kövsər, dəmbədəm,
Təşnə dünyadan gedən Ali-Rəsuli yad edin.
Macərayi-Kərbəla zikrin qılın şamü səhər,
Təb'iniz, ol zikri-rə'fətbəxşlə mö'tad edin[154].

*(Siz ey Kövsər hovuzunun suyundan içməyi diləyənlər, dünyadan susuz gedən Peyğəmbər balalarını xatırlayın! Səhər-axşam Kərbəla vaqeəsindən deyin, danışın və bununla da ruhunuzu, mənəviyyatınızı o uca dəyərlərlə, o yüksək şərəflə Tanrı qatında önəm verilən ali səviyyəyə qaldırın)*.

Şeirdən bir neçə qənaət ələ gəlir: **1.** "Abi-Kövsər", əslində, "dünyadan təşnə gedən Ali Rəsul"dur; **2.** "Şamü səhər macərayi-Kərbəla zikrin qıl"maq "zikri-rəf´ətbəxş"dir; **3.** Bu, "təb´i mo´tad etmək" üçün ən yaxşı vasitədir.

Birinci qənaət, zənnimizcə, istər ümumi şəkildə, istərsə də ayrı-ayrılıqda Kərbəla vaqeəsi ilə üzvi qovuşuqluqda olduqca dəqiq və kəsərli fikirdir. Çünki "Abi-Kövsər" və "təşnə"

.................................

[154] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.61*





ifadələri, leksik planda "Ali Rəsulin yad edilməsi" isə ideya yönündə şəhidlərin Aşura günündəki ağır susuzluq sınağına yeni baxış gətirir, bunu ümumislam səviyyəsinə yüksəldir. Ötəri deyildir ki, "Kövsər" məfhumu kəlamçıları həmişə düşündürmüşdür. Təfsirçilər ona 26 məna vermişlər. *Cənnətdə hovuz, çay, arx; peyğəmbərlik şərəfi; seyyidlər; müsəlman alimlər* və s.

Hədislərdə bildirildiyinə görə, cənnətdə Kövsər hovuzunun ixtiyarı Həzrət Muhəmmədin (s.) əlində olacaqdır. Gələn bilgilərə əsasən, bəzi şəxslərə o sudan verilmədikcə onlar Rəsulullaha gileylənəcək, o bunun səbəbini soruşduqda isə "Axı sən bilmirsən ki, onlar səndən sonra nələr etdilər, nələr?" deyiləcəkdir.

Bu hədis məlumatları şeirdən ələ gələn qənaəti dini-məfkurəvi baxımdan əsaslandırdığı kimi, bədii-estetik bir ucalığa da yüksəldir ki, bu da Füzuli dühasının bir imamhüseynsevər kimi yaratdığı parlaq bir obrazlılıqdır.

İkinci qənaət isə iki ayənin eyni ölçü ilə dərki yönündə daha yaxşı anlaşılır.

İnsanın elə bir dövrü olub keçmişdir ki, o, xatırlanmağa layiq bir şey olmamışdır (Yaxud insanın elə bir dövrü olub keçmişdirmi ki, həmin dövrdə xatırlanası bir şey olmasın? Əlbəttə olmuşdur. İnsan əvvəlcə mövcud deyildi. Sonra o, yəni ulu babamız Adəm torpaqdan və sudan yoğrulub insan şəklinə salınmış, ona ruh verilmiş və o, həyat sürməyə başlamışdır. İnsanın nə üçün yaradıldığını əvvəlcə nə göy əhli, nə də o özü bilirdi. Tədriclə mələklər və o özü nə üçün yaradıldığını anladı) *("Dəhr", 1)*.

"Həqiqətən sizə (Qureyş əhlinə) elə bir Kitab nazil etdik ki, o, sizdən ötrü bir şərəfdir (O, sizin qədir-qiymətinizi yüksəldər, dini və dünyəvi ehtiyaclarınızı aradan qaldırar, ürəkdən inananlara behişt yolunu göstərər). Məgər dərk etmirsiniz?" *("Ənbiya", 10)*.

İlahiyyatşünaslar ayələrdəki "məzkur" və "zikrikun" sözlərinə və onlardan birincisinin sual və ikincisinin nida cümləsi olmasına söykənərək ikincisindəki fikri birincisində





toxunulan məsələnin həlli hesab edirlər, əgər biz də bu yolla getsək, ikinci qənaətin birinci qənaəti əsaslı surətdə bitkinləşdirərək tamamladığını görərik. Yəni görərik ki, mütəmadi surətdə Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının ictimai-tarixi nəticələri və təzahürləri haqqında düşünüb onları real həyata tətbiq etmək bütövlükdə bəşəriyyət üçün böyük şərəfdir.

Üçüncü qənaət daha çox psixoloji əhvali-ruhiyyə üzərində köklənmişdir. Çünki Füzuli "Təb´iniz, ol zikri-rə'fətbəxş ilə mö´tad edin!" dedikdə, ilk növbədə ən yüksək insani keyfiyyətlər aşılayan Kərbəla vaqeəsini, onun doğurduğu kövrək duyğuları, gətirdiyi dərin mərhəmət hissini gündəlik olaraq həyatın bir parçasına çevirib Aşura dərslərini bir an belə unutmamağı nəzərdə tutur. Deməli, şair Yaqub–Yusif əhvalatının lirik təbiətinə aldanmamış, bu lirikanın potensial resurslarını məharətlə Kərbəla vaqeəsinə tətbiq edə bilmişdir.

* * *

Hissənin Kərbəla vaqeəsi ilə bağlı beşinci cəhəti "göz yaşı" motividir. Əsərdə oxuyuruq: "Yə'qubun abi-çeşmi-əşkbarı bir mərtəbədə rüxsəti cərəyan buldu ki, səvadi-mərdümi-çeşmin bəyazi-didədən məhv qıldı, netəkim, "Səhihi-Tənzil" andan xəbər verür: "Və´bəyəzzət əynahu min-əlhuzni".

Nəqldir ki, Həzrəti-İmam Zeynəlabidin vaqieyi-Kərbəladan sonra həmişə giryan idi, iltimas etdilər ki: "Ya İmami-zəman, kəsrəti-büka ilə iqdam etmə, səbr et. Ol həzrət buyurdu ki: "Ey əzizlər, bəni mə´zur dutun". Şe´r:

Bir oğlundan cüda düşmüşdü Yə'qub,
Hücumi-giryə qılmışdı gözün kur.
Əcəbmi giryə qılsam mən, ki düşdüm
Neçə Yusuf kibi mə'sumdən dur.

Həzrəti-Yə'qub peyğəmbəri-mürsəldi, on iki oğlundan biri qayib oldu və qayibin dəxi vüsalinə rica hasil ikən ol





qədər ağladı ki, nöqteyi-səvadi-didəsin tiği-seyli-sirişk hək qıldı: "Bən ki validi-büzürgüvarım və ə'mami-alimiqdarım və ixvani-bülənd iqtidarım hüzurumda şəhadət buldular və biümmidi-müraciət aləmi-bəqayə təvəccöh qıldılar, giryə qılsam əcəbmidir?"

Bənim halım nə bilsin olmayan möhnət giriftarı,
Bəla azürdəsi, qürbət pərişanı, qəm əfgarı?[155]

*(Yaqubun yaş axıdan gözlərindən qaynayan su o qədər çoxaldı ki, bəbəyinin qarası göz ağında görünməz oldu. Ötəri deyildir ki, Qurani-Kərim bütün aydınlığı ilə bildirir ki, "Kədərdən gözlərinə ağ gəldi" ("Yusif", 84).*

*Deyilənlərə görə, Kərbəla vaqeəsindən sonra Həzrət İmam Zeynəlabidin həmişə ağlar halda olardı. O, xahiş etdi ki, "Ey mənim əzizlərim, məni üzrlü bilin, çünki Yaqub yalnız bir oğlundan ayrı düşmüşdü. Buna baxmayaraq, ağlamağın çoxluğu gözünü kor etmişdi. Bəs neçə-neçə Yusif kimi pak-pakizə əzizimdən uzaq düşdüyüm halda mənim ağlamağım necə qəribə görünə bilər?*

*Yaqub həzrətləri mürsəl peyğəmbər idi. On iki oğlunun təkcə biri itmişdi. O itənin də tapılmasına güman çox idi. Ancaq o, buna baxmayaraq, o qədər ağlamışdı ki, göz yaşının qılınc kimi iti axan seli bəbəyinin qarasını apardı. Mənim ki böyük atam, şan-şövkətli imamım, bacarıqlı qardaşım birər-birər gözlərimin qabağında şəhid edildilər və mənə ümid bəsləməyə-bəsləməyə əbədi axirət dünyasına köçdülər, ağlasam, qəribəmidir? Dərddən-kədərdən xəbərsiz olanlar mənim hansı halda olduğumu necə bilə bilərlər axı?! Bunu ancaq bəla xəstəsi, qürbət didərgini, qəm, ələm hədəfinə çevrilən bilər!").*

Füzuli burada yaradıcı davranaraq Yaqub–Yusif xəttindəki ata-oğulluğu İmam Zeynəlabidin–İmam Hüseyn xəttindəki oğulluq və atalıqla əvəz etmişdir. Bu zaman o, bir az da irəli

.................................

155 *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.62-63*





gedərək İmam Zeynəlabidini bütün Kərbəla şəhidlərinin, xüsusən də Əhli-beyt igidlərinin varisi, ardıcılı və təəssübkeşi kimi təqdim etmişdir. Şair bu yaradıcı davranışını əsaslandırmaq üçün Quran ayəsini vasitə etmişdir ki, bu da nəinki Füzuli irsi üçün, bütövlükdə orta əsr Şərq ədəbiyyatı üçün novatorluqdur.

Füzulinin bu yöndə üz tutduğu ikinci üsul 12 rəqəmidir. Belə ki, 12 oğlundan yalnız birini itirən Yaqub 12 imamdan biri olan Zeynəlabidin həzrətlərinin gözündə bir elə də kədər rəmzinə çevrilmir. Axı onun üzləşdiyi qəm-kədər Yaqubun başına gələnlərlə müqayisədə çox böyükdür. İmam Zeynəlabidinin sözlərinin nəsrlə də, nəzmlə də verilməsi, mütəmadi təsvir və tərənnüm ardıcıllığı fonunda çatdırılması məhz belə uca yaradıcılıq istəyindən irəli gəlir.

Parçanın alt qatında məşhur "Yusife-qomkərde" – "itkin Yusif" obrazı da boy göstərir. Bu isə Kərbəla vaqeəsinə tətbiq edildikdə min bir əzab-əziyyətlə məhv edilən İmam Hüseynə qarşı amansız cəmiyyətin boğucu təzyiqinə edilən istehzadır.

Parçanın bədii-estetik gözəlliyi şeirlərin birgə dərkində daha tez üzə çıxır. Belə ki, birinci şeir Yaqub–Yusif əhvalatına söykəndiyi halda, ikinci şeir bütünlüklə İmam Zeynəlabidinin duyğu dünyası üzərində qurulmuşdur. Bu, bir yandan Yaqub–Yusif qissəsini bitkinləşdirirsə, o biri yandan əsərin, əslində, "İmam Hüseyn" elegiyası olmasına işarə kimi qavranılır.

* * *

Əhvalatın Kərbəla vaqeəsi ilə altıncı əlaqəsi mətnin poeziyasız olması ilə seçilir. Belə ki, Füzuli Yusifin kölə edilərək Misirə aparılarkən "Məqabiri-ali-İshaq" kənarından keçdikdə "Validəsi məzarin görüb" özünü dəvənin üzərindən yerə atmasını, səhərədək anasının məzarı üstə qalıb ağlayıb-sızlamasını, düşdüyü vəziyyətdən gileylənməsini geniş təsvir etdikdən sonra belə bir haşiyə çıxır: "Ey əziz, (Ay mənim istəkli imamhüseynsevər oxucum – **V.A.**), Yusuf məzari-madər (anasının qəbrini) görüb fəğan etdikdə böylə müəssir oldu. Mə´lumdür ki, müxəddərati-hicreyi-risalət (peyğəmbərlik





evinin yaxınları – **V.A.**) və xəvatini-sərapərdeyi-nübüvvət (əslində, yad gözlərdən gizli qalmalı olan Əhli-beyt xanımları – **V.A.**) və əytami-əslabü vilayət (yetim qalmış Əli övladları – **V.A.**) dəşti-Kərbəlada bədənsiz başları və başsız bədənləri görüb növhə qıldıqda nə əsər verüb"[156].

Hər şeydən öncə qeyd edilməlidir ki, "ey əziz" xitabı müəllifin birbaşa oxucuya müraciətidir. Odur ki, bu müraciət hər baxışdan publisistik təsir bağışlayır. Ancaq "xatimə"nin (sonluğun) müvafiq hissəsində burada oçerk çılpaqlığı ilə edilmiş müraciətin geniş təsvirlərinə rast gəldikdə həmin publisistik ton olduqca təsirli bir bədiiliyə çevrilmiş olur.

Əhli-beyt xanımlarının Kərbəla vaqeəsindən sonra Mədinədə Rəsulullahın mübarək qəbri üzərindəki vay-şivəni Yaqub–Yusif əhvalatındakı qeydin daha geniş bədii dərki kimi başa düşülür: "Rəvayətdir ki, Əhli-beyt öz çöhrələrindən səfər tozunu silməmiş və istirahət etmədən birbaşa Həzrət Rəsulun qəbrinin üstünə getdilər və salamdan sonra ərz elədilər ki, ya cəddah, biz Kərbəla səhrasının sərgərdanlarıyıq, qürbət diyarın pərişanlarıyıq.

Ya Rəsulullah, biyabani-bəla səyyahıyız,
Gəlmişiz dərgahivə zarü diləfgaru-həzin!
Şəm´i-nüzhətgahimiz badi-fənadən fövt olub,
Həmdəm olmuşdur bizə nirani-ahi-atəşin!
Rəxtimiz seylabə getmiş, mülkimiz olmuş xərab,
Halimiz olmuş mükəddər, könlümüz ənduhigin!"

*(Ey Tanrı elçisi, biz bəla səhrasının yolçularıyıq. Həzin bir ürək çırpıntıları və ağlar vəziyyətdə sənin qapına gəlmişik. Bu puç dünyada səninlə bağlı sonuncu yer bildiyimiz mübarək məzarına pənah gətirmişik. Heçlik küləyi şəm məclisimizin şamını söndürmüş və odlu ah cəhənnəmi bizim yol yoldaşımıza çevrilmişdir. İndi biz nə edək, neyləyək ki, taleyimizi sel-su ağzına alıb aparmış və şan-şövkətli əsil-nəsəb evimiz xaraba*

[156] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.65*





*qalmışdır. Vəziyyətimiz kədərlidən də kədərli, könlümüz qəmlidən də qəmli olmuşdur).*

“Əhli-beyt xanımları növhə dedikləri zaman birdən Həzrət Peyğəmbərin zövcəsi Ümm Sələmə saçları pərişan halda gəldi. Onun əlindəki şüşə qabda qana dönmüş Kərbəla torpağı vardı. Əhli-beyt xanımları Ümm Sələməni görən kimi elə bir yanıqlı növhə ilə fəğan etdilər ki, səma təbəqələrinin sükançıları sübheyi-ibadətlərini buraxıb, bu məclisə heyran qaldılar və ülya ibadətxanasının abidləri öz virdlərini unudub onların əzasına qoşuldular”[157].

Göründüyü kimi, bu təsvirlər Yaqub–Yusif əhvalatındakı “nə əsər verir?” (gör necə təsir edir!) şəklindəki sual-qeydi əyani surətdə tamamlayır.

Ən nəhayət, deyilməmiş qalmasın ki, əsərin başlanğıcı ilə sonu arasındakı bu uyarlıq mövzuya səriştəli müəllif baxışını göstərməklə yanaşı, qəbir ziyarəti və müqəddəslərin zəvvarı olmaq baxımından da bir xeyli önəmə malikdir.

* * *

Şair əhvalatın sonunda yenidən Kərbəla vaqeəsinin üzərinə qayıdır və geniş bir bədii yekun səhnəsi yaradır. Əsərdə Yaqubun Yusif üçün etdiyi duadan dərhal sonra oxuyuruq: “Allah, Allah! Nə xoş münasibdür Yusufun cəfalar görüb və bəndü zindana düşüb, Yə’quba irsali-peyğam etdügi şəhidi-Kərbəlanın cəfayi-qövmdən tə’ərrüz bulub dəşti-Kərbəlada möhnətlərə giriftar olduqda rövzeyi-Rəsulullaha ərzi-hal etdiginə. Zəhi, təhəmmül ki, ixvanü əqarib bir-bir müqabilində şərbəti-şəhadət içüb, kəndü tənha qaldıqda mütəzəlzil olmadı və təğəyyür bulmadı”.

Dərda ki əhli-danişü idrak getdilər,
Məcruhü dilşikəstəvü qəmnak getdilər.
Alayişi-zəxarifə aludə olmayub,
Dünyaya pak gəldilərü pak getdülər[158].

.................................

[157] *Füzuli. Kərbəla vaqiəsi, səh.173-174*

[158] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.70*





*(Allah, Allah! Yusifin əzab-əziyyətlərə tuş gələrək və zindana düşərək Yaquba sifariş göndərməsi Kərbəla şəhidinin öz xalqından zülm və haqsızlıq görüb Kərbəla düzündə sonsuz bəlalər çəkdikdə Rəsulullahın mübarək məzarına dərdini söyləməsi ilə necə də uyğundur. Sən bir dəyanətin zirvəsini gör ki, qardaşları, yaxınları birər-birər gözləri önündə şəhidlik şərbətini içdikləri və özü tək-tənha qaldığı zaman belə əsla həyəcanlanmadı və halında bir dəyişiklik olmadı.*

*"Faciə bundadır ki, bəşəriyyətin Kərbəlada itirdiyi şəxsiyyətlərin hamısı ilahi mərifətdə ən yüksək məqama çatmış böyük dərrakə sahibləri idi. Ancaq sən dövrün haqsızlığını gör ki, onlar yaralı, ürəyisınıq və qəmli bir halda məhv edildilər. Bununla belə, onlar qətiyyən dünyanın maddiyyat toz-torpağına bulaşmadan dünyaya pak-pakizə gəldikləri kimi, pak-pakizə də dünyadan getdilər!").*

Mətn bir neçə cəhətdən diqqəti çəkir:

**1. <u>"Allah, Allah!" nidası.</u>** Büsbütün hiss-həyəcan poeziyası olan Füzuli lirikasında nidalar geniş yer tutur. Bu nida isə İslam dininin Azərbaycan türklərinin ruhuna hopmasından, Ulu Yaradanın "Ləfzu-l-Cəlalə" deyilən mübarək adının xəlqi-mədəni və milli-mənəvi kimliyimizdə əks-səda verməsindən söz açır. Ötəri deyildir ki, Füzuli də yaradıcılığının çeşidli qatlarında bu nidaya üz tutmuşdur:

Büti-növrəsim nəmazə şəbü ruz rağib olmuş,
Bu nə dindir, Allah, Allah, bütə səcdə vacib olmuş?!
Cövri-könlümdür çəkən, gözdür görən rüxsarini,
Allah, Allah, kam alan kimdir, çəkən kimdir təəb!

Araşdırdığımız bölümün yuxarıdakı yerlərindən birində qarşılaşdığımız "Allah, Allah!" nidası şairin farsca divanının "Dibaçə"sində də işlənir: "Allah, Allah! Mənalar necə bir xəzinədir ki, xilqətin əvvəlindən bəri istər şəriətə tabe olanlar,



istərsə də həvavü-həvəs sahibləri bir-birinə əks olan məzhəb və görüşlərin doğru və yanlış hökmlərini ifadə etmək üçün onları sərf edirlər, yenə də pozulub əskilmir, kəlam (söz) necə bir nazik sapdır ki, bu xəzinənin dürləri dənə-dənə bu sapa elə bir nizamla düzülmüşdür ki, heç bir məna onsuz surət ala bilmir"[159].

Burada isə nida "necə də yerinə düşmüşdür", "zəhi, təhəmmül ki" kimi yaradıcı vasitələrlə bir qədər də qüvvətləndirilərək, bədii təsir gücünün zirvəsinə yüksəldilmişdir.

**2. <u>"Yusifin Yaqubə irsali peyğam"ı "şəhidi-Kərbəlanın rövzeyi-Rəsulullaha ərzi-halı"</u>**. İlk baxışdan da duyulur ki, Füzulinin gözündə Həzrət Muhəmmədin (s) mübarək məzarı Yaqub Peyğəmbərin həyatda olduğu illərdən daha üstündür. Əlbəttə, burada hər hansı bir yad fəlsəfi məzmun, yabançı dini məna axtarmaq əbəsdir. Çünki şair bu zaman İslam rəhbərinin mübarək məzarına İmam Hüseynin gözü ilə baxmış, onu onun baxışı ilə dəyərləndirmişdir. Burada istər-istəməz Mədinədən çıxarkən İmam Hüseynin Peyğəmbərin məzarı üzərinə gəlib onunla vidalaşma səhnəsi yada düşür. İmam onu dünyalar qədər sevən babası Həzrət Muhəmmədə (s) dövrün zalımlarından belə gileylənir:

Ya Rəsulullah, bənəm kami-dili-Zəhra, Hüseyn,
Yüz sürüb dərgahinə gəldim diləfkarü həzin.
Ol bənəm ki, ümmətin hifzini əmr etdin bana,
Ol bənəm ki, gənci-əsrarə bəni qıldın əmin.
Ümməti-zalim bana izhari-bidad etdilər,
Bikəsəm, biçarəyəm, sənsən bana ancaq müin!

*(Ey Tanrının elçisi, Zəhra könlünün istəyi olan Hüseyn mənəm. Mən ürəyi sındırılmış və qəmgin bir halda mübarək məzarının üstünə gəlmişəm, sənin qəbrinin müqəddəs torpağına üz sürtürəm. Mən ümmətinin vəhdətini qorumağı tapşırdığın ilahi sirlər xəzinəsini açdığın kimsəyəm. Ancaq səndən sonra sənin o zülmkar ümmətinin bir çox azğın*

.................................

[159] *Füzuli. Əsərləri, III cild, Bakı, 1958, səh. 13*





*idarəedariciləri mənə açıq-aşkar zülm etdilər. Odur ki, adamsız və köməksizəm, çarəsizəm. Yeganə yardım gözlədiyim yer yalnız sənin uca peyğəmbərlik məqamındır).*

**3. Səbirlilik**. Mətndə *təhəmmül, mütəzəlzil, təhəyyür* sözlərində əksini tapan bu anlayış sırf islami məzmuna malikdir. Bu, əsərin hər bir babında özünü göstərir. Odur ki, burada da səbirliliyin geniş yer tutması təbiidir. Anlayışın buradakı özünəməxsusluğunu isə onun Əhli-beyt və şəhidliklə bağlılığı təşkil edir.

Şeirin ikinci beyti isə İmam Hüseynlə yanaşı, digər Kərbəla şəhidlərinin də misilsiz dəyanətindən soraq verir. Ötəri deyildir ki, Füzuli bu dönməzliyi "alayişi-zəxarifə aludə olma"maq və "dünyayə pak gəlib, pak getmək" kimi parlaq bir obrazlılıqla təqdim edir.

Füzuli fəsli İmam Hüseynlə bağlı başladığı kimi, İmam Hüseynlə bağlı da bitirir: "Rəvayətdir ki, Hüseyni-məzlum ixvanü əqaribdən sonra tənha qalub münacat etdi ki: "Ya Rəbb! Misra: "Zarü tənha qalmışam, yarü diyarımdan cüda".

Əhli-beyti-risalət şahzadənin bikəsligin görüb, fəğanə gəlüb, bir tərəfdən bənati-mütəhərrat giriban çak edüb və bir tərəfdən üxüvvati-salihat xuni-cigər birlə nəmnak edüb və bir tərəfdən Həzrəti-İmam-Zeynəlabidin sədayi-fəğanın mütəvəccihi-əflak edüb, qülqüleyi-müsibət bir qayətə yetmişdi ki, fələki-birəhmin ol halətə rəhmi gəlüb, şiddəti-möhnət dövri-zalimi ol məzlumların halına mütəhəyyir etmişdi.

Bənzəməz Yusufun əhvalına əhvalı-Hüseyn,
Nişə kim Yusuf olub bəsteyi-zənciri-mihən.
Düşdü zəncirə, vəli qılmadı zəncirsifət,
Tiri-bidadi-ədu cismini rövzən-rövzən".[160]

*(Rəvayətə görə, məzlum Hüseyn qardaş və yaxın qohumlarının şəhadətindən sonra tənha qaldı və Allaha yalvardı ki, ya Rəbb, dostlarımdan və yurdumdan ayrı düşmüşəm, ağlar və tək-tənha qalmışam!*

.................................

[160] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.70*





*Peyğəmbər Əhli-beyti şahzadənin köməksizliyini görüb ahnalə çəkməyə başladı. Bir tərəfdə Peyğəmbər xanədanının pakpakizə qız-gəlini yaxa yırtır, bir tərəfdə əməlisaleh qardaşlar ciyər qanlarını göz yaşlarına qataraq gözlərindən durmadan sel-su axıdır, bir tərəfdə də İmam Zeynəlabidin həzrətləri ağlamaq səsini fələklərə qaldırmışdı. Müsibətin miqyası bir dərəcəyə çatmışdı ki, rəhmsiz fələk belə o hala acıyaraq, qəmkədərin çoxluğundan zülmkar dövrana, o məzlumun düşdüyü vəziyyətin ağırlığına heyrət edirdi).*

*(Hüseynin vəziyyəti əsla Yusifin vəziyyətinə bənzəməz, çünki Yusif zəncirlənsə də, bu zəncir yalnız vətən ayrılığı, qəriblik zənciri idi. Ancaq düşmənin zülm oxları heç vəchlə onun bədənini zəncir kimi pəncərə-pəncərə etməmişdi).*

Fəsil Tanrıya yalvarışın çoxluğu ilə seçilir. Özü də "münacat" adlanan bu yalvarışların çoxu Yusif Peyğəmbərin dilindən verilir. Odur ki, fəslin sonunda İmam Hüseynin münacatına yer ayrılması şairin ədəbi ustalığı ilə yanaşı, müqəddəslər arasındakı vəzifə vəhdətini nəzərə çarpdırmasının da orijinal dəlil-sübutudur. Bəllidir ki, bilavasitə İmam Hüseyndən danışan 7-ci, 10-cu bablarda bu ulu din böyüyünün dəfələrlə Tanrıya yalvarıb-yaxardığını görürük. Odur ki, burada "münacat" sözünə dair yığcam bilgi vermək yerinə düşərdi.

* * *

Söz sənəti istər özünün zahiri əlamətləri ilə, istərsə də batini keyfiyyətləri baxımından bu anın, yalvarışın, münacatın ifadəçisidir. Başqa cür deyilsə, dua, yalvarış, münacat və razü niyaz söz sənətinin boyuna biçilib. Hansı dildə yaradılmasından, kimin qələmindən çıxmasından asılı olmayaraq, dəruni duyğu və düşüncələr özünün zirvə nöqtəsinə çatdıqda bir dərəcədə dua, münacat, yalvarış məzmunu alır, razü niyaz səciyyəsi qazanır. Odur ki, söz, sənət böyüklərimizin irilixırdalı, nəzmli-nəsrli hər bir əsərində bir dua nişanəsi, bir münacat ünsürü, bir yalvarış tonu, bir razü niyaz ruhu duyulur. "Lisanü-l-qeyb" ("İlahi qeybin dili") adlandırılan Hafiz Şirazi:





Hafiza, dər konce fəqro xəlvəte-şəbhaye-tar
Ta bovəd virdət duavo dərse-Quran, qəm məxor!

*(Ey Hafiz, əgər Allah qarşısında duyduğun fəqirlik küncündə və ilahi xofla keçirdiyin qaranlıq gecələrin xəlvətində sənin durmadan təkrarlanan sözlərin, dilinin əzbəri duadan və Quran dərsindən (Qurandan aldığın ibrətlərdən) ibarət olsa, qətiyyən kədərlənmə, heç bir qəm-qüssə çəkmə) deyirsə, bu, ilk növbədə duanın yalnız quru ibadi təmrin olmayıb, həyatın, yaşayışın canlı, diri, duru bir parçası olmasının danılmaz dəlilidir).*

Yaxud Şeyx Nizami "Həft peykər"də ("Yeddi gözəl"):

Şəb şəbe-qədr, vəqt vəqte-duast,
Yaf, xahi, hər an çe xahiyaft! –

"Gecə – Qədr gecəsi, vaxt – duaetmə vaxtıdır. İstəyini Yaradandan almağa çalış ki, nə əldə eləsən, bu gecə əldə edəcəksən" dedikdə, Qədr gecələrinin zahiri oyaqlığından çox batini ehyasını, mənəvi dirçəlişini göz önündə tuturdu.

Qədim ərəb dilində "nəcəva" köklü sözlər əsasən iki istiqamətdə inkişaf etmişdir. Birinci istiqaməti *nədənsə qurtulmaq; tez olmaq; qurtarmaq; dərini üzmək; yüksək yerə çıxmaq; kimi isə yüksək yerdə, çöllükdə tərk edib getmək* kimi ən müxtəlifmənalı sözlər təşkil edir. İkinci istiqamət isə *birinə astaca söz demək; sözü sirr kimi demək; qarşılıqlı surətdə bir-biri ilə astaca danışmaq (pıçıldaşmaq)* səpkili mənalardan ibarətdir. Hər iki qrupu birləşdirən sözlər (məs.: "nəccəhü-l-lah" – *Allahın kimisə xilas etməsi;* "ən-nəciyyu" – *sirdaş;* "munəccin" – *xilaskar;* "münəcətu-l-insani-linəfsihi" – *öz-özünə danışmaq*). İslam dini bərqərar olduqdan sonra tədricən ümumi bir məna-məzmun qovşağı törətmiş və beləliklə də sözün dini-ədəbi çalarlara malik yeni istilahi yozumu



ortaya çıxmışdır. Belə ki, orta yüzilliklər Şərq ədəbiyyatında çox işlənən və geniş yayılan "münacat" adlı bir ədəbi janr formalaşmışdır.

"Münacat" bir dini-ədəbi anlayış kimi Tanrıya üz tutularaq yazılan, dua və yalvarış üzərində qurulan bədii nümunələri bildirir. "Münacatların başlıca mövzusu budur: Allah ən böyük güc, qüvvət, qüdrət və əzəmət sahibidir. Bunun əksinə, bəndələr çarəsiz, kiçik və olduqca acizdirlər. Belədə bəndələrin hər bir işdə Allaha yalvarmaları və dua etmələri qaçılmazdır"[161].

"Müxtəsər türki divanı"ndakı münacatlar Füzulinin bu şeir növünün də böyük ustası olduğunu, uca məqsəd və fikirlərini bu janrda da yüksək sənətkarlıqla ifadə etdiyini göstərir. Tövhidin bədii fəlsəfə açımı, Allahın elmlilik, əbədilik, qəzəblilik, mərhəmətlilik səciyyələrinin tərənnümü Tanrı Zatı, Tanrı işi, axirətin bu dünyadan üstünlüyü, hər şeyin Allahdan olması, Tanrı qüdrəti və ilahi hikmət anlayışlarının təbiət, cəmiyyət və təfəkkür üzərində çoxyönlü mənalandırılması, qəzəl, qitə, rübai, qəsidə şəklində yazılmış Füzuli münacatlarının başlıca mövzu, məzmun və ideya cizgiləridir. Bütün bunları yüksək bədiiliklə vermək üçün şair bənzətmə, istiarə, təlmih, təzad, şişirtmə, şəxsləndirmə və başqa bu kimi bədii ifadə vasitələrindən yararlanmış, yeri gəldikcə xəlqi-mədəni qaynaqlara üz tutmuşdur. Odur ki, Füzulinin münacat irsi ideya-bədii baxımdan dünya ədəbiyyatının uzunömürlü örnəkləri sırasındadır.

* * *

Parçanın ikinci orijinal cəhəti Aşura gününün fəci anlarının sonuna ayrıca diqqət yetirilməsi, bunun xüsusi rəğbət hissi və əlvan boyalarla təsvir və tərənnümüdür, belə ki, şair təsvirə "Əhli-beyti risalət"dən başlayır. O bu zaman əlləri qoynunda qalan Peyğəmbər xanədanının qız-gəlininin

.................................

[161] *Türk dili və ədəbiyyatı ensiklopedisi, 6 cilddə, VI cild, İstanbul, 1986, səh. 468*





acınacaqlı durumunu, xislətcə, əxlaqca yüksək mərtəbəyə ucalmasına baxmayaraq, əməlisaleh şəxslərin öz əllərindən bir iş gəlmədiklərini görmələrindən duyduqları təəssüf hisslərini, ən nəhayət, İmam Zeynəlabidinin təsəvvürəgəlməz həyəcanını miqyas genişliyi baxımından ən uca nöqtəyə – ümumkainat səviyyəsinə qaldırır və bütövlükdə kosmogen bir mənzərə yaradır. Ancaq fəsli bitirən şeirdə sözü yenidən Yusif Peyğəmbərin üzərinə gətirməsi şairin gözündə Yaqub–Yusif qissəsinin də, Kərbəla vaqeəsinin də ilk növbədə insan əməlinin, cəmiyyət hadisələrinin, ictimai proseslərin subyektiv təzahürü olduğunu, bütün bunların daha çox mənəviyyatsızlıqdan, imansızlıqdan, ictimai eybəcərliklərdən irəli gəldiyini sübuta yetirir.

## İmam Hüseyn və Zəkəriyya–Yəhya peyğəmbərlər

İmam Hüseyn və Zəkəriyya–Yəhya peyğəmbərlər

“Fəsli-ibtilayi-Zəkəriyya və Yəhya əleyhiməssəlam” (“Zəkəriyya və Yəhya salam olmuşların başlarına gələn bəlalardan danışan fəsil”) başlıqlı bölümün Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı ilə əlaqəsi bir xeyli fərqli şəkildədir. Belə ki, bu əlaqə “Nuh Nəbi bölümü”ndə birbaşa səciyyə daşıyırdısa, burada dolayılı olub, nisbətən alt qatda gözə dəyir. Din tarixinə az-çox bələd olanlar yaxşı bilirlər ki, ata-oğul olan bu iki peyğəmbərin ikisi də şəhid edilmişdir. Bu isə onların qissələrinin Kərbəla vaqeəsi ilə təşkil etdiyi ilkin bənzərlikdir. İkinci belə oxşarlıq ata-oğulluq baxımındandır; belə ki, Yəhya atasının gözləri qarşısında qətlə yetirildiyi kimi, Əliəkbər də İmam Hüseyndən öncə şəhid edilmişdir.

Doğrudur, Füzuli bu bənzərlikləri qabartmır, ancaq bölümün ümumi məzmunundan bu, dərhal duyulur. “Zəkəriyya və Yəhya qissəsi”nin Kərbəla vaqeəsi ilə əlaqəsinin nisbətən üzdə olan əlaqəsinə bölümün xanım Fatimeyi-Zəhranın Qiyamət günündəki dözülməz kədərinin təsviri və tərənnümü yerində rast gəlirk: “Nəqldir ki, ruzi-Qiyamət iki



növbət nidayi-amm edələr, bir növbət Yəhya üçün bu ibarətlə ki: "Ey əhli-məhşər, nəzzarə qılun bu bəndeyi-mə'suma ki, hərgiz əndişeyi-xəta zəmirinə yetməmişdir və mütləq ləzzati-dünyəvi təsərrüf etməmişdir". Cəmi'i-aləm göz açdıqda Yəhyayi-mə'sumə müşahidə qılalar və günahkarlar şərmsar olalar. Və bir növbət dəxi Fatimeyi-Zəhra üçün nida qılalar bu ibarətlə ki: "Ey mə'şəri-bəşər, "Əzzü əbsarəkum", yə'ni ey bəni-Adəm, göz yumun ki, Fatimeyi-Zəhra gəlür". Nəqldir ki, Fatimeyi-Zəhra ərəsati-Məhşərə bir növ'lə güzar edə ki, heç nazirin qüdrəti-nəzzarəsi olmuya və heç kim müşahidəsinə qüdrət bulmaya; kətfi-yəminində pirahəni-zəhraludi-Həsəni-Müctəba və kətfi-yəsarində cameyi-pürxuni-şəhidi-Kərbəla və kəfi-mübarəkində əmmameyi-xunini-Əliyyi-Murtəza qayəti-təzərrö' ilə daməni-ərş dutub təzəllüm göstərə ki: "Ya Rəbb, fəryadıma yet". Cəbrail Həzrəti-Seyyidi-Kainatə xəbər yetürə ki: "Ya Rəsulullah, Xatuni-Qiyamət daməni-ərşə əl urubdur və təzəllüm edüb, bargahi-ədalət dərgahında durubdur; vəqtdir ki, sərsəri-ahi-can güdazından dəryayi-qəhri-İlahi təməvvücə gələ və aləmi qərqeyi-tufani-qəzəb qıla. Həzrəti-Seyyid iste'cal ilə ərş əyağına gəlüb Fatimeyi-Zəhraya nəsihət qıla ki: "Ey nuri-didə və ey arami-dili-qəmdidə, bu gün ruzi-müavinətdir, vəqti-müxasimət degil və zəmani-riayətdir, əyyami-şikayət degil. Sən Həsənin pirahəni-zəhralud və Hüseynin cameyi-pürxunun ələ alub, bən gisuyi-qübaraludəmi açub dua qılalım və ümməti-günahkarlara şəfi' olalım ki, Ərhəmür-rahimin əhli-isyanə rəhmət qıla. Xüsusən ol kimsənələrə ki, məzlumlarımız müsibətində və şəhidlərimiz tə'ziyətində didələrin giryan və sinələrin büryan etmişlər və qayibanə övladımız əzasın dutmuşlar"[162].

*(Nəql edildiyinə görə, Qiyamət günündə iki dəfə çağırış olar. Bunların biri Yəhya üçün olar. Həmin çağırışın məzmunu belədir: "Ey məhşər əhli, bu məsum bəndəyə baxın ki, hələ də qəlbindən günah etməyi keçirməmişdir və heç vaxt dünyəvi*

.................................

[162] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.76-77*





*ləzzətlərdən faydalanmamışdır". Bütün insanlar bir anlığa diqqət kəsilərək məsum Yəhyaya baxarlar və günahkarlar xəcalət çəkərlər.*

*O gün eşidiləcək ikinci ümumi çağırış Fatimeyi-Zəhra üçün dilə gətirilər. Həmin çağırışın məzmunu isə bu cürdür: "Ey bəşər övladları, yumun gözlərinizi!"*

*Deyirlər ki, Fatimeyi-Zəhra məhşər səhrasına heç bir kimsənin baxmağa taqət gətirmədiyi bir vəziyyətdə daxil olar, gələr; belə ki, onun sağ çiynində Kərbəla şəhidinin (İmam Hüseynin) qana batmış köynəyi, sol çiynində Həsəni-Müctəbanın (pak, saf İmam Həsənin) zəhərə batmış köynəyi, mübarək əllərində də Mürtəza Əlinin qanlı əmmaməsi olar. O, son dərəcə incik və çılğın yalvarışlarla ərşin ətəyindən yapışıb, özünün bütün məzlumiyyətini verər və "Ya Rəbb, özün fəryadıma yet!" deyə ah-nalə edər. Cəbrayıl kainatın ağası olan Həzrət Rəsulullaha xəbər aparar ki, ya Rəsulullah, Qiyamət xanımı Allahın ərşinə doğru əl açıbdır və özünün bütün məzlumiyyətilə ədalət sarayının qapısı önündə dayanıbdır. Az qalıb onun canyaxıcı ahının təsiri nəticəsində Allahın qəzəb dənizi ləpələnsin və dünyanı qəzəb tufanı bürüsün".*

*Həzrət Seyyid (Peyğəmbər) sürətlə ərşin aşağı tərəfinə gələr, Fatimeyi-Zəhraya nəsihət verər ki, sən ey gözümün işığı, sən ey qəmli ürəyimin (yeganə) təsəllisi və təskinliyi, bu gün yardımetmə günüdür, nifrətbildirmə çağı deyil! Bu gün qoruyub, köməklik göstərmə zamanıdır, şikayətetmə günləri deyil! Sən Həsənin zəhərə batmış köynəyini və Hüseynin qanlı köynəyini ələ götürərək, mən toza-torpağa bulaşmış saçlarımı açaraq dua edək və günahkar, suçlu ümmət üçün şəfaətçi olaq ki, bəlkə Rəhimlilərin Rəhimlisi (Allah) yoldan azmış kimsələrə mərhəmət göstərsin; xüsusən o kimsələrə ki, onlar bizim məzlumlarımızın başına gətirilən müsibət və fəlakətlərdən ötrü şəhidlərimiz üçün yas saxlayaraq gözlərindən yaş axıtmışlar və ürəklərini yandırmışlar, beləliklə də övladlarımızı –*



*Əhli-beyti üzbəsurət görməyə-görməyə onlara həmişə qəlb səmimiyyətilə matəm saxlamışlar).*

Göründüyü kimi, şair Zəkəriyya və Yəhya qissəsini Kərbəla vaqeəsi ilə məsumluq məfhumunu qabartmaqla əlaqələndirir; İmam Hüseynin də aid olduğu din böyüklərinin "on dörd məsum" birləşməsini nəzərə aldıqda, bunun istər sırf islami baxımdan, istərsə də bədii-estetik cəhətdən çox uğurlu bədii gediş olması ortaya çıxır. Bu bədii gedişin uğurunu artıran başqa ştrix budur ki, parçada adları çəkilən on dörd məsum kimi, Yəhya Peyğəmbər də dini təsəvvürlərdə məzlum müqəddəslər sırasındadır. Odur ki, Zəkəriyya və Yəhya–Kərbəla vaqeəsi əlaqəsinin Füzuli qələmindəki incəliklərini açmaqdan ötrü burada məsumiyyətlə bağlı bir neçə söz deməyə ehtiyac duyulur. Ondan başlayaq ki, anlayış Qurani-Kərimdə mövcuddur. Bu mövcudluq daha çox aşağıdakı ilahi bəyanatda özünü göstərir: "Ey Peyğəmbər! Rəbbin tərəfindən sənə nazil ediləni (Quranı) təbliğ et! Əgər bunu etməsən, Onun risalətini təbliğ etmiş olmazsan. Allah səni insanlardan qoruyacaq!" *("Maidə", 67).*

Ayənin "vallahu yəsimukə minən-nəs" (Allah özü səni (Peyğəmbəri) insanlardan, insanların şərindən qoruyacaqdır) şəklindəki ikinci cümləsi istər linqvistik, istərsə də tekstoloji baxımdan məsumluq məfhumu üzərində qərarlaşmışdır. Ayənin Rəsulullahın Əliyyən Vəliyullahla bağlı ilahi bilgini gecikdirməklə əlaqədar gəlməsinə dair mövqeyin şiəlikdə geniş yayılmasını və sarsılmaz inam-inanc halqasına çevrilməsini göz önündə tutduqda, bu cəhət bir az da güclənir.

Digər tərəfdən, sünni qaynaqlarında da peyğəmbərlər, adətən, *ismət, əmanət, fətanət (zəkalılıq), sidq, təbliğ* kimi beş məziyyətə malik müqəddəsat olaraq qavradılır ki, bu da məsumluğa dair şiə müddəalarını başqa yöndən qüvvətləndirir.

Məsumluq məfhumunun parçadakı bədii ifadəsi baxımından diqqəti bu çəkir ki, anlayış Yəhya Peyğəmbərlə bağlı birbaşa verildiyi halda, xanım Fatimeyi-Zəhra ilə bağlı nisbətən qeyri-müstəqim surətdə qavrayışa təqdim





olunur. Belə ki, onun məhşər səhrasına gəlişini “Gözlərinizi yumun!” çağırışının müşayiət etməsi on dörd məsumun bu nümayəndəsinin qadın təbiətindən də irəli gələn əzəli-əbədi paklığına, saflığına dair bəlli dini təsəvvürləri assosiativ biçimdə andırır. Bu, hicab məfhumu ilə qırılmaz bağlılıqda olduğundan daha təsirli çıxır.

Füzuli bölümün bu yerində on dörd məsum anlayışının içərisində gizlənmiş daxili ehtiyat mənbələrini işə salaraq İmam Hüseynin də aid olduğu bir bədii əsatir verir. Kərbəla vaqeəsinə az-çox bələd olan oxucu üçün bu əsatirin özündə birləşdirici işarələr düzümünü açmaq qətiyyən çətin olmayacaqdır. Çünki İmam Hüseynin qanlı köynəyini xanım Fatimeyi-Zəhranın sağ çiynində görmək Kərbəla vaqeəsini bütün təfsilatı və təfərrüatı ilə göz önündə canlandırmaqdan ötrü kifayətdir. Ötəri deyildir ki, məqtəllərdə bacısı Zeynəbin meydana gedərkən İmam Hüseynə anasından yadigar qalmış qırmızı köynəyi geyinməyi təklif etməsi çox yanıqlı bir ştrix kimi verilir; reallıqla mifologiyanın üzvi qovşağında qovuşan bu motiv Füzuli qələmi ilə Həzrət Əli (ə) və İmam Həsən obrazları hesabına bir qədər də gücləndirildiyindən ayrıca ekspressivlik və emosionallıq qazanır.

Parçada xanım Fatimeyi-Zəhranın həm də Kərbəla vaqeəsinə və İmam Hüseynə görə “barigahi-ədalət dərgahində durması”nın üzərinə ağırlıq salınması dolayısı ilə də olsa İmam Hüseynə qarşı yol verilmiş haqsızlığı aydın təsəvvür etməyə yol açır. Çünki bu haqsızlıq gör hansı ölçüdədir ki, o, “dəryayi-qəhri-ilahi”nin “təməvvücə gəlməsinə” və “aləmi-qərqeyi-tufani-qəzəb qılmasına” səbəb ola bilər. Deməli, bu genişlik bəsit məqtəl bədiyyatı olmaqdan daha çox Füzuli təxəyyülünün məhsulu olan estetik uyarlıq və fəlsəfi dərinlikdir və bu cür də qavranılmalıdır.

Parçada İmam Hüseyn motivi ilə bir də qarşılaşırıq. Ancaq bu dəfə o ulu din böyüyünün adı və nişanəsi Rəsulullahın (s) dilində səslənir; belə ki, Həzrət Muhəmməd (s) intiqam hissləri ilə aşıb-daşan qızına nəsihətində İmam Hüseynin qanlı



köynəyini də ilahi mərhəməti coşduracaq bir şəfaət vasitəsi kimi önə çəkməyə çağırır. Bu isə sırf şiə məfkurəsində belə nadir hallarda toxunulan İmam Hüseyn şəfaəti bəhsinin, alt qatda da olsa, bədii ifadəsi olduğundan qiymətlidir.

Ən nəhayət, parçanın özündə birləşdirdiyi Kərbəla vaqeəsi ilə bağlı bilgi və motivlər sırasında İmam Hüseyn hərəkatında canından keçmiş igidlər üçün onlara layiq yas saxlamağın ayrıca bir dindarlıq və vətəndaşlıq tələbi kimi qoyulub həll edilməsidir. Son cümlələrin məhz bu məzmunda olması bunun bariz təzahürüdür. Belə ki, şair bölümün bu yerində daxili qafiyələri bilərəkdən artırmaqla xüsusi həssaslıq və həzinlik yaratmış, şəhidliyin bəşəri kədər tərəfini önə çəkmişdir.

Parçanın sonunda verilən şeirdə məhz on dörd məsum elegiyası olub, İmam Hüseyn başda olmaqla, Kərbəla şəhidlərinin hamısını əhatə edir:

Əhli-beytin yad edüb hər ləhzə abi-didəsin,
Zaye' olmaz əşk tökmək dideyi-xunbardan.
Bu müsibət əşkinün hər qətrəsinə ruzi-Həşr,
Əcrdir bin bəhri-rəhmət İzədi-Cəbbardan.[163]

*(Anbaan Peyğəmbər balalarının göz yaşını anıb, qan bulağına çevrilmiş gözlərdən durmadan yaş axıtmaq heç vəchlə (Tanrı qatında) boşa getməz! Ona görə ki, Qiyamət günündə Kərbəla müsibətindən ötrü axıdılmış bir damla göz yaşı üçün qəzəbli Allah dərgahında min mərhəmət dənizi mükafat veriləcəkdir!)*

Göründüyü kimi, dördcə misralıq bir parça bir könül incəliyi, bir ürək dağı, bir qəlb sınıqlığının tərənnümüdür. *Abi-didə, əşk, dideyi-xunbar, bu müsibət əşkinin hər qətrəsi, min bəhri-rəhmət* obrazlıqları məhz Kərbəla vaqeəsi kimi ali bəşəri igidlik və şəhidlik abidəsi önündə tökülən incə şair

..................................

[163] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 77*



qəlbinin göz yaşı inciləridir. Ancaq şeirin özündə birləşdirdiyi orijinallıq olaraq "min bədri-rəhmət İzədi-Cəbbar" təzadı üzərində ayrıca dayanmaq qaçılmazdır.

Oradan başlayaq ki, "Cəbbar" sözünün üzdə olan lüğəvi anlamları *cəbr edən, cəzalandıran, əvəz çıxan* kimi qavranılır və bu, Əsmau-l-Hüsnada – Allahın gözəl adları sırasında qavranılır. Ancaq diqqəti çəkən cəhət budur ki, bu anlam islami baxımdan özünü doğrultmamasına baxmayaraq, alt qatda daha dərin incəliyə də malikdir. Ona görə ki, ərəb dilinin qədim variantlarında "Cəbbar" sözünün həm də *sınıqları birləşdirən, nizamlayan, düzümə salan* kimi mənaları da vardır ki, bu da İslam dininin aparıcı və başlıca müddəalarına daha çox uyğun gəlir. Başqa sözlə, bu o deməkdir ki, Kərbəla şəhidləri üçün axıdılan bir damla, bir damcı göz yaşının min mərhəmət dənizi ilə mükafatlandırılması İslamiyyətdə əsla təsadüfi müddəa olmayıb, dəqiq, aydın və kəsərli bir qənaətdir və Füzuli də qail olduğu dini dərindən bilən bir şair kimi məhz bu incəliyi sənət incisinə çevirmişdir.

* * *

Bölümün Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı baxımından əhatə etdiyi bilgi, ad, anlam və motivlərin qalan hissəsi daha çox iqtibas səciyyəlidir. Bu, Füzulinin mövzuya yanaşmasının ciddiliyindən, haqqında danışdığı şəxsiyyətlərə verdiyi önəmin böyüklüyündən söz açır. Digər tərəfdən, bölümdə iqtibaslara üstünlük verilməsi şairin sənədli nəsr yolunu tutduğunu, bunu özünün yaradıcılıq qayəsinə çevirdiyini sübuta yetirir. Bu isə milli ədəbiyyat tariximizdə baş vermiş dəyərli bir novatorluqdur. Bütün bu cəhətlərin ideya-bədii keyfiyyətlərini üzə çıxarmaqdan ötrü belə örnəklərdən bir neçəsini gözdən keçirək.

**1.** "Şəvahidün-Nübüvvət"də İmami-Zeynəlabidindən nəqldir ki: "Həzrəti-Hüseyn Məkkeyi-müə'zzəmədən Kufəyə təvəccöh etdikdə heç mənzilə yetməzdi ki, Yəhyayi-mə'sum macərasın zikr etməsin. Və buyururdu ki, ruzigarın ədəmi-





mürüvvətin və fələkin kəmali-vəqahətin görün ki, Yəhya kibi salehün səri-səadətməndin bir facirə hədiyyə etmiş"[164].

*("Peyğəmbərlik dəlilləri" kitabında bildirildiyinə görə, İmam Zeynəlabidin söyləyir ki, Məkkədən Kufəyə gedərkən Həzrət Hüseyn dayandıqları, düşərgə saldıqları hər yerdə məsum Yəhyanın başına gələn macəralardan danışardı və buyurardı ki, zəmanənin (haqq adamlarına) olan köməyinin yoxluğunun və fələyin (hakim dairələrin) pisliyinin dərəcəsini görün ki, Yəhya kimi əməlisaleh bir şəxsiyyətin səadətgətirici mübarək baxışını bir pozğun qadının ayaqları altına atmışdır).*

Hər şeydən öncə belə bir cəhət diqqəti çəkir ki, İmam Hüseyn yol boyu apardığı məfkurəvi təbliğat və təşviqat işini müqəddəslərin sərgüzəştlərindən də yararlanmaqla daha təsirli etmişdir. Çünki bu, bir yandan onun xütbə və çıxışlarının emosional gücünü artırmış, bir yandan da mübarizəsinə qalxdığı haqq səsinin mahiyyət və kəmiyyət etibarilə əzəli-əbədi buyuruğun ilahi tərkib hissəsi olması gerçəkliyini qabartmağa xidmət etmişdir. Bölümün ortalarında Yəhya Peyğəmbərin sərgüzəştinin geniş təsvir olunduğunu nəzərə aldıqda İmam Hüseynin göz önündə tutduğu tarixi həqiqətləri təsəvvürə gətirməyən oxucu üçün asan olacağı anlaşılır. Mətnin alt qatından çıxan başqa bir fikir budur ki, Yəhya Peyğəmbər fərdi, şəxsi maraqlara qurban getdiyi halda, İmam Hüseynin fəaliyyəti büsbütün ictimai səciyyə daşıyaraq, cəmiyyəti hərəkətə gətirən hərtərəfli siyasi və dini amildir. Hədisin bilavasitə Kərbəlada olmuş İmam Zeynəlabidinin dilindən söylənilməsi də bu baxımdan çox söz deyir.

Ən nəhayət, mətnin alt qatında "bir faciə" sözü ilə İmam Hüseyn hərəkatını qan içində boğan hakim dairələrin əxlaqsız qadına bənzədilməsini də sezmək olur ki, bu da ideya baxımından Füzulinin dünyagörüşünə, bədiilik yönündə isə sənətkarlığına dəlalət edən incəlikdir.

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Yəhya Peyğəmbərin Kərbəla vaqeəsi ilə birbaşa bağlılığı baxı-

[164] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 79*





mından bir cəhət də diqqəti çəkir. Belə ki, istər salnamələrdə, istərsə də məqtəllərdə İmam Hüseynin qucağında Hərmələ tərəfindən oxlanan altı aylıq Əliəsğər adlı körpə övladının qanının yerə tökülməsi halında yer üzünü dəhşətli fəlakətlərin bürüyəcəyinə dair ilahi xəbərdarlıq artıq yüz minlərcə dindarın inam-inanc sisteminin qopmaz, ayrılmaz bir halqasına çevrilmişdir. Ötəri deyildir ki, Əliəsğər adı "babə-l-həvaic" (ehtiyaclar, hacət və istəklər, diləklər qapısı) kimi indi də anılmaqda və güvənilməkdədir. Bütün bunları göz önündə tutduqda, bölümün ortalarında qətlə yetirildikdən sonra Yəhyanın qanının əsrlər boyu töküldüyü quyuda cuşa gəlib coşmasının təsvir olunması, yalnız bütün əsərin intiqamdan sonra sakitləşməsinin bəsit tarixi bilgi kimi təsadüfi səciyyə daşımadığını, əksinə, İmam Hüseynin Əliəsğərin qanını ovcuna alaraq yerə düşməsin deyə göyə atması haqqındakı mənqəbələrin uzaq keçmişlərdə əks-səda verən arxetipi, özülü kimi qavranıldığını göstərir.

**2.** "Və Sə'd bin Cübeyr Əbbasdan rəvayətdir ki: "Bir gün Həzrəti-Rəsulullah xəbəri-vaqieyi-Kərbəladan mütəallim olub təfəkkür edərdi ki: Aya, ol qəriblərin intiqamın zalımlardan kim alur ola? Həzrəti-İzzətdən vəhy gəldi ki: "Ya Rəsulullah, Yəhya bin Zəkəriyya üçün yetmiş bin kafir siyasətə yetdi, sənin fərzəndi-ərcmindün üçün yetmiş bin (kafir 40 siyasətə yetər)". Və bir rəvayət dəxi oldur ki, yetmiş kərrə yetmiş bin münafiq qətl olsa gərək.

Filvaqe', bu və'də vəfaya yetdi, zira Muxtar bin Əbu Übeydeyi-Səqəfi və Müseyyib bin Qə'qa' Xüzai və İbrahim bin Malik Əştər Nəxə'i və Əbu Müslimi-Mərvəzi bir-birinə mütə'aqib xüruc edüb, səfheyi-ruzigardan əksəri-ə'dayi-Ali-Rəsulu məhv etdilər və qanlarından sirişki-məzlum kibi cuybarlar yürütdülər..."[165]

*(Səd bin Cübeyr Abbasın dilindən danışır ki, bir gün Peyğəmbər Kərbəla vaqeəsinə dair (özünə verilmiş ilahi) xəbərdən bərk kədərlənib dərin fikrə dalmışdı ki, görəsən, o qəriblərin qisasını zülmkarlardan kim ala biləcək? Bu*

[165] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 79*





*vaxt Ulu Yaradandan vəhy gəldi ki, "ya Rəsulullah, Yəhya bin Zəkəriyya üçün yetmiş min kafir qəzəbə uğradı, sənin qiymətdə tayı-bərabəri olmayan övladın üçün də yetmiş min kafir qəzəbə uğrayar!" Başqa bir rəvayətə görə, (Allah-taala) "yetmiş dəfə yetmiş min münafiq qətlə yetirilə bilər" deyə buyurmuşdur. Doğrudan da bu ilahi vəd gerçəkləşdi. Çünki Muxtar bin Əbu Übeydeyi-Səqəfi, Müseyyib bin Qəqa Xüzai, İbrahim bin Malik Əştər Nəxəi, Əbu Müslimi-Mərvəzi bir-birinin ardınca ardıcıl olaraq qiyam etməklə Peyğəmbər xanədanının düşmənlərinin çoxunu dövran səhifəsindən sildilər və onların qanlarından məzlumların göz yaşları kimi arxlar axıtdılar).*

Parçada aşağıdakı fikirlər aparıcı yer tutur:

- Kərbəla vaqeəsi qabaqcadan İslam rəhbərinə bəlli olmuşdur.
- Bu xəbər Həzrət Muhəmmədi dərindən sarsıtmışdır.
- Kərbəla vaqeəsi təfəkkür üçün münbit mənbədir.
- İntiqam hissi Kərbəla vaqeəsi ilə qırılmaz bağlılıqda xüsusi dini məzmun kəsb etməkdədir.
- "Allah məğlubedilməzdir və intiqam sahibidir" *("Ali-İmran", 4)* hökmü Əhli-beytə qarşı edilən zülm və haqsızlıqla bağlı ayrıca islami səciyyəyə malikdir.
- Ən nəhayət, bütün bu cəhətlər Kərbəla vaqeəsindən az sonra gerçəkləşməklə mücərrədlikdən çıxaraq, birmənalı surətdə kəskin və kəsərli bir dini-tarixi mahiyyət almışdır.

1. ...və "Üyunur-Riza"da məsturdur ki, "Mehdiyi-Ali-Məhəmməd qətəleyi-şühədayi-Kərbəlanın tətimmeyi-zürriyatın ruyi-zəmindən götürür və qaideyi-asarü şərti-intiqamı ol həzrət yerinə yetirür. Şe'r:

Gər olmasaydı qərəz intiqami-xuni-Hüseyn,
Zühuri-Mehdiyə çəkməzdi intizar vücud.
Qəzaya qaideyi-səbr ixtira'indən,
Cəzayi-qatili-Ali-Rəsuldur məqsud"[166].

.................................

[166] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 79*





*("İmam Rza əyanilikləri" kitabında yazılmışdır ki, Muhəmməd nəslindən olan Mehdi Kərbəla şəhidlərinin qatillərinin nəslindən qalmış tör-töküntülərini yer üzündən silər və qisas şərtlərinin əlamət və qaydalarını (qaideyi-asarü şərti-intiqami) gerçəkləşdirər.*

*"Əgər Hüseyn qanının intiqamını almaq (ali ilahi) məqsəd olmasaydı, heç bir kimsə Mehdinin zühurunun intizarını çəkməzdi. Qəzavü qədərə bu qədər çox səbirli olmağa izin verilməsində məqsəd Peyğəmbər nəslinin qatillərinin layiqincə cəzalandırılmasından ötrü əlverişli şəraitin yaradılmasıdır!").*

Göründüyü kimi, əgər öncəki parçada Kərbəla şəhidlərinin yaxın dövrdəki qatillərinin isti-isti aradan qaldırılmasından danışılırdısa, burada həmin taktiki gediş uzunmüddətli bir strategiya ilə əvəz olunur. Şair bunun üçün şiəliyin ən dəqiq əlaməti olan zəmanə imamına inam şərtinə söykənir və bunu ustalıqla əsaslı və təsirli bir motivə çevirir.

Beləliklə, aydın olur ki, Füzuli bu bölümü də Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı yönündə yaradıcı bir biçimdə qələmə alaraq, onu çeşidli bədii incəliklərlə işləmiş, Zəkəriyya və Yəhya peyğəmbərlərin qissələrinin özündə birləşdirdiyi mətləbləri sənətkarlıqla Kərbəla şəhidlərinin mübarizə yolu ilə qovuşdurmaqla bilgi, ad, anlayış və mənqəbələrdən biri o birindən dolğun və tutumlu olan əlvan və rəngarəng bir sənət qalereyası ortaya qoymuşdur.





# BİR-BİRİNDƏN İGİD MÜBARİZLƏR

(10-cu babın II fəsli əsasında)

"Hədiqətü-s-süəda"nın sənədli tarixi roman olduğunu nəzərə aldıqda Kərbəla vaqeəsinin epik janrda və klassik kitab və folklor danışıq üslublarının qovuşuğunda qələmə alınmasını, təsvirin tərənnümü üstələməsini tamamilə təbii hal hesab etməliyik. Hər babın lirik ricətlə başlaması da buradan irəli gəlir. Füzuli bu babı beş xüsusi şeirlə başlayır:

**1.** Rahət istər təb´ü möhnətdir ibadət sərbəsər,
Tərki-rahət rəğbəti-möhnət qılan mümtaz olur.
Bu səbəbdəndür ki, küfr asan olub, İslam sə´b,
Ərseyi-aləmdə mülhid çox, müvəhhid az olur[167].

*(İnsanın xisləti həmişə rahatlıq istəyir. Çünki ibadət etmək başdan-ayağa çətinlikdən ibarətdir. Odur ki, yalnız rahatlığından keçib çətinliyə meyil edənlər özlərinin xüsusi bacarığı ilə seçilirlər. Küfrün asanlıqla, İslamın isə çətinliklə yayılmasının səbəbi də budur. Diqqət yetirsən görərsən ki, həmişə kafir, müşrik çox, xalis niyyətli dindar isə az olmuşdur).*

.................................

[167] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.311*





“Zira igirmi iki bin cəfakar yetmiş iki ləbtəşneyi-dilfigara müqabil durmuşdu...”[168] cümləsi şeirdəki müqayisəyə nəsrlə verilmiş müəllif açıqlaması olduğu üçün Füzulinin babı ümumbəşəri dəyərlər müstəvisində başlamaq istəyini göstərir. Bu isə onun yüksək yaradıcılıq qayəsindən başqa bir şey deyildi.

Cümlə Kərbəla vaqeəsinin başqa qatlarına da aydınlıq gətirir. Məsələn, cümlədən aydın olur ki, Aşura günü İmam Hüseynin özünə və tərəfdaşlarına qılınc qaldıranlar yüngül xasiyyətli və əqidəsiz kimsələr olmuşlar. Deməli, onlar kafir və müşrik sayılmalıdır.

Ümumiyyətlə, əmlak hərisliyinin, dünyapərəstliyin ibadət duyğusunu öldürdüyü, insanı süst və əqidəsiz etdiyi bəllidir. Klassik poeziyada bu hal həmişə pislənilmişdir. Məsələn, Füzuli qitələrinin birində məsələni belə qoyub həll edir:

Həmişə dustum oldur, derəm ki, mal verib
Qılır təbiətimi bəsteyi-əlaqeyi-mal.
İbadəti-həqü-kəsbi-ülum üçün mütləq
Qomaz mülahizeyi-zəbti-mal məndə məcal!
Müdam düşmən ona söylərəm ki, malım alıb,
Mənə müyəssər edər ne´məti-fərağəti-hal.
Hüzuri-qəlb verər rövnəqi-ibadəti-həq,
Fəraqi-xatir olur mu´cibi-üsuli-kəmal!
Fəğan ki, dustumu düşmənimdən etməm fərq,
Kəmali-cəhlilə ovqat sərf olur məhü sal!
Bu cəhl ilə özümü əhli-mərifət sanıram,
Zəhi, təsəvvüri-batil, zəhi, xəyali-məhal!

*(Mənə mal-mülk verən şəxsi həmişə dost bilirəm. Halbuki o belə etdikcə məni mala-mülkə daha artıq bağlayır. Ancaq əmlak hərisliyi mənə Tanrıya ibadət etmək və elm öyrənmək üçün göz açmağa imkan vermir. Azacıq mal müqabilində*

.................................
[168] *Füzuli. Əsərləri 6 cilddə, VI cild, səh.311*



*mənə ruhi-mənəvi dinclik aşılayan şəxsə isə düşmən deyirəm. Halbuki Tanrıya ibadətin gətirdiyi mənəvi-əxlaqi üstünlük insana könül rahatlığı, qəlb təskinliyi verər. Kamilliyə doğru meyil etmək ürəyi dağınıq düşüncə və duyğulardan uzaqlaşdırar. Vay olsun mənə ki, mən dostumla düşməni bir-birindən fərqləndirməmişəm. Və beləliklə də ömrün ayları, illəri dərin bir cəhalət içərisində heç-puç olub getmişdir. Daha dəhşətlisi isə budur ki, mən belə dərin cəhalət bataqlığında ola-ola özümü mərifət əhli bilmişəm. Gör mən necə bir saxta anlayış, necə bir baştutmaz fikir sahibi olmuşam).*

Göründüyü kimi, hər iki parça dərin ruhi-psixoloji əhvali-ruhiyyənin aydın və parlaq bədii əksi kimi bir-biri ilə yaxından səsləşir. Bu isə iri bir fəslə verilən lirik ricət örnəyi olan xırda şeiri ideya istiqaməti və məna-məzmun incəliyi baxımından daha dolğun və tutumlu edir.

İstər babın lirik ricətinin, istərsə də qitənin dini-məfkurəvi qaynağını “ibadət” anlayışı təşkil edir. Bəs əsl islami ibadət nə deməkdir?

Dilimizdə artıq çoxdan doğmalıq qazanmış “ibadət” sözü və bu kökdən gələn kəlmələr mürəkkəb ömür yaşamaq, fəal həyat tərzi keçirmək, ictimai-siyasi və iqtisadi-mədəni proseslər içərisində İslama ən çox uyğun olanları seçməyə kömək edən mürəkkəb anlayışlar şəbəkəsidir.

“Ərseyi-aləmdə mülhid çox, müvəhhid az olur” misrası toxunduğu incə mətləb yönündə Əlican Qövsi Təbrizinin “Azdır” rədifli qəzəlini xatırladır:

Əndişeyi-tufan çox olur bəhrdə, amma
Sən ləngəri-təslim ələ alsan, xətər azdır!

*(Dənizdə tufan ehtimalı çox qüvvətlidir, ancaq sən Allaha təvəkkül ləngərindən bacarıqla istifadə edə bilsən, təhlükə ilə üzləşmə ehtimalın çox az olar).*

Göründüyü kimi, “əndişeyi-tufan və mülhid”, “ləngəri-təslim və müvəhhid” ifadələri üst-üstə düşməklə İmam





Hüseynin (ə) və tərəfdarlarının ilahi təqdir inamını, qəzavü qədərin hökmü qarşısındakı dözüm və dəyanətini çeşidli həyat həqiqətləri üzərində əks etdirir.

**2.** Mümkün olmaz ki, ola aləmdə
Əhli-bütlana əhli-Həqq məğlub.
Əhli-Həqq qatil olsa, gər məqtul,
Zəfəri əql ana qılub mənsub.
Qətldən oldur eyləyən ikrah
Ki, şəhadət degil ana mətlub[169].

*(Allah adamları dünyada bütpərəstlərə, şeytan və tağut camaatına məğlub ola bilməz. Allah adamları istər öldürsün, istərsə də öldürülsün, ağlın, kamalın zəfəri, təntənəsi daim onlarla birlikdədir. Döyüşdən Allah yolunda ölüb-öldürməkdən yalnız şəhidliyi özlərinin başlıca məqsədi bilməyənlər ikrah edərlər).*

Birinci şeirdən fərqli olaraq, burada müqayisə iti axar alır. Bu itilik "əhli-bütlan, əhli-Həqq" qarşılaşdırması ilə bitmir, əksinə, "qatil-məqtul", "zəfəri-əql", "qətl" və "şəhadət" ifadələrində əksini tapmış fikirlər parçanın məzmununa dərinlik, ideya istiqamətinə də kəsər verir, İmam Hüseyn hərəkatı ilə bağlı tarixi bilgi və əsatiri-mənqəbəvi motivlərə də məqsədyönlü aydınlıq gətirir. Unutmayaq ki, bu bağ bütövlükdə "Hədiqətü-s-süəda"nın canını təşkil edir. Məsələn, "qatil-məqtul" ifadəsi Kərbəla vaqeəsinin əsasında duran islami cihad konsepsiyasının başlıca daşıyıcılarından birini təşkil edən "Allah öz yolunda döyüşən, ölən və öldürülən möminlərin canlarını və mallarını cənnət yolunda satın almışdır" *("Tövbə", 111)* ayəsini yada salır. Yaxud "şəhadət" ifadəsi "Allah yolunda qətlə yetirilənlərə "ölü" deməyin, yox, onlar diridirlər, lakin siz qavramırsınız" *("Bəqərə", 154)* şəklindəki ilahi bəyanatı xatırladır.

.................................

[169] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.311*



**3.** Nəqdi-can sərfi-rəhi-canan edən sahibnəzər,
Eşq meydanində sərxeyli-səfi-üşşaq olur.
Mənzili-məqsudədir qeydi-təəllüq səddi-rah,
Rütbeyi-tərki-təəllüq əhsəni-əxlaq olur[170].

*(Can nəqdini canan yolunda işlədən yüksək səviyyəli kimsə eşq meydanında aşiqlər sırasının başçısına çevrilir. Dünyaya bağlılıq buxovu məqsəd mənzilinə gedən yolda başlıca əngəldir. Yalnız o buxovdan uzaq duranlar yetkin əxlaq sahibi ola bilər).*

Parça bir neçə cəhətdən bilavasitə İmam Hüseynlə bağlanır. Belə ki, əgər "sahibnəzər" (arif şəxsiyyət, kamil insan) sözü bu ulu din böyüyünün yüksək idraki cəhətinə işıq tutursa, "sərxeyli-səfi-üşşaq" ifadəsi onun rəhbərlik məqamına dair aydın anlayış yaradır. Belədə "nəqdi-can" – İmam Hüseynin (ə) son nəfəsinədək göstərdiyi qətiyyət, "sərfi-rəhi-canan" *Allah yolunda əliaçıqlıq etmək*, "eşq meydani" – *Kərbəla düzü,* "sərxeyli-səfi-üşşaq" – *Kərbəla döyüşçülərinin sərkərdəsi* anlamlarına gəlir.

Ancaq bədii incəlikdir ki, belə aşiqanə beyti fəlsəfi yüklü beyt tamamlayır. "Mənzili-məqsud" ifadəsinin "dünya axirətin əkin tarlasıdır" hədisi səpkisində ali axirət savabı, "əhsəni-əxlaq" ifadəsinin də "Allah əxlaqı" ilə əxlaqlının hədisi səpkisində "kamil cənnətlik" mənalarını qazanması bunu sübuta yetirir.

Beytdəki təəllüq motivi şairin məşhur "Tək" rədifli qəzəlini xatırladır və imkan verir ki, oxucu assosiativ biçimdə oradakı məna-məzmun əlamətlərini İmam Hüseyn şəxsiyyəti ilə əlaqələndirib bədii həzz ala bilsin.

Təəllüq zülmətin təcrid xurşidinə qıl mətlə´,
Əgər aləmdə bir gün görmək istərsən Məsihatək.

.................................

[170] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.311*



*(Dünyada İsa Peyğəmbər kimi göyün dördüncü qatına yüksəlməklə kamillik zirvəsinə ucalmaq eşqindəsənsə, onda gərək öncə hamıdan, hər şeydən uzaqlaşmağı bacarasan, sonra özün kamilləşərək bir günəştək ətrafına nur saçasan, işıq salasan).*

Araşdırdığımız parçanın ikinci beyti ilə üzvi vəhdətdə götürdükdə isə, bu, İmam Hüseyndən (ə) başqası deyildir.

**4.** Qeydi-cəm’iyyəti-əsbab giriftarı olan
Seyri-gülzari-cinan etməgə fürsət bulmaz.
Zövqi-dünya ilə zaye’ keçirən övqatın
Şərəfi-rütbeyi-tövfiqi səadət bulmaz[171].

*(Səbəblər əlində əsir-yesir olan cənnət çəmənliklərində gəzmək fürsətini itirər. Vaxtını dünyəvi ləzzətlər alaraq zay edən isə ilahi xoşbəxtliyi qətiyyən öz tərəfinə doğru çəkə bilməz).*

Bəllidir ki, Mədinədən Kərbəlayadək onlarla şəxs İmam Hüseyni getdiyi səfərdən, başladığı hərəkatdan çəkindirmək istəsə də, o, deyilənlərə hörmətlə yanaşmaqla yanaşı, haqq yoldan çəkilməmiş, göstərilən müxtəlif ictimai-siyasi amillərin, əslində, onun məqsəd və amalı yönündə cılız və zəif maneələr olduğunu söyləmişdir. Deməli, bu ulu din böyüyü hər vəchlə “Qeydi-cəm’iyyəti-əsbab giriftarı” olmamışdır.

“Seyri-gülzari-cinan etməgə fürsət bulmaq” da birbaşa Kərbəla vaqeəsi ilə bağlanır. Bir sıra Kərbəla igidlərinin son nəfəsdə cənnət nemətlərini görmələri bu bağlılığı kifayət qədər əsaslandırır.

Şeirin ikinci beyti isə:

Ey Füzuli, tələbi-rütbeyi-irfan eylə,
Cəhl ilə hasili-övqati-şərif etmə tələf!

.................................

[171] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.312*





*(Ey Füzuli, ariflik zirvəsinə ucalmağa can at, avamlıqla dəyərli vaxtının nəticəsini məhv etmə)* səpkili beytlər mənasında olub, "tofviqi-səadət" ifadəsi ilə ilahi eşq məzmunu və Kərbəla fədakarlığı ilə bağlılıq qazanmış olur.

Araşdırdığımız parçanın ikinci beyti, bundan başqa, İmam Həsənin (ə) oğlu Qasimə etdiyi:

Ləzzəti-ömri səni qılmaya qafil həqdən,
Kəndüvi qabili-meydani-səadət biləsən! –

vəsiyyəti ilə də üst-üstə düşür.

**5.** Kərbəladən hasil etmişlər ülüvvi-mənzilət,
Zillətü-izzətdə əhli-zülmü ərbabi-vəfa.
Nərdibani-bami-rif'ətdir, təəmmül eyləsən,
Nəqşi-mövci-riqi-səhrayi-şərifi-Kərbəla[172].

*(Zülmkarlar da, əhdinə sadiq qalanlar da azğınlıqla şərəfi, ucalıqla alçaqlığı Kərbəlada qazanmışlar. Əgər dərindən düşünsən, şərəfli Kərbəla düzünün hər bir damarı, dalğası və naxışı özlüyündə alilik damının pillələridir).*

Parça ilk növbədə Kərbəlanı bütöv bir mədəniyyət aktı kimi qavradır. Bu, təkcə "rif'ət" (ucalıq), "təəmmül eyləmək" (düşünmək), "nəqş" (naxış) sözlərindən bilinmir. Bu, daha çox həmin sözlərdə əksini tapmış və birbaşa İslam fəlsəfəsindən və müsəlman həyat tərzindən qaynaqlanan fikirlərin sistemlə şifrələşdirilməsində özünü göstərir. Belədə Kərbəla coğrafi məkan olmaqdan çıxıb, əyani bir din məktəbinə çevrilir, "Ülüvvi-mənzilət" də həmin məktəbdə təhsil alan şagirdlərin yuxarı və aşağı qiymətləri yerində çıxış edir.

**6.** Eyləyib hər yil cəmi'i-əhli-aləm ittifaq,
Şərh edərlər macərayi-Kərbəla əxbarını.

.................................

[172] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.312*



Nə tükənməz qissədir kim, hərgiz axir olmadi,
Şərhi aciz eylədi əhli-cəhanın varını[173].

*(Dünyanın bütün böyük ədib və filosofları hər il bir araya yığışıb Kərbəla macərasından gəlib çatmış xəbərləri açıqlamağa can atarlar. Gör Kərbəla vaqeəsi necə bitib-tükənməz bir hadisədir ki, hələ də açıqlamasının sonu yetməmişdir. Əksinə, onunla bağlı aparılan dərin təhlillər dünyanın bütün analitik beyin mərkəzlərini aciz qoymuşdur).*

Şeir bir neçə baxımdan diqqəti çəkir. Belə ki, bu kiçik parçada bir yandan dərin elmi-nəzəri təhlilə sövq özünü göstərirsə, o biri yandan həyat xammalının bədii ədəbiyyatın imkanları xaricində olmasına işarə vurulur. Şair sanki demək istəyir ki, əgər əsərimdə qüsurlar görsəniz, bunu mövzunun ağırlığı ilə əlqələndirin. Çünki Kərbəla vaqeəsini qələmə almaq Füzuli dühası üçün belə əlçatmaz və ünyetməz zirvədir.

Parçanın dərin elmi-nəzəri və analitik təhlilə sövqetmə baxımından özündə birləşdirdiyi informasiya yükünün ağırlığı haqqında isə yalnız onu deyə bilərik ki, monoqrafiyanın girişində dünyanın bir neçə qabaqcıl ədib və filosofundan gətirilmiş iqtibaslar belə Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının malik olduğu ictimai-siyasi və mənəvi-əxlaqi keyfiyyətlərə dair aydın anlayış oyatmaqda müəyyən qədər kömək edərdi. Problemin köklü biçimdə qoyulub həll edilməsi üçün uzunmüddətli və gərgin axtarışlar aparılmalı, qabaqcıl metodlardan barınmaqla ən müxtəlif yönlərdə hərtərəfli tədqiqat işləri yazılmalıdır. Şəhid Mürtəza Mütəhhərinin kitabları buna ən parlaq örnəkdir.

* * *

Belə geniş lirik ricətdən sonra Füzuli babı başlayır. O bildirir ki, Əbu-Bəkr ibn Əliyyü-l-Mürtəza Qasim şəhid olduqdan

.................................

[173] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.312*





sonra imamdan meydana getməyə icazə istəyir. İmam isə ona belə buyurur. “Ey qönçeyi-gülbüni-imamət və şükufeyi-bağirəhmət, bu təmənna qıldığın meydani-bəla ərseyi-fənadır. Bu ərsəyə qədəm basan müraciət qılmadı və bu meydana gedən gerü gəlmədi. Nə ümidlə sənə rüsxət verəyim və nə vəchlə müfariqətin rəva görəyim?”[174]

Əhli-beyt igidi üzünü imamın atının üzəngisinə söykəyib deyir: “Ey padşahi-məsnədi-izzütəmkin və ey şəhriyari-vilayəti-dövlətü din, təhti-şəhadət içdikcə bənim dəryayi-şövqüm təməvvücə gəlüb və təəttüşüm zülali-mülaqati-Mustəfa və Murtəzayə ziyadə olub, sibqət edənlər rəşkindən həlak oluram. Nola əgər kəmali-mərhəmətindən riza hasil edüb bən dəxi nəqdi-can bəzl eyləyüb bu meydanda muradım hasil edəm?!”[175]

Mükalimə, hər şeydən öncə, özünün etik məzmunu ilə diqqəti çəkir. Belə ki, iki qardaş arasındakı dialoq ənənəvi izinalma üslubundan daha çox qarşılıqlı sevgi və sayğı izharı üzərində qurulmuşdur. İmam Hüseynin kiçik qardaşı Əbu-Bəkrə “imamlıq qızılgülünün qönçəsi” və “ilahi mərhəmət bağımda açılmış çiçək” deyə üz tutması bəsit əzizləmə olmayıb, rəhbər və sərkərdənin qayğıkeş münasibəti, Həzrət Əli yadigarını hər cür çətinliklərdən qoruyub saxlama cəhdidir. İmamın *“Dilədiyin bu bəla meydanının sonunda bir heçlik (fiziki məhvolma) durur. Bu meydanə girən dönməz, axı mən sənə necə izin verim?!”* sözləri də bunu göstərir.

Əbu-Bəkrin cavabı daha orijinaldır. Ona görə ki, həmin cavabda indiyədək izinalmalarda görmədiyimiz bir cəhət – qibtə hissi qabarıqdır. O, imama belə üz tutur: *“Ey izzət və dözüm taxtının hökmdarı, ey dinc sərvətinin qərar tapdığı ölkənin başçısı. Hər bir döyüşçü sənin qalibiyyət bayrağın altında meydana girib şəhidlik şirəsindən daddıqca mənim*

.................................

[174] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.312-313*

[175] *Yenə orada, səh.313*





*eşq dənizim dalğalanaraq Müstəfa və Mürtəza (Peyğəmbər və Əli) görüşünün zülalına olan suzuluğum, təşnəliyim durmadan artdığından məndən qabağa düşənləri, önə keçənləri qısqanmaqla az qalıram ki, həlak olam! Sənin yetkin mərhəmətin sayəsində razılıq qazanıb can nəqdini sərf etməklə məni də bu döyüş meydanında muradıma qovuşdursana!"*

Füzuli öz qəhrəmanının sözlərini nəsrlə qələmə almaqla kifayətlənməyib onun dəruni duyğu və düşüncələrini şeirlə də ifadə edir:

Can təmaşayi-riyazi-rəhmət eylər arzu,
Dil səfayi-bəzmgahi-cənnət eylər arzu.
Oldu bağrım bərqi-ifrati-hərarətdən kəbab,
Səlsəbili-rövzədən bir şərbət eylər arzu[176].

*(Ey imam qardaşım, mənim bu həqir varlığım sənin o mərhəmət bağçanda gəzib-dolaşmaq arzusundadır. Könlüm isə sənin cənnət məclisində zövqü-səfa sürməyi diləyir. Bu eşqin şiddətindən bağrımın başı yanıb kabab olduğu üçün ürəyim behiştdəki Səlsəbil bulağından yalnız bir qədəh şərbət istəyir).*

Füzuli belə dərin lirizmdən sonra "İlhahi-təmamla icazət hasil edüb, mütəvəccihi-meydan olub bu məzmunla bir rəcəz ağaz etdi ki" deyərək öz qəhrəmanının döyüş əhvali-ruhiyyəsinin tərənnümünə keçir:

Bənəm nəqdi-sultani-Düldülsəvar,
Şəhi-Qənbərü sahibi-Zülfiqar.
Bənəm əxtəri-asimani-şərəf,
Əbu-Bəkr bin Heydəri-namdar.
Bənəm çakəri-nuri-çeşmi-Bətul,
Hüseyni-Əli sərvəri-kamkar.

.................................

[176] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.313*





Bihəmdullah, oldur imamım bənim,
Anın taətin qılmışam ixtiyar.
Muradım budur kim, rizasın bulub,
Ana eyləyəm nəqdi-canım nisar[177].

*(Düldülə minmiş sultanın varlığının cövhəri mənəm. O, Qənbərin ağası və Zülfiqarın yiyəsi idi. İzzət səmasının ulduzuyam mən. Mən adlı-sanlı Heydər oğlu Əbu-Bəkrəm. Xanım Fatimeyi-Zəhranın göz nuru və diləyə yetənlərin başçısı olan Əli oğlu Hüseynin nökəri mənəm. Allaha şükür olsun ki, mənim rəhbərim odur və mən yalnız onun buyuruğuna boyun əyməkdəyəm. Onun razılığını qazanıb varlığımı uğrunda fəda etməyim mənim yeganə diləyimdir).*

Rəcəz ilk növbədə Həzrət Əli (ə) ilə bağlılığıyla seçilir. *Düldül* bu ulu din böyüyünün atının, *Zülfiqar* qılıncının, *Qənbər* isə qulamının adıdır. Zənnimizcə, islami cihadın ən böyük təzahürü olan bir döyüşdə Həzrət Əlinin (ə) anılması qətiyyən ötəri deyil. Çünki o, bəsit bir soy-nəsil anımı yox, hər şeydən öncə cihadın islami dərki məsələsinin bədii ifadəsidir. Deməli, burada Düldül hərbi təchizatı, Qənbər sədaqətli hərbi heyəti, Zülfiqar da dürüst hərbi mövqe seçməyi təmsil edir. Azacıq sonra adı çəkilən Hüseyn ibn Əli (ə) isə bütün bu qüvvə və resursları vahid komandanlıq altında birləşdirən müdrik sərkərdəyə işarədir.

Rəcəz məfkurəvi baxımdan da dolğundur. Bu, son iki beytdə daha çox görünür. Həmin hissədə qəhrəmanın imam seçiminə görə Tanrıya minnətdarlığını bildirməsi, şəhidlik diləyini dilə gətirməsi Kərbəla igidlərinin əqidəcə möhkəmliyindən də soraq verməkdədir.

Bununla belə, rəcəzin məzmununda məfkurəvi möhkəmliyin Əhli-beytdən qaynaqlanması fikri də aparıcı yer tutur. "İzzət səmasının ulduzu", "Adlı-sanlı Heydər"

.................................

177 *Yenə orada*



(Həzrət Əli), "Bətul" – "bakirə" (xanım Fatimeyi-Zəhra), "məşhur sərkərdə" (İmam Hüseyn) obrazlılıqları məhz bu fikrin ifadəsinə qulluq edir.

Maraqlıdır ki, rəcəzi belə geniş olan qəhrəmanın döyüşü əsərdə yığcam verilir. Füzuli yazır ki, az müddətdə düşmən qoşunundan 140 əsgər öldürdü və özü də 27 "zəxmi-mühlik" *(öldürücü yara)* aldı, "Axuril-əmr Übeydullah bin Ütbə zərbiylə dari-dünyadan intiqal etdi" *(dünya evindən köçdü),* "Rəhmətullahi-Əleyh" *(Allah ona rəhmət eləsin)*[178].

Lakin bunu qətiyyən şairin qəhrəmana biganəliyi kimi yozmaq olmaz. Bu, sadəcə olaraq, əsərin həcmini nəzərə alıb lakonikliyi gözləmək şərtindən irəli gələn ədəbi qanunauyğunluqdur. Əgər belə olmasaydı, Füzuli "iki daşın arasında" macal tapıb Kərbəla igidinin şəninə daha bir şeir deməzdi:

Darussəlam cilvəgəhin ixtiyar edüb,
Peyvənd kəsdi rişteyi-qeydi-zəmanədən.
Meyli-fəzayi-rövzeyi-mülki-bəqa qılub,
Şəhbazi-ruhi uçdu bu təng aşiyanədən[179].

*(Zəmanənin buxov ipindən bağlılığı kəsərək "salam evi"nin (cənnətin) cilvələnmə yurdunu seçdi o. Onun əbədi behişt fəzasına doğru yol alan ruh quşu bu dar yuvadan (dünyadan) uçub getdi).*

"Ruh" və "bu təng aşiyanə" deyimləri "Leyli–Məcnun" məsnəvisinin bir yerini xatırladır:

Ey ruh ki, cami-cəhl edib nuş,
Hübbi-vətən eylədün fəramuş.
Kim saldı səni bu təngi rahə?
Qandan düşdün bu damigahə?

.................................

[178] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.313*

[179] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.314*





Belə oxşarlıqlar "Leyli–Məcnun" ilə "Hədiqətü-s-süəda"nı, şairin başqa-başqa qəhrəmanlarını idrak və mənəviyyat üfüqlərində birləşdirdiyindən Füzuli dünyagörüşü ilə bağlı daha aydın anlayış əldə etməkdən ötrü də önəmlidir.

* * *

Əsərdə Həzrət Əlinin (ə) Ömər adlı oğlunun döyüşə girib intiqam hissi ilə Yezid qoşununun ucalan bayrağına həyəcan dalğası salması, igidlik göstərməsi, ən nəhayət, şəhid olması təsvir edilir. Ancaq Füzuli burada publisistik üslubu gözləyib, onun, bir rəvayətə görə, Kərbəlada olmamasından danışılmasına baxmayaraq, "Səhih rəvayət vardır ki, orada olmuşdur" deyə tarixi dəqiqləşdirmə aparır.

Əsər Həzrət Əlinin (ə) Osman adlı oğlunun şücaəti ilə davam edir. O, belə bir rəcəz oxuyur:

Mən gövhəri-meydani-vəfayəm,
Osmani-Əliyyi-Mürtəzayəm.
Taci-səri-aləməm və lakin
Xaki-rəhi-Şahi-Kərbəlayəm.
Tərk eyləmişəm fəna məqamın,
Mən talibi-dövləti-bəqayəm[180].

*(Mən vəfa meydanının incisi olan Əli oğlu Osmanam. Özüm dünyanın baş tacı olsam da, bütün varlığımla Kərbəla şahının qədəmləri altındakı toz-torpağam. Mən heçlik (ötəri yaşayış) barəsində düşünmürəm. Çünki artıq əbədi sərvət (axirət) ardınca düşmüşəm).*

Əsərdə qəhrəmanı Sinan bin Yezid Əbtəhinin öldürdüyü bildirilir. Füzuli bu igidə belə yas saxlayır:

Hər şəhidə göstərüb cənnətdə dövran mənzilin,
Aldı ol mənzil təmənnasində könlündən qərar.

.................................

[180] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.314*





İsmət əşcarın fəzayi-rövzədə ğərs etməgə,
Xakdani-dəhrdən bir-bir qopardı ruzigar[181].

*(İlahi təqdir hər bir şəhidə cənnətdəki yerini göstərməklə onun könlünü o səmtə yönəltmişdir. İctimai proseslər behişt sahəsində əkmək üçün məsumluq ağaclarını birər-birər dünya torpaqlığından qoparmışdır)*.

Şeirin məzmunu **"Allah şəhidləri qabaqcadan özünə tanıtdığı yerə aparır"** *("Muhəmməd", 6)* ayəsi üzərində qurulmuşdur. Belə ki, *"Hər şəhidə göstərib cənnətdə dövran mənzilin"* misrası ayəni mövzuca əhatə etdiyi kimi, sonrakı misralar sıra ilə kiçik süjet, fabula və nəticə xarakteri daşıyır.

"İsmət əşcarı" (məsumluq ağacları) ifadəsi isə birbaşa Əhli-beytdən olan İmam Hüseyn fədailərinə işarədir. "Bir-bir" ifadəsi ilə şair Peyğəmbər xanədanından çıxmış igidlərin ardı-arasının kəsilmədiyini, onların İmam Hüseyn (ə) eşqində sabitqədəm olduqlarını nəzərə çarpdırmaq istəmişdir.

Bölümün diqqətçəkən cəhətlərindən biri Kərbəla vaqeəsində Həzrət Əlinin (ə) adı xüləfayi-Raşidinin ilk üç xəlifəsinin adı ilə eyni olan üç oğlunun iştirakının təsvir olunmasıdır. Bu, bir neçə baxımdan maraqlıdır. Birincisi, tarixi gerçəklikdir ki, Həzrət Əlinin (ə) 16 oğlu, 18 qızı olmuşdur. İmam oğlan övladlarının üçünü Əbu-Bəkr, Ömər, Osman adlandırmışdır. Bəs bunun səbəbi nədir?

Bəllidir ki, Rəsulullahın (s) vəfatından dərhal sonra onun tarixi vəsiyyəti gözgörəsi pozulmuş və Həzrət Əlinin (ə) başı Peyğəmbərin (s) dəfninə qarışdığı zaman Əbu Bəkr xəlifəliyi ələ keçirmişdir. Bu qəsbkarlıq 24 il çəkmiş, Əbu Bəkr 2, Ömər 10, Osman 12 il xəlifəlik etmişdir.

İkincisi, belə açıq-aşkar ədəbsizliyə baxmayaraq, Həzrət Əli (ə) nəinki kin saxlamamış, hətta hər bir işdə xəlifələrə kömək etmişdir. Ömər ibn Xəttabın dəfələrlə "Əgər Əli olmasaydı, Ömər mütləq həlak olardı" deməsi bunun danılmaz dəlilidir.

.................................

[181] *Yenə orada*







*İmam Əli (ə)-ın müqəddəs məzarı. İraq. Nəcəf şəhəri*

Övladlarından üçünə xüləfayi-Raşidinin adını qoyması isə bu ulu din böyüyünün ürəyinin genişliyini göstərməklə yanaşı, ictimai məsələlərdəki ardıcıllığından da soraq verir. Ötəri deyildir ki, ata rəqiblərinin adlarını daşımalarına baxmayaraq, hər üç oğul Kərbəla düzündə Həzrət Əliyə layiq igidlik göstərmiş, Həzrət Hüseyni (ə) bir an belə tək qoymamaqla, doğrudan da, imamlıq bağının qollu-budaqlı ağacları olduqlarını sübuta yetirmişlər.

Əlbəttə, Əli (ə) dühasından xəbərsiz olanlar oğlanlarından üçünə xüləfayi-Raşididən ad qoymasını bu ulu din böyüyünün "siyasət"i saya bilərlər. Ancaq unutmaq olmaz ki, Həzrət Əli (ə) ən qəddar İslam düşməni Müaviyə ilə mübarizədə belə qətiyyən siyasət işlətməmiş, onu müvəqqəti olaraq gözləmə müddəti çağıranlara "Mən bir an da Müaviyənin iş başında qalıb müsəlmanlara zülm etməsinə yol verə bilmərəm!" cavabını vermişdi. Deməli, bu məsələdə siyasi faktor istər-istəməz aradan qalxmış olur.

Belədə Həzrət Əlinin (ə) üç oğluna xüləfayi-Raşididən ad verməsinin səbəbi yalnız səmimiyyət, xəlifələrə islami vəhdət naminə bəslədiyi səmimi münasibət faktoru özünü doğruldur.



Ən nəhayət soruşula bilər: məgər məsələnin bu tərəfi üzərindən sükutla keçmək olmazdımı? Əlbəttə, əgər Əhli-beytə, Həzrət Əliyə (ə), İmam Hüseynə (ə) və Kərbəla şəhidlərinə obyektiv yanaşma bu gün mövcud olsaydı, məsələnin bu tərəfinə toxunmamaq da olardı. Ancaq təəssüflər olsun ki, dinimizin tarixinə dair başlıca bilgilər çevrəsində indi də bir çox saxta və yalançı çək-çevirlər aparıldığından hələ ki belə cəhətlərə toxunmamaq olmur.

* * *

Füzuli Əvn bin Əlinin döyüş bacarığını ayrıca təsvir və tərənnüm edir. Belə ki, şair onun döyüş izni istəməsini də şeirlə verir. Əvn qardaşına belə üz tutur:

Ey fəzayi-rövzeyi-qürbin behişti-cavidan,
Padişahi-dinü dövlətsən, imami-insü can.
İxtiyari-xidmətin misbahi-əbvabi-nəcat,
İnqiyadi-taətin miftahi-əbvabi cinan[182].

*(Ey səninlə yaxınlıq bağçasının sahəsi əbədi cənnət olan, sən həm dinin və dövlətin idarəedicisisən, həm də insanların və cinlərin imamısan. Odur ki, sənin qulluğunda durmaq qurtuluş qapılarında yanan çıraq, sənin itaət buyuruqlarını yerinə yetrimək cənnət qapılarının kilididir).*

Göründüyü kimi, şeir büsbütün nət olub, bir fədakarın öz sərkərdəsinə söyləyə biləcəyi bütün öyüncü özündə birləşdirir. “Qürb” (yaxınlıq), “padişah” (idarəedici), “imam” (dini-dünyəvi rəhbər), “dinü dövlət” (fərdi və ictimai məsuliyyət şüuru), “insü can” (bütövlükdə bəşəriyyət), “misbah” (yolgöstərən), “miftah” (vasitə, vəsilə) epitetləri yalnız müqəddəs şəxsiyyətə aid edilə bilərdi. Ötəri deyildir ki, “ixtiyari-xidmət” və “inqiyadi-taət” tərkibləri forma və

.................................

182 *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.314*



üslubca Füzulinin Həzrət Muhəmmədə yazdığı nətlə yaxından səsləşir:

Sünnətin məxfirət-əsbabinə minhaci-vüsul
Taətin mərsiyət əmrazinə tədbiri ilac.

Parçanın ikinci beyti bir xeyli Rəsulullahın (s) İmam Hüseyn (ə) haqqında buyurduğu həqiqətən "Hüseyn hidayət çırağı və qurtuluş gəmisidir" hədisini də xatırladır. Bu isə şeirin nət olma hipotezini qüvvətləndirdiyi kimi, məfkurəvi yerinin möhkəmliyini də artırır.

Füzuli Əvni ayıq-sayıq və qorxmaz döyüşçü olaraq təqdim edir. O yazır ki, Əvn meydan izni aldıqdan sonra İmam Hüseynə (ə) deyir ki, bir tədbirim var; istəyirəm ki, özümü düşmən qoşununun qəlbinə – bayraq saxlanılan bölüyünə yetirim ki, bəlkə ordu ruhdan düşsün. İmam bunun çətin bir iş olduğunu söyləyir. O isə belə cavab verir ki, Ənqanın hücumu müqabilində hörümçək toru, selin qabağında da çör-çöp neyləyə bilər? O, bu tədbirini həyata keçirir. Bu zaman iki min döyüşçü ilə ibn Əhcar önə çıxıb onunla vuruşmağa başlayır. Şair bu döyüşü belə təsvir edir:

Tişeyi-Fərhad qəsdi-Bisütun eylər vəli,
Tişə ilə Bisütun daşı tükənməkdir məhal.
Mün´ədim olmaq nə mümkün, ləşkəri-murü məgəs,
Tutalum kim, əjdaha dəm urdu, Simürğ açdı bal[183].

*(Fərhadın külüngü Bisütun dağının qəsdinə dursa da, külünglə o böyüklükdəki dağın daşlarının bitib-tükənməsi çətindir. Qarışqa və milçək qoşununun qarşısında durmaq necə mümkün olar? Əjdahanın nəfəs almaqla, Simurq quşunun da qanad çalmaqla edəcəyi kömək də heç bir fayda verməz).*

.................................

[183] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.315*



Şeir əski inam-inanc sisteminin Kərbəla vaqeəsinə tətbiq edilməsi üzərində qurulmuşdur. “Fərhad külüngü”, “Bisütun” və “Bisütun daşı” ifadələri ənənəvi obrazlar olaraq klassik kitab üslubunun daşıyıcılarıdırsa, “qarışqa və milçək ordusu” və “əjdaha, Simurq” ifadələri folklor danışıq üslublu mifik təsəvvürlərin atribut və ekvivalentləridir. Deməli, Füzulinin gözündə Kərbəlada törədilən ümumbəşəri faciə, əslində, bütün insanlığın əzəli-əbədi dərdidir.

Şeiri izləyən nəsr bölümünün mürəkkəbliyi də buradan irəli gəlir.

Füzuli əhvalatı belə təsvir edir: “Şəhzadə ol haramzadələrdən qətl etdikcə qəlbi-ləşkərdən *(ordunun mərkəzindən –* **V.A.***)* müavinət *(yardım)* gəlüb, şəhzadəyə təhəccüm qılub, qəlbi-ləşkərə düxul *(ordu mərkəzinə daxil olma),* mütəəzziz olub, həzrəti-imamın şövqi-didari *(görüşünə duyulan eşq)* şəhzadənin inani-əzimətin *(niyyət cilovunu)* canibi-xeyməgaha *(çadırlara sarı)* mün’ətif qılub *(yönəldir),* dövləti-mülazimət *(görüş neməti)* müyəssər olduqda həzrəti-imam ana dualar qılub ayıtdı *(deyir)*: “Ey Əvn, cərahətlərin *(yaraların)* çoxdur. Bir zaman hərəmsərayə təvəccöh qılub *(az müddət üçün qadınların çadırına qayıdıb),* cərahətlərin bağladub, bir miqdar istirahət edüb, yenə meydanə gəl”.

Əvn ayıtdı: “Ey bəradəri-*büzürgvar (şanı uca olan qardaşım),* görürəm ki, saqiyi-kövsər *(cənnət saqisi)* bir cami-şərbət mühəyya qılıbdur *(bir şərbət qədəhi hazırlamışdır),* bana işarət etməkdədir. Vəhmim *(qorxum)* andandır ki, bən mütəvəccihi-rahət olduqda *(rahatlandıqda)* bu şərbət fövt olub təəttüşüm ziyadə ola və canımda Fərat suyundan ziyadə bu şərbətin təhəssürü *(həsrəti)* qala”.

Həzrəti-imam gördü ki, mə´n olunmaz *(onu çəkindirmək qeyri-mümkündür),* ayıtdı: “Ey Əvn, rikabındakı mərkəb *(altındakı minik)* cərahətlərdən zəbun olubdur *(yaraların çoxluğundan çox zəif düşmüşdür).* Ol Ədhəm ki Həzrəti-Əliyyi-Mürtəzadan sana inayət qılınmışdı, mübarəkdir, səfəri-



axirət üçün anı rikabi-hümayuna çək"[184] *(İmam Əlinin lütf edib sənə bağışladığı Ədhəm adlı atı axirət səfərindən ötrü şanlı tərkinə al. Çünki o, belə iş üçün çox bərəkətlidir).*

Əvn imamın dediyi atı minib döyüşə girdikdə Həzrət Əlinin xilafəti zamanı şəriət hökmlərini pozduğuna görə 80 taziyanə ilə cəzalandırılan və ürəyində kin saxlayan Saleh bin Yəsar intiqam almaq üçün onun qabağına çıxır, o da fürsət vermədən bir zərbə ilə onu öldürür. Əvn yeni döyüşçü istədikdə hər yandan oxa tutaraq şəhid edirlər".

Füzuli bu igidə belə yas saxlayır:

Kim ki girdi Kərbəla meydaninə, fürsət bulub
Nüzhəti-üqbaya təbdil etdi dünyanın qəmin.
Qayib oldu kim ki cüllabi-şəhadət qıldı nuş,
Aləmi-qeyb eylədi dövran şəhadət aləmin![185]

*(Kərbəla meydanına girib fürsət tapan hər kəs dünyəvi qəm-kədəri axirət savabına çevirmişdir, şəhidlik bulağından su içən kimsə isə öz mənliyindən keçmiş və ilahi mərhəmət sayəsində onun maddiyyat dünyası asanlıqla mənəviyyat aləmi ilə əvəz olunmuşdur).*

Şair bu ağıda Əvnin ucaldığı mənəvi yetkinliyi, qovuşduğu ruhi dincliyi, qazandığı etiqadi, ibadi və əxlaqi sarsılmazlığı tərənnüm edir. O, bundan ötrü, əslində, köklü fəlsəfi-irfani məfhumları şeirə gətirib onları bir Kərbəla igidinin şücaəti zəminində mənalandırır. "Dünyanın qəmini nüzhəti-üqbayə təbdil etməkdən, cüllabi-şəhadət nuş qılıb qaib olmaqdan, dövranın şəhadət aləmini, aləmi qeyb etmə"sindən danışmaq buradan irəli gəlir.

Əvnin "dünyanın qəmini nüzhəti-üqbayə təbdil etməsi" o deməkdir ki, o, Tanrı sınağından alnıaçıq, üzüağ çıxmaq üçün qarşısına çıxmış Kərbəla vaqeəsini fürsət bilmiş, onu

..................................

[184] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.315-316*

[185] *Yenə orada, səh.316*





lazımınca dəyərləndirməyi bacarmış və beləliklə də maddi-utilitar qayğıları "uf" demədən əzəli-əbədi axirət xoşbəxtliyi yönündə faydalı əmtəəyə çevirə bilmişdir.

Əvnin "cüllabi-şəhadət nuş qılıb qayib olması" o deməkdir ki, o, şəhidlik bulağından içməklə özündən, mənliyindən keçmiş, məşhur "əna niyyət"çilik dünyagörüşünü ayaqları altına almış və bu yolla da İmam Hüseyn məktəbinin layiqli yetirməsi olduğunu sübuta yetirmişdir.

Əvnin "dövranın şəhadət aləmini aləmi-qeyb etməsi" o deməkdir ki, bəlli müşahidə məqamı olan bu dünyanın məhdud həyatı Kərbəla igidliyi sayəsində sırf Tanrı qatı ilə bağlı olan ilahi aləmə çevrilə və yüksək batini şühud dərəcəsi kəsb edə bilər.

Ancaq bu deyimlərin təsəvvüfi örtüyə bürünməsi heç kəsi aldatmamalı, onların arxasında gizli qalmış islami dəyərlər unudulmamalı, bu dəyərlərin Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı baxımından qazandığı uca bəşəri keyfiyyətlər önə çəkilməlidir.

* * *

Füzuli, ən nəhayət, Həzrət Əlinin (ə) Əbdullah adlı oğlunun döyüşü haqqında yığcam bilgi verir. O yazır ki, ondan sonra Əbdullah ibn Əliyyi-Mürtəza (ə) imamdan icazə aldı, 180 döyüşçü öldürdü, Hani bin Süveybi-Həzrəmin zərbi ilə şəhid oldu. Şair bu igidə belə yas saxlayır:

Bargahi-qürbdə tərtib olub bəzmi-sürur,
Növbət ilə içdilər cami-tərəb fərzanələr.
Pənceyi-dövran şəhadət riştəsinə verdi tab,
Dövrlə bir-bir düzüldi riştəyə dürdanələr[186].

*(Tanrı qatında şadlıq məclisi təşkil edildiyindən könül ərləri layiq olduqları sıraya uyğun şəkildə ceviz qədəhi içdilər.*

..................................

[186] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 316*





*Dövranın iti pəncəsi şəhidlik sapını qırmaqdan ötrü gücünü topladı. Odur ki, dəqiqələr bir-birini izlədikcə Kərbəla igidləri birər-birər şəhidlik sapına düzüldülər).*

Şeirin incəliyi ondadır ki, burada eyni hadisəyə iki fərqli yanaşma biçimi vardır. Belə ki, "barigahi-qürb" *(Tanrı qatı)* "pənceyi-dövran" *(zəmanənin iti pəncəsi)* ifadələri elə zahiri səsləşmələrindən də daban-dabana zidd olan iki mövqeyi əks etdirir: birincisi ilahi təqdiri, qəzavü qədəri, ikincisi isə qəddar idarəedicilərı nəzərdə tutur. Bəs bu, şairə niyə gərək olmuşdur?

Bəllidir ki, bəşər övladı özünü dərk edəndən bəri baş verən hadisələrə müxtəlif bucaqlardan baxmış, hərdən öz acizliyini suçlamış, hərdən də hər şeyi taleyin hökmü kimi qiymətləndirmişdir. Bu, Kərbəla vaqeəsinə münasibətdə də belə olmuşdur. Bəziləri Kərbəla vaqeəsini tarixin dönüm nöqtəsi adlandırmış (Mahatma Qandi), bəziləri də bədəvi ərəb tarixinin yüzlərlə adi səhra döyüşündən biri (Nəriman Qasımoğlu) bilmişdir. Göründüyü kimi, baxış bucağı olduqca fərqlidir. Ancaq Füzuli kimi bəsirət sahiblərinin gözündə Kərbəla vaqeəsi ilk növbədə ilahi imtahanın parlaq təzahürü, Tanrı sınağının məhək daşı olub, insan kamalının uca zirvələrinin fəthi yolunda kamil insanların ata biləcəyi ən sərrast addımdır.

* * *

"Hədiqətü-s-süəda"nın 10-cu babının ikinci fəsli ilə bağlı üzərində durulmasına ehtiyac duyulan məsələlərdən biri də dini-mənqəbəvi anlayışların İmam Hüseyn sayğısı və sevgisi yönündə işlədilməsidir. Əslində, burada heç bir qəribəlik yoxdur. Çünki İslamın ən parlaq daşıyıcısı İmam Hüseyn (ə) olduğundan çeşidli anlayış və bilgilərin onunla bağlı işlənməsi də tamamilə təbiidir. Ancaq həmin anlayış və bilgilər Füzuli kimi ustadın qələmi ilə cilalandıqda biri o birindən daha parlaq obrazlılıqlar yarandığı üçün özlüyündə könül oxşayan və gözqamaşdıran sənət möcüzəsinə çevrilir.





**1.** Ədəbiyyatşünaslıqda "Hədiqətü-s-süəda"nı, adətən, yüksək dairələr, saray əyanları üçün yazılmış əsər sayırlar və əsərin dilinin mürəkkəbliyini, bir qayda olaraq, bununla bağlayırlar. Zənnimizcə, bu fikir tarixi planda obyektiv olsa da, ədəbi-mədəni baxımdan dəqiq deyildir. Çünki şair təvazökarlıq edib "türkdilli imamhüseynsevərlərin könlünü oxşamaq" istədiyini desə də, əslində, "Hədiqətü-s-süəda"nı ilk növbədə Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı haqqındakı gizli həqiqəti idarəedicilərin nəzərinə çatdırmaqdan ötrü yazmışdır. "Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri" bölümündə gətirilmiş dəlillər bunu görümlü biçimdə sübuta yetirir.

Bəs Füzuli niyə belə etmişdir? Füzulini belə davranmağa sövq edən başlıca amil İmam Hüseynlə bağlı mənəvi-əxlaqi dəyərlərin yaşadığı cəmiyyətdə lazımınca və layiqincə həyata keçirilməməsi, özünün həqiqi ictimai-siyasi qiymətini almaması olmuşdur. Məsələn, şair çox yaxşı görürdü ki, yüksək çinli məmurlar İmam Hüseynin quruca adından belə qorxur, zəvvarlarının çoxluğu onların ürəyinə çarpaz dağ çəkir. Odur ki, əsərin leksikonundakı təmtəraq və təntənəni yalnız əyan-əşraf zövqü və saray protokolu ilə bağlamaq heç vəchlə özünü doğrultmur.

**2.** Dini-mənqəbəvi anlayışların İmam Hüseyn (ə) saygısı və sevgisi yönündə işlədilməsi baxımından belə bir cəhət də maraq doğurur ki, o, Kərbəla igidlərinin mənəvi-əxlaqi yetkinliyini təmin edən başlıca örnəkdir. İmam Hüseynin kiçik qardaşı Əbu-Bəkri "imamlıq qızılgülünün qönçəsi" adlandırmasının qayğıkeş rəhbər və sərkərdə münasibəti olması, Əbu-Bəkrin düşmən önündə:

Bihəmdullah, oldur imamım mənim,
Anın taətin qılmışam ixtiyar! –





deyə öyünməsi Əvn bin Əlinin döyüş izni istəməsinin İmam Hüseyn (ə) haqqında nət səciyyəsi daşıması, İmam Hüseynin (ə) ona “Həzrət Əlinin (ə) lütf edib sənə bağışladığı Ədhəm adlı atı axirət səfərindən ötrü şanlı tərkinə al, çünki o, belə işlər üçün çox bərəkətlidir” məsləhətini verməsi buna danılmaz dəlildir.

**3.** Məsələnin əsərin bu bölümündəki qoyuluşu və həlli yönündə mürəkkəb insan mənəviyyatının şəriətlə bağlanılması da diqqəti çəkir. Saleh bin Yəsar adlı birisinin Həzrət Əlinin (ə) xəlifəliyi zamanında şəriət hökmlərini pozmasının, Əvnin də Həzrət Əlinin (ə) göstərişi ilə ona 80 taziyanə vurmasının ayrıca vurğulanılması, həmçinin Salehin buna görə ürəyində Əvnə kin saxladığının nəzərə çarpdırılması dini-mənqəbəvi anlayışların İmam Hüseyn (ə) sayğısı və sevgisi baxımından aldığı məfkurəvi səciyyədən soraq verir.

**4.** Burada üzərində durulmasına ehtiyac duyulan cəhətlərdən biri də qəhrəmanların Əhli-beytdən olması və dini müqəddəslərə aid keyfiyyətlərlə təsvir və tərənnüm edilməsidir. Bu, bir neçə baxımdan önəmlidir. Məsələn, bir o baxımdan önəmlidir ki, Əhli-beyt qətiyyən xüsusi imtiyaz ummur, əsla əlahiddə səlahiyyət təmənnasına düşmür. Əksinə, onlar sadə və səmimi biçimdə sıravi döyüşçü kimi özlərinin rəhbər və sərkərdələrinin başçılığı ilə cihad edirlər. Belə ki, İslamın cihad konsepsiyası onların qanına, canına hopmuşdur. Bu, təkcə rəcəzlərdə özünü göstərmir. Rəcəzlərlə yanaşı, şairin geniş təsvir və pafoslu tərənnümündə də Əhli-beyt igidlərinin mübarizliyi, döyüş texnikasını ruhi-psixoloji əqidə hazırlığından almaları aydın duyulur. Məsələnin başqa önəmi ondadır ki, “Busvatün hasənə” *(gözəl nümunə) (“Əhzab”, 21)* adlanan Quran modeli bu Əhli-beyt igidlərinin hər birinin həyat və fəaliyyətində bütün aydınlığı və genişliyi ilə özünü göstərir. Bu isə onların bir yandan İmam Hüseyni (ə) örnək götürdüklərini, bir yandan da özlərinin başqalarına layiqli nümunə olduqlarını təsdiq edir.





Beləliklə, aydın olur ki, əsərin 10-cu babının ikinci fəslinin burayadək olan bölümü özünün ideya-məzmun xüsusiyyətləri və bədii-estetik keyfiyyətləri ilə Füzulinin İmam Hüseynə (ə) və tərəfdarlarına bəslədiyi dərin sayğının və tükənməz sevginin parlaq bədii inikasıdır və orta yüzilliklər mədəniyyətimizin şanlı ənənələri üzərində yaradılan incə bir sənət incisidir.





# HÜRRÜN KƏRBƏLA HÜRRİYYƏTİ

Füzulinin öz İmam Hüseyn (ə) sevgisi ilə yoğurduğu fəsillərdən biri də qazandığı ad-sanla bu gün də milyonlarla imamhüseynsevərin dərin saygı ilə andığı Hürr ibn Yezid Riyahidir. Bütün salnamə və məqtəllərdə göstərildiyi kimi, bu Kərbəla igidi mürəkkəb mənəviyyata malik olmuş, dəruni hallar keçirmiş, öz duyğu və düşüncələrini hərtərəfli təhlilə çəkməklə haqq yolunu tapan kamil bir şəxsiyyətə çevrilmişdir. Ötəri deyildir ki, fəsil lirik təbiəti – şeirlərin və obrazlı təhkiyənin genişliyi ilə dərhal seçilir.

Oxucu Hürlə ilk dəfə Kərbəla karvanının Kufəyə doğru hərəkəti zamanı qarşılaşır. Əsərdə oxuyuruq: “Əlqissə, Həzrəti-imam mənzil-mənzil qət'i-rah edüb bəni-Sükun qəbiləsinə yetdikdə, Bəni-Əkrəmədən bir şəxsə uğruyub andan Kufə əxbarın sual etdikdə ayıtdı: "Ya imam, Übeydullahi-Ziyad sənin qəsdinə hər canib ləşkər rəvan edüb təfəhhüsündə və təcəssüsündədir. Səlah oldur ki, müraciət qılasan. Həqqa ki, təvəccöhün tiği-abdar və sinani-xunxardır və müxalifin qayətdə cəfapişə və sitəmkarədir".

Ol nəhəngi-dəryayi-vilayət və şiri-bişeyi-siyasət ol xəbərdən təvəhhüm etməyüb bəlkə şövqü zövqi-şəhadət hiddətin ziyadə qılub rəvan oldu. Əmma rahdarlar və casuslar Həzrəti-imamın bəni-Sükun qəbiləsinə yetüb, andan dəxi rehlət edüb və hiddəti-'əzimətin görüb Übeydullahi-Ziyada xəbər verdilər. Ol müdbir Hürr bin Yezidi-Riyahiyə əmr etdi ki,



bin müsəlləh namərdlə istiqbal qılub Həzrəti-Hüseyni qanda görsələr, nə vəchlə olsa, qeyr canibin təvəccöhündən mən' edüb Kufəyə gətürə. Hürr bin Yezid ol ləşkərlə badiyəpeymay və səhranəvərd olub, mənzil-mənzil Hüseyni mütalibət edüb, tərəddüd qılub, Səddi-ab deməklə mə'ruf mənzilə yetüb, ol mənzildə aram dutub müntəzir ikən Həzrəti-İmam mənzilindən gecə ilə köçüb bədrəqeyi-əxtəri-əşki-qəmənduz və məş'əleyi-ahi-cigərsuzla sabahadək qət'i-rah edüb. Şe'r:

Sübh kim, xəlqi xazini-hikmət
Sirri-pünhandan eylədi agah,
Çərxi-zalimnihadü kafirkiş
Qıldı bütxanəsini atəşgah.

Ol padşahi-bütşikəni-atəşxanəfikən və ol şahbazi-düzmən-şikari-ülvinəşimən qayəti-isti'caldan ixtiyari-nüzul etməyüb, aftabvar rayəti-rif'ət asimana çəküb və səhabi-müjgani-dürəfşandan zaman-zəman rəhgüzara barani-rəhmət töküb yürürdü ol zəmanədək ki, əczayi-zəmin irtifa'i-xurşiddən kəsbi-zərarət qılub və bazari-səmumü sərab hiddəti-həvadan rəvacü rövnəq bulub rif'əti-aftab zəvala mütəvəccih oldu və hey'əti-rüzgar fərti-hərarətdən təğəyyür buldu. Şe'r:

Qayəti-hiddət verüb suhani-nəqşi-riglə,
Dəhr cəlladı həva tiğini xunriz eylədi.
Səfheyi-səhrada surət göstərib sudan sərab,
Təşnə təb'ində tə'əttüş atəşin tiz eylədi.

Dəbdəbeyi-tə'zimü təbcil və zəmzəmeyi-təsbihü təhlillə təlieyi-sipahi-zəfərpənah mənzili-Səddi-aba yetüb Hürr bin Yezidi-Riyahinin ləşkərinə mülhəq oldular. Və Hürrün ləşkəri dəxi bir səhrada düşüb hər biri kəndü sayeyi-mərkəbində qərar dutmuşkən səlabəti-əsakiri-zəfərməasirdən ehtizaza düşüb, mərkəblərinə binüb, səf çəküb müqabilə gəldilər. Təhqiqi-hal etmək üçün sultani-Kərbəladan ol ləşkər sipəhsaları ehzarinə





fərman sadir olduqda Hürr bin Yezidi-Riyahi ehtirazü ictinab etməyib, rikabi mülazimi-humayun olub ərzi-hal etdi bu rəsmlə ki. Şe'r:

Ey sücudi-dərgəhin sərmayeyi-dünyavü din,
Şəmseyi-eyvani-qədrin hilyeyi-'ərşi-bərin.
Xadimi-xəlvətsərayi-ta'ətin zikri müdam:
Hazihi cənnati' ədnin fədxuluha xalidin.

Ya Əmirəlmö'minin, İslam səndəndür dürüst,
Ya Əmirəşşər', sənsən rəhbəri-əhli-yəqin.
Yetməsün məqsudinə hər kim sənə eylərsə qəsd,
Görməsün rahət yüzin hər kim sənə bağlarsa kin.

Həzrəti-imam anın ismin və rəsmin sual etdikdə ayıtdı: "Ya imam, bənəm Hürr bin Yezidi-Riyahi". Həzrəti-imam ayıtdı: "Ya Hürr, "İləyna əm əleyna", yə'ni müavinətə gəlmişsən, ya müharibəyə? Hürr ayıtdı: "Ya imam, Übeydullahi-Ziyaddan mə'muram ki, mülazimətində olam Kufəyədək və sənə qeyr canibə getməgə təmkin verməyəm". Həzrəti-imam ayıtdı: "La-həvlə və la-quvvətə illa billahil Əliyyil-əzim". Ey Hürr, hala nəmaz vəqtidir, sən cəma'ətünlə və biz cəma'ətimizlə nəmaz edəlüm, andan sonra qanda getməlü isə, gedəlüm". Hürr ayıtdı: "Ya ibn Rəsulullah, sən imami-zəmansan, imamət qıl, iqtida qılalum". Şe'r:

Sana istərəm kim, qılam iqtida,
Budur aləm içrə həman niyyətim
Ki, bildim səni müqtəda, bilməsəm,
Qəbul eyləməz Həqq bənim ta'ətim.

Həzrəti-imam ana afərin oxuyub ittifaqla nəmaz qıldıqdan sonra xatibanə şəmşiri-abdarinə təkyə qılub həmdü sənaya müştəmil və dürudü duaya möhtəvi bir xütbeyi-bəliğ əda qıldıqdan sonra əhli-Kufəyi müxatəb edüb, möv'izeyi-



xütbəsin bu kəlimatla müzəyyən qıldı ki, “ey ümməti-Məhəmməd”, “Cə'ələ Əllahu ət-təvfiqə rəfiqəkum», əgərçi bənim rəqəbeyi-iqtidarım Yezidin ribqeyi-inqiyadinə girmək münasib görünməyüb, anın ita'əti-naməqbulindən inhiraf etdigim dərəceyi-vüzuha yetmişdi, siz ki əhli-Kufəsiz, mütəvatir namələr irsal edüb və asari-məhəbbət və məvəddət ərz eyləyüb “imamımız və müqtədamız yoxdur” deyüb bənim hüzurimi lazım etdinüz, imdi əgər həm ol qərar üzrəsiz, bən bana lazım olan əmrə iqdam etdim. Siz dəxi sizə lazım olan məsləhəti sərəncam edin və əgər əziməti-mülki-səadətdə xari-səhrayi-tə'əllüq daməni-himmətiniz dutub peşiman oldunuz isə, xari-rəhgüzarım olman, gəldigüm kibi müraci'ət qılayım. Zira bən bu diyara gəlüb cidalü qitali kəndü rə'yimlə ixtiyar etməmişəm və razı degiləm ki, səbəbi-[səfki]-dima' olam”. Hürr ayıtdı: “Ey Hüseyn bin Əli, bənim namələrdən xəbərim yoxdur”. Hüseyn ayıtdı: “Sənin yoxsa, ləşkərində xəbəri olan çoxdur”. Pəs buyurdi ki, ol namələri bə'zi hazır olanlara göstərüb infi'al verdilər. Şe'r:

Ey xoş ol dəm ki, nameyi-ə'mal
Qafili vaqifi-günah eylər.
Məhəki-imtəhan olub zahir,
Nəqdi-məqşuşi rusiyah eylər.

Bu hala müqarin canibi-Kufədən altı namərd isti'calla gəlüb Übeydullahi-Ziyaddan Hürrə bir namə gətürdilər, məzmunu bu ki: “Ey Hürr, nə mənzildə ki Hüseynə mülhəq olasan və mülaqat qılasan, gərəkdir ki, ana müvəkkil və müsəllət olasan, bu canibə gətürəsən”. Hürr ol məktubu mütali'ə etdükdə Həzrəti-imama göstərüb ayıtdı: “Ey nəqdi-Rəsulullahi-Haşimi, mülahizə qıl ki, sənin xüsusunda Übeydullahın nə miqdar ehtimamı var. Və bən heyrətdəyəm ki, aya, nə tədbir qılam? Əgər səni müaf etsəm, Übeydullahdan vəhm eylərəm və əgər sənə qəsd eyləsəm, Mə'budimdən xövf edərəm. Əmma Allah xövfü Übeydullah vəhminə qalibdir. Qələm olsun ol





pənceyi-namübarək ki, sən kibi pənceyi-afitaba şü'ai-şəmşiri-atəşparə çəküb, zülməti-üsyanla kəndü ruzigarın siyah edər və 'ədəm olsun ol nacəvanmərdin mənzili ki, sən kibi kamil vücuda zəxarifi-dünya üçün qəsd edüb, vəsvəseyi-şeytanla kəndü əhvalın təbah edə. Həqqa ki, bu canibə gəldikdə, yolda heç xarü xaraya yol qomadım ki, bana zəbani-halla müjdeyi-şəhadət vermədi və heç nəsim bəndən yana güzar etmədi ki, bana bəşarəti-behişti-bərin yetürmədi. Və mən heyrətdəyəm ki, aya, bu nə əməl cəzasıdır, bən xud müqatileyi-Ali-Rəsula mə'muram. [Əmma] ümiddir ki, müqatilə mürafiqətə mübəddəl ola və Həqq dövləti-mütabiətinizdə bana səadəti-nəcat müyəssər qıla. Hala bənimlə müxalifət olmağın səlah budur ki, mütəhhərati-hücərati-ismət bəhanəsiylə sizün orduyi-hümayuniniz bizim əskəri-şərarət əsərimizdən bir mərtəbə müba'ədət ixtiyar edüb nüzul edələr, zülməti-şəb müstövli olduqda irtihal edüb nə canibə murad isə rəvan olun ki, sabah olduqda bən ləşkəri xilaf səmtə çəküb, səhrada bir zaman tərəddüd edüb, "bulmadum" deyüb müraci'ət qılam və bu mə'siyətdən nəcat bulam".

Həzrəti-Hüseyn əsrari-hikmət izhar üçün ol səlahi münasib görüb nüzul etdikdə, bir miqdar anlardan bə'id olmaqla anlar xabi-qəflətdə ikən nisfi-leyldə orduyi-humayunun köçürüb canibi-Məkkeyi-mü'əzzəməyə rəvan oldu. Qaliba ol gecə ərusi-aləm şühəda üçün tə'ziyət iste'dadində olub, gisuyi-müşkbarində rüxsarın nihan etmişdi və şəhidlər və məzlumlar iztirabın görüb dudi-ahi-zəmin daməni-asimanı dutmuşdu. Əlqissə, bir zülməti-məhibi-cansitandı kim, badiyeyi-dəhşətdə Xizri-xirəd sərgərdan idi. Nə mahü sitarədən nişan peyda və nə sübhü afitabdan əsər hüveyda. Anın kibi zülmətdə ol məzlumlar 'inani-ixtiyar qayidi-qəzaya təslim edüb, təmam gecə ciddü cəhdlə qət'i-rah qılub, sübh olduqda mərkəbi-şəhsuvari-meydani-şəhadət bir hövlnak mənzildə təvəqqüf edüb, andan ilərü getməgə təqdirdən rüxsət bulmadı və Həzrəti-imam nə qədər ki taziyanə urub mütərrik etmək istədi, fayda qılmadı[187].

.................................

[187] *Füzuli, Əsərləri, VI cild, səh.253-256*





“Casuslar imamın bəni-Sükun qəbiləsinə çatdığını və oradan da artıq tərpəndiyini ibn Ziyada xəbər verdilər. O ləin Hürr ibn Yezid Riyahiyə əmr etdi ki, min nəfər silahlı götürüb İmam Hüseyn əleyhissəlamın qarşısına çıxsın və necə olursa-olsun onun dəstəsinin yolunu Kufə səmtinə yönəltsin. Hürr əsgərlərini götürüb səhra və biyabanlarda İmam Hüseyni izləməyə başladı və Səddi-ab deyilən məşhur bir mənzilə yetişib orada aram tutdu”.

*Hikmət xəzinədarı sübh çağı insanları gizli sirdən xəbərdar edər-etməz zülmkar təbiətli və kafir xislətli çərx (təbii-fiziki müstəvidə zaman, ictimai-siyasi müstəvidə isə dövrün hakim dairələri) özünün bütxanasını atəşgaha çevirdi – gecənin yerini gündüz tutdu, yaxud öz çirkin niyyətinə bər-bəzək vurmaqla onu cəlbedici etdi.*

İmamın (ə) dəstəsi Səddi-aba yetib, Hürr ibn Yezid Riyahinin qoşunu ilə qarşılaşdı. Bu zaman səhrada istinin şiddətindən Hürrün əsgərləri miniklərinin kölgəsinə çəkilmişdilər. İmamın (ə) dəstəsini görən kimi tez sıçrayıb ayağa qalxdılar və atlarını minib həzrət imamın (ə) qarşısına sədd çəkdilər. Bunun səbəbini öyrənmək üçün imam (ə) Hürrün hüzuruna adam göndərdi. Hürr özü imamın (ə) hüzuruna gəlib belə bir tərzdə ərz-hal etdi:

*Sən ey qapısı qarşısında dünyəvi və dini sərvətlərin baş əydiyi və qədir-qiymət eyvanında parlayan günəş, ən uca cənnət bağının bəzəyinə çevrilən kamil şəxsiyyət, sənin gizli itaət otağının xidmətçisinin zikri Qurani-Kərimin “bunlar Ədn cənnətləridir, əbədi olaraq qalmaq üçün oraya daxil olun!” ayəsidir. Ey möminlər əmiri, İslamiyyət yalnız sənin vasitənlə özünün doğru-düzgün təbiətini qoruyub saxlamışdır. Ey şəriət başçısı, yəqinlik zirvəsinə yüksələnlərin həqiqi öndəri yalnız sənsən. Odur ki, sidq-ürəkdən deyirəm: “Sənə qıyan kimsə heç məqsədinə çatmasın, sənə kin bəsləyən şəxs isə bir daha rahatlıq üzü görməsin!”*

Həzrət imam (ə) onun adını soruşduqda cavab verdi: “Mən Hürr ibn Yezid Riyahiyəm”. Həzrət imam (ə) dedi: “Ya Hürr,





ileynə, əm ’əleyna, yəni köməyə gəlmisən, ya müharibəyə?” Hürr dedi: “Ya imam, məni ibn Ziyad göndərib ki, sənin qarşına çıxım və Kufəyə yetişənə kimi sənə qeyri bir yerə dönməyə imkan verməyim”. İmam (ə) buyurdu: “La-həvlə və la quvvətə illa billah, yəni Allahdan başqa güc və qüvvət sahibi yoxdur! Ya Hürr, indi namaz vaxtıdır və biz dəstələrimizlə birlikdə namaz qılaq. Sonra hansı səmtə lazımsa gedək”. Hürr dedi: “Yəbnə Rəsulullah, sən imami-zamansan, imamlıq et, biz də iqtida qılaq...”

Həzrət İmam Hüseyn əleyhissəlam ona “Afərin!” söyləyib qılıncına söykəndi, həmdüsəna ilə başlayan bir dua əda edib, Kufə əhlini nəzərdə tutaraq bəlağətli bir xütbə oxudu: “Ey Məhəmməd ümməti, “cə'əl əllahu ət-tövfiqə rəfiqəkum”, Allah yardımını sizə yoldaş eyləsin. Mənim Yezidin hökmünə boyun əyməyimin münasib olmadığını bilib siz Kufə əhli namələr göndərərək bey’ətə girmək istədiniz. Və yazmışdınız ki, “imamımız və müqtədamız yoxdur”, bizim tərəfə təşrif gətir. Mən sizin dəvətinizlə buraya gəldim. Siz də sizə lazım olan məsləhəti sərəncam edin. Əgər peşmansınızsa, mənim qarşımı kəsməyin, gəldiyim kimi də geri qayıdım. Çünki mən bu diyara gəlməyi və cəngü cidal etməyi öz rə’yimlə ixtiyar eləməmişəm və razı deyiləm ki, qan tökməyə bais olam!” Hürr dedi: “Ya Hüseyn ibn Əli, mənim o namələrdən xəbərim yoxdur”. Hüseyn əleyhissəlam buyurdu: “Sənin xəbərin yoxdursa da, ləşkərində bundan xəbəri olan çoxdur”. Sonra buyurdu ki, o namələri oradakılara göstərsinlər.

*Əməllər dəftərini, qafil kimsəni öz günahlarından dəlil-sübutla xəbərdar edəcəyi an necə də maraqlı olacaqdır. Məhz o an sınaq ölçüsü ortaya çıxaraq suçluya necə də əliboş, üzüqara olduğunu göstərəcəkdir!*

Elə bu zaman Kufə səmtindən altı nəfər namərd gəlib ibn Ziyaddan Hürrə belə bir namə gətirdilər: “Ey Hürr, harada Hüseynə rast gəlsən, ondan əl çəkmə və hökmən onu Kufəyə gətir”.

Hürr məktubu oxuyub həzrət imama (ə) göstərdi və dedi: “Ey Rəsul övladı, bax gör ibn Ziyad sənin haqqında





nə yazır. Mən çaş-baş qalmışam ki, nə tədbir görüm. Əgər səni müdafiə etsəm, ibn Ziyaddan qorxuram. Sənə qəsd etsəm, Mə´budumdan xövf edirəm. Amma Allah qorxusu ibn Ziyadın qorxusundan üstündür. Qələm olsun o namübarək əl ki, sənin kimi şahzadəyə qılınc çəkib öz ruzgarını qara edər. Bir də dağılsın o igidin yurdu ki, sənin kimi bir kamil vücuda dünya malından ötrü qəsd edər. Doğrusu, bu tərəfə gələndə hər şey mənə behişt nişanələrini göstərdi. Heyrətdəyəm ki, bu, hansı əməlin cəzasıdır ki, mən indi Ali-Rəsulun qatili olmağa hazırlaşmışam?! Amma ümidim var ki, qatillik yoldaşlıqla əvəz oluna və sizin tabeliyinizdə mənə nicat səadəti müyəssər ola. Məsləhət budur ki, sizin ordunuz bizim əsgərlərdən bir az aralı getsinlər və axşam düşərkən başqa bir səmtə yönəlsinlər. Biz isə qəsdən başqa bir tərəfə yönələr və səhər olanda gedib ibn Ziyada "Onları tapa bilmədik" deyərəm".

Həzrət Hüseyn əleyhissəlam hikmət sirlərini izhar etmək üçün o məsləhəti münasib bildi və onlar qəflət yuxusunda ikən gecə yarısı öz ordusunu götürüb Məkkeyi-Müəzzəmə səmtinə üz tutdu. Lakin həzrət imam əleyhissalam öz atına nə qədər qamçı vurdusa, at yerindən tərpənmədi"[188].

Doğrudur, biz bu parçanı Hürrün əsərdə adının ilk dəfə çəkilməsinə örnək olaraq gətirdik. Ancaq parçanın özündə birləşdirdiyi ideya-bədii keyfiyyətlər təkcə Hürrün deyil, elə İmam Hüseynin (ə) də ruhi-mənəvi aləmini açmaqdan ötrü çox önəmli olduğundan buradakı bəzi cəhətlərin üzərində ayrıca dayanmalı oluruq.

Üzərində durulmasına ehtiyac duyulan ilk cəhət Hürrün birbaşa ibn Ziyada tabe olmasıdır. Əsərin başlanğıcından Yezidin öz vəziri Sərxunun məsləhəti ilə ibn Ziyadı Bəsrədən götürüb Kufəyə vali təyin etdiyini bilirik. Bu isə Hürrün xilafətdə çox etibar edilən bir sərkərdə olduğunu göstərir. Mətnin şeirlərlə bəzədilməsi, təhkiyənin xüsusi üslubu Füzulinin bu cəhəti qabartmağa ayrıca fikir verdiyini sübuta

.................................

[188] *Füzuli. Kərbəla vaqiəsi, səh. 62-64*





yetirir. Əgər belə olmasaydı, parçanın başlanğıcında elə bir ciddi ehtiyac duyulmaya-duyulmaya sübh haqqında şeir verilməzdi.

Ümumiyyətlə, “sübh” anlayışı müsəlman mədəniyyətinin çox işlək və çevik motivləri sırasında ən öndə gəlir. Bunun başlıca səbəbi anlayışın Qurani-Kərimdə son dərəcə fəal olmasıdır. Belə ki, Ulu Yaradan Şanlı Kitabında dəfələrlə sübhə and içmiş *(“Təkvir”, 17-18),* sübh namazını ayrıca qeyd etmişdir *(“İsra”, 78).* Rəsulullahın (s) “sübh yuxusu ruzinin qarşısını alar” səpkili hədisləri şəri göstərişlərlə yanaşı, ədib və filosofları da düşündürərək çeşidli bədii-idraki fikirlər də doğurmuşdur. Füzulinin “Müxtəsər türki divanı”ndakı – türkcə yığcam şeirlər toplusundakı “Sübh” rədifli iki qəzəlin sadəcə mütaliəsi belə bu barədə aydın anlayış yaradardı.

Əsərdə sübh haqqında şeirin verilməsi olduqca maraqlı bir qeydlə müşayiət olunur. Bildirilir ki, Hürr öz əsgərləri ilə birlikdə İmam Hüseynin (ə) dəstəsini axtara-axtara gəlib Səddi-ab adlı bir yerə çatır.

“Səddi-ab” – *su sərhədi, suyun önünün kəsildiyi bənd* deməkdir. Bu isə nəinki assosiativ biçimdə, hətta son dərəcə nominativ surətdə Kərbəla vaqeəsini, onun su amili ilə bağlı qatını andırır. Füzuli deyir:

Sübh kim xəlqi xazini-hikmət
Sirri-pünhandan eylədi agah.
Çərxi-zalimnihadü kafirgiş
Qıldı bütxanəsin atəşgah.

“Xazini-hikmət” *(hikmət xəzinədarı)*, heç şübhəsiz, Allah-taaladır. “Xəlq”, ümumiyyətlə, bütün insanlar, ayrıca götürüldükdə isə Hürrün ordusudur. Belədə “sirri-pünhan” *(gizli sirr)* İmam Hüseynin (ə) öz dəstəsi ilə birlikdə aşkar edilməsi anlamına gəlir. “Çərx”in “zülmkar təbiətli, kafir xislətli” epitetləri ilə əsərə gətirilməsi onunla birbaşa ibn Ziyadın və onun buyuruq qulu olduğu Yezid hakimiyyətinin





göz önündə tutulduğunu göstərir. Deməli, ilk baxışda təbiət təsvirinin təsirini artırmaq üçün yazıldığı düşünülən sadə bir şeir parçası ilə belə Füzuli özünün İmam Hüseyn eşqini dilə gətirmiş, Kərbəla şəhidlərinin alıb-verdikləri hər nəfəsin ondan ötrü son dərəcə önəmli olduğunu bir daha vurğulamış, onların qatillərini bağışlamağın bəşəriyyətin ən böyük səhvi olacağına inanmışdır. Parça bu baxımdan:

Ey Füzuli, şami-ğəm əncaminə yoxdur ümid
Bir təsəllidir sənə ol söz ki, derlər var sübh! –

beyti ilə yaxından səsləşir. Bu isə həmin beytin özlüyündə başqa mənalara gəlməsinə baxmayaraq, onun fikri axarını və bədii tutumunu "Hədiqətü-s-süəda"ya qovuşdurduqda Kərbəla şəhidləri üçün saxlanılan matəmdən də uzaq olmadığını göstərir. Ötəri deyildir ki, çağdaş filologiya Kərbəla şəhidlərinin ruhi-mənəvi aləm baxımından şairin lirik qəhrəmanı, daxili "mən"i ilə üzvi uyarlıq təşkil etdiyini təklif etmişdir; məs.: "Hədiqətü-s-süəda" qəhrəmanları bir sıra xüsusiyyətlərinə görə Füzulinin türkcə divanındakı qəzəllərin lirik qəhrəmanlarına bənzəyir. Bu qəhrəmanlar da Füzulinin lirik qəhrəmanı kimi dərin kamal və yüksək əqidə sahibləri – müdrik, kamil və yetkin insanlardır. Belə insanlar tutduqları yoldan dönmür, həyatın mənasını İlk və Əzəli Varlıq saydıqları Allaha qovuşmaqda görür, bu yolda canlarından belə keçməyə hər an hazır olurlar"[189].

"Hədiqətü-s-süəda" qəhrəmanları pak və müqəddəs şəxsiyyətlərdir. Onlar ilahi məhəbbəti dünyəvi məhəbbətdən, axirət dünyasını fani dünyadan üstün tutan insanlardır"[190].

Alim çox doğru olaraq Füzuli irsinə bütöv yanaşmış, onu vahid bir orqanizm kimi götürərək şairin üz tutduğu mövzular arasında yersiz fərq qoymaqdan qaçmış və beləliklə də istər

.................................

[189] *Nağısoylu M. Göstərilən əsəri, səh. 71*

[190] *Yenə orada, səh.77*





dini-tarixi, istərsə də ədəbi baxımdan tamamilə obyektiv mövqe tutmağı bacarmışdır. Ədalət naminə deyilməmiş qalmasın ki, yanaşma biçimi yönündə o, Əliyar Səfərli ilə Azadə Rüstəmovadan irəlidədir. Ancaq onların da fikirlərinin çoxu əsaslı və dəqiqdir. Aşağıda Hürrün keçirdiyi dəruni təbəddülatlardan, gərgin yaşantılardan danışarkən yuxarıdakı filoloji qeydlər bir daha təsdiqini tapacaqdır.

Yuxarıdakı parçada diqqəti çəkən ikinci cəhət Hürrün özünün İmam Hüseynin (ə) yanına gəlməsi və onunla olduqca mehriban və qayğıkeş davranmasıdır. Yəqin, elə bunun üçündür ki, Füzuli Hürrün sözlərini birbaşa poeziya ilə verir. Əlbəttə, şeirin leksikonu personaj dilindən çox müəllif dilidir. Yoxsa Hürrün İmam Hüseynə (ə) "sərmayeyi-dünyavü din" – *dünyəvi və dini fəaliyyət nəticəsində qazanılan sərvət,* "hilyeyi-ərşi-bərin" – *ən uca ərşin bəzəyi,* "Əmirəlmöminin" – *inananların ağası, "*əmir əş-şər'" – *şəriət rəhbəri* deyə üz tutması inandırıcı olmazdı. Ancaq gələcək Kərbəla igidinin göstərəcəyi şücaəti göz önünə gətirdikdə müəllif dilinin bu obrazlılığına istər-istəməz haqq qazandırmalı olursan. Çünki mürəkkəb mənəviyyatlı bir insan olan Hürrün ruhi-psixoloji gərginliyi, haqla batil arasında tərəddüddə qalması bədii estetikanın tələbatı olmaqla yanaşı, köklü həyat həqiqətlərinə də söykənirdi. Odur ki, Hürrün İmam Hüseynə (ə) müraciətinin:

Yetməsin məqsudinə hər kəs sənə eylərsə qəsd,
Görməsin rahət yüzün, hər kəs sənə bağlarsa kin!–

şəklindəki qarğışla, bəddua ilə bitməsi tamamilə təbiidir.

Parçanın toxunulması lazım gələn növbəti cəhəti İmam Hüseynlə (ə) Hürrün mükaliməsidir. Ona görə ki, çox vaxt təklikdə – monoloqda açılmayan xarakterlər əksər hallarda dialoqda açılır. Heç şübhəsiz, bu gerçəklik iri və sanballı nəsr əsərləri olan Füzuliyə də bəlli idi.

İmam Hüseyn (ə) Hürdən adını soruşur. Əsərin irəliləyən bölümlərində biz bu ulu din böyüyümüzün "Hürr" sözünə



verdiyi tarixi qiyməti görəcəyik. Ancaq indilik belə bir ştrixə toxunaq ki, İmam Hüseynlə (ə) mükalimə zamanı Hürr damla-damla əriyir, hissə-hissə təzələnir, kəlmə-kəlmə yeni ruhi dinclik qaynağına doğru addımlayır.

İmamın "Ya Hürr, köməyə gəlmisən, yoxsa müharibəyə" sualına Hürr bəsit sərkərdə cavabı verir ("Ya imam, məni ibn Ziyad göndərib ki, sənin qarşına çıxım və Kufəyə yetişənə kimi sənə qeyri bir yerə dönməyə imkan verməyim"). Ancaq İmam Hüseynin (ə) bu bəsit sərkərdə cavabına bəlli İslam şüarı ilə qiymət verməsi Hürrü sarsıdır və az qala bu ulu din böyüyünün pərəstişkarına çevirir. Odur ki, o, İmam Hüseynin (ə) namaz vaxtını xatırlatmasına nəinki müsbət yanaşır, hətta camaat namazı qılmağı belə təklif edir. Və Kərbəla sərvərinin "Afərin!"ini qazanır. Yəqin, elə buna görədir ki, Füzuli öz qəhrəmanının növbəti cavabını da poetik nümunədə əks etdirir. Hürr İmam Hüseynin (ə) namaz çağırışına belə cavab verir: "Ya Rəsulullah, sən imami-zamansan, imamlıq et, biz də iqtida qılaq".

Sana, istərəm kim, qılam iqtida,
Budur aləm içrə həman niyyətim
Ki, bildim səni müqtəda, bilməsəm
Qəbul eyləməz Həqq mənim taətim.

Əlbəttə, burada təfərrüata varıb *iqtida-müqtəda, niyyət, Həqq, taət* sözləri üzərində ayrıca dayanaraq onların etiqadi, ibadi və əxlaqi semantikasına toxunmaq da olardı və bu, qətiyyən yersiz də sayılmazdı. Ancaq Füzuli təhkiyəsinin yüyrəkliyi indiki halda bizi belə ədəbi axtarışdan çəkindirdiyindən mətləbdən uzaqlaşa bilmərik.

Parçada diqqət ayrılması önəmli olan dördüncü cəhət İmam Hüseynin (ə) xütbəsidir. Ona görə ki, bu xütbə Hürrün daxili aləminin açılması üçün də önəmlidir. Belə ki, o ulu din böyüyü "Mənim Yezidin hökmünə boyun əyməyimin münasib olmadığını bilib siz Kufə əhli namələr göndərərək



beyətə girmək istədiniz. Və yazmışdınız ki, imamımız və müqtədamız yoxdur, bizim tərəfə təşrif gətir" buyurduqda Hürr özünün həmin məktublardan xəbəri olmadığını bildirir, imam (ə) da cavab verir ki, "sənin xəbərin yoxdursa da, ləşkərində bundan xəbəri olan çoxdur" və tapşırır ki, həmin məktubları hər iki tərəfin adamlarına göstərsinlər.

Füzuli burada da çevik davranaraq dərhal məqamı tutur və gözlənilmədən əməl dəftəri kimi mühüm islami anlayışı əsərə gətirir:

Ey xoş ol dəm ki, nameyi-ə'mal
Qafili-vaqifi-günah eylər.
Məhəki-imtəhan olub zahir,
Nəqdi-məqşuşi rusiyah eylər!

Heç şübhəsiz, "əməl dəftəri" anlayışı İslamiyyətin nəinki din kimi, ictimai şüur forması kimi də həqiqi mahiyyətini əks etdirir. Çoxsaylı ayələr bu anlayışın həyatın bütün sahələri üzrə qazandığı geniş və dərin ictimai-siyasi, iqtisadi-mədəni, mənəvi-əxlaqi, hüquqi-fəlsəfi, etik-estetik, didaktik-pedaqoji və ruhi-psixoloji qatlardan soraq verir; məs.:

• "Biz hər bir insanın əməlini öz boynundan asar və Qiyamət günü (bütün əməllərini) açıq kitab kimi qarşısına qoyarıq. (Və ona belə deyərik:) "Oxu kitabını (əməl dəftərini). Bu gün sən haqq-hesab çəkməyə özün-özünə (özün öz əməllərinin şahidi olmağa) kifayətsən!" *("İsra", 13-14).*

• "Kafir olanların və (insanları) Allah yolundan döndərənlərin əməllərini (Allah) puç edəcəkdir. Bu ona görədir ki, kafirlər batilə uymuş, iman gətirənlər isə öz Rəbbindən gələn haqqa (Qurana) tabe olmuşlar. Allah insanlara özlərinə dair məsəlləri belə çəkir!" *("Muhəmməd", 1-3).*

• "Hər bir kiçik və böyük (günah Lövhi-Məhfuzda) yazılmışdır. Şübhəsiz ki, müttəqilər (axirətdə) cənnət bağlarında və çaylar kənarında, (Heç bir yersiz söhbətə və



günaha təhrik olunmayan) haqq məclisində, qadir hökmdarın (Allahın) hüzurunda olacaqlar!" *("Qəmər", 53-55).*

• "Vay halına çəkidə və ölçüdə aldadanların! O kəslər ki özləri insanlardan (bir şey) aldıqları zaman onu tam ölçüb alar. Onlar üçün ölçdükdə və ya çəkdikdə isə (onu) əskildərlər. Məgər onlar (öləndən sonra) diriləcəklərini düşünmürlərmi?! Özü də dəhşətli bir gündə?! O gün bütün insanlar (haqq-hesab üçün) aləmlərin Rəbbinin (Allahın) hüzurunda duracaqlar" *("Mütəffifin", 1-6).*

• "Həqiqətən, yaxşı əməl və itaət sahibləri (möminlər) Cənnətdə qərar tutacaqlar. Pis əməl sahibləri (kafirlər) isə Cəhənnəmdə olacaqlar" *("İnfitar", 13-14).*

Özlüyündə bəllidir ki, belə tutumlu Quran bilgiləri Füzuli kimi söz-sənət dahisinin diqqətindən qıraqda qalmayacaqdı və onun zəngin bədii-estetik təfəkkürü üçün münbit məfkurəvi fəlsəfi qaynaq təşkil edəcəkdi; məs.:

Yox məndə bir əməl sənə şayəstə, ah, əgər
Ə'malimə görə verə ədlin cəza mənə.
Xövfi-xətadə müztəribəm, var ümmid kim,
Lütfün verə bəşarəti əfvü əta mənə.

Yaxud:

Dəftəri-ə'malimin xətti xətadəndir siyah,
Qan tökər çeşmim, xəyal etdikcə hövli-məhşəri.
Məhşəri-əşkim verər seylabə, gər ruzi-cəza
Olmasa məqbuli dərgahın sirişkim gövhəri!
Biz düşdük öz əməllərimizdən bu günlərə,
Qoyma həmişəlik belə artsın məlalımız.

Bu səpkili beytlərin ideya-bədii xüsusiyyətlərini "Hədiqətü-s-süəda"dakı parçanın fikri axarına qovuşdurduqda "ol dəm" ifadəsi *Qiyamət günü, yaxud cinayət başında yaxalanma,* "nameyi-ə'mal" ifadəsi *kufəlilərin yazıb İmam*



*Hüseyni dəvət etdikləri məktubların dəlil-sübut təşkil etməsi,* "qafil" sözü *İmam Hüseynin dini-dünyəvi rəhbərliyini sonadək dərk etməyənlər,* "məhəki-imtəhan" ifadəsi *ilahi sınaq vasitəsi,* "nəqdi-məqşuş" ifadəsi *günahkarın iç üzü,* "rusiyah" sözü də *bu dünyada vicdan əzabı, axirətdə isə Tanrı qəzəbi, cəhənnəm odu* anlamlarına gəlir. Bütün bunlar Hürrün gözləri önündə baş verdiyindən onun ruhi-psixoloji əhvalını, dəruni gərginliyini əks etdirir, deməli, personajın başlıca cizgilərini təşkil edir.

Parça ilə bağlı açıqlanılmalı bir başqa cəhət Hürrün tərəddüdkar təbiətidir. Altı nəfərin gəlib ibn Ziyaddan ona təcili məktub gətirməsi, onun məktubu oxuyub həyəcana qapılması və bir-birinə zidd iki iş arasında qaldığını imama (ə) bildirməsi Hürrün tədricən dəyişməyə başlayan xarakterinin açılışıdır. Nəhayət, o, qəti qərara gələ və tədbir tökə bilir ki, zənnimizcə, Hürrün İmam Hüseynə (ə) yaxınlaşmasının zirvə nöqtəsini və təşəbbüskarlıq çevikliyini təşkil edir.

Beləliklə, əsərin bu bölümü özünün ideya-bədii xüsusiyyətləri ilə Hürrün mürəkkəb mənəviyyatını, keşməkeşli və tərəddüdkar təbiətini, duyğu və düşüncə gərginliyini, dəyişkən əhvali-ruhiyyəsini əsaslı surətdə əks etdirir. Odur ki, oxucu əsərin növbəti səhifələrində bu Kərbəla igidinin dönməz xarakterini gördükdə qətiyyən təəccüblənməyəcək, onun göydəndüşmə bir əlamət yox, tamamilə təbii bir portret-obraz olduğuna inanacaqdır. Aşura səhnələrinin ən parlaq örnəklərindən olan Hürlü səhifələri gəlin birlikdə oxuyaq.

* * *

"Raviyi-əxbari-məlalətasar bu tərzlə itmami-rəvayət vermiş və naqili göftari-küdurətasar bu tərzlə göftara zinəti-tətmim yetirmiş ki, çün süfufi-ləşkər mürəttəb oldu, Hürr bin Yezidi-Riyahi Ömər Sə'din hüzuruna gəlüb ayıtdı: "Ya ibn Sə'd, əlbəttə, Hüseynlə müharibə etmək müqərrərmidir?" İbn Sə'd ayıtdı: "Bəli, müqərrərdir. Bu hərbdə qanlar tökülür və başlar kəsilür". Hürr ayıtdı: "Rəsulullaha Qiyamət günü nə cəvab



verərsən?” Ömər Sə’d cəvab verməyüb, Hürr kəndü ləşkərinə müraciət qılub, heybət və səlabətdən ləvni mütəğəyyir olub və qəlbi mütəhəyyir olub biqərardı. Qarındaşı andan sual etdi ki, “ey pəhləvani-ərəb, hərgiz heç mə'rəkədə səndən bu təzəlzül mülahizə olunmayub, mə'ə qilləti-ə’da bu nə təğəyyürdür ki, səndə zahir oldu?” Hürr ayıtdı: “Ey bəradər, bana ə'dadan təvəhhüm yoxdur, əmma behişt və duzəx arasında mütəhəyyir qalmışam və həqqü batil imtiyazında heyran olmuşam”. Bu təkəllümdə ikən ixtiyarsız bir nə'rə urdu ki, “əlminnətu lillah, məkməni-qeybdən məş'əleyi-nuri-hidayət zahir olub bəni təriqi-zəlalətdən sirati-müstəqimə buraxdı”. Şe’r:

Lilləhil-həmd ki, bən sahibi-irfan oldum,
Qabili-mərtəbeyi-səhhəti-iman oldum.
Əməli-batil imiş Ali-Məhəmməd büğzü,
E'tiraf eylədim ol cürmə, peşiman oldum.

Pəs səməndi-badpayə cövlan verüb, kəndü ləşkərindən çıxub ləşkəri-Hüseynə mülhəq olub, mərkəbindən enüb, rikabi-hümayuninə yüz sürüb ayıtdı. Şe'r:

Ey çirağı-təl'ətin şəm'i-şəbistani-sürur,
Gərdi-xaki-rəhgüzarın tutiyayi-çeşmi-hur.
Ya Əmirəlmö'minin, üsyana iqdam eylədim,
Bilmədim ki, böylə tüğyan edə ərbabi-qürur.
Bilmədim ki, dutmayub şəm'i-risalət hörmətin,
İrtikabi-zülmü bidad edə qövmi-bişüur.
Ya Şəfi'ülmüznibin, üzri-günahım qıl qəbul,
Görmə caiz bünyeyi-ümmidə hirmandan fütur.

Bu təriqlə çox niyazlar edüb təzzərö' etdi ki, ya imam, aya, mə'zirətim məqbul olurmu ola? Həzrəti-imam ayıtdı: “Ey Hürr, dərgahi-lütfü ehsan əhli-etizara həmişə məftuhdur və günahın mö'tərif olan həmişə müsabü məmduhdur və “Huvə yəqbəlu't-tövbə ən ibadihi”.



Çün Müs'əb bin Yezid qarındaşın gördü ki, axirəti-dünyaya ixtiyar etdi və üzri-günahı dərəceyi-qəbula yetdi, ol dəxi səadəti-mülazimətinə müşərrəf oldu və surəti-ixlas ərz qıldı. Əlqissə, Hürr bin Yezidi-Riyahi mükafati-əf'al üçün Həzrəti-imamdan icazəti-hərb istədikdə Həzrəti-imam ayıtdı: "Ey Hürr, hənuz bizdən istişmami-rayiheyi-rahət etmədin, zəhmətə düşmək münasib degil. Səbr et, ibtidayi-hərb qeyrdən olsun". Hürr ayıtdı: "Ya imam, netə ki ibtidayi-müxasimət bəndən oldu, istərəm ki, ağazi-izhari-məhəbbət dəxi bəndən ola"[191].

"Qəmgin xəbərlər verən ravi belə rəvayət edir ki, qoşun tam hazır olanda Hürr ibn Yezid Riyahi Ömər Sədin hüzuruna gəlib dedi: "Ya ibn Səd, Hüseynlə müharibə etmək fikrinə qərar verilibmi?" İbn Səd dedi: "Bəli, qərar verilib. Bu döyüşdə qanlar axıdılacaq, başlar kəsiləcək". Hürr dedi: "Rəsulullaha Qiyamət günü nə cavab verəcəksən?" Ömər Səd Hürrə cavab vermədi. Hürr öz qoşununun yanına qayıtdı. Çox pərişandı və heyrət içində qalmışdı. Qardaşı ondan soruşdu ki, ey ərəbin pəhləvanı, heç vaxt döyüşdə səni bu şəkildə görməmişəm. Bu nə halətdir? Hürr cavab verdi: "Ey qardaşım, mən düşməndən qorxmuram. Amma behişt və cəhənnəm arasında heyrətdə qalmışam və haqla batil arasında qətiyyətim çatmır".

Bunu deyərkən ixtiyarsız elə bir nalə çəkdi ki, qeybdən hidayət nuru zahir olub, onu zəlalət yolundan sirati-müstəqimə döndərdi.

*Allaha həmd olsun, mən irfan yiyəsinə çevrildim və sağlam imanın uca mərtəbəsinə yüksələ bildim. Məhəmməd soyuna kin bəsləmək puç, saxta iş imiş. Mən artıq o suçumu dilə gətirərək sidq ürəkdən peşman olmuşam.*

Sonra atını çaparaq özünü Hüseynin dəstəsinə yetirdi və atdan düşüb, üzünü imamın mübarək üzəngisinə sürtərək dedi:

*Sən ey Ay üzünün çırağı, şadlıq məclisinin şamı olan böyük şəxsiyyət, sənin yolunun torpağının tozunu cənnət huriləri tutiya kimi gözlərinə sürtürlər. Ey möminlərin əmiri, mən*

.................................

[191] *Füzuli, Əsərləri, VI cild, səh.277-278*



*bilərəkdən və bilməyərəkdən üsyan etməyə davam etdim. Ancaq heç vaxt ağlıma gəlməzdi ki, bu təkəbbürlü adamlar sənə qarşı bu qədər azğınlığa yol versinlər. Bilmədim ki, bu şüursuz cəmiyyət peyğəmbərlik şamının ehtiramını saxlamayaraq, bu qədər zülmə, haqsızlığa bulaşsın. Sən ey günahkarların qılıncı, mənim günahımın üzrünü qəbul buyur və rəva görmə ki, mənim ümid bünövrəmdə və iman özülümdə peşmançılıq çat salsın.*

Bu təriqlə çox yalvarıb dedi ki, ya imam, üzrüm qəbul olunurmu? Həzrət imam dedi: "Ya Hürr, lütf və ehsan qapımız həmişə üzr istəyənlərə açıqdır və günahını etiraf edənlər amandadır. "Hüvə yəqbəlut-tövbə´an ibadihi" ("Qullarının tövbəsini qəbul edən Odur") *("Tövbə", 109)".*

Müs'əb gördü ki, qardaşı Hürr axirəti dünyadan üstün tutdu və onun üzrü imam tərəfindən qəbul olundu, o da durmayıb qardaşının ardınca İmam Hüseyn əleyhissəlamın qulluğuna gəldi.

Xülasə, Hürr imamdan mükafat olaraq onu döyüşə birinci göndərməsini təvəqqe elədi. Həzrət imam buyurdu: "Ya Hürr, istirahət etməmiş zəhmətə düşməyin münasib deyil. Səbir et, qoy döyüşü başqaları başlasın". Hürr dedi: "Ya imam, necə ki ilk düşmənçilik məndən oldu, istərəm ki, sizə məhəbbətini ilk izhar edən də mən olum!"[192]

Parçanın başlanğıcından bilinir ki, Hürr sərkərdəlik etdiyi ordunun Peyğəmbər nəvəsinə qılınc qaldırmayacağına hələ də inanırmış. Onun bu inamını şərtləndirən amillər isə az da olsa mövcud idi. Məsələn, Hürrə bəlli olmamış deyildi ki, Ömər ibn Səd Rəsulullahın (s) ən yaxşı səhabələrindən olan və əsl-səadətdə var gücü ilə İslam uğrunda qılınc çalan Səd ibn Əbu Vəqqasın oğlu idi. Bəzi müfəssirlər "Ənkəbut" surəsinin 8-ci ayəsinin onun iman gətirməsi haqqında gəldiyini düşünürlər. Odur ki, Hürrün Ömər ibn Sədin fikrini soruşması tamamilə təbiidir. Ancaq onun cavabının tonu gələcək Kərbəla igidini həm kədərləndirir, həm də qəti qərara gəlməyə sövq edir.

.................................

[192] *Füzuli. Kərbəla vaqiəsi, səh. 84-85*





Hürrün Ömər ibn Sədə "Rəsulullaha (s) Qiyamət günündə nə cavab verəcəksən" sualı ilk baxışda sadə axirət inamı təsiri bağışlayır. Ancaq onun Ömər ibn Sədə Allahı (c.c) yox, Peyğəmbəri (s) xatırlatması bir neçə baxımdan maraq doğurur.

Birincisi, Qurani-Kərimdə dəfələrlə Allahla (c.c) yanaşı Peyğəmbərə (s) itaət də vacib buyurulur *("Nisa", 59-80; "Ənfal", 20)*. Deməli, Hürr Ömər ibn Sədə Peyğəmbəri (s) xatırladarkən bütövlükdə İslamın qiyamət inancını göz önündə tuta bilərdi. İkincisi, Hürr bununla alt qatda da olsa, Ömər ibn Sədə səhabə oğlu olmasını, atasının vaxtilə ad çıxarmış döyüşçü kimi hələ də yaddaşlarda yaşamasını çatdırmaq və bu yolla da onun vicdanını oyatmaq istəmişdir. Axı oxucuya bəllidir ki, Ömər ibn Səd bir neçə kərə qarışıq duyğular keçirmiş, ancaq hər dəfə şan-şöhrəti, dünya malını, mənsəbi axirətdən üstün tutmuşdur. Ötəri deyil ki, Ömər ibn Səd Hürrə bir söz tapıb deyə bilmir.

Parçanın ardı bizə göstərir ki, qəhrəman artıq hissiyyat mərhələsindən keçib idrak səviyyəsinə yüksəlməkdədir. Onun qardaşına cavab olaraq söylədiyi sözlər məhz bunun əlamətidir. Təəccüblü deyildir ki, qeybdən hidayət nuru da yalnız bu an zahir olur.

Mətndə diqqəti belə bir cəhət çəkir ki, qeybdən zahir olan hidayət nuru qəhrəmanın ixtiyarsız çəkdiyi dəli nərədən sonra zahir olur. Zənnimizcə, bu, ulu Füzulinin birbaşa xəlqi-mədəni kökündən gələn və əski mifik dəyərlərlə bağlı olan əlamətdar bir dəlildir. Ona görə ki, İslama görə, qeyb yalnız müstəsna hallarda, o da müqəddəslərə bildirilib, Hürr isə müqəddəslər sırasında deyildi. Deməli, buradakı "nərə"də Qorqud igidinin, Koroğlu dəlisinin dağı-daşı titrədən "dəli nərəsi" səpkili həyəcan hayqırtısı, hissiyyat nidasıdır. "Zəlalət yolu"–"sirati-müstəqim" təzadı sırf bədiilik örnəyi olmayıb, əslində, kökü çox dərin qatlara gedib çıxan həyat ziddiyyətinin parlaq inikasıdır. Təəssüf ki, sovet dövründə rəsmi ideologiyaya yarınmaqdan ötrü bəzən "Dədə Qorqud"da yad qatlar" adı ilə



islami anlayış və bilgilər tendensiyalı şəkildə pislənilir, saf və səmimi türk bulağının gözünə çamur atılırdı[193]. Halbuki azacıq diqqət bütün aydınlığı və genişliyi ilə göstərərdi ki, müəyyən dini təsirə məruz qalmasına baxmayaraq, "Dədə Qorqud" boylarında İslam qətiyyən yad, yabançı səs, nəfəs olmamış, əksinə, türkün yaşı minilliklərlə ölçülən, kökü Qobustan qayaüstü rəsmlərinə, Şumer epitafiyalarına, "Avesta"ya, Orxan-Yenisey abidələrinə gedib çıxan doğma, həlim və mehriban bir inam-inanc sistemi olmuşdur. Odur ki, Hürrün ixtiyarsız çəkdiyi nərə nəticəsində qeybdən hidayət nurunun zahir olması və qəhrəmanı zəlalət yolundan sirati-müstəqimə döndərməsi nəinki xəlqi-mədəni, yaxud milli-mənəvi müstəvidə, hətta müsəlman mədəniyyəti zəminində belə yerində olan, özünü doğruldan, qonaq təsiri bağışlamayan və özünü naqolay hiss etməyən çoxqatlı, çoxşaxəli bir dini etnoqrafik faktdır.

Şair bu cəhəti şeirdə də əks etdirmişdir. Şeirdəki "sahibi-irfan", "etiraf eylədim", "peşiman oldum" ifadələri alt qatda qəhrəmanın dəli nərəsi ilə bağlı işarələr kimi qavranır. Hürrün konkret səciyyə daşıyan bu arifliyi Füzuli lirikasında aparıcı yer tutan arif obrazının təbiətini, xarakterini yada salır:

Rəhrövi-irfanə bəsdir sağərü saqi dəlil
Kim, məhü xurşiddən bulmuş təmənnasin Xəlil.
Olsa iste´dadi-arif qabili-idraki-vəhy,
Əmri-Həqq isbatinə hər zərrədir bir Cəbrəil!

Hər kəsin təqdirdən məqsudi öz qədrincədir,
Əhli-eşq istər zülali-vəsl, zahid Səlsəbil.
Cənnətə, zahid bilir, can vermədən yetməz, vəli
Canı qıymaz, öz təmənnasindədir miskin bəxil.

.................................

[193] *Əlibəyzadə E. "Dədə Qorqud"da yad qatlar. "Kitablar aləmində" jurnalı*



Göründüyü kimi, buradakı “rəhrövi-irfan” *(irfan yolçusu)* və “arif” deyimləri Hürrün, zahid surəti isə Ömər ibn Sədin lirik ekvivalenti yerində görünür.

Hürrün üzünü İmam Hüseynin (ə) atının üzəngisinə sürtməsi, Füzulinin üzəngini “mübarək” adlandırması artıq sənətkarın öz qəhrəmanının mənəvi yetkinliyə qovuşmasını sanki müjdələdiyini, bunu böyük iftixar hissi ilə qələmə aldığını göstərməyə xidmət edir. Odur ki, bu şeir Hürrün İmam Hüseynə (ə) ünvanladığı səmimi nitq təsiri bağışlayır.

Hürr İmam Hüseynə (ə) “Ey nurlu çırağı sevinc və şadlıq gecəsində qurulan məclisi işıqlandıran şam, ey keçdiyin yolun torpağının tozu hurilərin gözlərinə sürtdükləri sürmə” deyə üz tutaraq deyir ki, “ey möminlərin əmiri, mən üsyankar oldum, ancaq haradan biləydim ki, o məğrur dəstə bu cür azğınlıq edəcəkdi. Mən bunu da bilmədim ki, o anlaqsız tayfa peyğəmbərlik şamının hörmətini saxlamayaraq açıq-aşkar zülm atını minəcəkdir. Odur ki, sən ey suçluların cəza qılıncı olan kamil şəxsiyyət, gəl mənim günahımla dilə gətirdiyim üzrümü qəbul et və rəva görmə ki, mənim sənin mərhəmətinə bağladığım ümid özülü kökündən sarsılsın”.

İmamın (ə) Hürrə Quran ayəsi ilə cavab verməsi də bir neçə baxımdan diqqəti çəkir. Ümumiyyətlə, Quran bulağından su içən Füzuli bütün əsərlərini məfkurəvi baxımdan Quran buyuruqlarına söykəmiş, başlıca və aparıcı islami prinsipləri hər zaman önə çıxarmış, bunu yüksək sənətkarlıqla edərək hər hansı bir üzdəngetməyə, birtərəfliyə qətiyyən yol verməmişdir. Ötəri deyildir ki, “Hədiqətü-s-süəda”da da 107 yerdə Qurani-Kərimin müxtəlif ayələri verilmişdir. Xüsusilə mübarək “Bəqərə” surəsinin 156-cı ayəsi – “Biz Allahın bəndələriyik və (öləndən sonra) Ona tərəf (Onun dərgahına) qayıdacağıq” dönə-dönə təkrarlanır. Bu ayənin məzmunu Füzuli yaradıcılığında əsas yer tutan irfani-təsəvvüfi baxışları, xüsusilə də sufilərin ən böyük arzusu – Allaha qovuşmaq istəyi ilə yaxından səsləşir”[194].

.................................

[194] *Nağısoylu M. Göstərilən əsəri, səh. 86*





Digər tərəfdən, bu cəhət Kərbəla vaqeəsinin həm də parlaq bir əxlaq məktəbi olduğunun bədii ifadəsidir. Odur ki, Hürr də bu məktəbin yetirməsi olaraq bütün varlığı ilə boy göstərir.

İmam Hüseynin (ə) gətirdiyi ayənin mənasının parçanın məzmunu ilə bağlılığına gəlincə, məsələ təkcə onda deyildir ki, Hürr burada məşhur tövbəkar sifəti ilə önə çıxır. Bizcə, burada daha önəmli olan İmam Hüseynin Hürrə ilahi tədbiri xatırlatması, son sözün yalnız Tanrı qatında deyildiyini çatdırmasıdır.

* * *

Füzuli əsərin bu fəslini sanki xarakterlər toplusu üzərində qurmuşdur. Hürrün qardaşı Müsəbin ürəklənib İmam Hüseynin (ə) dəstəsinə keçməsi, Hürdən sonra döyüşə atılıb igidliklə vuruşaraq qardaşının intiqamını alması və şəhid olması Füzulinin yaratdığı qəhrəmanı tək görmədiyindən, onun fəaliyyətinin səmərəli olduğunu vurğulamaq istəyindən soraq verir.

İmam Hüseynlə Hürr arasındakı mükalimədə də xarakteri yaratmaq istəyi duyulur. Ona görə ki, İmam Hüseyn (ə) indiyədək meydan izni istəyən heç kimə istirahət etməyi, zəhmətə düşməməyi təklif etməmişdi. Ancaq Hürrün cavabı da özünəməxsusdur. O deyir ki, “ilk düşmənçilik məndən olduğu kimi, istərəm ki, sizə məhəbbətini ilk izhar edən də mən olum!” Bu isə ümmətin Əhli-beytə bəslədiyi məhəbbətə parlaq bir örnəkdir.

* * *

Əlqissə, təzərrö'lə rüxsət alub meydana girdi və bu təzəllümlə ismü rəsmin zühurə gətürdi. Şe'r:

Bənəm ol Hürr bin Yezidi-Riyahi
Ki, əzəldən mühibbi-ali-əbayam,
Şükrü lillah, kəmali-sidqü səfadan,
Qabili-xidməti-vəliyyi-Xudayam.





Tiği-xunrizlə zəmani-şücaət,
Düşməni-duni-nabəkara bəlayam.

İbn Sə'di-bixirəd Hürr bin Yezidi meydanda görüb, əndaminə təvəhhümdən lərzə düşüb, məxsuslarından Səfvan nam bir mübarizə ayıtdı: "Yürü var, Hürrə nəsihət qıl və malü əsbabla firib ver, əgər qəbul etməsə, siyasətə yetür".

Səfvan səfi-sipahdan çıxub səməndi-badrəftara cövlan verüb Hürrə müqabil olduqda ayıtdı: "Ey Hürr, sahibi-əqlü sahibi-rə'y olmaq gərək. Əcəb ki, ne'məti-dünyadan inhiraf edüb zillət ixtiyar etdün". Hürr ayıtdı: "Ey nadan, izzət xidməti-Ali-Rəsuldadır. Zəhi səfihi-siyəhruzgar ki ne'məti-fani üçün tərki-dövləti-baqi edə. Əlhəq, əgər iman varsa, nəfyi-tənəümati-rövzeyi-rizvan nədir və əgər iman yoxsa, də'vayi-iman nədir?" Şe'r:

Qabili-kəşfi-rümuzi-hikmət olmaz hər kişi,
Hər kimin fe'li nəqizi-qövldür, məzmum olur.
Pərdeyi-təşkikdir bu zülməti-qeydi-həyat,
Pərdə rəf' olduqda halı hər kimin mə'lum olur.

Səfvan gördü ki, Hürr qabili-nəsihət degil, qəzəbnak olub, sineyi-bikinəsinə nizeyi-cansitan həvalə qıldı. Hürri-vəfadar bir tiğlə nizəsin rədd edüb, bir zərblə mərkəbindən nigunsar edüb, bir lö'blə yıxdı ki, nə'reyi-afərin iki ləşkərdən asimana çıxdı.

Rəvayətdir ki, Səfvanın üç qarındaşı olub, talibi-intiqam təriqiylə mütəaqib meydana gəlüb bir-bir Hürr əlindən şərbəti-fəna içdilər. Hürr ol mübarizləri həlak etdikdən sonra Həzrəti-imamın izzi-hüzuri-şəriflərinə gəlüb ayıtdı: "Ya imami-zaman, bəndən xoşnud oldunmu?" Həzrəti-imam ayıtdı: "Nə'əm, əntə Hurrun kəma səmmətəkə ummukə". Hürr ol bəşarətlə yenə meydana müraciət qılub, gərmi-mübarizət ikən bir həramzadə mərkəbin səqət qılub, piyadə qaldı. Ol müxlisi-vəfadar ədəmi-mərkəb ilə ləşkəri-ə'dadan izhari-əcz etməyüb, inani-



əzimət döndərməyüb müharibə etdigin şahzadə gördükdə bir mərkəbi-tazinəjad irsal etdi.

Hürr ol mərkəbə binub, cövlan edüb, hər tərəf mütəvəccih olduqda güruh-güruh müxalifləri pərakəndə etdigi əsnada hatifdən səda gəldi ki: “Ey Hürr, müjdə ki, hurü qılman müntəziri-didarındır”. Hürr ol sədadan məsrur olub canibi-Hüseynə təvəccöh qılub ayıtdı: “Ya imam, cəddin xidmətinə mütəvəccih oluram, peyğamm nədir?” Həzrəti-imam ol xəbərdən giryan olub ayıtdı: “Ey Hürr, biz dəxi mütəaqib gəlməkdəyiz”.

Əlqissə, ol şiri-bişeyi-şücaət və nəhəngi-dəryayi-cəladət səddi-sipahi-ə'daya rəxnələr urub və cəm'iyyəti-müxalifə təfriqələr yetürüb, nizəsi şikəst bulub, tiği-abdarla mütəvəccihi-qəlbi-sipah oldu və qəlbi-sipahı dili-üşşaq kibi çak edüb, kəndüsin ələmdara yetürdi. Ələmi nigunsar etməkdə ikən Şimri-bədbəxt ləşkərinə nə'rə urdu ki, ey namərdlər, bir mübarizdən aciz olmaq nədir?

Ləşkər hər canibdən qülüvv qılub, ol namuradı ortaya alub, nagah Qisvar bin Kinanə bir zəxmi-mühlik urub, Hürr dəxi ana bir zəxm urub, ikisi dəxi mərkəbdən cüda olub, Hürr nə'rə urdu ki: “Ya ibn Rəsulullah, ədrikni”. Həzrəti-imam biixtiyar meydana girüb, Hürrü ol zalimlər arasından alub ləşkərinə yetürdi və mərkəbindən enüb, başın dizi üzərinə alub, astini-mübarəkiylə rüxsarından xakü xun pak edüb dua qılırkən Hürr anın rayiheyi-canbəxşindən həyat istiarə qılub, rüxsari-mübarəkinə dideyi-iştiyaq açub, təbəssüm qılub ayıtdı: “Ya imam, bəndən razı oldunmu?” İmam ayıtdı: “Səndən razı oldum, Allah səndən razı olsun”. Hürri-vəfadar bu bəşarətlə filhal nəqdi-can nisar edüb. Şe'r:

Eşq meydanında can vermək degil ar, ey könül,
Can verüb məqsuda yet, gər himmətin var, ey könül.
Eşq bazarına salmışdır səadət gövhərin,
Nəqdi-canın verməyən olmaz xəridar, ey könül.





Nəqldir ki, bu beyt Həzrəti-imamın Hürr üçün dedigi mərsiyədəndir. Şe'r:

Fə-ni mə'l-hurru Hurra'bni Riyahin
Səburun ində müxtəlifür-rimahin[195].

Fəsil belə davam edir: "Xülasə, izin alıb meydana girdi və özünü ləşkəri-ədaya bu cür təqdim elədi.

*Yaranışdan Əhli-beyt aşiqi olan o Yezid Riyahi oğlu Hürr mənəm. Allaha şükürlər olsun ki, doğruluq və zövqlülük yetkinliyi nəticəsində övliya qulluğunda durmağa layiq görülmüşəm. İgidlik çağı qan tökən qılıncla alçaq və yaramaz düşmənin başına bəlayəm.*

İbn Səd Hürrü meydanda görüb vahiməyə düşdü, Səfvan adlı bir döyüşçüyə dedi: "Tez özünü meydana yetir, Hürrə nəsihət ver, mal-dövlət vədəsi ilə aldat, əgər qəbul etməsə, ona hücum çək".

Səfvan qoşunun sırasından çıxıb, çaparaq Hürrün müqabilinə gəldi və dedi: "Ya Hürr, əql sahibi olmaq lazımdır. Niyə dünya nemətindən əl çəkib zillət yolunu tutdun?" Hürr dedi: "Ey nadan, izzəti-xidmət Ali-Rəsuldadır. Fani olacaq dünya neməti üçün əbədi dövlətdən əl çəkmək bədbəxtlikdir".

*Hər kişi hikmət rəmzlərini görməyə layiq görülməz. İşi sözü ilə düz gəlməyənin üzü həmişə danlanır. Bu yaşayış buxovunun qaranlığı şəkk-şübhə pərdəsi ilə örtülüdür, hər kəsin əsl üzü yalnız pərdə açıldığı zaman bəllənir.*

Səfvan gördü ki, Hürr nəsihət eşitmir, qəzəblənib onun sinəsinə bir nizə tulladı. Hürri-vəfadar bir oxla onun nizəsini kənar edib bir zərbə ilə atdan saldı və hər iki qoşundan "Afərin!" sədası asimana ucaldı.

Rəvayətdir ki, Səfvanın üç qardaşı vardı. Onlar intiqam qəsdi ilə meydana atıldılar və bir-bir Hürrün əlində məhv oldular.

.................................

[195] *Füzuli. Əsərləri, VI cild, səh.278-280*



Hürr onları həlak etdikdən sonra həzrət imamın hüzuri-şərifinə gəlib dedi: "Ya imami-zaman, məndən razısanmı?" Həzrət imam əleyhissəlam buyurdu: "Nə´əm əntə Hurrun kəma səmmətəkə ummukə". *"Bəli, anan sənə Hürr adını verdiyi kimi hürsən".* Hürr bu xoş sözlərdən sonra yenə meydana qayıtdı və qızğın döyüşdə ikən bir haramzadə onun atını vurub şikəst elədi. Hürr piyada qaldı. Lakin onun yenə də durmadan vuruşduğunu görən imam həzrətləri Hürrə iti yerişli bir at göndərdi.

Hürr həmin atı minib cövlan edərək düşmənləri dəstə-dəstə pərakəndə saldığı vaxt hatifdən səda gəldi ki: "Ey Hürr, sənə müjdələr olsun, hurü qılman müntəzirindir". Hürr o sədadan şad olub həzrət imamın hüzuruna qayıtdı və dedi: "Ya imam, cəddinin xidmətinə gedirəm, sifarişin nədir?" Həzrət imam bu xəbərdən giryan olub dedi: "Ya Hürr, biz də sənin ardınca gəlirik!"

Xülasə, o şücaət meşəsinin şiri və igidlik dəryasının nəhəngi düşmən qoşununun sırasına rəxnələr salaraq özünü adamların ən qalın yerinə vurdu və döyüşdə nizəsi sındı. Qılıncı ilə düşmənləri aşiq ürəyi kimi parçalayıb qoşunun bayraqdarına yetişdi. Aləmi darmadağın etməkdə ikən Şimri-lə´in qoşuna nərə vurdu ki, ey namərdlər, bu mübarizin qarşısında acizsinizmi?

Qoşun əhli hər tərəfdən hücum çəkib onu araya aldı. Qisvər ibn Kinanə ona, o isə Qisvərə öldürücü zərbələr endirdilər. Hər ikisi atdan yıxıldı. Hürr nərə vurdu ki, "Yəbnə Rəsulullah, ədrikni", yəni "imdadıma yetiş!"

Həzrət imam biixtiyar meydana girib Hürrü o zalimlərin arasından çıxardı, xeymələrə gətirib atından endirdi. Hürrün başını dizi üstə alıb paltarının qolu ilə üzündən qanı və tozu silərək dua eləməyə başladı. Hürr onun ətirli nəfəsindən həyat qoxusu duyub təbəssümlə dedi: "Ya imam, məndən razı oldunmu?" İmam buyurdu: "Mən razı oldum. Allah səndən razı olsun!" Hürr bu sözləri eşidən kimi dərhal gözlərini əbədi yumdu".





Hürrün rəcəzi ənənəvi səpkidə olsa da, bir neçə orijinal cizgiyə də malikdir. Məsələn, "əzəldən mühibbi-ali-əbayəm" deməsi Hürrün Əhli-beyt aşiqi kimi təsvir edilməsini çətinləşdirdiyindən ilk baxışda qeyri-müəyyən təsir bağışlayır. Çünki istər-istəməz oxucuda belə bir maraq oyanır ki, ağlı kəsəndən bəri Əhli-beyt aşiqi olan kimsə bəs necə olub ki, Yezid ordusunun aparıcı sərkərdələrindən birinə çevrilib? O biri tərəfdən, misranı bəsit qafiyəpərdazlıq saymaq Füzulinin sənətə və Kərbəla vaqeəsinə olan ölçülü-biçili münasibətilə bir araya sığmazdı. Deməli, burada bir gizli cəhət olmalıdır. Zənnimizcə, Hürr burada vaxtilə Peyğəmbər səhabəsi olmuş ata-babasına işarə vurur. O, sanki bununla yenidən haqq yola qayıtmasının əbəs olmadığını, bunun üçün onun zatında az-çox təpər olduğunu önə çəkmək və bu yolla da Yezid ordusunun sıra nəfərlərindən əsaslı surətdə seçildiyini nəzərə çarpdırmaq istəmişdir.

Rəcəzdə diqqəti çəkən ikinci cəhət "kəmali-sidqü səfa" tərkibində əksini tapmış mənəvi yetkinlik anlayışıdır. Çünki "sidq" təkcə *doğruluq, düzgünlük* olmaqla qalmayan, əslində, dərin batini əxlaq keyfiyyətindən soraq verən uca mənəviyyat əlamətidir. "Səfa" isə həmin əlamətin dini-məfkurəvi qaynağıdır. Deməli, Füzuli öz qəhrəmanını artıq bitkin və yetkin bir haqq aşiqi kimi görür. Ötəri deyildir ki, qəhrəman ürəkdən "qabili-xidməti-vəliyyi-Xudayəm" deyə öyünə bilir. Hürr "vəliyyi-Xuda" dedikdə, heç şübhəsiz, İmam Hüseyni (ə) nəzərdə tuturdu. Deməli, Füzuli Hürrün rəcəzini ənənəvi döyüşqabağı öyüncdən çox mənəvi-əxlaqi ucalıqdan danışan monoloq kimi qələmə almış və bununla da məqtəl daxilində belə üslub əlvanlığının, fikir rəngarəngliyinin daxili imkanlarını tapıb üzə çıxarmaqla daha bir novator sənətkarlıq nümunəsi ortaya qoymuşdur. Yalnız belə ali mətləblərdən sonra Füzuli sırf döyüş təsvirlərinə keçir.

Ömər ibn Sədin Hürrü İmam Hüseyn (ə) ordusunun nümayəndəsi kimi meydanda görüb qorxu keçirməsi maraqla oxunan epizodlar sırasındadır. Ötəri deyildir ki, o, öncə Hürrü





nəyin bahasına olursa-olsun fikrindən daşındırmaq istəyir. Axı Hürr kimi bir dilavəri itirmək hər bir ordu üçün ağır itki idi. Ancaq heç nəyə məhəl qoymayan Hürr istər sözü, istərsə də işi ilə bir daha "düşməni-dunü nabəkarə-bəla" olduğunu təsdiq edir. O, Səfvanın "Ya Hürr, əql sahibi olmaq lazımdır. Niyə dünya nemətindən əl çəkib zillət yolunu tutdun" sualına "Ey nadan, izzəti-xidmət Ali-Rəsuldadır. Fani olacaq dünya neməti üçün əbədi dövlətdən əl çəkmək bədbəxtlikdir" cavabını verir. Bu dialoq Hürrün xarakterinin açılışı baxımından önəmli olduğu üçün bunun üzərində ayrıca durmağa dəyər.

Düşmən əsgəri "əql" dedikdə nəyi nəzərdə tutur? Axı ağıl, kamal anlayışı əsər boyu müxtəlif mövqelərin ifadəsi kimi dəfələrlə işlənmiş və çeşidli məna-məzmun incəlikləri qazanmışdır. Xırdalığa getmədən bildirək ki, Füzulinin də mənsub olduğu şiəlik təlimində bir "şeytanət" termini var. Həmin terminin mənası *"murdar məqsədlərə qulluq edən iyrənc zirəklik"*dir. Belə zirəklik şiə təlimində yüksək intellektdən ayrı götürülərək kəskin pislənilir.

Doğrudur, məsələnin belə qoyuluşu ümumi fəlsəfədə mübahisə doğura bilər. Ancaq unutmayaq ki, Füzuli dindar bir sənətkar kimi daha çox kəlam elminin və şiə təliminin çıxardığı nəticələrə və gəldiyi qənaətlərə qaildir. Odur ki, əsərdə Səfvanın "zillət yolu" dediyi Hürrün gözündə "ömrə, günə məna verən insanlıq şərəfi və əbədi axirət nemətidir". Əksinə, Hürrün "nadanlıq və bədbəxtlik" dediyi Səfvanın gözündə "əql sahibi olmaq və dünya nemətinə yiyələnmək"dir.

Burada Hürrün Ömər ibn Sədə "Rəsulullaha (s) qiyamətdə nə cavab verəcəksən" sualı yada düşür. Belədə onun "İzzəti-xidmət Ali-Rəsuldadır" sözləri "Ömrə dəyər verən insanlıq şərəfi yalnız Peyğəmbər soyuna dərin ehtiram bəsləməklə mümkündür" şəklində Ömər ibn Sədə cavabı kimi başa düşülür. Bütün bunlar göstərir ki o, peyğəmbərlik əqidəsinə möhkəm bağlanan, sonuncu Peyğəmbərin (s) Tanrı qatındakı uca yerini və yüksək dəyərini yaxşı bilən, bunu özünün islami xislətinə çevirən bir igiddir. Heç şübhəsiz, Hürrü hürr edən və onu misilsiz igidə çevirən də elə budur.



Burada belə bir ştrixə də toxunmaq yersiz olmaz ki, qarşı cəbhələrdə yer alan bu döyüşçülərin nemət məsələsinə baxışları da köklü biçimdə fərqlənir.

Ümumiyyətlə, nemət məsələsi İslamın dərin ictimai fəlsəfi siqlət yüklədiyi köklü bir məsələdir. Allah-taala Qurani-Kərimdə ən müxtəlif mövqelərin ifadəçisi kimi çox incə məqamlarda işlənərək kəskin və kəsərli məna-məzmun xüsusiyyətləri kəsb edən nemət məsələsinə böyük önəm verir:

- ❖ “Allahın insanlara əta etdiyi mərhəmətə (verdiyi nemətə, ruziyə) heç kəs mane ola bilməz. Onun vermədiyi bir şeyi də Özündən başqa heç kəs göndərə (verə) bilməz. O, yenilməz qüvvət sahibi, hikmət sahibidir! Ey insanlar! Allahın sizə olan nemətini yada salın. Allahdan başqa sizə göylərdən və yerdən ruzi verən bir xaliq varmı?! Ondan başqa heç bir tanrı yoxdur. Elə isə necə (aldanıb haqdan) döndərilirsiniz?” *(“Fatir”, 2-3).*
- ❖ “Belə ki, orada dən (dənli bitkilər) göyərtdik; üzüm və yonca; zeytun və xurma (bağları); (Ağacları bir-birinə sarmaşan) bağçalar; (Növbənöv) meyvələr və ot (alaf) yetişdirdik. (Bütün bunlar) sizin və heyvanlarınızın istifadəsi üçündür!”*(“Abəsə”, 27-32).*
- ❖ “Onların ətrafında (xidmət üçün) özlərinə məxsus olan, sədəf içində gizlənmiş inci kimi gözəl oğlanlar dolanacaqlar. Onlar (dünyada gördükləri işlər barəsində) bir-birindən hal-əhval tutmağa başlayacaqlar. Və (söhbət əsnasında) belə deyəcəklər: “Biz bundan əvvəl (dünyada) ailəmiz içində olarkən (Rəbbimizin əzabından) qorxardıq. Artıq Allah bizə mərhəmət buyurub (minnət qoyub) bizi cəhənnəm (səmum) əzabından qorudu. Biz bundan əvvəl (dünyada) Ona ibadət edirdik. Şübhəsiz ki, O, (vədinə sadiq) kərəm sahibidir, rəhm edəndir! Elə isə (Ya Peyğəmbər! Sən müşriklərə) öyüd-nəsihət ver. Sən öz Rəbbinin nəməti (nübüvvət və İslam dini) sayəsində nə kahinsən, nə də divanə!” *(“Tur”, 24-36).*





Göründüyü kimi, bu ilahi bəyanatlarda nemət məsələsi çoxqatlı və çoxşaxəli məna-məzmun şəbəkəsinə malik olub, demək olar, həyatın bütün məhrəmani nöqtələrini özündə birləşdirməkdədir. Səfvan–Hürr dialoquna bu baxımdan yanaşdıqda "dünya neməti" Yezid ordusunun sıravi sıra nəfərinin gözündə "ötəri əyləncələr, keçici şan-şövkət, müvəqqəti mal-mülk"dürsə, İmam Hüseyn ordusuna qoşulmaqla şərəflənən keçmiş Yezid sərkərdəsinin gözündə fani olacaq və yalnız bədbəxtlik gətirəcək, habelə Tanrı qatında heç bir dəyəri olmayan çürük, puç və saxta köpükdən başqa bir şey deyil. Ulu Yaradan Şanlı Kitabında necə də gözəl buyurmuşdur:

❖ "Allah göydən bir yağmur endirdi, vadilər öz tutumlarına görə onunla dolub daşdı. (Sudan əmələ gələn) sel üstünə çıxan bir körpünü alıb apardı. (Haqq din olan İslam insanlara, torpağa həyat verən suya, müşriklərin etiqadı isə boş köpüyə bənzər). Bəzək şeyləri və ya əşya (qab-qacaq) düzəltmək məqsədilə insanların od üzərində qızdırıb əritdikləri (qızıl, gümüş və s. filizlərin) üstündə də buna bənzər bir köpük vardır. Allah haqq ilə batili (sizdən ötrü) ayırd etmək üçün belə misallar çəkir. Köpük heç bir şey olmadığı üçün uçub gedər. İnsanlara fayda verən bir şey isə yer üzündə qalar. Allah belə misallar çəkir" *("Ər-rəd", 17).*

❖ "Sizdə olan (dünya malı) tükənər, Allah dərgahında olan (axirət nemətləri) isə əbədidir. (Allah yolunda əziyyətlərə) dözənləri etdikləri yaxşı əməllərin müqabilində mükafatlandıracağıq (yaxud gördükləri yaxşı işlərin əvəzində onlara daha yaxşı mükafat verəcəyik" *("Nəhl", 96).*

Füzuli irsindəki oxşar örnəklər də Səfvan–Hürr mükaliməsinin bu qatını əsaslı surətdə təsdiq etməkdədir.

Səfvan–Hürr dialoqunu izləyən şeir parçasının dərin irfani məzmunu Füzulinin öz qəhrəmanını bir qədər ucaltmaq istədiyini göstərir. Buradan anlaşılır ki, şair Hürrə olduqca böyük sayğı ilə yanaşır. Çünki şeirin leksikonundakı "qabili-kəşfi-rümuzi-hikmət" tərkibi heç vəchlə epizodik personaja



aid edilə bilməzdi. Axı hikmət İslamda olduqca önəmli anlayışlardan biridir. Belə uca islami dəyəri şairin öz qəhrəmanı ilə bağlaması bir xeyli uzaqgedən mətləblərdən soraq verir. Məsələn, ondan soraq verir ki, "hər kişi hikmət rəmzlərini görməyə layiq görülməz" deyərkən şair öz qəhrəmanına, az qala, övliya kimi baxdığını, artıq onun müqəddəslərə yaxınlaşdığını, Kərbəla igidi olaraq sıravi insanlardan qat-qat yuxarıda dayanmağa layiq olduğunu sevinə-sevinə büruzə vermək istəyir və buna nail də olur. Unutmayaq ki, Hürrün sürəkli dəyişiklik keçirməsi əslində elə "rümuzi-hikmət"dir, Tanrının onun halına şamil buyurduğu xas lütf və mərhəmətidir.

Şeirdə "tərdeyi-pəşkik" (şəkk-şübhə örtüyü) ifadəsində əksini tapmış başqa məsələ tərəddüdkarlığın təbii bir hissiyyat olmasıdır. Burada Nəsiminin məşhur "Cümənamə"sindəki:

Ey əlləzi yuvəsvis, taətlərin həbadır,
Əgri yolun zəlalət, çürük sözün xətadır!
Zənnü güman içində qalmışsan, ey yəqinsiz,
Məşkuk ilən kim aydır, qılmaq əməl, rəvadır?[196] –

sözləri yada düşür.

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, bu Nəsimi misraları mübarək "Həcc" surəsinin 11-ci ayəsinə əsaslanır. Həmin ayə belədir: "İnsanların eləsi də vardır ki, Allaha şəklə ibadət edər. Əgər ona bir xeyir toxunsa, (dini barəsində) arxayın olar (İslamdan möhkəm yapışar). Yox, əgər ona bir bəla (müsibət) üz versə, çöhrəsi dəyişər (İslamdan üz döndərib yenə küfrə qayıdar). Beləsi dünyanı da əldən verər, axirəti də. Açıq-aşkar ziyan budur, bu!"

Maraqlıdır ki, İmam Hüseynin (ə) də bu ayəyə əsaslanan bir kəlamı vardır. Həmin kəlamında o, insanları "dünyanın köləsi" adlandıraraq buyurur ki, adamların çoxu xörəyin dadına baxırmışcasına dinin dadına baxar, din onların şəxsi

.................................

[196] *Nəsimi. Göstərilən əsəri*





mənafelərinə uyğun gəldikdə onlar dindən dördəlli yapışarlar, yox, əgər dini göstərişlər onların fərdi mənafeyinə toxunsa, onlar dindən üz döndərib qaçarlar.

İstər Nəsimi düşüncəsinin, istərsə də Füzuli təfəkkürünün əsasında dinimizin zənn haqqındakı ehtiyatlı mövqe tutma çağırışı da durur; məs.: "(Müşriklərin) çoxu ancaq zənnə uyar. Zənn isə əsla həqiqət ola bilməz. Şübhəsiz ki, Allah sizin əməllərinizdən xəbərdardır" *("Yunus", 36)*.

"Bu ayədə zənnə tabe olan müşriklər qınandığı kimi, müsəlmanlar da elmə təşviq olunur. Qazi Beyzaviyə görə, bu ayə elmi qaynağından öyrənmənin vacib olduğuna təqlid və zənlə kifayətlənmənin caiz olmadığına dəlildir"[197].

"Ey iman gətirənlər! Əgər bir fasiq sizə (pis) bir xəbər gətirsə, dərhal (onun doğruluğunu) yoxlayın, yoxsa bilmədən bir qövmə pislik edər, sonra da etdiyinizə peşman olarsınız!" *("Hücurat", 6)*.

"Rəvayət edildiyinə görə, Peyğəmbər (s) Vəlid ibn Ütbəni bəni-müstəliq qəbiləsinə zəkat məmuru olaraq göndərmişdi. O, onlarla arasında qabaqcadan var olan bir düşmənçiliyə görə qorxuya düşmüş, yarı yoldan qayıtmış, Peyğəmbərin yanına gəlib onların zəkat verməkdən boyun qaçırdıqlarını bildirmişdi. Peyğəmbər onlara qəzəblənmiş, müharibə etməyi belə planlaşdırmış, Xalid bin Vəlidi də vəziyyəti öyrənmək üçün göndərmişdi. Xalid öz müşahidələri nəticəsində onların azan deyib namaz qıldıqlarını və zəkatlarını da verdiklərini Peyğəmbərə bildirmişdi. Ayənin məhz bu əhvalatdan sonra gəldiyi müxtəlif rəvayətlərdə əksini tapmışdır"[198].

❖ "Ey iman gətirənlər! Çox zənnə-gümana qapılmaqdan çəkinin. Şübhəsiz ki, zənnin bəzisi (heç bir əsası olmayan zənn) günahdır. (Bir-birinizin eyibini, sirrini) arayıb-axtarmayın, bir-birinizin qeybətini qırmayın!" *("Hücurat", 12)*.

Göründüyü kimi, Füzuli də islami mövqeyə tam uyğun

.................................

[197] *Quran-i Kərim və türkcə açıqlamalı məali, hazırlayanlar: prof. Ali Karaman, prof. Hayreddin Karaman və başq., Mədinə, 1992, səh. 212*

[198] *Yenə orada, səh. 515*





olaraq bu fikirdədir ki, “zülməti-qeydi-həyat” – “yaşayış buxovunun qaranlığı” yalnız “pərdə rə’f olduqda” – “şəkk-şübhə örtüyü aradan qalxdığı zaman” işığa çıxır, aydınlıq qazanır.

* * *

Fəslin sonrakı hissəsində də Hürrün spesifik cizgiləri əksini tapmışdır. Onları belə ümumiləşdirə bilərik:

**1. “Hürri-vəfadar”.** “Hədiqətü-s-süəda” həm də bir vəfanamədir. İllah da 7-10-cu babların gərgin süjet xətti üzərində qurulan zəngin məzmunlu epizodların çoxunda bu və ya başqa ölçüdə vəfalılıq qırmızı xətt kimi özünü hər səhifədə büruzə verir. Ötəri deyildir ki, bu kiçik parçada Hürr bir neçə dəfə İmam Hüseynin (ə) dilindən razılıq almağa can atır, qail olduğu dini-dünyəvi rəhbərin duasını-alqışını almadan şəhidlik şərbətini içmək istəmir. Bu yerdə Mirzə Cahan Şah Həqiqinin:

Yarın qəmində bulmadı hər bisəfa səfa,
Yarın vəfasını nə bilir çəkməyən cəfa?!

Və Nişat Şirvaninin:

Yaxşı gündə bilmək olmaz kim, dəyanət kimdədir,
Yaxşı yoldaşı yaman gün imtahan etmək gərək! –

beytləri yada düşür. Və həm bu beytləri əzbər bilən, həm də Kərbəla vaqeəsindən yaxşı xəbərdar olan orta əsr Azərbaycan oxucusu, heç şübhəsiz, bunları daxili uyarlıqda götürüb qavrayacaqdı. Bu isə bir daha göstərir ki, orta əsr müsəlman mədəniyyətinə yalnız vahid bir orqanizm kimi yanaşılmalı, yeri gəldi-gəlmədi onu regionlara bölməkdən qaçılmalıdır.

**2. “Afərin!” sədası.** Bu cəhəti önə çıxaran başlıca amil Səfvanı bir zərbə ilə atdan salan Hürrü hər iki qoşunun eyni zamanda alqışlamasıdır. Bu yerdə İmam Hüseynin (ə) ali baş





komandan kimi düşmən ordusuna etdiyi "Gəlin bir-bir döyüşə gələk ki, mərdi namərddən seçmək mümkün olsun" təklifi yada düşür.

Digər tərəfdən, burada da əski mərdlik görüşlərinin qabarıq təsiri duyulur. Çünki qədim dünyanın təsəvvüründə cəngavərlik, döyüşkənlik, at belində ömür-gün keçirmək mərdliyin, igidliyin, kişiliyin ayrılmaz, qorxmaz daşıyıcısı idi və Hürr də hələ saflığını, paklığını itirməmiş o sakral aləmin adamı idi.

**3. "Əntə Hürrün".** Kərbəla vaqeəsi bəşəriyyətin ən böyük sınaq meydanı olaraq haqqın batildən ayırd edildiyi çox həssas tarixi hadisələrdəndir. Bunu o hadisənin ilhamvericisi və rəhbəri olan İmam Hüseynin (ə) ayrı-ayrı qəhrəmanlara verdiyi tarixi qiymətlər də göstərir. Bu baxımdan o ulu din böyüyünün Hürr haqqında buyurduğu sözlər çox səciyyəvidir.

Füzuli Hürrün Səfvanın öldürülməsindən sonra intiqam hissi ilə alışıb yanan üç qardaşını da həlak etməsini təsvir edərək bildirir ki, o, İmam Hüseynin (ə) yanına gələrək, "Məndən razısanmı?" soruşur. Sanki Hürr bununla indiyədək



*Hürr ibn Yəzid Riyahi (r.ə)-nin qəbri olan məscid.*
*İraq. Kərbəla şəhərinin yaxınlığında*



törətdiyi qəbahətə görə dini-dünyəvi rəhbərin dilindən bəraət almaq və əzəli-əbədi axirət səfəri qarşısında xeyir-dua əldə etmək istəyir. İmam Hüseyn (ə) isə bu Kərbəla igidinin şəxsiyyətinə, şücaətinə, özünüdərkinə, tövbəkarlığına misli görünməmiş qiymət verərək buyurur ki, "anan sənə Hürr adını verdiyi kimi hürsən". Füzulinin İmam Hüseynin (ə) bu kəlamını ərəbcə verməsi bir yandan kəlam sahibinə olan dərin sayğısının ifadəsidirsə, o biri yandan kəlamın özünün tarixi tutumuna, ictimai mahiyyətinə, fəlsəfi siqlətinə, dini dəyərinə bəslədiyi birmənalı müəllif münasibətinin göstəricisidir. Odur ki, həm Hürrün, həm də başqa Kərbəla şəhidlərinin şəninə ucalmış bu imam buyuruğu üzərində ayrıca dayanmaq yerinə düşərdi.

Oradan başlayaq ki, çox əski adət-ənənə olan və bütün xalqların həyatında yer alan adqoyma anlayışı etnoqrafik fakt kimi köklü məsələ olub, islami məzmuna da malikdir. Aşağıdakı qeydlər problemin elmi-nəzəri qoyuluşu və həlli ilə bağlı aydın anlayış əldə etmək üçün kifayətdir.

Xüsusi adları öyrənən antroponimika adlı bir elm sahəsi vardır. Bu sahənin mütəxəssisləri müəyyənləşdirmişlər ki, "dini mənbələrdən (Tövrat, İncil, Quran) məlum olduğu üzrə ad tale ilə bağlıdır"[199].

"Elmi araşdırmalar göstərir ki, müqəddəs adlar nəinki insanın taleyini müəyyənləşdirir, hətta adları verilənlərin həyatından hadisələr (peyğəmbərlər və s.) və onların adət və xasiyyətlərindən nişanələr təkrar olunur. Bu faktları iki ad üzərində nəzərdən keçirək.

"Musa" (qədim yəhudicə – Moissey) sözü hərfən (sulu, sudan çıxarılmış; övlad; sehrkar; gələcəyi qabaqcadan xəbər verən) deməkdir. Musa Peyğəmbərin dilinin pəltəkliyi Azərbaycan, türk, yəhudi xalqlarında bu adı daşıyanlar arasında geniş yayılmışdır. Onlar uşaqlıq və gənclik çağlarını arxada qoyduqdan sonra dilləri açılmışdır. Sanki onları ilahi

.................................

[199] *Tahirova M.N. Müqəddəs adlar, Filologiya məsələləri, 4, səh. 203*





qüvvə qoruyur. Onlar uzunömürlü olur, həyatlarında mərhələ-mərhələ hörmət və nemətlərin yüksəkliyinə nail olurlar[200].

"Fatimə" (ərəbcədə "ana döşündən ayrılmış" deməkdir). Adın islami yozumu belədir: "cəhənnəm odundan uzaqlaşdırılaraq xilas edilmiş", "seçilmiş və xilas olunmuş", "sevməli".

Yunus ibn Zəvyan İmam Cəfəri-Sadiqdən nəql edir: "Ona Allah ad verdi və bu adın 9 təyini var: Fatimət minə-ş-şər – *şərdən uzaqlaşdırılmış*. Suddiqə – *doğruçu, pak.* Mübarəkə – *bərəkətli*. Tahirə – *təmiz*. Zakiyə – *zəkalı*. Raziyə – *razı qalan.* Mərziyyə – *razı qalınmış.* Müqəddəsə – *müqəddəs xanım.* Zəhra – *parlaq*.

Səbail və Binəqədi rayonlarının vətəndaş aktlarının qeydiyyatı idarələrinin sənədlərindən bəlli olur ki, bu adların yeddisi indi də azərbaycanlılar arasında fəal surətdə işlənir"[201].

Göründüyü kimi, biri on dörd məsum sırasında yer alan iki ad üzərində aparılmış təcrübi araşdırmalar da tanınmaz biçimdə göstərir ki, insana qoyulan ad, sözün gerçək anlamında, onun ömrünə, həyatına, fəaliyyətinə, xarakterinin və dünyagörüşünün formalaşmasına ciddi təsir edir. Yəqin, elə buna görədir ki, Rəsulullah övladın ata üzərindəki haqlarını sadalarkən gözəl ad qoyulmasını da önə çəkir. Yəhya Peyğəmbərin adının Qurani-Kərimdə ayrıca mənalandırılması isə İslamın bu məsələyə münasibətinin genişliyinə ən tutarlı dəlildir *("Məryəm", 7).*

Füzuli də "Hədiqətü-s-süəda"da İmam Həsəni (ə) öyərkən:

Məhi-gərduni-iffətü ismət!
Həm "Həsən" namü həm Həsən sirət! –

*(O, namus və paklıq səmasının ayı idi. Həm adı Həsən (gözəl) idi, həm də xisləti)* deyərək İmam Həsənin (ə) adının da xisləti kimi gözəl olduğunu vurğulayır.

.................................

200 *Yenə orada, səh. 206-207*

201 *Yenə orada, səh. 207-209*



Bu bilgiləri İmam Hüseynin (ə) Hürrün sualına cavab verərkən öz fikrini onun adının anlamı ("Hürr" ərəb dilində "azad" deməkdir) üzərində qurması və bunu onun anası ilə bağlaması, habelə Füzulinin bu ali qiyməti orijinalda əsərə gətirməsi əsaslı surətdə sübuta yetirir ki, birincisi, İmam Hüseyn (ə) bir övliya kimi adın insan taleyinə yön verdiyini təqdir etmiş, ikincisi, bunu ictimaiyyətə çatdırmağı məsləhət bilmiş, üçüncüsü, keşməkeşli ömür yaşamış Hürrün axırda öz adının həqiqi gerçək məzmununa qovuşduğunu ifadə etmək istəmişdir. Bu isə Kərbəla vaqeəsinin yalnız döyüş səhnələri baxımından deyil, mənəviyyat, əxlaq və estetika baxımdan da dərslə dolu həyat məktəbi olmasının başqa bir təsdiqidir.

İmam Hüseynin (ə) bu tarixi kəlamının başqa bir tərəfi öz məna-məzmun çevrəsində birləşdirdiyi azadlıq ideyasındadır. Belə ki, o ulu din böyüyü "Hürr" sözünün ümumi və xüsusi mənalarını bir-birinə qovuşdurmaqla başçılıq etdiyi hərəkatın mayasında ilk növbədə qail olduğu dindən qaynaqlanan köklü azadlıq ideyasının dayandığını da nəzərə çarpdırmaqdadır. İmanını az-çox qoruyub saxlamağı bacarmış ayrı-ayrı şəxslərin irticaçı Yezid hakimiyyətinin sıxıntı və boğuntuları, ictimai, mənəvi təzyiqləri qarşısında yalnız İmam Hüseyn (ə) şəxsiyyətinə güvənmələr, bu şəxsiyyətin müqəddəs islami məziyyətlərini yeganə qurtuluş yolu saymaları məhz imamın Hürr haqqındakı tarixi kəlamında bir daha özünün real ifadəsini tapmışdır. Ötəri deyildir ki, ilahiyyatçılar Kərbəla vaqeəsinin bu tərəfi ilə bağlı geniş mühakimə yürüdür, problemi dini, fəlsəfi, ictimai və etik-estetik aspektlərdə dərindən öyrənir və müasir cəmiyyətlər üçün böyük önəm qazanan nəzəri və təcrübi qənaətlərə gəlirlər. Parçada üzərində ayrıca durulmasına ehtiyac duyulan cəhətlərdən biri də Hürrə hatifdən nida gəlməsidir. Əsərin başqa fəsillərində geniş açıqlanan bu anlayışın burada Hürlə bağlanılması bir yandan bu Kərbəla igidinin Tanrı qatındakı uca yerini, bir yandan da imamının öz döyüşünə verdiyi tarixi qiymətdən ilham alaraq var gücü ilə cihad etməsini özündə birləşdirir. Hürr yeganə Kərbəla şəhididir ki, məqtəllərdə



onun susuzluğundan danışılmır. Axı o, yalnız Aşura səhəri İmam Hüseyn (ə) düşərgəsinə keçmişdi. Ancaq hatifdən nida gəlməsinə baxmayaraq, Hürr yenidən meydana dönür, yenə də, bəlkə öncəkindən daha şücaətlə döyüşür. Yada salaq: “Hürr o sədadan şad olub həzrət imamın hüzuruna qayıtdı və dedi: “Ya imam, cəddinin xidmətinə gedirəm, sifarişin nədir?” Həzrət imam bu xəbərdən giryan olub dedi: “Ya Hürr, biz də sənin arxanca gəlirik”.

Xülasə, o şücaət meşəsinin şiri və igidlik dəryasının nəhəngi düşmən qoşununun sırasına rəxnələr salaraq özünü adamların ən qalın yerinə vurdu və döyüşdə nizəsi sındı...”

Hürrün dərəcəsinin yüksəkliyini göstərən bir ştrix diqqəti çəkir. Gör o, İmam Hüseynə (ə) necə ərk edir ki, öz dini-dünyəvi rəhbərinə onun babası Rəsulullahın xidmətinə getdiyini çox yəqinlik içərisində deyə bilir. İmam Hüseynin onun bu sözlərindən ağlaması və lütf edərək cavab verməsi də diqqətdən yayınmır.

Bütün bunlar – hatifdən Hürrə səda gəlməsi, Hürrün İmam Hüseynə (ə) ərki, Kərbəla vaqeəsində şəhidlər arasında ayrı-seçkiliyə yol verilmədiyini, yersiz və gərəksiz müqəddəsat xofu yaradılmadığını, əksinə, həlim və mülayim bir ab-havanın hökm sürdüyünü sübuta yetirir. Bu isə başqa surətlərlə yanaşı, Hürrün də xarakterini açıb göstərən Füzuli qələminin ustalıqlarından biri kimi ortaya çıxır. Beləliklə, aydın olur ki, əsərin bu fəsli daha bir Kərbəla igidinin İmam Hüseyn (ə) fədakarlığına ayrılmış dərin dini-fəlsəfi və zəngin bədii-estetik keyfiyyətlərə malik bir bölümüdür. “Hədiqətü-s-süəda”nın “Hürr” payı tarixin dönüm nöqtələrindən birini təşkil edən Kərbəla vaqeəsinin dini ruhunu, fəlsəfi çəkisini və ictimai yerini bir daha hərtərəfli surətdə əks etdirir və təkcə İmam Hüseyn (ə) haqqında yox, bütövlükdə bu hərəkat haqqında parlaq dastan təsiri bağışlayır.



# KƏRBƏLA SƏMASININ QOCA QARTALI

Kərbəla vaqeəsinin özünəməxsüs cəhətlərindən biri də bu uca din-iman məktəbinin çox müxtəlif şəxsləri əhatə etməsidir. Belə qəribə taleli şəxslərdən biri də Həbib bin Müzahirdir. Bütün məqtəl və mərsiyələrdə o, təqribən səksən yaşlarında olan nurani bir qoca olaraq təqdim edilir. Füzuli isə qələminə güc verərək özünün söz ehtiyatının bütün qüvvəsi ilə bu Kərbəla igidini xarakterizə edir. O, Yezid qoşununun sərkərdəsi Ömər Sədin əmisi oğlu Haşimi nəzərdə tutaraq yazır: "Andan sonra Həbib bin Müzahir mütəvəccihi-meydan oldu. Və (ol) bir piri-kühənsali-sahibkəmali-pakizəxisali-həmidəfial idi ki, asari-təqva nasiyeyi-əhvalində peyda və əlaməti-helmü həya surəti-ə'malində hüveyda idi"[202].

*(Müzahir oğlu Həbib meydana girdi. O, kamal sahibi, pakizəxislət, tərifə layiq işlər görən yaşı keçmiş bir qoca kişi idi ki, əhvali-ruhiyyəsindən təqvalılıq yağırdı. Və əməllərindən helm və həya boy göstərirdi).*

Füzuli qələmi bu Kərbəla igidini olduqca əlvan boyalarla rəsm edir. Odur ki, bu sözlər epitet olmaqdan daha çox Həbibin dini-mənəvi aləmindən soraq verən, ruhi-psixoloji yaşantılarını əks etdirən və müəyyən tarixi məlumatlara söykənən mənqəbəvi motivlərdir. Əgər bir surəti bütün aydınlığı və genişliyi ilə duyub qavramaq istəyiriksə, onda

[202] *Füzuli. Əsərləri, VI cild, səh.294*





gərək həmin söz və ifadələri həm ayrı-ayrılıqda, həm də əsərin ümumi məzmunu daxilində gözdən keçirməyə çalışaq.

Mətndə Həbiblə bağlı işlədilən ilk təyin "sahibkamal" deyimidir. Bəllidir ki, insan kamalı, kamil insan, mənəvi yetkinlik, xarakter bitkinliyi sənətin, mədəniyyətin daimi mövzularından olmuş, ədibləri həmişə dərindən məşğul etmiş, onların bu yöndə bir-birindən cəlbedici duyğu və düşüncələr qələmə almasına yol açmışdır. Bəs kamal, kamillik nədir və bunların İslam dinindəki yeri necədir?

1. Oradan başlayaq ki, **"kamillik"** anlayışı Qurani-Kərimdə *kəmalə, 'aqələ, fəkərə, rəşədə, fəqəhə, 'aləmə, hakəmə* kimi köklərdən gələn və sirf müsbət məzmuna malik onlarla söz və ifadədə özünü göstərir. Bundan başqa, Müqəddəs Kitabımızdakı "liulil-əlbab" – *əqli-mənəvi yetkinlik,* "müttəqi" – *Allah qarşısında şüurlu məsuliyyət dərrakəsi ilə ömür sürən şəxs* və "usvatun hasənətun" – *hər cəhətdən hamıya gözəl nümunə olan kamil şəxsiyyət* kimi dolğun tutumlu və parlaq şəxsiyyət modelləri, sözün gerçək anlamında əsl kamil insan tipinin ən bariz, ən səciyyəvi əlamətlərinin toplusudur. Özü də bu əlamətlər çox vaxt Ulu Yaradana həqiqi bəndə olma kimi vahid bir ideya ətrafında və möhkəm bir mövzu-məzmun müstəvisində təqdim edilir; məs.: "Yaxşı əməl heç də (namaz vaxtı) üzünüzü günçıxana və günbatana tərəf çevirməkdən ibarət deyildir. Yaxşı əməl sahibi əslində Allaha, Axirət gününə, mələklərə, Kitaba (Allahın nazil etdiyi bütün ilahi kitablara) və peyğəmbərlərə inanan, (Allaha) məhəbbəti yolunda (və ya mal-dövləti çox sevməsinə baxmayaraq) malını (kasıb) qohum-əqrəbaya, yetimlərə, yoxsullara, (pulu qurtarıb yolda qalan) müsafirə (səfər əsnasında pulu qurtarıb yolda qalan yolçulara), dilənçilərə və qulların azad olunmasına sərf edən, namaz qılıb, zəkat verən kimsələr, eləcə də əhd edəndə əhdinə sadiq olanlar, dar ayaqda, çətinlikdə (ehtiyac, yaxud xəstəlik üz verdikdə) və cihad zamanı (məşəqqətlərə) səbir edənlərdir. (İmanlarında, sözlərində və əməllərində) doğru olanlar məhz onlardır. Müttəqilər də elə onlardır!" *("Bəqərə", 177).*



Göründüyü kimi, bu ayədə *yaxşı, pak, təmiz, əxlaqı saf və nöqsansız, kamil adam* demək olan "birr" sözü ilə nəzərdə tutulan və ilahi mərhəməti qazanmağa layiq olan 17 yüksək insani keyfiyyət eyni bir mənbədən gələn və eyni ideya çevrəsində birləşdirilən vahid bir müstəvidə qavradılır. Bu təqdimat orijinallığı misilsiz bir Quran göstəricisi kimi surələrin çoxunda özünü büruzə verir. Belə ki, bütövlükdə Qurani-Kərimə göz gəzdirdikdə Allahın mömindən – kamilləşmə yolunda addımlayan sadə, zəhmətkeş bir bəşər övladından nələri və necə tələb etdiyi aydın görünür. Məsələn, görünür ki, mömin qidasına *("Əraf", 31),* ailəsinə – evlənib boşanmasına *("Bəqərə", 221-222),* uşağın neçə il əmizdirilməsinə *("Bəqərə", 233),* uşaqların ata-analarının yataq otaqlarına nə vaxt və nə cür girmələrinə *("Nur", 58-59)* və yeməyin birlikdə, yaxud ayrılıqda yeyilməsinə *("Nur", 61),* eləcə də ticarət *("Bəqərə", 275),* mirasın bölünməsi *("Nisa", 11-12, 176),* danışmaq, yol getmək *("Loğman", 18-19)* kimi məişətlə, cəmiyyət həyatı ilə bağlı ən müxtəlif fərdi və ictimai əxlaq normalarına qarşı olduqca həssas olmalı, onları son dərəcə yüksək səviyyədə yerinə yetirməyə çalışmalıdır. Görünür elə buna görədir ki, Ulu Yaradan möminə onun ilahi buyuruq və qadağalara bağlılıq dərəcəsi qədər dəyər verir *("Nisa", 95; "Ənam", 10; "Tövbə", 20).*

Yaxud Qurani-Kərimə yığcam bir baxış belə islami əxlaq qaydalarının ümumbəşəriliyinə dair aydın anlayış yaradır. Məsələn, bəlli olur ki, Qurani-Kərim təkcə iman gətirənlərə deyil, bütün bəşəriyyətə ünvanlanmışdır *("Ənam", 19; "Əraf", 158),* ədalət və ləyaqət nümunəsi olaraq başqasını olduğu kimi, bilavasitə fərdin özünü *("Bəqərə", 44, 267),* yadları olduğu qədər yaxınları, yoxsulları olduğu qədər varlıları *("Nisa", 135; "Mütəssifim" 1-3),* insanın öz cəmiyyətinə olduğu qədər başqa cəmiyyətləri *("Maidə", 2, 8)* də əhatə edir.

Belə olan surətdə Qurani-Kərimdə möminlərə axirətdə veriləcək nemət və mükafatların olduqca əlvan və rəngarəng





olması özlüyündə bir xeyli aydınlıq qazanmağa başlayır. Belə ki, Müqəddəs Kitabımızda "iman gətirib saleh işlər görənlər" ifadəsi ilə başlanıb, bütün cah-cəlalı ilə cənnətin vəd edildiyi 56 ayə var. Həmin ayələrdə möminlərin Ədn, Firdovs, Məva, Nəim adlı cənnətlərdə meyvələrlə ruzulanmaları, bağçalarda və yüksək köşklərdə nəşələnmələri, dinclik içərisində yaşadıqları, qızıl bilərziklərlə bəzənmələri, ipək libaslar geyərək mirvarilər taxıb misli-bərabəri görünməyən kölgəliklərdə pak-pakizə zövcələrlə mütəkkələrə dirsəklənmələri, əbədi nemətlərə, nura, qısası, dilədikləri hər şeyə qovuşmaları təsvir olunur *("Bəqərə", 25; "Ali-İmran", 57, 171; "Bəqərə", 82; "Nisa", 57; "Maidə", 9; "Yunus", 9; "Məryəm", 62; "Həcc", 50; "Ənkəbut", 58; "Rum", 45; "Bəyyinə", 8 və s.).*

Quran ümmanından uzaqbaşı bir damla sayıla biləcək bu dar qeydlər belə danılmaz biçimdə göstərir ki, İslam dinində insan kamalı ən ali vasitə, ilahi qüdrət və hikmətin dərki üçün kamil insan isə Allahın ondan tələb etdiyi uca dəyərlərin çoxunu özündə birləşdirən və uca dərgahda müəyyən ehtirama malik şərəfli və sədaqətli bəndə hesab edilir.

Həbib haqqındakı "sahibkamal" deyiminə belə geniş bilgilərin işığında baxdıqda isə, onları əsərin ümumi məzmununa qovuşdurduqda, həmin deyimin aid edildiyi personajın ayrılmaz-qopmaz mənəviyyat və əxlaq göstəricisi olduğu ortaya çıxır. Ötəri deyildir ki, Füzuli elə başlanğıcdaca Həbibin ömrünün çoxunu Həzrət Muhəmmədlə İmam Əlinin yanında keçirdiyini bildirir, mütəmadi surətdə Quran oxuduğunu yazır.

Əgər "sahibkamal" ifadəsini "tədbirli şəxs" mənasında başa düşsək, onda gərək bir az əvvələ qayıdıb məhərrəm ayının 8-ci günündə Həbibin İmam Hüseynin qoşununu gücləndirmək üçün göstərdiyi son cəhdi xatırlayaq. Əsərdə oxuyuruq: "Bu hücumu (ibn Ziyadın Kərbəlaya durmadan qoşun yeritməsini) görəndə Həbib bin Müzahir dedi: "Yəbnə Rəsulullah, bəni-Əsəd qəbiləsi bu yaxınlıqdadır, icazə versəniz, gedib onları çağırmaq olar. Bəni-Əsəd qəbiləsində şəhadət mərtəbəsinə



yetmək istəyənlər çoxdur, amma bu mərəkədən onların xəbəri yoxdur".

Xülasə, Həbib bin Müzahir icazə alıb o qəbilənin içərisinə getdi və nida qıldı: "Ey sə'adəti-şəhadətə müştaq olanlar və ey dövləti-baqi istid'a qılanlar" Şe'r:

Şəhbazi-aşiyani-vilayət həlakinə,
Səhrayi-Kərbəlada hücum eyləmiş qürab.
Şiri-şikargahi-ğəzadan hücum edib,
Əzmi-Fərat şəhdini mən' eyləmiş kilab[203].

*(Vilayət, imamlıq yuvasını qorumaq üçün qanad açmış toğrulu, şahini öldürməkdən ötrü Kərbəla düzündə qarğa-quzğun sürüsü hücuma keçmişdir. Sən bir qəza və qədərin işinə bax ki, murdar bir köpək sürüsü şəhidlər sərvərinin üzünə Fərat çayının dadlı suyunu bağlamağa cəsarət etmişdir).*

Mətnin ardını oxumamış elə buradaca qəhrəmanımızın bəzi keyfiyyətləri üzərində dayanaq.

İlk növbədə diqqəti bu çəkir ki, Həbib bu təklifi çox kəskin məqamda, həlledici anda irəli sürür. Bu isə qətiyyən ötəri davranış olmayıb, birbaşa Qurani-Kərimdən qaynaqlanan əsl islami təşəbbüskarlıqdır. Axı Ulu Yaradan Şanlı Kitabında dəfələrlə bəndələrini Qurana əsaslanaraq tədbir tökməyə çağırır *("Nisa", 82; "Sad", 29; "Muhəmməd", 24)*. Deməli, Füzuli "hər gecə bir növbə kəlami-İlahi xətm etmək mö'tadı olmuşdir" deməkdə və bununla da öz qəhrəmanının ardıcıl olaraq Tanrı Sözünü təkcə zahirən oxumaqla qalmayıb, ondakı ilahi göstərişləri qanına-canına hopdurduğunu nəzərə çarpdırmaqda tamamilə haqlı idi.

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Qurani-Kərim özünün bütün göstəriciləri üzrə "Hədiqətü-s-süəda"da işlək və çevik bir hərəkətəgətirici stimul və istiqamətverici faktordur.

Parçada qəhrəmanın daxili aləmi ilə bağlı diqqəti çəkən ikinci cəhət Həbibin öz təklifini İslamın şəhidlik

.................................

[203] *Füzuli. Əsərləri, VI cild, səh.265*





konsepsiyası ilə əsaslandırmasıdır. Təfərrüata varmadan bircə bunu deyək ki, bu konsepsiya bütövlükdə İslamiyyətin ən sarsılmaz dayağı kimi İmam Hüseyn hərəkatının özülünü təşkil etməkdə, Kərbəla igidlərinin fərdi və ictimai simasını müəyyənləşdirməkdə və gələcək nəsillərin qeyrətli dindar və vətəndaş olaraq yetişməsinə yön verməkdədir. Buna görə də "Allah yolunda qətlə yetirilənlənləri ölü adlandırmayın. Yox, onlar diridirlər, ancaq siz dərk etmirsiniz" *("Bəqərə", 154)* səpkili hökmləri qətiyyən sırf sxolastik ehkam, yaxud sırf mistik təlqin hesab etmək olmaz. Qətiyyən unutmaq olmaz ki, Həzrət Muhəmmədin həyat və fəaliyyətinin böyük bir hissəsi gətirdiyi dini yayıb genişləndirməyi uğrunda apardığı çoxsaylı hərbi yürüşlərlə bağlıdır. Belədə Həbibin bəni-Əsəd qəbiləsini məhz üzvlərinin şəhidliyə olan eşqə görə seçməsi bir yandan özünün məziyyətidirsə, o biri yandan bu konsepsiyanın Hicrətin 61-ci ilində artıq qəbilə səviyyəsində mənimsənilərək ictimailəşməsinin aydın göstəricisidir.

Personajın parçada əksini tapmış üçüncü cəhəti Yezid hakimiyyətinin İmam Hüseynə qarşı yürütdüyü irticaçı daxili siyasətlə bağlıdır. Belə ki, o, imama "bu mərəkədən onların xəbəri yoxdur" deməklə mənfur Yezid üsuli-idarəsinin son dərəcə məxfi davranmasına, Əhli-beyt sevgisi ilə alışıb yanan geniş kütlələri İmam Hüseyn hərəkatından xəbərsiz saxlamaq, uzaq tutmaq üçün dəridən-qabıqdan çıxmasına işarə vururdu. Bu isə nəinki alt qatda, elə ən yüksək səviyyədə də İslamın on köklü prinsipindən çoxunun hakimiyyəti zorla ələ keçirmiş, qəsb etmiş yuxarı dairələr tərəfindən bilərəkdən, nümayişkaranə şəkildə ayaqlar altına alınması, tapdalanması idi. Ötəri deyildir ki, Həbib bəni-Əsəd camaatına xitabında şəhidliyi "səadət, əbədi dövlət" adlandırır, belə uca dəyərin qədrini bilməyən Yezid hökumətini isə "qarğa-quzğun dəstəsi, köpək sürüsü" hesab etdiyini mərdi-mərdanə elan etməkdən zərrə qədər çəkinmir.

Hissə belə davam edir: "Rəvayətdir ki, o tayfadan doxsan nəfər şücaətli namdar İbnül-Bəşiri özlərinə başçı seçib



mükəmməl silahlanmış halda Həbib ibn Müzahirlə Həzrət Hüseyn əleyhissəlamın hüzuruna gəldilər. Ömər Səd bundan xəbər tutub Əzrəq Şamini dörd min namərdlə yolu kəsməyə göndərdi. Onlar Fərat kənarında bir-biri ilə qarşılaşdılar. O mücahidlər də yollarından dönməyib cəngü cidala girişdilər. Lakin onlardan bəziləri həlak oldu, bəziləri yaralandı, qalanları da Kərbəlaya yol tapmayıb öz qəbilələrinə qayıtdılar.

Həbib ibn Müzahir məyus halda imamın hüzuruna qayıdıb əhvalatı ona danışdı"[204].

Bu bilgilər bəni-Əsəd qəbiləsinin, doğrudan da, cihada və şəhidliyə istər mənən, istərsə də fiziki cəhətdən hazır olduğuna, dinin imanın və imamın yolunda, haqq işi uğrunda ölümün gözünün içinə dik baxan fədakar igidlər yetirdiyini göstərir. Ancaq Həbib bundan sarsılmayaraq ruhdan düşmür ki, bu da qəhrəmanın hər bir halda yalnız Allaha təvəkkül etdiyini, Tanrı təqdirini başlıca hakim qüvvə bildiyini əyani surətdə əks etdirir.

**2. "Pakizəxisal".** Həbiblə bağlı işlənən bu epitet, əslində, dinimizdə geniş yer tutan əxlaq gözəlliyini ayrıca bir etik kateqoriya kimi götürüb obrazın həyat və fəaliyyətinə tətbiq etməyə imkan verir. Ona görə ki, bu barədəki zəngin məfkurəli bilgilər təkcə dini istinadgah xarakteri daşımayıb, dərin və kəsərli bir ictimai mahiyyətə də malikdir. Aşağıdakı məsum tövsiyələrindən bunu aydın görmək olar. Məsələn, Şeyx Səduq özünün "Xisal" kitabının 3-cü babında İmam Cəfəri-Sadiqin dilindən Rəsulullahın Həzrət Əliyə tövsiyələrini verib. Onlardan bir neçəsi belədir: "Ya Əli, səni üç ağır xüsusiyyətdən çəkindirirəm: paxıllıq, hərislik, yalan".

Yaxud: "Ya Əli, mömin üçün dünyada üç sevindirici şey, üç fərəh mənbəyi var: din qardaşlarını görmək, orucdan sonra iftar etmək və sübhə yaxın – gecənin sonunda gecə namazı qılmaq".

..................................

[204] *Füzuli. Kərbəla vaqiəsi, səh. 73-74*





Və ya: "Ya Əli, kimdə bu üç cəhət olmasa, onun heç bir əməli möhkəm olmaz, yəni öz yerində qərarlaşmaz: onu Allaha qarşı üsyan etməkdən – günahdan qoruyub saxlayan vərə, başqaları ilə rəftar, müdara etmək üçün gözəl əxlaq və nadanların cəhlini, yersiz hərəkətlərini dəf etmək üçün helm".

Yaxud da: "Ya Əli, üç şey imanın həqiqətlərindəndir: əliboş, yoxsul olduğun vaxt sədəqə vermək, insanlarla insafla davranmaq və öz elmini onu öyrənmək istəyənlərə bəxş etmək, onlardan heç nə əsirgəməmək".

Yaxud da ki: "Ya Əli, üç xüsusiyyət əxlaqın gözəlliyinə dəlalət edər: səndən bir şey əsirgəyənə sənin heç bir şey əsirgəməmən, səninlə əlaqəsini kəsənlə sənin əlaqə saxlamağın və sənə zülm edəni sənin bağışlamağın!"

Əlbəttə, belə örnəklərin sayını istənilən qədər artırmaq olar. Ancaq gətirilən nümunələr də əsaslı surətdə sübuta yetirir ki, Füzulinin Həbibə aid etdiyi "pakizəxisal" epiteti belə islami istinadgahların hər bir çağda və hər bir durumda bir çox insanların konkret həyat tərzinə çevrilmiş, yaşarı, canlı və diri bir düşüncə, danışıq, davranış və dolanışıq norması olmuş, həyatın, diriliyin cövhərini təşkil etmişdir.

**3. "Həmidəfial":** Hərfi mənası "tərifəlayiq işlər görən" olan bu epitet də öncəkilər kimidir. Ancaq burada önə çıxan qəhrəmanın keşməkeşli ömür yolu keçib zəngin həyat təcrübəsi toplaması və bu təcrübəni bir an belə tərəddüd etmədən yalnız islami dəyərləri ən yüksək səviyyədə həyata keçirmək üçün səfərbər etməsidir. Həbib bu yöndə gör nə qədər həssasdır ki, döyüş gedə-gedə belə özünün bu cəhətini təkmilləşdirməyə can atır. Əsərdə oxuyuruq: "Həzrət imam və Həbib ibn Müzahir onun (Azərbaycaninin – **V.A.**) başı üstünə gəldilər... Həbib bin Müzahir dedi: "ya Müslim, əgər sonraya qaldığımı bilsəydim, iltimasi-vəsiyyət edərdim". Müslim dedi: "Ey Həbib, vəsiyyətim budur ki, canını həzrət imama fəda qılasan və ona xidmət etməyi dünya və axirət səadəti biləsən".



Bunları deyərkən onun ruhu cənnətə daxil oldu”[205].

Parçada diqqəti çəkən ilkin ştrix Həbibin bilavasitə İmam Hüseynlə yanaşı dayanmasıdır. Zənnimizcə, bu qoşalıq İmam Hüseynin Həbibə olan məxsusi diqqətinin göstəricisidir. Digər tərəfdən, burada yaşının çoxluğuna baxmayaraq, Həbibin həssas məqamlarda öndə olması, özünü oda-közə vurması fikri də çatdırılır.

Axı Həbib niyə Müslimdən özünə vəsiyyət etməsini istəsin? Məqtəl və mərsiyə ədəbiyyatında Həbib bin Müzahirlə Müslim Əvsəcənin bərk dost olduqları bildirilir. Deyilənlərə görə, Kərbəla vaqeəsi zamanı Həbibin 80, Müslimin 90 yaşı olub.

Belə bir mənqəbə məşhurdur: “Bir gün Kufə bazarına gəlmiş Müslim Həbibi orada görüb gəlişinin səbəbini soruşur. Həbib həna axtardığını bildirir. Müslim “Hənanı neyləyirsən?” deyə soruşduqda Həbib: “Saqqalıma yaxacağam ki, qızarsın. Ay Müslim, məgər həna haramdır?” – deyə dostcasına cavab verir. Bu zaman Müslim hönkürtü ilə ağlayır. Həbibin təəccübləndiyini gördükdə Müslim deyir: “Ey Həbib, sən bu gün saqqalına həna yaxacaqsan, bir həftədən sonra onun qırmızılığı keçib gedəcək. Gəl mən sənə elə bir həna yeri göstərim ki, onun rəngi Qiyamətədək səni, sənin ruhunu tərk etməsin! Məgər sən bilmirsənmi ki, Yezidin adamları Hüseyn ibn Əlini öz dəstəsi ilə birlikdə Küfə yolunda, Kərbəlada mühasirə ediblər?”

Hadisədən xəbərsiz olan Həbib dərhal Kərbəlaya gəlir və imamın ən yaxın silahdaşlarından biri olur. Ötəri deyildir ki, İmam Hüseyn ordunun sol cinahına başçılıq etməyi məhz ona tapşırır.

Belədə bir sual doğur: mənqəbələrdə Müslim “Əvsəcə” kimi göstərildiyi halda bəs niyə “Hədiqətü-s-süəda”da “Azərbaycani” kimi təqdim olunur?

.................................

205 *Füzuli. Kərbəla vaqiəsi, səh. 96*





Məsələ ondadır ki, "Müslim Azərbaycani və oğlu ilə bağlı epizod "Rövzətü-ş-Şühəda" əsərində də vardır. Lakin "Rövzətü-ş-Şühəda" əsərində Müslim bir qədər fərqli şəkildə – Müslüm bin Əfsəcə kimi verilir və onun Azərbaycandan olduğu, İmam Əlinin yanında Quran oxuduğu, İmam Əlinin onu "qardaş" adlandırdığı göstərilir"[206]. Göründüyü kimi, fərq yalnız soyaddadır. Bu isə orta yüzillik mətnləri üçün bir elə də böyük yanlışlıq deyildir. Digər tərəfdən, hər iki soyadı ilə Müslim Azərbaycandandır, Azərbaycan türküdür. Odur ki, onun vəsiyyəti istər xüsusi surətdə Həbib üçün, istərsə də ümumi şəkildə orta əsr azərbaycanlısının milli-mənəvi kimliyini formalaşdıran çoxsaylı dini-mənqəbəvi amillərdən biri kimi olduqca önəmlidir. Əsərin ardını oxuduqda Həbibin Müslimin vəsiyyətini yerinə yetirdiyi, imamın gözü qarşısında şirin canından keçdiyi, uzun ömür sürməsinin mənasını məhz bunda gördüyü ortaya çıxacaqdır.

**4. "Təqva".** Qurani-Kərimdə təqva haqqındakı ayələrin 98 faizi pəhrizkarlığın təbliğindən çox ictimai vəzifələrin yerinə yetirilməsinə təkidyönümlüdür. Anlayış Müqəddəs Kitabımızda "ittiqa" şəklində işlənir; məs.: "İttəqullah" *(Allahdan çəkinib pis əməllərdən uzaqlaşın) ("Həşr", 18 və s.).*

Sözün kökü "vaqiyə"dir ki, lüğəvi mənası *qorumaq, təhlükələr qarşısında özünə sipər çəkmək*dir. Deməli, təqvalı olmaq xanənişinlik, dərvişlik, el-obadan, cəmiyyətdən ayrılmaq yox, doğru, təhlükəsiz yolu seçmək və təhlükəni dəf etməkdən ötrü vəsilə, vasitə əldə etməkdir.

Bəzi alimlərə görə, təqvanın üç mərhələsi vardır: 1. Vaciblərə əməl etmək, haramlardan uzaqlaşmaq; 2. Əxlaqi kamilliyə nail olmaq; 3. İrfan.

Başqa bir bölgüyə görə, təqvalılıq üç mərhələdən ibarətdir: 1. Qəlbi şirkdən – Allaha ortaq qoşmaqdan təmizləmək; 2. Dili təmiz saxlamaq; 3. Vacib və haram hökmləri gözləmək.

.................................

[206] *Nağısoylu M. Göstərilən əsəri, səh.83-84*



Füzuli Həbib üçün "asari-təqva nasiyeyi-əhvalində peyda ...idi" dedikdə ilk növbədə məhz belə əməli və təcrübi cəhətləri, onların ictimai-siyasi fəaliyyətdəki konkret təzahürlərini göz önündə tutur, bununla da yaratdığı surətə bir portret, obraz çəkisi qazandırır.

**5. "Helm".** Zahirən həlimlik kimi başa düşülən bu söz, əslində, etik-didaktik bir istilah olub, bir sıra dini-fəlsəfi mətləblərdən soraq verir. İslamda "musamihə" *(əllə görüşmə)* deyilən, müasir terminologiyada daha çox "tolerantlıq" kimi başa düşülən xoşrəftarlıq dərin və tutumlu bir Quran müddəası olub, həyatın bütün sahələrini əhatə edir; məs.: "Yaxşlılıq və pislik bir ola bilməz! Sən pisliyi yaxşılıqla dəf et! Belə olduqda aranızda düşmənçilik olan şəxsi sanki yaxın dost görərsən. Bu, yalnız səbir edənlərə verilir və ancaq böyük qismət sahiblərinə əta olunur. Əgər sənə şeytandan bir vəsvəsə gəlsə, dərhal Allaha sığın. Şübhəsiz ki, Allah eşidən və biləndir" *("Fussilət", 34-36)*.

"Nə bilirsən, ola bilsin ki, Allah bundan sonra bir iş icad etsin (yenidən zövcənin məhəbbətini ərin qəlbinə salsın)" *("Təlaq", 1)*.

"Ola bilsin ki, Allah sizinlə düşmənçilik etdiyiniz şəxslər (Məkkə müşrikləri) arasında (yenidən) dostluq əmələ gətirsin" *("Mümtəhinnə", 7)*.

"(Ya Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla (döyüşdən qaçıb sonra yanına qayıdanlarla) yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün (Allahdan) bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən Allah (Ona) təvəkkül edənləri sevər!" *("Ali-İmran", 159)*.

Bu ilahi bəyanatlar həyatın bir çox sahələrinə dair birmənalı hökmlərə malikdir. Belə ki, onların birincisində məsələ ümumi surətdə daha çox etik planda qoyulub həll edilirsə, ikincisində ailə-məişət müstəvisində təqdim olunur. Üçüncü və dördüncü ayələr isə daha çox hərbi xarakterdə olub, müharibə dövrünün





qayda-qanunlarına aydınlıq gətirməkdədir. Ancaq hansı sahəyə aid olmasından asılı olmayaraq, xoşrəftarlıq bu ayələrin hər birində leytmotivdir, aparıcı və başlıca qənaətdir. Deməli, helmlikdə Həbibin yüksək mənəvi əxlaqi keyfiyyətlərindən biri kimi qavranılmaqla onun portret-obrazını zənginləşdirən başqa bir cizgidir.

**6. "Həya".** Öncəki keyfiyyətləri kimi, həyalılıq da Həbibin daxili dünyasını şərtləndirən dəruni bir cəhətdir. Əslində, bu cəhət o keyfiyyətlərin hamısının qaynağı olub, onları üzə çıxaran, onlara yön verən köklü etik prinsipdir. Bəs Həbib bu qədər zəngin mənəviyyatı necə qazanmış və onlara harada nail olmuşdur? Mətnin ardı başqa cəhətlərlə yanaşı, bunu da aşkarlayır: "...Və əksəri-övqati-ömrü Mustəfa və Mürtəza mülazimətində sərf qılmışdı..." *(Həyatının çoxunu Həzrət Muhəmmədlə İmam Əliyə xidmət etməklə keçirmişdi)*[207].

Bəllidir ki, bəşəriyyətin iki ən kamil şəxsiyyətini görüb bilavasitə onlarla gündəlik təmasda olan bir kimsə yalnız belə ali dini və insani məziyyətlər yiyəsi olacaqdı. Başqa sözlə, İslamiyyətdə ayrıca yeri olan "Usvətun həsənə" – "ən gözəl örnək" *("Əhzab", 21)* məfkurəsi Həbibin yalnız duyğu və düşüncələrinə təsir etməmiş, onun qanına-canına hoparaq hər bir sadə əməlində də özünü bütün aydınlığı və genişliyi ilə göstərmişdir. Deməli, Füzuli bu surəti yaradarkən onu kiçik bir səhabə obrazı kimi də düşünmüşdür. Ötəri deyildir ki, mətnin ardında Həbibin Qurani-Kərimlə qırılmaz bağlılığından danışılır: "...Və hər gecə bir növbə kəlami-İlahi xətm etmək mö'tadı olmuşdu" *(O, hər gecə Qurani-Kərimi bir dəfə başdan sona kimi oxumağı özünə borc bilirdi)*[208].

Ümumiyyətlə, Qurani-Kərimlə bağlı ən kiçik bilgi və anlayışlar belə orta əsr müsəlman cəmiyyəti üçün son dərəcə mühüm idi. Cəmiyyət isə hər baxımdan ayrı-ayrı fərdlərin subyektiv fəaliyyətindən ibarətdir. Bu fəaliyyətdə dini

.................................

[207] *Füzuli. Əsərləri, VI cild, səh.294*

[208] *Yenə orada*



davranış və əməllərin, o sıradan da Qurani-Kərimin təlavət, qiraət, təcvid və təfsirinin ayrıca yeri vardır. Əsərdə Həbib bin Müzahirə aid edilən "xətmetmə" təyini də bu qəbildəndir.

"Xətmetmə" dedikdə, ilk növbədə Qurani-Kərimin əvvəldən-axıradək bir şəxs tərəfindən bir dəfə oxunması nəzərdə tutulur. Adətən bu zaman Müqəddəs Kitabın orijinalı diqqət mərkəzində saxlanılır, ərəbcənin qrammatikasına, söz və ifadələrin dəqiq tələffüzünə, gözəl səslənişinə, avazla və ifadəli şəkildə oxunuşuna fikir verilir. Bütün bunlar "təlavət" termini ilə ümumiləşdirilir. "Təlavə" kökündən gələn bu istilahın məğzini "ardıcıl və uzunmüddətli olaraq reçitativlik (danışıqla musiqinin vəhdəti) üzərində qurulan avazlı oxu" təşkil edir. "Qaraə" kökündən gələn "qiraət" termini ilə isə əksinə, ardıcıllıqdan çox düşüncəyə, dərrakəyə üstünlük vermək nəzərdə tutulur. Çünki "qiraət" sözünün lüğəvi anlamı "bir yerə yığa-yığa, huşu, diqqəti cəmləşdirərək oxumaq"dır.

Quran xətminin surətlə bağlı bir gecə müddətinə sığışdırılmasına gəldikdə isə, göstərmək gərəkdir ki, bu, bir yandan ədibin Həbibə bəslədiyi sayğı və sevginin böyüklüyünün ifadəsinə yönəldilmiş mübaliğədirsə, o biri yandan Füzulinin Həbibə bir övliya kimi yanaşmasının alt qatda verilən bədii əks-sədasıdır. Çünki Qurani-Kərimlə bağlı anlayışlar içərisində yer alan "hizb" termini cüzün dörddə-birini bildirməklə yanaşı, təlavətin bir həftədə həyata keçirilməsini asanlaşdırmaqdan ötrü Müqəddəs Kitabın 7 bərabər hissəyə bölünməsini də ifadə edir. Heç şübhəsiz, belə təfsilatlı ritual islami baxımdan möhkəm əsaslara söykənməyə bilməzdi. Ulu Yaradan Şanlı Kitabında "Həqiqətən, bu Quran (bütün bəşəriyyəti) ən doğru yola (İslama) yönəldir, yaxşı işlər görən möminlərə böyük bir mükafata nail olacaqları ilə müjdə verir. Axirətə inanmayanlar üşün isə şiddətli bir əzab hazırlamışıq" *("İsra", 9, 10)* buyurur və tapşırır ki, Quranın qiraəti zamanı insanlar tam sakit olub, onu könül qulağı ilə dinləsinlər və bununla da ilahi mərhəmətə qovuşsunlar *("Əraf", 204)*.





Bu mövqeyi gücləndirən hədis və xəbərlərdə isə belə fikirlərin həyata tətbiqi təfərrüatla göstərilir, onların əməli-təcrübi önəminə və dəyərinə toxunulur; məs.: “Quran Allah süfrəsidir, odur ki, bu süfrədən bacardığınız qədər öyrənin!” (Həzrət Mühəmməd və İmam Əli). Yaxud: “Bizim dostlarımızdan, tərəfdarlarımızdan biri Quranı yaxşı oxumadan (bilmədən) dünyadan getsə, Allah onun dərəcəsini yüksəltsin deyə qəbrində ona Quran öyrədilər. Çünki, doğrudan da, Behişt dərəcələri Quran ayələrinin sayına uyğundur. Quran oxuyan şəxsə belə deyilər: “Oxu və ucal!” (Həzrət Mühəmməd). Və ya: “Quranın təlavəti ilə evlərinizi nurani edin. Quran oxunduğu, İzzət və Cəlal Sahibi Allahın anıldığı evlərin (ev əhlinin) bərəkəti artar, mələklər oraya gəlib-gedər və şeytanlar isə oranı tərk edər. Həmin ev elə işıqlanar ki, biz yerdən baxdıqda göy cisimlərini nurlu gördüyümüz kimi, göy əhli də yerə nəzər saldıqda həmin evi o cür nurlu görər. Lakin içərisində Quranın oxunmadığı, İzzətli və Cəlallı Allahın adlarının zikr olunmadığı evin bərəkəti azalar, mələklər oradan uzaqlaşar, şeytanlar orada qərar tapar” (Həzrət Mühəmməd). Və yaxud: “Əgər sizlərdən biri öz Rəbbi ilə danışmaq istəsə, Quran oxusun!” (Həzrət Mühəmməd).

Göründüyü kimi, ayə və hədislərin leksikonu (Quran, Ədədi-ayati-l-Quran – *Quran ayələrinin sayı,* Qarii-l-Quran – *Quran qiraətçisi,* təlavəti-l-Quran – *Quranın avazla oxunması,* yəqrəu-l-Quran – *Quran qiraəti*) olduqca geniş olub, “xətm” anlayışı ilə bağlı davranış və əməllərə dair dəqiq hökmləri özündə birləşdirir.

Anlayışın Füzuli irsindəki bədii əksinə gəlincə, Nizami kimi, Nəsimi kimi, Füzulini də Füzuli edən onun Quran bulağından su içməsidir. Belə ki, Qurani-Kərim özünün bütün göstəriciləri – möhkəmat və mütəşabihat, afaqi və ənfusi, nasix və mənsux ayələri ilə Füzuli irsinin mayasını oluşdurmuş, şairin ən iri əsərindən tutmuş birbeytlik mülləmmələrinədək hərəkətəgətirici və istiqamətverici faktor olaraq sənətkarı təkcə ilhamlandırmamış, onun özünə də, yaratdıqlarına da



ölməz ruh aşılamış, sözünə-sovuna dönməz kəsər vermiş, ən nəhayət, Füzuli adının, Füzuli sənətinin ən səciyyəvi göstəricisinə çevrilmişdir. Dini-mənqəbəvi anlayışların Füzuli yaradıcılığında yeri və bədii ifadə yolları ilə bağlı hələ 1994-cü ildə çıxarılmış elmi nəticə və nəzəri qənaətlərin bir bölümünü yada salsaq, bu barədə daha dəqiq bilgi əldə etmiş olarıq[209].

Digər tərəfdən, bu cümlə bizə Quran xətminin təkcə dini atribut olmadığını, əksinə, bu gündə mövcud olan yaşarı, canlı, diri bir həyat həqiqəti olduğunu göstərir. Əgər belə olmasaydı, sözdən bir-bir zərgər kimi çox xəsisliklə istifadə edən Füzuli yaratdığı obrazın mənəvi tərəfinə bu qədər söz ayırmaz, ruhi-psixoloji qatlarını bu qədər əlvan boyalarla və dolğun çalarlarla qələmə almazdı. Unutmayaq ki, Qurani-Kərimin yuxarıda sadaladığımız göstəricilərinin çoxu şairin lirik “mən”inin gözündə pozulmaz ilahi qüdrət və hikmət nişanələridir. Aşağıdakı qitə Füzuli irsinin Qurani-Kərimlə bağlı əsas sözü yerindədir:

El xəta ləfzilə Quranın şükühin sındıran,
M’öcüzi-ayati-Qurandan həzər qılmazmısan?
Hər əlif bir xəncəri-xunrizi-dürrandır sana,
Xəncəri-xunrizi-dürrandan həzər qılmazmısan?
Bir həkimi-kamilin darü-ş-şəfai-hikmətin
Etmək istərsən xərab, ondan həzər qılmazmısan?

*(Sənin sözləri səhv oxumaqla cah-cəlalını azaldan Quran ayələrinin möcüzəsindən qorxmursanmı? Axı Qurandakı hər bir əlif hərfi qanaxıdıcı bir iti xəncərdir! Bəs belə kəsici xəncərdən ehtiyatlanmırsanmı? Sən kamil bir hikmət sahibinin hikmətlərlə dolu şəfaverici evini xarabazarlığa çevirmək istəyirsən, bəs o ev sahibindən çəkinmirsənmi?).*

.................................

[209] *Almasov V. Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları (Türkcə divan və “Leyli–Məcnun” məsnəvisi üzrə), Azərbaycan Milli Elmlər Akademiyasının əsaslı kitabxanası, Bakı,1994, səh. 205-215*





Göründüyü kimi, şeirdəki *xəta ləfz, Quran, şüküh, möcüz, ayat, əlif, həkim, hikmət* sözlərində Qurani-Kərimlə birbaşa bağlı olan ən önəmli məsələlər – düzgün qiraət və təlavət, dərin ehtiram hissi, Quranın Rəsulullahın ən böyük möcüzəsi sayılması, Müqəddəs Kitabdakı hər bir hərfin ayrıca mənaya malik olması, Allahın "Həkim" adı, Quranın "şəfa qaynağı" hesab edilməsi *("İsra", 82)* və s. yığcam biçimdə əksini tapmışdır.

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Qurani-Kərimə belə sayğılı yanaşmada Füzuli tək deyil. Bütün klassiklərimiz Müqəddəs Kitaba sonsuz ehtiram hissi ilə yanaşmış, onunla bağlı ən adi bilgini belə şeirlərinin tacı etmişlər. Məsələn, Fəzlullah Nəimi "Çe kari darəd?" rədifli qəzəlində:

Ey hafizi-xətaxan, Qoran vəsineye to?
Dər sineye-moləvvər Qoran çe kare darəd?![210]

*(Sən ey əzbər bilməyinə baxmayaraq, Quranı səhv oxuyan hafiz, Quran və sənin sinən? Sənin o çirkli sinəndə Quranın nə işi var axı!),* – deyərək Tanrı buyuruqlarını layiqincə saya almayanlara qarşı nifrətini kəskin şəkildə bildirmişdir. Nəsimi də ustadından geri qalmayaraq "Nə əcəb" rədifli qəzəlində:

Hiç imiş zöhdivü zərgi zahidin əfsanəsi,
Şol fəqihdən mə'niye-Quran umursan, nə əcəb?[211] –

*(Əfsanələr danışmağa öyrəşmiş zahidin yalançı təqvalılığı, sən demə, bir heç imiş. Axı sən necə o saxtakar fəqihdən Quranın əsl mənasını çatdırmağı umursan?)* deməklə ali İslam hüququndan sui-istifadə edən yüksək rütbəli məmurların iç üzünü açıb göstərmişdir.

.................................

210 *Lətif Hüseynzadə. Nəimi haqqında bəzi qeydlər, Ədəbi Ermənistan (məcmuə), III kitab, Yerevan, 1960, səh.225*

211 *Nəsimi İmadəddin. Mən bu cahana sığmazam... Seçilmiş əsərləri, Bakı:Gənclik, 1991, səh.359*





Bütün bunlar, heç şübhəsiz, dolayısı ilə də olsa Həbibin Quran xətmini özünün gündəlik borcu bilməsi kimi çox ləyaqətli bir məsuliyyət nümunəsi ilə bağlıdır.

* * *

Əsərin Həbib bin Müzahir fəsli belə davam edir: "Həzrəti-Hüseyn ayıtdı: "Ey piri-pərhizkar, sən Həzrəti-Rəsuldan yadigarsan və səndə şiddəti-zə'fdən qüvvəti-müharibə yoxdur. Mürtəkibi-məşəqqəti-hərb olma". Həbib ayıtdı: "Ey nuri-dideyi-Zəhra, tövfiqi-tuli-ömr bana bu səadət üçün müyəssər olmuşdur. Hala ki fürsət düşdü, iktisabi-mətlubda tə'xir etmək rəva degil*" (Hüseyn həzrətləri Həbibə belə buyurdu: "Ey pəhrizkar qoca, sən Peyğəmbərdən yadigarsan, səndə zəiflikdən döyüş qüvvəsi yoxdur, sən gəl hərbin çətinliklərinə qatlaşıb meydana getmə". Həbib isə imama belə cavab verdi: "Ey Zəhranın gözünün işığı, mənim ömrümün uzun olması bu səadətə yetişməyim üçündür. Fürsət düşdüyünə görə bu fürsəti fövtə vermək olmaz!")*[212].

İmam Hüseynin "sən Həzrət Rəsuldan (s) yadigarsan" sözləri onun dini-dünyəvi rəhbər kimi səhabələrə bəslədiyi dərin sayğı və sevgini göstərmək baxımından olduqca önəmlidir. Axı Kərbəla vaqeəsinin baş verdiyi dövrdə nəinki səhabələrə, hətta Peyğəmbər (s) övladlarına belə yad, yabançı münasibət hökm sürürdü. Abdullah ibn Abbasın danışdığı epizod bunu aydın sübuta yetirir. O danışır ki, bir gün Hüseyn həzrətləri ilə bir məsciddə əyləşmişdik. Bir bədəvi ərəb gəlib məndən dini ehkama aid bir söz soruşdu. Mən Hüseyn həzrətlərini ona göstərib, bu, Rəsulullahın reyhan qoxulu nəvəsi Hüseyn ibn Əlidir. Gəl biz bu sualın cavabını ondan soruşub öyrənək dedim. O isə mənə bildirdi ki, "ey Abdullah, mən Hüseyni yaxşı tanıyıram, ancaq dini ehkam məsələlərində səni ondan bilikli hesab edirəm. Odur ki, sualımı da sənə verdim" söylədi.

.................................

[212] *Füzuli. Əsərləri, VI cild, səh.294*





Buradan aydın olur ki, ozamankı Hicaz mühitində cəmiyyətin böyük bir qismi İmam Hüseynin əlçatmaz-ünyetməz məziyyətlərindən xəbərsiz idi, onun vəhy mələyinin gəldiyi Peyğəmbər ocağında böyüyüb boya-başa çatan bir şəxsiyyət kimi hamı üçün məqbul sayıla biləcək sadə xüsusiyyətlərini belə qısqanclıqla qarşılayırdı.

İmam misilsiz bir ədəb örnəyi kimi yaşı ötmuş Peyğəmbər səhabəsinə olduqca həssas münasibət bəsləyir, hər an onun qayğısına qalır. "Səndə şiddəti-zə'fdən qüvvəti-müharibə yoxdur. Mürtəkibi-məşəqqəti-hərb olma" sözləri belə uca niyyətin təzahürüdür.

İmamın Həbibə söylədiyi bu sözlər istər-istəməz belə bir sual doğurur: əgər Həbib belə zəif və taqətsiz idisə, bəs onda niyə ordunun sol cinahının komandanlığını ona tapşırmışdı? Təfərrüata varmadan məsələyə belə aydınlıq gətirə bilərik: Kərbəla düzündə baş vermiş qeyri-bərabər döyüşün simvolik xarakter daşıması heç kimdən gizli deyil. İmam da belə sadə reallığı nəzərə alaraq Həbibi öz ordusunun sərkərdələrindən biri təyin edə bilərdi. Ancaq bu, bir azdan Füzuli qələminin ecazkar təsvirində görəcəyimiz Həbib igidliyinə qətiyyən kölgə salmır. Çünki, birincisi, ilk növbədə bədii əsər olan "Hədiqətü-s-süəda"da məhz belə də olmalı idi, ikincisi, insanın son anda bütün gücünü toplayıb şücaət göstərməsi, cəngavərcəsinə döyüşməsi heç də qeyri-adi hal deyildir, üçüncüsü, Kərbəla düzündə baş vermiş hadisə son dərəcə prinsipial məsələ, ölüm-qalım savaşı olduğundan bütün ömrünü imanla yaşamış qocaman bir peyğəmbər səhabəsinin son nəfəsində özündə fövqəladə güc tapıb döyüş meydanına atılması hər baxımdan tamamilə təbiidir. Elə Həbibin imama cavabı da onun buna hazırlıqlı olduğunu, bunun üçün onda sarsılmaz inam və iradənin, etiqad, ibadət və əxlaq ehtiyatlarının özünün ən yüksək zirvəsinə çatdığını göstərir. O deyir: "Tövfiqi-tuli-ömr bana bu səadət üçün müyəssər olmuşdur. Hala ki fürsət düşdü, iktisabi-mətlubda tə'xir etmək rəva degil".



Həbibin cavabından bir neçə qənaət hasil olur:

**1. "Tövfiqi-tuli-ömr".** Tərkib Həbibin uzun ömür sürməsini Tanrı tədbirinin təzahürü bildiyini göstərir. Aşağıdakı ilahi bəyanatlar bunun islami söykənəcəyidir: (Elə edin ki, sonradan) bir kəs: "Allaha itaət barəsində etdiyim təqsirlərə görə vay halıma! Həqiqətən, mən (Allahın hökmlərinə, Qurana, Peyğəmbərə və möminlərə) istehza edirdim!" – deməsin. Yaxud: "Əgər Allah məni doğru yola yönəltsəydi, mən mütləq müttəqilərdən olardım!" – söyləməsin. Və ya əzabı gördüyü zaman: "Kaş bir dəfə də (dünyaya) qayıda biləydim; yaxşı işlər görənlərdən olardım!" – deməsin! (Onun bu sözlərinin cavabında Allah belə buyurar): "Xeyr, Mənim ayələrim sənə gəlmişdi, amma sən onları yalan saydın, (iman gətirməyə) təkəbbür göstərdin və kafirlərdən oldun!" *("Zümər", 56-59).*

Həbibin cavabı Füzuli divanının:

Vədeyi-vəslin məni salmış xəyali-zülfinə
Kim, dilər tuli-əməl sərmayeyi-ömri təvil!–

beyti ilə yaxından səsləşir. Füzuli bu beytdə demək istəyir ki, mənim sənin saçının fikrini çəkməyim əbəs deyil. Çünki məni bu fikrə salan sənin görüş sözünü günü-gündən uzadıb təxirə salmağındır. Mən də bilirəm ki, böyük işlərin öhdəsindən yalnız uzun ömür kimi bir sərmayə ilə gəlmək mümkündur. Beytin leksikonunu və mənasını mücərrədlikdən çıxarıb Həbibin daxili aləmi ilə bağlasaq, onda onun burada aşiq, İmam Hüseynin də məhbub yerində durduğu aydın olar. Belədə "vədeyi-vəsl" Həbibin İmam Hüseynə xidmət etməyin mükafatını yalnız axirətdə alacağına bəslədiyi sarsılmaz inam, "xəyali-zülf" bunu ancaq candan keçməklə qazanılacağı müddəası, "tuli-əməl" qeyri-bərabər Kərbəla döyüşü, "sərmayeyi-ömri təvil!" təvildə Həbibin keşməkeşli ömür yolu, zəngin təcrübəsi kimi başa düşülür. Elə əsərdə Həbibin dilindən verilmiş şeir də bu yöndədir:





Çün əhli-cəhan küştələrin yad edələr,
Təhsin edələr, ruhların şad edələr.
Can nəqdini sərf qıldığımdan qərəzim,
Oldur ki, bəni daxili-te'dad edələr[213].

*(Bütün dünya şəhidlərini xatırlayanda"əhsən, yaşa, var ol" deyərək onların ruhlarını şad edəndə mən də canımdan keçməklə bu məqsədə qulluq edirəm ki, bəlkə lütf göstərib məni də belə fədakarlıqların sırasına salsınlar).*

Bu gün tam məsuliyyətlə deyə bilərik ki, o ulu Kərbəla igidi şəhidlərin ən ön cərgəsində yer tutmaqdadır. Dünyanın hər yerində olan milyonlarla imamhüseynsevərin ona göndərdiyi salam-salavat Həbibin pak və qəmnak ruhunu anbaan dindirib sevindirməkdədir.

**2. "Bu səadət".** Həbibin cavabındakı ifadə birmənalı surətdə şəhidliyə aiddir. Belədə şəhidlik Həbibin gözündə istər dünyəvi, istərsə də üxrəvi bir xoşbəxtlikdir. Quranın "xoşbəxtlik" anlayışı özünün bütün mahiyyəti ilə bu qocaman Kərbəla igidinin qanına-canına hopmuş, onun əqidəsinə yön vermiş, xarakterini formalaşdırmışdır. Aşağıdakı ayələri əsərin bu bölümünü məna-məzmun tutumuna qovuşdurduqda buna şəkk-şübhə yeri qalmır: "Allah yolunda öldürülənləri (şəhid olanları) heç də ölü zənn etmə! Əsl həqiqətdə onlar diridirlər. Onlara Rəbbi yanında ruzi (cənnət ruzisi) əta olunur. Onlar Allahın Öz mərhəmətindən onlara bəxş etdiyi nemətə (şəhidlik rütbəsinə) sevinir, arxalarınca gəlib hələ özlərinə çatmamış (şəhidlik səadətinə hələ nail olmamış) kəslərin (axirətdə) heç bir qorxusu olmayacağına və onların qəm-qüssə görməyəcəklərinə görə şadlıq edirlər" *("Ali-İmran", 169-170), "*Ey iman gətirənlər! (Dində vacib olan hökmləri yerinə yetirməyin zəhmətinə, düçar olduğunuz bəlalara) səbir edin, (Allahın düşmənlərinə qələbə çalmaq uğrundakı müharibə və döyüşlərdə sizə üz verən müsibət və çətinliklərə) dözün, (sərhəd boyu növbədə durub cihada) hazır olun və Allahdan qorxun ki, bəlkə, nicat tapasınız!" *("Ali-İmran", 200).*

.................................

[213] *Füzuli. Əsərləri, VI cild, səh.294*





Ayələrdəki “əhyaun” – *əzəli, əbədi dirilik,* “fəriqinə” – *Tanrı qatında duyulan daimi sevinc hissi,* “yəstəbşirunə” – *şəhidliyin ən böyük ilahi nemət olması muştuluğu,* “tuflihun” – *qurtuluş, nicat* sözləri xoşbəxt bir müsəlman kimi Həbibin də bütün varlığı ilə mənimsədiyi xoşbəxtliyin islami dərkidir.

**3. “İktisabi-mətlub”.** Bu ifadə Həbibin məqsədyönlü şəkildə hərəkət etməsindən, gördüyü hər bir işi yüksək islami dəyərlərə uyğunlaşdırmasından soraq verir. Ötəri deyildir ki, qabaqcıl ilahiyyatçılar Qurani-Kərimdə, “Nəhcü-l-Bəlağə”də və başqa aparıcı islami qaynaqlarda yeniyetməlikdən və gənclikdən başlayaraq hər bir kəsin özü üçün başlıca həyat məramnaməsi kimi qəbul edə biləcəyi köklü prinsiplər olduğundan dönə-dönə söz açır, onları birər-birər təsbit edib həmin prinsiplərin fərdi və ictimai faydalılıq əmsalını açıqlayırlar.

**4. “Fürsət”.** Həbibin nəzərdə tutduğu fürsəti şairin:

Gətir, saqi, qədəh, bil kim, təəllül fövti-fürsətdir,
Bu fürsət var ikən fövt etmə kim, fürsət qənimətdir![214]–

beyti açıqlayır. Belə ki, Füzuli bu beytdə kəmfürsət olub dünyadan necə gəldi kam almağı və mənasız ömür sürməyi yox, dünyaya axirətin əkin tarlası kimi baxmağı, həssas və həlledici məqamlarda təşəbbüskar olub yerində və bacarıqla faydalanmağı tərənnüm edir. Kərbəla vaqeəsi isə Həbibin illər uzunu gözlədiyi, həsrətini çəkdiyi misilsiz bir tarixi fürsət idi.

* * *

Fəsil belə davam edir: “Əlqissə, icazət alub, meydana girüb bu məzmunla bir rəcəz inşa qıldı. Şe’r:

Bənəm Həbibi-Müzahir, mühibbi-Ali-Rəsul,
Kəminə mö’təqidi-xanədani-zövci-Bətul.

.................................

[214] *Füzuli. Kərbəla vaqiəsi, səh. 100*





Hüseynə nəqdi-rəvan istərəm nisar qılam,
Zəhi səadət, əgər olsa xidmətim məqbul![215]

*(Şanlı Peyğəmbər nəslinin aşiqi olan Əhli-beyt vurğunu Həbib bin Müzahir mənəm! Mən pak-pakizə Əli–Fatimə ocağının dəyərsiz bir pənahgətirəniyəm. Bu azacıq qulluğum Tanrı qatında qəbul buyurularsa, ruhumu bədənimdən çıxarıb Hüseynə təqdim etmək istəyirəm).*

Həbibin rəcəzi də döyüşqabağı çağırışdan çox incə aşiq ürəyinin həzin çırpıntılarıdır. Şeir "mühibbi-Ali-Rəsul"un "mö'təqidi-xanədani-zövci-Bətul"a böyük önəm verməsini mücərrəd olaraq yox, aydın və dəqiq şəkildə ifadə edir. Buradan anlaşılır ki, Həbibin gözündə Əhli-beyt sevgisi şiəliyin Hüseyn və doqquz imam övladı düsturundən ayrılmazdır.

Bədiilik baxımından isə bu parça:

Min can olaydı kaş məni-dilşikəstədə,
Ta hər biriylə bir gəz olaydım fəda Sənə! –

beytini xatırladır.

Fəsil belə davam edir: "Ol piri-zəif zövqi-şəhadət bəşarətiylə qüvvəti-təmam bulub, murçeyi-nəhif ikən əjdəhayi-dəman və pəşşeyi-zəif ikən şiri-jəyan olub, ərseyi-heycada girdbad kibi hər cövlanda güruh-güruh xarü xaşakı yer yüzündən götürürdü və seylabmanənd hər təvəccöhdə süfufi-ə'daya rəxnələr buraxıb xələllər yetürürdi. Əlqissə, çehreyi-nürani və məhasini-kafurfamla tiği-atəşbar çəküb sübhi-sadiq kibi Şam əhlinə fəna bıraxmaqda ikən bəni-Təmimdən bir bədbəxt zərbətiylə ayaqdan düşdü. Nə'rə urdu ki: "Ya imam, mədəd". Həzrəti-imam anın nə'rəsindən mütəəssir olub, bizzat bəhri-bəlaya qutə urub üzərinə sayeyi-mərhəmət buraxdıqda rayiheyi-iltifatindən həyati-mücəddəd kəsb edüb zəbani-halla bu beyti inşa qıldı. Şe'r:

Şükrü lillah gərçi nəsrin oldu reyhanım bənim,
Dərmədən məqsəd gülün, bu bustandan çıxmadım.

[215] *Füzuli. Kərbəla vaqiəsi, səh. 100*





Hasil etdim dövləti-cavid tuli-ömrdən,
Vermədən cananıma canı cəhandan çıxmadım"[216].

*(O zəif qoca şəhadət zövqünün müjdəsi ilə kiçik qarışqa ikən od püskürən əjdahaya və cılız ağcaqanad ikən yırtıcı şirə çevrilərək, döyüş meydanının ortasında burulğan kimi cövlan edərkən yığın-yığın çör-çöpü yer üzərindən təmizlədi və hər hücumda coşqun seltək düşmən sıraları dağıdıb onlara ağır tələfat verdi. Xülasə, nurani çöhrəsi və ağ saqqalı ilə od yağdıran qılınc çəkərək Sübhi-Sadiq kimi Şam əhlini heç-puç etməkdə ikən bəni-Təmim qəbiləsindən olan bir bədbəxtin vurduğu zərbə ilə yerə sərildi. Nərə çəkdi ki, ya imam, mədəd!*

*İmam həzrətləri onun nərəsindən mütəəssir olaraq şəxsən özü bəla dənizinə girməklə başının üstünə kölgə saldıqda onun mərhəmət rayihəsindən içərisində olduğu vəziyyətə uyğun şəkildə ürəyindən belə bir beyt keçirdi: "Allaha şükür olsun ki, mənim reyhanım nəsrinə çevrilsə də, mən məqsəd gülünü dərməmiş bu bostandan çıxmadım. Allaha şükür olsun ki, uzun ömrümü yelə verməyib əbədi sərvət qazandım. Axı canımı cananıma verib dünyanı tərk etdim!").*

Parça, ilk növbədə, təsvir və tərənnümün yığcamlığı ilə seçilir. Belə ki, lakonizmi özünün başlıca yaradıcılıq manerası seçən Füzuli burada təsvir və tərənnümü növbələşdirməklə Həbib bin Müzahiri bir qəhrəmanın malik ola biləcəyi bütün xüsusiyyətləri ilə birlikdə canlandırır. Əgər Füzuli Həbibi bir yandan "piri-zəif" adlandırırsa, o biri yandan"zövqi-şəhadətin onun üçün bəşarət" olmasını önə çəkir. Odur ki, onun tamam-kamal güc əldə etməsi şişirtmə olmaqdan çox ruhi-psixoloji və mənəvi-məfkurəvi hal olaraq meydana çıxır. Belədə *murçeyi-nəhif–əjdəhayi-dəmal (zəif qarışqa–od püskürən əjdaha)* və *pəşşeyi-zəif–şiri-jəyan (cılız ağcaqanad–yırtıcı şir)* təzadları mübaliğəni istər bədiilikcə, istərsə də estetik tələblər baxımından əsaslı surətdə bitkinləşdirərək yetkin sənətkarlıq

................................

[216] *Füzuli. Əsərləri, VI cild, səh.295*





örnəyinə çevirir. Bu bədii-estetik dolğunluq qəhrəmanın burulğana, qarşı tərəfin isə çör-çöpə bənzədilməsini, düşmənə aid epitetin metafor şəklində verilməsini də şirinləşdirir, təhkiyəyə yüyrək nağıl dili gətirir. Deməli, Hürri-dilavər kimi, Həbib bin Müzahir də Füzulinin gözündə milli-mənəvi kimliyi orta əsr azərbaycanlısına yaxın olan milli qəhrəmandır. Odur ki, şair bu surətlərin başlıca cizgilərini də məhz xəlqi-mədəni qaynaqlara uyğun olaraq cızmaq istəmişdir.

Füzuli Həbibi gör nə qədər sevir ki, "əlqissə" – "sözün qısası" deməsinə baxmayaraq, təsvirin və tərənnümün miqyas genişliyini daraldıb sözün əl-ayağını bir yerə yığa bilmir və nəticədə surətin daha bir köklü portret-obrazı əmələ gəlir. Növbəti cümlədəki "nurani üz və kafur kimi parasaqqal" təsvir elementi Həbibin işıqlı obrazını hər birimizlə üz-üzə qoyur. Yaxud "od yağdıran qılınc çəkən" Həbibin "Sübhi-Sadiqə", qarşı tərəfin – Şam əhlinin isə sözün "axşam" anlamına söykənilməklə alt qatda qaranlığa, zülmətə, deməli, şərə bənzədilməsi yuxarıdakı obrazlılığı tamamlamaqla yanaşı, yeni bir bədii incəlik yaratmaqla qəhrəmanı oxucunun gözündə bir daha ucaldır.

Parçada qocaman Kərbəla igidinə qıyan şəxs də diqqətdən qıraqda qoyulmur. Onun bəni-Təmim qəbiləsindən olmasının ayrıca vurğulanılması ilə böyük bir elatın ağsaqqal və ağbirçəklərinə xəbərdarlıq edilmiş olur. Şair sanki demək istəyir ki, siz ey bəni-Təmim böyükləri, gərək belə bir şərəfsiz övlad yetişdirdiyinizə görə bəşəriyyət qarşısında tarixi üzqaralığınızı etiraf edəsiniz və bir daha belə bədbəxtlər böyütməyəsiniz.

Qəhrəmanın ölüm səhnəsi xüsusilə təsirlidir. Ötəri deyildir ki, İmam Hüseyn (ə) Həbibin "Ya imam, mədəd!" nərəsindən mütəəssir olub, bilavasitə şəxsən bəla dənizinə atılır, gəlib Həbibin başının üstündə şəfqətlə dayanır. Ancaq bu şəfqət adi bir acıma, yazığı gəlmə hissi deyildir. Əksinə, imamın (ə) – bir din böyüyünün, bir sərkərdənin öz ardıcılına, öz əsgərinə, ən



nəhayət, uğrunda canını qurban edən bir fədakarına duyduğu mükəmməl inayətin aydın və dəqiq nişanəsidir. Yəqin, elə buna görədir ki, Həbib dərhal imamın (ə) "rayiheyi-iltifatindən həyati-mücəddəd kəsb edir", lütf qoxusundan yenidən canlanır, müvəqqəti olaraq gözlərini açır və ətrafındakılar bu gözlərdə bir neçə kəlməlik sevincin ifadəsini aydınca görə bilirlər. Bunu isə nəsr yox, yalnız poeziyanın ecazkar dili könüllərə çatdıra bilərdi:

Şükrü lillah, gərçi nəsrin oldu reyhanım bənim,
Dərmədən məqsəd gülün, bu bustandan çıxmadım.

Göründüyü kimi, qəhrəman reyhanının nəsrin olmasını, yəni illərlə bəslədiyi əziz canının ox, nizə, qılınc zərbələri ilə yaralanaraq tikə-tikə edilməsini Tanrıya minnətdarlıq səbəbinə çevirir. Axı o, girdiyi bostandan məqsəd gülünü dərməmiş, yəni gəldiyi dünyanı məqsədinə çatmamış tərk etmir. Belədə "şükrü lillah" ifadəsi bəsit danışıq elementi olmaqdan çıxaraq məxsusi məna-məzmun şəbəkəsi əmələ gətirir, ayrıca bir portrettək boy göstərir.

Ətrafdakılar qəhrəmanın gözlərində daha sonra bu sözləri oxuyurlar: "Hasil etdim dövləti-cavid tuli-ömrdən".

Yuxarıda "tövfiqi-tuli-əməl" tərkibini açarkən gətirdiyimiz beyt misra ilə təkcə zahirinə görə səsləşmir. Bizcə, burada başlıca olan ideya səsləşməsidir ki, o da alt qatdadır. Həmin ideya isə fədakarlıq düşüncəsidir, məqsədyönlü və işgüzar fəaliyyətdir, mənəvi-əxlaqi yetkinləşmə təlaşıdır. Misradan anlaşılır ki, Həbib bütün bunları zövqlə, ruh yüksəkliyi ilə yerinə yetirməkdədir. Belədə:

Ey qılan izhari-zillət müjdeyi-izzət sənə
Kim, bu dərgəhdə müqərrərdir əziz, olmaq zəlil!

*(Sən ey şəhidliyə alçaqlıq nişanəsi kimi baxan dərrakəsiz, gəl mən sənə şərəf muştuluğu verim. Axı sən hardan bilə bilərsən ki, ən istəkli şəxsiyyətin torpaqlar üstündə sürünməsi Ulu Yaradanın uca qatında qərarlaşdırılmışdır).*





Və:

Ey Füzuli, xublər zikri-cəmalilə xoşam,
Şükr kim, kəsb etmişəm aləmdə bir zikri-cəmil!

*(Ey Füzuli, mən Tanrı qatına yaxın olan böyük şəxsiyyətlərin gözəl camallarını, işıqlı üzlərini xatırlamaqdan həmişə böyük mənəvi həzz alıram. Allaha şükürlər olsun ki, O mənə hərdən belə böyük bir şəxsiyyətin mübarək camalına baxmağı və durmadan bunu xatırlamaqdan zövq almağı qismət etmişdir)* beytləri də Həbibin konkret əhvali-ruhiyyəsi və amalı ilə birbaşa uyarlıq təşkil edir. Çünki əgər birinci beyt fədakarlara yuxarıdan aşağı baxanların hesabına ayrılmışdırsa, ikinci beyt artıq istəyinə çatmış, istəklisinə yetmiş, diləyinə qovuşmuş aşiqin ruhi-mənəvi rahatlığının, zövqlə dolu könül xoşluğunun tərənnümünə qulluq edir. Belədə "Vermədən cananıma canı cəhandan çıxmadım" misrası yekun kimi olduqca yerinə düşür. Çünki dəfələrlə toxunduğumuz can-canan qarşılaşdırılmalarından daha biri kimi bu misra da sərrast bir deyimə çevrilərək oxucunun könlünü ələ alır. Bu deyilənlər "Hədiqətü-s-süəda"nın bir çox yeri kimi, "Həbib" bölümünün də ideya-bədii baxımdan dolğun və tutumlu olduğunu, dini-mənqəbəvi anlayışların çeşidli yaradıcılıq istəkləri yönündə motivləşdirildiyini, bədii ifadə vasitələri ilə əlvan və rəngarəng bir sənət çələnginə çevrildiyini göstərir. Yəqin, elə buna görədir ki, Füzuli fəsli bitirməyə tələsmir. Gəlin birlikdə oxuyaq: "Həzrəti-imam ol məzluma bəşarəti-cinan verüb ol məzlum rövzeyi-cinan bəşarətiylə can verdi. Şe'r:

Nəsrinə rəngi-lalə verüb xuni-nabdən,
Arturdı bağı-cənnətə pirayeyi-sürur.
Kafurfam tarə çəküb danə-danə lə'l,
Qıldı dəmi-müaniqə zibi-üzari-hur[217].

[217] *Yenə orada*





*(İmam həzrətləri o məzluma cənnət muştuluğu verdi, o məzlum da cənnət bağçasına qovuşmaq sevinci içərisində can verdi.*

*Həbib təptəzə və isti qanı ilə nəsrin gülünü lalə rənginin qırmızısına boyayaraq cənnət bağlarında sevinc və şadlıq bəzəklərini çoxaltdı. O, kafur kimi, inciləri dənə-dənə sapa düzərək, can boğazına yığıldıqda hurilərin boyun-boğazının zinətinə çevirdi).*

Nəsrli-nəzmli mətn büsbütün cənnətlə bağlıdır. Bu önəmli məfhum haqqında isə kitabın bütün fəsillərində məlumat verilmişdir.

Hissədə cənnətlə bağlı toxunulan birinci cəhət sevinc və şadlıq hissidir. Qurani-Kərimdə oxuyuruq: "(Ya Rəsulum) De: "Allahın neməti və mərhəməti ilə, ancaq onunla sevinsinlər. Bu onların yığdıqlarından (dünya malından) daha xeyirlidir" *("Yunis", 58),* "İman gətirib yaxşı işlər görənlər cənnət bağçalarının birində sevinc içində qalacaqlar" *("Rum", 15).*

"Pirayeyi-sürur" – *"sevinc, şadlıq bəzəkləri"* ifadəsi bilavasitə Qurani-Kərimdən qaynaqlanır. Belə ki, Müqəddəs Kitabımıza görə, bu Kitabda qadağan olunmuş əşyalar cənnətdə möminlərin gözəlliyini artıran zinət vasitələrinə çevriləcəkdir *("Həcc", 23).*

Mətndə cənnətlə bağlı ikinci göstərici "huri" anlayışıdır. Qurani-Kərimdə dönə-dönə vəsf olunan hurilərin Kərbəla şəhidlərinin əli ilə bəzədilməsi, bunun onların gözəlliyini artırması isə, əslində, cənnətin də insansız, şəhidlik zirvəsinə ucalan kamil insansız özlüyündə dəyərdən düşəcəyini iddia etməkdir ki, bu da nəinki Füzuli irsi çərçivəsində, bütövlükdə orta əsrlər ədəbiyyatı üçün orijinal və novator bir fikirdir. Ancaq dərhal onu da deyək ki, əsla İslama zidd deyildir. Qurani-Kərimə diqqətlə baxsaq, onun insana, onun maddi-mənəvi tələblərinin daha yaxşı ödənilməsinə, əqli yetkinliyə çatmasına xidmət etdiyini görərik.

* * *

Əsərin "Həbib bin Müzahir" fəsli belə bitir: "Rəvayətdir ki, ol sərvərin səri-mübarəkin bir sərkəş qət' edüb, yanında





saxlayub, vaqieyi-Kərbəladan sonra Məkkəyə müraciət qılub, mərkəbinin boynuna asub, şəhrə girüb mübahat edərkən Həbibi-Müzahirin oğlu uğrayub, "Bu, kimin başıdır?" deyə sual etdikdə ol bixəbər təfaxür qılub ayıtdı: "Bu, Həbib bin Müzahirin başıdır". Ol xələfi-qabil (ol) müxalifi bir zərblə qətl edüb Həbibi-Müzahirin səri-mübarəkin bir büq'ədə dəfn etdi və hala Rə'sul–Həbib deməklə mə'ruf bir məzari-müqərrərdür"[218] *(Rəvayətdir ki, sərvərin mübarək başını bir sərkəş kəsib yanında saxlayırdı. Kərbəla vaqiəsindən sonra o, Məkkəyə qayıtdıqda həmin başı atının boynundan asıb şəhəri dolanır və öyünürdü. Təsadüfən Həbib bin Müzahirin oğlu onunla rastlaşıb, "Bu, kimin başıdır?" deyə soruşduqda, o da "Bu, Həbib bin Müzahirin başıdır" deyə cavab verdikdə, o məlunu qətlə yetirdi və atasının mübarək başını bir yerdə dəfn etdi. İndi də o yer Rəsul–Həbib adı ilə məşhur bir məzardır).*

Hər şeydən öncə diqqəti bu çəkir ki, o biri Kərbəla şəhidlərindən fərqli olaraq, Həbib bin Müzahirin sərgüzəşti bununla bitmir. Bu, bir neçə baxımdan önəmlidir. Məsələn, bir o baxımdan önəmlidir ki, qəhrəman özündən sonra qeyrətli oğul qoyub getmişdir. "Xələfi-qabil" – "bacarıqlı övlad" ifadəsi bu cəhəti qabartmağa xidmət edir.

Digər tərəfdən, əsər boyu dəfələrlə önə çıxan "ziyarət" anlayışı qəhrəmanla bağlanılmaqla o, əsaslı surətdə müqəddəslərə yaxınlaşdırılır. Bu isə qətiyyən sui-istifadə faktı olmayıb, istər sırf dini-məfkurəvi müstəvidə, istərsə də bədii-estetik baxımdan tamamilə qanunauyğundur.

Monoqrafiyada "Füzuli Kərbəla zəvvarlarının tərənnüm-çüsü kimi" ayrıca fəsil olduğundan, burada "ziyarət" anlayışının yalnız əsərin bu bölümündə qazandığı spesifik xüsusiyyətlərə toxunacağıq. Oradan başlayaq ki, bu qocaman İslam fədaisinin xatirəsi bu gün də geniş kütlə arasında diridir, bu gün də Həbib adı gələndə milyonlarla haqq-həqiqət tərəfdarının ürəyi titrəyir. Bu isə üzərindən sükutla keçiləcək ictimai-sosioloji fakt deyildir. Çünki bu münasibət əsrlər boyu formalaşmış ənənənin təzahürü olduğu üçün Həbib adının XVI yüzillikdə – Füzuli dövründə daha çox söz deməsinə,

[218] *Füzuli. Əsərləri, VI cild, səh.295*








*Həbib ibn Məzahir (r.ə)-in qəbri. İmam Hüseyn (ə)-ın müqəddəs məzarının yerləşdiyi məscidin içərisində. İraq. Kərbəla şəhəri*

daha artıq əziz tutulmasına şəkk-şübhə qalmır. Və qəhrəmanı şairə sevdirən amillərdən biri də elə budur.

Belədə Kərbəla vaqeəsinin ayrılmaz və qopmaz bir parçasına çevrilmiş Həbib bin Müzahirin digər Şərq xalqları ilə yanaşı, azərbaycanlıların da ziyarət yerinə çevrilməsi tarixi zərurətdən doğacaqdı. Odur ki, orta əsr azərbaycanlısının dünyagörüşünün formalaşmasında bu qocaman Kərbəla igidinin əziz xatirəsinin də öz yeri vardır.

Ən nəhayət, fəsildə Rəsul-Həbib adlı ziyarətgahın ayrıca qeyd edilməsi, "Mə'ruf bir məzari-müqərrər" (tanınmış bir hörmətli qəbir) şəklində önə çıxarılması Kərbəla şəhidlərinin dəfni ilə bağlı mübahisələri təzələdiyi kimi, bəzilərinin ziyarətgahlarının erkən orta əsrlərdən sonrakı dövrlərdə olduğu qədər ehtiram doğurmaması ilə bağlı iddialarını da danılmaz biçimdə çürüdür. Əgər belə olsaydı, vəhabiliyin tüğyan etdiyi Hicaz bölgəsi bu gün də ziyarətgahlarla belə zəngin olmazdı.

Bu, yaxud başqa səbəblərə görə Füzuli bölümün bu yerinə də şeirlə naxış vurur:



Təni-paki-şühəda sitri yetər pərdeyi-xun,
Nola gər olsa dəmi-dəfn kəfəndən ayru.
Şəfəqamiz günəşdir səri-xunini-şəhid,
Nola yerdən-yerə gər getsə bədəndən ayru[219].

*(Dəfn zamanı kəfənsiz də olsa şəhidlərin pak bədənini örtmək üçün qan pərdəsi kifayətdir. Şəhidin qanlı başı şəfəq saçan günəşdir. Odur ki, öz bədənindən ayrılmış halda tez-tez yer dəyişdirməsi, yəni bədəni ilə birlikdə dəfn olunmaması tamamilə təbiidir).*

Birinci beyt "Şəhidə qüsl verilməz, şəhidin bədəni elə öz libasıdır" inamı üzərində qurulmuşdur. Son 25 ildə əzəli-əbədi torpaqlarının üçdə birinin murdar və idbar yağı çəkmələri altında əzilən xalqımıza bu inam yaxşı bəllidir. Odur ki, bir daha İmam Hüseyn hərəkatının və Kərbəla vaqeəsinin çağdaşlığı ilə bağlı dərindən-dərinə düşünüb-daşınmağın zərurətini qeyd etməyi özümüzə borc bilirik.

İkinci beyt isə bilavasitə fəslin nəsr hissəsinin poetik davamıdır. Çünki orada:

Günəşi örtsə də qara buludlar,
Yenə günəş adlı bir qüdrəti var! –

səpkili bir fikir şəhid başına aid edilir. Qana bulaşmış başın qırmızıya çalması şəhid başını günəşə oxşatması üçün şairə imkan vermişdir.

Beləliklə, aydın olur ki, "Hədiqətü-s-süəda"nın "Həbib bin Müzahir" fəsli istər dini-mənqəbəvi, istərsə də bədii-estetik baxımdan Füzuli qələminin ecazı ilə araya-ərsəyə gələn parlaq və saf bir sənət incisi kimi milyonlarla imamhüseynsevərin duyğularını oxşaya-oxşaya, düşüncələrini kəsərli edə-edə, XVI əsrdən üzü bəri tarixi yora-yora, şəri, qaranlığı, imansızlığı qamçılaya-qamçılaya əzmlə, mətanətlə yol gəlir, yezidlərin, ibn ziyadların, ömər sədlərin tör-töküntülərinin nəfəsini kəsənədək hələ uzun, yorucu, ağır, ancaq şərəfli yoluna davam edəcəkdir.

..................................

[219] *Yenə orada*





# KƏRBƏLA DÜZÜNÜN İMAM HƏSƏN YADİGARI

Kərbəla vaqeəsinin ayrı-ayrı məqamları istər dini-tarixi baxımdan, istərsə də mənəvi-əxlaqi yöndə olduqca zəngin bədii-estetik xammala malikdir; belə ki, hər hansı bir sənətkar bu xammal əsasında ən müxtəlif mövzuları çeşidli məzmun incəlikləri ilə başqa-başqa üslublarda, rəngarəng və əlvan janr və formalarda qələmə ala bilər. Məqtəl və mərsiyə ədəbiyyatı belə örnəklərlə doludur. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, son illərdə məqtəl və mərsiyə ədəbiyyatının üzərindən qadağaların götürülməsinə baxmayaraq, bu ədəbiyyat indi də layiqincə öyrənilməmiş və həqiqi elmi-nəzəri qiymətini almamışdır. Halbuki bu qəbilli bədii nümunələr əski və tutumlu ədəbiyyatımızın ayrılmaz bir parçası kimi həmişə öndə olmuş, Xaqani–Nizami qələmilə cilalanaraq, Füzuli–Xətai lirikasının cövhərinə çevrilmiş, ən nəhayət, XIX əsrdə özünün həlledici və aparıcı ədəbi simalarını yetirmişdir. Çağdaş filoloji fikrin əldə etdiyi yeni-yeni tədqiqat metodlarının tətbiq olunduğu təqdirdə məqtəl və mərsiyələrimizin mövzu, məzmun, janr, forma, üslub cizgiləri özünün bütün aydınlığı və genişliyi ilə üzə çıxa biləcəyindən burada problemin həllini və qoyuluşunu mürəkkəbləşdirməyə qətiyyən lüzum yoxdur; bununla belə, etiraf etməmək də olmaz ki, problemə hələ də ögey münasibət bəslənilir, aparıcı elmi-tədqiqat müəssisələrinin perspektiv araşdırma planlarında onun sistemli surətdə və yüksək nəzəri



səviyyədə öyrənilməsi işində mütəmadi gecikmələrə yol verilir. Halbuki doğma yurd torpaqlarının dörddə birinin murdar yağı çəkmələri altında inim-inim inildədiyi bu günlərimizdə hər birimizin, cəmiyyət və dövlətinizin İmam Hüseyn hərəkatından, Kərbəla vaqeəsindən ala biləcəyi yüzlərlə dərs var. Həddi-buluğa çatmamış, hələ on üç yaşına keçməmiş cənab Qasimin artıq igidlik simvoluna çevrilmiş Aşura şücaətinin yeniyetmə və gənclərimizin vətənpərvərlik ruhunda yetişməsindəki yeri nəinki dini-tarixi, hətta yaşarı, canlı, diri və ölməz mənəvi-əxlaqi fakt kimi, təəssüflər olsun ki, bəhs mövzusu olan tematik planlarda hələ ki boş qalmaqdadır.

* * *

Cənab Qasim kimdir? Cənab Qasim şiələrin ikinci imamı Həsən ibn Əlinin (ə) övladıdır. İmam Həsən (ə) vəfat edəndə – Əşəsin qızı və həyat yoldaşı olan Cudənin əli ilə zəhərlənərək şəhid ediləndə cənab Qasimin üç yaşı olub. İmam Həsən (ə) isə Kərbəla vaqeəsindən düz on il qabaq şəhid edilib. Odur ki, cənab Qasimin olub-qalan 13 illik ömrünün son on ili əmisi, üçüncü imamımız Hüseyn ibn Əlinin (ə) himayəsində keçmiş, bilavasitə o ulu din böyüyünün bəşəriyyətə örnək olan əlçatmaz-ünyetməz məziyyətlərilə qırılmaz bağlılıq, üzvi qovuşuqluq içində günbəgün bitkinləşmiş və yetkinləşmişdir. Elə bunun nəticəsidir ki, o, Aşura günündə təsəvvürəgəlməyəcək qədər misilsiz qəhrəmanlıq göstərmiş və beləliklə də nəinki yaşıdları, hətta özündən qat-qat böyük döyüşçülər arasında belə dillərdə dastan olmuş, hünər və rəşadət yiyəsi kimi ad qazanmışdır.

Məqtəllərdə yekdilliklə bildirildiyinə görə, Tasuadan Aşuraya keçən gecə İmam Hüseyn (ə) ətrafında qalmış say-seçmə şəxslərə sabah hamının şəhadət şərbətini nuş edəcəyini bildirir. Ancaq həddi-buluğa çatmadığından bu ilahi müjdənin ona da aid olub-olmadığını kəsdirməyən cənab Qasim durduğu xeymə qırağındaca əmisindən soruşur: “Ey əmi, sabah mən



də qətlə yetiriləcəyəmmi?" İmam Hüseyn (ə) bir yandan onu sınamaq üçün, bir yandan da bədxah tarixçilərin – bu ulu din böyüyünün həddi-buluğa çatmamış şəxsin dini hisslərindən sui-istifadə etməsilə bağlı ehtimallarının qarşısını almaqdan ötrü qardaşı oğlunun sualına sualla cavab verir: "Ölüm sənin nəzərində necədir?"

Cənab Qasimin cavabı sözün gerçək anlamında tarixi, ancaq tarixi olduğu qədər də islami cavabdır: "Ölüm mənim gözümdə baldan da şirindir". İmam Hüseyn buyurur: "Bəli, sən də şəhid olacaqsan, ancaq böyük müsibətlərə düçar olduqdan sonra!"

Yazırlar ki, Aşura günü cənab Qasim döyüşməyə izin almaq üçün əmisinə çox yalvarıb-yaxardı, ən nəhayət, atasının vəsiyyətnaməsinin köməyilə İmam Hüseynin razılığını ala bildi. İmam Hüseyn bacısı Zeynəbi çağırdı ki, bir əmmamə gətir! O əmmaməni öz əliylə qardaşı oğlunun başına qoydu, libasını kəfən kimi geyindirib ata mindirdi. Cənab Qasim gəlib düşmən qoşununun qarşısında dayanıb ağladı. Bəziləri dedilər: "Yetimdir, ağlayır", bəziləri dedilər ki, "qorxudan ağlayır". Ancaq o, bir rəcəz oxudu və bundan bəlli oldu ki o, əmisinin susuzluğuna ağlayırmış.

Göründüyü üzrə, bu parçada tarixiliklə əsatirilik, diniliklə bədiilik, yığcamlıqla genişlik, konkretliklə mücərrədlik biri o birindən ayrılmayacaq dərəcədə üzvi qovuşuqluq içərisindədir. Bu orijinal üslub Füzuli qələminin cızdığı cənab Qasim portreti üçün də səciyyəvidir. "Hədiqətü-s-süəda"nın cənab Qasim bölümü belə bir təsvirlə başlanır ki, cənab Qasim Abdullah ibn Həsənin faciəli şəhadətini gördükdə İmam Hüseynə (ə) "İcazə ver ki, bu facirlərdən (azğınlardan) intiqam almaq üçün meydana girim və nizənin ucu kimi iti dillə və dil nizəsi ilə zəlalətin cavabını verim", – deyə müraciət edir. Amcaq Əhli-beyt "Həsənin ətrini səndən alırıq" deyərək etiraz edir. İmam Hüseyn (ə) də deyir ki, böyük qardaşımın xatirəsi indi yalnız səninlə diri qalır, kimsə sənə tay ola bilməz.



Dəvayi-dərdi-fəraqi-Həsən bana sənsən,
Sənin təvəccöhünə xatirim riza verməz!
Görür ədu sitəmin, kim ki bu məsafə girər;
Mürüvvətim sənə mütləq sitəm rəva görməz[220].

*(Mənim üçün Həsənin ayrılıq dərdinin dərmanı sənsən; odur ki, könlüm sənin bu istəyinə əsla razı olmaz. Axı bu döyüş meydanına girən hər kəsin əzab-əziyyət görməsi qaçılmazdır. Odur ki, insafım sənin əzab-əziyyətlə qarşılaşmanı heç vəchlə qəbul etməz!).*

Qasim əmisindən izin ala bilmədiyini gördükdə yadına düşür ki, vaxtilə atası bir təviz (nəzər duası, həmail) yazıb qoluna bağlamışdı. O, tez xəlvətə çəkilib həmin təvizi oxuyur və orada bu sözlərin yazıldığını görür: "Ey Qasim, sənə vəsiyyətim budur ki, Həzrəti-Hüseyn dəşti-Kərbəlada bəlaya giriftar olduqda zinhar, zinhar, ana nəqdi-can nisar etməgə təqsir etməyəsən və heç bəhanə ilə təriqi-təəllül dutmayasan". Şe'r:

Budur, ey nütfeyi-pakizə, vəsiyyət sənə kim,
Nəqdi-can sərf qılub kəsbi-səadət qılasan.
Ləzzəti-ömr səni qılmaya qafil Həqdən,
Kəndünü qabili-iqbali-şəhadət biləsən"[221].

*(Ey Qasim, mən sənə vəsiyyət edirəm ki, həzrət Kərbəla çölündə bəla ilə üzləşdikdə nəbadə can nəqdini ona qurban etməkdə qüsura yol verib, heç bir bəhanə gətirməklə özünü götür-qoy edirmiş kimi yalançı təfəkkür adamı kimi göstərməyəsən! Sən ey nütfəsi pak olan oğlum, mənim sənə ilk-son sözüm bax budur ki, sən Kərbəla döyüşü günü canının nəqdini xərcləməklə ən böyük xoşbəxtlik qazanasan! Qoy ömrün müvəqqəti zövqü səfası səni bir an belə haqq işi*

.................................

[220] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 305*

[221] *Yenə orada*





*uğrunda mübarizədən uzaqlaşdırmasın! Əksinə, sən gərək özünü şəhidlik meydanına layiq cavan kimi aparasan).*

Göründüyü kimi, gətirilən parça özünün fikri axarı və bədii tutumu ilə Kərbəla vaqeəsinin fərdi və ictimai təbiətinə tamamilə uyğun olub, İmam Hüseyn hərəkatının dini-tarixi mahiyyətini və mənəvi-əxlaqi çəkisini bütün aydınlığı və genişliyi ilə açıb göstərməkdədir. Füzuli Qasimlə yanaşı, İmam Həsənin (ə) Abdullah adlı oğlunun da Kərbəlada olduğunu, igidliklə döyüşüb şəhidlik mərtəbəsinə ucaldığını və qəhrəmanının həm də bundan güc aldığını yazır. O bununla sanki demək istəyir ki, vaxtilə göstərdiyi böyük dəyanətlə dillərdə dastan olan İmam Həsən (ə) təkcə ruhən yox, övladlarının simasında elə cismən də Kərbəlada qardaşı İmam Hüseynin (ə) yanında olub, qardaşlıq və imamlıq vəzifəsini yerinə yetirməkdədir. Cənab Qasimin əmisindən döyüşə getmək üçün izin istəməsində də bu irsi şücaətin tonu açıq-aşkar duyulur; belə ki, o, düşmən qoşununu "facir" *(azğın)* adlandırmaqla onların qətiyyən müsəlman olmadıqlarına, İslamın həqiqi mahiyyətindən xəbərsiz olduqlarına kəskin və kəsərli işarə vurur.

Cənab Qasimin əmisinə müraciətində diqqəti çəkən ikinci cəhət onun intiqam hissi ilə alışıb yanmasıdır. Bəllidir ki, bu hiss, əslində, təbii insani keyfiyyət kimi fərdi qatdan ictimai səviyyəyədək mürəkkəb inkişaf yolu keçmiş, dərin ruhi-psixoloji çalarlar qazanmaqla ətraflı islami məzmun kəsb etmişdir. Ulu Yaradan Şanlı Kitabında özünü "intiqam sahibi" *("Ali-İmran", 4)* adlandırmaqla bütün bu mənzərəyə dönməz bir ilahi səciyyə bəxş etmişdir. Aşağıda verəcəyimiz rəcəz də qəhrəmanın bu hissində tamamilə haqlı olduğunu göstərəcəkdir.

Yuxarıdakı təsvirdə diqqəti çəkən üçüncü cəhət meydangirlikdir; belə ki, Kərbəla döyüşü, hər şeydən öncə, bir meydan müharibəsi olmuşdur. Başqa sözlə, İmam Hüseyn (ə) ordusunun döyüşçüləri meydana bir-bir girmiş, təkbətək vuruşmuş, günlərlə susuz qalmalarına baxmayaraq, misilsiz



şücaət göstərmişlər. Füzuli qələmi Kərbəla igidlərini bu nöqtədə Dədə Qorqud və Koroğlu kimi təsvir və tərənnüm edir. Bu hal onların sözlərində də özünü göstərir. Görün Qasim əmisindən izni necə alır; deyir ki, sən gəl razı ol ki, mən həm nizənin ucu kimi iti dillə, həm də nizə ilə döyüşüm. Deməli, cənab Qasimin gözündə söz döyüşü ilə qılınc döyüşü ayrılmaz, qopmaz bir uyarlıq təşkil edir ki, bu da Dədə Qorqud və Koroğlu igidlərinə xas əlamətlərdəndir. Ancaq burada bu xüsusiyyət həm də islami məzmundadır. Çünki Qurani-Kərimdə Allah Peyğəmbərə (s) "Sən Rəbbinin yoluna hikmət, gözəl moizə və bir də qaydaları gözləmək şərtilə aparılan mübarizə ilə çağır" *("Nəhl", 125)* buyurur. Heç şübhəsiz, Əhli-beyt xanədanının bir üzvü olan cənab Qasim də bu ilahi tövsiyəyə uyğun davranacaq, bu Tanrı göstərişini özünün döyüş rəhninə çevirəcəkdi. Aşağıda dövrünün güclü pəhləvanı kimi ad çıxarmış Əzrəqi-Şamiyə söylədiyi sözlər araşdırılarkən qəhrəmanımızın, doğrudan da, "nizəsinin ucu kimi iti dillə" əlindəki qılıncı çox ustalıqla qovuşdurduğunu görəcəyik.

Əsərdən gətirilmiş təsvir davam etdikcə Füzuli qələminin İmam Hüseyn (ə) hərəkatı və Kərbəla vaqeəsi yönündə açdığı yeni-yeni bədii-estetik üfüqlər göz önündə canlanır; belə ki, Əhli-beytin "Biz Həsənin ətrini yalnız səndən alırıq" sözləri çox lakonik şəkildə Kərbəlada günlərcə susuz qalmış Peyğəmbər övladlarının ah-naləsini, dəruni iztirablarını tamamilə təbii olaraq əks etdirdiyi kimi, "Böyük qardaşımın xatirəsi indi yalnız səninlə diri qalır, odur ki, kimsə sənə tay ola bilməz" sözləri də şəhidlər başçısının əmilik, rəhbərlik, sərkərdəlik və imamlıqla bağlı duyğusu və düşüncələrinə dair aydın anlayış yaradır. Bu baxımdan parçanın ilk şeiri təkcə İmam Hüseynin (ə) deyil, çadırlarda nigaran-nigaran vurnuxan, heç bir vəchlə bir yerdə qərar tutmayan onlarca qız-gəlinin könül nəğməsi kimi səslənir.

"Dəvayi-dərdi-fəraqi-Həsən" *("Həsənin ayrılıq dərdinin dərmanı")* tərkibi İmam Hüseynin son on ildə qardaşı İmam





Həsənə necə də böyük ehtiyac duymasından, indi Kərbəlada olacağı təqdirdə onun məsləhət və tövsiyələrinin necə də gərəkli olacağına dərindən inanmasından soraq verir. Ötəri deyildir ki, həddi-buluğa çatmamasına baxmayaraq, Qasimin son dərəcə hazırcavab olmasını Füzulinin qabartması altda məhz bu çalarla da sıx bağlıdır.

Şeirin ümumi məzmununda İmam Hüseynin (ə) əmi mehribanlığı ilə sərkərdə zəhmi iç-içədir. “Görür ədu sitəmin, kim ki bu məsafə girər” misrası alt qatda olsa belə, bunu incəliklə əks etdirir. Digər tərəfdən, bu məqam İmam Həsənin (ə) vəsiyyətnaməsindəki döyüşkənlik əhvali-ruhiyyəsi ilə üzvi bir dini-tarixi əlaqənin bədii əksi kimi səslənir.

Parçada diqqətçəkən cəhətlərdən biri də məişət faktlarının yaşayışın təbii-fiziki reallığı kimi olduqca canlı və görümlü biçimdə təsviridir; belə ki, İmam Həsənin (ə) üç yaşında olan oğlunun bazusuna – qolunun dirsəkdən çiyninədək yerinə nəzər duası, yaxud həmayil bağlaması təhkiyədə xatırlanan predmet olmasına baxmayaraq, əslində, nəqlin indiki zamanı qədər gerçək, real təsir bağışlayır. Ancaq belə ekspessivlik və emosionallıq qətiyyən qeyri-islami təsəvvürə aparıb çıxarmır, çünki *gözmuncuğu* və *tilsim* anlamlarını da bildirməsinə baxmayaraq, burada – mətnin kontekstində “təviz” sözü yalnız islami mahiyyətinə uyğun yönü ilə işlənən leksem yerində çıxış edir. Sözün məzmununun nəsrlə yanaşı, nəzmlə də verilməsi isə çox ustalıqla köməyə çağırılmış ədəbi priyom olaraq da qəbul edilə bilər.

“Hədiqətü-s-süəda”nın “Cənabi-Qasim” qisməti belə davam edir: Qasim təvizi əmisinə göstərib ondan icazə istədikdə İmam Hüseyn (ə) deyir: “Ey nuri-didə və ey seyyidi-bərgüzidə, ol həzrətin bənə dəxi bir vəsiyyəti olmuş idi. Əmma vəfasinə dövran müsaid olmadı və əncamına fələk müavinət qılmadı”.

*(Ey gözümün işığı və ey seçkin seyyid, o həzrətin mənə də bir vəsiyyəti var idi, ancaq dövran mənim o vəsiyyətə vəfalı*



*olmağım üçün şərait yaratmadı və fələk də mənə onu yerinə yetirməkdə yardım göstərmədi).*

O, bu sözdən sonra Qasimin əlindən yapışıb Əvn Əli və Abbas Əli ilə birlikdə Əhli-beytə buyurdu ki, Qasimin namizədi olan şahzadəyə ərusanə zinət verib gətirələr. İmam Hüseyn (ə) o salehənin əlini damadın əlinə verib dedi: "İmam Həsənin vəsiyyəti yerinə yetsin deyə bu əmanəti sənə təslim etdim". Nakam ərus damada təhvil veriləndən sonra imam otaqdan çıxıb meydana getdi. Qasim ərusun gözəlliyi qarşısında heyrətə gəlib xəyala daldı, fikrə getdiyi vaxt qulağına meydandan "Həl min mübariz?" *(Məgər bizimlə vuruşacaq bir döyüşçü yoxdurmu?)* səsi yetişdi. O, özündən asılı olmayaraq otaqdan çıxıb meydana getmək istədi. Bu zaman Peyğəmbər xanədanının qız-gəlini qabağını kəsib dedi ki, bu əmanəti kimə təslim edib gedirsən? Qasim ağlaya-ağlaya belə söylədi ki, düşmən qoşunu əmimlə üzbəüz durub; belədə rəvamıdır mən sevincə və eyş-işrətə meyil göstərim? "Bənim vədeyi-təzvicim qiyamətə düşdü, məzur tutun" *(Mənim evlənmə vaxtım Qiyamət gününə qaldı, odur ki, məni üzrlü hesab edin!).* Şe'r:

Zəmanə bir gül etdi sərvə peyvənd,
Vəli sərv olmadı gül birlə xürsənd.
Araya saldı firqət ehtiraqın,
Ana göstərdi ol sərvin fəraqın.
Fələk bir riştəyə çəkdi iki dür,
Kəsüb ol riştəyi tiği-təğəyyür,
Bıraxdı bir-birindən dürləri dur,
Qəza bu əmrədir, guya ki, mə'mur[222].

*(Zəmanə sərvə (cənab Qasimə) bir gülü (İmam Hüseynin (ə) Fatimə adlı qızını) peyvənd etdi, ancaq sərv o güllə qovuşmadı. Aralığa ayrılıq alovu düşərək, ərusa sərvboylu*

.................................

[222] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 306*





*damadın ayrılığını göstərdi. Fələk iki incini bir sapa düzdü, ancaq əzab-əziyyət xəncəri o sapı kəsərək, inciləri bir-birindən uzaqlaşdırdı: sanki qəzavü qədər bütün işini-gücünü atıb, yalnız bu hökmü yerinə yetirməklə məşğuldur)*.

Bu zaman ərus ayrılıq pərdəsinə həsrət ahının ildırımı ilə od vuraraq "Qiyamət günündə mən səni hansı əlamətinlə tanıyım", – deyə soruşdu. Qasim dedi: "Ey güli-naşüküftə, və ey gövhəri-nasüftə" *(Sən ey açılmamış solan gül, sən ey deşilməmiş inci)* bəni ərseyi-Qiyamətdə xidməti-əcdadimdə cameyi-çak və dideyi-nəmnakla bulmaq olur"[223] *(Yırtıq yaxa və nəmli gözlə tapmaq mümkündür).*Cənab Qasim daha sonra ərusla vidalaşaraq, döyüşə yollandı.

Əsərin bu bölümü döyüş elementlərinə doğru tədrici inkişaf üzərində qurulmuşdur. Ancaq bu inkişaf bir xeyli ailə-məişət yönümlü olub, əsaslı surətdə həzin əhvali-ruhiyyə daşıyır. Belə ki, cənab Qasim kimi, İmam Hüseyn də İmam Həsənin sözlərinə – başqa bir vəsiyyətinə söykənməklə bir yandan qardaş yadigarının xeymələrdə bir qədər çox qalmasını təmin edir, bir yandan da onun ömrünün son anlarında olsa belə ailə xoşbəxtliyini dadması üçün şərait yaradır. Məqtəllərdə geniş təsvir olunan cənab Qasimin toy məclisi, gəlin otağı, damad-ərus mükalimələri prinsipcə Kərbəla vaqeəsinin mahiyyətinə zidd deyil. Ona görə ki, tarixi kökünün olmamasına baxmayaraq, belə elementlər Kərbəla vaqeəsinin ideya-fəlsəfi tematikasına yad olmayıb, havadan asılı qalmayan və son nəticədə İmam Hüseyn (ə) hərəkatının ayrılmaz, qopmaz tərkib hissəsinə çevrilən komponent yerindədir. Bəzi dini işbazların bundan – imamhüseynsevərlərin duyğu və düşüncələrindən sui-istifadə edib, kütlələrin mənəvi-əxlaqi dünyaduyumunu istismar etməsi isə tamamilə başqa məsələ olub, sırf günah səciyyəli bir əməldir və bunun üçün bədii ədəbiyyatı, məqtəl və mərsiyələri suçlu saymaq bütünlüklə qeyri-obyektivdir. Belədə belə bir sual doğur: bəs niyə Füzuli

...............................

[223] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 306*





tarixi kökü olmayan ailə-məişət faktlarına əsərində bu qədər geniş yer ayırmışdır?

Cavab olduqca sadədir: unutmamalıyıq ki, Füzuli ilk növbədə bir ədibdir, odur ki, həyatın hər bir üzünə ədib gözü ilə baxır, yaşayışın ən məhrəmanə nöqtələrinin belə bədii dərkinə can atır və bütün bunları oxucularının ən yüksək səviyyədə qavramasını diləyir. O istəyir ki, imamhüseynsevərlər cənab Qasimin şücaəti ilə yanaşı, həzin əhvali-ruhiyyəsini də görsünlər. Bu isə bir sənətkar üçün tamamilə təbii haldır. Qəhrəmanlarının – damadla ərusun keşməkeşli daxili aləmini, mürəkkəb duyğu və düşüncələrini təsvir və tərənnüm edərkən lirikanı başlıca yaradıcılıq manerası olaraq önə keçirməsi də məhz buradan irəli gəlir. Bu lirik üslub İmam Hüseynin (ə) cənab Qasimə müraciətində də duyulur. O, qardaş yadigarına belə üz tutur: *"Ey gözümün işığı və ey seçkin seyyid!"* Doğrudur, bu mehribanlığın əsasında, bəzilərinin düşündüyü kimi, bədiiyyatda heç bir rolu olmayan qafiyəlilik prinsipi dayanır: "didə-bərgüzidə" sözlərinin qafiyəliliyi buradakı həzinliyin lirikaya çevrilməsini şərtləndirən önəmli ədəbi faktlardandır: bunu danmaq söz sənətinin mahiyyətindən xəbərsizlikdən başqa bir şey olmazdı. Ancaq unutmaq da qətiyyən özünü doğrultmaz ki, əlində mum olan sözləri Füzuli imam-peyğəmbər təsviri və tərənnümü zamanı heç bir vəchlə sağa-sola səpələyib, özünün təbii əndazəsindən çıxarmazdı; bu, Füzulinin sənətə ölçülü-biçili münasibətinə yad, yabançı olan haldır. Şair, sadəcə olaraq, əmi-qardaşoğlu münasibətinin istiliyini görümlü biçimdə verməkdən ötrü sözlərin qafiyəliliyindən yerinə düşmüş təbii səs uyarlığı kimi yararlanmış və beləliklə də hər iki personajın – İmam Hüseyn (ə) və cənab Qasimin (ə) yığcam obrazını yaratmağa müvəffəq olmuşdur.

Müraciətin islami siqlətinə gəlincə, İmam Hüseynin (ə) cənab Qasimi "seçilmiş seyyid" adlandırması qətiyyən ötəri hal olmayıb, dərin dini-əsatiri bilgilərlə səsləşən çoxqatlı bir islami təyindir. Çünki müsəlman aləmində yayılmış





bir təsəvvürə görə, İmam Hüseyn (ə) soyundan gələnlərə "seyyid", İmam Həsən (ə) nəslindən olanlara isə "şərif" deyilir. Lakin Füzulinin burada İmam Hüseynin (ə) dili ilə İmam Həsənin (ə) oğlunu "seyyid" olaraq səciyyələndirməsi onun bu təsəvvürü, ən azı, qəbul etmədiyini, əksinə, seyyidliktək yüksək kateqoriyada imamlar arasında hər hansı ayrı-seçkilik salmağın yolverilməz olduğunu göstərir. Halbuki "seyyid" sözü Quran leksikonunda da mövcud olub, kifayət qədər müqəddəs məzmun almış bir leksemdir *("Ali-İmran", 38)*.

İmam Hüseynin (ə) nitqi içərisində ağır yük daşıyan "dövran" və "fələk" sözləri ayrıca diqqət çəkir. Çünki bu sözlər, əslində, İslamın saf mahiyyətini pozaraq, məhvə doğru aparan ozamankı idarə üsuluna o ulu din böyüyünün vurduğu kəskin və kəsərli işarədir. Müslüm ibn Əqilin şəhadət xəbəri gəldikdə ətrafındakı insanların çoxunun tezliklə qaçıb dağılmaq istədiyini görən İmam Hüseyn (ə) onlara belə buyurur: "Məgər siz görmürsünüz ki, heç kəs haqqa əməl etmir, heç kəs də batilin, saxtakarlığın qarşısını almağa çalışmır? Bəs mömin ilahi buyuruqların gerçəkləşməsi üçün səy etməməlidirmi? Mənim məqsədim yalnız yaxşılıqlara həvəsləndirib, pisliklərdən çəkindirmək və haqq yolundan azmış cəmiyyəti babamın və atamın izlədiyi həqiqi islami yaşayış biçiminə yönəltməkdir!"

Beyzə adlı bir yerdə Hürr ibn Yezid Riyahinin ordusuna xitabən söylədiyi nitqində də İmam Hüseyn (ə) bu səpkili ictimai-siyasi cəhətləri önə çəkir: "Ey camaat, Allahın Rəsulu (s) buyurub: "Hər kəs zülmkar, Allahın halalını haram edən, Allahla bağladığı əhdi sındıran, Rəsulullahın (s) sünnəti ilə müxalifətdə duran, bəndələrlə günah və düşmənçiliklə davranan bir hökmdarı gördüyü halda sözü, yaxud işi ilə ona qarşı çıxmazsa, Allah-taala onu da o hökmdarı daxil edəcəyi yerə daxil edər!"

Muhəmməd ibn Hənəfiyyə İmam Hüseynlə (ə) ata bir, ana ayrı qardaş idi. Çoxları kimi, o da bu ulu din böyüyünü Kufə



səfərindən çəkindirməyə can atırdı. İmam onun cavabında belə buyururdu: “Ey qardaşım, bu gen dünyada heç bir sığınacağım olmasa belə, yenə də Müaviyə oğlu Yezidə beyət gətirmərəm!”

Görəsən, Yezidi xəlifə kimi tanımamaqda İmam Hüseynin (ə) meyarı nə idi? Çünki bu sual da yuxarıdakı mətndə işlənən “dövran” və “fələk” sözlərinin bildirdiyi “idarə üsulu” və “hakim dairələr” anlamı ilə birbaşa bağlıdır. İmam Hüseyn (ə) buyururdu: “İzzətlə ölmək zillətlə yaşamaqdan qat-qat üstündür”. O deyirdi: “Mən (bu şəraitdə) ölümü xoşbəxtlikdən başqa, zalımlarla birlikdə sağ qalmağı isə tənədən, əskiklikdən özgə ayrı bir şey saymıram!”

Bu ulu din böyüyü “Mən Yezidə beyət etmirəm” demirdi; bu, İmam Hüseyn təfəkkürü üçün miqyas məhdudluğu olardı. O deyirdi: “Mənim kimisi Yezid kimisinə beyət etməz!” Yəni mənim əqidəmi daşıyan şəxsin Yezidə tabe olması, sadəcə olaraq, imkan xaricindədir.

Ən nəhayət, şairlərin əsrlər boyu yüzlərcə mənfi anlamda yüklədikləri, bacardıqları bütün eybəcərlikləri aid etdikləri “dövran” və “fələk” obrazlarının məğzində zülmkarlığın, haqsızlığın, vəfasızlığın dayandığını nəzərə aldıqda Həzrət Muhəmmədin (s) aşağıdakı siyasi qiymətini istər-istəməz Kərbəla vaqeəsinə də şamil etməli oluruq: “Bir cəmiyyət, bir dövlət küfrlə uzun müddət yaşaya bilər, ancaq zülmlə heç vaxt əbədi mövcud ola bilməz!” Yeri gəlmişkən deyilməmiş qalmasın ki, belə hikmətamiz kəlamlar bu ulu din böyüyünün əməli fəaliyyəti ilə yanaşı, çox böyük və dərin nəzəri irs sahibi olduğunu da bir daha xatırladır. Başqa sözlə, bu o deməkdir ki, Kərbəla vaqeəsi qiymətləndirilərkən Qurani-Kərim, Peyğəmbər hədisləri və Həzrət Əlinin (ə) “Nəhcü-l-bəlağə”si ilə yanaşı, elə İmam Hüseynin öz nəzəri irsi də ölçü olaraq götürülməlidir.

Təsvir olunan əhvalatda diqqəti çəkən başqa bir cəhət qızğın döyüşün, qan-qadanın içərisində İmam Hüseynin (ə) Peyğəmbər xanədanınının qız-gəlininə Qasimin namizədi



olan şahzadəyə (yəni qızı Fatiməyə) ərusanə zinət verib gətirmələrini tapşırmasıdır. Bu, bir yandan bəşər nəslini saxlama tələbinin İslamiyyətdəki yerinin önəmini göstərir, bir yandan da İmam Hüseynin (ə) də daxil olduğu dini müqəddəsatın gözəlliyə baxışının qətiyyən məhdud olmayıb, bütövlükdə maddi-mənəvi tərəfləri taraz surətdə, ölçülü biçimdə özündə birləşdirdiyindən soraq verir. Aşağıdakı mənqəbə bu cəhətlərin, ən çox da ikincisinin Kərbəlada da öz qüvvəsini saxladığını sübuta yetirir. Ravi nəql edir ki, Əli Əkbər meydana gedəndə İmam Hüseyn (ə) onun ya barmağından, ya da məhasinindən (saqqalından) yapışıb, əlini yuxarı qaldıraraq buyurdu: "Allahım, sən özün şahid ol, mən bunların cənginə elə bir cavanı göndərirəm ki, insanlar içərisində zahirinə, batininə və nitqinə görə sənin Peyğəmbərinə ən çox bənzəyənidir. Biz Rəsulun camalına müştaq olduqda həmişə onun üzünə baxmışıq".

Göründüyü kimi, bu ulu din böyüyünün dilindən çıxan sözlərin hər birində gözəlliyin bir tərəfi əksini tapmaqdadır. Belə ki, "halqən" sözü məqtəl və mərsiyələrdə Rəsulullaha ən çox bənzəyən Əli Əkbərin zahiri gözəlliyinin nişanəsidirsə, "xulqən" və "məntiqən" sözləri də batini və nitqi gözəlliyinin əlamətidir. Yaxud imamın ikinci cümləsindəki "camal müştaqlığı" məfhumu Rəsulullahın "Allah gözəldir və gözəlliyi sevər" hədisi yönündə də ayrıca çalar qazanmaqla Əli Əkbərin necə cəlbedici gənc olmasına dair aydın anlayış yarada bilir.

Deyirlər ki, İmam Hüseyn (ə) yalnız Əli Əkbəri meydana göndərəndə düşmən qoşununu qarğımışdır; o ulu din böyüyünün bu yöndəki sözlərindən də örnəklər dillərdə əzbərdir: "Ya Rəbb, onları yerin (torpağın) bərəkətindən məhrum elə, aralarına ayrılıq sal, onları dağıdaraq pərən-pərən et, dincliklərini əllərindən al, heç vaxt başçılarını onlardan razı salma! Çünki öncə bizi köməyə çağırdılar, ancaq sonra bizə əziyyət verdilər və bizi qətlə yetirdilər".





Parçanın estetik məzmunu ilə bağlı başqa bir təsdiqləyici mənqəbə düşmən ordusu sıralarında vuruşmuş Hilal ibn Nafeyə məxsusdur. O deyir ki, döyüşün qızğın çağı idi, Hüseyn ibn Əli (ə) yaralı halda qətlgahda düşüb qalmışdı, sonuncu dəfə onu görməyə getdim, onun üzünün nuru, gözəlliyi məni elə cəlb etdi ki, onun ölüm halında olması, az qala, fikrimdən çıxmışdı".

"Nuri-vachihi" *(üzünün nuru)* ifadəsi dini müqəddəsliyi bildirdiyi kimi, imamın zahiri görkəm gözəlliyindən də söz açır. Deməli, "Hədiqətü-s-süəda"nın nəinki cümlələrinə, hətta ayrı-ayrı söz və ifadələrinə belə məxsusi yanaşma bir tədqiqat metodu kimi özünü doğruldur, çünki məqtəl tarixi tərəflərə malik olmaqla yanaşı, əslində, daha çox söz-sənət əsəridir və ilk növbədə imamhüseynsevərlərin duyğu və düşüncələrini oxşamaq üçün yazılmışdır. Belə yüksək estetik tələbatı ödəmək isə yalnız son dərəcə böyük sənətkarların öhdəsindən gələ biləcəyi çətin ədəbi vəzifədir.

Vəsiyyətetmənin İslam dinindəki yeri hamıya bəllidir. Araşdırılan parçada İmam Hüseynin (ə) cənab Qasimə (ə) "İmam Həsənin (ə) vəsiyyəti yerinə yetsin deyə bu əmanəti sənə təslim etdim" deməsi bir yandan bu möhkəm dini anlayışın hər bir ağır vəziyyətdə belə qüvvəsini itirmədiyinin bədii ifadəsidirsə, o biri yandan belə halların döyüşqabağı hərəkətəgətirici bir amil olmasının önə çıxarılmasıdır. Deməli, bu din böyüyü belə davranmaqla imamlığın istisnasız olaraq bütün vəziyyət və şəraitlərdə aparıcı və həlledici rəhbərlik institutu olmasına diqqəti çəkərək, bunu bilavasitə ilahi göstərişdən qaynaqlanan dönməz xarakterli dini-mənəvi proses kimi də qavratmaq istəmişdir.

Bölüm davam etdikcə surətlərin və hadisələrin sayı artır, kəmiyyət və kefiyyət dəyişiklikləri sürətlə bir-birini əvəz edir. İmam Hüseynin (ə) toy otağından çıxıb birbaşa döyüş meydanına getməsi, Qasimin ərusun gözəlliyi qarşısında heyrətə düşüb xəyala dalması ilə qulağına meydandan döyüşçü istəyən düşmən əsgərinin təhqiramiz və təhdidkar



səsinin gəlməsinin üst-üstə düşməsi təhkiyəni yüyrək, təsviri çevik, tərənnümü isə inandırıcı edir, oxucunun gözləri önündə canlı Kərbəla səhrasını özünün bütün ağrı-acısı ilə canlandırır.

Təsviri tərənnümlə gücləndirən şeirin aşiqanə ruhda olması Peyğəmbər xanədanının qız-gəlininin “Bu əmanəti kimə təslim edib gedirsən” sualına cənab Qasimin (ə) “Bənim vədeyi-təzvicim Qiyamətə düşdü, məzur dutun!” şəklindəki cavabını olduqca təsirli edir və Kərbəla vaqeəsinin ruhi-psixoloji qatına ayrıca bir dolğunluq gətirir. Belə ki, Füzuli öncə damadı sərv ağacına, ərusu qızılgülə bənzətdiyi halda, şeirin davamında hər ikisini bir sapa düzülmüş inci kimi təsvir etməklə parlaq bir poeziya incisi yaradır. Digər tərəfdən, məsnəvidə “zəmanə” və “fələk” sözləri ilə hakim dairələrin əzici təzyiqinə işarə olunması nakam yeniyetmələrin saf məhəbbətinin Leyli–Məcnun məhəbbəti kimi məhz ictimai münasibətlərə qurban getməsi fikrini də nəzərə çarpdırmağa xidmət edir.

Ən nəhayət, belə bir cəhətin üzərindən sükutla keçməyək ki, ərusun “Qiyamət günündə mən səni hansı əlamətinlə tanıyım” sualına damadın “Qiyamətdə xidməti-əcdadimdə cameyi-çak və dideyi-nəmnakla bulmaq olur” şəklindəki cavabı Zeydin sonda Leyli ilə Məcnunu cənnətdə xoşbəxtlik içində yuxuda görməsini andırır ki, bu da nəticə etibarilə hər iki aşiq-məşuqun dünyadakı paklıq və səbirliliklərinə görə əzəli-əbədi axirət xoşbəxtliyini əldə etməsi fikrinin bədii əksidir.

“Hədiqətü-s-süəda”nın “Cənabi-Qasim” bölümünün qalan hissəsi, demək olar ki, bütövlükdə döyüş səhnələri üzərində qurulmuşdur. Əsərdə oxuyuruq ki, qəhrəman ərusla vidalaşıb döyüşə yollananda Peyğəmbər xanədanının qız-gəlini birağızdan fəryada gəlir, İmam Hüseyn (ə) cənab Qasimin şəhadətə meyilli olduğunu görüb, əyninə kəfən geyindirib, belinə də öz qılıncını bağlayaraq onu döyüş meydanına göndərir. O, meydana girib, cövlan edir və belə bir rəcəz oxuyur:



Bənəm güli-çəməni-sidq Qasim ibni-Həsən
Ki, nəqdi-can qılıbam nəzri-xaki-payi-Hüseyn,
Müqimi-kuyi-vəfayam, müsafiri-rəhi-Həq,
Mütii-əmri-Həsən, talibi-rizayi-Hüseyn[224].

*(Sədaqət çəməninin qızılgülü olan Həsən oğlu Qasim mənəm; mən elə bir cavanam ki, canımın nəqdini Hüseynin ayağı altındakı torpağa nəzir demişəm! Mən vəfa məhəlləsində şəstlə dayanmışam, yalnız və yalnız ilahi razılığı qazanmaq üçün Haqq yolunda səfərə çıxan bir cəfakeşəm; mən Həsənin göstərişlərinə boyun əymişəm və Hüseynin könlünü xoş etməkdən başqa özgə bir istəyim, diləyim yoxdur!).*

Qasim düşmən qoşununa həmlə edib ordunun ortasınadək irəliləyərək, Ömər bin Sədlə üz-üzə gəlir və uca səslə nərə çəkərək deyir ki, bu qədər mömini şəhid etdiniz, istiğfar edib, bağışlanma diləyib, bu əməldən peşman olmaq çağı çatmadımı?

İbn Səd deyir: “Bəs vəxt çatmadımı ki, siz də bu tüğyanı dərk edib, Yezidin beyətini qəbul edəsiniz?”

Qasim sonra ona belə deyir: “Ey şəqi *(ey azğın)*, tüğyan budur ki, bütün yaranmışlara mübah ola-ola Fəratın suyunu Əhli-beytin üzünə bağlayasan?! Bəs qiyamət səhrasının atəşi yadına düşməzmi və qorxu, xəbərdarlıq vədəsi daş qəlbinə təsir etməzmi?”

İbn Səd bu sözləri eşitdikdən sonra qoşuna üz tutub deyir: “Bu, Həsən oğlu Qasimdir; igidlik bacarığı ona atasından miras qalmışdır. O, döyüş günündə iti xəncərə gözəllərin “navəki-müjganindən ziyadə meyil edər” *(İti kirpiklərindən çox diqqət yetirər)*, nizəyə “sənəmlər” *(gözəllər)* qamətindən artıq fikir verər”.

................................

[224] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.307*





Budur ol nəqdi-Heydəri-Kərrar
Ki, çəküb tiğ edəndə qəsdi-qital,
Rəşkdən xəncərini daşa çalar
Ləm'eyi-bərqi-afitabmisal.
Tayiri-tiri-tizpərvazı
Meyli-seyd eyləsə açub pərü bal,
Ana eylər həvayi-vəsl dutub,
Mürği-ruhi-müxalif istiqbal[225].

*(Hücum çəkən şirin (Həzrət Əlinin (ə)) canının nəqdi budur, (cənab Qasimdir (ə)), o, qılınc çəkib döyüşmək istədikdə ildırım günəş kimi qısqanclıqdan xəncərini daşa çalar. Onun sürətli ox və nizələrinin durmadan havada uçuşu qol-qanad açaraq ovuna doğru yönəlsə, düşmənlərin ruh quşu özündən asılı olmayaraq qeyri-ixtiyari surətdə onunla görüşə tələsməklə sanki onun (qəhrəmanlıq və əzəmətinin) istiqbalına çıxar).*

Doğrudan da yer və göy əhli təkbətək bunun önündə duruş gətirə bilməz; məsləhət budur ki, bütün qoşun hamı bir yerdə üstünə hücum çəkib, döyüşə başlamağa fürsət vermədən çoxlu qılınc, ox və nizə ilə hər tərəfdən yaralayıb, təbil, şeypur və neylə "mürği-ruhin sərasimə qılasız" *(ruh quşunu yuvasından didərgin salasınız, yəni onu girinc edəsiniz)*. Bəlkə bu tədbirlə ona qalib gələsiniz!

Qoşun sel kimi Qasimin üstünə yeriyib, hər yandan ox atıb, döyüşə başladı, halbuki Qasim bu hiylədən xəbərsiz idi. Ancaq o, düşmənin çoxluğundan qorxmadan bir həmlə ilə qoşunu pərakəndə elədi. İşi belə görən ibn Səd Şam bölüyünün başçısı olan Əzrəq Şamiyə tənə vurub dedi: "Sən Yezidin xüsusi rəğbətini qazanmış bir pəhləvansan, bəs niyə irəli çıxıb bu döyüşçünün şərrini başımızdan uzaqlaşdırmırsan?"

Əzrəq Şami təkəbbürlə dedi: "Ey ibn Səd, bəni Ərəb bin Mübarizə müqabil tuturlar, mənə yaraşmaz ki, bir uşağın cənginə gedib adımı bədnam edəm".

..................................

[225]*Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.307*





İbn Səd dedi: "Ey nadan, bu cavan Peyğəmbərin və Əlinin nəvəsidir, Həsənin oğludur, susuz olmasaydı, bu qədər qoşunla vuruşmağı özünə ar bilərdi.

Əzrəq dedi: "Sən şişirdirsən, mənim dörd oğlum var, hərəsi də məşhur pəhləvandır, bu saat birinə deyərəm, onu tutub gətirər".

O, böyük oğluna xeyir-dua verərək Qasimin döyüşünə yollayır. Qasim də öldürdükdən sonra onun kəkilindən yapışaraq, bir az meydanı gəzdirir, sonra sür-sümüyünü, bədən üzvlərini sındırıb, yeni döyüşçü istəyir. Qasim bu münvalla Əzrəq Şaminin o biri oğlanlarını da bir-bir öldürür. İşi belə görən Əzrəq bərk hirslənərək, qəzəbli halda meydana girir və Qasimə xoşagəlməz sözlər söyləyir. Qasim deyir: "Ey Əzrəq, bu iztirab oğlanlar fərağindən isə, bu dərdin dərmanı əlimdədir".

İmam Hüseyn (ə) Əzrəqi meydanda gördükdə narahat olur, ona görə ki, Əzrəq böyük pəhləvan idi, Qasim isə gənc, susuz, yorğun və nigaran idi. Odur ki, imam dərhal onun üçün dua etməyə başlayır.

Xülasə, Əzrəq dəfələrlə hücuma keçir, ancaq Qasim onun hücumlarının hamısını bacarıqla dəf edir, aralarında ağır döyüşlər olur, ən nəhayət, Qasim fürsət taparaq Əzrəqə elə bir qılınc zərbəsi endirir ki, o, atından yıxılır. Qasim dərhal düşmənin başını kəsib, atını da yedəyə alaraq əmisinin hüzuruna gəlib deyir:

Ey rikabi-rəxşi-iqbalın hilali-övci-din,
Nəqşi-nə'li-mərkəbin mehrabi-ərbabi-yəqin.
İqtidayi-şər'dir fərmanına olmaq müti',
Əsli-imandır səni bilmək Əmirəlmö'minin[226].

*(Sən ey tale, bəxt atının üzəngisi din ucalığının təzə çıxmış Ayı olan imamım əmi, mindiyin atın nallarının torpağa saldığı*

................................

[226] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.309*





*naxışlar yəqinliyə yetmiş kamil şəxsiyyətlər üçün mehrabdır! Sənin buyuruqlarını yerinə yetirmək sözün gerçək anlamında şəriət yolu ilə getməkdir, səni "Əmirəlmöminin" (möminlərin əmiri – xəlifə, Rəsulullahın vəsisi, vəlisi) bilmək imanın əslidir, əsasıdır).*

"Ey əmi, susuzluq məni həlak etməkdədir, səndən yanğımı söndürməkdən ötrü yalnız bir qətrə su istəyirəm, axı mən susuzluğumu hərdən göz yaşımla, hərdən yaralarımdan axan qan çeşmələrilə, hərdən də düşmən qılınclarındakı nəmliklə yatırmaq istəyirəm. Aya, nə hikmətdir?"

Şahidi-zövqi-tələb rüxsarinə, ey çərxi-dun,
Bitəvəqqüf pərdeyi-fövtü fəna çəkmək nədir?
Bir içim su vermədən təşnəcigərlər qəsdinə,
Xəncəri-bidadü şəmşiri-cəfa çəkmək nədir?[227]

*(Ey alçaq çərxi-fələk, durmadan haqq-həqiqət zövqünü dadan gözəllərin, yəni mənəvi-əxlaqi baxımdan yetkin şəxslərin üzünə itkinlik və heçlik pərdəsi çəkməyinə nə ad verək? Cigərləri susuzluqdan yananlara bir içim su vermədən onların üstünə zülm xəncəri və əzab-əziyyət qılıncı çəkməyinə nə ad verək?).*

İmam Hüseyn (ə) Qasimə şəhadət şərbətinin müjdəsi ilə təsəlli verib dedi: "Ey Qasim, bir dəxi dövləti-didar qənimətdir, hərəmsərayə varıb, Əhli-beyt ilə rəsmi-müvadəə tazə qıl" *(Ey Qasim, bir daha görüş qisməti qənimətdir, odur ki, xeymələrə gedib Peyğəmbər xanədanının qız-gəlini ilə yenidən vidalaş).*

Qasim Əhli-beytin yanına gedir, bu zaman ərus otağından çıxır, Qasimin ayağından öpməklə şərafətə qovuşaraq növhələr oxuyur, Qasim də ona təsəlli verib, yenidən meydana qayıdır, ancaq ürəyinin dərinliyində məhəbbət alovu gurlaşdığından deyir:

.................................

[227] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.309*





Nədir, ey çərxi-zalim, yarı yarindən cüda qılmaq,
Murad əhlin əsiri-dami-bidadü bəla qılmaq?!
Çü lazımdır sənə qılmaq cüda hər yarı yarindən,
Çəküb zəhmət nə lazım bir-biriylə aşina qılmaq?![228]

*(Ey zalim çərxi-fələk, sevgilini sevgilisindən ayrı salmağın hikməti nədir? İstəkliləri zülmə və bəla toruna salmaq səndə nə adətdir axı? Hər sevgilini sevgilisindən ayırmaq sənə gərəkdirsə, bəs onda niyə zəhmət çəkib onları bir-birinə sevdirdin?).*

Əsərin bu bölümü ilə bağlı önə çıxan cəhətləri belə ümumiləşdirmək olar:

**1.** Həzinliklə döyüşkənliyin növbələşməsi. Bu hal cənab Qasimin düşdüyü vəziyyətlərdə, həm də digər surətlərin keçirdikləri hiss və həyəcanlarda özünü göstərir. Füzuli bu bölümün baş qəhrəmanı olan cənab Qasimi bir-birindən yüyrək və çevik olan vəziyyətlərdə göstərir. Bu vəziyyətlərin hər birində qəhrəmanın yeni-yeni duyğu və düşüncələri açılır; belə ki, başlanğıcda surətin hərbi bacarığından danışan rəcəzi önə çıxırsa, bölümün davamında bu rəcəzdə sözlə deyilənlərin əməldə, işdə təzahürü əks etdirilir. Yaxud başlanğıcda surətin həzin məhəbbət hissləri lirik planda verildiyi halda, bölümün davamında bu hisslər Füzuli qələminin ecazkar boyaları ilə özünün zirvə nöqtəsinə çatdırılır.

Bütün bu bədii cizgilər mahiyyətcə folklor-danışıq üslubunun klassik-kitab üslubuna pərçim olması nəticəsində baş tutmuş və beləliklə də şairə çeşidli yaradıcılıq istəklərini ustalıqla ifadə etməyə imkan vermişdir. Odur ki, əsərin bu hissəsi cənab Qasimi Dədə Qorqudun və Koroğlunun yeniyetmə igidləri kimi duyub qavramağa yol açır.

Bölümün ideya-bədii xüsusiyyətlərinin önəmli bir qismi oradakı şeir parçalarında əksini tapdığı üçün onların üzərində dayanmaq qaçılmazdır.

.................................

[228] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.309*





Füzuli öz qəhrəmanının həzinliklə döyüşkənliyini növbələşdirməkdən ötrü poetik deyimlərə ilk növbədə mənsub olduğu xalqın arxetipi – milli-mənəvi dəyərlərinin toplusu olan xəlqi-mədəni yaddaşının daşıyıcısı kimi müraciət etmişdir ki, o, bu yolla orta əsr azərbaycanlısının dünyaduyumu və dünyagörüşü ilə bağlı başlıca əlamətləri həm bir daha zehinlərdə canlandırmağa müvəffəq olmuş, həm də gələcək nəsillərə ötürüləcək əski və dolğun bilgilərin həmişəyaşarılığını təmin etməyi bacarmışdır. Örnək olaraq cənab Qasimin rəcəzini götürək. Cənab Qasim düşmən qoşununun ön səfləri önündə şəstlə belə deyir: "Mənəm güli-çəməni-sidq Qasimi-bin Həsən" *(Sədaqət çəməninin qızılgülü olan Həsən oğlu Qasim mənəm!).*

Bəlkə bölümün qızğın döyüşkənliyi içərisində alt qatda qaldığından diqqəti çəkməyən "güli-çəməni-sidq" *(sədaqət çəməninin qızılgülü)* tərkibi ifadə etdiyi həzinliyi bir o qədər də büruzə vermir, ancaq rəcəzin belə həzin lirika ilə başlaması ötəri səciyyə daşıya bilərdimi?

Hər şeydən öncə, unutmayaq ki, bu bölümün qəhrəmanı bığ yeri yenicə tərləmiş bir yeniyetmədir. Özü də o, bəşəriyyətin ən say-seçmə bir nəslinə mənsubdur. Başqa sözlə, Qasim haqqında "sədaqət çəməninin qızılgülü" tərkibini görən diqqətli və məlumatlı oxucu istər-istəməz Peyğəmbərimizin (s) olduqca gözəl və dünyadan çox tez gedən atası Abdullahın misilsiz gözəlliyini anacaqdır. Məgər Ulu Yaradan buyurmurmu ki, "O, var edən, gözəl yaradan, yaratdığına şəkil verən Allahdır" *("Həşr", 24),* yaxud: "Sizə surət verdi və surətlərinizi gözəl yaratdı" *("Təğabun", 3)* və s.

Digər tərəfdən, xatırlamamaq olmur ki, elə "Hədiqətü-s-süəda"nın ilk bölümlərində Füzuli cənab Qasimin atası İmam Həsənin (ə) də zahiri görkəmi ilə mənəvi-əxlaqi bütövlüyünün vəhdət təşkil etməsini sevə-sevə tərənnüm edirdi. Məsələn:

Məhi-gərduni-iffətü ismət
Həm "Həsən"namü həm həsənsiyrət!





*(O, namus və paklıq fəzasının ayıdır – həm adı Həsəndir (gözəldir), həm də mənəvi aləmi büsbütün gözəlliklər qaynağıdır!).*

**2. Kəskin və kəsərli mükalimələr.** Dialoq bir üsul kimi personajların ruhi-psixoloji və mənəvi-əxlaqi keyfiyyətlərinin açılmasında həmişə aparıcı və həlledici rol oynamışdır. Adətən, klassik ədəbiyyatda bu üsulun işlək və çevik olmadığı təsəvvürü yayılmışdır, ancaq Füzuli lirikasına göz gəzdirdikdə dialoqların tez-tez üz tutulan ədəbi priyom olduğu ortaya çıxır; məs.:

Dedim: Kimdir pərişan eyləyən aşiqlər əhvalin?
Səba göstərdi tari-sünbüli-zülfün ki, "bu eylər!"

Məşhur "Dedim-dedi" müsəddəsi özünün dialoq üzərində qurulan lirikası ilə dillərə düşmüşdü. "Hədiqətü-s-süəda" da nəsrlə nəzmin növbələşməsi üzərində qurulduğundan, epik janrın və prozaik üslubun qaçılmaz tələblərinə görə, bu əsərdə mükalimələr mənfi və müsbət surətlərin dilinə ayrıca bir şirinlik gətirir, oxucunun diqqətinin hadisə və əhvalatların mahiyyətinə çəkilməsinə yol açır. Odur ki, rəcəzdən dərhal sonra "Qasim düşmən qoşununa həmlə edib, ordunun ortasına kimi irəliləyərək Ömər bin Sədlə üz-üzə gəlir və uca səslə nərə çəkib deyir ki, bu qədər mömini şəhid etdiniz, bağışlanma diləyib, bu əməldən peşman olmaq çağı çatmadımı?" cümləsi qəhrəmanın sözlərini havada asılı qoymur, əksinə, həmin sözlərə bir kəskinlik verir, bir kəsər qazandırır; bu yerdə oxucunun yaddaşında canlanan Ömər bin Sədlə bağlı bir qədər yuxarıda verilmiş təsvirlər köməyə gələrək, qəhrəmanın tərəfi-müqabilinin necə bir murdar və idbar tip olmasına dair aydın anlayış yaradır və bu yolla Kərbəla vaqeəsini törədən ictimai-siyasi fiqurlar barəsində sənətkarın qətiyyətli müəllif mövqeyi bir daha ortaya çıxır.

Cənab Qasim–Ömər bin Səd dialoqunu şərtləndirən başqa bir xüsusiyyət onların arasında cərəyan edən söz döyüşünün



dinlə küfrün, haqla batilin simvoluna çevrilməsidir. Adama elə gəlir ki, Ömər bin Səd cənab Qasimin kəskin və kəsərli məntiqi qarşısında susub başını aşağı salacaqdır, ancaq onun "Bəs vaxt çatmadımı ki, siz bu tüğyanı dərk edib Yezidin beyətini qəbul edəsiniz?" şəklindəki cavabı qəhrəmanın tərəfi-müqabilinin necə də ağasına müti və başının bağlı olduğu idarə üsuluna kölə olduğunu göstərir.

Bununla belə, Füzulinin qəhrəmanı mənfur düşmən sərkərdəsinin önündə qətiyyən dil acizliyi keçirmədən ona olduqca dürüst və sərrast bir cavab verir: "Ey azğın, tüğyan budur ki, bütün yaranmışlara mübah ola-ola Fəratın suyunu Əhli-beytin üzünə bağlayasan?! Bəs qiyamət səhrasının atəşi yadına düşməzmi və qorxu, xəbərdarlıqlar vədəsi daş qəlbinə təsir etməzmi?!"

Göründüyü üzrə, cənab Qasim burada cavabını Ömər bin Sədin öncəki cümləsində işlətdiyi "tüğyan" sözünə verdiyi islami açıqlama üzərində qurur; buradan belə anlaşılır ki, eyni bir məfhuma – "tüğyan" anlayışına tərəflərin baxışları daban-dabana ziddir, çünki Ömər bin Sədin gözündə "tüğyan" hakimi-mütləq sandığı Yezidin qeyri-qanuni hakimiyyətinə qarşı çıxmaqdırsa, cənab Qasimin gözündə bu söz Peyğəmbər xanədanının Qurani-Kərimdə təsdiqini tapmış sadə insani haqq və hüquqlarını belə tapdalamaq, ayaqlamaqdır.

Araşdırılan bölümün maraqla oxunan mükalimələrindən biri də iki düşmən tipinin öz aralarındakı söz-söhbətidir. Belə ki, hər tərəfdən ox atmaqla üstünə seltək yeriyən qoşundan zərrəcə qorxub çəkinmədiyini görən Ömər bin Səd Şam bölüyünün başçısına – Əzrəq Şamiyə kinayə ilə "Sən Yezidin xüsusi rəğbətini qazanmış bir pəhləvansan; bəs niyə irəli çıxıb bu döyüşçünün şərrini başımızdan uzaqlaşdırmırsan?" deyir. Ancaq murdarlıq və idbarlıq etibarilə Ömər bin Səddən əsla geri qalmayan Əzrəq Şami elə ilk sözlərindəcə ağzını açar-açmaz mənfur xislətini büruzə verir. O, "Ərəblər məni min döyüşçüyə tay tuturlar, mənə yaraşmaz ki, bir uşağın cənginə gedib adımı bədnam edəm!" – deyə cavab verir.





İki düşmən tipinin mükaliməsi davam etdikcə onların arasındakı söz deyişməsi son nəticədə qəhrəmanın əzəmətinin çatdırılmasına yönəlir ki, bu da igidin qarşı tərəfin dili ilə öyülməsi kimi bəlli bir üsuldan ibarət olan bir bədii vasitənin bölümdəki başqa bir təzahür formasıdır. Belə olmasaydı, Ömər bin Səd Əzrəq Şamiyə "Ey nadan, bu cavan Peyğəmbərin və Əlinin nəvəsidir, Həsənin oğludur, susuz olmasaydı, bu qədər qoşunla vuruşmağı o, özünə ar bilərdi" deməzdi.

Yaxud belə olmasaydı, Füzuli qəhrəmanını düşməninin – Ömər bin Sədin dilindən verdiyi şeirlə sanki özü öyürmüşcəsinə mədh etməzdi; belə ki, Ömər bin Səd şeirlə dediyini obrazlı biçimdə bədii nəsrlə birbaşa olaraq da deyir: "Doğrudan da yer və göy əhli təkbətək bunun önündə duruş gətirə bilməz!"

Bölümün mükalimə baxımından diqqəti çəkən özgə bir cəhəti dialoqlarda sarkazma da yer verilməsidir. Məsələn, dörd oğlunu gözünün qabağındaca igidliklə bir-bir məğlub edib öldürən cənab Qasim Əzrəq Şaminin söyüş söydüyünü gördükdə ona "Ey Əzrəq, bu iztirab oğlanlar fərağindən isə, bu dərdin dərmanı əlimdədir" deyir, yəni övladlarının həsrətini çəkdiyinə görə qəzəblənib narahat olursansa, darıxma, səni də tezliklə onların yanına – cəhənnəmə göndərmək mənim üçün su içmək kimi bir şeydir.

**3. Su motivi.** Bəllidir ki, İslamiyyətə "su mədəniyyəti" deyirlər, çünki su özü pak olduğu kimi, həm də paklayıcıdır. Ulu Yaradan da Şanlı Kitabında "Biz hər bir canlını sudan yaratdıq; yenə də mi inanmayacaqlar?!" *("Ənbiya", 30),* "Allahın ərşi öncə su üzərində idi" *("Hud", 7)* buyurur. Bu gün mütəxəssislər Yer kürəsinin 71,12 faizinin sudan, 28,88 faizinin isə qurudan ibarət olduğunu hesablamışlar. Ərəb alimi Əbdürrəzzaq Novfəl Qurani-Kərimdə bu nisbətə işarə olunduğunu söyləyir. O deyir ki, Müqəddəs Kitabımızda "dəniz, göl, çay" anlamlarına gələn "bəhr" sözü 32 dəfə, "quru, çöl, səhra" anlamlarına gələn "birr" sözü isə 13 dəfə işlənmişdir ki, 32 ilə 13-ün cəmi 45 edir; 32-nin – suyun Yer kürəsindəki miqdarının ölçüsü 71,12-yə, 13-ün – qurunun Yer



kürəsindəki miqdarının ölçüsü 28,88-ə bərabərdir; göründüyü kimi, bu, Qurani-Kərimin ayrı-ayrı söz və deyimlərlə bizə çatdırdığı minlərcə möcüzədən yalnız biridir.

Suyun Kərbəla vaqeəsindəki yerinə gəlincə, hər cür təfərrüat və təfsilatdan sərf-nəzər edərək yalnız bunu demək kifayətdir ki, Ulu Yaradan Şanlı Kitabında Öz ərşinin su üzərində qərar tapmasını "Hansınızın daha yaxşı işlər görməsini sınamaq üçün" *("Hud", 7)* şərtinə bağladığı kimi, İmam Hüseyn hərəkatının da məğzini bəşəriyyətin üzə çıxara bilməsi üçün su amilini Aşura gününün mayasında qərar vermiş, dost və düşmən üçün məhz onun nemətmi, yoxsa niqmətmi (bədbəxtlik) olacağını insanların özlərinin seçməsini istəmişdir.

Araşdırılan parçanı bu bilgilərin işığında gözdən keçirdikcə suyun bu bölümdə həm bilgi, həm predmet, həm məfhum, həm də motiv yerində dedikcə çoxqatlı və çoxşaxəli bir ruhi-psixoloji, bədii-estetik mənzərəyə malik olduğu anlaşılır. Belə ki, bölümün başlanğıcında "Bütün yaranmışlara mübah (halal) olan suyun – Fərat çayının Peyğəmbər xanədanının üzünə bağlanması" "tüğyan" (Allaha qarşı üsyan və azğınlıq) əlaməti kimi səciyyələndirilirsə, ortasında sırf bioloji anlamda – həyatverici faktor yerində qavradılır (Xatırla: Ömər bin Səd Qasim haqda Əzrəq Şamiyə deyir: "Əgər susuz olmasaydı, bu qədər qoşunla vuruşmağı o, özünə ar bilərdi").

Yaxud: Füzuli təsvir edir ki, İmam Hüseyn (ə) Əzrəqi meydanda gördükdə narahat olur; onun bu narahatlığını şərtləndirən amillər sırasında gənclik, yorğunluq və nigarançılıqla yanaşı, susuzluq da vardır ki, öncəki təhkiyə fonunda bu faktor da aparıcı bədii fiqur təsiri bağışlayır. Ancaq bölümün su ilə bağlı ən qabarıq yeri qəhrəmanın Əzrəq Şamini öldürdükdən sonra əmisindən yana-yana su istəməsidir: "Ey əmi, susuzluq məni həlak etməkdədir, mən səndən yanğımı söndürməkdən ötrü yalnız bir qətrə su istəyirəm. Axı mən susuzluğumu hərdən göz yaşımla, hərdən yaralarımdan axan qan çeşmələrilə, hərdən də düşmən qılınclarındakı nəmliklə yatırmaq istəyirəm. Aya, nə hikmətdir?"





Göründüyü kimi, qəhrəmanın nitqi büsbütün "su" üzərində qurulmuşdur. Belə ki, su burada həm bioloji məfhum, həm hərbi bacarıqla bağlı anlayış, həm ən yaxın adama arxalanma, güvənmə əlaməti, həm adi bir predmet, həm də zəruri həyati tələbat kimi ən müxtəlif ruhi-psixoloji məqamlarda olub, göz yaşı, qan və nəmlik anlamları ilə üzvi qovuşuqluqda dolğun və tutumlu bir motivə çevrilmişdir .

Parçanı işləyən şeirsə cənab Qasiminmi, İmam Hüseyninmi (ə), müəllifinmi dilindən olmasından asılı olmayaraq, Kərbəla vaqeəsini törədən hakim dairəyə, mənfur idarə üsuluna olduqca sərt və yanıqlı bir etiraz kimi səslənir. Şeirin leksikonu ("çərxi-dun" *(alçaq, aşağı fələk),* "pərdeyi-fövtü fəna" *(yoxluq və heçlik pərdəsi),* "bir içim su verməmək", "xəncəri-bidadü şəmşiri-cəfa" *(zülm xəncəri ilə əzab-əziyyət qılıncı))* bunu aydın göstərməkdədir.

**4. Dini-mənqəbəvi anlayışların İmam Hüseyn (ə) hərəkatının və Kərbəla vaqeəsinin bədii-estetik dərkinə yönəldilməsi.** "Hədiqətü-s-süəda" sırf dini əsər – təbdil, yaxud orijinal olmasından asılı olmayaraq, məqtəl olduğundan etiqadi, ibadi və əxlaqi anlayışların, eləcə də islami mənqəbələrin orada çeşidli fikri-bədii incəliklərlə əksini tapması bütünlüklə təbii haldır. Odur ki, bu halı burada ayrıca araşdırmağa eytiyac yoxdur. Ancaq dini-mənqəbəvi anlayışların əsərdə İmam Hüseyn (ə) hərəkatı və Kərbəla vaqeəsi yönündə problemin bədii-estetik həlli və qoyuluşu baxımından işlənmə məqamlarının öyrənilməsi özlüyində çox önəmlidir. Ona görə ki, bu, birincisi, Füzuli dünyagörüşünün substansiyasına dair aydın təsəvvür qazandırar, ikincisi, orta əsr anadilli yazılı abidələrimizin mövzu, məzmun və məfkurə xüsusiyyətlərini üzə çıxarar, üçüncüsü, dövrün ideoloji mənzərəsini göstərər, dördüncüsü də, qədim azərbaycanlının milli-mənəvi kimliyi haqqında qəti anlayış yaradar.

Bölümdə gözə dəyən ilk islami məfhum"kəfən"dir; hər bir müsəlmanın yeganə axirət paltarı olan bu predmet burada sırf şəhidlik məzmunu alaraq, yalnız igidlik, qorxmazlıq,



əqidə dönməzliyi yönündə işlədilmişdir. Onun at, qılınc, meydan, şəhidlik eşqi, meydanda cövlanetmə və rəcəzoxuma ilə birlikdə verilməsi məhz bunun əlamətidir. Bu isə kəfəni ailə-məişət aktı olmaqdan çıxarıb ictimai səciyyəli islami anlayışa çevirdiyindən şairin bədii-estetik qayəsinə xidmətdə yaradıcılıq baxımından ustalıqla edilmiş bir ədəbi gedişdir.

Bölümdə nəzərə çarpan ikinci islami məfhum "nəzir"dir. Anlayış dinimizdə geniş yer tutur. Belə ki, o, Quran leksikonundada var *("Bəqərə", 170).* Əsərdə qəhrəmanın dilindən işlənən bu anlayış da fədakarlıq məzmunu aldığından sənətin, sənətkarlığın dindən bacarıqla yararlanması işinin komponenti kimi önə çıxmışdır. Özü də deyilən bu nəzir birbaşa bir ulu din böyüyünə aid edildiyindən yenidən elə dinə, islami dəyərlərə qaytarılır ki, bu isə Füzuli ustalığının nadir hallarda rast gəlinən özümlü örnəklərindən biridir.

Bölümdə qəhrəmanın özünü "müqimi-kuyi-vəfa" *(vəfalılıq məhəlləsinin həmişə hazır döyüşçüsü)* adlandırması əhdə sadiqliyin islami tərəfini də assosiativ olaraq təsəvvürdə canlandırır. Bu anlayış Müqəddəs Kitabımızda dedikcə çoxqatlı biçimdə əksini tapmaqdadır *("Bəqərə", 177; "Nəhl", 90-95).*

Kərbəla vaqeəsindən danışan məqtəllərdə əhdə sadiqlik ayrıca bir motivə çevrilməkdədir. Belə ki, Aşura günü ilə bağlı belə bir mənqəbə məşhurdur: İmam Hüseyn (ə) Tasuada öz yoldaşları haqqında buyurmuşdur: "Mən səhabələr içərisində öz səhabələrimdən də vəfalı və xeyirli olanlarını tanımıram".

Deyilənə görə, bəni-Haşimdən ilk şəhid olan İmam Hüseynin (ə) oğlu Əli Əkbər idi ki, bu da vəfanın nümunəsidir. Deyirlər ki, imamın vəfalı səhabələrindən biri "İcazə verin sizi qoruyum, siz də namaz qılasınız!" – deyə təklif edir. Ona 13 ox dəyir. İmam namazını bitirdikdə onu yerə yıxılmış görür. O, bu zaman imamdan soruşur: "Mən vəfalı oldummu?" O ulu din böyüyü belə cavab verir: "Bəli, sən cənnətdə mütləq mənim qarşımda olacaqsan!"





"Mütiyi-əmri-Həsən, talibi-rizayi-Hüseyn" misrası isə cənab Qasimin timsalında imamlara təqlidin ifadəsi kimi səsləndiyindən Füzulinin də mənsub olduğu şiə məzhəbində təqlid anlayışının önəminə və imamlar arasında yersiz fərqqoymanın zərərinə dair yığcam, ancaq kifayət qədər açıq işarə təsiri bağışlayır. Bu işarə Rəsulullaha (s) "tabe olma və tabeyun" anlayışlarına söykəndiyindən bir qədər də möhkəm islami məzmun almış olur. "Mənim bu iki nəvəmin ikisi də imamdır; istər evdə otursunlar, istərsə də qiyam etsinlər!" hədisi Rəsulullahın (s) həmişəyaşar tövsiyəsi kimi misraya, deməli, qəhrəmana dönməz bir islami xislət verir.

Bölümdə Ömər bin Sədin Yezidlə bağlı işlətdiyi "beyət" sözü də, əslində, geniş bir islami məfhumdur. Hüdeybiyyə sülhü və Məkkənin fəthi ilə bağlı Rəsulullahın (s) ictimai-dini rəhbərliyini qəbul və təsdiq etmək anlamına gələn bu anlayış, prinsipcə, vaxt ötdükcə dəyişdirilmiş, özünün həqiqi mahiyyətindən uzaqlaşdırılaraq hakimiyyəti zorla əldə saxlamaq alətinə çevrilmişdir.

Bu anlayışın Kərbəla vaqeəsindəki yerinə gəlincə, hər iki tərəf beyətə özünün dünyagörüşü çərçivəsində yanaşmış, ona bağlı olduqları məfkurənin mənasını yükləmişlər. Kərbəla vaqeəsinin baş verməsinin başlıca səbəblərindən birini də məhz İmam Hüseynin (ə) bir şəxsiyyət kimi Yezid idarə üsulunu qəbul etməyib tanımaması və onu kökündən yanlış sayması təşkil edir. Odur ki, bölümün mənfi personajının dilində "beyət" sözünü görən oxucu istər-istəməz bu təfərrüatı xatırlayacağından anlayışla bağlı bütün mahiyyət onun gözləri önündə canlanacaqdır ki, Füzulinin də bir müəllif kimi qarşısına qoyduğu yaradıcılıq istəklərindən biri elə budur.

Bəllidir ki, dinimizin üzərində qurulduğu mühüm prinsiplərdən biri də xəbərdarlıq prinsipidir. **"İnsanların haqq-hesaba çəkilmə vaxtları yaxınlaşdı, ancaq onlar hələ də qəflət içərisində (haqdan) üz çevirirlər!"** *("Ənbiya", 1)* səpkili neçə-neçə Quran müddəası və qənaətləri, "Siz özünüz necəsinizsə, sizi idarə edənlər də elə olacaqdır!" hədisi tək



Peyğəmbər (s) səciyyələndirmələri xəbərdarlıq məfhumunun islami mahiyyətinin dedikcə geniş olduğunu göstərir. Bütün bunlar qəhrəmanın qarşı tərəfə yönəltdiyi "Qorxu, xəbərdarlıq vədəsi daş qəlbinə təsir etməzmi? xitabı ilə qırılmaz bağlılıqda əsərə yön verəcək qədər bir ideya səviyyəsinə yüksəlmiş olur.

Yeri gəlmişkən deyək ki, bu xitabda dinimizdə ayrıca yeri olan qəlb qatılığı məsələsinə də toxunulmuşdur. Ulu Yaradan Şanlı Kitabında istəkli Peyğəmbərinə (s) belə buyurur: "(Ya Rəsulum!) Allahın mərhəməti səbəbinə sən onlarla (döyüşdən qaçıb sonra yanına qayıdanlarla) yumşaq rəftar etdin. Əgər qaba, sərt ürəkli olsaydın, əlbəttə, onlar sənin ətrafından dağılıb gedərdilər. Artıq sən onları əfv et, onlar üçün (Allahdan) bağışlanmaq dilə, işdə onlarla məsləhətləş, qəti qərara gəldikdə isə Allaha təvəkkül et! Həqiqətən, Allah (Ona) təvəkkül edənləri sevər!" *("Ali-İmran", 159)*. Mehriban olan Rəbbimiz Müqəddəs Kitabımızın bir başqa yerində qəlb qatılığı məsələsini dedikcə gerçək, real və inandırıcı bir bənzətmə ilə biz günahkar bəndələrinə qavradır: "Bundan (bu əhvalatdan) sonra qəlbləriniz yenə sərtləşərək daş kimi, bəlkə daha da qatı oldu. Həqiqətən, bəzi daşların içərisindən nəhrlər axar, bəzisi yarılıb içindən su fışqırar və bəzisi də Allahın qorxusundan (uca yerlərdən, dağdan) yuvarlanıb düşər. Allah sizin etdiklərinizdən, əlbəttə, qafil deyildir!" *("Bəqərə", 74).*

Rəsulullah (s) Əliyyən Vəliyullaha (ə) xitabən söylədiyi tövsiyələrdə də qəlb qatılığından tez-tez söz açmış, bu mənfi keyfiyyətin fərdi və ictimai eybəcərliyini bütün aydınlığı və genişliyi ilə açıb göstərmişdir.

Onu da qeyd edək ki, Ömər bin Səd bir personaj kimi mürəkkəb surətdir; belə ki, fundamental və monumental bir roman təsiri bağışlayan "Hədiqətü-s-süəda"nın müxtəlif yerlərində bu ad hərdən quruca çəkildiyi halda, çox vaxt Ömər bin Səd birbaşa hadisə və əhvalatların içində olur, bu, yaxud başqa ölçüdə prosesləri yönləndirir və beləliklə də əksər hallarda özünün mənfur xislətini ortaya qoymuş olur. Qəlb qatılığının islami səciyyələndirmə yönündə qazandığı bir çox



çalarlar məhz onun mürəkkəb daxili dünyası, qarmaqarışıq psixoloji durumu üzərində açılıb göstərilir. Məs.: Böyük oğlu Ömər bin Sədə deyir:

At ölür, don yırtılır, Rey mülkü eylər intiqal,
Leyk ta Məhşər qalır baqi vəbali-infial[229].

*(Ay ata, mindiyin at da, geydiyin libas da, tamahı ilə Peyğəmbər nəvəsinin əleyhinə getdiyin Rey vilayəti də ötəridir, keçəridir, ancaq xəcalət günahı Qiyamətədək həmişəlik olaraq qalacaq, yəni səni rüsvay edəcək).*

Yaxud Ömər bin Səd Kərbəlaya yola düşməyə hazırlaşanda bacısı oğlu Həmzə ibn Müğeyrə ona ciddi xəbərdarlıq edir, axirətlə bağlı bu xəbərdarlığı təsdiq etməsinə baxmayaraq, Ömər bin Səd bacısı oğlunun sözlərindən bir qədər mütəəssir olursa da, çox keçmir ki, rəyasət və mənsəb sevdası gözlərini tutur və o, Kərbəlaya yollanır[230].

"Hədiqətü-s-süəda" isə bilavasitə İmam Hüseynlə (ə) bağlı belə fədakarlıq örnəkləri ilə doludur. Əsərin bir yerində oxuyuruq: "Yol əsnasında həzrət imam bir kürsü üstünə çıxıb, həmdü sənadan sonra orduya müraciət edərək buyurdu: "Ey əziz əshablar və ey burada cəm olanlar! Mən müsibət səhrasının səyyahıyam, mən möhnət biyabanının müsafiriyəm. Mən qəriblər asimanının ulduzuyam, mən şəhadət yolunun salikiyəm. Mənim xəyalıma dünya ləzzəti gəlməz. Söhbətim hiylədən uzaqdır. Mənim qəlbimdə Haqqın ülfəti var. Heç kəsi dünya nemətləri müjdəsilə öz tərəfimə çəkmərəm və mənsəbə yüksəlmək naminə heç kəsə sığınmaram. Bayrağım altında səltənət sevinci təmənnasında olanlar mənim ülfətimdən əl çəksinlər"[231].

Zümeyr ibn Qeys Nəhayi bu sözləri eşitdikdə imamın təklifinə belə cavab verir:

---

[229] *Füzuli. Kərbəla vaqiəsi, səh. 69*
[230] *Yenə orada, səh. 70*
[231] *Füzuli. Kərbəla vaqiəsi, səh. 56-57*





Gəldi ol dəm ki, qılam canımı cananə fəda,
Eyləyim ərzi-məhəbbət, qılam izhari-vəfa![232]

Atasının İmam Hüseynin (ə) elçisi kimi getdiyi Kufədə şəhid edildiyini eşidən Müslüm ibn Əqilin qızının cavabı da bu səpkidədir:

Zillət ilə ləzzəti olmaz həyatin, dustlər,
Nəqdi-can sərf eyləyib dünyada kam almaq gərək.
Əcz ilə dönmək ədudən səhldir, himmət dutub
Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək.

Dini-mənqəbəvi anlayışların bölümdə İmam Hüseyn hərəkatının və Kərbəla vaqeəsinin bədii-estetik dərki yönündə işlədilməsi baxımından, ən nəhayət, belə bir cəhətə də toxunaq ki, Qasimin əmisinə müraciətlə dediyi şeirdə "şəriət" və "iman" məfhumları sırf şiəlik məfkurəsinin daşıyıcıları kimi verilmişdir. Belə ki, qəhrəmanın əmisinin buyuruqlarını yerinə yetirməyi şəriət yolu ilə getmək və onu yeganə Peyğəmbər nümayəndəsi – qanuni xəlifə hesab etməyi imanın əsası bilmək kimi səciyyələndirməsi şiəliyin şəriət, iman məfhumlarına yüklənməsi siqlətindən soraq verir. Bəs bu siqlət özünü nədə göstərir? Təfərrüata varmadan təkcə onu demək kifayətdir ki, başqa haqq məzhəblərdən fərqli olaraq, şiəlik şəriətə və imana statik, durğun və ölgün ənənə kimi baxmaqdan çox uzaq olub, yaşarı, canlı, diri və duru İslamın məğzindən irəli gələn hal kimi bu anlayışları həyatın, yaşayışın ən məhrəmanə nöqtələri ilə bağlayır, ən gözlənilməz məqamlarda ortaya çıxa biləcək ailə-məişət aktlarından tutmuş ta ictimai-iqtisadi dəyişikliklərədək bütün mərhələlər üçün bu kateqoriyaların konkret hökmlərini hazırlayıb təsbit edir.

Bu deyilənlər dini-mənqəbəvi anlayışların İmam Hüseyn hərəkatı və Kərbəla vaqeəsi yönündə bədii-estetik həllinin və

.................................

[232] *Yenə orada, səh. 58*





qoyuluşunun "Hədiqətü-s-süəda"nın çox uğurlu olduğunu, şairin çeşidli yaradıcılıq istəklərinin ustalıqla ifadəsinə xidmət etdiyini, ən nəhayət, orta əsr azərbaycanlısının dünyaduyumu və dünyagörüşü çərçivəsində milli-mənəvi kimlik amilinə əsaslı surətdə təsir göstərdiyini sübuta yetirir.

* * *

"Hədiqətü-s-süəda"nın cənab Qasim adına bölümünün sonuncu hissəsi belədir: "Xülasə, Qasim min qəmlə meydana getdikdə gözü Übeydullah Ziyadın əlində tutduğu bayrağa sataşdı. O, ordunun orta hissəsinə yönəldi. Piyadalar onu araya aldılar. Qasim onları dəf edərkən Şiş bin Nəhai çiyninə bir zərbə vurub onu atdan saldı. İyirmi yeddi yara aldığından və çox qan itirdiyindən Qasim olduqca zəifləmişdi. Qasim bu zaman "Ya əmmah, ədrikni" *(Ey əmi, özünü mənə yetir)* deyə səsləndi. İmam Hüseyn (ə) Qasimin səsini eşidib, meydana daxil olduqda gördü ki, qardaşı oğlu qanına bulaşmışdır və Şiş bin Rəbii onun başını bədənindən ayırmaq istəyir. İmam bir zərbə ilə onu uzaqlaşdırıb, Qasimi götürərək xeyməgaha gətirdi. Hələ Qasimin həyatından bir an qalmışdı, odur ki, Əhli-beytin üstündə nalə etməsindən bir anlığa gözünü açıb gülümsəyərək cənnətə qovuşdu"[233].

Rəhmət ol əhli-dillərə kim, ixtiyarla
Rəğbət bu kargahi-fənadan götürdülər.
Bel bağlayub təriqi-məhəbbətdə mərdvar,
Hər də'vi etdilərsə, yerinə yetürdilər[234].

*(Öz güclü iradələri hesabına bu puç iş yerindən (dünyadan) rəğbətini kəsməyi bacaran könül ərlərinə rəhmət olsun! Çünki onlar məhəbbət yolunda mərdliklə addım ataraq, irəli sürdükləri bütün iddiaları yerinə yetirmişlər).*

................................

233 *Mətn sadələşdirilmişdir - Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.310*

234 *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.310*





Parçada daha çox diqqəti çəkən cəhət qəhrəmanın düşmən bayrağını hədəf alması və bu yolla qarşı tərəfin əhvali-ruhiyyəsini zəiflətməklə qələbəni yaxınlaşdırmaq əzmidir. Firui-d-dinin on maddəsindən biri olan cihad konsepsiyasının əsl islami dərki bax budur! Çünki Qasimin babası olan Həzrət Əli (ə) özü cihadın canlı və misilsiz timsalına çevrildiyi kimi, bir-birindən mənalı buyuruqları da cihadın islami dərkinin ən parlaq nəzəri əsasını təşkil etməkdədir; bu ulu din böyüyünün xütbə, məktub və hikmətamiz kəlamlar toplusu olan "Nəhcü-l-bəlağə"də oxuyuruq: "Cihad cənnət qapılarından biridir. Allah onu xüsusi bəndələrinin üzünə açmışdır. O, Allahın təqva libasıdır. O, Allahın möhkəm zirehi və etibarlı qalxanıdır. Kim ona rəğbət bəsləməsə, Allah ona zillət libası geyindirər" *("Xütbə", 27);* yaxud: "Cihad dörd hissədən ibarətdir: yaxşılıqlara həvəsləndirmək, pisliklərdən çəkindirmək, vətənə sadiq olmaq, fasiqlərlə düşmənlik etmək" *("Xütbə", 31).*

Yuxarıda Füzulinin öz qəhrəmanının yüksək döyüş bacarığını necə saygı ilə təsvir etdiyini nəzərə alsaq, bunun şairin üzərində ardıcıllıqla durduğu ədəbi qayə olmasına var gücümüzlə inanarıq. Ancaq bölümün sonuncu şeirində Qasimin cəmdə "əhli-dil" *(könül əhli)* adlandırılması Füzulinin gözündə məsələnin əsla döyüş texnikası ilə məhdudlaşmadığını, əksinə, şairin qəhrəmanına bir övliya kimi baxdığını göstərir, odur ki, sənətkarın şeirdə Qasimə və onun kimi igidlərə söylədiyi "rəhmət" "eşq olsun, yaşasın!" kimi başa düşülməklə yanaşı, "Tanrının şəfqət, inayət, mərhəmət və məğfirəti əzəli-əbədi olaraq onun halına şamil olsun!" kimi də qavranılır. Bölümün bu yerini fərqləndirən bir başqa cəhət tarixilikdir; belə ki, Füzuli burada bir sıra bilgi və dəlilləri bilərəkdən qabartmışdır. Məs.: bu kiçik parçada Übeydullah Ziyad kimi kifayət qədər yüksək rütbəli Yezid sərkərdəsinin, yaxud Şiş bin Nəhai və Şiş bin Rəbii kimi düşmən əsgərlərinin adları çəkilir və ya Qasimin 27 yara alması ayrıca vurğulanır və yaxud qəhrəmanın son nəfəsdə Peyğəmbər xanədanının gözləri qarşısında gülümsəyərək,



yəni özünün dünyəvi və üxrəvi xoşbəxtliyini bütün aydınlığı və genişliyi ilə dərk edərək vəfat etməsi nəzərə çarpdırılır.

Beləliklə, aydın olur ki, "Hədiqətü-s-süəda"nın hər yerində olduğu kimi, bu bölümündə də Füzuli İmam Hüseyn hərəkatının və Kərbəla vaqeəsinin dini-fəlsəfi və mənəvi-əxlaqi qatlarını açmağı başlıca yaradıcılıq qayəsi saymış və bunun öhdəsindən uğurla gəlmişdir. Belə yüksək bədii-estetik amala nail olmaqdan ötrü o, mümkün olan bütün bədii ifadə vasitələrindən, ədəbi fiqurlardan, obrazlı deyim tərzindən gen-bol yararlanmış, nəsrin təsvir imkanları ilə şeirin tərənnüm potensialını ustalıqla qovuşdurmuş, ailə-məişət səhnələri ilə döyüş səhnələrinin üzvi vəhdətini yaratmış, surətlərin daxili aləmini açmağa xidmət edən gözlənilməz prozaik və poetik elementləri eyni bir qayə ətrafında və vahid bir müstəvidə bir araya gətirmiş, ən nəhayət, təkcə böyüklərin yox, uşaq və yeniyetmələrin də zövqünü oxşaya biləcək parlaq bir sənət örnəyi ortaya qoymuşdur.





# ƏLƏMDARIN MİN BİR ƏLƏMİ

Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının ən aparıcı simalarından biri, heç şübhəsiz, Həzrət Abbasdır. Yaxın və Orta Şərq xalqlarının çoxunda onunla bağlı köklü, dərin inam və yozmalar var. Bu isə Həzrət Abbas fenomeninin miqyas genişliyindən soraq verir. Məsələn, bu sətirlərin müəllifinin böyüyüb boya-başa çatdığı Bakının Hövsan kəndində, eləcə də digər Bakı kəndlərində hələ də yaşarı olan belə bir inam vardır ki, haqsızlığa uğrayan bir kimsə Həzrət Abbasa ərizə yazıb onu Xəzər dənizinə atsa, bu ulu din böyüyü mütləq onun imdadına yetişər, üzləşdiyi çətinlik tezliklə aradan qalxar. Yurdumuzun dəniz olmayan bölgələrində isə Xəzəri su quyusu əvəz edir.

Həzrət Abbasın (ə) əsərdə boy göstərən obrazını lazımınca görməkdən ötrü onun haqqındakı nəqli dəlillərə göz gəzdirmək yerinə düşərdi.

* * *

Hər hansı bir şəxsiyyətə İslam dininin necə yanaşdığını bilmək üçün üç mərhələ – ilkin mənbələr, prinsip və müddəaların seçdiyi tarixi yol, bir də onlara müasir baxış mərhələləri nəzərə alınmalıdır. Bu baxımdan Qurani-Kərimin cihad və şəhidliklə bağlı buyuruqlarının çoxu Həzrət Abbasa da aiddir. Məs.: “Biz həddindən artıq və insanlara fayda verən dəmiri də icad etdik (mədənlərdən çıxartdıq) ki, Allah Özünü görmədən Ona (Onun dininə) və peyğəmbərlərinə kömək



göstərənləri (dəmirdən düzəldilmiş silahlarla kafirlərə qarşı vuruşan mücahidləri) bəlli etsin" *("Hədid", 25)* ayəsi özünün istər zahiri məzmunu, istərsə də batini duyumu ilə el içində "Əlinin qəzəb oğlu" kimi ad çıxarmış Həzrət Abbasın Kərbəla vaqeəsindəki xüsusi çəkisi ilə bağlı çox söz deyir. Çünki onun Kərbəla düzündə tarixə düşmüş döyüşçü siması ilə yanaşı, yüz minlərlə həqiqətsevərin könlündə özünə həmişəlik yuva salmış mənəvi kimliyi də "Liyə-ləmə-l-lahu – ona görə ki, Allah-taala bəndələrinə bildirsin" şəklindəki ifadələrin əsl ortayaçıxma yerini təşkil edir. Ötəri deyildir ki, İslam müqəddəslərindən Həzrət Abbasla bağlı çoxlu hədis, xəbər və mənqəbələr yadigar qalmışdır. Qəhrəmanın əzəmət və böyüklüyünü bütün aydınlığı və genişliyi ilə başa düşməkdən ötrü onların bir neçəsinə diqqət yetirmək qaçılmazdır:

**1.** *"Mə`ali-s-sibteyn"* kitabının 1-ci cildində bildirildiyinə görə, İmam Əli (ə) vəfatı zamanı Həzrət Abbası çağırır, sinəsinə basıb buyurur: "Ey mənim əziz oğlum. Qiyamət günü mənim gözüm sənin varlığınla işıqlanar!"

"Valədi" xitabı imamın gözündə Həzrət Abbasla iki imam övladının – Həsənlə Hüseynin bir olduğunu göstərir. Yaxud "tuqirru" – "işıqlanar" feilinin önündə işlənmiş "sə" mütləqlik ədatı hər iki din böyüyünün başlıca islami müddəalar baxımından, demək olar ki, eyni olmasından soraq verir. Və ya "yaumi-l-qiyaməti" ifadəsi imamın Həzrət Abbasa əzəli-əbədi haqq işi uğrunda ən fəal mübariz kimi baxdığına dəlalət edir.

**2.** "Balam Abbas ətcə göyərçin (anasının) dimdiyindən qidalandığı kimi, elmi də məndən o cür almışdır" *(Həzrət Əli)*.

"İnnə valədi Əbbas" tərkibi bir neçə peyğəmbərin, məsələn, İbrahimin, Yaqubun, Zəkəriyyanın, Loğmanın övladlarına etdikləri misilsiz valideynlik qayğısının danılmaz göstəricisi olan "ya buneyyə" – "sən ey mənim balaca əziz oğlum" xitabını yada saldığından qiymətlidirsə, "vəqqa-l-ilm`a" – "elm almaq" ifadəsi Həzrət Abbasın indiyədək kölgədə qalan bir məziyyətinə – uca ilahi bilik xəzinəsi ilə birbaşa bağlılığına işarə olduğundan ayrıca önəmə malikdir.





**3.** Belə bir mənqəbə danışılır ki, Qiyamət gününün ən çətin sorğu-sualı zamanı Rəsulullah Həzrət Əlini xanım Fatimeyi-Zəhranın yanına göndərəcəkdir ki, get gör ümmətimin çox hissəsini bağışlatdırmaq üçün qızımın daha hansı ehtiyat vəsiləsi vardır? Həzrət Əli gəlib bunu Fatimeyi-Zəhraya bildirdikdə o belə deyəcəkdir: "Ey möminlərin əmiri, balam Abbasın iki kəsik qolu (ümmətə şəfaət üçün) kifayətdir!"

Əlbəttə, mənqəbədə Kərbəla vaqeəsinə Həzrət Abbasın qollarının qələm edilməsinə işarə vurulması ilk baxışda kimdəsə qıcıq yarada bilər. Ancaq dəfələrlə vurğuladığımız kimi, birincisi, belə hallar mənqəbələr üçün səciyyəvi əlamətdir, ikincisi, o böyüklükdə hadisənin öncədən Tanrı qatında bilinməsi tamamilə təbiidir, odur ki, burada yerli-yersiz etiraz etməyə çalışmaqdansa, mənqəbənin ruhunu duymağa, aşılamaq istədiyi mətləbi qavramağa, hissədən hissə çıxarmağa can atmaq yaxşıdır.

**4.** İmam Hüseyn (ə) Aşura günü Həzrət Abbasa (ə) belə deyir: "Canım sənə fəda olsun! Sən Allah yolunda lazımınca döyüşdün!"

Hər şeydən öncə bu, diqqəti çəkir ki, "binəfsi əntə"– "canım sənə fəda olsun" xitabı Ulu Yaradanın Peyğəmbərin canına and içməsini xatırladır *("Sicr", 79)*. Bu isə zahirən Müqəddəs Kitaba söykənməyin bariz təzahürlərindən olmaqla qalmır, əksinə, İmam Hüseynin (ə) Həzrət Abbasa (ə) verdiyi böyük dəyəri, Həzrət Abbasın İmam Hüseynin (ə) gözündəki əvəzsiz yerini göstərir.

Digər tərəfdən, "Haqqa cihadihi" – "layiqincə cihad etmək" ifadəsi ilə imam ən etibarlı yavərinə tarixi vəzifəsinin öhdəsindən bacarıqla gəldiyini önə çəkməklə bütün Kərbəla şəhidlərinə dini-məfkurəvi qiymət vermiş olur. Ötəri deyildir ki, ifadə Qurani-Kərimdəki "Haqqa tuqatihi" – "lazımınca təqvalı olmaq" *("Təğabun", 17)* meyarı ilə yaxından səsləşir.

**5.** "Abbasın Allah dərgahında elə məqamı vardır ki, Qiyamət günü bütün şəhidlər həmin məqama qibtə edərlər" *(İmam Zeynəlabidin)*.





Nəzərə alınmalıdır ki, bu söz Kərbəla vaqeəsi gözlərinin önündə baş vermiş böyük bir şəxsiyyətin dilindən çıxmışdır. Odur ki, "mənzilətun" – "məqam, dərəcə" ifadəsinə uzaqdan-uzağa verilmiş siyasi qiymət kimi baxmaq olmaz. Əksinə, bu ifadədə imamın bir övliyaya olan saf, səmimi münasibəti gizlənmişdir. "Yəğbituhu bihə" – "Həzrət Abbasın Tanrı qatındakı məqamına qibtə" tərkibinə də məhz belə yüksək kriteriya ilə yanaşılmalıdır. Əks təqdirdə o ulu din böyüyünün nəzərdə tutduğu uca mətləb əsla anlaşılmayacaqdır.

Hədisdəki "cəmiu-ş-şühəda" – "bütün şəhidlər" ifadəsi də diqqət çəkir. Belə ki, ifadə, əslində, kifayət qədər tutumlu olub, İslamın haqq işi uğrunda aparılmış mübarizə tarixini özündə birləşdirməkdədir. Başqa sözlə, İmam Zeynəlabidin (ə) bu ifadə ilə yalnız nadir simaları istisna edir. Deməli, bu ulu din böyüyünə görə, Həzrət Abbas olduqca uca islami və insani dəyərlər yiyəsidir.

**6.** "Əmimiz Abbasın bəsirəti açıq idi, imanı möhkəm idi, odur ki, o, nəticədə şəhid oldu" *(İmam Cəfəri-Sadiq).*

Göründüyü kimi, şiəliyi sistemləşdirərək aparıcı məzhəb etmiş bu böyük şəxsiyyətin sözlərində öncəki hədislərdə toxunulmayan cəhətlər var. Belə ki, o ulu din böyüyü burada Həzrət Abbası "nafizə-l-bəsirəti" – "açıq gözlü" adlandırmaqla qətiyyən adi təriqət mürşidlərinə aid edilən "bəsirət məqamı" anlayışı ilə məhdudlaşdırmır. Əksinə, imamın ifadəsinin alt qatında Həzrət Abbas şəxsiyyətinin hələ üzə çıxmamış etiqad, ibadət və əxlaq resurslarına və bu resursları məhv edən Yezid üsuli-idarəsinə bir etiraz mövcuddur.

Məntiqi ardıcıllıq "sulbə-l-iman" – "iman möhkəmliyi" ifadəsinə də belə yanaşmağa sövq edir. Çünki burada hər hansı bir yenicə iman gətirmiş şəxsin primitiv imanından yox, "Allah özünün möhkəm sözləri ilə bu dünyada da, axirət həyatında da möminləri möhkəmləndirəcəkdir*" ("İbrahim", 27)* ilahi bəyanatında bildirilən əlcatmaz-ünyetnəz əqidə mübarizliyindən danışılır. Odur ki, "məza şəhida" – "son nəticədə şəhid oldu" qənaəti bu iki keyfiyyətin timsalında



nəinki yerinə düşür, hətta burayadək gətirilmiş örnəkləri də dini-məfkurəvi baxımdan tamamlayır.

Bu deyilənlər danılmaz biçimdə sübuta yetirir ki, Kərbəla vaqeəsinin İmam Hüseyndən (ə) sonra ikinci siması olan Həzrət Abbas (ə), bizə indiyədək daha çox təqdim edildiyi kimi, fiziki güçü ilə yox, dərin və dolğun islami və insani kimliyi ilə yetkin, bitkin və bütöv bir şəxsiyyətdir və ötəri deyildir ki, 1400 ildir milyonlarla zəvvar kilometrlərlə yolu min bir əziyyətlə keçərək bu ulu din böyüyünü də uyuduğu Kərbəla torpağında ziyarət etmək üçün şərəflə yarışır. Əgər biz bu yarışı "(Ey insanlar), Rəbbiniz tərəfindən bağışlanmağa və göycə və yercə geniş olub Allaha və Onun peyğəmbərlərinə iman gətirənlərdən ötrü hazırlanmış Cənnətə nail olmaq üçün (yaxşı əməllər etməkdə) bir-birinizdən qabağa düşməyə çalışın!" *("Hədid", 22)* ayəsi ilə bağlasaq, qətiyyən səhv etmiş olmarıq.

* * *

Bu ulu din böyüyünün dini-mənəvi kimliyinə dair aydın anlayış almaqdan ötrü onun ömür yoluna da nəzər salmalıyıq.

Xanım Fatimeyi-Zəhranın vəfatından sonra Həzrət Əli (ə) evlənmək istəyir. O, ərəblər içərisində ən yaxşı nəsil tanıyan şəxs sayılan böyük qardaşı Əqilə müraciət edir: "Mənə qeyrətli ərəb qadının doğduğu bir qız tap ki, onunla evlənim, o da mənim üçün cəngavər bir oğul doğsun!"

O, bir az düşünüb qardaşına belə cavab verir: "Kilab qəbiləsindən olan Ümmü-l-Bəninlə evlən. Ərəblər arasında onun ata-babasından daha şücaətli bir kimsə yoxdur!"

Sonra Əqil Ümmü-l-Bəninin əsil-nəsəbini xatırladır: "O, Fatimə binti Hişam ibn Xalid ibn Rəbiə ibn Amir ibn Sasa`a ibn Müaviyyə ibn Bəxr ibn Həvazindir. Anası Tumanə bint Süheyl ibn Amir ibn Cəfər ibn Kilabdır. Ümmü-l-Bəninin ikinci babası Əbu Bura Amir ibn Malik ən şücaətli, ən məharətli ərəb pəhləvanlarındandır. O, təkbaşına əllidən artıq cəngavərə qalib gəlirdi. Buna görə də ona "Nizəoynadan" adı vermişdilər".





Allah-taala Ümmü-l-Bənindən Həzrət Əliyə (ə) 4 oğul qismət edir: Abbas, Abdullah, Cəfər, Osman.

Həzrət Abbas (ə) Hicrətin 26-cı ilində doğulmuşdur. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, müstəqillik nəticəsində dini dəyərlərimizə qovuşduğumuz üçün hər ilin həmin günü yurdumuzun hər yerində təntənəli surətdə qeyd olunur. Belə ki, məsçidlərdə, ziyarətgahlarda, evlərdə mərasimlər keçirilir, ehsanlar verilir, Əhli-beyt məddahları ulu din böyüyünün və başqa Kərbəla şəhidlərinin igidliklərindən söz açır, onların şəninə yazılmış qəsidə və mənqəbələr oxuyur.

Həzrət Abbas (ə) doğulandan misilsiz zahiri gözəlliyə malik idi. Onun uşaqların ən gözəli olması dillərə düşmüşdü. Buna görə də ona "bəni Haşimin qəməri" *(Haşim oğulları qəbiləsinin Ayı)* ləqəbi verildi. Ümumiyyətlə, ərəblər qədd-qamətli, təmiz əxlaqlı kişiyə "Qəmər" adı verərdilər. Məsələn, Haşimin atası Əbdü-l-Manafa "Vadilər qəməri", Həzrət Muhəmmədin (s) atası Abdullaha "Hərəmin qəməri" demişlər ("Hərəm" – "müqəddəs torpaq" deməkdir. Kərbəla torpağı da bu qəbildəndir).

Həzrət Abbasın (ə) çoxsaylı ad və ləqəbləri var:

**1.** Saqi ataş – yanğıyatızdıran, odsöndürən, susuzluğu aradan qaldıran.

**2.** Əs-səqqa – sudaşıyan. Hər iki ləqəb ona Yezid ordusu Fərat çayına gedən yolu kəsəndən sonra həyatı bahasına qardaşı Hüseyn (ə), ailəsi və silahdaşları üçün su gətirdiyinə görə verilmişdir.

**3.** Əbu qirbə – tuluqlu. Bu ad ona görə verilmişdir ki, o, hər iki qolunun qələm edilməsinə baxmayaraq, Peyğəmbər övladlarına çatdırmaqdan ötrü əlində tutduğu su tuluğunu yerə buraxmadan şəhid olmuşdur.

**4.** Əbü-l-fəzl – Fəzl atası, yaxud fəzilətli şəxs. Həzrət bu ləqəblə iki səbəbdən tanınmışdır: **a.** Fəzl adlı bir oğlu olduğunu deyirlər; **b.** O, çox fəzilətli, qoçaq və qorxmaz olmuşdur.

**5.** Əl-Əbdü-s-Saleh – əməlisaleh, gördüyü işlərə görə Tanrı qatında savab qazana bilən kimsə. Bu, bəzi tarixçilərin



həzrətə verdikləri addır. Onlar bunu Allah-taalanın "Əbd" – *bəndə* sözünü özünün bir çox peyğəmbərlərinə aid etməsi ilə açıqlayırlar. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Ulu Yaradan Şanlı Kitabında Həzrət Muhəmmədi *("İsra", 1; "Hədid", 9),* Əyyub Peyğəmbəri *("Sad", 41),* Zəkəriyyanı *("Məryəm", 2)* bu sifətlə səciyyələndirmişdir.

**6.** Əş-şəhid. İlk baxışda Həzrət Abbasın belə adlandırılması adi hal sayıla bilər. Ancaq dərindən düşündükdə bunun arxasında köklü dini-fəlsəfi qatların durduğu anlaşılır. Məsələn, anlaşılır ki, Həzrət Abbasa bu ləqəbin verilməsi ilə o, şəhidlik baxımından İmam Hüseynlə (ə) bir tutulur, şəhidlər başçısının uca mərtəbəsinədək işlədilir. Ötəri deyildir ki, 12 imam cərgəsində yer almamasına baxmayaraq, Həzrət Abbas (ə) o taylı-bu taylı Azərbaycanın hər yerində "babə-l-həvaic" *(ehtiyaclar qapısı)* kimi dinimizin ən müqəddəs şəxsiyyətlərindən sayılır, "adına qurban, Əbəl-fəzl!" deyilərək adına, qələm olan qollarına and içilir, "Əlinin qəzəb oğlu"tək azğın və zalımlara qarşı sarsılmaz güvənc və söykək yeri olaraq anılır, xatırlanır.

Belə bir lətifə danışırlar: bir gün bir ərdəbillidən 12 imamın adlarını sadalamasını istəyirlər. O, sadalayır. Ancaq imamların sayı 13 olur. Ondan bunu bir daha etməsini istədikdə rəqəm dəyişmir. Axırda çarəsiz qalıb, ona bunun səbəbini bildirirlər. O isə belə deyir: "Sizi Allaha and verirəm, oradan kimi çıxarırsınızsa çıxarın, ancaq bircə Həzrət Abbasa dəyməyin!"

Bu lətifə, əslində, islami dəyərlərimizə söykənən folklor vahidi kimi xalqımızın bu ulu din böyüyü ilə bağlı köklü və dərin sayğı və sevgisi üzərində yoğrulduğundan bütün cəhətlərdən özünü doğrultmaqda, milli-mənəvi çəki baxımından dolğun, keçərli bir qaynaq olaraq boy göstərməkdədir. Yeri gəlmişkən deyək ki, folklor qurumlarının sayının artmasına baxmayaraq, xalqımızın belə parlaq şifahi sərvəti hələ də diqqətdən kənarda qalır, lazımınca toplanılıb öyrənilmir. Halbuki həmin qurumların başlıca işi bu cür yaşarı və canlı örnəkləri toplayıb öyrənmək, millətin əzəli-ədəbi sərvətinə çevirməkdir.





Həzrət Abbas Kərbəla vaqeəsindən öncə də igid kimi ad çıxarmışdı. Əl-Xarəzminin bildirdiyinə görə, o, Siffeyndə atası Həzrət Əli ilə çiyin-çiyinə Müaviyə ibn Əbu Süfyana qarşı döyüşmüş, düşmənə böyük itki vermişdi. Aşuradan öncə baş vermiş silahlı toqquşmalar da məhz onun adı ilə bağlıdır. Belə ki, məhərrəm ayının 7-də axşama doğru İmam Hüseynin düşərgəsində su qurtarır. Peyğəmbər xanədanının qız-gəlini susuzluqdan əziyyət çəkməyə başlayır. Həzrət Abbas İmam Hüseyndən izin alıb, 30 atlı və əli tuluqlu 20 piyada götürür və Fərat çayına sarı yollanır. Fəratın yolunu isə Əmr ibn Həccac əz-Zibeydi kəsmişdi. Onun başçılığında piyadalardan başqa 500 atlı da toplanmışdı.

İbn Həccac at ayaqlarının tappıltısını eşitdikdə irəli gəlib ucadan soruşur:

– Burda kim var?

Həzrət Abbasın yoldaşlarından Mafi Hilal əl-Cəməli deyir:

– Gəlmişik yolunu kəsdiyiniz sudan içək!

İbn Həccac ondan soruşur:

– Sən kimsən ki?!.

O cavab verir ki, mən Mafi Hilal əl-Cəməliyəm.

– Siz Hüseyn ibn Əbu Turabın adamlarındansınız?

– Bəli.

– İç bu sudan, nuş olsun! Ancaq bir şərtim var: bir damla su belə Hüseynə və Abbasa çatmamalıdır!

– Hüseynin qardaşı Abbas da bizimlədir.

– Bizi bura ona görə qoyublar ki, sizi suya yaxın buraxmayaq. Əgər yaxınlaşmağa cəhd etsəniz, vuruşacağıq!

Bu zaman Həzrət Abbas qılıncını siyirir və bir neçə döyüşçüyə tuluqlarını doldurmağı tapşırır. Döyüşçülər 20 tuluğu dolduraraq, bircə yara da almadan sağ-salamat düşərgəyə qayıdırlar.

Bu şəxsiyyətin mənəvi-əxlaqi yetkinliyi ilə bağlı aydın anlayış əldə etməkdən ötrü Tasuada baş vermiş bir əhvalat da olduqca maraq doğurur. Deyilənlərə görə, Şimr bir qaya üzərinə çıxıb ucadan səslənir ki, bacımız Ümmü-l-Bəninin






*Telli-Zeynəbiyyə. İraq. Kərbəla şəhəri*

oğlanları hanı? (Tarixi qaynaqlara görə, Şimr də Ümmü-l-Bəninin qəbiləsindən – Kilabdan idi, o zamanın adətlərinə görə, Ümmü-l-Bənin qəbilə üzvlərinin bacısı sayılırdı).

Bunu eşidən Abbas, Cəfər və Osman irəli çıxır, Həzrət Abbas qəzəblə soruşur:

– Sənə nə olub, nə istəyirsən?

Şimr deyir:

– Bacımız oğlanları, sizə aman verilir.

Həzrət Abbasın cavabı tarixi bir cavabdır: “Allah sənə və sənin “amannamə”nə lənət eləsin. Dediyin kimi, həqiqətən, bizim dayımızsansa, Rəsulullahın övladına aman verilmədiyi halda, sən bizə necə aman verirsən?”

Bu əhvalat da bir daha danılmaz biçimdə sübuta yetirir ki, Həzrət Abbasın (ə) Kərbəla düzündəki igidliyinin əsasında özünün ali soyundan gələn və İmam Hüseynə (ə) sonsuz sayğı və sevgi üzərində qurulan yüksək mənəvi-əxlaqi məziyyətləri durur. Bu məziyyətlər onun diri, canlı, yaşarı və ölməz portret cizgilərini şərtləndirmiş, onu milyonların güvənc yerinə çevirmişdir. Həzrət Abbasın igidlik zirvəsini isə Aşura döyüşləri təşkil edir. Belə ki, şəhidlərin çoxaldığını gördükdə





*İmam Hüseyn (ə) və Əbəlfəzl (ə)-ın müqəddəs məzarları.*
*İraq. Kərbəla şəhəri. (Üstdən görüntü)*

o, qardaşlarına belə tapşırır: “Gedin, sizi Allaha və Onun peyğəmbərinə həvalə edirəm”. Onlar – Abdullah, Osman və Cəfər var qüvvələri ilə vuruşub, bir-bir şəhidlik zivəsinə ucalırlar.

“Düşərgədə susuzluq yenidən şiddətlənir. Südəmər körpələrin, uşaqların, qadınların bənizləri saralır, gizli hıçqırtıları ürək dağlayır. İslamiyyətin və Əhli-beytin qeyrət rəmzi olan Həzrət Abbasın qəlbi buna tab gətirmir. Odur ki, atına minib, qılıncını çıxarır, belinə tuluq keçirib Fərata sarı yollanır. Bu zaman bəzi düşmən atlıları ona mane olmağa çalışır. O, qılıncını siyirərək bir şir kimi nərə çəkir və onların üstünə cumur. Onu tanıyırlar. Çünki gücünü görmüşdülər. Odur ki, yolundan çəkilirlər, Fərata gedib tuluğunu doldurmasına imkan verirlər.

Həzrət yenidən atının belinə qalxır və Əhli-beytin düşərgəsinə doğru hərəkət edir. Bu zaman qarşısını çoxsaylı düşmən atlıları kəsir. O, qılıncı ilə onların çoxunu həlak edə bilir. Onlar qaçmağa üz qoyurlar. Çünki onunla üzbəsurət vuruşmağın qeyri-mümkün olduğunu bilirdilər. Belədə



düşmənin yalnız bir çıxış yolu qalırdı – qorxaqların tutduğu hiyləgərlik, arxadan zərbə vurmaq yolu.

Zeyn ibn Rəqqab Cehni ilə Hukm ibn Tufeyl Səyumi hərəsi bir xurma ağacının arxasında gizlənərək o igidlik timsalına pusqu qururlar. Zeyd arxadan zərbə endirərək, Həzrət Abbasın sağ qolunu kəsir. Kəskin ağrıya baxmayaraq, həzrət bayrağın sapını kəsilmiş əlindən sol əlinə ötürür və onu yuxarı qaldıraraq var gücü ilə nərə çəkir: “Allaha and olsun, sağ tərəfimi büsbütün doğrasanız da, mən daim öz imanımı və saf, etibarlı Peyğəmbərin övladı olan imamımı bütün varlığımla qoruyacağam”.

Həzrət Abbas (ə) bu sözləri deyib, atını İmam Hüseynin çadırına doğru çapmağa başlayır. Bu zaman Hukm o biri xurma ağacının arxasından çıxıb Kərbəla igidinin sol qolunu da vurur. Abbas qollarının salamat qalan hissəsi ilə bayrağı sinəsinə sıxır ki, onu qaldırılmış vəziyyətdə saxlaya bilsin.

Qəhrəmanın qollarının kəsildiyini görən qorxaqlar ürəklənirlər və onun üzərinə ox yağdırırlar. Həzrətin atına da çox ox dəyir. Odur ki, at davam gətirə bilməyib Həzrət Abbasla birlikdə yerə yıxılır. Bu zaman tuluğa da ox dəyir və suyu yerə axır.

Çoxlu qan itirdiyindən həzrətin qüvvəsi anbaan tükənir. Odur ki, son gücünü toplayaraq, “Məndən sənə salam olsun, ey Əba Əbdillah!” – deyə ucadan səslənir.

Düşmən qoşunundan bir nəfər yaxınlaşaraq, əmudla həzrətin başına zərbə endirir və onun başını bədənindən ayırır. Həzrət Abbas şəhid olur. Bunu yəqin edən Həzrət Hüseyn deyir: “İndi belim sındı, gücüm tükəndi”.

Səkinə atasına yaxınlaşıb əmisini ondan soruşur, Abbasın şəhadətə yetdiyini bildikdə özünü qışqırıb-ağlamaqdan saxlaya bilmir.

Qardaşının ölüm xəbərini eşidər-eşitməz xanım Zeynəbin şivən səsi yeri-göyü titrədir: “Vay qardaş! Vay Abbas! Özündən sonra bizi kimə tapşırıb getdin?!”





Bu zaman İmam Zeynəlabidin xəstə yatağından qalxaraq, düşmənlərə sarı üz tutur. O, bir əlində əsa, bir əlində də siyrilmiş qılınc tutmuşdu. İşi belə görən İmam Hüseyn Ümmü-l-Gülsümə deyir: "Onu tutub saxla ki, Muhəmməd nəslindən heç kəs yerə yıxılmasın!"[245]

* * *

Nisbətən sənədli bilgilərə söykənən bu tarixi xülasə bir neçə baxımdan dəyərləndirilə bilər. Birincisi, nəzərə alınmalıdır ki, bu bilgilər ilk növbədə uzunmüddətli və gərgin axtarışların bəhrəsidir. Çünki Peyğəmbərdən və imamlardan fərqli olaraq, Həzrət Abbasın həyat və fəaliyyəti bir elə də ətraflı öyrənilməmişdir. İkincisi, nəzərə almaq gərəkdir ki, Həzrət Abbasın həyat və fəaliyyətinin öyrənilməsi bir çox məzhəb və təriqət əngəlləri üzündən indiyədək layiqincə baş tutmamışdır. Üçüncüsü, az-çox araşdırılmış hadisə və əhvalatlar da bir xeyli şübhəli olduğu üçün ciddi dəqiqləşdirməyə möhtacdır. Bununla belə, yuxarıda xülasə etdiyimiz kitabça Həzrət Abbasın tarixi portretini bir xeyli aydın cızmağa, onun dünyagörüşü, münasibətlər sistemi və ömür-gün yolu haqqında əsaslı məlumat almağa imkan verir. Əsərin "Həzrəti-Abbas" fəslini araşdırdıqca bu, bir daha əyani surətdə özünü göstərəcəkdir.

* * *

Həzrət Abbas İmam Hüseynin (ə) bu yer üzündə sonuncu dayağı idi. Tarixi xülasədə olduğu kimi, əsərdə də ulu din böyüyünün quruca adı belə güvənc və söykək yeri olaraq hamıya bəs edir. Belə ki, Həzrət Abbas (ə) Füzuli qələmində son dərəcə təmkinli, ləngərli və sanballı surətdir. O, qətiyyən döyüş texnikası və mübarizliklə önə çəkilmir. Əksinə, istər döyüş işində, istərsə də ailə-məişət qatında Həzrət Abbas

.................................

[245] *Muhəmməd Kamil Həsən əl-Muhami. Əl-Əbbas ibni Əli ibni Əbu Talib, Bakı, 1992, səh. 3-36*





*Xeyməgah. İraq. Kərbəla şəhəri*

İmam Hüseyn (ə) və başqaları arasında körpüyə çevrilir. Yalnız susuzluq kəskin həddə çatdıqda meydana atılır.

Fəsil belə başlanır: "Andan sonra növbəti-təcərrö'i-şərbəti-şəhadət Əbbas bin Əliyyi-Mürtəzaya yetdi və ol həzrət ələmdari-sipah və ələmeyi-ləşkəri-zəfərpənahdı. Çün gördü ki, təngnayi-həyati-müstəari-fani tərtibi-süfufi-əskəri-ərbabi-vəzayə müzayiqə verüb, ləşkər bir-bir fəzayi aləmi-bəqayı cilvəgah etməkdədir və Sultani-Kərbəladan bir-bir rüsxət alub məziqi-möhnətdən ol fəzayi-fərəhfəzaya getməkdədir, ələmi-(ələmeyi)-əskəri-hümayunu dili-zəmində möhkəm edüb Həzrəti-Sultani-Kərbəlanın rikabi-hümayunun mülsəmi-təqbili-ədəb qılub, bu təriqlə ərzi-niyaz etdi ki: "Ey ləngəri-səfineyi-səbrü təhəmmül və ey ənqayi-Qafi-təslimü təvəkkül, vəqt oldu ki, bən dəxi ələməfrazi-aləmi-ülvi olam və ələmi-ahı ələmeyi-ülüvvi-iqtidar edüb aləmi-üqbaya təvəccöh qılam".

Həzrəti-imam giryan olub ayıtdı: "Ey Əbbas, sən ələmeyi-əskəri-İslam idin. Hala ki ləşkər badiyeyi-fənadan mülki-bəqaya əziməti-rihlət qıldı, sana dəxi ol diyara ələm çəkmək münasib oldu. Əmma sana nəsihətim budur ki, meydana



gəldikdə bu zalimlərə təcdidi-hüccət təriqiylə nəsihət verəsən”[246].

*(Şəhidlik şərbətini qəbul etmək növbəsi Mürtəza Əli oğlu Abbasa çatdı. O həzrət ordunun bayraqdarı və uğur nişanəsi idi. Fani həyatın darlığından döyüşçülərin öz vəzifələrini yerinə yetirmək uğrunda tələsdiklərini və ordunun sıra nəfərlərinin bir-bir əbədiyyət aləminə yönəldiyini gördüyü üçün özünün şanlı bayrağını əlində möhkəm tutaraq Kərbəla sultanı həzrətlərinin atının mübarək üzəngisinə ədəblə üz qoydu və öz ürək sözlərini belə dilə gətirdi ki: “Ey səbir və dözüm gəmisinin ləngəri və ey təslim və təvəkkül Qafının Ənqası, zamanı çatdı ki, mən də uca aləmin ali kədərartıranı olam və ah bayrağını yüksək əbədiyyət nişanəsi etməklə axirət dünyasına doğru yol alam”. İmam Hüseyn ağlaya-ağlaya dedi: “Ey Abbas, sən müsəlman qoşununun rəmzi idin. Bir halda ki ordu fəna çölündən əbədi axirət yurduna getmək niyyətinə düşüb səfərə başladı, sənin üçün indi orada bayraq tutmaq daha münasibdir. Ancaq sənə tapşırığım budur ki, döyüşə girdikdə ilahi höccəti – dəlil-sübutu tamamlamaqdan ötrü bu zülmkarlara öyüd-nəsihət verəsən”).*

“Hədiqətü-s-süəda” klassika olduğundan, klassika da daha çox rəmz və işarələr üzərində qurulduğundan istər-istəməz kimin kimə nə dediyindən çox niyə və necə dediyinə diqqət yetirməli olursan. İslam aləminin bu iki kamil şəxsiyyətinin bir-birinə müraciətləri də bu baxımdan olduqca dolğun və tutumludur; məs.:

**1.** “Ey ləngəri-səfineyi-səbrü təhəmmül” Həzrət Abbasın (ə) İmam Hüseynə (ə) etdiyi bu müraciəti çox asanlıqla *“Ey dözüm və səbir gəmisinin ləngəri”* deyə sadələşdirmək və üzərindən sükutla keçmək olar. Ancaq belə etdikdə sözün sehrinə arxa çevrildiyi kimi, sənətin incəliyinin də üstü örtülər. Halbuki tərkibi qat-qat soyuq anlam ləpəsinə çatdıqda qardaşın qardaşa, müqəddəsin müqəddəsə, dostun dosta,

.................................

[246] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 316-317*





qəhrəmanın qəhrəmana bəslədiyi münasibətin min bir rəngi, qoxusu, cilvəsi ortaya çıxar. Məsələn, kimsə tərkibdəki "səbir" və "təhəmmül" sözlərini bəsit sinonim saya bilər. Ancaq müsəlman dünyasında islami cihad konsepsiyasının bariz nümunələrindən sayılan aşağıdakı ayədə "səbir" sözünün iki dəfə yanaşı işlənməsini yada saldıqda ən saya adamlar belə istər-istəməz insafa gəlib diqqətli olmağa, sözün, sənətin geniş imkanlarını zay etməməyə çalışar: "Ey iman gətirənlər, səbir edin, dözümlü olun, sərhədlərdə növbə çəkməyə hazır olun, Allah qarşısında şüurlu məsuliyyətinizi qoruyub saxlayın ki, bəlkə səadətə çatasınız" *("Ali-İmran", 200)*.

Mütəxəssislər ayədəki birinci səbri ailə-məişət qatı ilə bağladıqları halda, ikinci səbri sırf müharibə istilahı, döyüş texnikasına yiyələnmə çağırışı kimi götürürlər. Belədə bəs niyə bu incəlik dinin ən böyük simvoluna çevrilmiş İmam Hüseynin həyat və fəaliyyətinə aid olmasın?!

"Gəmi" tərkib baxımından incəlik qaynağıdır. Belə ki, Rəsulullahın İmam Hüseyn (ə) haqqında söylədiyi çoxsaylı hədislərin birində bu ulu din böyüyü "qurtuluş gəmisi" adlandırılır. Burada yalnız sadə səciyyələndirmə olan münasibət məşhur "Əl-qədir" hədisində məzmun səviyyəsinə qaldırılaraq, çox yığcam biçimdə İmam Hüseynin ümumbəşəri siması açılıb göstərilir.

Ən nəhayət, müraciətdə Həzrət Abbasın İmam Hüseyni (ə) "gəminin lövbəri"nə bənzətməsi Füzulinin yalnız sənətkarlığından yox, dini baza üzrə ideoloji ustalığından da soraq verir. Çünki bu yolla şair Həzrət Muhəmməddən (s) gələn səciyyəni qəhrəmanının dili ilə bir az da təkmilləşdirmiş olur. Bunun başlıca səbəbi isə onun İmam Hüseynə (ə) bəslədiyi məhəbbətdə axtarılmalıdır.

Başqa yerdə verdiyimizə baxmayaraq, yeri gəldiyi üçün burada Əlican Qövsi Təbrizinin:





Əndişeyi-tufan çox olur bəhrdə, əmma
Sən ləngəri-təslim ələ alsan, xətər azdır! –

beytini bir daha yada salmamaq olmur.

**2.** "Vəy ənqayi-Qafi-təslimü təvəkkül" yuxarıda "və ey təslim və təvəkkül qapısının ənqası" şəklində sadələşdirdiyimiz bu tərkib də bir neçə özünəməxsus cəhətə aiddir. Oradan başlayaq ki, "təslim" sözü, əslində, bəsit sitayiş, boyunəymə, itaətetmə olmayıb, çoxqatlı, çoxşaxəli bir etiqad, ibadət və əxlaq anlayışıdır. Çünki "saləmə" köklü bu söz *sülh, salamatlıq, bəndəlik, Allahtanıma, Allahaxtarıcılıq* kimi geniş spektrə malikdir. Sözün müxtəlif məzhəb və təriqətlərdə çeşidli yönlərə yozulması da buradan qaynaqlanır. Məs.: dini mətnlərdə belə mənqəbələrə tez-tez rast gəlinir: "Həzrət Musa bir gün Rəbbi ilə bu münacatı etdi: "Ey Rəbbim, mənə elə bir iş göstər ki, bunu etməyimlə məndən razı qalasan".

Allah ona belə vəhy etdi: "Mənim razılığım sənin istəmədiyin işdədir. Sən sevmədiyinə səbir etməzsən!"

Musa dedi: "Ey Rəbbim, o işi mənə göstər".

Allah buyurdu: "Mənim razılığım sənin qəzavü qədərindən razı qalmağındadır".

Dini mətnlərdə deyilir ki, bir gün Allah-taala Davuda vəhy edərək buyurdu: "Ey Davud, sən də istəyirsən, Mən də istəyirəm. Lakin Mən istəyən olur. Əgər sən Mən istəyənə təslim olsan, nə istədiyini verərəm. Yox, hərgah Mən istəyənə təslim olmasan, səni istədiyində yoraram və sonda yenə Mən istəyən olar"[247].

Göründüyü kimi, Musa və Davud peyğəmbərlərlə bağlı olan bu mənqəbələr, hər şeydən öncə, ilahi təqdirə, qəzavü qədərə sözsüz-danışıqsız razılıqvermə dərrakəsi üzərində qurulmuşdur. Bu isə Kərbəla vaqeəsinin irfani-fəlsəfi dərki baxımından olduqca önəmlidir və vaxt ötdükcə müsəlman Şərqinin mütəfəkkirləri bunu əlvan və rəngarəng bir xalı

..................................

[247] *İslamov R. Riza və təslim, "Hikmət" jurnalı, №2, 2009*



kimi işləmiş, ona çeşidli ilmələr vurmuşlar. Məsələn, Şeyx Fəridəddin Əttar "Əsrarnamə"nin "Eşqlə əqlin mübahisəsi" adlı birinci fəslində "Zəburi-eşq əzcanan bər amuz" *(eşq "Zəbur"unu bilavasitə Allahdan öyrən)* deyərkən Həzrət Davudu Tanrı qarşısında bilərəkdən kiçiltmiş, bunu təkcə bədii fiqur kimi yox, həm də irfani-fəlsəfi işarə kimi etmişdir.

Deyilənlər eyni ilə "təvəkkül" sözünə də aiddir. Çünki "təslim" sözü kimi, o da lüğəvi mənalarla (*söykənmə, istinadetmə, güvənmə* və s.) yanaşı, dolğun və tutumlu istilahi anlamlara malikdir.

"Kim Allaha təvəkkül etsə, Allah ona kifayətdir" *("Təlaq", 3)* qəbilli Quran ayələrinə söykənən belə irfani-fəlsəfi yozumlar müsəlman mədəniyyətinin bütün sahələri üçün səciyyəvidir. İki övliyanın aşağıdakı mükaliməsi buna parlaq misaldır.

Deyilənlərə görə, bir gün İbrahim Ədhəmlə Şəfi Bəlxi qarşılaşırlar. Şəfi Bəlxi İbrahim Ədhəmdən necə dolandıqlarını soruşur. O, cavab verir ki, biz bir şey tapanda şükür edirik, tapmayanda isə səbir edirik. Şəfi Bəlxi deyir ki, bizim Bəlx şəhərinin itləri də belədir. Onlara bir şey atanda yeyib hürür, minnətdarlıqlarını bildirir, atmayanda isə sadəcə olaraq quyruqlarını bulayırlar.

Bu dəfə İbrahim Ədhəm sual verir:

– Bəs siz necə dolanırsınız?

– Biz bir şey tapdıqda başqalarına paylayırıq, tapmadıqda da şükür edirik.

Tərkibdəki "Qaf" da İmam Hüseyn (ə) siqlətinin bədii ifadəsi baxımından maraq doğurur. Çünki "Qaf" *dağ* mənasında bu ulu din böyüyünün əzəmət və şərəfini əks etdirirsə, Qurani-Kərimin surələrindən birinin adı olmaq etibarilə oxucunu Kərbəla vaqeəsinin məfkurəvi söykənəcəyi ilə bağlı düşüncələrə sövq edir.

Digər tərəfdən, sözün hürufu-l-müqəttəa (kəsik-kəsik hərflər) istilahı yönündə də yozula bilməsi Kərbəla vaqeəsinə bəslənilən münasibətin formalaşması baxımından müəyyən





mülahizələrin doğmasına yol aça bilər. Ən nəhayət, “Qaf”ın mifik məzmuna da malik olmasının İmam Hüseyn hərəkatının metafizik və mistik dərki üçün bir açar yerində də dura biləcəyini düşünmək mümkündür.

Tərkibdəki “ənqa”ya gəldikdə isə, belə bir cəhət diqqəti çəkir ki, əfsanəvi Simurq quşunun Şərq təfəkküründə işlək və çevik irfani motiv olması və bu motivin hamıya yaxşılıqetmə kimi ali prinsipə söykənməsi Həzrət Abbasın İmam Hüseynə (ə) “Allahın yer üzərinə uzatdığı qurtuluş ipi” olaraq baxdığını və onu əzəli-əbədi xilaskar yerində gördüyünü göstərir.

Ənqa quşunun orta əsrlər poeziyasında aldığı çeşidli məna-məzmun incəlikləri də daha çox bu yöndədir; məs.:

Ömrlərdir itmişəm, mən bilmənəm kim, handayam,
Heç məni gördünmü, ey ənqa, dolanım başına.

Şair demək istəyir ki, ey adı olub, özü olmayan ənqa quşu, mən də sənin kimiyəm. Yəni camaat səni tapa bilmir. Bu, bəllidir. Ancaq iş ondadır ki, camaatın səni görməyə az-çox gümanı var. Mən isə gözlərdən elə gizlənmişəm ki, bir kimsə nə vaxtsa məni görə biləcəyinə əsla inanmır.

Yaxud:

Xəlqdən tərki-əlaqə eyləyib ənqa kimi,
Bir qənaət guşəsində aşiyan etmək gərək!

Şair demək istəyir ki, zəmanədə heç kəsə etibar qalmadığından yalnız ənqa quşu kimi olmaq gərəkdir. Bu isə ancaq özünü toplayıb qənaətcil həyat tərzi keçirməklə mümkündür.

**3.** “Ələməfrazi-aləmi-ülvi”. Həzrət Abbasın (ə) özünə aid etdiyi bu ifadə islami təsəvvüfə söykənən bir sıra məqamlara işarə sayıla bilər. Məsələn, “Mətlə’ü-l-e’tiqad”da Füzulinin də bildirdiyi kimi, varlıq “yuxarı atalar, aşağı analar” deyə iki sferaya bölünür: Günəş şüası, Ay işığı, yağış, qar üst qatın, külək, torpaq, su, od isə alt sferanın ünsürləri hesab



olunur. Həzrət Abbas bu ifadə ilə ətəyində böyüdüyü, qoynunda bəsləndiyi müqəddəs Peyğəmbər ocağını, yüksək peyğəmbərlik məqamını, uca imamət dərəcəsini nəzərdə tuta bilərdi. Hər halda tərkibin istər quruluşu, istərsə də ifadənin məzmunu oxucunun belə düşünməsinə yol aça bilər.

**4.** “Badiyeyi-fəna” və “mülki-bəqa”. İmam Hüseynin (ə) Həzrət Abbasla (ə) bağlı söylədiyi bu ifadələrin həyat ziddiyyəti və bundan doğan bədii təzad olmasını bir yana qoyub, daşıdığı islami əsaslı irfani yükə diqqət yetirsək görərik ki, burada, əslində, dərin dərrakədən, geniş təfəkkürdən, rəngarəng baxışlar toplusundan söhbət gedir. Aşağıdakı “Leyli–Məcnun” misraları bunu görümlü biçimdə qavrada bilər:

Hər zərreyi-zahirin zühuri,  
Bir özgəyə bağlıdır zəruri.  
Gər ğayətə eyləsən təhəmmül,  
Zahir olur onda məzhəri-küll!  
Gəl varisə mə’rifət məzaqi,  
Fani sənə bəs, dəlili baqi!  
Həqqa ki vücud birdir,  
Bir zatə vücud münhəsirdir.

“Hədiqətü-s-süəda”nın “Əyyub” fəslindəki aşağıdakı şeir də bu səpkidədir:

Bir dürür məsdəri-cəlalü camal  
Bir bilir qəhrü lütfi əhli-kəmal.  
Gərçi əhvali-müxtəlif çox olur,  
Birdir əsli-həqayiqi-əhval!

**5.** “Təcdidi-höccət”. Lüğətdə *mübahisə etmək, sözlə qalib gəlmək* demək olan “höccət” sözü islami istilah kimi dini rəhbərin qarşı tərəfi ilahi göstərişlərin doğruluğuna, düzgünlüyünə inandırmaq üçün gətirdiyi kəsərli dəlil-



sübutlara deyilir. "Təcdid" isə *yeniləmə* deməkdir. Deməli, İmam Hüseyn (ə) Həzrət Abbasdan (ə) düşmən qoşununa bir daha üz tutub onları haqq yola çağırmasını və bununla da öhdəsinə düşən övliyalıq vəzifəsini sonuncu dəfə yerinə yetirməsini istəyir. Bu isə Həzrət Abbasın (ə) İmam Hüseynin (ə) gözündə təkcə igid bir döyüşçü kimi yox, sözü ilə işi üzvi uyarlıq əmələ gətirən bir övliya kimi də uca olduğunu göstərir. Şiəlikdə Həzrət Abbasla (ə) bağlı müxtəlif mənqəbələrin geniş yayılmasının bir səbəbi də elə burada axtarılmalıdır.

Məsələnin sırf dini hərbi tərəfinə gəldikdə isə, göstərməliyik ki, öyüd vermək, nəsihət etmək dinimizdə aparıcı yer tutur. "Allah sizə necə də gözəl öyüd verir!" *("Nisa", 58),* "Bu, sizin üçün öyüd-nəsihətdir. Bəlkə ibrət götürəsiniz" *("Nəhl", 90)* səpkili ümumi qoyuluşla yanaşı, Musa və Harun örnəyində və Həzrət Muhəmmədin timsalında olan xüsusi həll nümunələrinin də olması *("Nisa", 63; "Ali-İmran", 159)* İslamiyyətin burada quru sxolastikaya yox, canlı, yaşarı öyüd-nəsihətə üstünlük verdiyini göstərir. Nəsiminin 17 beytlik:

Əya mömin gər istərsən səadət,
Özinə pişə qıl daim se adət! –

mətləli nəsihətnaməsi bu islami göstərişin Şərq ədəbiyyatındakı parlaq bədii əkslərinə səciyyəvi misaldır.

* * *

Həzrət Abbas, imamın buyurduğu kimi, meydana daxil olur və belə bir rəcəz oxuyur:

Bənəm Əbbasi-Sərdari-müxalifsuzü xəsməfkən!
Müti'i-Mustəfa'nəqdi-Əmirəlmö'minin Heydər!
Əgər dəryaya düşsə tiği-atəşbarımın əksi,
Şüaindən olur dəryada hər bir qətrə bir əxgər.





Və gər toprağa pərtöv salsa, şəm'i-rayəti-əzmim,
Ziyasindən olur topraqda hər zərrə bir əxtər![248]

*(Düşmən odlayan və qəzəb püskürən sərkərdə Abbas mənəm. Mən seçilmiş sonuncu Peyğəmbərin ardıcılı və şir xislətli möminlər əmirinin – Həzrət Əlinin hərb şücaəti üzrə canlı varisiyəm! Əgər mənim od saçan qılıncımın şəkli dənizə düşsə, onun şüaları nəticəsində dənizin hər bir damlası bir tikana çevrilər. Yox, hərgah mənim niyyət bayrağımın şamı torpağa, səhraya işıq salsa, işığının çoxluğundan yer üzündəki hər bir zərrə özlüyündə dönüb bir ulduz olar).*

Malik olduğu xüsusiyyətlər baxımından rəcəz bu ulu din böyüyünün bir sıra portret cizgilərini aydın göstərir.

**1. "Sərdar".** Bəllidir ki, İmam Hüseyn (ə) öz azsaylı qoşununun bütün hərbi səlahiyyətini Həzrət Abbasa həvalə etmişdi. Bu, onun Həzrət Abbasa etibarını göstərdiyi kimi, qəhrəmanın fərdi hərbi bacarığından da soraq verir. Odur ki, "sərdar" burada təkcə sərkərdə kimi yox, sözün gerçək anlamında fövqəladə səlahiyyətli rəhbər kimi də başa düşülür. "Müxalifsuzi-xəsnəfkən" epiteti obrazın hərbi istedadına dəlalət edirsə, "nəqdi-Əmirəlmöminin və müti'i-Mustafa" epitetləri də də əsil-nəsəblə yanaşı, surətin məfkurəvi dayaqlarının sarsılmazlığını da göstərir.

Digər tərəfdən, rəcəzin ardında qəhrəmanın şücaətinin yerinə düşən mübaliğəli tərənnümü də "sərdar" sözünün özündə birləşdirdiyi gizli mətləblərin çox dərinliklərə gedib çıxdığını ifadə edir.

**2. "Müti'i".** Daha çox mənfi anlamda eşitdiyimiz bu söz, əslində, dini terminologiyada *tabe olan ardıcıl, davamçı* mənasını verir. Belədə "müti'i-Mustəfa" ifadəsi Həzrət Abbasın (ə) Rəsullulahı (s) şəxsən görməməsinə baxmayaraq, özünü onun həqiqi ardıcılı olduğuna, bunun əsil-nəsəbdən daha çox mənəvi səciyyə daşıdığına işarə etməkdədir.

..................................

[248] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh.317*





**3. “Nəqd”.** Lüğətdə *gerçək, real, indi əldə edilən* kimi qavranılan bu söz islami terminologiyada daha çox *varisin malik olduğu vərəsəyə layiq olması, onun bunu aidiyyəti üzrə işlədəcəyinə hamının inanması* şəklində başa düşülür. Deməli, Həzrət Abbas (ə) özünü “Həzrət Əlinin nəqdi” adlandırmaqla İmam Əli (ə) şücaətinin onun timsalında hələ də yaşadığını, yüksək islami və insanı dəyərlərin ölmədiyini demək istəmişdir.

Rəcəz bədii tutumca da dolğundur. 2-ci və 3-cü beytlərin mübaliğə, müqayisə və bənzətmələrlə zənginliyi həyat həqiqətinin bədii-estetik təqdimini inandırıcı və görümlü edir. *Dərya-torpaq, qətrə-zərrə, əxgər-əxtər (tikan-ulduz)* qarşılaşdırmaları rəcəzin ümumi məzmunu içərisində ayrı-ayrı element olmaqdan çıxıb, eyni qayə ətrafında və vahid müstəvidə birləşən komponentə çevrilməklə Həzrət Abbasın (ə) portret-obrazının başlıca cizgilərini, onun döyüş bacarığını, taktiki gedişlərini, çevik hərb oyunlarındakı məharətini daha aydın təsəvvürə gətirməyə yol açır.

Bundan başqa, 2-ci beytdəki “tiği-atəşbarı” – *od saçan qılıncı*, 3-cü beytdəki “şəm’i-rayəti əzm” – *niyyət bayrağının əzmi* məfkurəvi planda əsaslandırılır və qəhrəmanın maddi qabiliyyətini mənəvi müstəvidə bir az da gücləndirmiş olur.

Bütün bunlar rəcəzi Həzrət Abbasa (ə) layiq bir monoloqa çevirir və dilindən söylənildiyi din böyüyünün şəxsiyyəti haqqında köklü bir bilgi toplusu halına gətirir.

* * *

Əsər belə davam edir: “İzhari-ismü rəsm etdikdən sonra avazi-büləndlə nida qıldı ki: “Ey qövmi-bimürüvvət, əgər nəsihət məqbul isə Həzrəti-Hüseyni-Əlidən sizə Rəsuli-pəyamgüzaram və əgər xilafi-təriqi-mürüvvət dutsanuz, müəddiyi-karzaram”. Ol müanidlər ayıtdılar: “Peyğamın nədür?” Əbbas ayıtdı: “Ey bivəfalar, Həzrəti-Sultani-Kərbəla





və nəqdi-Mustəfa və nuri-çeşmi-Mürtəza və cigərguşeyi-Zəhra buyurur ki, təmamiyi-vəfadarü həvaxahlərimi qətl etdinüz. Vəqt olmadımı vaqe' olan əhvaldan peşiman olub bu nirani-təəttüşdən iztirab edən övrətü ətfala bir içim su verəsiz ki, ləbi-xüşklərin tər qılalar və aman verəsiz ki, anları alub canibi-diyari-Rum, ya Hindü Çinə çıxub cəzireyi-Ərəb və mülki-Hicazı sizə müsəlləm qılam və şərt edəm sizinlə ta ruzi Qiyamət müxasimə qılmıyam?!"

Bu kəlimatdan ləşkəri-Yezidə xüruşü qülqülə düşüb, bə'zi mütəəssif olub, ümərayi-ləşkərə qəsd etmək tədarükində ikən Şimri-Zilcövşən və Şisi-Rəbii və Həcərüləhcar fitnədən təvəhhüm edüb, ləşkərə təmkin verməyüb Həzrəti-Əbbasa müqabil durub ayıtdılar: "Ey Əbbas, əgər təmamiyi-ruyi-zəmin seylabla dolsa və anın hifzi bizüm qəbzeyi-iqtidarimizdə olsa, Yezidə bey'ət etməyincə bir qətrə su Hüseynə və ətbainə verilmək mümkün degil".

Əbbas ol tayifədən novmid olub, müraciət qılub ərzi-hal etdikdə nagah ətfali-Əhli-beytdən fəryadi-"Əl-ətəş, əl-ətəş"



*Beynəl-hərəmeyn. İki hərəm arası meydan. İraq. Kərbəla şəhəri*



səm'i-mübarəklərinə irişüb, bir-iki məşkü məthərə alub biixtiyar seylmanənd mütəvəccihi-rudi-Fərat oldu"[249].

*(Abbas adını bildirdikdən sonra uca səslə düşmən qoşununa belə üz tutur: "Ey insafsız camaat, əgər qəbulunuzdursa, mən Əli oğlu Hüseyn tərəfindən sizə sifariş gətirən elçiyəm. Yox, hərgah insaf yolu ilə getməsəniz, bilin ki, öhdəmə düşən vəzifəni yerinə yetirməkdən geri çəkilən deyiləm". O düşmənlər soruşdular: "Sifarişin nədir?" Abbas cavab verdi: "Ey vəfasızlar, seçilmiş sonuncu Peyğəmbərin canının nəqdi, Tanrı razılığını qazanmışın (Həzrət Əlinin) gözünün işığı və Zəhranın ciyərinin bir parçası olan Kərbəla sultanı həzrətləri buyurur ki, bütün sədaqətli tərəfdarlarımı və havadarlarımı öldürdünüz, vaxt çatmadımı ki, baş vermiş əhvalatdan peşman olub bu cür susuzluq alovundan əzab çəkən qadınlara və uşaqlara bir içimlik su verəsiniz ki, qurumuş dodaqlarını isladalar. Həm də aman verəsiniz ki, onları götürüb Rum ölkəsinə tərəf, yaxud Hind və Çin istiqamətinə yönəlib Ərəb yarımadasını və Hicaz vilayətini sizə təslim edim? Bir də sizinlə bunu şərt kəsim ki, hətta Qiyamət günündə belə sizə qarşı qətiyyən qəzəbli olmayım".*

*Bu sözlər Yezid ordusunda həyəcan və qarmaqarışıqlıq əmələ gətirdi. Düşmən qoşunundakı bəzi şəxslər dərindən təəssüflənərək, ordu başçılarına qəsd etməyə hazırlaşdıqda Şimri-Zilcovşən, Şis Rəbii və Həcərüləhcar fitnə-fəsad törənməsindən qorxdular və boşuna başqa hərəkətlər etməyə imkan vermədən Həzrət Abbasla qarşı-qarşıya durub dedilər: "Ey Abbas, əgər bütün yer üzü sel-su ilə dolsa və onun qorunması bizim bacarığımız daxilində olsa, Yezidə beyət etməyənədək Hüseynə və ona tabe olanlara bir damcı su vermək əsla mümkün olan iş deyil".*

*Abbas ol camaatdan ümidini kəsdi. Odur ki, geriyə dönüb vəziyyəti imama bildirmək qərarına gəldi. Bu zaman Əhli-beyt uşaqlarının "Suzundan yandım, suzundan yandım!"*

................................

[249] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 317-318*





*qışqırıqları qulağına çatdı. O, bir neçə su qabı – məşk və tuluq götürərək qeyri-ixtiyari seltək Fərat çayına doğru yönəldi).*

Mətndə diqqəti çəkən ilk cəhət Həzrət Abbasın (ə) şəxsində diplomatik nümayəndəliklə peşəkar hərbçiliyin birləşməsidir. "Pəyamgüzar" və "müəddiyi-karzar" hər iki sahəni kifayət qədər aydın əks etdirir. "Ey qövmi-bimürüvvət" xitabı göstərir ki, Həzrət Abbas nəticəni qabaqcadan görürmüş. Onun şərtlə danışmasının səbəbi də budur.

Burada toxunulmasına ehtiyac duyulan başqa bir xüsusiyyət onun İmam Hüseyni (ə) təqdimidir. Doğrudur, bu təqdimat ilk baxışdan ənənəvi poetika ünsürü təsiri bağışlayır. Ancaq bunun yerini kiçiltməməklə birlikdə göstərməliyik ki, ifadələrin qafiyəliliyinin arxasında beş kimsənənin parlaq siması durur və həmin səs uyarlığı da bu tarixi və dini gerçəkliyin bədii əksinə xidmət edir.

Digər tərəfdən, Həzrət Abbas (ə) bununla adı müsəlman ola-ola İslamın canlı timsalı olan İmam Hüseynə (ə) qarşı yol verilən haqsız və zülmkar davranışa da işarə vurur. Onun bu işarəsində belə bir fikir də vardır ki, "Siz ey İmam Hüseynə qılınc qaldıranlar, imanınız yoxdursa, heç olmasa əhd-peymana sədaqətiniz olsun!" Ərəb millətçiliyinə belə üz tutması Həzrət Abbasın (ə) imamət qurumunu hər vəchlə xilasetmə istəyində nə qədər ardıcıl olduğunu sübuta yetirir.

Parçanın ideya-məzmun cizgiləri ilə bağlı diqqəti çəkən 3-cü cəhət Həzrət Abbasın (ə) İmam Hüseynin (ə) mövqeyini məntiqi ardıcıllıqla, şərtləri bir-bir sadalamaqla nəzərə çatdırmasıdır. Belə ki, onun dilindən çıxan təkliflər mənəvi-əxlaqi, xəlqi-milli, dini-məfkurəvi və hərbi-siyasi sferaları eyni zamanda özündə birləşdirir. Bu isə qarşı tərəfin acizliyini, cılızlığını bütün aydınlığı və genişliyi ilə açıb göstərir. Əsl səadətdən cəmi 50 il keçməsinə baxmayaraq, əqidəsizliyin, dönüklüyün, xainliyin ozamankı ərəb cəmiyyətində necə dərindən kök saldığını əyani surətdə nümayiş etdirir.

Mətndə fikir verilməsi lazım gələn başqa ştrix bir neçə sözlük yığcam təsvirdə düşmən ordusunda sərkərdələrlə sıravi qoşun arasındakı ziddiyyətin görümlü biçimdə əks



etdirilməsidir. Belə ki, “Bu kəlimatdən ləşkəri-Yezidə xüruşi-qülqülə düşüb, bə’zi mütəəssif olub ümərayi-ləşkərə qəsd etmək tədarükündə ikən” sözləri Həzrət Abbasın nitqindəki hökmü göstərdiyi kimi, sıravi əsgərlərin keçirdiyi hiss-həyəcanı da, ruhi-psixoloji gərginliyi də, dərhal əmələ gəlməyə başlayan və elə o andaca beşiyində boğulan qiyam əhvali-ruhiyyəsini də son dərəcə aydın şəkildə göz önündə canlandırır.

Hadisələrin sürəkli inkişafı qəhrəmanı daha tez qərar qəbul etməyə sövq edir. Belə ki, Həzrət Abbas (ə) İmam Hüseynə (ə) məlumat verməyə macal tapmamış Peyğəmbər xanədanı körpələrinin susuzluqdan çəkdiyi gözgörəsi dözülməz əziyyəti bir daha görər-görməz dərhal tədbir görür, o an döyüşə yollanır: “Və dört bin namərd ki, mühafizəti-Fərat içün müqərrər olmuşdu, Əbbası görüb, səvarü piyadə mütəvəccih olub tirbaran etdilər. Ol şiri-bişeyi-məhabət əndişə qılmayub, ol güruhə həmlə qılub, bir həmlədə yetmiş namərd dərəkati-cəhənnəmə göndərüb, tətimməsin pərakəndə qılub Fərata girdi. Əmma təmkin verməyüb, səvarü piyadə hücum edub, tirbaran etdilər. Ol nəhəngi-dəryayi-şücaət Fəratdan çıxub, yenə ol dəryayi-tüğyanə əsayi-Musa kibi çaklər salub geru, Fərata müraciət qıldı. İstədi ki, mərkəbin sirab edub, kəndü dəxi bir miqdar su içə, yenə Əhli-beytin ləbtəşnəvü cigərsuxtələri yadına gəlub, rəva görmədi ki, anlardan müqəddəm sirab ola. Əlqissə, bir içim su içmədən əlindəki məşkü mətharəyi pürab edüb çıxdıqda ol bədbəxtlər ətrafin alub, tirbaran edub, əsnayi-müharibədə Nofəl bin Əzrəqi-həramzadə qəfil tiği-bidiriğ urub, ol məzlumun saidi-yəminin bədəni-mübarəkindən cüda qıldı. Əbbas ol məşki əlindən buraxmayub, bazuyi-yəsarə salub, rəvan oldu. Bir həramzadə dəxi fürsət bulub, bir zərbə ilə bazuyi-yəsarın dəxi qə’t etdi. Rəvayətdür ki, ol saniyi-Cə’fəri-Təyyar və varisi-Heydəri-Kərrar ol məşki buraxmayub, mübarək dişləriylə kətfinə buraxub, rikabla ədayi ətrafindən mən’ edərdi və derdi. Şe’r:



Səbrdən qət'i-kəfü said bəni mən' eyləməz,
Nəxli qılmaz münhərif nöqsani-bərgü şaxsar!
Mərdi-meydani-bəlayam, qət'i-ə'zadən nə bak?
Şəhpəri-himmətdədir pərvazi-övci-iqtidar!"[250]

*(Fəratın qorunması üçün ayrılmış dörd min namərd Abbası görər-görməz atlı-piyada ona sarı yönələrək oxa tutdular. O igidlik meşəsinin şiri zərrəcə qorxmadan düşmən dəstəsinin üstünə hücum çəkdi, bircə həmlədə 70 namərdi cəhənnəmin təkinə göndərdi, yerdə qalanını pərən-pərən salaraq Fərata girdi. Ancaq atlı-piyadalı macal vermədən hücuma keçib, onu oxa tutdular. O igidlik dəryasının nəhəngi Fəratdan çıxıb, Musanın əsası kimi, yenidən o tüğyan dəryasını bölük-bölük edərək Fərata qayıtdı. İstədi ki, atını suvarsın, özü də bir az su içsin, ancaq Əhli-beytin dodağı susuzluqdan cadar-cadar olan və ciyəri od tutub yanan körpələrini yada saldığı üçün onlardan qabaq susuzluğunu yatızdırmağı özünə rəva görmədi.*

*Xülasə, Abbas bir içim su içmədən, əlindəki qabları ağzına kimi doldurub çaydan çıxdıqda o bədbəxtlər yan-yörəsini sararaq yenidən onu oxa tutdular. Novfəl bin Əzrəqi – haramdan əmələ gələn o qafil var gücü ilə qılınc çalıb o məzlumun sağ qolunu bədənindən ayırdı. Lakin Abbas su məşkini əlindən yerə salmadan sol qoluna keçirərək yoluna davam etdi. Bu zaman başqa bir haramzadə fürsət tapıb bir zərbə ilə onun sol qolunu da vurub saldı.*

*Deyilənlərə görə, o ikinci Cəfəri-Təyyar və Heydəri-Kərrar su məşkini yerə düşməyə qoymadan mübarək dişləri ilə çiyninə qoyaraq atı ilə düşmənləri ətrafından uzaqlaşdırırdı və bu sözləri deyirdi ki: "Əlin-qolun kəsilməsi, vurulub salınması qətiyyən məni səbirdən uzaqlaşdıra bilməz, çünki yarpaq və budaqlarının budanması əsla xurma ağacını barsız etməz! Mən bəla meydanının mərdiyəm, bədən üzvlərimin*

.................................

[250] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 318*



*kəsilməsindən nə qorxum olacaq?! Bacarıq zirvəsində uçmaq qeyrət və ismət qanadları ilə mümkündür!”).*

Mətn büsbütün su motivi üzərində qurulmuşdur. Ümumiyyətlə, bu motiv “Hədiqətüs-s-süəda”da aparıcı yer tutur. Əsərin “Cənabi-Qasim” fəslində su motivinin işlənmə məqamlarını geniş araşdırdığımızdan burada yalnız “Həzrət Abbas” fəslinə xas cəhətlərə toxunacağıq.

Oradan başlayaq ki, Yezid ordusu təbii insan ehtiyatlarını belə özlərinin çirkin niyyətlərinə alət etməkdən çəkinməmiş və bununla da ənənəvi müharibə qaydalarını kobud surətdə pozmuşlar. Ötəri deyildir ki, onlar Fərat çayının qorunmasından ötrü dörd min əsgər ayırmışlar. Həmin əsgərləri “namərd” adlandırması Füzulinin bu çirkin hərəkəti qəti surətdə pislədiyini göstərir.

Parça bir yanda o böyüklükdəki Fərat çayını, bir yanda isə susuzluqdan dili-dodağı qabar çalan köməksiz qız-gəlini, qadın və uşaqları qabarıq əks etdirir. Ancaq bu inikas qətiyyən çılpaq publisistik üslubda olmayıb, həzin bədii-estetik təhkiyə ilə verilir. Abbasın iki dəfə Fərat çayına girməsinin bir-birini tamamlayan təsvirləri bunu göstərir.

“İgidlik dəryasının nəhəngi” və “tüğyan dəryası” ifadələri su motivinin parçadakı başqa maraqlı işlənmə məqamıdır. Ona görə yox ki, birinci ifadə Həzrət Abbas (ə), ikincisi düşmən ordusu haqqındadır, bunun özü də bədii gözəllikdir. Ancaq nəzərə alınmalıdır ki, Füzuli Həzrət Abbasın (ə) igidliyini büsbütün su ilə bağlamış, suyun həyati tələbat olaraq əvəzsiz yeri üzərində qurmuşdur. Belədə öz qəhrəmanını Musanın əsasına bənzətməsi bu ulu din böyüyünün əsil-nəsəb və siqlət köklərini göstərməklə yanaşı, istiarə olaraq Nil çayını da, Musanın öz əsası ilə Nildə 12 qol açmasını da mətnə gətirir ki, bu da yalnız şairin öz qəhrəmanının əlçatmaz-ünyetməz ucalığını daha qabarıq biçimdə nəzərə çarpdırma istəyinə qulluq edir. Odur ki, Yezid ordusuna aid edilən “tüğyan dəryası” ifadəsi də istər-istəməz Nildə boğulan Fironu və dəstəsini assosiativ olaraq mətnə gətirmiş olur ki, bu da başqa bir bədii özümlülükdür.



Su motivinin parçadakı işlənmə məqamları sırasında belə bir incəlik də diqqəti çəkir ki, Həzrət Abbas (ə) özü susuz ola-ola atını suvarmaq istəyir. Əski mifik və folklor qaynaqlarımızı andıran bu ştrixin içərisində, əslində, dərin tarixi keçmişimizə gedib çıxan və xəlqi milli adət-ənənələrə söykənən dəyərli etnoqrafik cizgilər gizlənməkdədir. “At igidin qardaşıdır” səpkili atalar sözləri belə bilgilərlə zəngindir.

“Bir mıx bir nalı, bir nal bir atı, bir at bir igidi, bir igid bir eli saxlar” atalar sözü isə malik olduğu xəlqi milli və bədii-estetik xüsusiyyətlər etibarilə sanki Həzrət Abbasın (ə) boyuna biçilmişdir. Ötəri deyildir ki, həmin idiom əsərin “Həzrət Abbas” fəslinin folklor versiyası kimi görünür. Deməli, Füzuli təkcə xalqdan almaqla qalmamış, həm də faydalandığı uca mətləbləri cilalayaraq daha incə biçimdə yenidən xalqa bəxş etmişdir.

Su motivinin fəsildəki işlənmə məqamlarının kulminasiya nöqtəsini Həzrət Abbasın (ə) Əhli-beytin susuzluğunu anaraq özünün su içməməsi və yalnız əlindəki qabları su ilə doldurması səhnəsi təşkil edir: “İstədi ki, atını suvarsın, özü də bir az su içsin, ancaq Əhli-beytin dodağı susuzluqdan cadar-cadar olan və ciyəri od tutub yanan körpələrini yada saldığı üçün onlardan qabaq susuzluğunu yatızdırmağı özünə rəva görmədi. Xülasə, Abbas bir içim su içmədən...”

Parça istər leksikon, istərsə də bədii-estetik təqdimatca şairin “Su” qəsidəsi ilə tutuşdurula bilər. Çünki hər iki əsərdə su anlayışı özünün bütün əlamətləri üzrə çevik və işləkdir. O, hər iki əsərdə hərdən predmet, hərdən səbəb-imkan-nəticə zəncirinin bir halqası, hərdən element, hərdən komponent, hərdən irfani fəlsəfi qat, hərdən estetik fiqur, hərdən də bədii vasitə kimi biri o birindən əlvan və dolğun olan boyalar alır. Elə buna görədir ki, mürəkkəb ərəb-fars izafətlərinin arasında doğma türkcənin “bir içim su” deyimi dərhal gözə dəyir və dərhal da yad leksikondan gərilmiş, tarıma şəkilmiş əsəb tellərinə su səpir.

Ən nəhayət, bu baxımdan görməmək olmaz ki, Füzuli Həzrət Abbasın misilsiz igidliyini qələmə alarkən onun suyu



bayrağa çevirdiyini ayrıca vurğulayır, bunu məxsusi hüsn-rəğbətlə təsvir və tərənnüm edir. Təsvir nəsrlə, tərənnüm isə şeirlədir: “Novfəl bin Əzrəq – haramdan əmələ gələn o qafil var gücü ilə qılınc çalıb o məzlumun sağ qolunu bədənindən ayırdı. Lakin Abbas su məşkini əlindən yerə salmadan sol qoluna keçirərək yoluna davam etdi”.

Poetik örnək zahirən sudan uzaq görünür. Ancaq qolları qələm olunan Həzrət Abbasın (ə) budanan xurma ağacına bənzədilməsi ağac, yaşıllıq fonunda su motivini assosiativ olaraq göz önünə gətirir. Su məşkini yerə düşməyə qoymadan mübarək dişləri ilə çiyninə qoyan və qolları qələm edildiyi üçün yalnız atı ilə düşmənləri ətrafından uzaqlaşdıran qəhrəman durmadan deyirmiş:

Səbrdən qət’i-kəfü said bəni mən’ eyləməz,
Nəxli qılmaz münhərif nöqsani-bərgü şaxsar!
Mərdi meydani-bəlayam, qət’i-ə’zadən nə bak?
Şəhpəri-himmətdədir pərvazi-övci-iqtidar!

Qollarının qılınclanıb çalınmasını xurma ağacının qol-budağının budanmasına bənzədən Kərbəla igidi “Məni heç nə səbirdən uzaqlaşdıra bilməz” deyə nərə çəkərkən barının-bəhərinin əbədi axirət yurdunda yığıla biləcəyini nəzərdə tuturdu. Müqəddəs Kitabımızın aşağıdakı ayələri sanki müqəddəslərimiz sırasında yer alan bu ulu şəxsiyyət üçün nazil olmuşdur: “Ey iman gətirənlər, sizə sizi şiddətli əzabdan qurtaracaq ticarəti göstərimmi? Allaha və Peyğəmbərinə inanacaqsınız, mallarınız və canlarınızla Allah yolunda cihad edəcəksiniz! Əgər bilsəniz bu, sizin üçün olduqca xeyirlidir (hərgah belə etsəniz), Allah sizin suçlarınızdan keçər, sizi altından arxlar axan bağlara aparar və Ədn cənnətlərindəki gözəl sarayların sakininə çevirər” *(“Səff”, 10-12)*.

Göründüyü kimi, Həzrət Abbasın (ə) dilində “səbir” sözü yarpaq və budaqlarının budanmasına mətanətlə duruş gətirərək “qət’i-ə’zadan nə bak?” *(bədən üzvlərinin itirilməsindən nə qorxu)* deyə hayqıra bilmək “əzəli-əbədi” qeyrət və ismət



anlamına gəlir. Bu, bir yandan surətin portretləşdirilməsidirsə, o biri yandan Kərbəla igidinin uca islami dəyərlərin ən ləyaqətli təmsilçisi kimi nəzəriyyəni qanı bahasına gerçəkləşdirməsinin ifadəsidir.

Yəqin, elə buna görədir ki şeir ruhən Məcnunun məşhur "Ya Rəbb, bəlayi-eşq ilə qıl aşina məni" münacatını yada salır. Əgər Məcnun münacatını mühitin sıxıcı-boğucu təzyiqinə etiraz səsi kimi deyirdisə, Həzrət Abbas onu doğram-doğram doğrayan, qanını su yerinə axıdan Yezid üsuli-idarəsinə, mənəviyyatsız, münafiq, satqın məmurlara qarşı çılğın üsyan kimi hayqırırdı.

* * *

Şeirin ideya-məzmun xüsusiyyətlərindən biri də Həzrət Abbasın (ə) Cəfəri-Təyyara bənzədilməsidir. Doğrudur, "sanii-Cəfəri-Təyyar" metaforu fəslin nəsr yerindədir. Ancaq "qət'i-kəfü said" *(çiyinin, qolun vurulub salınması),* "nöqsani-bərgü şaxsar" *(yarpaqların tökülməsi və budaqların budanması),* "qət'i ə'zadan nə bak" *(bədən üzvlərinin itirilməsindən qorxmamaq),* "mərdi-meydani-bəla" *(sınaq meydanının igidi)* ifadələri dolayısı ilə, "şəhpər, pərvaz, ovc" *(qanad, uçmaq, ucalıq)* ifadələri isə bilavasitə şeiri Cəfəri-Təyyarla bağlayır.

"Cəfəri-Təyyar ibn Əbu Talib – İslam dini tarixində adı hörmətlə yad edilən şəxs. İmam Həzrət Əlinin (ə) böyük qardaşıdır. Allahın vahidliyinə, İslam dininə və Məhəmməd Peyğəmbərə (s) ilk iman gətirənlərdən biri olmuşdur. Rumilərlə Mötə döyüşündə qətlə yetirilmişdir. Azərbaycan klassik ədəbiyyatında adı xatırlanır. Haqqında əldə ətraflı məlumat yoxdur"[251]. Rəsulullah onun vurulub salınmış qollarının yerinə Allahın ona iki qanaq verdiyini və Cəfərin onlarla uçub cənnətə getdiyini bildirmişdir.

Göründüyü kimi, Füzuli bölümün nəsr yerində yaratdığı istiarəni şeir yerində müstəqil portret-obraza çevirmişdir. Bu da bir daha onun Həzrət Abbasa (ə), Həzrət Abbasın (ə) İmam

.................................

[251] *Buzovnalı Rəhimağa İmaməliyev. İslam ensiklopdiyası, Bakı, 1997, səh. 514*





Hüseyn (ə) eşqi ilə dolu olan könlünə bəslədiyi sonsuz sayğı və sevgini göstərir. Axı irfanda belə bir qayda vardır: "Sevgilinin sevdiklərini sevmək". Mövlanə Cəlaləddin Rumi ilə bağlı bu gün də dildə-ağızda gəzib dolaşan bir sıra mənqəbələr bu qayda üzərində qurulmuşdur. Kitabın "İmam Hüseyn aşiqi Füzuli" adlandırılmasının bir səbəbi də elə budur.

Şeirdəki "himmət" sözü bütövlükdə mətn üçün bir açar olub, "Həzrət Abbas qeyrəti" anlayışını da özündə birləşdirir. "Taməmə" kökündən gələn "təmiyyət" sözü *əqidə və amal uğrunda durmadan çalışmaq* anlamını verir. Tarix boyu mütəfəkkirlər "Himməti İslamiyyə, müsəlman himməti" deyə çeşidli fikirlər söyləmiş, müxtəlif məzhəb və təriqətlərin bu barədəki fəlsəfi mövqelərini uzlaşdırmağa can atmış və ayrı-ayrı imperiyaların boyunduruğu altında əzilən müsəlman xalqların dini təəssübkeşlik hisslərini oyatmağa səy etmişlər. XX yüzilliyin başlanğıcından Cəmaləddin Əfqani, Əli bəy Hüseynzadə, Ziya Gökalp, Hüseyn Cavid, Ömər Faiq Nemanzadə kimi filosof və ədiblər bu dini-fəlsəfi zəmində yetişərək dünya mədəniyyətinin korifeylərinə çevrilmişlər.

Ancaq elə buradaca onu da qeyd etməliyik ki, adları sadalanan mütəfəkkirlərin heç biri nəinki Həzrət Abbasa (ə), hətta İmam Hüseynə (ə) belə ayrıca əsər həsr etməmişlər. Onlardan bəziləri bunu dini vəhdət naminə etdiklərini bildirmişlər. Ancaq özlüyündə güntək aydındır ki, bu, belə olmamışdır. Çünki hər bir sağlam mühakimə sahibi Kərbəla vaqeəsini malik olduğu bütün keyfiyyətləri ilə birlikdə qəbul etməyə borcludur.

"Həzrət Abbas qeyrəti" anlayışına belə geniş spektrdə baxdıqda aydın olur ki, bu anlayış mahiyyətini Qurani-Kərimdən, Peyğəmbər sünnəsindən və Həzrət Əli (ə) xislətindən götürür. "Ğəyur" *(qeyrət sahibi)* sözünün Allahın adlarından biri olması vaxt ötdükcə dini təriqət və fəlsəfi cərəyanlara təsir göstərmiş, çeşidli irfani-təsəvvüfi mətləblərin ortaya çıxmasına yol açmışdır. "Qeyrət" sözü *başqasının iştirakını istəməmək* deməkdir. Sufilər Allahın yaxınlığına onun sirlərini dərk edə bilməyənləri buraxmamaq,



müqəddəsliyini hifz etmək mənasında bu sözdən istifadə edirlər. "Allah-taala hamıdan qeyrətlidir və şirk günahını heç vaxt bağışlamır. Onun qeyrəti ikitərəfli olur: aşiqi və məşuqi".

Mütəsəvviflər Tanrını "Şahi-qeyrət", "Sultani-qeyrət" adlandırırlar. Leylinin toy gecəsi İbn Səlamı yaxınına buraxmaması, onu "Qeyrət qılıncına əl uran cin"lə qorxutması Həqq-taalanın qeyrəti-məşuqisinə bir misaldır"[252].

"Həzrət Abbas qeyrəti" anlayışının formalaşmasında aparıcı amil "Əlinin qəzəb oğlu" səciyyələndirməsidir. Təfərrüata varmadan deyə bilərik ki, bəzən ifrat həddə çatmasına baxmayaraq, belə təsəvvürlər, əslində, dinlərin çoxunda var. Digər tərəfdən, unutmayaq ki, belə təsəvvürlər metafizik dünyaduyumunun məğzini təşkil etdiyi üçün onları dərhal mövhumat, xurafat nişanəsi elan etmək olmaz. Bu, İslam dininə və onun şiə məzhəbinə də aiddir.

İstər tarixi qaynaqda, istərsə də "Hədiqətü-s-süəda"da Həzrət Abbas (ə) ilk növbədə həyati tələbat olan su uğrunda mübarizə aparan qəhrəman olaraq təqdim edilir. Odur ki, onun heybəti, nüfuzu və bundan irəli gələn qəzəbi barəsindəki təsəvvürlər, eləcə də həmin təsəvvürlər əsnasında yaranan mənqəbələr prinsipcə ümumbəşəri mahiyyət daşımaqda və İslam dininin başlıca müddəalarına tamamilə cavab verməkdədir.

* * *

Fəsil belə bitir: "Nagah bir həramzadə dəxi zəxmi-navəki-dilduzla ol məşki dəlüb anda olan su məzlumlar əşki kibi və şəhidlər qanı məsabəsində xaki-Kərbəlaya töküldü. Əbbas ol vaqeədən pərişan olub ahi-cigərsuz sineyi-püratəşdən çəküb ayıtdı: "Ya Rəbb, bu nə halətdir ki, bir qətrə su Əhli-beytə nəsib olmaz?!" Hatifdən nida gəldi ki: "Ey məzlum, hüsuli-dərəcati-üxrəvi asan olmaz və cəfa çəkmədən heç salik mənzili-məqsuda dəstrəs bulmaz". Şe'r:

..................................

[252] *Məmmədli N. Füzulinin "Leyli və Məcnun" əsərində təsəvvüf və bədii ifadə sistemi, avtoreferat, Bakı, 2000, səh. 18*



Fəraq atəşi rövşən qılub çirağı-vüsal,
Hərarəti-ətəş eylər ziyadə zövqi-zülal.

Əlqissə, Əbbasi-Əli ol iki zəxmi-mühliklə mərkəbdən düşüb nərə urdu ki: “Ya əxi, ədrik əxakə”. Hüseyni-məzlum ol avazı istima’ edib fəğan etdi ki: “Ə’lanə ənkəsərə zəhri”, yəni “İmdi belim sındı”. Və bir ahi-cigərsuz çəkdi ki, zəmini-Kərbəla mütəzəlzil oldu. Şe’r:

Getdi ol sərvi-səmənbər ki, dilaramım idi,
Rahəti-sinəvü kami-dili-nakamım idi.

Rəvayətdir ki, Məhəmməd Ənəs həzrəti-imam xidmətində idi. Həzrəti-Əbbasın avazın istima’ etdikdə və ol səda istima’indən şahzadə Hüseynin iztirabın gördükdə mütəvəccihi-meydan olub gördü ki, Həzrəti-Əbbas ağüşteyi-xakü xun olub can vermiş. Kəndüsin anın üzərinə buraxub şivən edərkən ləşkəri-müxalif səvarü piyadə tirbaran edüb anı dəxi şəhid etdilər. Rəhmətullahi əleyhi”[253].

*(Qəfildən başqa bir haramzadə iti bir ox atışı ilə o məşki dəldi. Onda olan su məzlumların göz yaşı kimi və şəhidlərin qanına bənzər şəkildə Kərbəla torpağına axıb töküldü. Abbas bu hadisədən kədərlənərək odlu sinəsindən bir ciyəryandıran ah çəkib dedi: “Ya Rəbb, bu nə işdir ki, Əhli-beytə bir damcı su nəsib olmur?”*

*Qeybdən səs gəldi ki, “ey məzlum, axirət dərəcələri asanlıqla əldə edilə bilməz və əzab-əziyyətə qatlaşmadan heç bir mübarizin məqsəd mənzilinə əli çatmaz!”*

*“Ayrılıq odu görüş çırağının daha gur yanmasına yol açar, susuzluğun gətirdiyi qızdırma cənnət zülalının dadını bir az da artırar”.*

*Xülasə, Abbas o iki öldürücü yara ilə atdan yıxılaraq nərə çəkdi ki, “ey qardaş, qardaşının dadına yet”.*

..................................

[253] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 318-319*



*Məzlum Hüseyn o səsi eşidərək nalə etdi ki, "mənim belim indi sındı". O, elə bir ciyəryandıran ah çəkdi ki, Kərbəla torpağına zəlzələ düşdü.*

*"Ürəyimin toxtağı olan o yasəmən ətirli sərv əlimdən getdi. O, mənim könül dincliyim və nakam qəlbimin arzu-kamı idi!"*

*Deyilənlərə görə, bu zaman Mühəmməd Ənəs imamın qulluğunda dayanmışdı. O, Həzrət Abbasın səsini eşidəndə və o səsi eşidən Hüseynin iztirablarını görəndə meydana üz qoyub gördü ki, Həzrət Abbas toz-torpağa bulaşaraq və qanına bələşərək artıq can vermişdir. O özünü onun üstünə atıb ağlarkən düşmən qoşunu atlı-piyadalı oxa tutaraq onu da şəhid etdi. Allah hamısına rəhmət eləsin).*

Göründüyü kimi, burada da su motivi öndədir. Belə ki, şair motivin yuxarıdakı təsvir və tərənnümünü genişləndirərək ona bir qədər də insani keyfiyyətlər verir. Dəlinən məşkdən Əhli-beytə qismət olmadan yerə axıb-tökülən suyun məzlumların göz yaşına və şəhidlərin qanına bənzədilməsi buna bariz dəlildir. Oxucu bəlkə bununla təsəlli və təskinlik tapar ki, Əhli-beytə qismət olmayan su onların uyuduğu "xaki-Kərbəla"ya tökülür.

Göz yaşı ilə qanın maye olma baxımından suya bənzədilməsi böyük sənətkarlıq istəmir. Burada Füzuli sənətinin böyüklüyünü göstərən cəhət dəlinən məşkin, göz yaşının, şəhidlər qanının və Kərbəla torpağının sintez yaratmaqla qız-gəlinin, körpələrin əzab-əziyyətini eyni qayə ətrafında və vahid müstəvidə əks etdirməsidir. Gör iş nə yerə çatır ki, dözüm-dəyanət və səbir-mətanət timsalı olan Həzrət Abbas (ə) belə duruş gətirə və tab edə bilməyərək Tanrı qatına üz tutub gileylənir: "Ya Rəbb, bu nə halətdir ki, bir qətrə su Əhli-beytə nəsib olmaz?!"

Qeybdən gələn "Ey məzlum, axirət dərəcələri asanlıqla əldə edilə bilməz" cümləsi Qurani-Kərimin "Hansınızın daha yaxşı işlər gördüyünü sınamaq üçün Allahın ərşi ilkin olaraq su üzərində qərar tapmışdı" *("Hud", 7)* şəklindəki ilahi bəyanatı ilə üst-üstə düşür. Bu da motivin islami baxımdan tamamilə əsaslı olduğunu təsdiq edir. Şeirdəki "Hərarəti-ətəş eylər



ziyadə zövqi-zülal!" *(Susuzluğun gətirdiyi qızdırma cənnət zülalının dadını bir az da artırır)* qənaəti də bu danılmaz gerçəkliyin parlaq inikasıdır.

Hissə başqa parlaq bədii-estetik məziyyətlərinə görə də diqqəti çəkir.

**1. "Hatif".** Hətta XX əsr dramaturgiyamıza da gəlib çatan bu anlayış ədəbiyyatımızın milli-mənəvi və islami dəyərlərin üzvi vəhdəti üzərində qurulduğunu bir daha sübuta yetirir. Kökü şamanizm kimi əski təsəvvürlərə gedib çıxan qeybdən səsgəlmə motivi sonralar İslamda "qeyb" adlanan ayrıca sistemin formalaşmasına yol açmışdır. Ancaq burada ümdə cəhət vəhyin Rəsulullahın rəhməti ilə kəsilməsinə baxmayaraq, Həzrət Abbasa (ə) Tanrı qatından cavab verilməsidir. Bəs bu nə deməkdir?

Təfsilata varmadan deyə bilərik ki, Füzulinin gözündə bu şəxsiyyət bir övliyadır və ona qeybdən cavab verilməsini şair öz qəhrəmanının kəraməti olaraq təqdim edir. Bəllidir ki, Peyğəmbərdə möcüzə, imam və övliyada kəramət, kafirdə isə istidraz (gözboyama) olar.

**2. "Ey məzlum".** Qeybdən gələn səsin bu xitabla başlaması qətiyyən ötəri deyil. Zənnimizcə, Füzuli bununla Həzrət Abbasın (ə) məzlumluğunu önə çəkmək istəmişdir. Bu məfhumun nədən ibarət olması isə tamamilə başqa məsələdir.

Əlbəttə, heç kəs "Əlinin qəzəb oğlu"nu aciz, çarəsiz, yazıq göstərə bilməz. Füzulinin də məqsədi bu olmamışdır. Məsələnin məğzini Həzrət Abbasın (ə) misilsiz igid və tükənməz güc-qüvvət sahibi ola-ola bir neçə alçaq və xainin qarşısında Əhli-beytin dodaqları susuzluqdan cadar-cadar olan körpələrini sona kimi müdafiə edə bilməməsi və bundan duyduğu ağır xəcalət hissi təşkil edir. Ötəri deyildir ki, İmam Hüseyn (ə) yalnız bu Kərbəla igidi üçün "Mənim belim indi sındı" deyə fəryada gəlmişdir. Füzuli deyir ki, "O, elə bir ciyəryandıran ah çəkdi ki, Kərbəla torpağına zəlzələ düşdü".

Ən nəhayət, Həzrət Abbasın (ə) məzlumluğu, əslində, bütün arxasızların, bütün köməksizlərin, o sıradan da İmam



Hüseynin məzlumluğudur. Odur ki, bu anlayış əsərin bu bölümündə xitab olmaqla qalmır, əksinə, söz və deyimlərin alt qatında aydın və parlaq bir obraz kimi boy göstərir.

**3. "Hüsuli-dərəcati-üxrəvi".** Asanlıqla *axirət dərəcələrinin qazanılması* şəklində sadələşdirə biləcəyimiz bu ifadə, əslində, dərin məzmunlu islami anlayışdır. Belə ki, dinimizə görə, möminlər axirətdə "altlarından arxlar axan cənnətlərə *("Bəqərə", 25),* Ədn *("Məryəm", 61),* Firdovs *("əl-Mu′minun", 11),* Mə′va *("əs-Səcdə", 19),* Nə′im *("Yunus", 9)* cənnətlərinə daxil olarlar və orada həmişəlik qalacaqlar *("Bəqərə", 82),* cənnətlərdə meyvə ilə ruzilənərlər *("Bəqərə", 25)*, ruziləri səhər-axşam hazırdır *("Məryəm", 60),* orada kərim bir ruziyə qovuşarlar *("əl-Həcc", 50),* cənnət bağçalarında *("əş-Şura", 22)* və cənnətin uca köşklərində *("əl-Ənkəbut", 58)* nəşələnərlər *("ər-Rum", 15),* hüzur və sakitlik içərisində yaşayarlar *("Səba", 37),* qızıldan bilərziklər taxarlar, incə və qalın dibadan *("əl-Kəhf", 31)* və ipəkdən libaslar geyinər, incilər taxarlar *("əl-Həcc", 23),* taxtlara söykənərlər *("Sad", 31),* tayı-bərabəri olmayan kölgəliklər *("ən-Nisa", 57),* təmiz həyat yoldaşları *("Bəqərə", 25),* böyük əcr *("əl-Maidə", 9),* gözəl mükafat *("əl-Kəhf", 2),* yüksək dərəcələr *("Taha", 75),* daimi nemətlər *("Fussilət", 2)* və nur *("əl-Hədid", 19, 28),* bir sözlə, dilədikləri hər şey var *("əş-Şura", 22)*. Allah möminləri etdiyi əməllərin ən gözəli ilə mükafatlandıracaq *("ən-Nəhl", 97),* mükafatlarını tamam-kamal verəcək *("Ali-İmran", 57),* gördükləri işlərin artıqlaması ilə onları mükafatlandıracaq *("ər-Rum", 45),* əcrlərini zay etməyəcək *("Ali-İmran", 171)* və dünyadakı cəhdlərini boşa çıxarmayacaq *("əl-Ənbiya", 94),* onları bağışlayacaq *("əl-Maidə", 9),* onlardan razı olacaq *("əl-Bəyyinə", 8).* Möminlər axirətdə ədalətlə qarşılaşarlar *("əl-Maidə", 4)* və əsla zülmə məruz qalmazlar *("Məryəm", 60),* onlar üçün qorxu yoxdur və onlar kədərlənməyəcəklər *("Bəqərə", 62),* zülmdən və hüquqlarının pozulmasından qorxmayacaqlar *("Taha", 112).* Möminlər axirətdə qurtuluşa qovuşmuş *("əl-Əraf", 8)* və cənnət əhli olmuşlar *("Bəqərə", 82),* xoşbəxtlik və ən gözəl gələcək onlarındır *("ər-Rə′d", 29).*



Quranda "İman gətirənlər və saleh əməllər edənlər" deyə başlanan cənnət və onun nemətlərinin vəd edildiyi 56 ayə var"[254].

İslami qaynaqlarda cənnət əsasən belə təsvir olunur: "Qızıl-gümüşdən, inci örpəkdən bir-birinin üstündə olan, lazım gəldikdə içərisindən bayırı, bayırından da içərisi görünən cürbəcür ev, oba, qəsr və çadırlar. Sıx budaqlı və yarpaqlı, geniş kölgəli, müxtəlif meyvəli, çox gözəl qoxulu, bu dünyada görünməmiş ağaclar".

*"Nisa"* surəsinin 58-ci ayəsinə görə, əbədi cənnət səadəti 4 zümrəyə – peyğəmbərlərə, siddiqlərə, şəhidlərə və salehlərə nəsib olacaqdır.

Bu bilgilər "füsuli-dərəcati-üxrəvi" tərkibində əksini tapmış əbədi axirət mükafatının özünün bütün əlamətləri ilə Həzrət Abbasın (ə) halına şamil olunduğunu, Füzulinin öz qəhrəmanını əzəli-əbədi cənnət nemətlərinin hamısına layiq bildiyini göstərir. Bu da nəinki bu bölümün, bütövlükdə əsərin orijinal məziyyətlərindən birini təşkil edir və şairin İmam Hüseynlə (ə) yanaşı, Həzrət Abbas (ə) aşiqi olduğunu da sübuta yetirir.

**4. "Cəfa çəkmə".** Bəllidir ki, Şərq şeiri büsbütün əzabkeş, fədakar və dözümlü aşiq tipi üzərində qurulmuş, lirik "mən"in gərgin və yorucu sıxıntı və üzüntülərinin tərənnümünə ayrılmışdır. Əlbəttə, bunun qnoseoloji, sosial və psixoloji səbəbləri var, problem köklü araşdırmaya möhtacdır. Ancaq indiki halda bizi maraqlandıran bu motivin məqtəl ədəbiyyatında hərb işinə tətbiq edilməsidir. Odur ki, Hatifin "Cəfa çəkmədən heç salik mənzili-məqsudə dəstrəs bulmaz!" cavabını

Füzuli, dəhrdən kam almaq olmaz olmadan giryan!
Sədəf su almayınca əbri-nisandan gühər verməz! –

mənasında başa düşmək yanlış olardı.

..................................

[254] *Qaragöz İ. Qurana görə insana verilən dəyər və görəv, Ankara, 1996*





Həzrət Abbasın (ə) çəkdiyi cəfa ilk növbədə mənəvi səciyyə daşıyır. Çünki vuruşma, döyüş texnikası nümayiş etdirmə, bir-birindən çətin hərb oyunları göstərmə onun üçün adi bir iş idi. Bir daha qeyd edirik ki, Füzuli başqa Kərbəla şəhidlərinə baxanda Həzrət Abbasın (ə) şücaətindən çox su uğrunda apardığı insani mübarizəni təsvir edir. Bu isə səbəbsiz ola bilməzdi.

Əlbəttə, hər iki qolunun vurulub salınması da, Əhli-beyt üçün gətirdiyi tuluğun oxlanması da, bir bayraqdar olaraq İslam ordusunun gözü önündə nümayişkaranə surətdə qətlə yetirilməsi də özlüyündə böyük cəfadır. Ancaq Həzrət Abbas (ə) onsuz da bunların hamısını gözünün altına almışdı. Odur ki, cəfaçəkmə anlayışı burada özünün ictimai-mənəvi və ruhi-psixoloji qatları ilə önə çıxır, qəhrəmanı da məhz bu yöndə səciyyələndirir.

**5. “Salik”.** Sırf sufilik termini olan və ətrafında dərin və geniş təsəvvüfi-irfani halə əmələ gətirən bu anlayış Şərq ədəbiyyatında çoxqatlı və çoxşaxəli işlənmə məqamlarına malikdir. Məşhur “Saliki-rahi-həqiqət eşqə eylər iqtida” *(Həqiqət yolunun yolçusu yalnız məhəbbətə söykənər)* misrasının da dəqiq bildirdiyi kimi, Şərqin böyük mütəfəkkirlərinin, demək olar ki, hamısı müəyyən dərəcədə cəfakeş və fədakar eşq yolçuları, məhəbbət fəadiləri olmuş, az qala yazdıqları kimi də yaşamışlar. Sözlə işin uyğunluğu ilə birlikdə bu, gerçəkliklə təxəyyülün də, reallıqla əfsanənin də, bilinənlə bilinməzin və görünənlə görünməzin də sirli-sehrli bir biçimdə vəhdəti idi. Ancaq bunu kor-koranə surətdə təkcə İslamla bağlamaq, yalnız müsəlman mədəniyyətinin faktı saymaq olmaz.

“Heç salik” *(heç bir eşq yolçusu)* epitetini Həzrət Abbasa (ə) aid etməsi Füzulinin öz qəhrəmanına peyğəmbər və övliyalardan biri kimi baxdığını, onu onların dönməz ardıcılı saydığını göstərir. Yuxarıda Həzrət Abbasın (ə) dilindən söylənilən şeirin Məcnunun məşhur Kəbə münacatını xatırlatdığını demişdik. Qeyd etmək yerinə düşərdi ki,



Füzulinin gözündə saliklik baxımından da Həzrət Abbas (ə) və Məcnun yaxındır. Tədqiqatçıların müəyyənləşdirdiklərinə görə, “Füzuli Məcnununun həyatının ilk dövrlərindən tutmuş son günlərinədək baş verən bütün hadisələri araşdırarkən mərğubü qeyri-salik olduğunu görürük. Yəni Məcnun, əslində, sülukundan xəbəri olmayan salikdir. Əsərdən də göründüyü kimi, Məcnunun həyatında səbir, şükür, təvəkkül, riza, təcərrüd, fəqir, heyrət, istiğna, səna, bəqa və s. olduqca təbii, hiss olunmadan bir-birini əvəz edir”[255].

“Hədiqətü-s-süəda”nın “Həzrəti-Abbas” fəsli də belədir. Çünki Həzrət Abbas (ə) da bir Məcnundur. Onun “Leylisi” isə bəşəriyyət tarixində heç bir övliyanın indiyədək götürə bilmədiyi ağır yükü götürmüş və beləliklə də Tanrı sınağından alnıaçıq, üzüağ çıxaraq Allah dərgahında misilsiz ilahi rəhmət qazanmış İmam Hüseyndir (ə). Odur ki, “Cəfa çəkmədən heç salik mənzili-məqsudə dəstrəs bulmaz!” cümləsinə ənənəvi mətn kimi yox, gizli informasiya qaynağı kimi yanaşılmalı, onun öz çevrəsində birləşdirdiyi mətləbləri:

Dağlamaz hər şükufə meyvəyi-tər
Əksəri bitdiyi yerində itər!

Və ya:

Hərifi-ərreyi-ğəm sanma hər quru ağacı
Ki, yazılur Zəkəriyya adına ol mənşur, –

səpkili beytlərin məna-məzmunundakı mətləblərə uyğun qavramalıyıq.

**6. “Ya əxi, ədrik əxakə”.** Bu cümləni ərəbcə verməsi özlüyündə şairin qəhrəmanının son anlarını təbii təsvir etmək istəyindən doğmuşdur. Ancaq zənnimizcə, bu, Füzulinin sənət miqyası üçün çox kiçikdir. Çünki istər tarixi qaynaqlarda,

.................................

[255]*Məmmədli N. Göstərilən əsəri, səh. 27*



istərsə də mənqəbələrdə nəql olunur ki, son nəfəsinədək Həzrət Abbas (ə) İmam Hüseynə (ə) "qardaş" deyə üz tutmamış, həya pərdəsini qoruyub saxlayaraq həmişə ona "ağa" demişdir. Deməli, Füzuli burada alt qatda da olsa, bu Kərbəla igidini diləyinə qovuşdurmuş, onsuz da körpələrin yanında su xəcalətlisi olaraq dünyadan gedən Həzrət Abbasın (ə) son nəfəsində onun dilində İmam Hüseynə (ə) ünvanlanan "qardaş" çağırışını var gücü ilə səsləndirmişdir. Bu isə Kərbəla vaqeəsinin yalnız döyüş-vuruş yeri olmadığını, böyük bir ədəb-ərkan məktəbi də olduğunu bir daha göstərir.

**7. "Əl-ənə ənkəsərə zəhri".** Həzrət Abbasın şəhidlik şərbətini içdiyi an söylədiyi "Mənim belim indi sındı" sözlərinin zəmanə imamının dilindən çıxması bu ulu din böyüyünə verilən ən yüksək qiymətdir. Yuxarıda da göstərildiyi kimi, İmam Hüseyn (ə) bunu heç bir Kərbəla igidi barəsində buyurmamışdı. Çünki Həzrət Abbas (ə)–İmam Hüseyn (ə) qardaşlığı ilahi məhəbbətdən qaynaqlanırdı.

Kərbəla düzündə İmam Hüseyn (ə) ordusunu canlı orqanizmə bənzətsək, fəqərə sütununun orqanizmdəki yerini yada salsaq, onda Həzrət Abbasın bütövlükdə İmam Hüseyn hərəkatının ən ağırçəkili vurucu silahı olması qənaətinə gələrik.

Beləliklə, aydın olur ki, "Həzrəti-Abbas" fəsli özünün fikri axarı və bədii tutumu ilə əsərin ən maraqlı hissələrindən biri olub, öz çevrəsində birləşdirdiyi ad, bilgi, anlayış, obraz və ideyaların dolğunluğu və yetkinliyi baxımından adına bağlandığı igidin övliyalığına layiqdir və məzmun, fabula, bədii ifadə sistemi bitkin olan bir dastan təsiri bağışlayır. Odur ki, Həzrət Abbas, doğrudan da, Füzulinin gözündə saf bir İmam Hüseyn (ə) aşiqi kimi Kərbəla vaqeəsinin həlledici fiquru yerində duran parlaq bir surətdir. Şair onun bir-birindən gözəl keyfiyyətlərini Ulu Tanrıdan güc almaqla sevə-sevə qələmə almış, yüz minlərlə insanın ruhunu özünə arxa-dayaq sandığı bu böyük İmam Hüseyn (ə) fədaisinin portret-obrazını tamam-kamal yarada bilmişdir.



# İMAM HÜSEYN AĞANIN OĞUL DAĞI – ƏLİ ƏKBƏR

Kərbəla vaqeəsinin ən parlaq səhifələrindən və ən yanıqlı səhnələrindən biri də İmam Hüseynin (ə) oğlu Əli Əkbərin (ə) döyüşə getməsi, igidliklə vuruşaraq, çox böyük faciə ilə şəhidlik zirvəsinə ucalmasıdır. Füzuli "Hədiqətü-s-süəda"nın bir neçə yerində bu möhtəşəm Kərbəla igidindən söz açır, onun dərin mənəvi-əxlaqi keyfiyyətlərini açan yığcam epizodlar verir; məs.: "Rəvayətdir ki, mənzillərin birində həzrət imam başını Zeynəbin dizi üstünə qoyub yuxuya getmişdi və iztirabla yuxudan oyananda nəmli gözlərindən bir qətrə yaş rəvan oldu. Ümm Gülsum dedi: "Ya Hüseyn, ağlamağına səbəb nədir?" İmam buyurdu: "Yuxuda cəddimi görürdüm. Ağlayaraq mənə dedi ki, ya Hüseyn, vüsal vədəsi yaxınlaşdı". Ümm Gülsüm də ağladı. Əli Əkbər dedi: "Ya imam, düşmən qoşunu ilə üz-üzə gələndə Haqq bizim tərəfimizdədir, yoxsa onların tərəfində?" İmam buyurdu: "Haqq bizdədir və biz Haqq iləyik!" Əli Əkbər dedi: "Onda nə cəfa olsa, qəm deyil!"[256]

Bu kiçicik epizodda Əli Əkbərin (ə) bir neçə keyfiyyəti üzə çıxır. Hər şeydən öncə onun İmam Hüseynə (ə) "ata" yox, "imam" deyə üz tutması diqqəti çəkir. Buradan anlaşıldığına görə, Əli Əkbər (ə) İmam Hüseynin (ə) gözündə övlad olmaqdan çox sıravi bir haqq əsgəri olduğu kimi, İmam Hüseyn (ə) də Əli Əkbərin (ə) gözündə ata olmaqdan çox

..................................

[256] *Füzuli. Kərbəla vaqiəsi, Bakı, 1996, səh.60-61*



dini-dünyəvi rəhbər və məsum bir övliyadır. Bu isə böyüyüb boya-başa çatdığı müqəddəs ocağın ruhi təsiriylə yanaşı, fərdi məziyyətlərinin də Əli Əkbərin (ə) dünyagörüşünü formalaşdırdığını, onu yetkin bir şəxsiyyətə çevirdiyini göstərir.

Parçada qəhrəmanın daxili aləmini açan başqa bir cizgi Əli Əkbərin (ə) haqq-nahaq məsələsini hər şeydən önə çəkməsi, bunu qarşılaşacağı hadisələrin məğzinə vara bilməkdən ötrü yeganə meyar saymasıdır.

"Ya imam, düşmən qoşunu ilə üz-üzə gələndə haqq bizim tərəfimizdədir, yoxsa onların tərəfində" sualı son dərəcə aydın və dəqiq olub, surətin dini-mənəvi kimliyini birmənalı surətdə əks etdirməklə yanaşı, onun həyat, ölüm, axirət kimi köklü məsələlərə olan həssas münasibətinin də parlaq ifadəsidir.

Ötəri deyildir ki, Əli Əkbər (ə) bu sualı yuxu, iztirab, göz yaşı, dini müqəddəslər, hədis nəqli kimi sırf ruhi-psixoloji hallar fonunda dilə gətirir. Odur ki, İmam Hüseynin (ə) Həzrət Əli (ə) müdrikliyi ilə buyurduğu "Haqq bizdədir və biz Həqq iləyik" kəlamı Əli Əkbəri (ə) büsbütün qane edir və onun "onda nə cəfa olsa, qəm deyil!" kimi son dərəcə obyektiv bir nəticə çıxarmasına yol açır.

Aydındır ki, epizodlarda əksini tapmış belə geniş portret cizgiləri əsərin birbaşa Əli Əkbərə (ə) ayrılmış bölümündə daha dərin bədii-estetik çalarlarla veriləcəkdir. Ötəri deyildir ki, Füzuli bölümü olduqca əngin bir miqyas genişliyində davam etdirir: "Çün cəmi'i-ənsabü əqrəba şəhdi-şəhadət nuş edüb növbəti-təsərröi-şərbəti-bəqa Hüseynə və övladinə yetdi, hiddəti-atəşi-sitəm cigəri-kainata tə'sir etdi. Asiman pənceyi-xurşidi-daməni-dövrana urdu ki, vəqt oldu bu dövri-müxalifdən peşiman olasan və əcəli-Mələkülmövtə ağazi-təərrüz etdi ki: "Necə bir bəni Ali-Mustəfadan şərmsar qılasan?"[257]

*(Bütün yaxınları şəhidlik şərbətini içib, əbədiyyət şərbətinin axarının növbəsi Hüseynə və övladlarına çatdığından zülm*

---

[257] *Füzuli. Əsərləri, 6 clddə, VI cild, Bakı, 2005, səh.319*





*alovunun dilimləri kainatın ciyərini odladı. Asiman özünün günəş pəncəsini zəmanənin dövretmə ətəyinə vurdu ki, bu cür ziddə getməkdən peşman olmağın vaxtıdır və ölüm mələyinə təsir göstərməyə başladı ki, axı necə olar ki, sən Peyğəmbər nəslinin nümayəndələrindən xəcalət çəkmirsən?).*

Təcavüz qıldı həddən, ey fələk, bidadın, insaf et,
Yetər tə’zimi-əşrar eyləyib, təxfifi-əşraf et.

*(Ay fələk, zülmün həddi -hüdudu keçdi, insafın olsun! Heç olmasa, bundan sonra şan-şöhrətli adamların qulluğunda durmağa son qoyub, (Əhli-beyt) şərəflilərinə (verdiyin əzab-əziyyətləri) yüngülləşdir!).*

Əsərin "Əli Əkbər" bölümünün başlanğıcının vüsəti, heç şübhəsiz, istər bütövlükdə vaqeənin, istərsə də onun ayrılmaz bir parçası olan qəhrəmanın təbiətindən irəli gəlir. Odur ki, kainat, asiman, günəş, zaman və zəmanə, Ölüm mələyi, Əhli-beyt kimi ağır çəkili anlayışların burada motivə çevrilməsi tamamilə təbiidir. Çünki bölümün ardında görəcəyimiz təsvir və tərənnümlər məhz belə böyük miqyası tələb edir.

Digər tərəfdən, unutmaq olmaz ki, Füzuli başqa yerlərdə mənfi planda verdiyi "fələk" məfhumuna burada Ölüm mələyi kimi mötəbər anlayışı da qoşmusdur. Bu isə yalnız şairin Əli Əkbərə (ə) bəslədiyi mükəmməl sayğı və sevginin təzahürü ola bilərdi. Yoxsa heç bir azadfikirli sənətkarın Ölüm mələyinə "Necə bir bəni Ali-Mustəfadan şərmsar qılasan?" deməyə cəsarəti çatmazdı.

Deyilməmiş qalmasın ki, sonda verilən şeir də parçanın çılğın təbiətinə uyğundur. Şairin fələyi – dövrün hakim dairələrini insafa, ədalətə çağırması ənənəvi tənqidi notlar üzərində köklənmişdirsə, "Yetər təz’imi-əşrar eyləyib, təxfifi-əşraf et!" deyə Tanrı təqdiri və Əhli-beyt kimi tutumlu dəyərləri üsuli-idarə ilə əlaqələndirməsi qeyri-adi bədii-estetik yanaşmadır.

Füzuli bu genişmiqyaslı girişdən sonra qəhrəmanı haqqında tərcümeyi-hal bilgisi verir: "Rəvayətdir ki, Hüseyn ibni Əlinin





üç oğlu olub, biri Əliyyi-Əkbər idi və biri Əliyyi-Əvsət idi ki, Zeynəladibindür və biri Əliyyi-Əsğər idi ki, Əbdullah derlər və həzrəti-imam anın ismiylə mükənnadür"[258].

Bu bilgilərdən anlaşıldıgına görə, Əli Əkbər (ə) İmam Hüseynin (ə) böyük oğludur. Doğrudur, Füzuli də daxil olmaqla, məqtəl müəlliflərinin çoxu Əli Əkbəri (ə) bığ yeri təzəcə tərləyən 18 yaşlı yeniyetmə kimi qələmə almağa meyillidir. Əlbəttə, bu münasibət müsbət yanaşmadan – vaqeəni daha təsirli çatdırmaq istəyindən irəli gəlmişdir. Ancaq dərinə getdikdə bunun tarixi baxımdan doğru olmamaqla yanaşı, dini-mənəvi və bədii-estetik cəhətdən də özünü doğrultmadığı aydın olur. Ona görə ki, belədə bilavasitə vaqeənin xammalı – hadisə, əhvalat, epizod və proseslərin həyat həqiqəti zədə almış olur.

Əgər İmam Zeynəlabidinin (ə) Hicrətin 61-ci ilində 23 yaşında olduğunu nəzərə alsaq, Əli Əkbərin ən azı 25 yaşında şəhadətə yetməsi qənaətinə gəlib çıxacağıq. Bununla belə, aşağıda görəcəyimiz kimi, Füzuli də ənənəvi yolla getmiş, öz qəhrəmanının igidliyi ilə yanaşı, onun ailəsi, xüsusən də atası tərəfindən əzizlənən övlad olmasını da sevə-sevə tərənnüm etmişdir.

Hissə belə davam edir: "Ol sərvəri-mülki-bəqa və məhrəmi-sərapərdeyi-vəfa övladınun fövtü mövtün görməmək məsləhəti üçün kəndüyə silah mürəttəb qıldı, mütəvəccihi-meydan olmağa. Əliyyi-Əkbər xurşidi-rüxsarun həzrəti-imamın kəfi-payi-ərşpayəsinə sürüb, təzərrö' edüb rüxsəti-meydan istədi. Hər necə ki, xəvatini-hərəmsərayi-nübüvvət fəryadü fəğanla mən' etdilər, faidə qılmadı. Həzrəti-imam təzərrö'vü ilhanindən mütəəssir olub, kəndü mübarək əliylə əsbabi-rəzmin mürəttəb qılub, Həzrəti-Adəm kəmərin ki Şahi-Vilayətdən yadigar idi, belinə bağlayub və Həzrəti-Əbbasın mərkəbinə bindirüb, himməti-aliyəsin bədrəqeyi-rahi-bəqa qılub meydana rəvan etdi.

................................

[258] *Yenə orada, səh.319-320*



Vəh ki, ol gülrux səfər əzminə ahəng eylədi,
Şəhrü səhrayı bana könlüm kibi təng eylədi.

"Rəvayətdir ki, ol zamanda şahzadə on səkkiz yaşında olub sünbüli-gisuyi-müşkbarı gülşəni-rüxsarinə sayə salmaqda idi və ətrafi-laləzarı bənəfşeyi-tərdən müzəyyən olmaqda idi. Və bu məşhurdur ki, hüsni-surətlə Rəsulullaha andan əşbəh madəri-əyyamdan mütəvəllid olmamışdı və andan əmləh daireyi-vücuda ədəmdən gəlməmişdi. Hərgah ki, Əhli-beytə arzuyi-istima'i-kəlimati-Rəsul qalib olurdu, anın (ləli-şəkərbarın göftara gətirirlərdi və hərgah ki, didari-seyyidi-kainata müştaq olurlardı), anın çehrəsindən didəyə nuri-sürur yetürürlərdi"[259].

*(Əbədiyyət mülkünün başçısı və vəfa sarayının məhrəmi övladlarının ölümünü görməsin deyə meydana getməkdən ötrü özü üçün silah-sursat hazırladı. Əli Əkbər üz günəşini həzrət imamın ərşin dayağı olan ayağının üzərinə sürtərək yalvarıb-yaxardı və meydana getmək üçün icazə istədi. Peyğəmbər xanədanının qız-gəlini, xanımları hər nə qədər ah-nalə edib razılıq verməsələr də, bu, heç bir fayda vermədi. İmam həzrətləri Əli Əkbərin yanıqlı yalvarışlarından təsirlənib, öz mübarək əli ilə döyüş alətlərini hazırladı və Vilayət Şahından yadigar qalan Həzrət Adəm kəmərini belinə bağladı. İmam sonra onu Həzrət Abbasın atına mindirib, dərin inam bəslədiyi bacarığını əbədiyyət səfərinə azuqə anlamında öyərək, döyüşə yolladı.*

*Ah, aman ki, o gül üzlü cavan səfərəçıxma niyyətini həyata keçirməyə basladı və şəhəri, kəndi, bu gen dünyanı könlüm kimi mənə dar etdi.*

*Deyilənlərə görə, o vaxt şahzadə 18 yaşında idi. Onun müşk qoxulu sünbul saçları üz çəmənliyinə kölgə salmaqda və laləliyinin yan-yörəsi tər bənövşətək zinət tapmaqda idi.*

*Belə bir bilgi də bəllidir ki, üzünün gözəlliyi baxımından dövranın anası indiyədək Rəsulullaha (s) ondan da çox*

................................

[259] *Füzuli. Əsərləri, VI cild, səh.319-320*





*bənzəyən şəxs doğmamışdı və yaranış çevrəsində bu yöndə yoxluq aləmindən bu dərəcədə bənzərlik görünməmişdi. Belə ki, Əhli-beyt Rəsulun sözlərini, danışığını dinləməyi çox dilədikdə onun şəkər saçan inci dodaqlarını (danışıq üçün) hərəkətə gətirir və kainatın ağasını görməyi arzuladıqda onun camalına baxmaqla öz gözlərinə sevinc, şadlıq işığı verirdi).*

"Hədiqətü-s-süəda"nın "Əli Əkbər" bölümü özünəməxsus bir tərzdə başlanır. Belə ki, şair Əli Əkbər (ə) qala-qala İmam Hüseynin (ə) özünün döyüşə getməyə hazırlaşdığını təsvir etməklə, əslində, Əli Əkbərin (ə) bu ulu din böyüyünün həyatda olub-qalan son sevinci olmasını önə çəkmək istəmişdir. Bu isə qəhrəmanın hər baxımdan ucalığına dəlalət etməkdədir.

Peyğəmbərlik və imamlıq ocağında aldığı nurani tərbiyə Əli Əkbərin (ə) qeyrət dənizini dalğalandırır və o, İmam Hüseyndən döyüş izni istəyir. Füzuli bu səhnəni olduqca parlaq bir obrazlılıqla təsvir edir. Əli Əkbərə (ə) aid "xurşidi-rüxsar" – "üz günəşi", İmam Hüseynə (ə) aid "kəfi-payi-ərşpayə" – "ərşin dayağı olan ayağın üzəri" tərkibləri bir yandan surətlərin dini-mənəvi paklığını, bir yandan da siqlət və əzəmətini, bütövlükdə insanlıq üçün önəmli olan bəşəri simasını görümlü biçimdə əks etdirir. Ötəri deyildir ki, Əli Əkbərə (ə) aid edilən epitet "Leyli–Məcnun"da İslam rəhbərinə Cəbrayılın (ə) söylədiyi "Xurşidini ərşə sayə qılğıl, Meraci buləndpayə qılğıl!" sözlərini xatırladır. Metafor yolu ilə yaradılan hər iki obrazlılıqda müqəddəslərin üzü günəşə tay tutulub. Aşağıda da görəcəyimiz kimi, Əli Əkbərin (ə) simaca Rəsulullahı (s) çox xatırlatması bunu tarixi planda da təsdiq edir.

İmam Hüseynlə (ə) bağlı epitet malik olduğu keyfiyyətlərə görə daha çox diqqət çəkir. Çünki burada ərş kimi mötəbər islami anlayışla yanaşı, İmam Hüseynin (ə) ayağının üzəri son dərəcə böyük məfhum olan ərşın dayağı, sütunu yerində qavradılır. Deməli, Füzuliyə görə, imamət anlayışı və İmam Hüseyn (ə) şəxsiyyəti, əslində, kainatı doğurub-yaşadan ilahi təqdirin aparıcı və başlıca şərtləri sırasında yer almaqda, Tanrı



qatında müqayisəyəgəlməyəcək qədər dəyərli olan misilsiz məna-məzmun qazanmaqdadır. Odur ki, belə tərkibləri əsla sıravi obrazlılıq örnəyi saymaq olmaz.

Qəhrəmanın siqlətini göstərən başqa bir cizgi “xəvatini-hərəmsərayi-nübüvvət” – “Əhli-beyt xanımları” tərkibində əksini tapan sayğı və sevgidir. Məqtəllərdə bildirildiyinə görə, Əli Əkbər (ə) atasından meydan izni alıb, görüşüb ayrılmaq üçün xeymələrə daxil oldu. Bibiləri onu dövrəyə alaraq növhə deyib ağlayır, hey vidalaşırdılar.

İmam Hüseyn (ə) Əli Əkbərin (ə) ləngidiyini görüb, xeymənin qapısına yaxınlaşdı və uca səslə buyurdu: “Onu sərbəst buraxın, ləngitməyin! Çünki O, çoxdan Allahın (c.c) Zatına qovuşubdur!”

Vaxtilə bu sözü Rəsulullah (s) Həzrət Əlinin (ə) barəsində buyurmuşdu.

Qadınlar Əli Əkbərdən (ə) əl çəkdilər. O, atını çaparaq uzaqlaşdı və heç qanrılıb arxaya da baxmadı.

Göründüyü kimi, “Hər necə ki, xəvatini-hərəmsərayi-nübüvvət fəryadü fəğanla mən’ etdilər, faidə qılmadı” cümləsi yuxarıdakı mənqəbə qəbilli epizodların lakonik ifadəsi təsiri



*Telli-Zeynəbiyyə. İraq. Kərbəla şəhəri*



bağışlayır. XVI yüzillikdə vaqeənin orta əsr azərbaycanlısına çox yaxşı bəlli olmasını nəzərə aldıqda bu lakonikliyin aldığı bədii-estetik vüsətə heç bir şəkk-şübhə qalmır.

Cizginin ardı olaraq o böyüklükdəki faciənin içərisində İmam Hüseynin (ə) yenidən kədərlənməsinin ayrıca gözə çarpdırılması da diqqəti çəkir. Belə ki, Füzuli bu ulu din böyüyünün Əli Əkbərin (ə) yanıqlı yalvarışlarından çox təsirlənməsini, ona görə də döyüş alətlərini onun üçün şəxsən özünün hazırlamasını, Həzrət Əli (ə) yadigarı olan Adəm Peyğəmbərin kəmərini əziz oğlunun belinə bağlamasını, Əli Əkbəri (ə) Həzrət Abbasın (ə) atına mindirməsini məxsusi şövq və zövqlə təsvir edir. Bunu göstərən başlıca danılmaz cəhət təsvirin sonunda işlənmiş "himməti-aliyəsin bədrəqeyi-rahi-bəqa qılub meydana rəvan etdi" cümləsidir. Zənnimizcə, bu, qətiyyən ənənəvi bir təhkiyə olmayıb, qəhrəmanın daxili aləminə açılan işıqlı bir pəncərədir. Bu, elə bir parlaq və aydın işarədir ki, əgər həmin işarələr şəbəkəsi bir semiotik düzüm kimi istər ayrılıqda, istərsə də kull halında açılsa, Əli Əkbərin (ə) kəsb etdiyi məziyyətlər sıravi personaj əlaməti olmaqdan çıxaraq ulu bir din böyüyünə xas göstəricilər kimi qavranacaqdır. Örnək olaraq "himməti-aliyə" deyimini götürək.

Hərfən *uca bacarıq, böyük işgüzarlıq, dönməz iradə, qətiyyətli əzmkarlıq* anlamına gələn bu deyim əslində:

Ey vicüdin əsəri xilqəti-əşya səbəbi!
Nəbi ol vəqti ki, bil-fel gərəkməzdi nəbi! –

beytindəkinə oxşar bir vüsətə malik olub, müstəsna dini-mənəvi və bədii-estetik məzmun bildirir. Şişirtməsiz deyə bilərik ki, bu vüsət:

Himmət, a vətəndaşlar! Qeyrət, a vətəndaşlar! –





şəklindəki Sabir harayınadək uzanan bir genişlikdə olub, bütövlükdə azərbaycanlı tipinə yönəldilən möhtəşəm bir xitab yerində durur.

Digər tərəfdən, bir hipotez kimi də olsa söyləyə bilərik ki, şairin məşhur “Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən” misralı qəzəlinin mövzu, məfkurə və üslub xüsusiyyətləri onu Əli Əkbərin (ə) Yezid (l.ə) idarə üsuluna etirazı kimi də götürməyə imkan verir. Bu isə daha çox “himməti-aliyə” ifadəsində əksini tapmış yüksək mənəvi keyfiyyətlərə görə mümkündür. Bu yön qəzəlin üçüncü-dördüncü beytlərində daha qabarıqdır.

“Bədrəqeyi-rahi-bəqa qıl”maq deyimi də bu baxımdan çox söz deyir. Hərfən *əbədiyyət yolunun azuqəsi* anlamına gələn bu ifadə, əslində, “Tədarük görün! Tədarükün ən yaxşısı isə təqvalılıqdır – Tanrı qarşısında şüurlu məsuliyyət hissidir” *(“Bəqərə”, 197)* səpkisində olub, dərin islami təlqin və təmrinlərdən soraq verən uca bir dəyərlər sisteminə işarədir. Bu işarə Əli Əkbəri (ə) Həzrət Abbas (ə) səviyyəsinə qaldırıb ona əvəzsiz bir dini kimlik qazandırır.

Qəhrəmanın şərəf və ləyaqətini artıran xüsusiyyətlər də mətni bir xeyli cəlbedici edir. Odur ki, müxtəsər surətdə olsa da, həmin xüsusiyyətlər üzərində dayanmağa ehtiyac duyulur.

Belə xüsusiyyətlərdən biri Adəm Peyğəmbərin kəməridir. Sözün düzü, “Hədiqətü-s-süəda” boyu belə əski çağlara, bu qədər qədim dövrlərə gedib çıxan əlamətə rast gəlmək çətindir. Bunun özü isə qəhrəmanın müqəddəs Əhli-beyt (ə) ocağındakı yeri ilə bağlı yetərincə aydın söz deyir.

Ümumiyyətlə, “Adəm Peyğəmbərin kəməri” anlayışı nəinki islami, hətta dini-əsatiri bir anlayış kimi haqqında bilgi olmayan bir termindir. Hissədə bu kəmərin vaxtilə Həzrət Əlidə (ə) də olmasının, ondan İmam Hüseynə (ə) yadigar qalmasının bildirilməsi bir yandan əlavə bir bilgidirsə, o biri yandan, vilayət – övliyalıq, vəlilik institutuna söykənən əlahiddə bir təəssüratdır. Zənnimizcə, bu təəssürat terminin əsas açarıdır. Belədə, dəqiq bilinməməsinə baxmayaraq,





düşünmək olar ki, Füzuli (r.ə) İmam Hüseynin (ə) Adəm Peyğəmbərin kəmərini Əli Əkbərin (ə) belinə bağlamasını ayrıca vurğulamaqla öz qəhrəmanının əzəli-əbədi müqəddəslər soyundan gəldiyini önə çəkmək istəmişdir.

Əli Əkbəri (ə) ucaldan başqa bir cəhət İmam Hüseynin (ə) onu "Həzrəti-Əbbasın (ə) mərkəbinə bindir"məsidir. Bəllidir ki, Üqab adlanan bu məşhur at neçə-neçə mənqəbənin yaranmasına yol açmış, məqtəl və mərsiyə ədəbiyyatına qol-qanad vermişdir. Əgər "himməti-aliyə" anlayışının da Həzrət Abbasdan (ə) qaynaqlandığını düşünsək, onda İmam Hüseynin (ə) onu "bədrəqeyi-rahi-bəqa qıl"masını, əbədiyyət səfərinə yola salmasını mütləq Həzrət Abbas (ə) qeyrəti ilə əlaqələndirməliyik. Belədə zahirən dəyişməsinə baxmayaraq, əslində, mətn zərrə qədər xələl görmür. Əksinə, Adəm Peyğəmbərin kəməri Həzrət Əli (ə) və İmam Hüseynlə (ə) vasitəli şəkildə bağlandığı halda, "himməti-aliyə" məfhumu bilavasitə Həzrət Abbasın (ə) məxsusi övliyalıq keyfiyyəti kimi anlaşılır.

Parçadakı:

Vəh ki, ol gülrux səfər əzminə ahəng eylədi,
Şəhrü səhrayı bana könlüm kibi təng eylədi! –

beytini mütləq İmam Hüseynin (ə) dilindən deyilən sözlər hesab etməliyik. Belədə bu şeir də o ulu din böyüyünün Əli Əkbərlə (ə) bağlı duyğu və düşüncələrinin daha həzin və sızıltılı əks-sədası olaraq üzə çıxır. "Vəh" birləşməsinin "ah, eh" nidalarını bildirməsi, "gülrux" sözünün Əli Əkbərin (ə) üz cizgilərini aydıncasına göz önünə gətirməsi, "könlüm kibi təng" tərkibinin İmam Hüseynin (ə) ata ürəyinin necə sıxıldığını dəruni yanğı ilə əks etdirməsi, "şəhrü səhra" ifadəsinin isə Əli Əkbərsiz (ə) həyatın, Əli Əkbərsiz (ə) dünyanın onun gözündən düşdüyünü birmənalı surətdə çatdırması cəmi-cümlətanı bircə beyt olan bu şeirin, əslində, olduqca dolğun və tutumlu bir məna-məzmun şəbəkəsi əmələ gətirdiyini sübuta yetirir.





Füzulinin Əli Əkbərə (ə) bəslədiyi tükənməz saygı və sevgini göstərən cəhətlərdən biri də qəhrəmanın görkəm gözəlliyinin ayrıca təsvir olunmasıdır. Təbiidir ki, belə hallar Füzuli qələmi üçün olduqca səciyyəvidir. Həzrət Mühəmmədin (s) görkəm gözəlliyinin Füzuli irsində geniş yer tutması bunun parlaq dəlilidir.

Maraqlıdır ki, Füzuli burada Əli Əkbərin (ə) görkəm gözəlliyini nəzmlə yox, nəsrlə qələmə qalmışdır. Bununla belə, "Rəvayətdir ki, ol zamanda şahzadə on səkkiz yaşında olub sünbüli-gisuyi-müşkbarı gülşəni-rüxsarinə sayə salmaqda idi və ətrafi-laləzarı bənəfşeyi-tərdən müzəyyən olmaqda idi" cümləsi qəhrəmanın kişi, igid və mərd portretindən soraq verməklə yanaşı, bu portretin işıq-kölgə (gülşəni-rüxsar–sayə) və aydınlıq-tutqunluq (ətrafi-laləzar–bənəfşeyi-tər) fonunda boy göstərməsini də təmin etməkdədir. Bu yerdə "O, var edən, gözəl yaradan, yaratdığına şəkil verən Allahdır!" *("Həşr", 24), "*Allah gözəldir və gözəlliyi sevər" (Həzrət Mühəmməd (s) kimi ilahi bəyanatlar yada düşür.

Lakin Əli Əkbərin (ə) ən səciyyəvi keyfiyyəti bütün göstəricilər üzrə Həzrət Mühəmmədi (s) xatırlatmasıdır. Məqtəllərin çoxunda bu keyfiyyət belə verilir: "Ravi nəql edir ki, Əli Əkbər (ə) meydana gedəndə İmam Hüseyn (ə) onun barmağından və ya saqqalından yapışaraq, əlini yuxarı qaldıraraq buyurdu: "Allahım, Sən Özün şahid ol. Mən bunların cənginə elə bir cavanı göndərirəm ki, insanlar içərisində zahirinə, batininə və nitqinə görə Sənin Peyğəmbərinə (s) ən çox bənzəyənidir. Biz Sənin Peyğəmbərinin (s) camalına müştaq olduqda həmişə onun üzünə baxmışıq".

İmam (ə) Əli Əkbəri (ə) meydana göndərəndə nifrin də etdi: "Ya Rəbb. Onları torpağın bərəkətindən məhrum et, aralarına ayrılıq sal, onları dağıdaraq pərən-pərən sal, dincliklərini əllərindən al, heç vaxt başçılarını onlardan razı etmə! Çünki onlar özləri bizi köməyə çağırdılar. Ancaq elə özləri də bizə əzab-əziyyət verib, bizi qətlə yetirdilər".





Məqtəllərin çoxunda olduğu kimi, “Hədiqətü-s-süəda”da da bu mənqəbə bilgiləri hissediləcək qədər üzdədir. Füzulinin bu barədə danışmağa “Və bu məşhurdur ki” deyə başlaması bu motivin geniş yayılmasına işarədirsə, “Hüsni-surət Rəsulullah, Əşbəh” (çox oxşar) ifadələri Əli Əkbərlə (ə) Həzrət Mühəmməd (s) arasındakı zahiri bənzərliyi, “Əhli-beyt, arzuyi-istima’i-kəlimati-Rəsul, ləli-şəkərbar, göftar” ifadələri də batini və nitqi bənzərlikləri əks etdirir. Xüsusən parçanın sonu (“hərgah ki, didari-seyyidi-kainata müştaq olurlardı, anın çehrəsindən didəyə nuri-sürur yetürürlərdi”) İmam Hüseynin (ə) yuxarıda verilmiş sözləri ilə üst-üstə düşür. Bu da Füzulinin gözündə Əli Əkbərin (ə) etiqad, ibadət və əxlaq baxımından da, mənəviyyatca da babası, sonuncu Peyğəmbərin (s) ləyaqətli ardıcılı olduğunu göstərir.

Bu deyilənlər inkarolunmaz surətdə sübuta yetirir ki, əsərin “Əli Əkbər” bölümündən gətirilmiş bu parça qəhrəmanın hər bir xüsusiyyəti ilə bağlı aydın və dəqiq, eləcə də dolğun və tutumlu anlayış yaradır, onu şücaətli bir Kərbəla igidi olaraq hərtərəfli şəkildə təqdim edir və imamhüseynsevərlərin ona olan sayğı və sevgisini birə-min artırır.

* * *

Hissə belə davam edir: “Əlqissə, ol nihali-gülşəni-səbahət ol zəman ki rüxsət alub sərvi-xuramanın ələmi-ərseyi-meydan etdi, zövqi-pabusi-səməndi-səbükseyrdən zəmzəmeyi-mübahat zəminü asimana yetdi”[260].

*(Xülasə, o parlaqlıq çəmənliyinin şitili izin alıb uca qədd-qamətini meydanın ortasında yüksələn bayrağa çevirdiyi zaman iti yerişli atının ayağının altını öpmək zövqündən torpağın iftixar nəğməsi yeri-göyü tutdu).*

Füzuli nəsrlə verdiyi bu təsvirin təmtərağını poeziya ilə bir az da artırmağı lazım bilir:

.................................

[260] *Füzuli. Əsərləri, VI cild, səh.320*





Üqabi-bərqşitabı səbadan aldı qərar,
Sipehri eylədi heyran sür'əti-rəftar.
Zəminə rəxşi salub nəqşi-mixi-rizeyi-nə'l,
Səvabit eylədi zahir kəvakibi-səyyar.
Lətafəti-hərəkatinə "afərinlər" edüb,
Təbəq-təbəq düri-əncüm sipehr qıldı nisar[261].

*(Əli Əkbərin şimşək sürətli Üqabı səhər yelini öz sürəkli yerişi ilə qısqandırmaqla onun hövsələsini daraltdı. Əli Əkbərin özünün göstərdiyi hərb oyunları isə səma təbəqələrini, göy qapılarını heyrətləndirdi. Üqabın nalındakı mıxların izlərinin saldığı naxış yeri torpağı bəzədi, sanki səyyar ulduzlar sabit ulduzlara çevrildi. İncə və çevik davranışlarına yüzlərlə "əhsən" söyləməklə kainat tabaq-tabaq incitək ulduzu Əli Əkbərin ayağının altına səpələdi).*

Göründüyü kimi, nəsrdə Əli Əkbərin (ə) "aləmi-ərseyi-meydan" olan "sərvi-xuraman"ı və "səməndi-səbükseyr"i şeirdə həm konkretləşir (məsələn, qəhrəmanın atı öz adı ilə verilir), həm də misilsiz miqyas genişliyi alır (məsələn, *səba, sipehr, zəmin, kəvakib* kimi kosmoqonik predmetlər nəinki motivləşdirilir, hətta müstəqil obrazlara çevrilir. Kainatın şəxsləndirilməsini (o, Əli Əkbərə "afərinlər" deyir, ulduzları inci kimi tabağa düzərək, onun başına, ayaqları altına tökür)) buna örnək verə bilərik.

Hissə belə davam edir: "Hər tərəf cövlanlar edüb lö'blər göstərdikdən sonra bəyani-ismü rəsm edüb nə'rə urdu ki: "Bənəm şükufeyi-nihali-təqva, bənəm nəqdi-Hüseyn bin Əliyyi-Mürtəza"[262].

*(Əli Əkbər bütün istiqamətlərdə at səyirtməklə cürbəcür hərb oyunları nümayiş etdirdikdən sonra özünün adını və soyunu açıqlamaqdan ötrü "təqvalılıq şitilinin çiçəyi mənəm, mənəm Mürtəza Əli oğlu Hüseynin ömrünün-gününün yeganə hasili, həyatının başlıca mənası, dəyəri!" deyə nərə çəkdi).*

.................................

[261] *Yenə orada*

[262] *Füzuli. Əsərləri, VI cild, səh.320*





Yuxarıda olduğu kimi, Füzuli burada da nəsrə nəzmlə vüsət verir:

Bənəm ol şahi-şahzadeyi-dəhr
Ki, sifatimdə əql heyrandür.
Həsri-övsafi-qədrü mənzilətim,
Xarici-ehtimalü imkandır.
Nurbəxşi-çirağī-icadım,
Mahi-kövneynü Şahi-Mərdandır.
Cəddi-pakım Məhəmmədi-Mürsəl,
Əsli-zatım Əliyyi-İmrandır[263].

*(Malik olduğu xüsusiyyətləri ilə ağılları heyrətdə qoyan o dünya yeganəsinin – İmam Hüseynin şahtək bəslədiyi igid mənəm! Qədir-qiymətimin və uca məqamımın əlamətlərindəki uğuru, qalibiyyəti əhatə etmək imkan xaricindədir. Yaradılış çırağından yayılan işıq Həzrət Əli varlığının göylərində görünən aydır. Pak babam peyğəmbərlərin sonuncusu olan Həzrət Muhəmməd, zatımın mayası isə İmran oğlu Həzrət Əlidir).*

Ancaq yuxarıdakı nəsr-nəzm növbələşməsindən fərqli olaraq, burada rəcəz əhvali-ruhiyyəsi real qüvvə yerində durmaqla hər iki mətni şərtləndirir. Ona görə də qəhrəmanın istər təbii-fiziki, istərsə də ruhi-mənəvi aləmini açmaq üçün həmin real qüvvəyə dəlalət edən bir neçə cəhətə toxunmaq qaçılmazdır.

**1. Hərb oyunları.** Bəllidir ki, dünya yaranandan bəri bəhanələrlə minlərlə irili-xırdalı müharibələr baş vermiş, bəşəriyyət istər-istəməz silah-sursat tədarükü görməyə, çeşidli döyüş texnikasına yiyələnməyə məcbur olmuşdur. Bir meydan müharibəsi olan Kərbəla döyüşü də özünün bir-birindən seçilən qəribə hərb oyunları ilə tarixə düşmüşdür. Ona görə də Əli Əkbərin (ə) "lö'blər göstər"məsinin ayrıca vurğulanması bir yandan Füzulinin bu sahəyə böyük marağını, bir yandan

[263] *Füzuli. Əsərləri, VI cild, səh.320-321*





da bu marağın əsasında onun xəlqi-mədəni keçmişindən qalan arxetipin, hazırlığın yer tutduğunu göstərir. Yaxın və Orta Şərq xalqlarının ortaq dəyəri olan çovkan oyununun müsəlman mədəniyyətində geniş yayılması, Əfzələddin Xaqanidən Molla Vəli Vidadiyədək lirikamıza hopması, divanları bəzəyən miniatürlərdə aparıcı yer tutması bu fikri bir qədər də gücləndirir.

**2. "Bənəm şükufeyi-nihali-təqva!"** Əli Əkbər (ə) özünü "təqvalılıq şitilinin çiçəyi" adlandırmaqla həm bu uca dəyərin ona irsən keçdiyinə işarə vurur, həm də həmin dəyərlərin ən ləyaqətli daşıyıcılarının – Həzrət Əli (ə) ilə İmam Hüseynin (ə) malik olduqları böyük təqvalılıq ehtiyatının ortaya çıxıb cəmiyyətə xeyir verməsinə əngəl törədən boğucu ictimai mühitə diqqət çəkir. O bununla demək istəyir ki, Müaviyə (l.ə) və Yezid (l.ə) üsuli-idarəsinin təzyiqinə baxmayaraq, Hüseyn təqvası bir fidan qədər cücərdiyi halda, Əli Əkbər təqvasının yalnız çiçək aça biləcək qədər ömrü oldu.

**3. "Sifatimdə əql heyrandür!"** Şeirdə gəldiyi üçün bu tərkib mübaliğə də sayıla bilər. Ancaq qəhrəmanın özünəməxsus keyfiyyətlərinə iki beyt ayrılması və bu cəhətlərin "nəqdi-Hüseyn bin Əliyyi-Mürtəza" – "Mürtəza Əli oğlu Hüseynin həyatının dəyəri" təyinini tamamlaması tərkibə əlahiddə dini-fəlsəfi məzmun qazandırır.

Düşüncəni, dərrakəni mat qoyan Əli Əkbər keyfiyyətləri, hər şeydən öncə, sırf ruhi-mənəvi səciyyə daşıyır. Qəhrəmanın öz soyunu – "cəddi-paki"ni Muhəmmədi-Mursəllə, "əsli-zatı"nı Əliyyi-İmranla bağlaması məsələnin zahiri tərəfi olduğundan bununla iş bitmir. "Həsri-övsafi-qədrü mənzilətim xarici-ehtimalü imkandır" fəxriyyəsi qəhrəmanın iftixar mənbəyinin daha dərin qatlara gedib çıxdığını göstərir. Belədə bəlli olur ki, şair çəkinmədən Əli Əkbərin (ə) ruhi-mənəvi başlanğıcını ilahi aləmlə əlaqələndirir. Bu da sənətkarın öz qəhrəmanına bəslədiyi saygı və sevginin əzəmətinə dəlalət edir.





* * *

Hissə belə davam edir: "İbn Sə'd ki ol füruği-şə'şəe'yi-cəmalı mütaliə qıldı və ol lətafəti-hüsni-məqala vaqif oldu və şahzadənin kim olduğunu bildi, kəndü qəbahəti-əf'alindən əsəri-infı'al bulub, ahi-həsrət çəküb ə'yani-ləşkərə ayıtdı: "Ey qövm, bu sərvər əkbəri-övladi-Hüseyn bin Əlidir ki, şəklü şəmayildə şəbihi-Həzrəti-Nəbidir". Bir zəman mütəhəyyir olub kimsənəyə rüxsət vermədi ki, meydana girə və ana bir ələm yetürə. Zira bildi ki, məks etdikcə təərrüzi-ləşkər ehtiyac olmayub ol növcəvanın həlakinə tiği-təəttüş yetər və nəvaki-şüai-afitabi-suzan və sinani-zəhrəşikafi-səmumi-cigərsuz kifayət edər. Şəhzadə gördü ki, dirəng etməklə şəmşiri-hərarət tiz olub mövcibi-zə'fi-qüva və baisi-riqqəti-ə'za olur, bimühaba kəndüsin qəlbi-sipaha urub bünyadı-cidal etdi və hökmi-zülali-şəmşiri-abdarın mümkün olduqca məcariyi-üruqi-əbdani-ə'daya yürütdü. Əmma izhari-kəmali-şücaət edüb, şövqlə cəng edərkən tabi-afitabdan zireh halqaları hiddəti-hərarət bulub bədəni-nazpərvərdinə dağlar urdu və ehtimali-aləti-hərb kətfi-şərifinə ələmlər yetürdi"[264].

*(İbn Səd Əli Əkbərin mübarək camalındakı təntənə işığını və danışığındakı gözəl incəlikləri gördükdə və şahzadənin kim olduğunu bildikdə öz əməllərinin pisliyindən xəcalət çəkərək, peşmançılıqdan bir ah çəkib, qoşun böyüklərinə dedi: "Ay camaat, baş tacı olan bu sevimli və istəkli cavan Əli oğu Hüseynin böyük oğludur. O, görkəmcə də, xislətcə də Həzrət Nəbinin bənzəridir". İbn Səd bir müddət heyrət içində donub qaldı, kimsəyə icazə vermədi ki, meydana girib Əli Əkbərə zərər yetirsin. Çünki o bilirdi ki, vaxt ötdükcə qoşunun hücuma keçməsinə ehtiyac duyulmadan susuzluq qılıncı o yeniyetmənin həlak olması üçün bəs edər və yandırıcı günəşin şüa oxları ilə ciyəri qurudan səmum yelinin zəhər saçan nizəsi kifayət edər.*

*Şahzadə gördü ki, susuzluq qılıncı anbaan itiləşir, gücü-qüvvəsi getdikcə azalır və bütün bunlar bədən üzvlərini*

.................................

[264] *Füzuli. Əsərləri, VI cild, səh.321*





*gərginləşdirir. Ona görə də qorxub-çəkinmədən özünü ordunun ortasına vurub döyüşə başladı və bacardıqca iti qılıncının ölüm şüası saçan qaçılmaz zərbələri ilə düşmənlərin bədənlərindən əcəl təri axıtdı. Ancaq o, misilsiz bir igidlik göstərərək böyük həvəslə vuruşsa da, yandırıcı günəş şüalarından son dərəcə qızan geyindiyi ağır zirehin halqaları həmişə naz-nemət içərisində saxlanan bədəninə dağ çəkirdi və döyüş sursatını daşıması incə çiynini durmadan incidirdi).*

Parça əsərin "Əli Əkbər" bölümünə yeni bir surət gətirir. Bu, Ömər ibn Səddir. "Hədiqətü-s-süəda" boyu ən mürəkkəb personaj təsiri bağışlayan ibn Səd burada da ikili hisslər keçirən, tutqun və dumanlı mənəviyyat sahibi bir şəxs kimi təqdim edilir. Belə ki, o, bir yandan Əli Əkbərin (ə) gəncliyinə qıymaq istəmir, onun Peyğəmbər soyunun, Əhli-beytin ləyaqətli nümayəndəsi olduğunu gizlətmədən dilə gətirir, bir yandan da öhdəsinə götürdüyü murdar və idbar işi – övladları ilə birlikdə İmam Hüseyni (ə) və övladlarını yer üzündən silib məhv etməyi tələm-tələsik yerinə yetirmək istəyir.

Diqqət yetirmək gərəkdir ki, Əli Əkbərin zahirən, batinən və nitq baxımından Həzrət Muhəmmədə (s) eynən bənzəməsi Ömər ibn Sədə təsir göstərən ən güclü amildir. Mətndəki *füruği-şəşəeyi-cəma, lətafəti-hüsni-məqal* tərkiblərindəki təmtəraqlı dil-üslub cizgiləri, *qəbahəti-əfal, əsəri-infial, ahi-həsrət* ifadələri, ən nəhayət, Əli Əkbəri *"sərvər"* adlandırması, *"şəklü şəmayildə şəbihi-Həzrəti-Nəbi"* olduğunu ayrıca vurğulaması şairin ustad bir nasir kimi çəkdiyi prozaik portretin dəqiq və aydın cizgiləridir.

Parçada Əli Əkbər də dolğun və tutumlu bir personaj təsiri bağışlayır. Düşmən dili ilə öyülməsindən tutmuş ta günəş, susuzluq, səmum yeli, zireh halqaları, hərbi alətlər kimi ən müxtəlif predmetlərin ruhi-psixoloji, dini-mənəvi, əxlaqi-fəlsəfi və bədii-estetik baxımdan qəhrəmanla əlaqələndirilərək, çeşidli yönlərdə mənalandırılmasına və səciyyələndirilməsinədək ədəbi üsul və üslub əlamətləri bundan soraq verir. Bu cəhətlər aşağdakı şeirdə də özünü göstərir:





Bari-tari-pirəhəndən inciyən cismi-lətif,
Necə çəksin rəzm meydanında bəndi-ahənin?
Nazpərvərdi-nəimi-şəfqətü ehsan olan,
Necə olsun qabili-bidadi-əhli-zülmü kin?[265]

*(Köynəyin nazik saplarının belə incitdiyi incə bədən döyüş meydanında qaba dəmirdən düzəldilən silahların ağırlığına necə dözsün axı?! Ətrafındakılardan həmişə tükənməz şəfqət və yaxşılıq görən, cürbəcür nemətlər içərisində nazla bəslənən kimsə axı necə zalım və kinli adamların zülm hədəfinə çevrilsin?!).*

Göründüyü kimi, şeir büsbütün təzad üzərində qurulmuşdur. *Bari-tari-pirəhən* və *bəndi-ahəni*, *nazpərvərdi-nəimi-şəfqətü ehsan* və *qabili-bidadi-əhli-zülmü kin* təzadları qətiyyən bədiiyat faktı olmaqla qalmır, əksinə, dərin həyat həqiqətlərində yatan və ictimai-siyasi, iqtisadi-mədəni, ruhi-psixoloji və mənəvi-əxlaqi mahiyyəti üzə çıxaran ziddiyyətləri önə çəkir, onlarla bağlı oxucuda bir-birindən mənalı duyğu və düşüncələr oyadır. Bizcə, "Hədiqətü-s-süəda"nın bədii-estetik təbiəti belə ali sənət kredosuna xidmət mayası ilə yoğrulmuşdur. Elə bu yüksək yaradıcılıq istəyinin qanunauyğun nəticəsidir ki, əslində, ziddiyyət təşkil etməyən *cismi-lətif* və *rəzm meydanı* ifadələri də şeirin ümumi məzmunu içində təsirli bir bədii təzad yerində görünür.

Digər tərəfdən, şeirin ekspressiv və emosional təbiəti onun məzmunu içində Ömər ibn Sədi (l.ə) də, onun murdar və idbar dəstəsini də təsəvvürə gətirməyə imkan verir. *Əhli-zülmü kin* ifadəsində əksini tapmış bu qaragüruhun həqiqi islami dəyərlərdən uzaqlığını göz önündə canlandırmaqdan ötrü ayə, hədis yada salmağa ehtiyac qalmır, əksinə, ifadənin içərisində yer aldığı tərkibi bütöv oxuduqda *(qabili-bidadi-əhli-zülmü kin),* xüsusən "qabil" sözünü məntiqi vurğu altına saldıqda hər cür islami anlayış və dini bilgi özlüyündə aydınca anlaşılmaqla motivləşib, bir yarımobraza çevrilmiş olur. Bunun özü də parlaq bir obrazlılıq örnəyidir.

[265] *Füzuli. Əsərləri, VI cild, səh.321*





* * *

Bölüm belə davam edir: “Əlqissə, külfəti-alati-rəzm əlaveyi-ənduhi-təəttüş olub, şahzadə təlatümi-hərbdən kənara çıxub, validi-büzürgvarının xidmətinə müraciət edüb fəryada gəldi ki: “Ya əbətah, zəbəhəni əl-ətşu və əsqələni’l hədid”, yəni “Bəni həlak etdi susuzluq və ağırlandırdı bari-ahən”. Həqqa ki, əgər bir qətrə suyla təskini-hərarət versəydin, ləşkəri-müxalifi qərqeyi-tufani-fəna qılırdım”. Həzrəti-imam gərdi-meydan çehreyi-pakindən pak edüb, Həzrəti-Rəsulun nigini-mübarəkin təskini-hərarət üçün lə’li-abdarinə mülazim etməgin bir miqdar təskin bulub yenə meydana müraciət qıldı. Bu növbət ibn Sə’d Tariq bin Şisə əmr etdi ki, ey Tariq, sən meydana girüb bu şəhzadə dəfinə qüdrət bulsan, vilayəti-Mosul hökumətin sənə ənam edərəm. Tariqi-məl’un hökuməti-Mosul həvasiylə meydana girüb Əli bin Hüseynə nizə həvalə qıldı. Şəhzadə ol bədbəxtin nizəsin rədd edüb sineyi-pürkinəsinə bir nizə urdu ki, nuki-nizə səbzəmanənd şurəzari-cismi-pəlidindən baş çıxarub həlak oldu.

Andan sonra Öməri-Tariq gəlüb şəhzadə əlindən şərbəti-fəna içdi. Andan sonra Misra bin Qalib meydana gəlüb müqabil



*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı (giriş). İraq. Kərbəla şəhəri*



olduqda şəhzadə şücaəti-Mustəfəvi və cəladəti-Mürtəzəvi izhar edüb, tiği-abdarla nizəsin qələm qılub fərqi-namübarəkinə bir zərb urdu ki, iki parə olub mərkəbinin iki tərəfindən meydana düşdü. Ləşkəri-müxalif ol zərbi-dəsti görüb, bərgi-xəzan kibi lərzan olub müharibəsindən mütəvəhhim olduqda ibn Səd Möhkəm bin Tüfeyli iki bin mübarizlə (şəhzadənin məsafinə təhris etdi. Möhkəm bin Tüfeyl iki bin mübarizlə) ol afitabi-asimani-vilayəti araya alub, şəhzadə əndişə qılmayub, nəş'eyi-vilayət sərməsti olub, ol iki bin namərdi mütəfərriq edüb bir dəxi həzrəti-imam xidmətinə təvəccöh edüb dedi: “Ya əbətah, əl-ətəş, əl-ətəş”. Həzrəti-imam dideyi-nəmnakdan seyli-xunabə rəvan edüb dedi: “Ey cigərguşə, səbr et ki, səninçün şərbəti-Kövsər mühəyya olubdur”[266].

(*Xülasə, döyüş alətlərinin ağırlığı susuzluğun törətdiyi əziyyəti artırdığı üçün şahzadə müharibə təlatümündən qırağa çıxdı və böyük şəxsiyyət olan atasının yanına qayıdıb uca səslə belə söylədi: “Ay ata, susuzluq məni öldürdü, dəmir döyüş alətləri isə çiyinlərimi əzdi. Əgər bir damcı su ilə yanğımı söndürsəydin, düşmən qoşununu heçlik-puçluq tufanına qərq edərdim!”*

*İmam həzrətləri onun pak çöhrəsindən meydanın toz-torpağını təmizlədikdən sonra susuzluğunu yatırmaqdan örtü Həzrət Rəsulun mübarək üzüyünü onun cadar-cadar olan dodaqlarına yapışdırdığı üçün Əli Əkbər bir az dinclik tapdı və yenidən döyüş meydanına qayıtdı.*

*İbn Səd bu dəfə Tariq bin Şişə hökmlə dedi ki, ey Tariq, sən meydana girib bu şahzadəni var gücünlə dəf edə bilsən, mən Mosul vilayətinin hökumətinin idarəsini sənə peşkəş edərəm. Məlun Tariq Mosul hökumətinə yiyələnmək ehtirası ilə meydana atılaraq, Hüseyn oğlu Əliyə nizə tulladı. Şahzadə o bədbəxtin nizəsini özündən uzaqlaşdırıb, onun kinlə dolu sinəsinə elə bir nizə vurdu ki, nizənin ucu göy-göyərti torpağı dəlib baş qaldıran kimi, murdar bədəninin arxasından çıxaraq onu öldürdü.*

................................

[266] *Füzuli. Əsərləri, VI cild, səh.321-322*





*Ondan sonra Ömər Tariq gəlib şahzadənin əlindən puçluq şərbəti içdi. Ondan sonra Misra bin Qalib meydana atılıb qarşısına çıxdıqda şahzadə mustəfavi igidlik və mürtəzavi qəhrəmanlıq göstərməklə özünün iti qılıncı ilə əlindəki nizəni sındırdı və murdar başına elə bir zərbə endirdi ki, başı iki yerə bölünərək, atının hər iki tərəfindən yerə düşdü. Bu məharəti görən düşmən qoşunu payız yarpağıtək əsib titrəməyə başladı və hamı qabağına çıxmağa qorxdu.*

*Bu zaman ibn Səd (l.ə) Möhkəm bin Tufeylə iki min döyüşçü verib onu şahzadənin döyüş meydanına getmək üçün həvəsləndirdi. Möhkəm bin Tufeyl iki min döyüşçü ilə o övliyalıq səmasının günəşini araya aldı. Ancaq Əli Əkbər bundan qətiyyən qorxmadı, övliyalıq sərxoşuna çevrilərək o iki min naməndi pərən-pərən saldı və bir daha imam həzrətlərinin yanına qayıdıb dedi: "Axı mən susuzluqdan yandım, yandım mən susuzluqdan!"*

*İmam həzrətləri nəmli gözlərindən qan-yaş axıdaraq buyurdu: "Sən ey ciyərimin bir parçası, səbir et, çünki sənin üçün Kövsər şərbəti hazırlanıb").*

Göründüyü kimi, "Hədiqətü-s-süəda"nın "Əli Əkbər" fəslinin bu parçası incəlik, susuzluq, ata-oğul məhəbbəti, Peyğəmbər xatirəsi, düşmən hiyləsi, döyüş texnikası, övliyalıq əzəməti, qeybdən xəbərvermə kimi çox müxtəlif anlayışların vahid müstəvidə və eyni qayə ətrafında bir araya gətirilməsi üzərində qurulmuşdur. Şair mənşəyindən asılı olmayaraq, bu anlayışları məqamında motivə çevirməyi bacarır, onların hər birinə dərin ideya yükləyib və bununla da parlaq obrazlılıqların durmadan bir-birini izlədiyi çəkici və təsirli bir mətn ortaya çıxarır. Nəzərə alaq ki, Füzuli hələ arabir "əlqissə", "xülasə" deyə ümumiləşdirmə aparır. Əgər belə olmasaydı, yəqin ki, şair Füzuli özünün nəsr istedadını heç cür cilovlaya bilməzdi. Bu isə poeziya ilə yanaşı, nəsrdə də üzə çıxan Füzuli dühasının başqa bir maraqlı cəhətidir.

Parçanın ideya-bədii cizgiləri ilə bağlı daha aydın anlayış almaqdan ötrü yuxarıda sadaladığımız motivlərdən bir neçəsinin üzərində ayrıca dayanmaq yaxşı olardı.





**1. İncəlik.** *Külfəti-aləti-rəzm* izafətində Əli Əkbərin (ə) atalıq şəfqətinə güvənərək, İmam Hüseynə (ə) etdiyi müraciətdə əksini tapan bu cəhət əsərin bu bölümü üçün xarakterik olub, qəhrəmanın zahiri gözəlliyi ilə məhdudlaşmayan, əksinə, daha çox batini dünyasından soraq verən parlaq bir cizgidir. Oğulun ataya xitabını ərəbcə, yəni onların öz ana dilində verməklə Füzuli bu motivin mənəvi qatını önə çəkmək istəmişdir. Bununla yanaşı, Füzuli burada düşmən qoşununun adi humanizm prinsiplərini və bəsit cahiliyyət qaydalarını belə ayaqlar altına salıb tapdalamasını da nəzərə çarpdırmışdır. Ötəri deyildir ki, bölümün bundan qabaqkı yerində Əli Əkbərin (ə) görkəm gözəlliyi və əsil-nəsəbi qarşısında vicdanı az da olsa qımıldanan Ömər ibn Səd (l.ə) burada yenidən qəddarlaşaraq özünün əsl simasına qayıdır.

**2. Susuzluq.** Mətndə *əlaveyi-ənduhi-təəttüş, susuzluq, bir qətrə su, təskini-hərarət, əl-ətəş, əl-ətəş, şərbəti-Kövsər* ifadələrində əksini tapan bu motiv bütövlükdə “Hədiqətü-s-süəda” üçün səciyyəvi xüsusiyyətdir. Çünki əsərin həyat həqiqəti olan və xammalını təşkil edən Kərbəla vaqeəsində su məfhumu hər baxımdan çevik və işlək bir faktordur. Yuxarıdakı ifadələrin birincisi bu faktoru hərb alətləri ilə bağlılıqda qavradırsa, ikincisi sırf tərcümə faktı kimi ortaya çıxır, yaxud beşincisi bir nida kimi dərin emosional duyğuları əks etdirirsə, altıncısı da qeybi xəbər, din böyüyünün dilindən çıxan axirət məlumatı yerində çıxış edir. Deməli, “Hədiqətü-s-süəda”nın “Cənabi-Qasım” bölümündə olduğu kimi, burada da su məfhumu son dərəcə çoxqatlı və çoxşaxəli olub, yerinə görə adi predmet, yerinə görə dini istilah, yerinə görə də ədəbi-bədii fakt məqamında dayanır.

**3. Ata-oğul məhəbbəti.** Məqtəl və mərsiyələrin ən yanıqlı yerini təşkil edən bu motiv Füzuli irsində bəlkə də burada kulminasiya nöqtəsinə çatır. Doğrudur, əsərdə İbrahim–İsmayıl, Yaqub–Yusif, İmam Hüseyn–İmam Zeynəlabidin xətləri üzərində də ata-oğul münasibətləri qələmə alınmışdır. Ancaq birmənalı surətdə deyə bilərik ki, İmam Hüseyn (ə) və



Əli Əkbər (ə) arasındakı münasibət istər səmimiliyi, istərsə də dəmir nizam-intizama malik olması ilə bunların hamısını üstələyir. Ona görə ki, bu münasibət *validi-büzürgvar, ya əbətah, ey cigərguşə, səbir et* kimi sıravi ifadələrlə bitmir. Düzdür, bunlar da bu iki din böyüyü arasındakı əlçatmaz-ünyetməz ata-oğulluq dağını aydınca göstərir. Ancaq mətn bu motivin daha incə bədii ifadə yollarına da malikdir.

**4.** Gör susuzluq Əli Əkbərə (ə) necə təsir edir ki, o, müvəqqəti də olsa döyüşü dayandırıb atasının yanına qayıtmalı və "Bəni həlak etdi susuzluq və ağırlandırdı bari-ahən!" deyə üz tutmalı olur.

Yaxud İmam Hüseynin (ə) mehribanlıqla istəkli oğlunun üzündən meydanın toz-torpağını təmizləməsi və azacıq təsəlli və təskinliyə qovuşsun deyə onun susuzluqdan həyat nişanəsi görülməyən dodaqlarına Həzrət Muhəmməddən (s) yadigar qalmış üzüyü sürtməsi səhnəsini heç cür hiss-həyəcansız oxumaq olmur.

Və ya İmam Hüseynin (ə) ata məhəbbətini övliyalıq keyfiyyəti ilə yoğuraraq, al-qan içində olan istəkli oğluna "Səninçün şərbəti-Kövsər mühəyya olubdur" sözləri quru dini-əsatiri cəhət olmaqdan çox uzaqdır. Əksinə, səviyyəli oxucu, həqiqi imamhüseynsevər bu sözlərdə bəşəriyyətin dansökülənindən, alatoranlığından axıb gələn, süzülüb tökülən əzəli-əbədi ata-oğulluq münasibətinin çox incə tellərini görəcək, çox həssas məqamlarını sezəcək.

Deyilməmiş qalmasın ki, İmam Hüseyn–Əli Əkbər ata-oğulluğu tamam başqa bir bəhs olan "atalar və oğullar" problemi ilə qarışdırıla bilməz. Hətta Hafiz Şirazi kimi liriki belə deyindirib-danışdıran o problemin burada zərrə qədər də yeri yoxdur.

**5. Peyğəmbər (s) xatirəsi.** Bəllidir ki, dini müqəddəsat, Əhli-beyt, din böyükləri, Peyğəmbər-səhabə münasibətləri əsər boyu çeşidli yönlərdə əlvan və rəngarəng bir xalıtək toxunmaqda, müxtəlif baxış bucaqlarında çevik və işlək bir ilmə kimi təqdim edilməkdədir. "Əli Əkbər" fəslinin



bu hissəsi bu baxımdan da zəngindir. *Həzrəti-Rəsulin nigini-mübarəkləri, nəşeyi-vilayət sərməsti, şərbəti-Kövsər* ifadələri həmin cəhətlərlə bağlıdır. Belə ki, bu ifadələrin birincisi bilavasitə sonuncu Peyğəmbərin (s) əlahiddə bir əlamətini əsərə gətirdiyindən çox maraqlıdır. Çünki Füzulinin *mübarək* dediyi o üzük adi bir bəzək əşyası olmayıb, Həzrət Muhəmmədin (s) peyğəmbərlik və hakimiyyət rəmzinə çevrilmiş bir möhür olmuşdur. "Sana" rədifli nətində:

Sənsən ol xatəm ki, də'f etmiş təmami-hakimi,
Xatəmi-hökmi-risalət tapşırıb dövran Sana! –

deyə bu cəhəti önə çəkmişdir.

Göründüyü kimi, İmam Hüseyn (ə) özünün tükənməz atalıq məhəbbəti ilə Adəm Peyğəmbərin kəmərindən tutmuş Həzrət Muhəmmədin (s) üzüyünədək hər şeyini oğlu Əli Əkbərə verir. Axı Əli Əkbər də həmin müqəddəslər silsiləsinin bir halqası idi.

Bu yöndəki başqa bir incəlik sonuncu Peyğəmbərin üzüyünün susuzluqla üzvi qovuşuqluqda bədii qavrayışa təqdim olunmasıdır. "Təskini-hərarət" – *susuzluğun yatırılması,* "lə'li-abidar" – *sulanmış cavahirata bənzər dodaqlar,* "mülazim etmək" – *sürtmək,* "bir miqdar təskin bulmaq" – *azacıq sakitləşmək* tərkibləri buna xidmət edir.

Peyğəmbər (s) xatirəsini diri saxlamağa yönəldilmiş ikinci ifadə qəhrəmanın igidliyinin təsviri zamanı işlədilən *nə'şeyi-vilayət sərməsti* ifadəsidir. Füzulinin ustalıqla sürəkli təsvir mətninə sığışdırdığı bu ifadə, əslində, bir yandan Həzrət Əlinin (ə) vəliliyindən, vəsiliyindən söz açırsa, o biri yandan Əli Əkbərin həmin vəlilik və vəsilikdəki böyük payı ilə bağlı aydın və yığcam söz deyir.

Digər tərəfdən, nəzərə almamaq olmaz ki, "nə'şə" – *sevinc, şadlıq* və "sərməst" – *ilahi gözəllik önündə əbədi heyranlıq, heyrət* sözləri tərkibə bir xeyli təsəvvüfi-irfani anlam da yükləyir. Bu da heç bir mürşidə mürid olmayan, heç bir dini



təriqətə və fəlsəfi cərəyana qoşulmayan Füzulinin hərdənbir sufizm terminlərindən sırf rəhmani yolda və tam islami məqsədlə necə gözəl barındığını göstərir.

Cənnətdəki Kövsər hovuzunun ixtiyarının Həzrət Əliyə (ə) veriləcəyinə dair məşhur dini bilgini, axirət xəbərini nəzərə aldıqda sonuncu ifadə də Peyğəmbər xatirəsi baxımından ayrıca önəm qazanır. Beləliklə, aydın olur ki, araşdırdığımız mətn bu məsələnin olduqca parlaq bədii ifadə yollarını özündə birləşdirməklə qəhrəmanın mənəvi-əxlaqi və ruhi-psixoloji keyfiyyətlərinin təsirli səhnəsidir.

**6. Düşmən hiyləsi.** İbn Sədin (l.ə) Tariq bin Şişi "vilayəti-Mosul hökuməti"nin "ənam"ı ilə tovlamaq cəhdi düşmənin qoşun böyükləri arasındakı xəbisliyi, ikiüzlülüyü, eqoizmi, amalsızlığı, məsuliyyətsizliyi aydın göstərir. Füzuli "məlun" adlandırdığı Tariqin bu boş vədə aldanmasını nisbətən geniş təsvir edir (Tariqi-məlun hökuməti-Mosul həvasiylə meydana girüb Əli bin Hüseynə nizə həvalə qıldı).

Qəhrəmanla təkbətək bacarmadıqlarını görən ibn Səd Əli Əkbərin üzərinə iki min döyüşçü göndərir. Bu isə meydan müharibəsinin şərtlərinin namərdcəsinə pozulması idi. Ancaq hərbi taktikadan uzaq olan bu düşmən hiyləsi qəhrəmanı zərrə qədər qorxutmur. Əksinə, o, Dədə Qorqud igidləri və Koroğlu dəliləri kimi, "əndişə qıl"mayıb, "nə'şeyi-vilayət sərməsti olur" və "ol iki bin namərdi mütəfərriq edir".

Buraya qədər deyilənlər döyüş texnikası, övliyalıq əzəməti və qeybdən xəbərvermə anlayışları haqqında da aydın anlayış yaratdığından daha onların üzərində dayanmırıq.

* * *

Fəsildə daha iki cəhətin üzərində ayrıca durulmalıdır. Bunlardan biri Əli Əkbərin (ə) şücaətidir.

Mətn bu motivin daşıyıcıları ilə zəngindir. Həmin daşıyıcılar parçada Əli Əkbərin (ə) həm təkbətək, həm də kütləvi döyüş səhnələrindəki ustalığının bədii inikasını təmin edir. Verilən təsvirlər qəhrəmanın igidliyinin hər iki halda misilsiz olduğunu göstərir. Ötəri deyildir ki, Füzuli Əli





Əkbərin şücaətini qələmə aldıqca şövqə gəlir və oxucusunu özünün personajı yerində hiss edə biləcək qədər coşdurur. Onun düşmənə aid etdiyi söz və ifadələr qarşı tərəfin iyrənc xarakteri ilə yanaşı, özünün dərin nifrətini də bildirir. Yada salaq: *hökuməti-Mosul həvəsi, ol bədbəxt, sineyi-pürkinəsinə, cismi-pəlid, şərbəti-fəna, fərqi-namübarək, bərgi-xəzan kibi lərzan olub müharibəsindən mütəvəhhim olduqda...*

Parçada üzərində durulması lazım gələn ikinci cəhət Əli Əkbərin (ə) vilayət anlayışı ilə əlaqələndirilərək bir övliya kimi təqdim olunmasıdır. Bu əlaqənin mətndəki ilk daşıyıcısı "çöheryi-pak" ifadəsidir. "Həzrəti-imamın gərdi-meydanı Əli Əkbərin çöhreyi-pakından pak etməsi", zənnimizcə, qətiyyən epizodik hərəkət olmayıb, imamın övliyaya bəslədiyi ruhi-mənəvi saflığı göstərən köklü bir cəhətdir. İmam Hüseynin (ə) bu davranışını görən səriştəli oxucu dərhal əsərin "Yaqub–Yusif" qissəsindəki:

Alayişi-zəxarifə aludə olmayıb,
Dünyayə pak gəldilərü pak getdilər! –

beytini anacaqdır.

Bu cəhətin ikinci daşıyıcısı İmam Hüseynin (ə) "Peyğəmbərin mübarək üzüyünü susuzluğu yatırmaqdan ötrü" məhz Əli Əkbərin inci dodaqlarına toxundurmasıdır. Əlbəttə, mübarək üzük mübarək dodaqlara toxundurulmalı idi. Axı Əli Əkbər yalnız zahiri görkəmi ilə yox, zəngin daxili aləmi və çevik icraçı bacarığı ilə də Həzrət Muhəmmədin (s) ən ləyaqətli ardıcılı idi.

Mətndə Əli Əkbərin övliyalığını daha aydın göstərən ifadələr də var. "Ol afitabi-asimani-vilayət" və "nə'şeyi-vilayət sərməsti ol"maq ifadələri bu qəbildəndir.

Füzuli irsi ilə müxtəsər tanışlıq birmənalı surətdə göstərir ki, orta əsrlər şairi *afitabi-asimani-vilayət* ifadəsini yalnız Həzrət Əli (ə) haqqında işlədə bilərdi. Bunu sübuta yetirməkdən ötrü "Bəngü badə"nin müvafiq yerinə göz gəzdirmək kifayətdir.



Deməli, Füzuli Əli Əkbəri *afitabi-asimani-vilayət* adlandırmaqla yaratdığı epitetin dini-ictimai məsuliyyətini dərk etmiş və bununla da Kərbəla vaqeəsinə yol açan Yezid (l.ə) üsuli-idarəsinin necə böyük səhvə yol verdiyini, İmam Hüseyn (ə) hərəkatının isə cəmiyyətin inkişafı üçün necə böyük önəm daşıdığını ustalıqla ifadə etmişdir. Axı "iki bin" mübarizdən ibarət düşmən dəstəsi yalnız son dərəcə fövqəladə bir qüvvə yiyəsinin üstünə göndərilə bilərdi. Unutmayaq ki, qaragüruh da olsa, ibn Səd (l.ə) ordusunun tərkibi hələ də bədəvi adət-ənənələrindən əl çəkməmiş cahil ərəblərdən ibarət idi ki, hətta onlar üçün belə iki min nəfərin bir nəfərə qarşı durması böyük rüsvayçılıq sayılırdı.

Əli Əkbərin bu keyfiyyətini göstərən ikinci ifadənin məna-məzmun tutumu daha dərindir. Çünki "nə'şeyi-vilayət sərməsti ol"ması surətin təkcə igidliyindən soraq vermir, bu tərəf qalmaqla yanaşı, həmin ifadə daha çox Həzrət Əlinin (ə) qeybi yardımlarla göstərdiyi misilsiz şücaəti, övliyalıq heybətini də əks etdirir. Burada istər-istəməz İmam Hüseynin (ə) Əli Əkbər haqqında buyurduğu "O, çoxdan Allahın Zatına qovuşub" sözləri yada düşür.

Son olaraq deyilməmiş qalmasın ki, Əli Əkbərin incə xarakterinin susuzluqdan əziyyət çəkməsinin qabardılması qətiyyən onun övliyalıq keyfiyyətinə kölgə salmır. Çünki Füzuli qəhrəmanın bu xüsusiyyətlərini də tamamilə təbii səbəblər və insani amillərlə əsaslandırdığı kimi, sözaltı qatda verdiyi fikirlərlə, əslində, belə dini-əsatiri anlayışların heç vəchlə mücərrəd təsəvvür və təəssüratlar olmadığını da ifadə edir.

* * *

Bölüm belə bitir: "Şahzadə ol bəşarətlə meydana müraciət qıldıqda, ləşkəri-ə'da hücum edüb, yəminü yəsarın alub və nihali-cismi-lətifi gülbüni-qönçə kibi pürpeykan olub və sipərmisal ə'zayi-şərifinə müxtəlif zəxmlər, çaklar salub,





aqibətüləmr ibni Təmir tə’nəsiylə, bir rəvayətdə Mən’ə bin Mürreyi-Əbdi zəxmilə mərkəbdən düşüb nə’rə urdu ki, “Ya əbətah, ədrikni”. Şe'r:

Qərqi-girdabi-fəraq oldum, tərəhhüm qıl, səba
Şərh edüb halım bənim, billah, yetür dildarımı.
Qıldı cəlladi-fələk qəsdi-həlakım Tanrıçün,
Ərz qıl dildarimə hali-dili-əfgarımı.
Var ikən cismimdə can, məqsudum oldur kim, qılam
Şəm’i-ruyindən münəvvər dideyi-xunbarımı”[267].

*(Şahzadə o imamət muştuluğu ilə yenidən döyüşə yollandıqda düşmən qoşunu hücuma keçərək sağ-solunu aldı və onun şəffaf, zərif şitil bədəni qızılgül gönçəsi tək oxla doldu. Şahzadənin bədəni sanki sipərə çevrilmişdi. Çünki atılan oxlar onun şərafətli bədən üzvlərində müxtəlif yaralar açırdı, ən nəhayət, o, ya ibn Təmir hücumu, ya da Mən’ə bin Mürreyi-Əbdinin vurduğu yara nəticəsində atından yıxılıb nərə çəkdi ki, “Ey ata, özünü mənə yetir!”*

*Sən ey səhər yeli, mən axı ayrılıq burulğanında batıb qərq oldum, bir mərhəmət göstərsənə! Sən Allah, düşdüyüm vəziyyətdən o istəkli atamı xəbərdar edib, onu mənə yetir! Əcəl cəlladı həlak olmağım üçün artıq niyyət etmişdir. Səni Tanrı, bu dağınıq könlümdən axan qara qanları o istəkli atama bildir! Axı mənim yeganə məqsədim ruhum bədənimdən çıxmamış bu qan-yaş tökən göz bəbəyimi onun üz şamı ilə işıqlı etməkdir.*

“Həzrəti-imam ol məzlumun intizarında ikən və nə’rəsin eşidüb, biixtiyar meydana girüb ol sərvi-rəvanı xaki-məzəllətdən götürüb xeyməgaha yetürdi və rüxsarın rüxsarinə sürüb ayıtdı: “Ey fərzəndi-dilbənd və ey arami-dili-dərdmənd, bir təkəllüm et”. Şahzadə göz açub validi-büzürgvarın, bəradəri-qəmküsarın və valideyi-biqərarın üzərində görüb ayıtdı: “Ya əbətah, gördüm ki, əbvabi-asiman məftuh olub,

.................................

[267] *Füzuli. Əsərləri, VI cild, səh.322*





şərbəti-Səlsəbildən camlar mürəttəb olubdur". Bu təkəllüm əsnasında ruhi-pürfütuhi rövzeyi-rizvana intiqal etdi. Şe'r:

Mahi-cəmalın ol güli-bağі-risalətin
Sitri-səhabi-mərg nihan etdi, ey diriğ!
Şaxi-güli-hədiqeyi-iqbali-ruzigar
Pamali-inqilabi-xəzan etdi, ey diriğ![268]

*(İmam həzrətləri o məzlumun həsrətini çəkirdi. Bu zaman Əli Əkbərin nərəsini eşidib, dərhal meydana girərək o ruhverici sərvtək cavanı toz-torpağın içindən götürdü və xeymələrə gətirdi. İmam Hüseyn üzünü Əli Əkbərin üzünə sürtərək belə dedi: "Ey mənim ürəyimin açarını özü ilə aparan istəkli oğlum, ey dərdli-qəmli ürəyimin yeganə təsəllisi, nə olar, dil açıb danışsana!"*

*Şahzadə göz qapaqlarını aralayaraq böyük olan atasını, möhnət içində çırpınan qardaşını və dözümünü əldən vermiş anasını başı üzərində görüb dedi: "Ay əziz ata, gördüm ki, səmanın qapıları açılmış və Səlsəbil şərbəti ilə doldurulmuş qədəhlər sıra-sıra düzülmüşdür".*

*Əli Əkbər bu sözləri deyərkən qəlbləri fəth edən ruhu cənnət bağçasına doğru pərvazlandı. Allahın tükənməz mərhəməti bir an belə onu tərk etməsin!*

*(O peyğəmbərlik bağının gülünün Ayabənzər mübarək camalını ölüm buludlarının pərdəsi bəşəriyyətdən gizlətdi, ay aman! Ay aman, zəmanənin qara gəlmiş bəxti, taleyi Əhli-beyt bağçasında bitmiş o qızılgül yarpağını gözlənilməz payız dəyişikliyi ilə ayaqlar altına salıb tapdaq-tapdaq etdi!).*

Əsərin bu yeri Əli Əkbəri (ə) artıq ruhu Allahın (c.c) Zatına qovuşmuş bir müqəddəs kimi qavradır. Çünki o, İmam Hüseynin (ə) əbədi cənnət müjdəsi ilə döyüşə atılır. Odur ki, burada cəngavərlik axtarmaq yersizdir. Əksinə, əsərin bu yeri hər bir Kərbəla şəhidinin qibtə edəcəyi bir ruhi həzz və mənəvi ucalıq məqamının təsvir və tərənnümündən ibarətdir.

.................................

[268] *Füzuli. Əsərləri, VI cild, səh.323*





Bu sətirlərdə Füzuli Əli Əkbəri (ə) qızılgülə bənzətməyə çox fikir vermişdir. O, bunun üçün düşmən qoşununun saysız-hesabsız sıra nəfərlərini qızılgülü əhatə edən tikana oxşatmaqla yaratdığı məcazı bir qədər də dolğunlaşdırmış, bununla həm qəhrəmanın incəliyini, həm də qarşı tərəfin kobudluq və qəddarlığını olduqca incə bir biçimdə qələmə almışdır. Bir də oxuyaq: “Nihali-cismi-lətifi gülbüni-qönçə kibi pürpeykan olub...”

Bölümün bu yerini şərtləndirən başqa bir cəhət tarixilikdir. Çünki Füzuli hər şeyin yerini bilən bir ədib kimi tarixilik prinsipinin yerinin gəlib çatdığını sövq-təbii duyduğu üçün onu önə çəkmişdir. Əli Əkbəri (ə) qətlə yetirən iki şəxsin adını çəkməklə ədib, əslində, irəli gedərək, tarixi araşdırmalar üçün də şərait yaratmış və bununla da Kərbəla vaqeəsi kimi böyük ictimai-siyasi hadisənin gec-tez həqiqi qiymətini alacağına inamını ifadə etmişdir. Ötəri deyildir ki, Füzuli qəhrəmanın vəfatı ilə bağlı bilgi fərqlərini nəinki qeyd etmiş, hətta onların hər birinə ayrıca hissə də ayırmışdır.

Əsərin bu yerinin başqa bir səciyyəvi cəhəti İmam Hüseyn (ə) ilə Əli Əkbər (ə) arasındakı misilsiz ata-oğul münasibətinin parlaq təsvir və tərənnümüdür. Bəllidir ki, nəsrin aciz qaldığı yerdə şeirə söz verilir. Əli Əkbər (ə) də ömrünün son anlarında üzünü səhranın öldürücü səmumuna az da olsa bir sərinlik qatan səbaya – xəfif səhər yelinə tutub, bir ömür atasına deyə bilmədiyi ürək sözlərini bu hava axınına söyləyir: “Qərqi-girdabi-fəraq oldum, tərəhhüm qıl, səba”.

Əli Əkbərin (ə) əlindən dad etdiyi ayrılıq burulğanı qətiyyən bəsit ölüm xofu deyildi. Bu, hər şeydən öncə, zəmanə imamının qulluğunda durmaq şərəfindən məhrum olmağın gətirdiyi ağır bir nisgilin acı təəssüratı idi. Ötəri deyildir ki, həmin misralı şeirdə Əli Əkbər (ə) “billah, Tanrıçün” deyə səbanı iki dəfə Allah-taalaya and verir. Övliyalıq məqamında olan bir kamil şəxsiyyət üçün isə bu, əsla az şey deyildi.

Digər tərəfdən, Əli Əkbər (ə) orada “Şərh edüb halım, qıldı cəlladi-fələk qəsdi-həlakım, hali-dili-əfganım” deyərək,



dəruni iztirabını, ruhi hiss və həyəcanını yerin də, göyün də, elə həzin səba mehinin də başının bağlı olduğu imamət məfkurəsinə, zəmanə imamına şirin-şirin pıçıldayır. Şeirin son beyti isə qəhrəmanın son sözləri kimi səslənir: "Var ikən cismimdə can məqsudum oldur kim, qılam Şəm'i-ruyindən münəvvər dideyi-xunbarımı".

Bununla Əli Əkbər (ə) ruhu bədənindən çıxmadan ruhunu əziz atasının imamət nuru ilə işıqlandırmaq istəyir. Axı mənqəbələr qətlgahda olduqda belə İmam Hüseynin (ə) mübarək camalından nur saçıldığını bildirir (Hilal ibni Nafe). Ötəri deyildir ki, bəşəriyyətin ən böyük mütəfəkkirləri zaman-zaman insanlığı kamil şəxsiyyətlərin mübarək camallarında təcəlli edən əzəli-əbədi həqiqət nurundan işıq almağa səsləmişlər. Məsələn, Şeyx Fəridəddin Əttar "Əsrarnamə" əsərinin "Məqalate-əvvəl dər bəyane-eşqü əql" – "Eşq və ağlın açıqlamasına dair birinci məqalə" adlı ilk fəslində belə deyir:

Dela yekdəm rəha kon abu gelra,
Səlaye-eşq dər dəh əhle delra!
Zenure-eşq şəm'e can bər əfruz
Zəbure-eşq əz canan bər amuz![269]

(Tərcüməsi: *Ey ürək, bir bu "su, palçıq" söhbətini boşlayıb, qəlb əhlinə eşqin tərifini ver! Ruh şamını eşq nuru ilə işıqlandır, eşq zəburunu Canandan, yəni Allah-taaladan öyrən)*[270].

Bəs hissənin daha hansı səciyyəvi cəhətləri var?

Məqtəllərdə, adətən, şəhidlərin başı üstünə İmam Hüseynin (ə) gəldiyi bildirilir, burada da belədir. Ancaq bu epizod əsərin bu bölümündə davam etdirilir. Belə ki, Əli Əkbər (ə) İmam Hüseynlə (ə) yanaşı, qardaşını və anasını da başı üzərində

[269] *Şeyx Fəridəddin Əttar. Əsrarnamə, Tehran, h.-ş. 1298, səh.36*

[270] *Məmmədli N. Şeyx Nəcməddin Razinin "Eşq və əql risaləsi" və onun "Məntiqü-t-teyr"lə əlaqəsi, Filologiya məsələləri, 4, Bakı, 1999, səh.152*





dayanmış görür. Bu təsvir iki cəhətə aydınlıq gətirməyi tələb edir.

Əgər “Bəradəre-qəmküsar” ifadəsi ilə İmam Zeynəlabidin (ə) nəzərdə tutulursa, bu, onun Aşura günündə son dərəcə ağır xəstə olmasına dair tarixi məlumatla uyğun gəlmir. O biri tərəfdən də, Füzuli kimi sərištəli bir ədibin belə yanlışlığa yol verdiyi düşünülə bilməz. Belədə təkcə bir versiya qalır: Əli Əkbərə (ə) bəslədiyi böyük məhəbbət İmam Zeynəlabidini (ə) xəstə yatağından qalxmağa məcbur etmişdir.

“Valideyi-biqərar” ifadəsindən anası Leylanın (s.ə) da Əli Əkbərin (ə) başı üzərinə gəldiyi anlaşılır. Halbuki son illərdə aparılan araşdırmalar birmənalı surətdə sübuta yetirmişdir ki, Leyla (s.ə) Kərbəla vaqeəsindən azı üç-dörd il öncə vəfat etmişdir.

Belədə iki ehtimal ortaya çıxır: ya bu məlumat Füzuli dövründə dini-ədəbi ictimaiyyətə bəlli olmamışdır, ya da şair bilərəkdən belə yazmaqla əsərinin təsir gücünü bir az da artırmaq istəmişdir.

Parçada üzərində durulmasına ehtiyac duyulan cəhətlərdən biri də Əli Əkbərin axirət həyatı ilə bağlı sözləridir. O, atasının “bir təkəllüm et” ricası zamanı son nəfəsində belə söyləyir: “Ya əbətah, gördüm ki, əbvabi-asiman məftuh olub. Şərbəti-Səlsəbildən camlər mürəttəb olubdur”.

Dəqiq islami bilgilərə görə, cənnət səmada yerləşir. Odur ki, Əli Əkbərin (ə) göylərin qapılarından danışması mötəbər məlumatdır.

Digər tərəfdən, bəlli bir dini təsəvvürdür ki, son nəfəslərində əməlisaleh adamlara gedəcəkləri yer göstəriləcəkdir. Ona görə də yuxarıdakı cümlə bu baxımdan da dəqiqdir.

Üçüncüsü, Əli Əkbərin (ə) “camlər mürəttəb olubdur” deyə xəbər verdiyi sıra-sıra düzülmüş qədəhlərin axirət səciyyəsi yalnız pak, saf, təmiz olan, baş gicəlləndirməyən və zərər verməyən cənnət şərbətidir. Qurani-Kərimin “Tur”, “Vaqeə”, “Ər-Rəhman” surələri belə təsvirlərlə doludur.





Hissədə toxunulması lazım gələn bir başqa cəhət Əli Əkbərə (ə) aid edilən “ruhi-pürfütüh” epitetidir. Çünki bu ifadə qətiyyən sıravi bədiilik faktı olmayıb, qəhrəmanın mənəvi-əxlaqi və ruhi-psixoloji yetkinliyini göstərən sərrast bir obrazlılıq örnəyidir. Belə ki, Füzuli bu ifadə ilə Əli Əkbərin (ə) hələ sağlığında ürəkləri fəth edən bir könül əri, bir ümid yeri, bir kamil şəxsiyyət olduğunu demək istəmişdir. Bu ifadədən dərhal sonra şeirin qəmgin təbiəti də, əslində, belə şərəfli bir igid üçün saxlanılan matəmin bədii inikasıdır. “Ey diriğ” – *çox heyif, təəssüflər olsun, ay aman* rədifi, “sitri-səhabi-mərg” – *ölüm buludlarının pərdəsi, “*iqbali-ruzigar” – *dövrün acı gərdişi, “*pamali-inqilabi-xəzan” – *payız dəyişikliyinin əzici təzyiqi* deyimləri özündə birləşdirdiyi yüksək bəşəri kədərlə qəhrəmana yas saxlayır.

* * *

Füzulinin tükənməz Əli Əkbər (ə) sayğısı və sevgisi bir də ondan bilinir ki, o öz qəhrəmanının ucaldığı şəhidlik zirvəsinə yalnız bir nöqtədən baxmır. Əksinə, Əli Əkbərin (ə) şəhadəti haqqında saralmış vərəqlərdə qalan başqa məlumatlara da özünün həzin və şirin sözü ilə yenidən can verir: “Və bu dəxi bir rəvayətdir ki, şəhzadə qəlbi-sipahi-ə’daya həmlə qıldıqda həzrəti-imamın nəzərindən qayib oldu. Ol həzrət biixtiyar anın mütalibətinə rəvan olub, “ya Əli, ya Əli” deyib, hər tərəf gəzüb fəryad edərkən nagah bir canibdən sədayi-“Ya əbətah” istima’ edüb ol canibə rəvan oldu, əmma əsərin görmədi. Və səbəb ol idi ki, Mən’ə bin Mürruyi-həramzadə şəhzadəyə zəxm urduqda bişüur olub, mərkəb biixtiyar anı meydandan çıxarub, bir səhraya bıraxmışdı. Həzrəti-imam şəhzadə təfəhhüsündə ikən gördü ki, mərkəbi-birakib mütəvəccihi-xeyməgah oldu. Cameyi-səbrü təhəmmül çak edüb mərkəbi tutmaq istədi. Mərkəb fərar etdikdə həzrəti-imamı ol mənzilə ilətdi ki, şəhzadə düşmüş idi. Həzrəti-imam gördü ki, şəhzadə aludeyi-xakü xun olub, hənuz həyatından bir rəməq var. Mərkəbindən piyadə olub, səri-mübarəkin kənari-şərifinə





alub, rüxsarın rüxsarinə sürüb, şəhzadə gözün açdıqda Həzrəti-Sultani-Kərbəlanun rüxsari-mübarəkin görüb ayıtdı: "Ey validi-büzürgvar, hala görürəm ki, Həzrəti-Rəsul iki əlində iki cam dutubdur. Birin bana vermək istədi, bən ayıtdım: "Ya cəddah, ikisin dəxi iltifat et ki, qayətdə təşnəyəm". Buyurdu ki, "Ey Əli, bu camlərin biri sənə mənsubdur, sən təsərrüf et. Bu birinə təmə' qılma ki, Hüseyn içün müheyya olubdur. Hala gəlüb nuş edəcəkdir". Bu təkəllümdə ikən canın canana təslim etdi. Rəhmətullahi-əleyh"[271].

*(Əli Əkbərə aid başqa bir rəvayətə görə, şahzadə özünü düşmən qoşununun ən gur yerinə vurduqda imam həzrətlərinin gözündən itdi. O həzrət var gücü ilə onu axtarmağa başladı, "ey Əli, ey Əli" deyə çağıra-çağıra hər yana baxaraq fəryad edirdi. Birdən bir tərəfdən "ay ata" səsini eşitdiyi üçün dərhal o tərəfə yönəldi, ancaq Əli Əkbərdən heç bir nişanə görmədi. Buna səbəb o idi ki, Mənə bin Mürrə haramzadə şahzadəni ağır yaraladıqda o, şüurunu itirmişdi və atı qeyri-iradi olaraq onu döyüş meydanından çıxarıb bir səhraya salmışdı.*

*İmam həzrətləri nigaranlıq içində şahzadənin axtarışında ikən bir minicisiz atın xeymələrə sarı yönəldiyini gördü, bu zaman səbir və dözümünü itirib atı tutmaq istədi, ancaq at qaçaraq imam həzrətlərini də öz ardınca şahzadənin yıxılıb qaldığı yerə çəkib apardı.*

*İmam həzrətləri gördü ki, torpağa və qana bulaşmasına baxmayaraq, hələ şahzadənin bir neçə anlıq nəfəsi qalıb. O, atından düşərək, Əli Əkbərin mübarək başını şərafətli dizlərinin üstünə qoyub üzünü üzünə sürtdükdə şahzadə gözlərini açdı və Kərbəla sultanının mübarək camalını görüb dilə gəldi: "Ey mənim böyük atam, bax elə indi görürəm ki, Rəsul həzrətləri iki əlində iki qədəh tutubdur. O, həmin qədəhlərdən birini mənə vermək istədi. Mən dedim ki, ey baba, mərhəmət göstərərək ikisini də ver. Axı mən çox susuzam! Buyurdu ki, "Ey Əli, bu qədəhlərin biri sənə mənsubdur, al, sən özün iç, ancaq o birinə meyil etmə, çünki o, Hüseyn üçün hazırlanıbdır, indi gəlib nuş edəcəkdir".*

.................................

[271] *Füzuli. Əsərləri, VI cild, səh.323*



*Əli Əkbər bu sözləri deyə-deyə canını canana təslim etdi. Allah ona rəhmət eləsin!).*

Dərda ki, içdi bəzmi-bəlada meyi-fəna,
Canü cəhandan almadan ol növrəsidə kam.
Gülzari-ömri gördü xəzan, görmədən bəhar,
Mahi-cəmalı etdi qürub, olmadan təmam[272].

*(Dərd üstə dərd qoyan budur ki, bu cavan öz bədənindən və dünyadan kam almadan bəla məclisində fanilik meyi içdi, ömür çəmənliyi bahar üzü görmədən sərt payız yelinə tuş gəldi, ay üzü bədirlənməmiş qürub etdi, birdəfəlik gözdən itdi!).*

"Diriğa ki, nihali-növrəsi-imamət izhari-şükufə qılub, çəmənarayi-bustani-vilayət olmuş ikən sərsəri-xəzani-fənadan şikəst buldu və hilali-asimani-səyadət guşeyi-əbru göstərüb əhli-iştiyaqı nəzzarəsiylə məsrur etmiş ikən bədri-təmam olmadan səhabi-əcəldə müxtəfi oldu. Müxəddərati-sərapərdeyi-ismət bünyadi-növhə qılub təcdidi-matəm etdilər"[273].

*(Heyiflər olsun ki, imamlıq növrağının şitili çiçək açaraq övliyalıq bağçasının çəmən bəzəyəni ikən heçlik payızının başıpozuq əsən acı səmum yelindən sındı və seyidlik səmasının hilalı qaşlarının bir guşəsini göstərməklə aşiqləri, əliəkbərsevərləri özünə baxmaqla sevindirmişkən bədirlənmədən əcəl buludları ilə örtüldü. Odur ki, həmişə məsumluq pərdəsi arxasında hamıdan, bütün pis nəzərlərdən uzaq qalan Peyğəmbər xanədanının qız-gəlini ağı deməyə başlayaraq yenidən Əli Əkbərin matəminə əyləşdi).*

Göründüyü kimi, qəhrəmanın vəfatı ilə bağlı bu ikinci versiya istər dini-tarixi yöndən, istərsə də ideya-bədii baxımdan qətiyyən birincidən geri qalmır. Əksinə, bir neçə

.................................

[272] *Füzuli. Əsərləri, VI cild, səh.323-324*

[273] *Yenə orada*





ştrixlə daha geniş məna-məzmun şəbəkəsi əmələ gətirir, daha təsirli səhnələrlə seçilir. Məsələn, birinci rəvayətdə Əli Əkbərin vəfatı daha çox meydan müharibəsi fonunda verildiyi halda, ikincidə döyüş səhnəsi artıq geridə qalır, qan-qadanı təsəvvürəgəlməyəcək qədər böyük olan ata məhəbbəti əvəz edir.

Yaxud, əgər birinci versiyada yalnız "gördüm ki, əbvabi-asiman məftuh olub, şərbəti-Səlsəbildən camlər mürəttəb olubdur" sözlərini söyləyirsə, ikincidə əbədi axirət nemətləri haqqında və sonuncu Peyğəmbər (s) barəsində ətraflı danışır.

Əlbəttə, ədalət naminə deməliyik ki, təfərruat və təfsilat genişliyi heç də həmişə ikinci versiyanın xeyrinə deyil. Məsələn, ikinci rəvayətdən fərqli olaraq, birincidə Əli Əkbər (ə) son nəfəsində atası ilə yanaşı qardaşını və anasını da görür. Bu isə epizodik xarakter daşımayıb, əsərə canlılıq gətirir.

Yaxud, görməmək olmaz ki, poetik məhsul baxımından birinci versiya ikincini bir xeyli üstələməkdədir. Ancaq birmənalı surətdə bəllidir ki, Füzulinin məqsədi versiyaları yarışdırmaq yox, onlar arasındakı fərqli bədii-estetik cəhətləri qabartmaqla qəhrəmanın ruhi-psixoloji durumuna, mənəvi-əxlaqi üstünlüklərinə və şəhidliklə bağlı dünyaduyumuna dair oxucuda aydın anlayış yaratmaq olmuşdur. İnsafən deməyə bilmərik ki, ulu Füzuli qarşısına qoyduğu belə yüksək yaradıcılıq istəyinə bütünlüklə nail olmağı bacarmış, əliəkbərsevərlərin ürəyindən tikan çıxara bilmişdir. Odur ki, gəlin biz də ölməz Füzuli sözünün Əli Əkbər soraqlı izi ilə bir daha böyük şairin Kərbəla sevdasına dalaq.

* * *

Mətnin ilk cümləsindən də anlaşılır ki, İmam Hüseyn (ə) Əli Əkbərin (ə) meydandakı bütün hərəkətlərini izləyir, hər bir halına və davranışına ata məhəbbəti ilə göz qoyurmuş. "Biixtiyar", "ya Əli, ya Əli", "deyub fəryad edərkən", "fədayi, ya əbətah" tərkibləri bunu görümlü biçimdə əks etdirir.





Parçanı orijinal edən başlıca cəhət Füzulinin burada Əli Əkbərin atını ayrıca obraz kimi işləməsidir. “At igidin qardaşıdır”, “Bir mıx bir nalı, bir nal bir atı, bir at bir igidi, bir igid bir eli saxlar” səpkili atalar sözlərinin timsalında atın folklor və etnoqrafiyamızdakı aparıcı yeri və bunun ərəb şifahi xalq ədəbiyyatında, ərəblərin düşüncə biçimində və həyat tərzində çevik və işlək olması şairin haqlı olaraq özünün xəlqi-mədəni keçmişindən ustalıqla barındığını göstərir. Ötəri deyil ki, bölümdə “mərkəbin biixtiyar Əli Əkbəri meydandan çıxarması, bir səhraya, yəni təhlükəsiz yerə aparması, minicisiz atın xeymələrə sarı getməsi, İmam Hüseynin səbirsizliklə “mərkəbi dutmaq istə”məsi, ən nəhayət, atın İmam Hüseyni ardınca apararaq Əli Əkbərin yıxılıb qaldığı yerə çatdırması şirin təhkiyə ilə təsvir olunur. Sonda ürək ağrısı olmadan oxumaq olmur ki, qəhrəmanın canlı, igid və parlaq diriliyi kimi, nəşi məhz doğma atı Üqabın üstundə xeymələrə qayıdır.

Parçaya xüsusi təravət verən cizgilərdən biri də Əli Əkbərin vəfatını təsvir edərkən Füzulinin “canın canana təslim etdi” və “Rəhmətullahi-əleyh” cümlələrini yanaşı işlətməsidir. Zənnimizcə, bu, məntiqi bir dini-ədəbi zərurətdən doğmuşdur. Böyük ehtimalla şair bununla:

> Kim versə can yolunda, bulur xaki məqdəmin,
> Güya ki, xaki-rahinədir nəqdi-can bəha! –

beytindəkinə oxşar bir fikir demək istəmişdir.

Hər iki cümləni vahid dini-fəlsəfi müstəvidən və eyni bədii-estetik qayə ətrafında götürdükdə, buradan belə bir qənaət ələ gəlir ki, şəhidlərin ölməzliyi haqqındakı islami təsəvvür *(“Bəqərə”, 154, “Ali-İmran”, 169-170, “Səff”, 10-12)* ən gözlənilməz hallarda belə ortaya çıxıb öz ictimai-siyasi təzahürünü tapa bilər. Odur ki, həqiqi müsəlman bunu bir anda unutmamalı, əksinə, bu cür uca dəyərlərlə ömrünə-gününə məna qazandırmağa can atmalıdır. Ən nəhayət,





deyilməmiş qalmasın ki, Əli Əkbərin (ə) vəfatı ilə bağlı bu ikinci versiyada önə çıxan bir başqa cəhət yas əhvali-ruhiyyəsi, matəm ab-havası və elegiya notlarıdır. Özü də bu motivlər təkcə ayrı-ayrı söz və deyimlərdə (məs.: *müsibət, meyi-fəna, kam almadan, səhabi-əcəl (ölüm buludları), növhə, matəm* və s.) özünü göstərmir, əksinə, qəhrəmana layiq bir kədər sükutu bütövlükdə mətni bürüyüb onun hər leksemindən görünür. Parçadakı yeganə şeirin sırf elegiya olması isə bu xətti "Əli Əkbər" (ə) fəslinin başlıca keyfiyyətlərindən birinə çevirir. Füzuli dühasının nadir örnəklərindəndir ki, başqa yerlərdə nəsri nəzm tamamladığı halda, burada əksinə, nəzmi məhz o qəbilli, yəni təpədən-dırnağa kimi poeziya ruhlu bir nəsr cümləsi izləyir. Bu isə yalnız Füzulinin tükənməz Əli Əkbər sayğısı və sevgisindən doğa bilərdi.

Beləliklə, aydın olur ki, "Hədiqətü-s-süəda"nın "Əli Əkbər" fəsli özünün mövzu, məfkurə, məzmun, üslub və forma xüsusiyyətləri ilə bir çox orijinal ideya-bədii keyfiyyətlərə malik olub, bütövlükdə əsərin qayəsi ilə qopmaz, qırılmaz bir uyarlıq təşkil etməkdə, baş qəhrəmanla yanaşı, İmam Hüseyn (ə), İmam Zeynəlabidin (ə), Leyla (ə.s), Ömər ibn Səd (l.ə) kimi bir-birindən çox fərqli surətlərin mənəvi siması haqqında da aydın və dolğun anlayış yaratmaqda, ən nəhayət, Füzuli dünyagörüşünün səciyyəvi estetik ifadəçisinə çevrilməkdədir. Ona görə də ürəklə demək mümkündür ki, əsərin bu hissəsi başdan-ayağa kimi imamhüseynsevər, əliəkbərsevər olan orta əsr azərbaycanlısının milli-mənəvi kimliyinə böyük təsir göstərən, dini dünyagörüşünü formalaşdıran başlıca amillər sırasında yer almış, Kərbəla vaqeəsinin və İmam Hüseyn (ə) hərəkatının istər fərdi şəkildə, istərsə də ictimai müstəvidə dərkində şüurlara olduqca müsbət yaradıcılıq və quruculuq ruhu aşılamışdır.



# FÜZULİ QƏLƏMİNİ ACİZ QOYAN MÜSİBƏT

Füzulinin İmam Hüseyn (ə) aşiqi olmasını göstərən cəhətlərdən biri də "Hədiqətü-s-süəda"nın ən iri hissəsinin – 7-10-cu bablarının bilavasitə bu ulu din böyüyünün ömrünün son günlərinə, həyat fəaliyyətinin zirvə nöqtəsinə çevrilən Aşura hərəkatına ayrılmasıdır. Doğrudur, Füzuli İmam Hüseynin (ə) ömür yolunu ayrıca izləmiş, onun haqq yolunda atdığı addımları ayrıca işıqlandırmışdır. Ancaq İmam Hüseyn (ə) şəxsiyyəti, bu şəxsiyyətin əlçatmaz-ünyetməz məziyyətləri, əməl və fəaliyyəti o qədər çoxqatlı və çoxşaxəlidir ki, Füzuli dühası belə bu miqyas genişliyi önündə aciz qalmışdır. Odur ki, şair təcrübəli bir ədib olaraq əsərini baş qəhrəmanının ən səciyyəvi üstünlüklərinin, ən bariz keyfiyyətlərinin təsvir və tərənnümü üzərində qurur. Ötəri deyildir ki, İmam Hüseynin şəhadəti babın "Əli Əkbər" fəslinin təbii ardı kimi başa düşülür.

Füzuli baş qəhrəmanının sərgüzəştini belə başlayır: "Həzrəti-imam vücudi-hirqəti-təmam ilə xəvatini-Əhli-beytə ol müsibətdə təsəlli verüb derdi: "Ey Əhli-beyti-risalət və ey riyazi-gülzari-imamət, bəlayi-asiman nüzul etdikdə asarı cəmi'i-gülzari-imamət, bəlayi-asiman nüzul etdikdə asari cəm'i-kainata şamildir və kafirü müsəlman əhateyi-ümumi-möhnətə daxildir. Əmma əyari-imtiyazi-mö'min bəlada səbrü şükr etməklə rütbeyi-rif'ət bulur və kafir cəzə'vü iztirab qılmağ ilə məqhurü məzmum olur və təqriri-dilpəziri-



"İnnəma yüvəffə'ssabirunə əcrəhüm bi-ğayri-hisabin" bu məzmuna əsəhhi-dəlayidir. Şe'r:

Səbr etməyüb müsibətə hər kim qılur cəzə',
Şayisteyi-məvahibi-əfvü əta degil.
Mə'lum olur məsayibi-ərbabi-küfrdən
Kim, səbrdir vəsileyi-rəhmət, bəla degil"[274].

*(İmam həzrətləri bütün varlığı ilə Əli Əkbərin müsibətində Peyğəmbər xanədanının xanımlarına təsəlli verərək belə deyirdi: "Siz ey Peyğəmbərin Əhli-beyti və imamlıq çəməninin reyhanları, göydən ilahi bəla gələndə təsiri bütün kainatı əhatə edir. Bu zaman kafirliyindən və müsəlmanlığından asılı olmayaraq hamı əzab-əziyyətə düçar olur. Ancaq möminlə kafiri fərqləndirən başlıca ölçü vahidi bəla zamanı səbirli olmaqla giley-güzar etməkdir. Nemət zamanı isə bu ölçü vahidi fasiqliliklə təqvalılıqdır. Xülasə, mömin olan kimsə bəlayə səbir və şükür etməklə uca dərəcə qazanır. Ancaq kafir giley-güzara yol verib özünü iztiraba salmaqla Tanrı qatında qəzəbə tuş gələrək danlağa layiq görülür. Axı "Yalnız (dünyada Allah yolunda çətinliklərə) səbir edənlərə (axirətdə) saysız-hesabsız mükafat veriləcəkdir" ("Zumər", 10) ayəsinə sidq ilə ürək bağlayanlar bu ilahi bəyanatın dəqiq dəlil-sübut mühtəvasına daxildir.*

*Müsibətə səbir etməyib giley-güzar edən şəxs əfv və əliaçıqlıq ehsanına layiq deyil. Kafirlərin başına gələn müsibətlər göstərir ki, ilahi mərhəmətə yol açan amil heç də çətinlik zamanı giley-güzar etmək yox, səbirli olmaqdır).*

Oradan başlayaq ki, parça etiqadi-ibadi və əxlaqi baxımdan olduqca dolğun və tutumlu olub, ən müxtəlif dini-mənqəbəvi anlayışları özündə birləşdirir, onların rəngarəng bədii ifadə yollarının parlaq örnəyinə çevrilir. Birinci cümlə baş qəhrəmanın pak-pakizə Peyğəmbər

.................................

[274] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 324*





soyunun ogünkü nümayəndələrinə yönəldilmiş müraciətinin mövzu və məfkurəsinə dair, məqsəd və vəzifələri haqqında yığcam bilgidən ibarətdir. Belə ki, "xəvatini-Əhli-beyt" tərkibi Peyğəmbər soyunu bildirirsə, "ol müsibət" ifadəsi xüsusi surətdə Əli Əkbərin fəci vəfatına, ümumi şəkildə də bütövlükdə Kərbəla vaqeəsinə işarə yerində durur. Belədə "təsəlli ver"mək deyimi də islami yükdən məhrum olmayaraq, "Bilin, ürəklər yalnız Allahı anmaqla təskinlik tapar" *("Rəd", 28)* qəbilli ilahi bəyanatların bədii inikası kimi anlaşılır.

İmam Hüseynin (ə) müraciətinin ilk diqqətçəkici cəhəti bir din böyüyünün qadına xitab zamanı olduqca incə bir üslubdan istifadə etməsidir. "Rəyahini-gülzari-imamət" *(imamlıq çəmənliyinin reyhanları)* tərkibi dərhal Həzrət Muhəmmədin (s) qadınlarla bağlı həssas münasibətini xatırladır.

İmam Hüseynin (ə) nitqini lazımınca qavramaqdan ötrü bəlayi-asiman deyərkən onun nəyi nəzərdə tutmasını aydınlaşdırmaq qaçılmazdır.

"Hədiqətü-s-süəda"da aparıcı yer tutan bəla motivinin islami dərki olduqca genişdir. Ötəri deyildir ki, Füzuli əsərin müqəddiməsində bu anlayışı bir kəlamçı kimi ayrıca bir bəhsə çevirərək ayə və hədislər əsasında hərtərəfli surətdə açıqlayır.

Göründüyü kimi, bu şəxs XVI əsrin başlıca teoloji bilgilərini özündə birləşdirməklə "bəla" anlayışı ilə bağlı dəqiq təsəvvür yaradır. Elə bu təsəvvürün nəticəsidir ki, əsərin 1-ci babında İbrahim, İsmayıl, Əyyub, Zəkəriyya, Yəhya peyğəmbərlərlə bağlı anlayış ən müxtəlif cəhətlərdən bəhs mövzusuna çevrilir. Məsələn, İbrahim Peyğəmbərin sərgüzəştində oxuyuruq:

Qafil olmaz dərddən dərdə giriftar eyləyən,
Aşiqi-arif deyil dərdini izhar eyləyən.
Əl çəkin dərdim əlacindən ki, təhqiq etmişəm,
İstəsə səhhət verir bimarə bimar eyləyən!





Göründüyü kimi, "dərdə giriftar eyləyən" və "bimar eyləyən" tərkibləri birmənalı surətdə İmam Hüseyn (ə) haqqında danışdığı "bəlayi-asiman"la eynidir.

Bu fikri Zəkəriyya Peyğəmbərə edilən ilahi xitaba da aid edə bilərik.

Yar səndən tərki-can istər, götür candan təmə',
Hər nə andan qeyri görsən, qə't qıl andan təmə'
Şəm'vəş canan səni çün yaxmaq istər müddəsil,
Atəşi-suzanə gir, kəs abi-heyvandan təmə'!

Buradakı *yar, andan qeyri görsən, canan, atəşi-suzan* ifadələri də İmam Hüseynin (ə) toxunduğu bəlayi-asiman bəhsinin başqa bir biçimdə ifadəsidir.

Şəhidlik zirvəsinə ucaldığı zaman Allahla (c.c) Peyğəmbəri (s) arasında olan mükalimədə də "bəla" anlayışı aparıcı yer tutur: "Ey Zəkəriyya, bu hökmi-müta' *(qəti hökm)* mənimdir, əgər mütəəllim olacaq olsan *(kədərlənsən),* ismin cərideyi-nübüvvətdən məhv olmaq müqərrərdir *(adının peyğəmbərlər sırasından silinməsi qaçılmazdır)".*

"Aşiqəm" dersən, bəlayi-eşqdən ah eyləmə,
Ah edüb əğyari-əsrarindən agah eyləmə!
Eşq sultani nə fərman etsə, göstər inqiyad,
İstinab etmə, tənəffür qılma, ikrah eyləmə!

*(Əgər özünün xalis niyyətli aşiq olduğunu iddia edirsənsə, eşq bəlasına görə ah çəkmə, ah çəkərək öz sirlərini rəqibə bildirmə. Eşq hökmdarı hansı fərmanı versə, mütləq tabeçilik göstər, heç vaxt onun fərmanından boyun qaçırma, ona nifrət etmə və sidqini ondan siyirmə).*

Zəkəriyya ayıtdı: "İlahi, çün mənim qanım sənin sərikuyində tökülür, həqqa ki, əgər ərrəvar cəmiyyi-əndamim zəban olsa, şükründən qeyri təkəllümə iqdam etməyəm və iztirab edüb, təriqi-cəza dutmayam" *(Ya Rəbb, mənim qanım*





*sənin camal, calal və kamal nişanələrinin təcəlla etdiyi yerdə töküldüyü üçün, doğrudan da, bütün bədənim mişarın dəlikləri kimi dildən ibarət olsa, heç vaxt sənin şükründən başqa dilimə söz gətirmərəm və iztiraba düşüb giley-güzar yolunu tutmaram).*

Ləzzəti cövrü bilən cövrdən ikrah etməz,
Yarsalar cismini başdan-ayağa, ah etməz!

“Bəla” anlayışının “Hədiqətü-s-süəda”da ən yaxşı işlənmə məqamı ilə – irəlidə İmam Hüseynlə (ə) İmam Zeynəlabidinin (ə) vida səhnəsində qarşılaşacağıq. Birmənalı surətdə deyə bilərik ki, həmin səhnə müqəddəslərin bu məsələyə dair baxışı haqqında çox söz deyir.

* * *

Parçanı önəmli edən bir cəhət İmam Hüseynin (ə) “bəla” anlayışına yanaşma biçimidir. Belə ki, *kafirü müsəlman, əyari-imtiyazi-möminü kafir, bəladə səbrü cəzə, səbrü şükür, rütbeyi-rif’ət, cəzəvü iztirab, məqhurü məzmun* ifadələri imamın öz mövqeyini sırf islami inanış üzərində qurduğunu əks etdirir. Odur ki, həmin ifadələrə yüklənmiş aparıcı anlayışların başlıca dini-fəlsəfi mahiyyətinə varmadan bu ulu din böyüyünün “bəlayi-asiman” dedikdə daha çox nəyi nəzərdə tutduğunu bilmək olmaz.

“Bəlayi-asiman nüzul etdikdə asari, cəmi’i kainatə şamildür və kafirü müsəlman əhateyi-ümumi-möhnətə daxildür” cümləsindən əsasən bu qənaətlər ələ gəlir:

1) Bəla göydən gəldiyi üçün Tanrı tədbiridir;

2) Bəla, hər şeydən öncə, ilahi imtahandır;

3) Kainat bütün mümkün məxluqların ortaq, müştərək evidir. Odur ki, Tanrı təqdiri və ilahi imtahan olan bəlanın istər təbii-fiziki, istərsə də ictimai-mənəvi təzahürləri yer üzünün hər yerini əhatə edir;





4) Bəla gəldiyi zaman kafirlərlə yanaşı müsəlmanların da əzab-əziyyət çəkmələrinin bir səbəbi onların öz insani borclarını yerinə yetirməmələrində axtarılmalıdır.

"Bəla göydən gəldiyi üçün Tanrı tədbiridir" qənaətini Kərbəla vaqeəsinə tətbiq edə bilməkdən ötrü, heç şübhəsiz, bunun islami söykənəcəyini üzə çıxarmalı, dini-fəlsəfi məzmununa bələd olmalıyıq.

Əgər bu qənaətə bu mövqedən baxsaq, yəqin ki, onu asanlıqla Kərbəla vaqeəsinə tətbiq edə bilərik. Bu zaman bütün aydınlığı və genişliyi ilə bizə bəlli olar ki, Kərbəla vaqeəsi İmam Hüseynin gözündə ozamankı ictimai-siyasi proseslərin qaçılmaz, labüd təzahürü, məhz onun dini-dünyəvi rəhbər qismətinə yazılan misilsiz ilahi bəxşişdir. Burada istər-istəməz Məcnunun sözləri yada düşür:

Olduqca mən götürmə bəladən iradətim,
Mən istərəm bəlani, çü istər bəla məni!

İmam Hüseynin (ə) bu nitqinin ilk cümləsindən ələ gələn ilk qənaət də *(Bəla hər şeydən əvvəl ilahi imtahandır)* məfkurəcə geniş olub, sarsılmaz islami dayağa malikdir. Ötəri deyildir ki, traktat qədər fəlsəfi olan "Leyli–Məcnun" bölümlərində Füzuli bu məsələni də ətraflı surətdə işləmiş və bu mürəkkəb problemlə bağlı anlaşıqlı bədii mühakimə yürütmüşdür. Odur ki, Kərbəla vaqeəsi bəşəriyyət tarixində insanlığın qarşılaşdığı bəlkə də ən ağır imtahan, ən çətin sınaqdır və əhatə etdiyi müddəa və prinsiplərcə mənalı ömür yolu keçirmək istəyən hər bir kimsə üçün tükənməz dini və ictimai resurs mənbəyidir.

Doğrudur, "Kainat bütün mümkün varlıqların müştərək evidir" qənaəti ilk baxışda bir xeyli panteist təsir bağışlayır. Ancaq ilk iki qənaətlə üzvi uyarlıqda götürdükdə, oxucu baş qəhrəmanın bu sözlərini **"Siz harada olsanız, Allah sizinlədir"** *("Hədid", 4)* səpkili ilahi bəyanatların təsdiqi kimi qavrayacaqdır. Deməli, Tanrı təqdirinin və ilahi imtahanın birmənalı atributu və ekvivalenti olan "bəla"nın yer



üzünün hər yerini, hər fərdini və hər cəmiyyətini əhatə etməsi istər təbii fiziki və ictimai-mənəvi baxımdan, istərsə də sırf dini-fəlsəfi bazada tamamilə köklü müddəadır. "Əli Əkbər" fəslinin başlanğıcında bütövlükdə kainatın şəxsləndirilərək obrazlaşdırılması onun çoxsaylı örnəklərindən biridir.

* * *

Bəllidir ki, İslamın iman əsasları "Üsuli-d-din", əməl və fəaliyyət istiqamətləri də "Firu'i-d-din" kodekslərində toplanmışdır. İkinci kodeksin 10 prinsipindən biri yaxşılığa həvəsləndirib, pisliklərdən çəkindirməkdir. İmam Hüseynin (ə) "bəla" haqqındakı sözləri insanların dindar və vətəndaş kimi kifayət qədər müsəlman həyat tərzi keçirməmələrindən, Tanrı və öz vicdanları qarşısında lazımınca məsuliyyət duymamalarından duyulan bir dini-dünyəvi rəhbər təəssüfü, bir imam təəssüratıdır. Odur ki, Kərbəla vaqeəsinin törənməsinə bu faktorun da az təsir göstərmədiyi nəzərə alınmalı, belə halların, əslində, cəmiyyətin aparıcı təbəqələri üçün müstəsna hərəkətəgətirici və istiqamətverici ola biləcəyi unudulmamalıdır. Axı heç kimə gizli deyildir ki, Kərbəla vaqeəsi kimi böyük faciənin İslamın köksü üzərində dərin xəncər yarası açmasının bir səbəbi də ozamankı İslam dünyasında hökm sürən hərc-mərclik, müsəlman cəmiyyətində baş alıb gedən məsuliyyətsizlik və laqeydlik idi.

❖ "Siz insanlara yaxşı işlər görmələrini əmr etdiyiniz halda özünüzü unudursunuz? Halbuki özünüz Kitab (Tövrat) oxuyursunuz. Məgər (çirkin əməllərinizi) başa düşmürsünüz?" *("Bəqərə", 44)*.

❖ "Sevdiyiniz şeylərdən (haqq yolunda) sərf etməyincə savaba çatmazsınız. Şübhəsiz ki, Allah (Onun yolunda) xərclədiyiniz hər bir şeyi biləndir" *("Ali-İmran", 92)*.

❖ "Bir kimsə özü üçün arzuladığını qardaşı üçün də arzulamadıqca həqiqi mömin ola bilməz" *(Həzrət Muhəmməd (s))* səpkili ayə və hədislər və onlarla bağlı irəli sürülən çoxsaylı fikirlər bu cəhətin İmam Hüseynin (ə) nitqinə





ayrıca bəlağət və fəsahət gətirdiyini, sözlərini Allah kəlamı qədər təsirli etdiyini göstərir.

* * *

İmam Hüseyn (ə) sözlərinin ardında fikrini daha aydın bildirməkdən ötrü əyani misal çəkir. Belə ki, o, insanın Allahın verdiyi nemətlərə münasibətini müəyyənləşdirmək üçün "fisqü vərə'"nin aparıcı yer tutduğu kimi, Tanrı təqdiri və ilahi imtahan olan "bəla"ya dözüb-dözməməkdə də "mö'minü kafir"liyin məhz "səbrü cəzə'" ilə üzə çıxdığını bildirir ("Əyari-imtiyazi-mö'minü kafir bəladə səbrü cəzə'dir, netə kim, nemətdə fisqü vərədir").

Ulu din böyüyünün buyurduğu mətləblərə aydınlıq gətirmək üçün gör neçə istilahın dini-fəlsəfi tutumu və ictimai-mənəvi çəkisi ortaya qoyulmalıdır: 1) mömin, 2) kafir, 3) nemət, 4) fisq, 5) vərə, 6) səbir, 7) cəzə.

Hər biri köklü islami məsələ olan bu anlayışlar istər ayrılıqda, istərsə də küll halında imamın nitqində yeniləşmiş, təzə əhvali-ruhiyyəyə qovuşmuş və sanki Kərbəla vaqeəsi ərəfəsində ölməkdə olan dini-mənəvi dəyərlərə yenidən can vermişdir. Məsələn, "Hədiqətü-s-süəda"da İmam Hüseynin (ə) Mədinədən Məkkəyə və Məkkədən Kərbəlaya gəlişini ardıcıllıqla izləyən hər bir oxucu özü üçün konkret mömin və kafir tipləri müəyyənləşdirəcəkdir. Belə ki, o, əslində, nemətin maddiyyatla məhdudlaşmadığını, fisq və vərənin bu qeyri-məhdudluğu üzə çıxarmaqda aparıcı yer tutduğunu, səbir və cəzənin də insanın Tanrı və vicdanı qarşısındakı şüurlu məsuliyyət hissinə yön verdiyini daha əyani surətdə görəcəkdir. Odur ki, imam sözlərini "lacərəm, mömin bəlayə səbrü şükür etməklə rütbeyi-rif'ət bulur və kafir cəzə'vü iztirab qılmaqla məqhurü məzmum olur" deyə yekunlaşdırır. "Yalnız (dünyada Allah yolunda çətinliklərə) səbir edənlərə (axirətdə) saysız-hesabsız mükafat veriləcəkdir" *("Zumər", 10)* ayəsinin İmam Hüseyn (ə) kimi əlçatmaz-ünyetməz bir kamil şəxsiyyətin dili ilə bir daha dilə gətirilməsi də danılmaz biçimdə göstərir ki,



buradakı "üybeyi rif'ət" əsla "uca məqam, yüksək dərəcə" şəklində sadələşdirilərək bəsitləşdirilə bilməz. Çünki belədə ifadənin alacağı "böyük bəndəlik şərəfi" *("Fatir", 10)* anlamı belə ulu din böyüyünün çatdırmaq istədiyi mətləb yönündə aciz qalacaqdır. Zənnimizcə, İmam Hüseyn (ə) burada insan kamalının çata biləcəyi ən yüksək zirvədən, ən uca nöqtədən danışır ki, bu da şəhidliklə əldə edilə bilən övliyalıqdır.

Ən nəhayət, mütləq qeyd edilməlidir ki, Füzuli imamın nəsrlə verdiyi sözlərini şeirlə də bir daha bədiiləşdirib bir din böyüyünə layiq olan yüksək sənət abidəsinə çevirir. Ötəri deyildir ki, şair poetik parçanı "əfvü əta" və "rəhmət" məfhumları ilə bir az da zənginləşdirir.

* * *

İmam Hüseyn (ə) sözlərini belə davam etdirir: "Ey xəvatini-sərapərdeyi-sitrü ifaf, səbr edin və təhəmmül pişə qılun ki, bu səbrü təhəmmülün nəticəsi axirətdə rövzeyi-nə'im və dünyada Qiyamətədək ehtiramü tə'zimdir. Zinhar, zinhar, bəndən sonra çaki-giriban edüb muyi-sər pərişan etməyəsüz ki, mövcibi-şəmatəti-ə'da olmaya. Əmma giryədən sizi mən' etməzəm, zira abi-dideyi-məzlum hədiqeyi-rəhməti sirab edər və seyli-əşki-qəribi-məhmum ilə mir'ati-əməldən qübari-küdurət gedər"[275].

*(Siz ey gözlərdən gizli qalan ilahi ismət və namus evinin xanımları, daima səbir edin, həmişə ağır və çətin Tanrı sınaqlarına hazır olun. Çünki bu, Axirətdə Nəim cənnətinə getməyinizə, dünyada isə qiyamətədək hamının dərin sayğı və sevgisini qazanmağa yol açar. Amandır, amandır! Mənim vəfatımdan sonra yaxa yırtıb, saç açmayınız. Çünki bu, düşmənin istehza və şəbədəsinə səbəb verə bilər. Ancaq mən heç vaxt ağlamağı sizə qadağan etmərəm. Ona görə ki, məzlumların göz yaşları ilahi mərhəmət bağçasını suvarar və biçarələrin, qəriblərin göz yaşı seli ilə əməl və fəaliyyət*

.................................

[275] *Füzuli. Əsərləri, VI cild, səh. 324*





*güzgüsündəki qəm-kədər tozu, yaxud hər cür maddi istəklər və həvavü həvəs nişanələri aradan qalxar).*

İmamın “Xəvatini-sərapərdeyi-sitrü ifaf” xitabı istər-istəməz “Ayətü-l-təthir”i xatırladır. Ayə belədir: “Ey Əhli-beyt! Allah sizdən çirkinliyi (günahı) yox etmək və sizi tərtəmiz (pak) etmək istər!” *(“Əhzab”, 33).*

“Axirətdə rövzeyi-Nəim” tərkibi də bizi Qurani-Kərimə üz tutmağa sövq edir. Bəllidir ki, Müqəddəs Kitabımızda möminlərin axirətdəki nemət və mükafatlarına dair ətraflı məlumat verilir *(“Bəqərə”, 25; “Məryəm”, 61; “Möminun”, 11; “Səcdə”, 19; “Yunus”, 9 və s.).*

* * *

İmam “Dünyada Qiyamətədək ehtiramü təzim” deyərkən isə “Məvəddət” ayəsini nəzərdə tutmuşdur. “(Ya Peyğəmbər!) De: “Mən sizdən bunun (risaləti təbliğ etməyimin) müqabilində qohumlara məhəbbətdən (Əhli-beytə sevgidən) başqa bir şey istəmirəm” *(“Şura”, 23).*

Bu ayələrin və onlara verilən açıqlamaların işığında baxdıqda tərkibin Peyğəmbər xanədanının hicri-qəməri 61-ci ilində, miladi 680-ci ildə Kərbəla çölündə tuş gəldiyi son dərəcə böyük faciəyə görə hər cür dini-dünyəvi saygı və sevgiyə, qaygı və hörmətə layiq olması fikrini də özündə birləşdirdiyi ortaya çıxır. İmam Hüseyn (ə) başda olmaqla, şəhidlər üçün saxlanılan matəm də bu təqdirəlayiq münasibətin ayrılmaz bir parçasıdır.

Parçada diqqəti çəkən cəhətlərdən biri də imamın öz ailə üzvlərinə nəyin bahasına olursa-olsun hicabı qorumağı tapşırmasıdır. Qurani-Kərimdə möhkəm surətdə təkid edilən və israrla tapşırılan bu Tanrı göstərişi *(“Nur”, 30)* ilahi hökmlərin hər yerdə və hər vəziyyətdə danışıqsız yerinə yetirilməsinin İslamın labüd şərti olmasından, müsəlman həyat tərzinin hətta hərbi şəraitdə belə sonadək gözlənilməsinin zərurətindən soraq verir. “Zinhar, zinhar!” nidası hicab buyuruğunun önəmi ilə yanaşı, Əhli-beyt xanımlarının qadın



təbiətindən irəli gələn həssaslığı da səmimi şəkildə ifadə edir. “Mövcibi-şəmatəti-ə’da” – *düşmənin istehza və şəbədə etməsi üçün bəhanə* tərkibi isə düşmən tərəfin mənəviyyatsızlığını, əxlaqsızlığını bildirməklə yanaşı, yaxa yırtmaq, saç yolmaq kimi cahiliyyət adətlərinin Hicrətin 60-cı illərində də mövcud olduğunu və bunun dini-dünyəvi rəhbər kimi imamı (ə) da dərindən narahat etdiyini bizə çatdırır. Ədalət naminə deməliyik ki, müasir müctəhidlər həmişə bu cəhəti göz önündə tutaraq, müqəllidlərini belə ifrat hallardan çəkinməyə çağırmış, bu barədə konkret fitvalar vermişlər və bütün bunlar Aşura günündə şəhidlərə saxlanılan yas mərasimlərinə də aid edilmişdir.

Ancaq “Giryədən sizi mən’ etməzəm” – *ağlamağı sizə qadağan etmərəm* şəklindəki sözlər imamın bir könül əri kimi həyatın hər məqamını nəzərə almasını, qəm-kədərin yalnız ürəyi sakitləşdirən həzin göz yaşları ilə yüngülləşdirilə biləcəyini tövsiyə etdiyini göstərir.

* * *

Füzuli “İmam Hüseynin şəhadət fəsli”ni belə davam etdirir: “Pəs əsağiri-övladını əkabirə əmanət təriqiylə təslim edüb və məcmuin Vacibülvücuda tapşırub, vida’ qılub meydani-məsafa mütəvəccih olduqda mütəhhərati-Əhli-beyt bir növhə qıldılar və bir növ’lə nalan oldular ki, sükkani-səvami’i-mələkut ğülğüleyi-növhələrindən sərasimə olub (təsbihü təhlillərin fəramuş etdilər və ənadilü qümariyi-riyazi-behişt zəmzəmeyi-giryələrindən) mütəhəyyir qalub kəndü sürudlərin unutdular. Şe’r:

Şahidi-ifrati-ğəmdir kəsrəti-fəryadü ah,
Seyli-abi-çeşm miqdarı dil azarincədür.
El əzasinə nə nisbətdir əzayi-Əhli-beyt,
Çün əzası hər kimin məqtul miqdarincədür.







*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. İraq. Kərbəla şəhəri*

Ol hala müqarin Əliyyi-Əsğər ki, tifli-şirxarə idi və hərarəti-ruzigar qönçeyi-pistani-validəsinə hiddəti-peykan verüb ol tiflin çeşmeyi-məişətin məsdud qılmışdı və ol tifli-mə’sum iztirabi-cu’vü ətəşdən vərteyi-həlaka qərib olmuşdu, həzrəti-imama əhvalın ərz etdikdə, həzrəti-imam ol tifli mübarək əlinə alub, ləşkəri-müxalifə müqabil durub ayıtdı: “Ey zalimlər, tutalım ki, bən günahkaram, bu tifli-bigünaha neçün bir qətrə su verməzsiz?” Ol səngparələrdən abi-rəvan çıxmaq mümkün olmayub ayıtdılar: “Ey Hüseyn, Übeydullahi-Ziyadın hökmi-rəvanı su mən’ində müəkkəddir, təğəyyür bulmaz və bey’ət etməyincə sana və övladına su içmək müyəssər olmaz”. Həzrəti-imam novmid olub müraciət etmək sədədində ikən Hüzeymə Kahili bir navəki-dilduza güşad verüb, ittifaqla ol mə’sumun hülqi-mübarəkinə dəgüb, güzar edüb həzrəti-imamun saidi-mübarəkinə sancıldı. Həzrəti-imam ol oxu çəkdikdə ol tiflin hulqumundan çeşmeyi-xun rəvan olub, pak edərək validəsinə yetirüb ayıtdı: “Ey biçarə, fərzəndin şərbəti-şəhadət ilə sirab oldu”.

Rəvayətdir ki, Əliyyi-Əsğərlə yetmiş iki nəfər təmam oldu və Həzrəti-İmam Zeynəlabidindən qeyri ki, bimardı, səhrayi-



vücudda Həzrəti-Hüseynə həmrah qalmadı. Şəhzadə kəndüsin tənha gördükdə ahi-cigərsuz çəküb bu məzmunla bir rəcəz ağaz etdi ki. Şe'r:

Dərda ki, dari-dəhrdə bir yar qalmadı,
Bir yari-qəmküsarü vəfadar qalmadı.
Dami-bəladan əhli-vəfa buldular nəcat,
Bir bəndən özgə zarü giriftar qalmadı"[276].

*(İmam Hüseyn (ə) kiçik övladlarını böyüklərinə əmanət kimi tapşırıb hamını isə ən Vacib Varlığa – Allah-taalaya həvalə edərək vidalaşdı və döyüş meydanına sarı yönəldikdə Əhli-beyt xanımları elə bir tərzdə növhə oxuyub o qədər ah-nalə çəkdilər ki, idarəedici mələklərin (qüvvələrin) bunu eşidənlərinin sükançıları onların mərsiyələrinin təsirindən özlərini itirib zikrlərini unutdular, cənnət bağçalarındakı anadil və qumrular da onların ağlar hıçqırıqlarından heyrətə düşərək ötdükləri nəğmələri yaddan çıxartdılar. "Fəryad etməyin və ah çəkməyin çoxluğu qəm-kədərin həddi-hüdudu keçməsinin dəlil-sübutudur. Göz yaşlarının selə-suya dönməsi könüldə olan qüssənin dərəcəsindən asılıdır. Əhli-beytin sərgüzəşti heç vəchlə başqalarının sərgüzəşti ilə bir tutula bilməz, çünki hər kəsin sərgüzəşti verdiyi itkilərin sayı ilə ölçülür".*

*Südəmər körpə olan Əli Əsğər anasının döşünün qönçəsi zamanənin əmələ gətirdiyi susuzluq nəticəsində iti ox ucuna çevrilməklə o uşağın dolanışıq bulağının gözünü tutmuşdu və az qalmışdı ki, günahsız körpə aclıq və susuzluqdan məhv olsun. Bu zaman onun ağır vəziyyətini imam həzrətlərinə (ə) bildirdilər və o, o mübarək körpəni əlləri üstünə götürüb düşmən qoşununun qarşısına gələrək buyurdu: "Ey zülmkarlar, tutaq ki, mən günahkaram, bəs bu məsum körpəyə niyə bir damla su vermirsiniz?"*

.................................

[276] *Füzuli. Əsərləri, VI cild, səh.324-325*





*O daş parçasına çevrilmişlərdən axar su gözləmək imkan xaricində olduğu üçün onlar belə cavab verdilər: "Ey Hüseyn, Übeydullah Ziyadın su qadağasına dair hökmü möhkəmdir, əsla dəyişməz və beyət gətirməyənədək sənə və övladlarına su içmək qismət olmaz!"*

*İmam həzrətləri ümidsiz olub qayıtmaq istəyərkən Hüzeymə Kahili bir iti oxu yaya qoyub atdı və o ox o günahsız körpənin mübarək boğazına dəyərək dəlib keçməklə imam həzrətlərinin mübarək qoluna sancıldı. İmam həzrətləri o oxu çəkib çıxartdıqda həmin körpənin boğazından qan bulaq kimi axmağa başladı, o, Əli Əsğəri pak edərək anasının yanına apardı və ona belə söylədi: "Ay yazıq, balan şəhidlik şərbəti ilə doyunca su içdi".*

*Rəvayətə görə, Əli Əsğərlə 72 nəfər tamam oldu və o gün müvəqqəti olaraq xəstələnmiş İmam Zeynəlabidin həzrətlərindən başqa, varlıq aləmində Həzrət Hüseynə bir yar-yoldaş qalmadı. Şahzadə özünü tək-tənha gördükdə ciyər odlayan bir ah çəkib bu məzmunlu bir rəcəz oxumağa başladı ki: "Dərd budur ki, dünya evində bir yarı-yoldaş qalmadı, qəmə, kədərə ortaq ola biləcək vəfalı bir şəxs gözə dəymir. Bütün vəfalı dostlar bəla tələsindən qurtuldular, bir məndən özgə ağlar və tələyə düşmüş kimsə yoxdur").*

Göründüyü kimi, parça istər dini-fəlsəfi fikirlərlə, istərsə də bədii-estetik mənalandırmalarla zəngindir. Özü də bu, son dərəcə üzvi uyarlıq içindədir. Odur ki, biz də bu uyarlığı pozmadan mühakimə yürütməliyik.

Parçanın başlanğıcı bir el sözünü yada salır: "Bunları sənə tapşırıram, səni də Allaha". Lakin Füzuli bu folklor faktını eynən əsərə gətirməmiş, İslamda böyük önəmə malik olan "əmanət" məfhumu ilə qırılmaz bağlılıqda işlətmişdir. Deməli, şair bu zaman Qurani-Kərimə yaxşı bələd olan orta əsr oxucusunun bilgi çevrəsini (məlumat dairəsini) nəzərə almış və onun əmanətlə bağlı hökmləri assosiativ surətdə də olsa anacağını yəqin etmişdir *("Nisa", 58; "Ənfal", 27; "Əhzab", 71)*. Bu isə bir xeyli öyrənilmiş "Füzuli və folklor"



probleminin indiyədək toxunulmamış spesifik cəhətlərindən biridir.

İmam Hüseynin (ə) öz övladlarının hamısını Allaha həvalə etməsindən danışarkən Füzulinin "ləfzi-cəlalə" "Vacibül-Vücud" ifadəsini işlətməsi yalnız sırf dini-fəlsəfi aspektdə yox, Kərbəla vaqeəsi müstəvisində də ayrıca bədii-estetik yük daşıyır. Çünki hansı prizmadan yanaşılırsa-yanaşılsın, Kərbəla vaqeəsi ilk növbədə ilahi qüdrət və hikmətin danılmaz və pozulmaz bir təzahürüdür. Odur ki, buradakı "Vacibül-Vücud"u bəsit ənənəvi deyim tərzinin məhsulu saymaq olmaz. Ötəri deyildir ki, Füzuli nəinki fəlsəfi traktat olan "Mətləü-l-etiqad"da, bədii əsər olan "Leyli–Məcnun"da da varlıqların "vacib və mümkün" deyə iki yerə ayrılmasını az qala bir kəlamçı dəqiqliyi ilə işləmiş, buna böyük diqqət ayırmışdır.

* * *

Parçanın ideya-bədii xüsusiyyətləri sırasında miqyas genişliyi ayrıca diqqət çəkir. Mərhum prof. Azadə Rüstəmova çox doğru müşahidə etmişdir ki, "Klassik İslam Şərqi, eləcə də Azərbaycan şeirinin görkəmli nümayəndələrinin əsərləri yüzilliklərin sınağından ona görə çıxmışdır ki, onlar zahirən normativ çərçivələrə sadiq qalaraq ənənəvi bədii məzmun və forma daxilində şahidi olub təsirləndiyi hər hansı bir həyat hadisəsinə, onun hətta bir ünsürünə, cizgisinə belə ictimai-bəşəri məzmun vermiş, bütün bunlara mütəfəkkir-filosof, şair-vətəndaş mövqeyindən yanaşmışlar"[277].

Alimin bu fikrini parçanın başlanğıcına aid etsək, "sükkani-səvami'i-məlakut" – *eşidici qüvvələrin sükançıları,* "sərasimə olmaq", "təsbihü təhlillərin fəramüş et"mək tərkibləri ümumi məzmunun içində xüsusiləşərək əngin bir miqyas genişliyi qazanır. Başqa sözlə, bu o deməkdir ki "mütəhhərati-Əhli-beyt"in "növhə"si cənnət quşlarının nəğmələrindən daha təsirli, daha qəmgin olub, Aşura gününün faciəsini daha canlı biçimdə göz önünə gətirməyə imkan verir.

................................

[277] *Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, II cild, Bakı, 2009, səh. 419*



Şair müqayisəni şeirlə davam etdirir. Ancaq incə bir orijinallıqdır ki, gözləniləni əksinə olaraq, şeir nəsrdən daha emosional olmaq yerinə daha fəlsəfidir. Belə ki, Füzuli poetik mətni səbəb-nəticə üzərində qurur: "Şahidi-ifrati qəm" "kəsrəti-fəryadü ah"ın "seyli-abi çeşm" "dil azari"nin nəticəsi, təzahürü yerində qavranır. Əlbəttə, bu, qətiyyən bütün varlığı ilə lirik olan Füzulinin poetik zəifliyi kimi yozula bilməz. Bizcə, Füzuli burada nəsr-nəzm növbələşməsinin məzmun tarazlığını təmin etmişdir.

Parça Kərbəla vaqeəsinin çox həssas məqamlarından olan İmam Hüseynin (ə) südəmər körpəsinin müsibəti ilə davam edir.

* * *

Məqtəl və mərsiyə ədəbiyyatının ən işlək və çevik motivlərindən olan Əli Əsğər surəti faciənin bəşəri tərəfini qat-qat gücləndirdiyindən ədiblər vaqeənin bu cəhətinə ayrıca diqqət yetirmiş, Əli Əsğərin faciəsini bütövlükdə insanlığın üz qarası kimi təqdim etmişlər. Füzuli də bu yolla getmişdir. Belə ki, o, "tifli-şiirxarə" – *südəmər körpə,* "hərarəti-ruzigar" – *Yezid qoşununun Aşura günüdə törətdiyi misilsiz cinayət*, "ol tiflin çeşmeyi-məişəti" – *o günahsız körpənin (susuzluqdan dözülməz hala gələn) dolanışığı, yaxud yaşamaq hüququnun kobud surətdə pozulması,* "və'deyi-həlakət qərib olmaq" – *bilərəkdən ölüm həddinə çatdırılmaq* kimi mənalandırma və səciyyələndirmələrlə atanın əlləri üstə qanına bələşən o müqəddəsin aydın cizgilərini, unudulmaz xatirəsini və əbədi mövqeyini ustalıqla qələmə almağı bacarmışdır.

Fəslin bu hissəsi əhatə dairəsinin genişliyinə görə "Əli Əsğər" bölümü adlandırıla bilər. Bunu təmin edən cəhətlərdən biri imamla düşmən qoşunu arasındakı mükalimədir. Düşmən qoşunu imamın "Ey zalimlər, dutalım kim, mən günahkarəm, bu tifli-bigünahə neçin bir qətrə su verməzsiniz?" şəklindəki tarixi xitabına "Ey Hüseyn, Übeydullah Ziyadın hökmi-rəvani su mən'ində müəkkəddir, təğəyyür bulmaz və bey'ət





*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. İraq. Kərbəla şəhəri*

etməyincə sənə və övladinə su içmək müyəssər olmaz!" deyə olduqca mənfur bir cavab verir.

Özlüyündə bədii təzad olan bu mükalimə, əslində, ozamankı müsəlman cəmiyyətinin ictimai ziddiyyətlərinin parlaq ifadəsidir. Çünki əgər İmam Hüseyn (ə) Yezid (l) üsuli-idarəsinin az da olsa vicdanlı davranıb insafa gələcəyini gözləsəydi, heç vaxt müraciətinə "Ey zalimlər!" deyə başlamazdı. Digər tərəfdən, Füzuli düşmən qoşununun cavabından öncə çox dəqiq bir qiymətləndirmə edir. O yazır ki, "ol səngparələrdən abi-rəvan çıxmaq mümkün olmayıb ayıtdılar..."

Füzuli düşmən qoşununu "səngparələr"ə *(daş parçalarına)* bənzədərkən əgər bir yandan Qurani-Kərimdən ilham almışdırsa (mübarək "Bəqərə" surəsinin 74-cü ayəsində oxuyuruq: "Bundan (bu əhvalatdan) sonra qəlbləriniz yenə sərtləşərək daş kimi, bəlkə, daha qatı oldu. Həqiqətən bəzi daşların içərisindən nəhrlər axar, bəzisi yarılıb içindən su fışqırar və bəzisi də Allahın qorxusundan (uca yerlərdən, dağdan) yuvarlanıb düşər. Allah sizin etdiklərinizdən, əlbəttə, qafil deyildir!"), o biri tərəfdən özünün dolğun mütaliəsi nəticəsində əldə etdiyi nadir tarixi bilgilərə söykənmişdir.



Tarixi bilgiləri Quran işığında bədiiləşdirdiyindən bu sual-cavab yalnız Übeydullah Ziyadın yox, bütövlükdə Yezid hakimiyyətinin murdar və idbar iç üzünü dərhal açıb göstərə bilir.

Əsərin bu yerində İmam Hüseynlə (ə) Əli Əsğər surətləri təkcə ata-oğul kimi yox, iki müqəddəs kimi iç-içədir. Bu, Hüzeymə Kahilinin atdığı oxun Əli Əsğərin boğazını dələrək İmam Hüseynin (ə) biləyinə sancılmasından da, Füzulinin Əli Əsğəri məsum adlandırmasından da, İmam Hüseynin (ə) Rübaba "Ey biçarə, fərzəndin şərbəti-şəhadətlə sirab oldu" deyə üz tutmasından da görünür. Ancaq Füzulinin gözündə Əli Əsğər qətiyyən adi bir körpə deyil. Əgər belə olsaydı, o, əsla "Rəvayətdir ki, Əliyyi-Əsğərlə 72 nəfər təmam oldu" deməzdi. İmam Hüseynin (ə) tənhalığı da məhz bundan sonra başlanır. Belə ki, Füzuli kiçik qardaşın kövrək körpə şəhadətindən dərhal sonra İmam Zeynəlabidinin (ə) "bimar"lığını qeyd edir.

Ən nəhayət, hissədə diqqəti belə bir cəhət çəkir ki, döyüşqabağı şeir sayılan rəcəz burada büsbütün lirik əhvali-ruhiyyədə olub, İmam Hüseynin (ə) təsəvvürəgəlməz itkilərlə bağlı keçirdiyi dəruni hiss-həyəcanı əks etdirir. Bu isə rəcəzlə bağlı gözlənilməz bir yenilikdir.

Bu deyilənlərdən görünür ki, əsərin bu bölümü bir-birindən maraqlı ideya-bədii cizgiləri ilə İmam Hüseyn (ə) şəxsiyyətinin hərtərəfli surətdə təqdimi yönündə olduqca dolğundur.

* * *

Fəsil belə davam edir: "Rəvayətdir ki, Həzrəti-İmam Zeynəlabidin validi-büzürgvarın tənha görüb, riqqəti-təmamla xabgahdan dışra çıxub, cismi-zəif və kəfilərzanla kəndüyə əsbabi-rəzm mürəttəb qılub, əziməti-meydan etməkdə ikən Həzrəti-Hüseyn ayıtdı: "Ey nuri-didə, hala sənə rüxsəti-şəhadət yoxdur, zira silsileyi-siyadət sənə mərbutdur və bəqayi-nəsli-Mustəfəvi sənin vücudinə məşrutdur". İmam Zeynəlabidin ayıtdı: "Ey məxdum, haşa ki, bən şərbəti-şəhadətdən binəsib və dövləti-didari-şərifindən məhrum qalam!" Həzrəti-Hüseyn





ayıtdı: "Ey cigərguşə, bəzmi-bəlada cami-şəhadət nuş etməgə hənuz sənə növbət yetməmişdir və saqiyi-əcəl səni hənuz yad etməmişdir. Ənqərib sən dəxi bu şərbətdən içüb bizə vasil olursan və muradınca bu xani-müsibətdən nəsib alursan". Pəs Həzrəti-Zeynəlabidini hüzurinə alub cəddü abadan mövdu' olan əmanətləri ol həzrətə tapşurdı. Kəlamüllahi-Məcid və müshəfi-Fatimə, cifri-əbyəz və cifri-came', elmi-qiyamət və baqi ülum ki, əimmədən qeyrə mümkün degil, ana təslim edüb və anı Vacibülvücuda tapşırıb. Şe'r:

Seyr eylədi zülali-səfa bağa bağdan,  
Nur etdi intiqal çirağa çirağdan"[278].

*(Rəvayətə görə, İmam Zeynəlabidin (ə) həzrətləri böyük olan atasının tək-tənha və köməksiz qaldığını görüb başdan-ayağadək həyəcan içində xəstə yatağından qalxıb çadırdan çıxaraq zəif bədənlə və titrəyən əlləri ilə özü üçün döyüş ləvazimatı hazırlamağa başladı. O, döyüş meydanına sarı getmək istəyərkən Hüseyn həzrətləri dedi: "Ey gözümün işığı, hələ ki sənin üçün şəhidlik izni alınmamışdır. Ona görə ki, seyidlik silsiləsi sənə bağlıdır və seçilmiş Peyğəmbər soyunun daimiliyi yalnız sənin varlığınla mümkündür!"*

*İmam Zeynəlabidin (ə) belə cavab verdi: "Ey xidməti vacib olan böyük şəxsiyyət, axı bu necə ola bilər ki, mən şəhidlik şərbətindən nəsibimi almayam və sənin şərafətli görüş nemətindən məhrum qalam?"*

*Hüseyn həzrətləri (ə) buyurdu: "Ey mənim ciyərimin bir parçası, bəla məclisində şəhidlik badəsini içmək üçün hələ sənə növbə çatmayıb və əcəl saqisi hələ ki səni xatırlamayıb, çox yaxın zamanda sən də həmin şərbətdən içib bizə qovuşarsan, bax o vaxt bu müsibət süfrəsindən istədiyin qədər faydalanarsan".*

.................................

[278] *Füzuli. Əsərləri, VI cild, səh. 326*





*Bu mükalimədən sonra İmam Hüseyn (ə) Zeynəlabidin (ə) həzrətlərini təklikdə yanına çağıraraq ata-babadan yadigar qalmış ilahi əmanətləri o cənaba tapşırdı. Həmin əmanətlər sırasında şanlı Allah kəlamı, Fatimənin Müshəfi, Əbyəz cifri, Came cifri, Qiyamət elmi və imamlardan başqasının bilə bilməyəcəyi digər elmlər var idi. İmam Hüseyn (ə) bunların hamısını onun ixtiyarına verərək onu ən Vacib Varlıq olan Allahın himayəsinə həvalə etdi.*

*"Saf və zövqverici zülal bağdan-bağa keçdi, bir çıraqda olan ilahi nur o biri çırağa ötürüldü").*

Parça üçün yeni surət İmam Zeynəlabidindir (ə). Ümumiyyətlə, "Hədiqətü-s-süəda" boyu bu ulu din böyüyü ən müxtəlif məqamlarda anılır, gözlənilməz epizodlarda boy göstərir. Burada isə İmam Zeynəlabidin (ə) ilahi hikmətə görə Aşura günündə müvəqqəti olaraq xəstələnməsi halında təqdim olunur. "Xabgah, cismi-zəif, kəfi-lərzan" ifadələri onun dəruni hiss-həyəcanını, döyüşdə iştirak edə bilməməkdən duyduğu iztirabları kifayət qədər aydın və təsirli əks etdirir.

Hər iki din böyüyünün daxili aləmini açan ikinci cəhət onların arasındakı dialoqdur. Çünki bu dialoqda köklü dini-mənəvi məsələlər yığcam olaraq qoyulub həll edilir. Odur ki, ata-oğul arasındakı bu söhbətin alt qatında, əslində, vaqeəyə yön verən dərin dəyərlər mövcuddur. Məsələn, İmam Hüseyn (ə) İmam Zeynəlabidinə (ə) "Hənuz sənə növbət yetməmişdir" dedikdə incəliklə şəhidliyin də ilahi təqdirlə olduğunu ifadə etmiş olur.

Yaxud "silisileyi-siyadət sənə mərbutdur" cümləsi şəhadət rüsxətinin olmadığını aydınlaşdırmaqdan başqa, bu gün də dini çəkisini saxlayan seyidlik kateqoriyasına dair birmənalı söz deyir.

Ötəri deyildir ki, Füzuli seyidliyi sonuncu Peyğəmbərin soyunun həmişə davam etməsinin başlıca amili kimi göstərir. İmam Hüseyn (ə) İmam Zeynəlabidinə (ə) belə buyurur: "Bəqayi-nəsli-Mustəfəvi sənin vücudi və məşrutdur".





Mükalimədə diqqəti çəkən bir cəhət də İmam Hüseynin (ə) birmənalı izahından sonra belə İmam Zeynəlabidinin (ə) yenə təkid etməsidir. Əlbəttə, bu, səbəbsiz olmaya bilməzdi. Zənnimizcə, İmam Zeynəlabidini (ə) yenidən dilləndirən onun oğulluq, övladlıq hissləri, bu hisslərdən qaynaqlanan rəhbərlik məsuliyyəti idi. Nitqinə "Ey məxdum" deyə başlaması, "haşa ki!" kimi təəccüb və heyrət nidasını dilə gətirməsi bunu göstərir.

* * *

Fəslin ən orijinal xüsusiyyəti məqtəl və mərsiyə ədəbiyyatında ən nadir hallarda toxunulan peyğəmbərlik və imamlıq irsi məsələsinin önə çəkilməsidir. Böyük İslam alimi Əhmədağa Əhmədovun (Allah ruhunu şad eləsin) "Allahın höccətləri" kitabında hərtərəfli olaraq araşdırdığı həmin irsi Füzuli "əmanət" adlandırır.

"Cəddü əbadən məvdu olan əmanətlər" – *İmam Hüseynə (ə) öz müqəddəs ata-babasından yadigar qalan mötəbər dini müqəddəsat* burada birər-birər sadalanır. Təkcə bunun özü həmin irsin İmam Hüseyn (ə) üçün nə dərəcədə və hansı yöndə dəyər və önəm qazandığını təsəvvür etməyə bəsdir. Odur ki, onları həm ayrılıqda, həm də küll halında Kərbəla vaqeəsinin sarsılmaz məfkurəvi dayaqları olaraq qəbul etmək qaçılmazdır. Həmin peyğəmbərlik və imamlıq daşıyıcıları bunlardır:

**a) "Kəlamü-l-lahi Məcid" – *şanlı-şərəfli Tanrı Sözü.*** Qurani-Kərim yeganə Kitabdır ki, öz haqqında çox təfsilatlı bilgi verir. Müqəddəs Kitabımızın çoxsaylı adları barəsindəki ilahi bəyanatlara göz gəzdirsək, bu haqda aydın anlayış əldə etmiş olarıq; məs.:

1. "Ümmü-l-Kitab" – *Kitabın anası.* Bu ad mübarək *"Ali-İmran"* surəsinin 7-ci ayəsi əsasında formalaşmışdır. Həmin ayədə "möhkəmat-mütəşabihat" (birmənalı və çoxmənalı ayələr), "təəvvil" (mənanı ilkin anlamına qaytarma), "bəndə





və Allah elmi" kimi köklü dini-fəlsəfi elmi məsələlərdən danışılır.

2. "Bürhan" – *kəsərli və kəskin dəlil.* Ad mübarək *"Nisa"* surəsinin 174-cü ayəsinə istinadən meydana çıxmışdır. "Ey insanlar! (Bu Məhəmməd) sizə Rəbbiniz tərəfindən dəlil gəlmişdir. Biz sizə aydın bir Nur (Quran) endirdik".

Məsələnin önəminə dair təkcə bunu demək yetər ki, Ulu Yaradan dəlili olduqca böyük həyati güc kimi səciyyələndirir *("Ənfal", 42).*

3. "Bəsair" – *bəsirətlilər, batini gözü açıq olanlar ("Əraf", 203).*

4. "Təbsiratun" – *bəsirətli olmaq üçün ləvazimat ("Qaf", 38).*

5. "Bəlağ" – *təbliğətimə çatdırma" ("İbrahim", 52).*

6. "Bəyan" – *açıqlama ("Ali-İmran", 138).*

7. "Bəyyinə" – *açıq-aşkar dəlil-sübut ("Ənam", 157).*

8. "Tibyan" – *aydınlaşdırma ("Nəhl", 89).*

9. "Təzkirətün" – *xatırlatma ("Haqqa", 48).*

10. "Təfsil" – *genişlik ("Yusif", 111).*

11. "Hukm" – *möhkəmlik ("Rəd", 37).*

12. "Hikmət" – *vəhy ("Əhzab", 34).*

13. "Həkim" – *hikmətli ("Yasin", 2).*

14. "Həqqü-l-yəqin" – *tam yəqinliklə anlaşılan həqiqət ("Haqqa", 51).*

15. "Zikr" – *öyüd ("Əraf", 69; "Hicr", 9).*

16. "Zikrü-l-həkim" – *hikmətlə dolu öyüd ("Ali-İmran", 58).*

17. "Zikrun-mübarəkun" – *müqəddəs öyüd ("Ənbiya", 50).*

18. "Sühufün-mükərrəmətun" – *kəramətli, şərəfli səhifələr ("Abəsə", 13).*

19. "Sühufün-mütəhərratun" – *pak səhifələr ("Bəyyinə", 2).*

20. "Quran" – *oxumalı Kitab ("Bəqərə", 185).*

21. "Quranu-l-Əzim" – *əzəmətli Kitab ("Hicr", 87).*

22. "Quranun-Kərim" – *çox hörmətli Quran ("Vaqeə", 78).*

23. "Quranun-mübin" – *sözü, mənası büsbütün aydın olan Kitab ("Hicr", 1; "Yasin", 69).*

24. "Quranu-l-Məcid" – *şanlı Quran ("Qaf", 1).*

25. "Kitab". Bu söz bədəvi çöl ərəblərinin atların çəmənlikdə



otlaması zamanı yaranmış dağınıq fiqurları xatırlatmasına verdikləri ibtidai yozum nəticəsində əmələ gəlmişdir. Sözün terminoloji anlamı "Bəqərə" surəsinin 2-ci ayəsinə söykənir.

26. "Kitabu-l-lah" – *Tanrı Kitabı ("Ali-İmran", 23).*

27. "Əl-kitabü-l-həkim" – *hikmətli Quran.* Bu təbir yalnız Qurani-Kərimi bildirir *("Yunus", 10; "Loğman", 2).*

28. "Kitabün-əziz" – *məğlubedilməz Quran ("Fussilət", 41).*

29. "Kitabun-mübin" – *açıq-aşkar Quran ("Zariyat", 15).*

Göründüyü kimi, hələ tamamlanmayan bu siyahı Qurani-Kərimin özünün öz məfkurə, mövzu, məzmun, üslub və forma gözəllikləri haqqında necə geniş bilgi verdiyini, bununla da insan kamalını yeni-yeni əngin üfüqlərə yönəltdiyini göstərir. İmam Hüseynin İmam Zeynəlabidinə bir övlad olmaqdan çox bir dini-dünyəvi rəhbər kimi aşıladığı ilahi sirləri məhz "Kəlamü-l-lahü Məcid"lə başlaması qətiyyən ötəri olmayıb, belə uca dərkin əlaməti yerində qavranır və yuxarıdakı adları da əhatə edir.

* * *

**b) "Müshəfi-Fatimə".** Bu, Həzrət Əlinin (ə) hər bir ayənin şəni-nüzulu (gəlmə səbəbi) haqqında dəqiq məlumatlardan ibarət olan və müqəddəsat arasında yer alan, həmçinin indi 12-ci imamda olan mötəbər Kitabdır.

Füzulinin əsərin bu yerində "Müshəfi-Fatimə"nin də adını çəkməsi göstərir ki, həmin kitab saf şiə məfkurəsində qətiyyən mövhumi və xurafi yox, aydın və sarsılmaz bir məfhumdur və bir halqası da Kərbəla vaqeəsinin təşkil etdiyi haqq işi uğrundakı mübarizənin başlıca ideoloji mənbələrindən biridir. Odur ki, belə istilahlara əsla yuxarıdan aşağı baxmaq, onların dünyagörüşü məsələlərində heç bir önəm və dəyər qazanmadığını düşünmək olmaz.

**c) "Cifri-əbyəz" – *ağ sehrbazlıq.*** "Sehr" və "səhər" sözlərinin semantik yuvası birdir. Hətta Qurani-Kərimdə belə sehr məsələsinə dair qeydlər indiyədək müsəlman dünyasında sonadək və birmənalı surətdə aydınlaşdırılmamışdır. Məsələ



ilə bağlı nisbətən qəti qənaət mübarək “Bəqərə” surəsinin 102-103-cü ayələrində əksini tapmışdır: “(Yəhudilər) Süleymanın səltənətinə (şahlığına) dair şeytanların oxuduqlarına (sehr kitablarına) uydular. Süleyman (bu kitablara uymadığı üçün) kafir olmadı, lakin şeytanlar (bildikləri) sehri və Babildə Harut və Marut adlı iki mələyə nazil olanları xalqa öyrədərək kafir oldular. Halbuki (o iki mələk): “Biz Allah tərəfindən göndərilmiş imtahanıq (sınağıq), sən gəl kafir olma!” deməmiş heç kəsə sehr öyrətmirdilər. (Bununla belə, yəhudilər) yenə də ər-arvad arasına nifaq salan işləri onlardan öyrənirdilər. Lakin onlar (sehrbazlar) Allahın izni olmadan heç kəsə zərər verə bilməzlər. Onlar (yəhudilər) ancaq özlərinə faydası olmayan, zərər verən şeyləri öyrənirdilər. Həqiqətən, onlar (yəhudilər) belə şeyləri satın alanların (Allahın Kitabını şeytan əməlləri ilə mübadilə edənlərin) axirətdə payı olmadığını yaxşı bilirlər. Kaş ki onlar özlərini nə qədər yaramaz bir şeyə satdıqlarını biləydilər! Əgər onlar (Qurana və Peyğəmbərə) iman gətirib pis əməllərdən (sehrə uymaqdan) çəkinsəydilər, Allah tərəfindən əldə etdikləri savab daha xeyirli olardı. Kaş ki bunu dərk edəydilər”.

“Qədim xalqların çoxu sehrə inanırdı. Odur ki, sehr dini etiqadlarla qarışmış bir vəziyyətdə idi. Sehrbazlar bundan sui-istifadə edərək camaatı aldadırdılar. Sehrin bu növləri vardır:

**1. Kəldanilərin sehri:** Onlar ulduzlara ibadət edər və belə düşünərdilər ki, kainatı ulduzlar idarə edir, xeyir və şər onlardan gəlir. Onları haqq yola gətirməkdən ötrü Allah Həzrət İbrahimi göndərdi. Onlar isə öz aralarında üç dəstə idilər:

a) Planet və ulduzların daimi olduğunu söyləyənlər ki, onlara “sabiə” deyilir.

b) Planetləri tanrı kimi qəbul edənlər. Onlar hər bir planet üçün yer üzündə bir büt yaradan və ona xidmət edən bütpərəstlərdir.

c) Planetləri və ulduzları yaradan bir qüvvə olduğunu və bunun onlara yer üzünü idarəetmə haqqı verdiyini söyləyənlər. Onlara görə, ulduzlar vasitəçidir.





**2. Ruhi qüvvə üzərində bərqərar olan sehr:** Onların mövqeyinə əsasən saflaşdırma vasitəsilə ruh – icadetmə, öldürmə, diriltmə, cövhər və ərəzdə dəyişikliketmə qabiliyyəti əldə edir.

**3. Ruhani məxluqlardan istifadə edilməklə işlənilən sehr:** Bu isə cadu-piti yazmaq və cinlərdən güc almaqla həyata keçirilir.

**4. Hoqqabazlıqla, göz aldatmaqla edilən sehr.** İslam alimləri yekdilliklə bu fikirdədirlər ki, sehrin birinci və ikinci növlərinə inananlar tam kafirdirlər. Ancaq ayədə bildirildiyi kimi, Yaradıcının Allah-taala olduğuna inanaraq və pis niyyətlə istifadə etməmək şərti ilə sehrkarlığı öyrənməkdə beis (maneə) yoxdur. Yəhudilər arasında sehrbazlıq çox yayılmışdı. Odur ki, onlar Həzrət Süleymanın böyük bir sehrbaz olduğunu, hökmdarlığı sehrlə əldə etdiyini, heyvanlara və cinlərə sehrlə hökm etdiyini deyir və buna inanırdılar. Həzrət Süleyman Quranda Peyğəmbər kimi təqdim edildikdə "Muhəmməd Süleymanı peyğəmbər sanır, halbuki o, bir sehrbazdır" dedilər"[279].

Məsələnin şiəlikdəki dərki yalnız xeyirxah niyyətlə və şər qüvvələri dərk etmək məqsədilə işlədilən sehrə istisna hallarda verilmiş müstəsna səlahiyyət kimi yanaşmadan ibarətdir. Döyüşün qızğın çağında İmam Hüseynin (ə) harayına gələn "Pərilərin sərdarı" ilə söhbəti məhz belə mürəkkəb anlayışın bədii ədəbiyyatdakı nadir işlənmə məqamıdır.

**ç) "Cifri-came'" – cəmiyyətin bir çox təbəqələrində geniş yayılmış psixi təsir vasitəsi.** "Cifri-əbyəz" kimi, bu da dini-dünyəvi rəhbərin müstəsna səlahiyyəti daxilində olan xüsusi hərəkətəgətirici və istiqamətverici bir amildir. Ancaq ondan fərqli olaraq, "Cifri-came'" daha yumşaq və daha ümumi səciyyəyə malikdir.

**d) "Elmi-Qiyamət" – Qiyamətin əlamətlərinə dair dini biliklər.** Bəllidir ki, Qurani-Kərimin böyük bir bölümünü Qiyamətlə bağlı ən müxtəlif ad, bilgi, anlayış, xəbər və

.................................

[279] *Qurani-Kərim və türkcə açıqlamalı məalı, səh. 15*





motivlər təşkil edir. Ancaq bunların heç birində onun başvermə zamanı haqqında dəqiq məlumat yoxdur. Ulu Yaradan "Mən onun vaxtını az qala Özümdən də gizlədirəm" *("Taha", 16)* buyurur. Bununla belə, Həzrət Muhəmmədin (s) dilindən söylənilən çoxsaylı hədislərdə bu barədə geniş danışılır, həmin dövrdə yaranacaq ictimai-əxlaqi şərait və vəziyyət haqqında, insanların bir-biri ilə mürəkkəb davranışına dair təfərrüata və təfsilata varılır. Bütün aparıcı islami məzhəblər bu hədislərin çoxunu məqbul sayır, bu bilgiləri qəbul edir, özlərinin bir çox prinsiplərini məhz həmin bilgilər üzərində qurur. Odur ki, əsərin bu yerində İmam Hüseynin (ə) İmam Zeynəlabidinə (ə) "elmi-Qiyamət"i də əmanət olaraq təhvil verməsi istər dini-dünyəvi rəhbərlik işində, istərsə də islami ənənələr baxımından tamamilə təbiidir.

**e) "Baqi ülum" – imamlardan başqasının bilə bilməyəcəyi, yaxud yalnız onlara etibar edilən digər elmlər.** "Əimmədən qeyrə mümkün degil" şərti danılmaz biçimdə göstərir ki, bu stimul şiəlikdə xüsusi çəkiyə malikdir və hər bir situasiyada dini-dünyəvi rəhbərə gərək olub, ən mürəkkəb məsələlərin həlli zamanı onun karına gəlib, ona müsbət güc verə bilər. Sonralar orta əsrlər Şərqini ağzına götürən və indi haqqında ağlasığmaz söhbətlər gəzib-dolaşan sufizmin həqiqi substansiyası, çox güman ki, "baqi ülum" adlandırılan bu imamlıq təlimində yatır. Odur ki, həmin təlimi diqqətdən qıraqda saxladıqca sufizm, təsəvvüf, irfan adına danışanların, yazanların fikirlərinin əsl mahiyyəti üzə çıxmayacaq. Zənnimizcə, bir neçə əlamətindən barınmasına baxmayaraq, Füzulinin həmişə sufilərdən və sufilikdən uzaq durmasının, heç vaxt heç bir mürşidə mürid olmamasının, heç bir təriqətin himayəsinə sığınmamasının başlıca səbəbi də burada axtarılmalıdır.

Ən nəhayət, parçanın sonundakı şeirdə İmam Hüseynin (ə) İmam Zeynəlabidinə (ə) ötürdüyü bu ilahi əmanətləri "saf zülal" və "nur" adlandırması yuxarıda sadalanan anlayışların



şairin gözündə olduqca önəmli dəyərlər olduğunu, onun bunları İmam Hüseyn (ə) hərəkatının əsas dayaqları saydığını bir daha təsdiq edir. Axı "zülal" həyatln maddi özülüdürsə, "nur" mənəvi qaynağıdır. Qurani-Kərimdə ən müsbət anlayışlar bu, yaxud başqa ölçüdə nurla bağlanılmışdır *("Nur", 35; "Hədid", 9; "Səf", 9 və s.).*

Bu bilgilərin işığında beytin ikinci misrası İmam Hüseynin (ə) İmam Zeynəlabidinə (ə) "Ey nuri didə!" deyə üz tutmasını bir az da mənalı edir. Belə ki, bu mənalandırmada ilahi əmanətlərlə yanaşı, İmam Hüseynin (ə) gözünün işığını da İmam Zeynəlabidinə (ə) verib dünyadan getməsi kimi çox incə bir assosiativ məqam da boy göstərir.

* * *

Əsər belə davam edir: "Təslimi-əmanət etdikdən sonra ziyafətxaneyi-behişt əzimətin müqərrər bilüb: "Dostlar vəliməsinə getdikdə müzəyyən olmaq rəsmdir" deyüb bir dəxi hərəmsərayə girüb, qübari-meydandan məhasinü gisu pak edüb və təcdidi-libas təriqiylə dəqqi-Misridən bir giranmayə xəl'ət geyüb və əmmameyi-Rəsulullahın əqdin tazələyüb və seyyidüş-şühəda Həmzənin sipərin kətfinə bıraxub və Əliyyi-Mürtəzanın Zülfiqarın həmayil qılub və Rəsulullahın Zülcənah nam Büraqrəftarın rikabi-hümayuna çaküb, mübarək əlinə bir rəmhi-əjdəhamanənd alub, zinəti-təmamla Əhli-beytə vida' edüb "Və kəfa billahi şəhidən" kəliməsin yad qılub, ərseyi-meydana yüz dutdu və yetdikdə nizeyi-cansitanın dili-xakə üstüvar qılub və nizəsinə təkyə qılub bir rəcəz ağaz etdi ki, bə'zi əbyatı budur. Şe'r:

Xəyrətu'llahə minə'l-xəlqi əbi,
Summə ümmi və ənə'bnə'l-xəyrətəyn.
Fizzətun qəd xuliqət min zəhəbin,
Və ənə'l-fizzətu'ibnə'z-zəhəbəyn.
Fatimətu'z-Zəhra ümmi və əbi,
Varisu'r-rusuli imamə's-səqələyn.





Min ləhu cəddin kə-cəddi fi'l vəra,
Əv kə'şəyxi və ənə'bnu'l-aləməyn.
Zəhəbun fi-zəhəbin fi-zəhəbin,
Və ləcinu fi-ləcin fi-ləcəyn.

Ol bənəm kim, cəddi-pakimdir çirağı-ənbiya,
Afitabi-övci-himmət, sərvi-bağı-İstəfa.
Ol bənəm kim, mə'dəni-dürri-vücudumdur Əli,
Şahi-ərbabi-həqiqət, şəm'i-cəm'i-övliya.
Ol bənəm kim, şəm'i-nuri-xilqətimdir Fatimə,
Cövhəri-kani-şərəf, şəm'i-şəbistani-həya.
Bən nihali-gülşəni-ədlü riyazi-ismətəm,
Ey fəsad əhli, nədir bunca bana cövrü cəfa?
Tökdünüz bir-bir atub səngi-sitəm övraqımı,
Qoydunuz tənha bəni qürbətdə bibərgü nəva.
Haliya qət'üm təmənnasində qılmışsız qülüvv,
Qansı məzhəbdə bənim qət'i-həyatımdır rəva?!

Və məqalədən sonra ol güruhi-müxalifi müxatəb qılub nida qıldı ki: "Ey qövmi-sitəmkar və ey taifeyi-qəddar, ehtiraz edin ol Qəhhar qəhrindən ki, firqeyi-Ali-Fir'ovni qərqeyi-seylabi-Nil və sipahi Əshabi-Fili məğlubi-hücumi-təyri-əbabil etdi. Və təvəhhüm qılun ol Cəbbar qəzəbindən ki, üsati-qövmi-Lut şəhrin sərnigun edüb, ğülati-Ali-Nuhun mülkinə seylabi-siyasət yürütdü. "Və istəğfiru Rəbbəkum summə ətubu iləyhi yumətti'kum məta'ən həsənən". Ey zalimlər, əgər hakimi-divani-qəza ədlinə və Həzrəti-Rəsul şəriətinə e'tiqadınız var isə, yad edin əvaqibi-ümuru və bu zülmlərdən istiğfar qılun və bana aman verin ki, bu ətfalü əyalı paymali-qürbət olmadan ya Həbəş canibinə, ya Rum tərəfinə alub gedəyim və bu cəzireyi-Ərəb və ərzi-Babil və mülki-Hicazı sizə təslim edəyim və əgər müharibədən təcavüz mümkün olmazsa, barı, bir-bir meydana gəlin"[280].

---

[280] *Füzuli. Əsərləri, VI cild, səh. 326-328*





*(İmam Hüseyn (ə) ilahi əmanətləri İmam Zeynəlabidinə (ə) verdikdən sonra cənnət qonaqlığına getmək qərarına gəldiyi üçün "Dostların evinə gedəndə adətən bəzənərlər" deyərək bir daha öz xeyməsinə daxil olub saqqalını və saçlarını döyüş meydanının toz-torpağından təmizlədi, geyimini təzələməkdən ötrü Misir parçasından bahalı libas geyindi, Rəsulullahın (s) əmmaməsini başına qoydu, şəhidlər ağası Həmzənin qalxanını çiyninə aldı. Mürtəza Əlinin (ə) Zülfiqarını belinə həmail etdi, Rəsulullahın (s) Zülcənah adlı ildırım sürətli atını mindi, mübarək əlinə əjdahayabənzər bir yay götürdü və tamam-kamal bir hərb hazırlığı içində Əhli-beytlə vidalaşdı. O, bu zaman "Allahın şahidliyi mənə yetər" sözlərini dilinə gətirərək meydanın ortasına doğru yönəldi.*

*İmam (ə) oraya çatdıqda canlar alan nizəsini torpağın bağrına sancdı və nizəsinə söykənərək bir rəcəz oxumağa başladı. Onun bəzi beytləri belədir: "Allahın yaratdıqlarının xeyirlisi babam, sonra atamdır. Sonra anamdır və mən bu ikisinin oğluyam. Mən gümüşəm və iki qızılın oğluyam. Anam Fatimətü-z-Zəhradır və babam Səqəleyn imamı və peyğəmbərlərin varisidir. Mənim kimi belə bir babaya və ya belə bir şeyxə sahib kimdir? Mən iki dünya oğluyam. Qızıl içində qızılam və dəniz içində dənizəm!*

*Pak babası "peyğəmbərlər çırağı" olan kimsə mənəm. O, bacarıqlılıq zirvəsinin günəşi və saflıq bağının ən uca sərvi idi. Varlıq incisinin qaynağı Əli olan şəxs mənəm. O, haqsevərlərin, həqiqətaxtaranların başçısı və bütün övliyaların başına pərvanə kimi dolandıqları şamdır. Yaradılış işığının şamı Fatimə olan insan mənəm. O, şərəf mədəninin mayası olan və həyalılıq məclisini nurlandıran bir şamdır. Mən ədalət çəmənliyində bitmiş bir şitiləm, mən məsumluq bağçasıyam. Bəs elə isə, ey fitnə-fəsad törədiciləri, mənə qarşı bu qədər zülm və əzab-əziyyətə yol verməyin adını nə qoymaq olar axı?! Zülm daşları atmaqla yarpaqlarımı birər-birər vurub saldınız, yerə töküb məhv etdiniz və məni qürbətdə yarpaqsız – səssiz-sədasız tənha bir ağaca çevirdiniz. İndi isə*



*hamılıqla toplaşmısınız ki, birdəfəlik məni kökümdən qoparıb atasınız. Axı bir deyin görək hansı məzhəb mənim həyatıma son qoymağı rəva görür?!"*

*İmam Hüseyn (ə) bu sözlərdən sonra o müxalif dəstəyə üz tutaraq belə səsləndi: "Ey zülmkar camaat və ey qəddar adamlar, Firon nəslinin dəstəsini Nil çayında selə-suya vermiş və fil sahiblərinin ordusunu əbabil quşlarının hücumu qarşısında məğlub etmiş o Qəhhar qəhrindən həzər qılın. Digər tərəfdən, qorxun ol Cəbbar qəzəbindən ki, Lut qövmünün iyrənclik üzərində qurulmuş firavan şəhər həyatını darmadağın edərək Nuh camaatının əyanlarının mülkünü acı intiqam selinin ağzına verdi! "Tanrınızdan üzrlər diləyin, sonra tövbə edin ki, sizə gözəl ruzi yetirsin" ("Hud", 51). Ey zülmkarlar, əgər qəzavü qədər divanının hakiminin ədalətinə və Rəsul həzrətlərinin (s) şəriətinə inanırsınızsa, sizdən öncəkilərin başına gələnlərin qorxunc aqibətini xatırlayıb etdiyiniz bu zülmlərə görə Tanrıdan əvf diləyin və mənə aman verin ki, qürbətdə qalaraq ayaqlar altında tapdalanmamış bu qız-gəlini ya Həbəş səmtinə, ya da Rum tərəfinə götürüb aparım və bu Ərəb yarımadasını, bu Babil torpağını, bu Hicaz məmləkətini sizin ixtiyarınıza verim. Yox, hərgah müharibə fikrindən əl çəkməyiniz imkan xaricindədirsə, barı onda meydana tək-tək gəlin!").*

Öncəki bölümlər kimi, bu bölüm də çeşidli ideya-bədii cizgiləri ilə diqqəti çəkir.

Bəllidir ki, İslama görə, hər bir əməlin arxasında möhkəm niyyət durmalıdır. Həzrət Muhəmmədin (s) "Əməllər niyyətlərə görədir" sözü bunun ən aydın dəlilidir. İmam Hüseyn (ə) də ilahi əmanətləri İmam Zeynəlabidinə (ə) verdikdən sonra öz Məbudu ilə niyyətini təzələyir. "Ziyafətxaneyi-behişt əzimətün müqərrər bilüb" tərkibində əksini tapmış bu dəruni istək ulu din böyüyünün təkcə dini-məfkurəvi inam-inanc sisteminin yox, həssas və nigaran gündəlik qayğılarının da bir halqası kimi anlaşılır. Odur ki, mətnin ardında sadalanan hərəkətlər hər iki sahənin göstəriciləri sayılmalıdır.





"Dustlər vəliməsinə getdikdə müzəyyən olmaq rəsmdür" cümləsi İmam Hüseynin (ə) axirət gözəlliklərinin ən parlağı olan cənnətə səfər ərəfəsində dünyanın məhdud maddi gözəlliklərini özündə birləşdirmək işini qaçılmaz bildiyini göstərməklə yanaşı, "Hər bir ibadət yerinə getdikdə özünüzə bəzək vurun" *("Əraf", 34),* "Allah gözəldir və gözəlliyi sevər" *(Həzrət Muhəmməd (s))* kimi islami buyuruqların da ömrünün-gününün ən ağır sınaq anlarında belə nəzərə alınmalı olmasına dəlalət edir. Belədə imamın (ə) döyüşqabağı özünə zinət verməsini yalnız "Təmizlik imanın yarısıdır" *(Həzrət Muhəmməd (s))* səpkili gigiyenik tələbat saymaq olmaz.

Öncəki bölümlərdə gördüyümüz geniş hərbi geyim-kecim təsvirləri burada da davam edir. Ancaq bu təsvirlər burada hərbi hazırlıq sahəsi ilə məhdudlaşmayaraq bir sıra dini müqəddəsat xüsusiyyətləri də kəsb edir. Belə ki, İmam Hüseynin (ə) "Əmmameyi-Rəsulullahın əqdin tazələ"məsi yalnız dini və ruhi-mənəvi səciyyə daşıyırsa, "Həmzənin sipərin kətfinə buraxması, Əliyyi-Mürtəzanın (ə) Zülfiqarın həmayil qılması, Rəsulullahın (s) Zülcənah nam Buraqrəftarın rikabi-hümayuna çək"məsi həmin qatla yanaşı, daha çox hərbi-hazırlıq məzmununa malikdir. Bu isə hərbi hazırlıq işinin İslam dinindəki danılmaz yeri ilə bağlı daha bir kəsərli sənətkar sözüdür.

Parçanı cəlbedici edən cəhətlərdən biri də İmam Hüseynin (ə) Əhli-beytlə belə tamam-kamal bir hərbi hazırlıq içində vidalaşmasıdır. Zənnimizcə, Füzuli bununla demək istəyir ki, "təvəkkül" anlayışının həqiqi mahiyyətini gerçəkləşdirən İmam Hüseyn (ə) özündən asılı olan hər bir işi lazımınca gördüyünü Əhli-beytin nəzərinə çatdırmış, bundan sonra baş verəcək hadisələrin isə yalnız Allah-taalanın əzəli-əbədi iradəsinə bağlı olduğunu onlara bildirmişdir. Bu anda onun "Allahın şahidliyi mənə yetər" müqəddəs kəlamını dilə gətirməsi də bu istəyə qulluq edir.



* * *

Əsərin bu yerinə ideya-bədii dolğunluq verən bir başqa cəhət Füzulinin İmam Hüseynin (ə) dilindən iki rəcəz verməsidir. Biri ərəbcə, o biri Azərbaycan türkcəsində olan bu rəcəzləri şair orijinal və tərcümə aktları kimi nəzərdə tutsa da, əslində, hər iki şeir özünəməxsusluqları ilə bir-birindən xeyli seçilir.

Ərəb dilindəki rəcəz əsil-nəsəb təqdimi üzərində qurulmuşdur. "Allahın yaratdıqları içində ən xeyirli məxluqat atamdır" misrası Həzrət Əlinin (ə) İmam Hüseynin (ə) gözündə necə böyük dini-dünyəvi rəhbər olduğunu əyani surətdə göstərir. Ötəri deyildir ki, o ulu din böyüyü də özünün ən gərəkli və yararlı tövsiyələrini məhz İmam Hüseynə (ə) etmiş, parlaq imamlıq incilərini məhz ona etibar etmişdir.

Ərəbcə rəcəzdə aparıcı yer tutan əsil-nəsəb motivi ənənəvi mədh olmaqla qalmayıb, dərin bir dini-məfkurəvi məzmuna da malikdir. Aşağıdakı cəhətləri bu məzmunun bariz əlamətləri hesab etmək olar.

**"Varisu-r-rusul"** – ***peyğəmbərlər varisi.*** Bu keyfiyyətə aydınlıq gətirməkdən ötrü öncə "varis" sözünün lüğəvi və istilahi anlamlarına göz gəzdirməliyik[281].

Keyfiyyəti daha dərindən dərk etmək üçün "rusul" – *peyğəmbərlər* sözü də bəhs mövzusuna çevrilməlidir. Çünki Füzuli bu sözlə Həzrət Əlinin (ə) nəinki nəbi, mürsəl və ülü-l-əzim peyğəmbərləri, hətta sonuncu Peyğəmbərin (ə) də həqiqi, layiqli varisi olduğu, əzəli-əbədi ilahi quruculuq işinin onun tükənməz gücü ilə başa çatdığı fikrini bildirmişdir. "Qönçə bağrı dəhr bidadilə əzəl qan olur" misralı qəsidəsində şairin o ulu din böyüyünü ən müxtəlif peyğəmbərlərlə müqayisə edib, onların hamısından üstün tutması məhz belə yüksək ideyanın parlaq bədii ifadəsidir.

.................................

[281] *Almasov V. Həzrəti Əli aşiqi Füzuli, səh. 320-352*





Haqqında danışılan keyfiyyəti “İmamu-s-səqəleyn” – *insanların və cinlərin dini-dünyəvi rəhbəri* (Həzrət Əli (ə)), “Fatimətü-z-Zəhra” səciyyələndirmələri olmadan sona kimi qavramaq olmaz.

Rəcəzə ayrıca bədii-estetik yön verən bir ştrix də İmam Hüseynin (ə) özünü də düşmən qoşununa çoxqatlı və çoxşaxəli bir qüvvə kimi tanıtmasıdır. “Mən gümüşəm və iki qızılın oğluyam! Kim mənim kimi belə təqvalı bir babaya sahibdir?!” səciyyələndirmələri bunu göstərir. Ana dilindəki rəcəz isə büsbütün bir müqəddəsat təcəssümüdür. Aşağıdakı cəhətlər bunu aydın göstərir:

**1. Həzrət Muhəmmədin (s) “pak” adlandırılması və “çirağі-ənbiya” kimi təqdimi.**

Ən səriştəsiz oxucu belə “cəddü pak” ifadəsini İmam Hüseynin (ə) dilindən eşitdikdə onun bununla Həzrət Muhəmmədin (s) “Mustafa” adını nəzərdə tutduğunu dərhal biləcəkdir. Ad mübarək “Əhzab” surəsinin 45-46-cı ayələrinə söykənir: “Ya Peyğəmbər! Həqiqətən, Biz səni (ümmətinə) bir şahid, bir müjdəçi və bir qorxudan kimi göndərdik! (Biz səni) Allahın izni ilə Ona tərəf çağıran və nurlu bir çıraq olaraq göndərdik!”

İlahi bəyanatdakı “Siracən munira” – *nurlu çıraq* ifadəsi bəsit təyin olmayıb, islami məzmunlu dərin göstərişdir. Axı onu Yaradan Şanlı Kitabında Ay üçün “Nur” təyinini işlətdiyi halda, Günəş üçün “Sirac” təyinini işlədir *(“Nuh”, 16-17)*. Deməli, Füzuli Qurani-Kərimdə Ay və Günəş üçün ayrılıqda işlədilmiş iki təyini Həzrət Muhəmmədin (s) timsalında birləşdirmiş, bununla da İmam Hüseynin (ə) “cəddi-paki”nin misilsiz portretini və özünəməxsus siqlətini yaratmışdır.

**2. Həzrət Muhəmmədin (s) “afitabi-övci-himmət” və “sərvi-bağі-istifa” adlandırılması.**

Beytin ümumi məzmunu bu epitetləri İmam Hüseynə (ə) də aid etməyə imkan verir. Belə ki, “himmət” – *bacarıqlılıq* əlaməti İslam rəhbərinin tükənməz peyğəmbərlik gücünü göstərməklə yanaşı, İmam Hüseynin (ə) də hərtərəfli rəhbərlik



fəaliyyətini əks etdirir. Yaxud “istifa” – *saflıq* epiteti Həzrət Muhəmmədin (s) uca mənəviyyatından soraq verdiyi kimi, İmam Hüseynin (ə) də əvəzsiz əxlaqi keyfiyyətlərinə dair aydın anlayış yaradır. Bu paraleli rəcəzdə Həzrət Əli (ə) və xanım Fatimeyi-Zəhra (s.ə) haqqındakı epitetlər üzərində də aparmaq olar.

Anadilli rəcəzin başqa bədii-estetik məziyyəti İmam Hüseynin (ə) burada özünü tam səmimi bir insan kimi – bütün umu-küsüləri ilə tanıtmasıdır. “Mən nihali-gülşəni-ədləm” – *mən ədalət çəmənliyində bitmiş sınıq bir şitiləm,* “nədir bunca mənə cövrü cəfa?”, “tökdünüz övraqimi...”, “qoydunuz tənha məni qürbətdə”, “qansı məzhəbdə mənim qət’i-həyatimdir rəva?” tərkibləri məhz belə kövrək, incik və həzin duyğuların bədii ifadəsidir. Deməli, Füzuli anadilli rəcəzi ərəbcə rəcəzin açıqlaması yerində təqdim etməklə təkcə tərcüməni yox, İmam Hüseynin (ə) dini-dünyəvi rəhbərliyinə dəlalət edən bütün cəhdləri nəzərdə tutmuş, bunların əlvan və rəngarəng bədii-estetik dərkinə can atmışdır.

* * *

“Qansı məzhəbdə mənim qət’i-həyatimdir rəva” sualı, zənnimizcə, bədii-estetik qatdan başqa dini-fəlsəfi məzmuna da malikdir. Odur ki, bu yön üzərində ayrıca durmalıyıq.

Oradan başlayaq ki, XVI əsrdə hərfən “gedilən yol”, istilahən isə ictimai şüur forması olan dinin bəlli bir çərçivədə qavranılıb yaşanması demək olan məzhəb məsələsi artıq formalaşmış və oturuşmuş bir institut idi. Heç bir kəskin mübahisə predmeti deyildi. Odur ki, Füzulinin rəcəzdə bunu ritorik sual səviyyəsinə qaldırmasını bilərəkdən edilmiş çaxnaşma cəhdi, təxribat addımı, təfriqə amili saymaq olmaz. Bu, uzaqbaşı, problemin islami substansiyası ilə bağlı köklü araşdırmalara hələ də böyük ehtiyac duyulmasına vurulan dini-fəlsəfi işarə idi. Heç şübhəsiz, Füzuli istər bir dindar və vətəndaş kimi, istərsə də bir ədib olaraq yalnız öz haqqını tələb etməkdə, öz dünyagörüşündən irəli gələn dəruni mənəvi tələbi ödəməkdə idi.





Bəs XVI əsr Şərqində məzhəblərin Kərbəla vaqeəsinə baxışları necə olmuşdur? Çağdaş Türkiyənin Aşura mərasimini hələ indi-indi mənimsədiyini, müasir türk cəmiyyətinin İmam Hüseyn (ə) şəxsiyyətini özü üçün yenidən kəşf etdiyini nəzərə alsaq, problemin orta əsrlər Şərqində necə mürəkkəb olması ilə bağlı həyəcan keçirməyə bilmərik. Ötəri deyildir ki, Türkiyə ilahiyyatşünaslığı bugündən o dövrə boylananda hissediləcək qədər dərin ruhi-psixoloji təbəddülat keçirir. Məsələn, vaxtilə İstanbul Universitetinin İlahiyyat fakültəsinin dekanı olmuş Yaşar Nuri Öztürk yazır: "Qurandakı "lənətlənmiş ağac"dan – "lənətlənmiş nəsil"dən məqsəd, İslam mütəfəkkirlərinin bəzilərinə görə, Əməvilərdir... O qövm haqqında nə deyək? Müsəlman qadınların üstünə qudurmuş it sürülərini qısqırdan onlardır. Hüseynin başını kəsib, sonra da onun məqbərəsini tarla kimi şumladan və türbəni ziyarətə gələnləri ora-bura qovanlar onlardır! Bu nəsil üçün nə deyək ki, analarının uşaqlığına şərab damlalarından tökülmüşlər?!"[282]

Bu səpkili qeydlərin sayını artırmaq da olardı. Ancaq istər bu, istərsə də digər qeydlərə birtərəfli baxmamaq şərtilə söyləyə bilərik ki, problemə münasibət dəyişməyəcəkdir. Çünki tarixi zərurət və obyektiv dəyərləndirmə bunu tələb edir.

Araşdırdığımız mətndə üzərində dayanılmasına ehtiyac duyulan başlıca cəhətlərdən biri də İmam Hüseynin (ə) düşmən qoşununa xitabıdır. Çünki bu xitab bir yandan onun Qurani-Kərimdən qaynaqlanan irşad metodunu göstərirsə, o biri yandan olduqca həlledici məqamlarda kara gələ biləcək təbliğat-təşviqat üsullarından son dərəcə bacarıqla istifadə etdiyini əks etdirir.

İmam düşmən qoşununa iki rəcəzdən sonra müraciət edir. Bu isə o deməkdir ki o, artıq hər şeyi gözünün altına almış, əzəli-əbədi taleyi ilə barışmış və yalnız gələcək nəsillər üçün

[282] *Yaşar Nuri Öztürk. Əhli-beytin anası Həzrəti-Fatimə, İstanbul, 1997, səh. 21*



dilə gəlmişdir. Düşmən qoşununu "qövmi-sitəmkar, taifeyi-qəddar" adlandırması bunun danılmaz dəlilidir.

İmam Hüseyn (ə) bu nitqində bir neçə etiqadi cəhəti önə çəkir. "Ehtiraz edin ol Qəhhar qəhrindən" və "təvəhhüm qılın ol Cəbbar qəzəbindən" tərkibləri inam-inanc sisteminin başlıca cizgilərini özündə birləşdirir.

"Həzər qılın, bütün varlığınızla çəkinin!" çağırışının əsasında "va-hzəruhum" şəklində Quran istilahı durur. Ötəri deyildir ki, Allah-taala bu istilahı bəndələriylə bağlı çox həssas məqamlarda işlədir *("Təğabun", 17).*

Bu, "qorxub pis işlər görməkdən birdəfəlik əl çəkin!" təhdidinə də aiddir. Ancaq nəzərə alınmalıdır ki, Qurani-Kərimin belə ifadələri yersiz təhdidkarlıqdan çox uzaqdır. Məsələn, mübarək *"Ənfal"* surəsinin 2-ci ayəsində oxuyuruq: "Möminlər yalnız o kimsələrdir ki, yanlarında Allahın adı çəkildikdə qəlbləri titrəyər".

Burada zahirən "qorxu" anlamına gələn "vacilət" sözü "bəndənin Allahın gözündən düşməsi" kimi çox incə mənaya malikdir.

İmamın nitqindəki ilahi sifətlərə gəlincə, *Qəhhar qəhri* və *Cəbbar qəzəbi* deyimləri sinonim olmaqla yanaşı, fərdi cizgilərə də malikdir. Belə ki, birinci deyim Tanrı qəzəbinə esxotoloji cəza mexanizminə söykəndiyi halda, ikinci deyim bununla yanaşı, təbii-fiziki sahədə nizamasalma kimi dünyəvi məzmun da bildirir. Ötəri deyildir ki, şairin lirikası belə ilahi sifətlərin tərənnümü ilə doludur.

Digər tərəfdən, imamın nitqindəki tarixi bilgilər *Qəhhar qəhri* və *Cəbbar qəzəbi* deyimlərinin işığında daha tutumlu olur. Həmin bilgilər bu və ya başqa baxımdan Kərbəla vaqeəsi ilə bağlı olduğundan "Firqeyi-Ali-Fir'on" – *Firon nəslinin yaratdığı və hakimiyyəti zorla ələ aldığı siyasi qruplaşma* bilavasitə Yezid idarə üsuluna, "sipahi-əshabi-fil" – *fil sahiblərinin ordusu* həmin hakimiyyətin amansız ordu sisteminə, "büsati-qövmi Lut" – *Lut camaatının iyrənc eyş-işrət və şəhvət üzərində qurulan murdar və idbar həyat*



*tərzinə,* Müaviyə vasitəsilə müsəlman cəmiyyətinə aşılanan dəbdəbə, təmtəraq içərisində yaşama həvəsinə və "ulati-nuh" – *Peyğəmbərlə yersiz mübahisə etmə, mənasız sözgüləşdirmə, höcətləşməni* gündəlik adət halına gətirmə kimi gərəksiz davranış və hərəkətlərə işarə olaraq başa düşülür.

Qurani-Kərimdə olduğu kimi, imamın nitqində də xilqətin əvvəlindən bəri özbaşınalıq etmiş bu cəmiyyət və dövlətlər istər fərdi şəkildə, istərsə də siyasi müstəvidə "qövmi-sitəmkar" və "taifeyi-qəddar" deyə xarakterizə olunur. Bu isə Kərbəla vaqeəsinə yol açan başlıca mənfi faktor idi.

Digər tərəfdən, deyilməmiş qalmasın ki, həmin cəmiyyət və dövlətlərdə də dərin islahat işi apara biləcək kamil şəxsiyyətlərin olmasına baxmayaraq, onlar hər cür ilahi çağırışları qulaqardına vurmuş, peyğəmbərlərini yalançı sayaraq qətlə yetirmişlər. Nuh Nəbinin Allaha etdiyi aşağıdakı şikayət bunun bariz nümunəsidir: "Sənin onları bağışlamağın üçün mən nə zaman onları (imana) dəvət etdimsə, onlar (dəvətimi eşitməsinlər deyə) barmaqlarını qulaqlarına tıxadılar, (məni görməsinlər deyə) libaslarına büründülər, (küfrlərində) israr edib durdular və təkəbbür göstərdilər" *("Nuh", 7)*. Ancaq nitqinin ardında sözü Tanrı mərhəmətinin və tövbənin üzərinə gətirməsi imamın bu bilgiləri quru tarix xatirinə yox, qarşı tərəfi hərəkətə gətirib onlarda vicdan duyğusu oyatmaq, onları ayıldıb cəmiyyətin faydalı təbəqəsinə çevirmək üçün dediyini göstərir. Bunun üçün isə Allah kəlamından daha təsirli stimul tapmaq olmazdı. Odur ki, imam (ə) nitqini Qurani-Kərimin aşağıdakı ayəsi ilə davam etdirir: "Ey camaatım! Mən buna (peyğəmbərliyi təbliğ etməyə) görə sizdən heç bir mükafat istəmirəm. Mənim mükafatım yalnız məni Yaradana aiddir. Məgər dərk etmirsiniz?"

Göründüyü kimi, Ulu Yaradan bu şanlı bəyanatını üç amil üzərində qurmuşdur: 1. "Əni-s-təğfiru rabbəkum" – *Rəbbinizdən əfv diləyin;* 2. "Summə ətubu ileyhi" – *sonra Ona tövbə edin;* 3. "Yumətti'kum məta'ən hasənə" – *O da sizə gözəl dolanışıq bəxş etsin.* Nəinki ilahiyyatşünaslar, hətta



materialist sosioloqlar belə çox asanlıqla təsdiq edərlər ki, bu üç faktorun təsdiqi ilə ən geridəqalmış cəmiyyəti və dövləti də az müddət ərzində sürəkli biçimdə dirçəltmək, yüksək rifah halına çatdırmaq olar. Axı kimdən gizlidir ki, az öncə İmam Hüseynin (ə) də işarə etdiyi keçmiş cəmiyyət və dövlətlər məhz bu amillərdən uzaqlıqları ucbatından məhvə uğramışlar. Odur ki, bu ulu din böyüyü mehriban və qayğıkeş bir rəhbər kimi yenidən ilahi şərtləri və tarixi bilgiləri önə çəkərək buyurur ki, "ey zalimlər, hakimi-divani-qəza ədlinə və Həzrəti-Rəsul şəriətinə e'tiqadınız var isə, yad edin əvaqibi-ümuru və bu zülmlərdən istiğfar qılun".

İmamın dini-dünyəvi rəhbər simasını aydınlaşdırmaqdan ötrü bir neçə ifadənin mətnin ümumi məzmununda qazandığı bədii üslubi cizgilərə diqqət yetirilməlidir:

**1. "Hakimi-divani-qəza".** İmamın nitqinin bu yerində "qəza" sözü ədliyyə termininə çevrilərək "ilahi məhkəmə, Tanrı mühakiməsi" anlamlarını alır. İzafətdəki "divan" sözü isə bunu bir az da gücləndirir. Belədə "hakim" sözü istər-istəməz Allah mənasında başa düşülür. Odur ki, burada "qəza" sözünün "qəzavü qədər" anlamı özünü doğrultmur.

**2. "Ədl".**

**3."Həzrəti-Rəsul şəriəti".**

**4. "Əvaqibi-ümur" – gördüyünüz işlərin nəticəsi, etdiyiniz əməllərin aqibəti.** Müqəddəs Kitabımızın neçə-neçə ayəsi "əvələm yərau" – *Məgər görmürlərmi?,* "əvələm ya'ələmu" – *Məgər bilmirlərmi?,* "əvələm yəsiru fil ərzi" – *Yoxsa yer üzündə gəzib dolaşmırlarmı?*, "fənzuru" – *hadisələrə, əhvalatlara, işlərin gedişatına diqqət yetirmirlərmi?* çağırışları ilə başlanır. Belə ilahi bəyanatlar birmənalı surətdə göstərir ki, Ulu Yaradan bəndələrini diqqətcil, ayıq, oyaq görmək istəyir. Duanın nə olduğunu soruşanlara Həzrət Əli "Dua iki əməlin ortasında olan bir işdir. Onun əvvəli düşüncə, sonu isə əməldir" deyə cavab vermişdir. "İşi görməmişdən qabaq görülən tədbir insanı peşmançılıqdan saxlar" (İmam Rza) kəlamı "əvaqibi-ümur" ifadəsi ilə üst-üstə düşür.



**5. "İstiğfar qılın".** Əslində, "istiğfar" sözü dini termin kimi bir qədər başqa anlama gəlir. Belə ki, tövbə etməkdən fərqli olaraq, əfv diləmək üçün suçlu olmaq, günah iş tutmaq şərt deyil. Ancaq bu, sırf dini terminologiya məsələsi olduğundan "istiğfar"ı burada bütünlüklə tövbə anlamında qavramaq gərəkdir. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, klassikada belə ştrixlər çoxdur və onlar, əslində, sırf texniki tərəf kimi nəzərdən keçirilməlidir.

Beləliklə, İmam Hüseynin (ə) Kərbəla düzündə qarşı tərəfə ünvanladığı bu sözlər onun öz düşmənlərinin də dini-dünyəvi rəhbəri olduğunu, bunu özünün başlıca tarixi missiyası olaraq gördüyünü, onların doğru yola gəlmələrinin fəaliyyətinin məqsədini təşkil etdiyini sübuta yetirir. Bu isə Füzuli qələminin o ulu din böyüyünün mənəvi-idraki üstünlüklərinin vəsfinə niyə belə ürəklə can atmasının obyektiv, ədəbi, fəlsəfi səbəblərinə dair ayrıca mühakimə yürütməyə sövq edir. İmam Hüseynin (ə) haqqında danışdığımız nitqinin son hissəsi ("Bana aman verin ki, bu ətfalü əyalı paymali-qürbət olmadan ya Həbəş canibinə, ya Rum tərəfinə alub gedəyim və bu cəzireyi-Ərəb və ərzi-Babil və mülki-Hicazi sizə təslim edəyim və əgər müharibədən təcavüz mümkün olmazsa, barı bir-bir meydana gəlin") din böyüklərinin ən ağır məqamlarda da təşəbbüskar olduğunu, təşəbbüləri ələ aldığını, qarşı tərəfin müddəalarını kökündən çürüdən təkliflər irəli sürdüyünü göstərir. Göründüyü kimi, imam burada mərhələ-mərhələ hərəkət edir. Düşmənə son dəfə əzəli-əbədi axirət həyatı ilə bağlı düşünməyə imkan verir, son nəticədə qarşı tərəfin bundan da imtina etdiyini gördükdə ənənəvi ərəb döyüş tarixinin ən bariz əlamətini önə çəkir və bununla da bədəvi qəbilə təfəkkürünün alt qatına enərək bunu düşmənin özü üçün utandırıcı faktora çevirir.

* * *

Əsər belə davam edir: "Ləşkəri-Kufə və Şam ol kəlimati-məhəbbətamizi istima' etdikdə daşlardan çeşmələr rəvan olur





kibi biixtiyar dideyi-vəqahətpişələrindən əşki-nədamət rəvan olub bir miqdar peşiman olmağa mütəvəccih ikən Bəxtəri bin Rəbi'ə, Şiş bin Rəbi'i və Şimr Zilcövşən və bə'zi rüəsayi-əskər ki dili-səxtlərində ədavəti-xanədani-vilayət mütəməkkin idi, gördülər ki, Hüseynin kəlimatı tə'sir edüb təğəyyüri-əqaidi-əskər mümkündür, filhal Hüseynə müqabil durub ayıtdılar: "Ey Hüseyn, bizim müharibəmiz Yezid hökmüylə olub, sənin zülali-nəcatın anın çeşmeyi-bey'ətindədir. Ya qəbuli-bey'ət etmək gərək, ya siyasətə yetmək gərək".

Bu hala müqarin tirəndazlara əmr olundu ki, Hüseynə möhlət verməyüb tirbaran edin. Bir qayətdə tirbaran etdilər ki, həva pəri-üqabdan məmlüv olub, kəsrəti-peykani-hücumi-ammi-siham şüai-afitabdan ol mahi-ovci-rif'ətə bir sipəri-ahənin oldu və ol gülzari-ismətin ətrafın qələbeyi-navək xaristani-cəfa qıldı. Əmma hirzi-himayəti-Rəbbani hisni-hifz olub, ol padşaha zərər yetmədi. Həzrəti-imam ol halı görüb qəlbi-sipaha həmlə qılmaq tədarükündə ikən nagah bir qübari-vəhmnak peyda olub aləmi tirə qıldı. Və ol halətdə bir şəxsi-mühib və surəti-əcib zahir oldu ki, başı mərkəbə bənzəyib, ayaqları aslan ayaqlarına bənzərdi. Həzrəti-Sultani-Kərbəlanun mülazimətinə müşərrəf olub ayıtdı: "Əssəlamu əleykə və əla cəddikə və əla əbikə". Həzrəti-imam cəvabi (səlam) alub ayıtdı: "Ey nikbəxt, sən kimsən ki, bu tənhalıqda qəribnəvazlıq edərsən?" Dedi: "Ya ibn Rəsulullah, bən bu diyarda sakin olan pərilərin sərdarıyam və bana Zə'fəri-Cinn derlər. Və Həzrəti-Əli bin Əbu Talib ol zəmanda ki Çahi-Beynəl-ələmeyndə zərbi-Zülfiqarla divləri müsəlman etdi, mənim babamı bu diyarın pərilərinə sərdar qıldı və hala bən varisi-mülkəm. Rüxsət ver ki, bu sitəmkarların etdikləri əməllərin nəticəsin göstərəyim". Həzrəti-imam ayıtdı: "Ey Zə'fəri-Cinn, hüsni-e'tiqadinə məmnun oldum, əmma siz əcsami-lətifəsiz, məhsus olmayub insanla müharibə etmək mütəzəmmini-zülmdür. Rəva görməzəm". Zə'fər Cinn ayıtdı: "Ya Hüseyn, surəti-insanə girüb cəng edəlim, netə ki, Bədr və Hüneyn mə'rəkəsində məlayikə Həzrəti-Rəsula Bədr və



Hüneyn mə’rəkəsində və’deyi-şəhadət yetməmişdi. Bəhər hal nəcat üçün müavinət lazım olmağın Həzrəti-Həqq məlayikəyə hökm etdi. Hala bən elmül-mənayada görmüşəm ki, bu gün Mə’budimlə mülaqat edərəm və dari-fənadan mülki-bəqaya gedərəm. Bu bir saət həyat üçün dostlarımı zəhmətə salmaq nə münasibdir?”

Zə’fəri-Cinn rüxsəti-müharibə bulmayub, vida’ edib müraciət etdikdə (ol qübar sakin olub, ol zülmət açılub, həzrəti-imam mütəvəccihi-hərb olub mübariz tələb etdikdə) Təmim bin Qəhtəbə ki, ümərayi-Şamdan olub, mübarizi-mə’rufdu, müqabil durub ayıtdı: “Ey Hüseyn, nəfsi-vahiddə bir ləşkərə müqabil durmuşsan ki, zəmani-sabiqdə əksərinin abavü əcdadın Nəhrəvanda və Siffin müharibəsində atan qətl edib hənuz xatirlərində ol kinə mütəməkkin ikən hala dəxi əksərinin ixvanü övladın həlak edib təcdidi-ədavət vaqe’ olmuşdur və zəman-zəman ziyad olmaqdadır. Bunun kibi ləşkərlə müqabilə etmək qələtdir. Səlah odur ki, təriqi-bey’ət məsluk edib tələbi-nəcat edəsən”. Həzrəti-imam ayıtdı: “Ey Şami, bən sizünlə ibtidayi-hərb etmədim. Siz baisi-fəsad olub övladü ənsabımı qətl etdiniz. Hala kəsrəti-ə’dadan bana təvəhhüm verib bey’ətimi almaq istərsən. Ey bədbəxt, əgərçi aləmi-surətdə sizin ləşkəriniz çoxdur, aləmi-mə’nidə bənim sipahimə (nəhayət) yoxdur. Mən ol sultani-büləndbargaham ki, süradiqi-cahü cəlalım səthi-ərşdə ətnabi-tövfiq və övtadi-tə’yidlə istehkam bulub, sayeyi-ümumi-məlayiki-ülviyyəvü süfliyyə və üqulü nüfusi-bəşəriyyə və divü pəri və vəhşü teyr təhti-livayi-imamətimdə i’anətimə mə’mur olub, mütiləri mizbani-mərhəmətim mütəməti’i-ne’məti-behişt edib, mütəmərridləri iqtizayi-müxalifətim atəşi-cəhimə yaxmışdır. İnşaallah, bu surət aqibət sizə mə’lum olur və pərdeyi-qəflət rəf’ olub hər kim surəti-ə’malın mülahizə qılur: “Qəd xəsirə’l-ləzinə kəzzəbu bi-likai’llahi hətta iza ca’əthumus-sa’ətu bəğtətən qalu ya həsrətəna əla ma-fərrətna”. Ey həramzadə, bənim cəddi-rəfi’-miqdarımdır ol ki, ləşkəri-müxalif hücum etdikdə məlayik surəti-insana girib xidmətin ixtiyar etdi. Və



bənim validi-büzürgvarımdır ol ki, rayəti-qədrin məhçeyi "Yuhibbu'llahu və rəsuluhu" gərdunsay edib zərbi-dəstindən babi-Xeybərə şikəst yetdi". Bu nişatla bir nə'rə urdu ki, cəmi'i-ləşkər heybətindən titrədi, bəlkə ərzi-Kərbəlaya zəlzələ düşdü. Həm ol halətdə tiği-saiqəkirdarın çəküb, Təmim bin Qəhtəbəyi bir zərblə həlak edib dəxi mübariz istədikdə cəmi'i-ləşkər ol səlabəti-nə'rə və ol zərbi-dəstdən tərsnak olub mütəğəyyirü mütəfəkkir qalmış ikən Zeyd Əbtəhiyi-bədbəxt ki aləmi-şücaətdə bəğayət sahibi-qürur idi və ərəbdə kəmali-mübarizətlə məşhur, şəhzadəyə müqabil durub bimühaba tiğ həvalə qıldı. Həzrəti-imam anı dəxi bir zərblə iki parə qılub, təşnəlikdən bəğayət müztərib olub su içmək qəsdinə ahəngi-rudi-Fərat etdi"[283].

*(Kufəlilərdən və şamlılardan ibarət olan ordu bu məhəbbətli sözləri eşitdikdə daşlardan çeşmələr axan kimi özlərindən asılı olmayaraq kədərli gözlərindən peşmançılıq yaşları axıtdı və onlar etdikləri əməldən bir xeyli utandılar. Bu zaman Bəxtəri bin Rəbi, Şiş bin Rəbii, Şimr Zilcövşən və daş ürəklərində vilayət xanədanının ədavət hissləri möhkəm olan bəzi qoşun böyükləri gördülər ki, Hüseynin (ə) sözlərinin təsiri ilə əsgərlərin əqidəsinin dəyişməsi ehtimalı güclüdür, dərhal Hüseynin (ə) qarşısında dayanıb dedilər: "Ey Hüseyn, bizim müharibəmiz Yezidin buyuruğu ilədir. Odur ki, sənin qurtuluş zülalın yalnız ona beyət bulağındadır. Ya beyəti qəbul etməlisən, ya da qəzəbə tuş gəlməlisən!"*

*Sonra oxçulara əmr edildi ki, Hüseynə (ə) möhlət vermədən onu durmadan oxa tutsunlar. Oxçular ona o qədər ox atdılar ki, hava lələklərlə doldu, ox uclarının ardıcıl çoxluğu və oxların hər tərəfi bürüməsi o ucalıq zirvəsinin ayı üçün onu günəş şüalarından qoruyan dəmir bir sipərə çevrilmişdi. Sanki oxların çoxluğu və sıxlığı o məsumluq çəmənliyinin ətrafında bir əzab-əziyyət tikanlığı əmələ gətirmişdi. Ancaq ilahi himayə neməti bir qoruyucu qala olduğundan o şahə heç bir zərər dəymədi.*

.................................

[283] *Füzuli. Əsərləri, VI cild, səh. 328-330*



*İmam həzrətləri (ə) vəziyyəti belə görüb ordunun ortasına hücum çəkməyə hazırlaşarkən birdən bir qorxunc toz-torpaq əmələ gəlib hər yanı qaranlığa bürüdü. Və bu an bir sevimli şəxs və qəribə sima göründü ki, onun başı at başına, ayaqları isə aslan ayaqlarına bənzəyirdi. Bu məxluq Kərbəla Sultanı həzrətlərinin xidmətində durmağı özü üçün şərəf bilərək dedi: "Salam olsun sənə! Sənin babana və atana da salam olsun".*

*İmam həzrətləri (ə) salamı alıb dedi: "Ey xoşbəxt, sən kimsən ki mənim bu yalqızlıq halımda belə qəribsevərlik edirsən?" O, belə cavab verdi: "Ey Tanrı elçisinin nəvəsi, mən bu yurdda yaşayan pərilərin başçısıyam. Adım da Zəfərdir. Əbu Talib oğlu Əli həzrətləri Beynə-l-ələmeyn quyusunda öz Zülfiqarının zərbəsi ilə divləri müsəlman etdiyi zaman mənim atamı bu yurdun pərilərinə başçı etdi. İndi isə bu mülkün varisi mənəm. İzin ver ki, törətdiyi əməllərin nəticəsini bu zülmkarlara daddırım!"*

*İmam həzrətləri (ə) buyurdi: "Ey Zəfər, imanının gözəlliyindən razı qaldım. Amma siz şəffaf cisimlərsiz, insanla döyüşmək sizin barənizdə zülm olardı. Mən bunu rəva görmürəm!"*

*Zəfər dedi: "Ey imam, biz insan şəklini alıb döyüşərik. Necə ki, Bədr və Hüneyn müharibələrində mələklər Rəsul həzrətlərinin yardımına gəldilər". İmam həzrətləri (ə) buyurdu: "Ey Zəfər, Bədr və Hüneyn müharibələrində Rəsul həzrətlərinə (s) şəhidlik vədəsi verilməmişdi. Hər ehtimala qarşı qurtuluş üçün yardıma ehtiyac duyulduğundan Həqq həzrətləri mələklərə yardım hökmü verdi. Mən isə məna elmi ilə bilirəm ki, bu gün Məbuduma qovuşacağam və heçlik evindən əbədi yurda gedəcəyəm. Odur ki, bu bir saatlıq həyat üçün dostlarımızı zəhmətə salmaq nəyə gərəkdir?"*

*Zəfər döyüş izni ala bilmədiyi üçün vidalaşaraq qayıdıb getdikdə toz-torpaq yatdı, qaranlıq çəkildi, imam həzrətləri (ə) döyüşə başlamaq üçün hazırlıq gördü. O, döyüşçü istədikdə Şam qoşununun böyüklərindən olan tanınmış döyüşçü Təmim bim Qəhtəbə onun qarşısına gəlib dedi: "Ey Hüseyn,*



*tək canınla elə bir ordu ilə üz-üzə dayanmısan ki, keçmiş günlərdə çoxunun ata-babasını Nəhrivanda və Siffeyn müharibəsində atan qətlə yetirmişdir. O kin-küdurət hələ də ürəklərində möhkəm ikən, indi də əksəriyyətinin qardaşlarını və övladlarını həlak etməklə ədavət yenidən təzələnmişdir. Hətta bu, arabir artmaqdadır da. Odur ki, belə bir qoşuna qarşı durmaq yanlışdır. Məsləhətdir ki, beyət yolunu tutub qurtuluş istəyəsən".*

*İmam həzrətləri (ə) buyurdu: "Ey şamlı, sizinlə müharibəni mən başlamadım. Siz fitnə-fəsad törədib övladlarımı, qohum-əqrəbamı qətlə yetirdiniz. İndi isə düşmənin çoxluğu ilə məni qorxudaraq beyətə gətirmək istəyirsən. Ey bədbəxt, üzdə sizin qoşununuzun çox görünməyinə baxma, məna aləmində mənim ordumun ucu-bucağı görünmür. Mən o uca dərgahlı sultanam ki, cah-cəlalımın nişanələri ilahi uğur sayəsində və Tanrı yardımı nəticəsində ərşin üzərində möhkəmlənmişdir, ümumi tabelik kölgəsini bütün kainatın üzərinə salmışdır. Digər tərəfdən, bütün ülvi və süfli mələklər, bütün bəşəri nəfs və ağıllar, bütün divlər və pərilər, bütün qaçarlar və uçarlar (vəhşilər və quşlar) imamlığımın bayrağı altında buyuruğumu yerinə yetirməyə hazır olmuşdur. Belə ki, onların müti olanlarını mərhəmət keşikçim cənnətin nemətlərinə qovuşdurmuş, tərəddüd edənləri isə mənə zidd getdiklərinə görə cəhənnəm odunda yanmışdır. Allahın dilədiyi təqdirdə bu vəziyyət sizə də bəlli olar və qəflət pərdəsi aradan qalxmaqla hər bir kimsə özünün əməllərinin, davranış və rəftarının əksini görər."Allaha dönəcəklərini yalandan söyləyənlər ziyan etmişlər. Nəhayət, özlərinə qəfildən o zaman gəlib çatınca "Vay başımıza gələnlərə, gör bir nə etdik!" deyərlər" ("Ənam", 31). Ey haramzadə, düşmən qoşunu hücuma keçdikdə mələklərin insan şəklinə düşərək xidmətində durduğu o şəxsiyyət mənim qədir-qiyməti yüksək olan babamdır. "Allah və Peyğəmbəri onu sevir" aycığını özünün qədir-qiymət bayrağında fələyin kölgəsinə çevirərək qolunun bircə zərbəsi ilə Xeybər qapısını köklü-köməcli yerindən qoparan o şəxs mənim böyük olan atamdan özgəsi deyil!"*



*İmam Hüseyn (ə) bu sözləri ilə elə bir nərə çəkdi ki, bütün qoşun qorxusundan tir-tir əsdi. Bəlkə də Kərbəla torpağı zəlzələyə gəldi. Bu andaca o, ildırım sürətli qılıncını çəkib Təmim bin Qəhtəbəni bircə zərbə ilə həlak etdikdən sonra təzə döyüşçü istədikdə bütün qoşun o nərənin təsirindən və iti qılınc vuruşundan dərin qorxuya düşdü. Düşmən qoşunu belə dəyişkənlik və fikir-xəyal içərisində mat-məəttəl qalmış ikən döyüşçülər arasında olduqca qürurlu, qürrəli və ərəblər içində seçkin vuruş texnikasına malik şəxs sayılan bədbəxt Zeyd Əbtəhi şahzadənin qarşısına çıxıb gözlənilmədən ona qılınc çəkdi. İmam həzrətləri onu da bircə zərbə ilə iki yerə parçalayıb azacıq su içmək üçün Fərat çayına sarı yönəldi, çünki susuzluqdan böyük əziyyət çəkirdi).*

Göründüyü kimi, parça istər ideya-məzmun baxımından, istərsə də bədii-estetik keyfiyyətləri ilə olduqca mürəkkəb struktura və kompozisiyaya malikdir. Bu struktur və kompozisiya xüsusiyyətlərini belə ümumiləşdirmək olar: 1. Gərgin psixoloji əhvali-ruhiyyə; 2. Kəskin dialoqlar; 3. Kəsərli mövqe mübarizəsi; 4. Çevik hərbi gedişlər; 5. Gözlənilməz ilahi yardımla əsatiri halların növbələşməsi; 6. Dini müqəddəsatın məqsədyönlü bəhs mövzusuna çevrilməsi; 7. Baş qəhrəmanın şücaətinin vüsətli təsvir və tərənnümü.

Əlbəttə, bu xüsusiyyətlər hər biri barəsində ayrıca danışıla biləcək qədər dolğun və tutumludur. Ancaq yersiz təfərrüatdan çəkinməkdən ötrü biz həmin xüsusiyyətlərə dair ümumi şəkildə mühakimə yürütməklə kifayətlənəcəyik.

İlk növbədə bunu deyək ki, parçanın struktur və kompozisiya xüsusiyyətləri çox vaxt qırılmaz bağlılıq və üzvi uyarlılıq içində olub, biri o birini fikri axar və bədii tutumca bitkinləşdirməkdə və yetkinləşdirməkdədir. Məsələn, gərgin psixoloji əhvali-ruhiyyə amili əksər hallarda kəskin mükalimə və kəsərli mövqe əsaslandırmaları ilə müşayiət olunur. Yaxud çevik hərbi gedişlərin və baş qəhrəmanın şücaətinin vüsətli təsvir və tərənnümünün içərisində gözlənilməz ilahi yardımın



və əsatiri halların növbələşməsi faktı özünə möhkəm yer edir. Dini müqəddəsatın məqsədyönlü bəhs mövzusuna çevrilməsi isə bu xüsusiyyətlərin çoxu üçün səciyyəvidir.

Parçanın ideya-məzmun göstəricilərindən biri kimi bu, diqqəti çəkir ki, baş qəhrəmanın çoxsaylı düşmən ordusu ilə apardığı əzəmətli mübarizədə dini müqəddəslərlə bağlı yaxın keçmiş artıq zamanın qaranlıqlarına qarışmış “ölü tarix” kimi yox, yaşarı, diri və işlək mübarizlik faktoru kimi çıxış edir. Bəxtər ibn Rəbinin, Şiş bin Rəbiinin, Şimr Zilcövşənin “qatı” qəlblərində Həzrət Əli vilayətinə və bu vilayətin daşıyıcıları olan sonrakı imamlara bəslənən kinin möhkəm olmasının, Zəfər adlı mifik varlığın Həzrət Əlinin (ə) Beynə-l-ələmeyn quyusunda öz Zülfüqarı ilə divləri müsəlman etməsinin və onun atasını o yerin pərilərinə sərdar seçməsinin, düşmən tərəfdən olan Təmim bin Qəhtəbənin İmam Hüseynə (ə) Nəhrivan və Siffeyn müharibələrini xatırlatmasının, İmam Hüseynin (ə) məşhur Xeybər qalasının fəthindən söz açmasının ayrıca vurğulanması məhz bunu göstərir.

Digər tərəfdən, bu vurğulanma Kərbəla vaqeəsini şanlı İslam müharibələrinin təbii davamı kimi qavratdığı üçün də ayrıca bədii-estetik önəm qazanır. Belə ki, əsərin bu bölümünü mütaliə edən səriştəli oxucu üçün İmam Hüseyn (ə) hərəkatını əzəli-əbədi haqq işinin həlledici mərhələsi saymaq qətiyyən çətin olmayacaqdır.

* * *

Nəinki parçanın, bütövlükdə əsərin ideya-məzmun cizgilərini yetərincə qavramaqdan ötrü buradakı mifik qatın dərinliklərinə enmək qaçılmazdır. Çünki bu qat bir yandan vaqeənin mistik təbiətindən soraq verirsə, o biri yandan müəllifin milli-mənəvi kimliyinin və üzərində bərqərar olduğu xəlqi-mədəni köklərin bariz tarixi və ədəbi əlaməti yerində çıxış edir.





Oradan başlayaq ki, ictimai şüur formalarından biri olan din hər nə qədər mükəmməl olsa da, istər-istəməz müəyyən mifoloji motivlərdən tam azad ola bilmir. Çünki ilahi başlanğıc ideyasının mayasında sarsılmaz bir ilkin əsatiri qat durur. Dünya xalqlarının mifologiyasının toplandığı çoxcildlikləri ələk-vələk etdikdə dini müddəalarla əsatiri təsəvvürlərin iç-içə olduğunu görürük. Qobustan qayası rəsmlərindən Qədim Roma və yunan ədəbiyyatına kimi, "Avesta"dan postmodernist nəsrədək bu cəhət dəyişilməz qalır.

Digər tərəfdən, professor, mərhum Mirəli Seyidovun gərgin əməyinin məhsulu olan "Azərbaycanın mifik təfəkkürünün qaynaqları" və "Qızıl döyüşçünün taleyi" kitablarında möhkəm surətdə əsaslandırırlan zəngin türkçülük və bunun orta əsr azərbaycanlısının dünyagörüşündəki əvəzedilməz yeri ilə bağlı birmənalı bilgilər Füzuli irsinin ayrılmaz, qorxmaz bir parçası olaraq meydana çıxan "Hədiqətü-s-süəda" əsərinin canına-qanına hopmaya bilməzdi. Birdəfəlik bilmək gərəkdir ki, ədibin hansı mövzuda nə yazmasından asılı olmayaraq, bu bilgilər onun gen yaddaşında möhkəm bərqərar olduğundan istər-istəməz ruhundan su içən qələmi ilə yaratdığı hər bir əsərə keçir, bu, yaxud başqa formada özünü büruzə verir. Odur ki, "Hədiqətü-s-süəda" da bu baxımdan istisna təşkil etmir.

Mifik qat əsərə qəfildən gəlir. Ancaq bu gözlənilməzlik qətiyyən onun mətnə yad-yabançı olmasına dəlalət etmir. Əksinə, əsatir aləminə yaxşı bəlli olan bu hal mifik qatı parçaya bir az da möhkəm pərçim edir. Unutmayaq ki, Füzuli İmam Hüseynin (ə) çox şiddətli şəkildə oxa tutulmasına baxmayaraq, onun yalnız "hirzi-himayəti-rəbbani" – *ilahi yardım çətiri* sayəsində sağ-salamat qaldığını bildirir. Zənnimizcə, yuxarıda qonşu anlayışlar kimi göstərdiklərimiz gözlənilməz ilahi yardım və əsatiri hallar məfhumlarına müəllifin verdiyi estetik dəyərləndirmənin bariz təzahürüdür.

Bəllidir ki, mifik personajların Adəm övladı ilə görüşü ərəfəsində qeyri-adi hallar baş verir: günün günorta çağı





lapdan hava qaralır, qaranlıq çökür, ətrafı toz-duman bürüyür. Füzuli də Zəfər adlı mifik məxluqu İmam Hüseynlə (ə) bu vəziyyətdə görüşdürür (Nagah bir ğübari-vəhnak peyda olub, aləmi tirə qıldı).

Digər tərəfdən, bütün mifik varlıqlar üçün səciyyəvidir ki, onlar əcaib və qorxunc olub, heybətli görünsünlər. Bu, burada da belədir: "Bir şəxsi-mühib və surəti-əzib zahir oldu ki, başı mərkəbə (ata) bənzəyüb, ayaqları aslan ayaqlarına bənzərdi".

Lakin bu əcaib və qorxunc məxluq bəşəriyyətin ən kamil şəxsiyyətlərindən biri ilə görüşdüyündən son dərəcə ədəblə davranır, dərin sayğı və sevgi nümayiş etdirir.

"Ey nikbəxt, sən kimsən ki, bu tənhalıqda qəribnəvazlıq edirsən" sualından İmam Hüseynin (ə) bu mifik obrazı tanımadığı anlaşılır. Zənnimizcə, bu, qətiyyən müqəddəsliyə və övliyalığa uyğun gəlməyən hal sayılmamalıdır. Çünki İmam Hüseyn (ə) burada ilk növbədə sırf döyüş əhvali-ruhiyyəsindədir. Digər tərəfdən, nəzərə alınmalıdır ki, bu ulu din böyüyü indiki halda olduqca köməksiz, əlacsız durumdadır.

Parçanın mifik qatı ilə bağlı diqqəti çəkən bir başqa ştrix əsatiri personajın adıdır. Belə ki, sırf ərəb leksemi olan "Zəfər" sözünü həm əski bədəvi təsəvvürləri ilə bağlamaq olar, həm də ərəblərlə qonşu olan xalqların sokral dünyaduyumunun, inam-inanc sisteminin ərəb versiyası, ərəbləşmiş şəkli saymaq mümkündür. Ancaq necə qəbul edilməsindən asılı olmayaraq, bilmək gərəkdir ki, bu ad, hər şeydən öncə, bir qalibiyyət, bir üstünlük fenomenidir. Odur ki, onu qədim türklərin "Uğur tanrısı"nın ərəb versiyası da saya bilərik. "Rüxsət ver ki, bu sitəmkarların etdikləri əməllərin nəticəsin göstərəyim!" təklifindəki özünəinam tonu məhz bundan soraq verir.

İmam Hüseynin (ə) bu təklifə cavabı Zəfərlə bağlı anlayışı bir az da genişləndirir. Çünki onun "hüsni-etiqadına məmnun oldum, amma siz əcsami-lətifəsiz, məhsus olmayub, insan ilə müharibə etmək mütəzzəmmini-zülmdür, rəva görməzəm" şəklindəki sözləri bu mifik personajın da insanlar kimi əqidə sahibi ola biləcəyini göstərir. Onun "Mən bu diyarda sakin



olan pərilərin sərdarıyam" deyərək özünü "pəri" adlandırması əsərdəki mifik obrazın cinlərdən olduğunu söyləməyə imkan verir. İslam isə cinləri də, insanlar kimi, mükəlləf varlıq hesab edir *("Fussilət", 29; "Nas", 6).*

İmamın sözlərindən Zəfərin şəffaf varlıq olduğu da anlaşılır. Bu isə onun mifik təbiətini daha geniş şəkildə qavradır. Ancaq Füzuli təxəyyülü əsatiri obrazın imkanlarını bununla da məhdudlaşdırmır. Zəfərin İmam Hüseynə (ə) cavabından onun insan şəklinə girə biləcəyi də bəlli olur.

Beləliklə, görürük ki, Füzuli qələminin yaratdığı mifik personaj əsatir aləminə xas başlıca keyfiyyətləri özündə birləşdirir. Odur ki, bir məqtəldə belə bir surətlə qarşılaşmaq qətiyyən təəccüb doğurmamalı, əksinə, həm həyat həqiqətinin – Kərbəla vaqeəsinin, həm də sənətkarın bilgi və anlayış genişliyinin dəlili sayılmalıdır.

* * *

Füzuli əsərin baş qəhrəmanının portretini parçadakı mükalimələrdə daha qabarıq cızır. Məsələn, onun Zəfər mifik obrazına verdiyi cavabların birindən İmam Hüseyn (ə) şəxsiyyətinin mayasının şəhidlik və cihad fəlsəfəsi ilə yoğrulduğu bütün aydınlığı və genişliyi ilə ortaya çıxır. O, Zəfərə insan şəklinə düşüb döyüşmək üçün izin verməməsini belə əsaslandırır: "Ey Zəfər, Həzrəti-Rəsula Bədr və Hüneyn mə'rəkəsində və'deyi-şəhadət yetməmişdi. Bəhər hal nəcat üçün müavinət lazım olmağın Həzrəti-Həqq məlayikəyə hökm etdi. Hala bən elmü-l-mənayada görmüşəm ki, bu gün Mə'budimlə mülaqat edərəm və dari-fənadan mülki-bəqaya gedirəm. Bu bir saət həyat üçün dostlarımı zəhmətə salmaq nə münasibdir?"

Göründüyü kimi, imamın gözündə "vədeyi-şəhadət" "nəcat üçün müavinət"dən qat-qat üstündür.

Şam əmirlərindən olub məşhur pəhləvan kimi ad çıxaran Təmim bin Qəhtəbə ilə dialoqu isə İmam Hüseynin (ə) istər maddi-fiziki gücünə, istərsə də ruhi-mənəvi böyüklüyünə dair olduqca aydın anlayış verir. İbn Qəhtəbənin sözlərindən bu





başlıca cəhətlər anlaşılır: 1. İmam təkbaşına təpədən-dırnağa kimi silahlanmış bir orduya qarşı dayanmışdır; 2. Düşmən imama Nəhrəvan və Siffeyn müharibələrində atası Həzrət Əlinin (ə) indi onun təkbaşına qarşı durduğu ordunun sıra nəfərlərinin çoxunun ata-babalarını öldürdüyünü xatırladır; 3. O, Aşura günündə də imamın qoşununun düşmən əsgərlərinin çoxunun qardaş və övladlarını qətlə yetirdiyini ayrıca nəzərə çatdırır; 4. İbn Qəhtəbəyə görə, belə bir orduya qarşı təkbaşına durmaq hər baxımdan yanlışdır; 5. Ona görə də gərək imam "təriqi-bey'ət məsluk edüb tələbi-nicat etsin – Yezidə tabeçilik yolunu seçərək onun qoşun böyüklərindən qurtuluş istəsin.

Əlbəttə, ibn Qəhtəbənin sözləri öz zahiri məntiqi ilə utilitar, maddi maraqlarla yaşayan dünyasevərlərin gözündə cəlbedici təklifdir. Ancaq Rəsulullahdan (s) və Həzrət Əlidən (ə) sonra bəşəriyyətin üçüncü ən kamil şəxsiyyəti olan bir kimsə belə təklifə heç gözünün ucu ilə də baxmazdı. Odur ki, bu ulu din böyüyünün ibn Qəhtəbəyə verdiyi cavab adi mükalimə elementi olmaqdan çıxıb, misilsiz bir qəhrəmanın özünün əzəli-əbədi haqq işi ilə bağlı sarsılmaz mövqeyini hərtərəfli surətdə əsaslandırdığı proqram xarakterli bir monoloqa çevrilir. İmamın sözlərindən bu başlıca cəhətlər anlaşılır: 1. İbn Qəhtəbə imama "ey Hüseyn" deyə adı ilə üz tutduğu halda, imam ona "ey şamlı" şəklində xitab etməklə onu hər baxımdan özündən qat-qat aşağıda dayanan mənfur bir tərəf kimi səciyyələndirir; 2. "Sizinlə döyüşü mən başlamadım" sözləri İmam Hüseynin (ə) sülhsevərliyini, yalnız qaçılmaz olduğu təqdirdə müharibəni gərəkli saydığını göstərir; 3. "Siz baisi-fəsad olub övladimi, ənsabimi qətl etdiniz" cümləsi bir yandan bu ulu din böyüyünün başında Yezidin durduğu hakimiyyətin başdan-ayağadək bir fitnə-fəsad yuvasına çevrildiyinin mərd-mərdanə elan edilməsidirsə, o biri yandan verdiyi itkilərin qanını belə asanlıqla yerdə qoymayacağını göstərən bir açıqlamadır; 4. "Hala kəsrəti-ə'dadən bana təvəhhüm verüb bey'ətimi almaq istərsən" cümləsi sualdan çox nida ilə doludur. Bu cümlə danılmaz biçimdə sübuta



yetirir ki, düşmənin çoxluğundan zərrəcə qorxub çəkinməyən imam üçün beyət məsələsi hər baxımdan ölüm-dirim və şərəf məsələsidir. "Mənim əqidəmdə olan kimsə Yezidin əqidəsində olan kimsəyə əsla beyət etməz!" sözləri İmam Hüseynin (ə) təkcə mübarizliyini, əzmkarlığını göstərmir. Bu sözlər ilk növbədə bir inam-inanc ərinin, bir etiqad-əqidə mücəssəməsinin qranit təbiətindən soraq verir; 5. İmamın ibn Qəhtəbəyə ikinci dəfə "ey bədbəxt" deyə xitab etməsi onun öz nitqini artıq mənəviyyat müstəvisinə keçirməsinə vurulmuş arifanə işarədir; 6. "Əgərçi aləmi-surətdə sizin ləşkəriniz çoxdur, aləmi-mə'nidə bənim sipahimə (nəhayət) yoxdur!" cümləsi özlüyündə ayrıca irfani bəhs olan "surət–siyrət" məsələsini mətnə gətirməklə maddi və mənəvi dəyərlərin qarşılaşdırılması üzərində qurulan bir müqayisə çətiri yaradır. Belə ki, imam yalnız "qoşun" anlamına gələn "ləşkər" sözünü düşmənə, daha çox "ordu" mənasını verən "sipah" sözünü isə özünə aid etməklə malik olduğu ilahi başlanğıcı dilə gətirmiş olur; 7. İmam "ilahi uğur"a və "Tanrı yardımı"na malik olmaqla "cah-cəlalının nişanələri ərşin üzərində möhkəmlənmiş"dir və bütövlükdə kainata təsir etmək imkanı əldə etmişdir; 8. Əzəli-əbədi mükafat və cəza bir xeyli imama bəslənilən münasibətdən asılıdır; 9. Bütün bunlar mücərrəd məzmunla qalmayıb, Allah-taalanın buyurduğu zaman hər kəsə bəlli ola biləcək qədər konkretdir; 10. Bu konkretlik imamın nitqində nəqli dəlillərlə – ayə və hədislərlə təsbit olunur; 11. İmam babası Rəsulullahın qədir-qiymətinin yüksəkliyinə düşmən hücumu zamanı mələklərin insan şəklinə düşərək onun xidmətində durmasını dəlil göstərir; 12. İmamın nitqində "Əlinin bircə zərbəsi ilə Xeybər qalasının qapısını yerindən qoparması" Həzrət Əlinin (ə) ən bariz məziyyətləri sırasında qeyd edilir; 13. Ən nəhayət, imam Rəsulullahın (s) və Həzrət Əlinin (ə) dosdoğma ata-babası olmasını özü üçün ən şərəfli öyünc qaynağı sayır.

Göründüyü kimi, İman Hüseyn (ə)–ibn Qəhtəbə dialoqu düşmənin iç üzünü açıb göstərdiyi qədər, o ulu din böyüyünün



əlçatmaz-ünyetməz məziyyətlərini də olduqca dəqiq ifadə edir. Ötəri deyildir ki, bütün qoşunu qorxusundan tir-tir əsdirən və Kərbəla torpağını zəlzələyə saldıran məhz bu sözlərin güc verdiyi nərədir. Odur ki, baş qəhrəmanın daxili aləmini daha yaxşı qavramaqdan ötrü onun yuxarıdakı məziyyətlərinin bir neçəsini ayrıca gözdən keçirmək gərəkdir.

Məsələn, "Əzəli-əbədi mükafat və cəza bir xeyli imama bəslənilən münasibətdən asılıdır" qənaəti baş qəhrəmanın Tanrı sınağının, ilahi imtahanın məhək daşına çevrilməsi baxımından ayrıca önəm qazanır. İmam Rzanın xəlifə Məmunla olan mükalimısi bu fikrə bir az da islami dolğunluq gətirdiyindən qənaət burada əsərin ideyası səviyyəsinə yüksəlir.

"Əbu Sullət Hərəvidən nəql olunur ki, o, belə dedi: Məmun Həzrət Əli ibn Musa Rzaya belə dedi:

– Baban Əmirəl mömininindən mənə xəbər ver ki, o, cənnəti və cəhənnəmi nə cür böləndir?

İmam Rza buyurdu:

– Atalarından, o cümlədən də Abdullah ibn Abbasdan eşitməmisənmi ki, deyirdi: "Allahın elçisinin belə buyurduğunu eşitdim: "Əliyə sevgi – iman, ona qarşı kin və düşmənçilik isə küfrdür"?!"

Məmun "Bəli" deyə cavab verdi.

İmam belə buyurdu:

– Cənnət mömin üçün, od isə kafir üçündür. Bir halda ki cənnət və cəhənnəm onun sevgisi və düşmənçiliyi yönündə bölünür, deməli, o, onların ayıranıdır!

Məmun dedi:

– Allah sizdən sonra bizləri yaşatmasın. Doğrudan da, sən baban Rəsulullahın varisisən.

Əbu Süllət nəql edir: İmam evə qayıtdıqda ona belə söylədim: "Ey Peyğəmbər balası, Allah məni sənə fəda etsin ki, Məmuna necə də gözəl cavab verdin!" O həzrət buyurdu: "Mən atamdan, o da öz atalarından, onlar da Əlidən, o da Peyğəmbərdən eşidib: "Ey Əli, sən Qiyamət günündə cənnət



və cəhənnəmi ayıransan. Sən oda deyəcəksən: "Bu, məndəndir, o isə səndən!"[284]

İmam Şafeyinin aşağıdakı məşhur şeiri məhz bu Əli ucalığının tərənnümünə həsr edilmişdir:

'Aliyyun hubbhu cünnəh,
Qasimun nari va-l-cənnəh.
Vəsiyyu-l-Mustəfa Həqqa:
İmamu-l-insi va-l-cinnəh![285]

*(Əli məhəbbəti cəhənnəm odundan qoruyan qalxandır. O, cəhənnəmlə cənnəti böləndir, Tanrının izniylə təyinedəndir. Peyğəmbərin tapşırığı və vəsiyyəti tamamilə doğrudur: "Əli insanların və cinlərin, bütün yaranmışların imamıdır, rəhbəridir!").*

Aydındır ki, Həzrət Əli (ə) dühasının ən yetkin yetirməsi olduğundan bu şəxsiyyət bütövlüyü İmam Hüseynə (ə) də aiddir. Ötəri deyildir ki, mənqəbələrdə o ulu din böyüyünün özünə yardım etməyi taleyüklü məsələ sayması dəfələrlə göstərilir. Məsələn, imam şair Fərəzzəqdən sona kimin onunla birlikdə olub-olmadığını soruşduqda: "Ey Hüseyn ibn Əli, mən səni çox istəyirəm. Ancaq məni üzrlü hesab et, bu səfərdə səni müşayiət edə bilməyəcəyəm" cavabını eşitdikdən sonra belə buyurur: "Ey Fərəzzəq, onda elə bir yerə get ki, mənim insanları imdada çağırmağımı eşitməyəsən. Çünki bu səsi eşidib köməyə gəlməyənlərə cəhənnəm odu vacibdir!"

* * *

İmam Hüseyn (ə)–ibn Qəhtəbə dialoqunu şərtləndirən amillərdən biri də bu ulu din böyüyünün əsaslandığı nəqli dəlillərdir. Məsələn, imamın gətirdiyi ayə "Əzəli-əbədi

.................................

[284] *Əli və-l-Vəsiyyətu zi-l-Əskəriyy, səh. 64 – Mahmud Şəriətzadə Xorasani. Dər sayeyi-övliyayi-Xuda, 2 cilddə, I cild, Qum, h.-ş. 1378, səh. 110*

[285] *Fəra'idu-s-səmteyn, səh. 326*





mükafat və cəza İmam Hüseynə (ə) bəslənilən münasibətdən asılıdır" qənaətinin təsdiqi – islami söykənəcəyi yerindədir. Odur ki, həmin ilahi bəyanatın ümumi təfsirini, yığcam açıqlamasını bilmək əsərin ideya-bədii xüsusiyyətlərinə bələd olmaq və baş qəhrəmanın daxili aləminə daha geniş pəncərə açmaq üçün qaçılmazdır.

İmam Hüseynin (ə) nitqindəki ikinci nəqli dəlil hədisdir. O, ibn Qəhtəbəyə belə söyləyir: "Allah və Peyğəmbəri onu sevir" ayparasını özünün qədir-qiymət bayrağında fələyin kölgəsinə çevirərək qolunun bircə zərbəsi ilə Xeybər qapısını köklü-kötəcli yerindən qoparan o şəxs mənim böyük olan atamdan özgəsi deyil!"

Oradan başlayaq ki, hədisin Quranda əsası vardır: "Ey iman gətirənlər! Sizdən hər kəs dinindən dönsə, (bilsin ki) Allah (onun yerinə) elə bir tayfa gətirər ki, (Allah) onları, onlar da (Allahı) sevərlər. Onlar möminlərə qarşı mülayim, kafirlərə qarşı isə sərt olar, Allah yolunda vuruşar və heç kəsin tənəsindən qorxmazlar. Bu, Allahın lütfüdür, onu istədiyinə verər. Allah (öz lütfü ilə) genişdir. (O, hər şeyi) biləndir!" *("Maidə", 54).* Hədisin ayədəki istinadgahı "Yuhibbuhum va yuhibbunəhu" *(Allahın mürtədlərin yerinə gətirdiyi yeni bəndələri Onu sevərlər, O da onları sevər)* hissəciyidir. Bu hissəcik gör nə qədər yayılmışdır ki, sufilər belə hesab edirlər ki, "Allah ən böyük Aşiq və Məşuqdur"[286].

Deməli, təsəvvüf əhli həmin hissəciyi yozmuş, ona təriqət və cərəyanlara uyğun anlam çalarları qazandırmışdır. Belədə Füzulinin həmin hissəciyi sırf islami yöndə əsərə gətirməsi tamamilə təbiidir. Ancaq şair bu nəqli dəlili adi iqtibas kimi yox, parlaq obrazlılıq kimi əsərə gətirmişdir. Belə ki, müqəddəs sözü bayrağın tərkib hissəsinə çevirən sənətkar onu Həzrət Əlinin (ə) qədir-qiyməti və fələyin kölgəsi kimi önəmli islami anlayışlarla bağlamış, "Həzrət Əli və Xeybər

[286] *Məmmədli N. Şeyx Nəcməddin Razinin "Eşq və əql" risaləsi və onun "Məntiqü-t-teyr"lə əlaqəsi, Filologiya məsələləri, 3, səh. 154*





qalası" timsalında öncə reallığa əsaslanan ziddiyyət, sonra həmin ziddiyyət üzərində parlaq təzad yaratmışdır.

* * *

Ən nəhayət, mətnin özündə birləşdirdiyi dini-mənqəbəvi anlayışların bədii-ifadə yollarına göz gəzdirək. Çünki bu, indiyədək toxunduğumuz mətləblərin ideya-bədii təbiətinə dair aydın və dolğun anlayış almaqdan ötrü qaçılmazdır.

Oradan başlayaq ki, sözün əlində mum olduğu Füzuli üçün hər hansı bir məfhumu istənilən yöndə motivə çevirmək su içmək qədər asandır. Ancaq son dərəcə imanlı olduğundan şair qətiyyən dini dəyərlərlə oynamamış, əksinə, öz tutduğu hər bir anlayış üzərində bir etiqad, ibadət və əxlaq mühafizəçisi kimi əsmişdir.

Mətndə dini-mənqəbəvi anlayışlar çoxdur; məs.:

**1.** "Ədavəti-xanədani-vilayət" – Həzrət Əli (ə) vilayətinə kin-küdurət bəsləmək;
**2.** "Təğəyyüri-əqaidi-əskər" – düşmən əsgərlərinin dini etiqadını dəyişmə ehtimalı;
**3.** "Yezidin beyət bulağı";
**4.** "Gülzari-ismət" – İmam Hüseynin (ə) məsumluq çəmənliyi;
**5.** "Hirzi-himayəti-rəbbani" – ilahi yardım çətiri;
**6.** "Həzrəti-imam";
**7.** "Həzrəti-Sultani-Kərbəla";
**8.** Salamlaşmaq;
**9.** "Yə-bnə Rəsulullah" – Ey Tanrı elçisinin nəvəsi;
**10.** Pərilər;
**11.** "Həzrəti-Əli bin Əbu Talib (ə)";
**12.** "Çahi-beynə-l-ələmeyn" – iki bayraq arasında yerləşən quyu;
**13.** Zülfiqar;
**14.** Divlər;
**15.** Müsəlman;
**16.** Vərəsəlik (mətndə: varisi-mülk);





**17.** "Hüsni-etiqad" – əqidə gözəlliyi;
**18.** "Mütəzəmmini-zülm" – haqsızlığı rəva görmək;
**19.** "Bədr və Hüneyn döyüşləri";
**20.** "Məlaikə";
**21.** "Həzrəti-Rəsul" (s)";
**22.** Şəhidlik (mətndə: vədeyi-şəhadət);
**23.** "Həzrəti-Həqq" (Allah-taala (c.c));
**24.** "Elmü-l-məani" – batin elmi;
**25.** "Məbud" – ibadətə layiq Tanrı;
**26.** Dünya və axirət (mətndə: dari-fəna və mülki-bəqa);
**27.** Nəhrivan, Siffeyn müharibələri;
**28.** Fasidlik (mətndə: baisi-fəsad olma);
**29.** Ərş – yüksək idarə mərkəzi (Abdullah ibn Abbas);
**30.** "Məlaiki-ülviyyəvü süfliyyə" – yuxarı və aşağı mələklər;
**31.** İmamət;
**32.** Cənnət nemətləri (mətndə: neməti-behişt);
**33.** Cəhənnəm odunda yanmaq (mətndə: atəşi-cəhimə yaxmaq);
**34.** İnşallah – əgər Allah istəsə;
**35.** Əməl dəftəri (mətndə: surəti-ə'mal);
**36.** Ayə və hədis iqtibasları;
**37.** "Haramzadə" – haram yolla, zinakarlıqla əmələ gəlmiş;
**38.** Xeybər qalasının qapısı;
**39.** Kərbəla torpağı;
**40.** Fərat çayı.

Bunlar hələ parçada müstəqim surətdə işlənmiş müstəqil dini-mənqəbəvi anlayışlardır. Ancaq mətndə sətiraltı şəkildə əksini tapan məfhumlar da vardır. Məsələn, "Daşlardan çeşmələr rəvan olur kimi" tərkibi assosiativ surətdə mübarək "Bəqərə" surəsinin 74-cü ayəsini xatırladır. Yaxud "əşki-nədamət rəvan ol"maq – peşmançılıqdan doğan göz yaşları axıtmaq və "bir miqdar peşiman olmağa mütəvəccih ikən" tərkiblərindən açıq-aşkar bir tövbəkarlıq duyğusu boylanır *("Nisa", 17-18)*. Və ya mifik obraz olan Zəfərin başının mərkəbə (at başına), ayaqlarının isə aslan ayaqlarına bənzədilməsi Rəsulullahın (s) üzərinə minərək Meraca getdiyi Buraqı xatırladır. Belə ki,



hədislərdə bildirildiyinə görə, Buraq qatırdan kiçik, eşşəkdən böyük, uzun, ağ rəngli, addımını gözünün görə bildiyi yerin sonuna atan bir minikdir[287].

Parçadakı dini-mənqəbəvi anlayışların şairin çeşidli yaradıcılıq istəklərinin əlverişli bədii ifadəsi kimi yerindən danışdıqda onların yerinə görə tarixi (məs.: "ədavəti-xanədani-vilayət"), yerinə görə psixoloji (məs.: "təğəyyüri-əqaidi-əskər"), yerinə görə hərbi (məs.: Bədr, Siffeyn və s.), yerinə görə də ictimai-siyasi ("Yezidə beyət", "fasiqlik", "imamət") sferalarını əhatə etmək üçün son dərəcə yararlı olduğu ortaya çıxır. Ötəri deyildir ki, bu məfhumların çoxu "Hədiqətü-s-süəda"nın bundan qabaqkı və sonrakı bölümlərində qabarıq əksini tapmışdır. Əsərin "Xatimə"sində Übeydullah Ziyadın, Ömər Sədin və Yezidin Əhli-beytə bəslədiyi kin-küdurətin geniş təsvir edilməsini səriştəli oxucu çox asanlıqla "ədavəti-xanədani-vilayət" tərkibində əksini tapmış anlayışın bədii əks-sədası kimi qavrayacaqdır.

Araşdırdığımız parçanın ən orijinal anlayışı "Xeybər qalasının qapısı"dır. Çünki bu anlayış yalnız şanlı İslam tarixinə dair yaddaşları təzələməklə qalmayıb, Həzrət Əli (ə)–İmam Hüseyn (ə) bağlılığının yeni bir dini ictimai teli kimi anlaşılır.

* * *

"Hədiqətü-s-süəda"nın İmam Hüseyn (ə) bölümü belə davam edir: "Şimri-lə'in ol halı görüb fəryad etdi ki: "Ey ləşkəri-Şamü Kufə, zinhar, zinhar, Hüseynə təmkin vermən ki, bir qətrə su içə ki, əgər kəndü sirab olub, mərkəb su içə, bin bu ləşkər kibi ana cəvab verməz və cəmi' etdigimüz sə'ylər zaye' olmaq müqərrərdir". Ol həramzadə təhrikilə ləşkər qələbə qılub, həzrəti-imamla Fərat arasına hayil oldular və həzrəti-imam mərkəbi-badrəftarına cilvə verib və tiği-atəşbarın çəkib müqatiləyə mücadiləyə məşğul oldu. Şe'r:

.................................

[287] *Mətin Akar. Türk ədəbiyyatında mənzum meracnamələr, Ankara, 1987, səh. 216*





Öylə kim pulad ilə daşdan olur atəş əyan,
Axıdırdı tiği-bərqindən ədunin xuni-nab.
Xuni-ə'dadan rəvan eylərdi hər yan seyllər,
Seyllər üzrə əyan eylərdi başlardan hübab.
Cövhəri-tiğində məzmun mövci-tufani-fəna,
Sayeyi-rəmhində müzmər şərhi-əhvali-əzab.
Cilveyi-rəxşində rövşən sür'əti-nuri-bəsər,
Surəti-seyrində zahir həmleyi-sultani-xab.
Rəxşi kuhi-badcünbüş, tiği bərqi-abgün,
Rəxşinə gərdun fəda, tiğinə qurban afitab.

Ol şahsəvari-ərseyi-meydani-şəhadət və ol şahbazi-seydgahi-səadət rəxşi-himmət gərmcövlan edib və tiği-şücaət qərqi-xunabi-əhli-şəqavət qılub, ol zalimlərin üç səfin çak edib kəndüsin Fərata yetirdi. Nəhəngvar Fərata girib, əlinə su alıb içmək istədikdə bir kimsənə nida yetirdi ki: "Ey Hüseyn, nə su içmək məcalıdır, ləşkəri-bədxah qarəti-hərəmsəraya mütəvəccih oldular". Kəmali-qeyrət inani-ixtiyarın əlindən alıb, bir qətrə su içmədən səməndi-seylrəftarın canibi-xeyməgaha səddi-sipər edib yetdikdə gördü ki, ol avaz mən'i-ab üçün bir hiylə imiş, əmma müvafiqi-iradeyi-təqdir vaqe' olmuş. Zira ol gün şərbəti-şəhadət içmək müqərrər idi"[288].

*(Lənətə gəlmiş Şimr vəziyyəti belə gördükdə var gücü ilə bağırdı ki, siz ey Şam və Kufə qoşunu, amandır, amandır, Hüseynə bir damcı su içməyə imkan verməyin. Çünki özünün suya əli çatsa və atını suvara bilsə, bu cür ordu kimi min ordu onun qarşısında duruş gətirməz. O zaman isə indiyədək göstərdiyimiz bütün cəhdlər boşa çıxar.*

*Beləliklə, o haramzadənin təhriki ilə bütün qoşun hərəkətə gələrək, imam həzrətləri ilə Fərat çayı arasında pərdə əmələ gətirdi. Bu zaman imam həzrətləri düşmən üstünə yerimək üçün şahə qalxan atını cövlanə gətirərək odyağdıran qılıncını çəkib, döyüşə və vuruşa başladı.*

.................................

[288] *Füzuli. Əsərləri, VI cild, səh. 330-331*







*Beynəl-hərəmeyn. İki hərəm arası meydan. İraq. Kərbəla şəhəri*

*"Bu döyüş və vuruş poladla odun toqquşmasından çıxan qığılcım kimi idi. Belə ki, onun ildırım kimi çaxan qılıncından düşmənin təzə tökülən isti qanı damırdı. İmam düşmən qanından meydanda sellər əmələ gətirmişdi. Həmin sellərin köpüyü isə düşmən əsgərlərinin başları idi. İmamın qılıncının mayasında düşməni heç-puç etmə tufanının yaratdığı dalğalar, yayının kölgəsində isə əzabın ən müxtəlif növlərinin təzahürləri gizlənirdi. İmamın atının şahə qalxmasında gözün işığının sürəti vardısa, özünün meydanda etdiyi gözlənilməz yerdəyişmələrdə (taktiki gedişlərdə) yalnız yuxu sultanına xas olan ani hücumlar nəzərə çarpırdı. İmamın atı küləklər yaradan dağ qılıncı ilə buludlardan su içən şimşək idi. Qoy atına göylər, qılıncına da günəş qurban olsun!"*

*Şəhidlik meydanının o şahsuvarı və xoşbəxtlik ovlağının o toğrulu bacarıq atını hərarətlə tərpədərək igidlik qılıncını azğın düşmən əsgərlərinin qanına batıraraq o zülmkarların üç cərgəsini dağıdıb özünü Fərat çayına çatdırdı. O, bir nəhəng kimi Fəratın sularına girib əlinə su alıb içmək istədikdə bir kimsə ucadan səsləndi ki, "məgər indi su içmək vaxtıdır? Artıq pisniyyətli qoşun qız-gəlini soymağa yönəlmişdir".*



*Bunu eşidən imamın valideynlik və rəhbərlik qeyrəti büsbütün sərbəstlik cilovunu əlindən aldığı üçün o, bir damcı su içmədən sel kimi sürəkli atını çadırlara olan yerin qoruyucu səddinə çevirdi. Ancaq gəlib çatdıqda gördü ki, eşitdiyi o səs onun su içməsinin qarşısını almaqdan ötrü adi bir hiylə imiş. Bununla belə, həmin iş qəzavü qədərə uyğun baş vermişdi. Çünki o gün imam üçün şəhidlik şərbəti içmək Tanrı qatında qərarlaşdırılmışdı).*

"Hədiqətü-s-süəda"nın ən başlıca həyat həqiqəti olan su burada da aparıcı motivdir. Birbaşa baş qəhrəmanla bağlı olduğundan motivin bədii ifadəsi əsərin başqa yerlərindən daha təsirlidir. Bir yandan Şimri-ləini bar-bar bağırdan, bir yandan təkbaşına və köməksiz qalmış imamla dirilik qaynağı olan Fərat çayı arasında Yezid qoşununa canlı divar əmələ gətirən, bir yandan da "mövci-tufani-fəna" *(heç-puç etmə tufanının dalğaları)* deyimində igidlik nişanəsinə çevrilən məhz sudur. Fərat çayının canlı və görümlü təsviri də, bioloji tələbat olan adi su içmək istəyi də, hiyləgərlik çağırışı ilə gözdənsalma cəhdi də, suya tamarzılığın qabardılması da, atın itiyerişliliyinin belə su ilə bağlanılması da (mətndə: "səməndi-seylrəftar" – *sel kimi sürətli olan at),* ən nəhayət, "Tanrı təqdiri" anlayışının "mən'i-ab-şərbəti-şəhadət" *(su qadağası–şəhidlik şərbəti)* təzadının üzərində qurulması da predmetin bölümdəki bədii-estetik çəkisini ağırlaşdırır. Onu adi əşya olmaqdan çıxarıb kəskin və kəsərli ictimai faktora və ədəbi stimula çevirir.

Bu yüksək işləklik və çeviklik tezliyi "Hədiqətü-s-süəda"nın "Cənabi-Qasım" və "Həzrəti-Abbas" bölümlərini yada salır. Belə ki, əgər həmin bölümlərdə Kərbəla igidləri susuzluqdan əziyyət çəkərkən İmam Hüseynə (ə) arxalanırdılarsa, burada susuzluq onların haqlı olaraq sarsılmaz dayaq bildikləri bu ulu din böyüyünü sözün bütün anlamlarında yandırıb-yaxır, sinəsinə çarpaz oğul dağı çəkir, onu xırdaca körpələrin yanında əhli-əyal şərməndəsi edir.



Digər tərəfdən, Fərat çayına girməsinə baxmayaraq, qardaşı Abbasın (ə), qardaşı balalarının susuzluğunu anaraq su içmirsə, İmam Hüseyn (ə) əzəli-əbədi buyuruğun gerçəkləşməsi yönündə yenilməz bir qeyrət, namus fədaisi kimi son nəfəsində özünü sudan məhrum edir.

Parçanı orijinal edən cizgilərdən biri də şeirin nəsrin içindən çıxmışcasına təhkiyənin ayrılmaz, qorxmaz bir parçasına çevrilməsidir. Belə ki, Füzuli, öncəki bölümlərdən fərqli olaraq, burada döyüş səhnələrini nəsrlə yox, şeirlə verir və bununla da sanki öncəki bölümdə şeirin azlığının əvəzini çıxır. Odur ki, istər-istəməz həmin poetik mətnin bədii-estetik yükü üzərində ayrıca durmalı olursan.

Birincisi, şeir kifayət qədər iridir. Zənnimizcə, bu, Füzuliyə miqyas genişliyi yolu ilə gedərək keyfiyyət dəyişmələrini kəmiyyət dəyişmələri ilə tarazlamaq üçün gərək olmuşdur. Əgər belə olmasaydı, "polad və daş" təzadı, "şimşək-qılınc" istiarəsi, "qılınc-qan" və "qan damcısı-köpük" uyarlıqları əlvan və rəngarəng bədii ifadə vasitələri kimi belə incəliklə söz-sənət muncuğuna düzülməzdi.

İkincisi, şeirin kifayət qədər prozaik olması ötəri deyildir. Zənnimizcə, bu, əsərin sənədli-tarixi roman səpkisində yazılmasından irəli gəlmişdir. Azacıq diqqət etdikdə aydınca görürsən ki, qızğın döyüş meydanına və o meydanda at oynadan möhtəşəm qəhrəmana gərək olan nə varsa, hamısı şeirdə toplanmışdır. Məsələn, birinci misra qılıncların qalxanla toqquşmasını əks etdirdiyi halda, ikinci misrada qəhrəmanın təkliyi ilə düşmənin çoxluğu qarşılaşdırılır. Yaxud ikinci beytdə qəhrəmanın düşmən qanını su kimi axıdıb selə döndərməsi ənənəvi təsir elementləri ilə yox, sel üçün tamamilə təbii ünsür olan köpük predmetinin mətnə gətirilməsi kimi orijinal bənzətmə ilə ifadə edilir. Belə ki, Füzuli düşmən əsgərlərinin başlarının elə seltək axıdılan düşmən qanında bir andaca yaranıb itən köpük qədər dəyərsiz olduğunu bildirir. Bizcə, şair bu zaman Qurani-Kərimin zəngin təşbeh ehtiyatından



ustalıqla faydalanmışdır: “Allah göydən bir yağmur endirdi. Vadilər öz tutumlarına görə onunla dolub daşdı. (Sudan əmələ gələn) sel üstünə çıxan bir köpüyü alıb apardı. (Haqq din olan İslam insanlara, torpağa həyat verən suya, müşriklərin etiqadı isə boş köpüyə bənzər). Bəzək şeyləri və qab-qacaq düzəltmək məqsədilə insanların od üzərində qızdırıb əritdikləri (qızıl, gümüş və s. filizlərin) üstündə buna bənzər bir köpük vardır. Allah haqq ilə batili sizdən ötrü ayırd etmək üçün belə misallar çəkir. Köpük heç bir şey olmadığı üçün uçub gedər, insanlara fayda verən bir şey isə yer üzündə qalar. Allah belə misallar çəkir” *(“Rəd”, 17).*

Görünür, birbaşa bu şanlı ayədən ilham aldığına görədir ki, Füzuli təsviri beşinci misraya da ötürür. Belə ki, “Cövhəri-tiğində məzmun mövci-tufani-fəna” etik vahidinin birinci tərəfi yenə təkbaşına bütöv bir orduya qarşı duran qəhrəmanı, ikinci tərəfi isə düşmən əsgərlərinin öz qanları içində üzən kəsik başlarını göz önünə gətirir.

“Sayeyi-rəmhində müzmər şərhi-əhvali-əzab” misrasındakı “rəmih” sözü ilə Füzuli İmam Hüseynin (ə) döyüş meydanında məharətlə qılınc çalmaqla yanaşı, ustalıqla ox atdığını da ifadə edir. “Əzab” sözü qəhrəmanın oxlarının birinin belə boşa çıxmadığını göstərir.

Döyüş meydanını atsız təsəvvür etmək olmur. Füzuli də şeirdə imamın vəfalı atına ayrıca yer ayırmış, ona xüsusi rəğbətlə yanaşmışdır. “Cilveyi-rəxş” – *atın şahə qalxması, cövlanə gəlməsi,* “Rəxşi kuhi-badicünbüş” – *atı küləklər yaradan dağ* ifadələri bu rəğbətin bariz təzahürüdür. Elə buna görədir ki, Füzuli şeiri “Rəxşinə gərdün fəda” deyə göyləri qəhrəmanın atına qurban etməklə bitirir.

“Hədiqətü-s-süəda” boyu işlək və çevik olan “Tanrı təqdiri” anlayışı burada qabarıqdır. Bu, təkcə “təqdir və müqərrər” sözlərində leksem səviyyəsində qalmır, “bir kimsənə nida yetirdi” təhkiyəsi və “Ey Hüseyn, nə su içmək məcalidir, ləşkəri-bədxah qarəti-hərəmsərayə mütəvəccih oldular” xitabı ilə bir xeyli möhkəmləndirilir.





"Nida yetirən" kimsənin kim olması özlüyündə bəlkə də bir elə maraq doğurmaya bilər. Ancaq söhbət bəşəriyyətin ən kamil şəxsiyyətlərindən biri haqqında getdiyindən, zənnimizcə, bu ştrix də diqqətdən qıraqda qalmamalıdır.

Əski dini-əsatiri mətnlərdə belə hallar, adətən, iblis, şeytan, hatif, cin kimi qeyri-maddi məfhumlarla əlaqələndirilir. Məsələn, Uhud döyüşündə Rəsulullahın (s) mübarək dişi sındırılarkən kiminsə "Muhəmməd öldürüldü" deyə ucadan qışqırdığı nəql olunur. Qaynaqlar onun şeytan olduğunu bildirir. Gör bu nə qədər qorxulu bir hal olmuşdur ki, Yaradan bu barədə ayrıca ayə nazil etmişdir *("Ali-İmran", 144)*. Kərbəla döyüşündə "nida yetirən"in də şeytan olduğunu düşünmək olar. Belədə aydınlaşdırılmalı o cəhət qalır ki, görəsən, belə müqəddəs yerdə, belə həlledici məqamda şeytanın iştirakı "Tanrı təqdiri" anlayışı ilə nə dərəcədə uyğun gəlir.

İblis, şeytan, cin kimi qeyri-maddi anlayışların da bilavasitə Allah-taalanın qüdrət və hikməti daxilində olduğunu nəzərə aldıqda bu suala müsbət cavab verilməlidir.

Bəs "Tanrı təqdiri" anlayışının qəzavü qədər məfhumunun mahiyyəti nədən ibarətdir?

"Bəzi insanlar İslam terminlərini doğru anlamamış, Quran ayələrinin və Peyğəmbər (s) hədislərinin yozmasında səhvə yol vermişlər. Məsələn, *qəza və qədər, hidayət ayələri* və *zəlalət ayələri* kimi. Onlar belə təsəvvür etmişlər ki, bu, insanın azadlıq və ixtiyarı ilə uyğunlaşmayan məcburiyyət və məhdudiyyətdir. Biz bu mövzunu araşdırmaq niyyətində deyilik. Sadəcə olaraq, Quran ayələri və Quran terminləri arasında heç bir ziddiyyət və ixtilaf olmadığını qeyd edəcəyik. Quran ayələrinin bəzisinin digər ayələrlə ziddiyyət təşkil etdiyi anlaşılsa, gərək Quran deyil, fəhmimiz ittiham edilsin.

Bir nəfər şamlı İmam Əlinin (ə) yanına gələrək sual edir: "Şama gedişimiz Allahın qəza və qədəri deyilmi?" İmam Əli (ə) dərhal anlayır ki, sual verən şəxs qəza və qədərin mənasını səhv anlamış və onu insan azadlığı ilə uyğun olmayan bir məcburiyyət və məhdudiyyət kimi dərk etmişdir. İmam Əli (ə)



bu sorğuya çox uzun bir cavab verdi. O cavabdan: "Ey yazıq, sən qəzanın baş verməsini, qədərin hökmən olmasını gərəkli sayırsan. Belə olsaydı, savab və qəza batil olaraq, dinin aradan qaldırılması vacib hesab edilərdi. Halbuki nöqsan sifətlərdən münəzzəh olan Allah bəndələrini edəcəkləri əməllərində azad buraxmış və pisliklərdən çəkinmələrini bildirərək qadağa qoymuşdur. Həmin əmr və qadağalar isə bədənin ixtiyarını məhdudlaşdırmamış, qüdrətini yox etməmişdir. Onlara asan olanı tapşırmış, çətin olanı isə buyurmamışdır..."

"Qədər"in lüğəti mənası: hər bir şeyin həddi, miqdarı və qiymətidir.

"Qəza"nın lüğəti mənası: bir işin öz sahəsində mükəmməl və dürüst icra edilməsidir. Bunu məşhur dilçi Əhməd ibn Faris özünün "əl-Məqayis" adlı kitabında qeyd etmişdir.

Kuleyni İmam Əli ibn Musa Rzadan (ə) qəza və qədərin tərifini imamın bu sözləri ilə rəvayət edir: "Qədər: varlıq və yoxluğun planlaşdırılması və onun həddinin qoyulmasıdır. Qəza isə həmin şeyin qəti olaraq baş verməsidir".

**Deməli, qədər Allahın kainat və həyatda təyin etdiyi hədd, nizam-intizam, nişanə və qanunlardır.** Qəza isə bu nişanələrin, nizam-intizamın və qanunların həqiqətdə bir-biriylə uyğunluq təşkil etməsidir. İmam Əli (ə) buyurur: "(Allah) bizə göstərdiyi kamil tədbir əlamətləri və baş verməsi mütləq olan təqdir nişanələri ilə ağıllara, düşüncələrə əyan olmuşdur".

Əsbəğ ibn Nubatə rəvayət edir ki, Əmirəlmölminin Əli (ə) dağılmaq üzrə olan divarın yanından digər bir təhlükəsiz divarın yanına yerini dəyişərkən o həzrətə dedim: "Ey Əmirəlmölminin, Allahın qəzasından qaçırsan?" İmam Əli (ə) cavabında buyurdu: "Allahın qəzasından qaçıb, qədərinə sığınıram".

Əgər imam dağılmaq üzrə olan divarın yanında qalsaydı və divar dağılaraq imama zərər yetirsəydi, bu, qanunun icra edilməsi ilə Allah qəzasının bir nümunəsi olardı. Lakin imamın yerini dəyişməsi, insanın salamatlığını və himayəsini



təmin edən qanundan istifadə etməsi Allah qədərinin bir nümunəsidir”[289].

* * *

Əsərin “İmam Hüseyn” fəsli belə davam edir: “Rəvayətdir ki, Fərat kənarındən xeyməgaha yetincə qırx mübariz bıraxmışdı və nəqli səhihdir ki, həzrəti-imam xeyməgaha yetdikdə mükərrər xəvatini-hərəmsərayi-isməti hazır edib vəsiyyət tazə qıldı ki: “Ey əsmari-nihali-fütüvvət və ey əsçari-rəyahini-təharət, müsibət üçün mühəyya olun, əmma zinhar, camə çak edib muyi-gisu pərişan etmən və kəndünüzi mümkün olduqca naməhrəmdən nihan dutun”. Həzrəti-Zeynəlabidini bir dəxi bağrına basıb, yüzün yüzünə sürüb vida’ etdi. Şe’r:

Gəl ey həmdəm ki, cismimdə vida’ etməkdədir canım.
Tökər qanlar, anıb firqət bəlasın çeşmi-giryanım.
Bənim müşkül degil halım ki, qürbi-Həqq qılur hasil,
Qəmi-dünya əlindən qurtulur hala giribanım.
Səninçün ağlaram kim, edəcəkdir halını müztər,
Həm ə’da zülmü cövri, həm bənim ənduhi-hicranım.

Ey nuri-didə, təriqi-müsabirətdən inhiraf etmə ki, şimeyi-ənbiya və şiveyi-övliyadır. Yəqin ki, bu ibtila bizə nəsib olmaseydi, bizdən sonra zahir olan müsəlmanlara hər bəla nazil olduqda anı mövcibi-qəzəbi-İlahi təsəvvür edüb mə’yus olmaq müqərrər idi. Zəhi səadət ki, bəla bizim mülazimətimizdə məmduhi-əhli-həqiqətdir və vüqui-müsibət mövcibi-təsəlliyi-ətqiyayi-ümmət. Şe’r:

Bəlaya səbr edəlim, cövrə şükrlər qılalım
Ki, bu rəviş tələb əhlinədir təriqi-vüsul.
Cəmi’i-xəlqə bəla ehtiramı vacibdir,
Kim oldu əqrəbi-xüddami-Əhli-beyti-Rəsul.

.................................

[289] *Səffar H. “Nəhcül-bəlağə”də həyata baxış, Bakı, 2005, səh. 50-52*



Ey cigərguşə, Mədinəyə yetdikdə netə ki bən sənin səlamını sükkani-əhli-behiştə ilətərəm, sən dəxi bənim səlamımı anda olan əhibbavü əviddaya ərz edərsən"[290].

*(İmam Hüseyn (ə) Zeynəlabidin həzrətlərini (ə) bir də bağrına basıb, üzünü üzünə sürtərək vidalaşdı: "Gəl ey könül sirdaşım, gəl ki, ruhum bədənimlə vidalaşmaqdadır. Ağlar gözüm ayrılıq bəlasını xatırlayaraq qan ağlayır. Mənim halım müşkül deyildir. Çünki öz Tanrıma qovuşmağım çox yaxındır. Əksinə, yaxam dünyanın qəminin əlindən qurtardığı üçün mən bir az da sevinirəm. Mən sənə görə ağlayıram ki, həm düşmənin zülmü və cəfası, həm də mənim ayrılığımdan doğan kədər hər an səni dərdə-qəmə boğacaqdır.*

*Ey gözümün işığı, səbir yolundan çıxma ki, o, peyğəmbərlər və övliyaların yoludur. Bu bəla bizə üz verməsəydi, bizdən sonra gələn müsəlmanlara bir çətinlik üz verər-verməz, onu Allahın qəzəbinin təzahürü bilib mütləq yasa batardılar. Nə gözəldir, necə də xoşbəxtlikdir ki, bəla bizim xidmətimizdə haqsevərlərin öyücüsüdür və müsibətin üz verməsi ümmətin təqvalı şəxsləri üçün böyük təsəllidir.*

*Bəlaya səbir edək, əzab-əziyyətə şükür edək, çünki Allaha qovuşmaq istəyənlərin əsl yolu budur. Gərək bütün insanlar bəlanın hörmətini saxlasınlar. Çünki Peyğəmbər Əhli-beytinin ən yaxın sirdaşı o oldu.*

*Ey ciyərimin parası, mən sənin salamını cənnət əhlinin idarəedicilərinə çatdıracağım kimi, Mədinəyə çatdıqda sən də mənim salamımı oradakı dostlara yetirərsən!).*

İmamın imama tövsiyələri sırasında diqqəti səbrin peyğəmbər və övliyaların ən aparıcı keyfiyyəti olaraq təqdim edilməsi cəlb edir. Ötəri deyildir ki, Ulu Yaradan Şanlı Kitabında dəfələrlə istəkli Peyğəmbərinə səbirli olmağı tapşırır *("Nəhl", 127; "Müzəmmil", 10 və s.).* Həzrət Muhəmməd (s) öz Rəbbinin göstərişini canla-başla yerinə yetirmiş, dözümlü, dəyanətli ömür sürdüyü kimi, inci sözlərində də səbirlə bağlı

................................

[290]*Füzuli. Əsərləri, VI cild, səh. 331*





çox yararlı tövsiyələr vermişdir; məs.: “Səbir qurtuluşun açarıdır”, “Zəfər səbir edənindir”, “Səbrin imandakı yeri başın bədəndəki yeri kimidir” və s.

İmam Hüseynin (ə) tövsiyəsində diqqəti çəkən ikinci cəhət “bəla” anlayışına verilən yeni açıqlamadır. Bu açıqlamaya görə, “nazil olan bəla”nı “mövcibi-qəzəbi-İlahi təsəvvür et”mək olmaz. Çünki bu, yersiz məyusluq əmələ gətirib insanı fəal həyatdan geri qoyar. Buradan anlaşılır ki, canlı Quran olan İmam Hüseyn (ə) Kərbəla vaqeəsi kimi ən ağır müsibət zamanında belə öz ardıcıllarına kədər, ətalət, durğunluq aşılamaq istəmir.

İmamın vəsiyyətində “bəla” anlayışının dini-dünyəvi rəhbərlərə lazım olan bir başqa tərəfi də əksini tapmışdır. Bu tərəf “Əl-bəlau li-l-vila” – “bəla xas Allah dostlarına məxsusdur” (Həzrət Muhəmməd (s)) hədisində özünün səciyyəvi ifadəsinə qovuşmuşdur. Füzuli ədəbi məktəbinin ən layiqli davamçısı olan Seyid Əzim fürsət tapar-tapmaz bu anlayışı çox ustalıqla bədiiləşdirmişdir:

“Əl-bəlau li-l-vila” camilə mən məst olmuşam,
Cismü candan bak yox, dərdü bəladən dönmərəm!
Olmuşam ruzi-əzəl dərdü bəlayə aşina,
Get ki, ey biganə, mən ol aşinadən dönmərəm.

*(Mən “Bəla Allah dostları üçündür” qədəhini içib onun içindəki ilahi eşq şərabı ilə sərxoş olmuşam. Odur ki, indi mənim nə bədənimə görə qorxum var, nə də ruhuma görə. Çünki artıq bütün varlığım ən ağır sınaqlara hazırdır. Ona görə də mən əsla bəla yolundan geri dönən deyiləm. Axı ilk yaradılış günündən etibarən dərdlə, bəla ilə dostlaşmışam. Sən ey yad-yabançı kimsə, məndən əl çək ki, mən o dostdan dönmərəm).*





Şərabi-"Əl-bəlau li-l-vila"dən məst olan aşiq
Keçər Mənsurtək candan, bəlayi-dardən keçməz.

*("Bəla Allah dostları üçündür" şərabı ilə məst olan aşiq Həllac Mənsur kimi canından keçsə də, dar ağacı çırağından keçməz).*

İmam Hüseynin vəsiyyətinin üçüncü cəhəti "salam" anlayışının dünyəvi və üxrəvi tərəflərini ən ağır məqamda da qovuşdurması, bunun qaçılmazlığı haqda aydın sifariş verməsidir. Bu isə belə mötəbər məfhumun asanlıqla yox, məhz Allah dostu və mütəqqi kimi uca mərtəbələrə yüksəlməklə qazanıla biləcəyinə vurulmuş sərrast işarədir.

* * *

Əsər belə davam edir: "Bu halətdə Şəhrəbanu ol şəhriyarın damənin dutub ayıtdı: "Ey sərvəri-alimiqdar və ey seyyidi-büzürgvar, bən nəsli-Yəzdigird şəhriyaram. Həvadisi-əyyamdan sənin hüsni-himayətin pənah etmişdim. Hala vəhmüm andandır ki, zəmani-qeybətində bu zalimlər sayirxəvatini-Əhli-beytə övladi-Rəsul olmaqla hörmət edüb bana ihanət yetirələr. Bəni kimə təslim edərsən?" Həzrəti-Hüseyn ayıtdı: "Ey Şəhrəbanu, bu vasitədən dəğdəğə çəkmə ki, sən daxili-Əhli-beytsən və bu hisari-iffətdə sənə naməhrəm təərrüzü yetməz". Şe'r:

Pəri-Cibrildir divari-dövlətxaneyi-ismət,
Anın sükkaninə asib yetməz şərri-şeytandan.
Hərimi-qürbi-Əhli-beyt bənzər zövrəqi-Nuha,
Olan ol zövrəq içrə ehtiraz eylərmi tufandan?!

Və bir rəvayət dəxi oldur ki, həzrəti-imam Şəhrəbanuya vəsiyyət qıldı ki: "Bəndən sonra mərkəbim xeyməgaha gəlür, ol mərkəbə kəndüni möhkəm edüb inani-iradətin rayizi-qəzaya tapşur. Ol mərkəb səni badiyeyi-hövldən çıxarur". Və





Şəhrəbanu ol vəsiyyətə əməl edüb ol mərkəblə ləşkərgahdan çıxdı. Aqibətüləmri Allah bilür. Əmma əsəhhi-rəvayət oldur ki, Əhli-beytlə Şama getdi”[291].

*(Bu zaman Şəhrəbanu o şahın ətəyindən yapışaraq dedi: “Ey qədir-qiyməti uca olan rəhbər, ey böyük olan ağa, mən Yəzdigird şahının qızıyam. İndiyədək baş verən hadisələrdən yalnız sənin himayə qalana sığınmışdım. Ancaq indi qorxuram ki, sən həyatda olmadıqda bu zülmkarlar Peyğəmbər övladı olduqlarına görə digər Əhli-beyt xanımlarına ehtiram göstərdikləri halda, mənə əl uzatsınlar. Məni kimə tapşırıb gedirsən?” Hüseyn həzrətləri ona belə buyurdu: “Ey Şəhrəbanu, buna görə fikir çəkmə, çünki sən də Əhli-beytə daxilsən və bu namus divarı içərisində heç bir naməhrəm sənə əl uzada bilməz!*

*Xoşbəxt məsumluq evinin möhkəm və sarsılmaz divarı Cəbrayıl mələyin o qırılmaz qanadlarıdır. Odur ki, onun idarəedicisinə heç vaxt şeytanın şərindən sədəmə toxunmaz. Əhli-beytin özü və ona yaxın olanların əmələ gətirdiyi müqəddəs ocaq Nuhun gəmisinə bənzəyir. O gəminin içində olan kimsə də heç tufandan qorxub çəkinərmi?” Başqa bir rəvayətə görə, imam həzrətləri (ə) Şəhrəbanuya vəsiyyət etdi ki, mən qətlə yetirildikdən sonra atım xeyməgaha gələr, özünü möhkəm surətdə ona bağlayarsan və iradə cilovunu qəzavü qədərin razılığına tapşırarsan. O at mütləq səni qorxu və dəhşət səhrasından çıxaracaq. Şəhrəbanu da imamın vəsiyyətini yerinə yetirməklə onun atı vasitəsilə döyüş meydanından çıxa bildi. İşin sonunu yalnız Allah bilir. Ancaq ən dəqiq bilgi bundan ibarətdir ki, o, Əhli-beyt xanımları ilə birlikdə Şam şəhərinə aparılmışdır).*

Şəhrəbanu əhvalatını qətiyyən epizodik hissə saymaq olmaz. Çünki bu əhvalatdan ən azı imamın ona son dərəcə qayğı ilə yanaşdığı anlaşılır. Digər tərəfdən, əsərin başqa bölümləri kimi, burada da hicab tövsiyəsi aparıcı yer tutur. Ancaq əhvalatın ən diqqətçəkici yönü, zənnimizcə,

---

[291] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 332*





tarixilikdir. Belə ki, Füzuli hətta “Aqibətu-l-əmri Allah bilir” dedikdən sonra belə “Əmma əsəhhi-rəvayət oldur ki” deyə dəqiqləşdirmə aparır. Deməli, o, bir tarixçi kimi buna ciddi ehtiyac duymuşdur. Əgər Füzuli buna zərurət görmüşsə, deməli, nəyin bahasına olursa-olsun tarixilik prinsipindən geri çəkilmək istəməmiş, bu prinsipi gözləməyi özünün başlıca yaradıcı kredosu saymışdır. Bu isə bir daha sübuta yetirir ki, “Hədiqətü-s-süəda”nı sənədli-tarixi roman sayan ədəbiyyatşünaslar tamamilə haqlıdırlar.

* * *

Əsər belə davam edir: “Əlqissə, Həzrəti-Sultani-Kərbəla vəsiyyəti tamam olduqda mütəvəccihi-meydan olub bu məzmunla bir rəcəz ağaz etdi. Şe’r:

Gəldi ol dəm ki, dili-qəmnakımı şad eyləyəm,  
Mürği-ruhu damgahi-təndən azad eyləyəm.  
Gəldi ol dəm ki, bu möhnətxanəyi viran edüb,  
Qüds mülkünə binayi-işrət abad eyləyəm.  
Gəldi ol dəm kim, qılam dərgaha ərzi-halımı,  
Çeşmi-nəmnakü dili-qəmnakla dad eyləyəm”[292].

*(Xülasə, Kərbəla sultanı həzrətləri öz vəsiyyətini bitirib meydana girdi və belə bir rəcəz oxudu: “Qəmli-ələmli qəlbimi şadlandırmaq çağı gəlib çatdı. Artıq ruh quşumu bu bədən torumdan azad etmək çağıdır. Mən gərək indi bu möhnət evini yıxıb, o müqəddəs yurdda, axirətdə özüm üçün əzəli-əbədi bir səadət evi tikəm. Ən nəhayət, Ulu Yaradanın o uca dərgahına ürək sözlərimi yetirməyin əsl vaxtı gəlib çatmışdır. Axı mən nəmli gözlərimə yalnız qəmli qəlbimlə kömək edə bilərəm”).*

Adətən, rəcəzlər çox kəskin söz və ifadələr üzərində qurulub, təsəlli xitabdan ibarət olur. Ancaq imamın buradakı rəcəzi sırf ruhani mənəvi məzmunda olub, büsbütün özünün daxili aləminə yönəldilmişdir. İmam sanki çoxsaylı düşmən ordusunu görməmişcəsinə öz-özü ilə danışır, özü özünün

[292] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 332*







*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. İraq. Kərbəla şəhəri*

könlünü alır. *Dili-qəmnak, mürği-ruh, qüds mülkü, ərzi-hal, çeşmi-nəmnak* ifadələri bu, yaxud başqa ölçüdə bir könül ərinin ömrünün son anlarında yaşadığı dərin dəruni iztirablardan, mürəkkəb, ancaq mürəkkəb olduğu qədər də aydın duyğu və düşüncələrdən soraq verir. Hər beytin "Gəldi ol dəm" tərkibi ilə başlanması isə bu misra tellərini daha həzin titrədir, bu duyğu və düşüncə qalereyasını daha əlvan və rəngarəng edir.

* * *

Əsər belə davam edir: "Ol padişahi-qüdsisipah və ol sultani-ərşbargah zövqi-təqərrübi-dərgahullah ilə "Ənə'bnu Rəsulullahi (və ənə'bnə Əliyyun Vəliyullahu)" deyüb bir nə'rə urdu ki, ol sədadan cəmi'i-əczai-tərkibi-kainat mütəhəllil olub, fələki-dəvvar hərəkətdən mütəvəqqif və ərzi-sakin mütəzəlzil oldu. İbn Sə'd şahzadəyi ol səlabətdə görüb, ləşkəri bir-bir müharibə qılmaqdan mən' edüb, fəryad etdi ki: "Ey bixəbərlər, şücaəti-Mustəfa və səlabəti-Mürtəza və heybəti-Həsəni-Müctəba bu gün bu şəxsdə münhəsir olubdur. Həqqa ki, əgər cəmi'i-kainat bir surətə mütəşəxxis olub ana müqabil dursa, bir həmləsinə vəfa qılmaz və hala zəxmi-tiği-atəş və





*Beynəl-hərəmeyn. İki hərəm arası meydan. İraq. Kərbəla şəhəri*

cərahəti-müfariqəti-əhbab ana kargər olubdur. Cəmi'i-ləşkər ittifaqla həmlə qılub, tərəddüdün ziyadə qılun". Ol məl'unun əmriylə cəmi'i-ləşkər ittifaqla mütəvəccih olub şəhzadəyi araya aldılar və ol şiri-bişeyi-şücaət tiği-bərqasayla dideyi-idraki-bədxahı xirə qılub, hər canibə təvəccöh qıldıqca gərdi-nə'libadpayi-badiyəpeymasından ruzigari-ə'da tirə olurdu"[293].

*(O müqəddəs ordunun hökmdarı və məqamı ərş olan o böyük sultan Tanrı qatının yaxınlıq zövqü ilə, "Rəsulullah və Əliyyən Vəliyyullah övladı mənəm!" deyərək elə bir nərə çəkdi ki, kainatın bütün tərkib hissələri əridi, durmadan dövr edən fələk hərəkətdən qaldı və həmişə sükunətdə olan Yer kürəsi zəlzələyə düşdü.*

*Şahzadənin bu heybətini görən ibn Səd qoşuna İmam Hüseynlə (ə) bir-bir döyüşməyi qadağan edib, var gücü ilə qışqırdı ki, ey xəbərsizlər, Mustafa igidliyi, Mürtəza siqləti və Müctəba heybəti bu gün bu şəxsdə bir araya gəlmişdir. Əgər bütün kainat bir insan şəklini alıb, onunla qarşı-qarşıya gəlsə,*

.................................

[293] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 332-333*



*bircə həmləsinə də dözməz. Nə qədər ki susuzluq qılıncının vurduğu yara və dostlarının ayrılığının açdığı dərin mənəvi ağrı-acı ona böyük təsir göstərməkdədir, hamılıqla hücum edərək əhvali-ruhiyyəsini bir az da korlayın!*

*O lənətə gəlmişin göstərişi ilə bütün qoşun səfərbər olaraq birlikdə şahzadənin ətrafını bürüdü. O igidlik meşəsinin şiri şimşək kimi qılıncından saçdığı şüalarla öz bədxahlarının dərrakə gözünü kor edib, döndüyü hər səmtdə durmadan yeri eşələyən yel qanadlı atının nalının altından qopan toz-torpaqla düşmənin gününü qara edirdi).*

Parçanın ən çox diqqətçəkən cəhəti "zövqi-dərgahi-Rəsulullah ilə" tərkibində əksini tapmış ilahi məhəbbət anlayışıdır. Zahirən "İman gətirənlərin Allaha məhəbbəti çox olar" *("Bəqərə", 165)* ayəsindən qaynaqlanan bu anlayış, əslində, burada olduqca dolğun və tutumludur. Çünki məfhum istər *qüds, ərş, nərə, kainat, fələki-dəvvar, ərzi-sakin* kimi genişmiqyaslı söz və ifadələrlə, istərsə də həmin leksemlərin bildirdiyi bir-birindən dərin məzmunlu obrazlarla əhatə edilmişdir. Ancaq bu şəbəkənin ən parlaq incisi qəhrəmanın "Ənə'bnu Rəsulullahi (və ənə'bnə Əliyyun Vəliyullahu)" hayqırtısıdır. Çünki Füzulinin sonuncu Peyğəmbərə dediyi:

Sən bildirdin ki, kimdir Allah.
Sənsiz kim olurdu ondan agah? –

beytində olduğu kimi, burada da Peyğəmbər (s) və Əhli-beyt gizli tövhid əqidəsinin aşkar təzahürü yerindədir. Ötəri deyildir ki, Həzrət Mühəmməd (s) bir neçə dəfə buyurmuşdur: "Mən və Əli bu ümmətin atalarıyıq!"

Əsər belə davam edir: "Rəvayətdir ki, bir dəxi ol ləşkəri paymali-rəxşi-himmət qılub səməndi-badrəftarın Fərata yetürdi və daiyə qıldı ki, bir qətrə su içüb təskini-hərarət verə. Ətəşi-mütəhhərat və ətfal yadına gəlüb tərki-müddəa qıldı. Və





bir rəvayət dəxi oldur ki, bir miqdar su içmək tədarükündə ikən Hüseyr bin Təmimi bir ox atub, ol ox zəxmiylə ləbü dəndani-mübarəkin məcruh edüb su içmək müyəssər olmadı”[294].

*(Belə bildirilir ki, imam bu qoşunu özünün himmət atı ilə bir daha ayaqlayaraq yel yerişli atını Fərat çayına çatdırdı və istədi ki, bir damcı su içib susuzluq odunu söndürsün. Xanımların və uşaqların susuzluğunu xatırladığından bu istəyindən əl çəkdi. Başqa bir bilgiyə görə isə, azacıq su içməyə hazırlaşarkən Hüseyr bin Təmim bir ox atdı və mübarək ağzı yaralandığı üçün imama su içmək qismət olmadı).*

Bununla üçüncü dəfədir ki, imam Fərat çayına gedib çıxa bilsə də, su içə bilmir. Əlbəttə, Füzuli bir nasir kimi hər üç hala uyğun səbəb göstərir. Ancaq bizcə, bu səbəblər, əslində, “hüsni-təlil” – *səbəb ola-ola yeni səbəb göstərmə* bədii ifadə vasitəsi olub, İmam Hüseynin (ə) əzəli-əbədi taleyinin çox incə bir biçimdə qələmə alınmasıdır. Bu isə, adətən, poeziya üçün xarakterik olan bir fiqurun nəsrlə verilərək, orijinal və novator yaradıcılıq yolunun izlənilməsidir.

* * *

Əsər belə davam edir: “Əlqissə, ləşkəri-ə’da hücum edüb gəldikcə ğülüvvi-müxalif ziyadə olub və və’deyi-şəhadət müqaribət qılub zəxmlərindən çeşmə-çeşmə qanlar getməklə şəhzadəyə zə’f qalib oldu. Rəvayətdir ki, ol həzrətin yetmiş iki zəxmi olub, səməndi-səbükseyri dəxi kəsrəti-zəxm və ifrati-ətəşdən süst olub asari-təzəlzül zahir oldu. İbn Sə’d şəhzadənin zə’fi-halın mülahizə qılub qətlinə iqdam etdikdə həzrət ol bədbəxtə qəhrlə baxub ayıtdı: “Ey zalim, bu əmri-qəbihə sənmi iqdam edərsən?” Ol bədbəxt infial olub gerü döndükdə Şimri-bədbəxt piyadələrə buyurdu ki, ətrafü cəvanibin dutub tirbaran edələr. Yenə şəhzadə bir həmlə qılub, anların səfin sındırub bir mövze’də qərar dutdu. Rəvayətdir ki, ol bədbəxtlərdən bə’zi mübaşiri-qətli-Hüseyn olub, bə’zi mütəvəccihi-nəhbi-Əhli-beyt oldular. Həzrəti-imam ol ha-

[294] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 333*





lətdən vaqif olub ayıtdı: "Ey Ali-Əbu Süfyan, tutalım ki, sizdə iman əsəri yoxdur, barı qaideyi-namusi-cahiliyyəti ki lazimeyi-cibilliyyətinizdir, tərk etmək nə münasibdir ki, qəsdi-əvrat edərsiz? Əgər məqsudiniz bənim qətlim isə, ol müddəa bəndən müyəssərdir". Şimri-məl'un ayıtdı: "Ey Hüseyn, bu iltimasun qəbul edəriz". Pəs ləşkəri təərrüzi-Əhli-beytdən mən' edüb mübaşiri qətli-Hüseyn oldu"[295].

*(Xülasə, düşmən qoşunu hücuma keçdikcə sıraları artırdı, odur ki, imamın şəhidlik çağı anbaan yaxınlaşırdı. Çünki imamın yaralarından qan bulaq kimi axıb tökülürdü və o, durmadan zəifləyirdi. O həzrətin yetmiş iki yarası var idi və iti yerişli atı da yaralarının çoxluğundan və susuzluğun şiddətindən süstləşmişdi. Odur ki, o biçarə heyvan artıq döyüş həngaməsinə tab gətirə bilmirdi.*

*Şahzadənin durmadan zəiflədiyini görən ibn Səd onu qətlə yetirmək istədikdə həzrət o bədbəxtə acıqla baxaraq dedi: "Ey zülmkar, bu murdar işi sənmi edəcəksən?" O bədbəxt xəcalət çəkərək geri qayıtdıqda bədbəxt Şimr piyada əsgərlərə buyurdu ki, imamın dörd dövrəsini alaraq onu oxa tutsunlar. Ancaq yenə də imam bircə həmlədə onların sırasını dağıdaraq özü üçün münasib döyüş mövqeyi tutdu.*

*Bizə gəlib çatan məlumatlara əsasən, düşmən qoşununun bəzi sıra nəfərləri Hüseynin (ə) qətli üçün hazırlaşırdı, bəziləri də Əhli-beytin çadırlarını qarət etməyə yönəldi. Bundan xəbər tutan imam uca səslə dedi: "Ey Əbu Süfyan nəsli, tutaq ki, sizdə imandan heç bir əsər-əlamət yoxdur, barı yaradılışınızda olan cahiliyyət dövrünün namus qaydalarını tərk etməyin və heç olmazsa, arvad-uşağın qəsdinə durmayın! Məqsədiniz məni öldürməkdirsə, mən bunun üçün sizə şərait yaradaram, buna hazıram!" Lənətlənmiş Şimr dedi: "Ey Hüseyn, bu xahişini qəbul edərik, nəzərə alarıq". O, bu sözləri deyib qoşunu Əhli-beytin üzərinə getməkdən çəkindirdi və Hüseynin qətlinə hazırlaşdı).*

.................................

[295] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 333*





Parça əsərin ən tutumlu bölümlərindəndir. Belə ki, burada həm personaj bolluğu vardır (məs.: ibn Səd, Şimr, düşmən qoşununun piyadaları, Zülcənah, Əhli-beyt və s.), həm də bir-birindən əlvan və rəngarəng obrazlı deyim tərzi mətnə hakim kəsilmişdir (Məs.: "zəxmlərindən çeşmə-çeşmə qanlar getməklə", "ol bədbəxt infial olub, geri döndükdə" və s).

Ancaq mətn bütün incəlikləri ilə birlikdə vahid bir orqanizmdir. Odur ki, onu bu, yaxud başqa yöndə təsnif edib tikə-tikə doğramaq, əslində, möhtəşəm vaqeəyə də, bitkin Füzuli sözünə də laqeydlik olardı.

Səriştəli oxucunun yaxşı yadındadır ki, ibn Səd əsər boyu ən müxtəlif məqamlarda görünən, hər dəfədə çox asanlıqla bu olub-qalan imanını keçici dünya malına satan çürük əqidəli bir şəxsdir. Onun bu xarakteri burada da özünü göstərir. Belə ki, o, bir yandan İmam Hüseynin (ə) son dərəcə zəiflədiyini görərək, üstünə ayaq alıb onu qətlə yetirmək istəyirsə, o biri yandan imamın ona acıqla baxmasından az-çox çəkinərək bu murdar fikrindən dönür. Dərindən diqqət yetirdikdə görməmək olmur ki, imam (ə), əslində, ibn Sədi əzəli-əbədi cəhənnəm odundan qorumaq istəyir. Yoxsa imamın ona dediyi sözlərə heç cür məna vermək olmaz.

Yenə də səriştəli oxucunun gözündən yayınmayacaqdır ki, Şimr ibn Sədlə müqayisədə daha qəddar, daha sərt təbiətə malikdir. Ötəri deyildir ki, o, yalnız İmam Hüseynin (ə) cahiliyyət dövrü haqqındakı olduqca kəskin və kəsərli sözlərindən sonra azacıq rəhmə gəlir və öz adamlarını Əhli-beyt xanımlarını qarət istəyindən döndərir. Füzuli qələminin bütün gücünü işə salaraq İmam Hüseynin yana-yana söylədiyi sözlərə son dərəcə böyük təsir qüvvəsi aşılamış, ulu bir sərkərdənin, əlçatmaz-ünyetməz bir din böyüyünün son nəfəsində əl atdığı son cəhdi də dərin ağrı hissi ilə ifadə etmişdir. Gəlin bir də oxuyaq: "Ey Ali-Əbu Süfyan, tutalım ki, sizdə iman əsəri yoxdur, barı qaideyi-namusi-cahiliyyəti ki lazimeyi-cibilliyyətinizdir, tərk etmək nə münasibdir ki, qəsdi-əvrat edərsiz? Əgər məqsudiniz bənim qətlim isə, ol müddəa bəndən müyəssərdir!"





* * *

Əsər belə davam edir: “Rəvayətdir ki, ol kəmali-zə’flə tiği-abdarından ehtiraz edüb, qətlinə kimsənə iqdam edə bilməzdi. Aqibət iraqdan tirbaran etdilər. Həzrəti-imam gördü ki, cövlan etməgə qüdrət yox, naçar mərkəbdən enüb piyadə oldu ki, mərkəbinə tirbarandan zərər yetməyə, zira yadigari-Mustəfa və Mürtəza olub mükərrəm və möhtərəm idi. Ol bədbəxtlər həzrəti-imamı piyadə görüb, dilbir olub qətlinə mütəvəccih oldular. Əsnayi-mə’rəkədə bir lə’in ol afitabi-övci-səadətin cəbini-mübarəkinə bir ox urub məcruh [etdi]. Həzrəti-imam ol navəki-xunfəşanı çəküb, cəbini-mübarəkindən məhasini-şərifinə qanlar rəvan olub xəzab olduqda mübarək əliylə rüxsarinə sürüb mübahat edərdi ki: “İnşallah, bu rənglə cəddim xidmətinə müşərrəf oluram”. Və bu halətdə qibləyə mütəvəccih olub və bargahi-qürbi-Mə’buda yüz dutub müntəziri-şəhadət oldu. Şe’r:

Şəm’i-həyata sübhi-əcəl verdi iztirab,
Mülki-vücuda seyli-ədəm saldı inqilab.
Gülzari-ömrə qıldı əsər sərsəri-xəzan,
Dəsti-zəmanə rişteyi-ümmidə verdi tab.

Rəvayətdir ki, ol sərvi-riyazi-şəriət sərsəri-hücumi-ə’da və seyli-sihami-əşqiyayla mərkəbdən düşüb bixud olduqda münafiqlər bir-bir, iki-iki qəsdi-qətl edüb müqabilinə gəldikdə rüxsari-mübarəkin görüb, şərm edüb tə’xir edərlərdi. Şe’r:

Tökmək övladi-Rəsulun qanını asan degil,
Ol səbəbdən kim, bu qan hər qana bənzər qan degil”[296].

*(Rəvayətə görə, imamın tam zəiflik içində olmasına baxmayaraq, iti qılıncından çəkindikləri üçün kimsə onu qətlə yetirməyə cəsarət etmirdi. Odur ki, məcbur olub onu uzaqdan*

[296] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 333-334*





*oxa tutdular. Cövlanə gəlməyə gücünün yetmədiyini görən imam həzrətləri çarəsiz qalıb atından enərək piyada oldu ki, atı atılan oxlardan zərər çəkməsin. Axı bu at Mustəfa və Mürtəzadan yadigar qaldığı üçün əziz və hörmətli idi.*

*İmam həzrətlərini (ə) atsız görən o bədbəxtlər cəsarətə gəlib daha ürəklə onun qətlinə hazırlaşdılar. Bu gərgin zamanda bir məlun o xoşbəxtlik ucalığının günəşinin mübarək alnına bir ox vurmaqla onu yaraladı. Həmin qansaçan oxu alnından çəkib çıxaran imam həzrətləri qanın mübarək alnından şərafətli saqqalına axdığını və üz-gözünü qırmızıya boyadığını gördükdə qanı əli ilə üzünə sürtüb öyünürdü ki, "inşallah, babam Peyğəmbərin qulluğuna belə qalibiyyət rəngi ilə getmək şərəfinə nail oluram".*

*O, bu vəziyyətində üzünü qibləyə çevirərək və yeganə ibadətə layiq olan Allah-taalanın yaxınlıq dərgahına üz tutaraq özünün şəhidlik anının gəlib çatmasını gözləməyə başladı.*

*"Ömrün əcəl sübhü dirilik şamını titrətməyə başladı. Yoxluq seli varlıq malikanəsində dəyişiklik törətdi. Başıpozuq payız yeli ömür çəmənliyinə qış şaxtası gətirdi. Zamanənin əli ümid sapına düyün saldı".*

*Belə yazırlar ki, şəriət bağında ucalan o sərv düşmən hücumunun və quldurcasına olan təzyiqin nəticəsində atından yıxılaraq şüurunu itirmək üzrə olduqda münafiqlər bir-bir, iki-iki qətlinə niyyət edib irəli çıxdıqları zaman mübarək camalını görər, utanar və fikirlərindən daşınardılar.*

*"Axı Peyğəmbər balalarının qanını axıtmaq asan deyildir! Çünki bu qan heç bir qana bənzəməyən müqəddəs, mübarək bir qandır!").*

Bu bölüm də özünəməxsus cizgiləri ilə seçilir. Belə ki, düşmən qoşununun qorxaqlığının daha bir yığcam ştrixi ilə başlanıb, qəhrəmanın öz atına verdiyi böyük dəyərlə bağlı, qarşı tərəfin ayrı-ayrı sıra nəfərlərinin miniksiz və silahsız qalmış və gücdən, taqətdən düşmüş qəhrəmana olmazın əzab və işgəncə verməsi ilə əlaqədar, qəhrəmanın ilahi "Sidqətullah" –



*Allah rəngi ("Bəqərə", 138)* eşqi ilə bu əzab və işgəncəyə olduqca dərin dini-fəlsəfi məzmun bəxş etməsi haqqında, ən nəhayət, qanın qılınca qalib gəlməsi barəsində lakonik, ancaq sərrast təsvir elementləri ilə davam edir. Şair fikirlərini vahid müstəvidə və eyni qayə ətrafında topladığından həmin elementlər mətnin ideya-bədii təbiətinin ayrılmaz parçasına çevrilmiş, vaqeənin zirvə nöqtəsinə layiq bir komponent ola bilmişdir. Parçada iki şeirin yer almasının da başlıca səbəbi elə budur.

Birinci şeir qəhrəmanın "Qibləyə mütəvəccih ol"ması və "Barigahi-qürbi-Mə'buda yüz dut"ması bilgiləri üzərində qurulduğundan imamın burada "müntəziri-şəhadət ol"ması özünün bütün aydınlığı və genişliyi ilə görünür. Odur ki, poetik mətndəki ənənəvi ifadələr (məs. *şəm'i-həyat, sübhi-əcəl, mülki-vücud, seyli-ədəm* və s.) novator anlam çalarları alaraq istər İmam Hüseyn şəxsiyyətinin, istərsə də vaqeənin fəci siqlətinin parlaq obrazlarına çevrilir. Belədə "iztirab, inqilab, verditab" nəticələri ictimai-siyasi məna qazanaraq müvafiq surətdə müsəlman cəmiyyətinin, İslam dövlətinin və insan mənəviyyatının gözgörəsi və bilərəkdən özülündən dağıdılıb məhvə uğradılmasına vurulmuş kəskin işarə və edilmiş kəsərli etiraz səciyyəsi alır. Ancaq Füzuli ikinci şeirdə bu fikirlərini simvolikadan xilas edərək birbaşa və birmənalı olaraq ifadə edir ki, bu da şairin Yezid idarə üsulunun murdar və idbar üzünə çəkdiyi sarkazm şilləsi təsiri bağışlayır.

* * *

Əziz və istəkli oxucu, monoqrafiya boyu mən özümlə bağlı yalnız birinci şəxsin cəmində danışmışam. Ancaq indi – İmam Hüseyn (ə) ağanın ömrünün son anlarının dözülməz təsviri zamanı özümə "biz", sənə də "siz" deyə bilmirəm. Qorxuram ki, belə etsəm, bu, Füzulinin qan ağlayan qələminin xətrinə dəyər. Sözün düzü, burayadək nə təhlil aparılıb, aparılıb. İmam Hüseyn ağanın ömrünün son anlarının Füzuli qələminin parlaq ifadəsi ilə səni üz-üzə qoymaq istəyirəm. Qoy bizim





duyğu və düşüncələrimizi Füzuli qələminin yazdığı qanlı sətirlər oxşasın və bir daha bizi İmam Hüseynə (ə) və tərəfdarlarına, Kərbəla şəhidlərinə əzadar və təziyədar olmaq şərəfinə çatdırsın.

Əsər belə davam edir: "Aqibətuləmr Şimri-lə'in gördü ki, ləşkər ol həzrətin qətlində tə'xir edərlər, fəryada gəldi ki: "Ey bihəmiyyətlər, bu nə tə'xirdir?" Dər'ə bin Şəriki-bidövlət gəlüb ol həzrətin saidi-mübarəkin məcruh etdi və Sinan bin Ənəs kətfi-mübarəkinə bir ox urub, ol iki zəxmdən şəhzadəyi-aləm ixtiyarsız düşüb, xaki-Kərbəlaya təzəlzül buraxdı və ol vaqeədən sükkani-təhtüssəradan Sürəyyaya ğülğülə çıxdı. Dövrani-fələk sərasimə olub derdi ki: "Aya, bu nə əmri-qəbihdir?" Və daireyi-zəman iztiraba düşüb təəssüf çəkərdi ki: "Aya, bu nə zülmi-sərihdir?" Əlqissə, Xəvl bin Yezidi-Əshəbi və anın fərzəndi Şibl bin Yezid ittifaqla piyadə olub, ol sərəfrazın səri-mübarəkin bədəni-şərifindən cüda qılmaq qəsdinə mütəvəccih oldular. İqdam etdikdə məhabət müstövli olub müyəssər olmadı"[297].

*(Ən nəhayət, məlun Şimr gördü ki, qoşun həzrəti qətlə yetirməkdə tərəddüd keçirir, qışqırdı ki, ey bacarıqsızlar, axı bu nə tərəddüddür!*

*Əbədi səadətdən birdəfəlik uzaq düşmüş Dərə bin Şərik Qəribi imamın mübarək qolunu yaraladı, Sinan bin Ənəs mübarək çiyninə bir ox vurdu. Şahzadə bu iki yara nəticəsində şüurunu itirərək yerə yıxıldı və Kərbəla torpağını titrətdi.*

*Bu faciəyə görə dünyanın yeraltı idarəçilərindən Sürəyya ulduzunadək ah-vay sədası yüksəldi. Fələkin dövranı başını itirərək deyirdi ki, bu nə pis işdir? Zamanın dövretməsi iztirab içərisində təəssüflənirdi ki, yaxşı, bəs bu nə açıq-aşkar zülmdür?*

*Xülasə, Xəvli bin Yəzid Əshabi oğlu Şibli bin Yəzidlə birlikdə atdan enərək o başı uca imamın mübarək başını şərafətli bədənindən ayırmaq istədilər. Ancaq onlar bu iyrənc əməllərini həyata keçirmək istədikdə imamın heybəti onların bütün varlıqlarını bürüdüyündən bu onlara qismət olmadı).*

.................................

[297] *Füzuli. Əsərləri, 6 clddə, VI cild, səh. 334*





* * *

"İsmail Buxaridən nəqldir ki, şahzadə düşdügü saətdə ibn Sə'd əmriylə bir mübariz anın qətlinə iqdam etdikdə həzrəti-imam ayıtdı: "Ey fəqir, bənim qatilim sən degilsən, bu əmri-qəbihə iqdam etmə. Heyifdir ki, atəşi-duzəxə giriftar olasan". Ol mübariz giryan olub ayıtdı: "Ya ibn Rəsulullah, bu halətdə sən hənuz bizə rəhm edirsən, Əhli-Həqq olduğuna şəkküm qalmadı". Ol mübariz biməhaba əlindəki tiği müraciət qılub ibn Sə'də həvalə qıldı. Mülazimlər hər tərəfdən mane olub, ana zəxmlər urub, ol yeganeyi-zəman bədəni-məcruhla həzrəti-imam hüzurinə gəlüb ayıtdı: "Ya Hüseyn, sənin üçün bəni şəhid edirlər". Həzrəti-imam ayıtdı: "Mücahidlər əməli zaye' olmaz"[298].

*(İsmayıl Buxari nəql edir ki, şahzadə atdan yerə yıxılanda bir döyüşçü ibn Sədin buyuruğu ilə onu öldürmək istədikdə imam həzrətləri ona belə buyurdu: "Ay yazıq, mənim qatilim sən deyilsən. Odur ki, bu pis işi görmə, heyifsən, cəhənnəm odunda yanmayasan!" Həmin döyüşçü imamın bu sözlərindən ağladı və belə dedi: "Ey Tanrı Elçisinin nəvəsi, sən hətta bu vəziyyətində də bizə mərhəmət göstərirsən. Sənin Allah adamı olduğuna heç bir şəkk-şübhəm qalmadı". Bunu deyən həmin döyüşçü əsla qorxu-hürkü hiss etmədən geriyə çevrilərək əlindəki qılıncı ibn Sədə tərəf çevirdi. Mühafizəçilər tez özlərini yetirərək ona mane oldular və onu bədəninin müxtəlif yerlərindən yaraladılar. Belə nadir cəsarət yiyəsi yaralı bədənlə imam həzrətlərinin hüzuruna gələrək dedi: "Ya Hüseyn, sənin üstündə məni şəhid edirlər". İmam həzrətləri buyurdu: "Mücahidlərin əməli heç vaxt puça çıxmaz!").*

* * *

"Əlqissə, hər tərəfdən tiğlər çəküb Yezidin ən'amü iltifatı ümidinə ol əmri-qəbihə iqdam edərlərdi. Əmma kimsənəyə bu şəqavət müyəssər olmayub, iki kimsənəyə münhəsir oldi: biri Sinan bin Ənəs və biri Şimri-Zilcövşən. Sinani-bədbəxt

[298] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 334-335*







*İmam Hüseyn (ə)-ın müqəddəs məzarının yerləşdiyi məscidin həyəti (namaz vaxtı). İraq. Kərbəla şəhəri*

istədi ki, ol əmrə mübaşirət qıla, Şimri-bidövlət sibqət edüb ol həzrətin sineyi-bikinəsinə qədəm basdı. Həzrəti-imam göz açub dedi: "Ey bədbəxt, sənə kim derlər?" Dedi: "Bən Şimri-Zilcövşənəm!" Həzrəti-imam ayıtdı: "Daməni-zireh çehreyi-napakindən götür, səni görəyim". Ol bədbəxt daməni-zireh rəf' edüb, çehreyi-napakini göstərdikdə həzrəti-imam gördü ki, dişləri xinzir dişləri kibi dəhani-pəlidindən dışra çıxmış. Dedi: "Sədəqə-Allah və sədəqə-Rəsulullah, bu, bir nişanədir". Zira vaqiəsində Həzrəti-Rəsul qətlindən xəbər verüb və'deyi-qətlin müqərrər etmişdi. Dedi: "Ey Şimr, bənim qətlim sənə müqəddər olubdur, əməlində təqsir etmə. Əmma, ey Şimr, bu vəqt nə vəqtdir və bu gün nə gündür və bu ay nə aydır?" Şimr ayıtdı: "Məhərrəm ayıdır, cümə günüdür və nəmaz vəqtidir". Həzrəti-imam ayıtdı: "Ey zalim, bunun kibi şəhri-həram və ruzi-cəm'iyyət və vəqti-nəmaz ki, xütəbayi-İslam və rüusi-mənabirdə cəddim övsafın bəyan edərlər və übbadi-xəvasü əvam mütəvəccihi-dərgahi-Mə'bud olub ədayi-ibadət qılurlar, sən nişə bu əmri-qəbihə iqdam edərsən? Barı, ey Şimr, köksüm üzərindən durub bir miqdar möhlət ver ki, bən dəxi ləbi-təşnə



ilə nəmaza məşğul olayım və çün nəmazda ikən şəhid olmaq bana mirasdır, bən dəxi ol səadəti bulayım".

Şimri-bədbəxt ol həzrətin sinəsindən durub və ol həzrətdə bir miqdar qüdrət var idi ki, oturub qibləyə mütəvəccih olub nəmaza iştiğal etdi"[299].

*(Xülasə, düşmən qoşununun sıra nəfərləri dörd bir yandan qılınc çəkməklə Yezidin mükafat və lütfü ümidi ilə bu iyrənc əməllərini yerinə yetirməyə çalışırdılar. Ancaq belə murdar və azğın iş yalnız iki nəfərə qismət oldu. Onların biri Sinan bin Ənəs, digəri isə Şimri-Zilcövşən idi.*

*Bədbəxt Sinan öz çirkin niyyətini gerçəkləşdirmək üçün cəhd göstərdikdə səadətdən əbədi olaraq uzaq düşmüş Şimr onu qabaqlayaraq bu həzrətin ümmətə kindən, nifrətdən uzaq olan pak sinəsinin üstünə ayaq qoydu. İmam (ə) həzrətləri gözlərini açıb soruşdu: "Ey bədbəxt, sənin adın nədir?" O, "Mən Şimri-Zilcövşənəm" deyə cavab verdi. İmam həzrətləri buyurdu: "Murdar sifətindən zirehi uzaqlaşdır ki, səni görə bilim". O bədbəxt zirehi kənarlaşdıraraq murdar sifətini göstərdikdə, imam (ə) həzrətləri gördü ki, dişləri donuz dişi kimi murdar ağzından kənara çıxmışdır. Buyurdu: "Peyğəmbər (s) tamamilə doğru buyurmuşdur!" Axı Peyğəmbər (s) həzrətləri yuxusunda imamın qətlindən xəbər verərək bunun nə zaman baş verəcəyini bildirmişdi.*

*İmam buyurdu: "Ey Şimr, mənim qətlim sənin əlindədir. Odur ki, öz işində möhkəm ol. Ancaq, ey Şimr, bu vaxt hansı vaxt, bu gün hansı gün, bu ay hansı aydır?" Şimr cavab verdi: "Məhərrəm ayıdır, cümə günüdür, namaz vaxtıdır". İmam (ə) həzrətləri buyurdu: "Ey zülmkar, İslam xətiblərinin minbər üzərində babam sonuncu Peyğəmbərin (s) əlçatmaz-ünyetməz məziyyətlərindən danışdıqları və bütün Allah bəndələrinin o bir olan Məbudun Uca qatına üz tutaraq özlərinin bəndəlik borclarını yerinə yetirdikləri belə şərəfli ayda, gündə və vaxtda axı sən niyə bu pis işi görürsən? Ey Şimr, barı sinəm*

................................

[299] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 335*





*üstündən qalx və bir az möhlət ver ki, mən də susuzluqdan cadar-cadar olmuş dodaqlarımla namaz qılım. Axı namazda ikən şəhid olmaq atamdan mənə miras qalmışdır. Qoy mən də o xoşbəxtliyə qovuşum!"*

*Bədbəxt Şimr imamın (ə) sinəsi üstündən qalxdı. İmamın (ə) bir qədər qüvvəsi qalmışdı. Odur ki, o, var gücünü toplayıb oturaraq üzünü qiblə səmtinə çevirdi və namaz qıldı).*

* * *

"Ol vəqt bir vəqt idi ki, sultani-sərapərdeyi-tarəmi-çarüm sihami-şüain xarü xaşaka urub, parə-parə qılub və şəmşiri-şə'şəəsin kuhsara çalmaqdan sındurub zəvala mütəvəccih olmuşdu. Və xütəbayi-ümmət minbərə çıxub "İnnə'llahə yə'muru bil-ədli və'l-ihsani və itai zi'l-qurba və yənha əni'l-fəhşai və'l-münkəri və'l-bəğyi yə'izu kum lə'əlləkum təzəkkərun" moizəsin zalimlərə ilqa qılub və müəzzin minarələrdən "İnnə'l-lahə və məlaikətəhu yusəllunə ə'lən-nəbiyyi" zəmzəməsin cəhana salmışdı. Filvaqe', əgərçi ol vəqt aləmi-surətdə əhli-zəlalətin kövkəbi-iqballarıdərəceyi-rif'ətdə ibn Sə'd və sayir ümərayi-ləşkəri-Yezid bir-birinə təhniyeyi-zəfər verüb, ümidi-iltifatü ən'amla nişati-təmam bulub və Yezid və Übeydullahi-Ziyad məsnədi-hökumətlərində məcalisi-tərəb tərtib edüb nazü nuşla məşğuli-eyşü tərəb olmuşlardı və Əhli-beyti imamın nəvayibü əhzanı kəmala yetüb Hüseyn və sayir şühəda aludeyi-xakü xun, dəşti-Kərbəlada mərkəblər paymalı olub, mütəhhərati-hərəmsərayi-nübüvvət riqqəti-qəlblə küştələrin parə-parə bərabərlərində görüb və başları üzrə mücərrəd tiğlər müşahidə qılub iztirabi-təmamla təzəlzül bulmuşlardı. Əmma aləmi-mə'nidə ol bədbəxtlərin münşiyi-qəza, nasiyeyi-əhvallərinə rəqəmi-"Xəsirə'd-dunya və'l-axirətu" çəküb istirdadi-ne'mətlərinə fələk pənceyi-təsərrüf mühəyya qılub və tə'zibi-ruhlarına Maliki-duzəx səlasilü əğlal mürəttəb edüb, əsəri-zülmü sitəmləri sərayi-aqibətlərin viran etmişdi. Və Həzrəti-Hüseynə və ətbainə ərvahi-ənbiya istiqbal edüb, məlayikeyi-müqərrəbə nisar üçün ətbaqi-



cəvahiri-təhiyyat mühəyya qılub, divani-qəzadan (misali) hökuməti-dünyavü axirət verilüb və mütəhhərati-Əhli-beytə hüccəti-təmliki-hur və qüsuri-cənnət ən'am olunub, səm'i-rizalərinə müjdeyi-ehtirami dünyəvi və üxrəvi yetmişdir. Şe'r:

Bir dükandır bu büsati-dəhr kim, ümmalinə
Əcr miqdari-əməldir, müzd miqdari-hünər.
Xakdani-dəhr bir məzrə'dirü ə'mal zər',
Xeyr olur məhsul xeyr əhlinə, şər əhlinə şər"[300].

*(Bu o zaman idi ki, dördüncü göyün sultanı (günəş) bütün şüalarını çör-çöpə salaraq onları parça-parça etmişdi və özünün parıltı və işıltı qılıncını dağ ətəklərinə saplamaqdan sınıq-sınıq edərək artıq qüruba doğru meyillənməkdə idi.*

*Digər tərəfdən, həmin vaxtda Muhəmməd (s) ümmətinin xətibləri minbərə çıxaraq "Həqiqətən, Allah (Quranda insanlara) ədalətli olmağı, yaxşılıq etməyi, qohumlara (haqqını) verməyi (kasıb qohum-əqrəbaya şəriətin vacib bildiyi tərzdə əl tutmağı) buyurur, zina etməyi, pis işlər görməyi və zülm etməyi isə qadağan edir. (Allah) sizə düşünüb ibrət alasınız deyə belə öyüd-nəsihət verir!" ("Nəhl", 90) məsələsini zülmkarlara çatdırır, müəzzinlər isə minarələrdən "Həqiqətən, Allah və Onun mələkləri Peyğəmbərə (s) salavat deyirlər (xeyir-dua verirlər). Ey iman gətirənlər! Siz də ona salavat deyib layiqincə salamlayın! (Allahummə səlli əla Muhəmmədin və ali Muhəmməd; əssəlamu əleykə əyyuhən-nəbiyyu və rəhmətullahi və bərəkatuhu" deyin!") ("Əhzab", 56) zümzüməsini bütün yer üzünə yayırdı.*

*Üçüncü bir tərəfdən, həmin vaxt zahiri cəhətdən azğınların bəxt ulduzları ən uca nöqtədə parıldasa da, ibn Səd və Yezid ordusunun başqa sərkərdələri bir-birinə uğur, gözaydınlığı verib, lütf və mükafat ümidi ilə şadlansalar da, Yezidlə Übeydullah Ziyad hakimiyyət taxtlarında şadlıq məclisi*

.................................

[300] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 335-336*





*quraraq eyş-işrət sürsələr də, həmçinin imamın Əhli-beytinin müsibət və möhnəti hər baxımdan bitkin və yetkin olmaqla Hüseyn və digər şəhidlər torpağa və qana bulaşmış halda Kərbəla düzündə atların nallarının altında tapdalansa da, Peyğəmbər xanədanının pak-pakizə xanımları qəlb riqqəti ilə öz ölənlərini qarşılarında parça-tikə olmuş halda görsələr də, başları üstündə hazır tutulmuş qılınclara baxıb son dərəcə böyük iztirablarla əsib-titrəsələr də, məna aləmində qəzavü qədər yazıçısı o bədbəxtlərin əhvali-ruhiyyələrinə "hər iki dünyadan əli çıxmış" ("Həcc", 11) sözlərini yazmış, fələk müvəqqəti olaraq istifadə etdiyi nemətlərə əl qoymuş, cəhənnəm maliki, ruhları əzab çəksin deyə, onlar üçün ən öldürücü zəhər hazırlamış, zülm və vəhşilikləri öz axirət evlərini xaraba qoymuşdu. Həzrət Hüseyni (ə) və ona tabe olanları isə peyğəmbərlərin ruhları qarşılamış, onların ayaqları altına səpmək üçün Tanrı qatına ən yaxın olan mələklərə tabaq-tabaq salam-dua inciləri paylanılmış, qəzavü qədər divanından İmam Hüseynə (ə) və ona tabe olanlara dünya və axirət idarəediciliyi bəxş edilmiş, Əhli-beytə huri-qılmanların səlahiyyəti və çeşidli cənnət nemətləri hədiyyə*



*Beynəl-hərəmeyn. İki hərəm arası meydan. İraq. Kərbəla şəhəri*



*olunmuş və razılıq qulaqlarına Allah dərgahından dünyada da, axirətdə də həmişə istəkli olacaqlarına dair ilahi müjdə yetirilmişdir.*

*"Bu dünya həyatı bir dükandır. Bu dükanda aparılan ticarət nəticəsində mükafat da görülən iş miqdarındadır, zəhməthaqqı da. Allah-taala dünyanı əkin yeri olaraq yaratmışdır. Əkinçinin fəaliyyəti nəticəsində xeyirxahların məhsulu xeyir, bədxah adamların məhsulu isə şər olur").*

* * *

"Əlqissə, həzrəti-imam nəmaza məşğul olub səcdədə ikən Şimri bədbəxt baş qaldırmağa möhlət verməyüb şərbəti-şəhadət içirdi. "İnna lillahi və inna ileyhi raci'un". Bu halətdə qülqülə səvame'i-mələkuta düşüb və xətayiri-cəbərut vəlvəleyi-məlai-ə'ladan dolub, çün padişahi-məsnədi-imamət aləmi-surətdən aləmi-mə'naya intiqal etdi, əhli-aləmi-surət ol daği-fəraqa səbr etməyüb, ittifaqla iztirab edüb, micməreyi-gərduni-gərdan qüsuri-nigari-əflaka atəş urub məlayik pərü balın atəşi-fəraqa yaxdı və şö'bədəbazi-surətxaneyi-təbiət silsileyi-rabiteyi-təbayei qət' qılub əczai-mürəkkəbata ehtiraz bıraxdı. Fəzayi-dərya bu müsibətdə mahilərə çeşmeyi-zəhri-həlahil oldu və ərseyi-səhrayı bu möhnət vühuşü tüyura təngnayi-tənuri-püratəş qıldı.

Nəqldir Ətəmi-Kufidən ki, müqarini-qətli-Hüseyn həvaya bir qübar tari olu ol qayətdə ki, aləm tirəvü tar oldu ki, "əlameyi-Qiyamətdir" deyüb xəlqi-aləm istiğfara başladılar. Ol qübar mürtəfe' olduqda Həzrəti-Hüseynin mərkəbi kakülin qanla rəngin edüb, mütəvəccihi-xeymədah olub, mütəhhərati-Əhli-beyt ol mərkəbi kaküli-pürxunla şəhzadədən cüda gördükdə fəğanlar edüb, mərkəbi müxatəb qılub növhə ilə ayıtdılar. Şe'r:

Ey səməndi-badpa, billah, qanı ol şəhsəvar?
Nişə ol sərdardan qıldun cüdalıq ixtiyar?
Neylədin ol dürri-şəhvarı ki, tapşurduq sənə?
Qanda saldın, nişə gəlməz, ötdü həddən intizar.





Paybusindən anın məhrum olub, sən ey rikab,
Səxtdilsən kim, gözün olmaz dəmadəm əşkbar!
Dəstbusindən anın düşmüşsən ayrı, ey licam,
Nola toprağa düşüb oldunsa xarü xaksar?!

Anlar sürudla növhə qıldıqca Zülcənah didələrindən əşki-rəvan axıdırdı. Rəvayətdir ki, ol mərkəbi-vəfadar ol həzrətdən sonra rəhi-badiyə dutub minbə'd andan kimsənə nişan bulmadı və anın rükubu kimsənəyə müyəssər olmadı"[301].

*(Xülasə, imam həzrətləri (ə) namazının səcdə yerinə çatdıqda bədbəxt Şimr başını səcdədən qaldırmağa imkan vermədən ona şəhidlik şərbətini içirtdi. "Biz Allahdanıq və Allaha sarı da qayıdacağıq" ("Bəqərə", 156).*

*Bu an mələkut aləminin qulağına qülqülə düşdü, Tanrı qatına ən yaxın idarəedicilərin arasında vəlvələ əmələ gəldiyindən cəbarut qüvvələrinin könüllərində sonsuz qəm-kədər doğmuş, imamət taxtının hökmdarı surət aləmindən məna aləminə köçdüyü üçün surət aləmindəkilər bu ayrılıq dağına dözməyərək hamılıqla iztirab çəkməyə başlamış, dövr edən gərdunun tonqalı planetlərin yazısına od vuraraq onların trayektoriyasını dəyişdirmiş, mələklər öz qanadlarını ayrılıq odunda yandırmış və təbiətin zahiri qanun və qanunauyğunluqlarının tabelik əlaqəsinin zəncirini pozmuş, bu isə funksiyalarını yerinə yetirməkdən məhrum olduqlarına görə mürəkkəb ünsürləri fəryada gətirmişdir.*

*Bu müsibətdə dənizlərin saf suları balıqlar üçün ən öldürücü zəhər olan Həlahil zəhərinin qaynağına çevrildi. Digər tərəfdən, bu möhnət səhra ərazisini vəhşi heyvanlarla, uçan quşlar üçün od-alovla dolu təndirin dar içi etdi.*

*Ətəmi Kufinin dilindən danışılır ki, Hüseynin (ə) qətlinə yaxın havanı qalın toz dumanı bürüdü. Bu, o dərəcədə idi ki, dünya qaraldı, qaranlıq hər yanı tutdu. Camaat "Bu, qiyamətin nişanəsidir" deyərək Allaha yalvarıb-yaxarmağa başladı.*

.................................

[301] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 336-337*







*İmam Hüseyn (ə)-ın müqəddəs məzarı. İraq. Kərbəla şəhəri*

*Toz-torpaq bir az ara verdikdə Hüseyn həzrətlərinin (ə) atı kəkilini qana batırıb xeymələrə sarı üz qoydu və Əhli-beyt xanımları onun kəkilinin qana batdığını və atın İmam Hüseynsiz gəldiyini gördükdə üzlərini ata tutaraq ah-naləyə gəlib növhə dedilər: "Ey yel qanadlı at, səni Allaha and veririk, o dəstə başçısı hanı? Axı sən niyə o sərkərdədən ayrıldın? Sənə tapşırdığımız o misilsiz incini nə etdin? Harada salıb itirdin, axı niyə gəlib çıxmaz? Bizim intizarımızın həddi-hüdudu yoxdur axı! Sən ey üzəngi, onsuz da onun ayağını öpmək şərəfindən məhrum olmusan, gör sən necə daşürəklisən ki, anbaan gözündən yaş gəlmir! Sən ey cilov, onsuz da onun əlini öpmək şərəfini itirmisən, əgər torpağa düşüb alçalsan, zəlil olsan, nə olacaqdır ki!" Onlar avazla növhə dedikcə Zülcənah durmadan gözlərindən yaş axıdırdı. Deyilənlərə görə, o vəfalı at İmam Hüseyndən sonra çölə üz qoydu, bir daha heç kəs onu görmədi və heç kəs də bir daha onun belinə qalxa bilmədi).*

* * *



“Rəvayətdir ki, qətldən sonra Şimri-məl’un münafiqlərlə mütəvəccihi-hərəmsəra olub bünyadi-qarət etdilər, əmma mütəhhərata dəsti-təərrüz yetmədi. Əmma Şimri-bədbəxt Həzrəti-İmam Zeynəlabidinə yetüb qəsd etdi ki, qətl edə, Həmid ibn Müslim təriqi-mən’lə ayıtdı: “Ey bədbəxt, bu növrəsidə əsiri-dami-mərəzdir. Bigünah qətlinə iqdam etmək mürüvvətmidir?” Və bir rəvayət dəxi oldur ki, Ömər Sə’d mən’ etdi. Bəhər hal, çün müqtəzayi-hikmət bəqayi-şəhzadə idi, ol vərtədən nəcat buldu. Həzrəti-imamın matəminə iştiğal edüb bu məzmunla sürüda başladı. Şe’r:

Ya Rəbb, nə fitnədir ki, cəhan qıldı aşikar?!
Ya Rəbb, nə zülmdür ki, əyan etdi ruzigar?!
Ya Rəbb, qəza bu əmrdə çəkməzmi infial?!
Ya Rəbb, fələk bu fe’ldən olmazmı şərmsar?!
Abü həvayi-gülşəni-möhnətfəzayi-dəhr
Çün olmadı Hüseynə səfabəxşü sazkar,
Aram dutmayub yerə keçsin həmişə ab,
Məhdi-fərağət üzrə həva tutmasın qərar.
Çün xakdani-dəhrdə aram bulmadı,
Sultani-din Hüseyni-Əli, şahi-kamkar,
Badi-fənaya getsə, rəvadır bu xakdan,
Ayineyi-vücuda ədəmdən salıb qübar.
Ey dil, hökumətinə cəhanın nə e’timad?!
Ey didə, həşmətinə zəmanın nə e’tibar?!
Olsaydı ruzigar nihadında bir səbat,
Əhdin qılırdı Ali-Rəsul ilə üstüvar.
Dövran cibillətində gər olsaydı bir vəfa,
Ali-Rəsul xidmətin eylərdi ixtiyar.
Ol vəqtdən ki xəsm rizasıyla tiğü tir
Şahi-şəhidin eylədi ə’zasını figar,
Açmış dəhan təəssüf üçün tiri-tündrəv,
Çəkmiş zəban təhəssür üçün tiği-abdar.





Ya Pəbb, ki tiğ çıxmaya həbsi-niyamdan!
Ya Rəbb, ki qanda olsa ola tir xaksar[302].

*(Belə yazırlar ki, İmam Hüseynin (ə) qətlindən sonra məlun Şimr münafiqlərlə qadın və uşaqların əyləşdiyi bölümə keçib qarətə başladılar. Ancaq pak-pakizə Əhli-beytə əl uzadılmadı.*

*Bu zaman bədbəxt Şimr Zeynəlabidin (ə) həzrətlərinə çatdıqda onu öldürmək istədi. Həmid ibn Müslüm çəkindirmək üçün ona belə dedi: "Ay bədbəxt, bu yeniyetmə xəstəlik toruna düşüb. O, ağır xəstədir. Heç bir günahı olmadan öldürmək insafdandırmı?"*

*Başqa bir bilgiyə görə, Şimri Ömər Səd çəkindirdi. Hər hali-karda ilahi hikmətin qaçılmaz təzahürü şahzadənin sağ-salamat qalması yönündə olduğu üçün o, həmin təhlükədən qurtuldu və imam həzrətlərinin (ə) matəminə əyləşərək bu məzmunda dilə gəldi: "Ya Rəbb, dünyanın başımıza gətirdiyi bu fitnə nə fitnədir axı?! Ya Rəbb, bu nə zülmdür ki, biz ruzigardan görürük?! Ya Rəbb, qəzavü qədər bu işinə görə heç xəcalət çəkmirmi? Ya Rəbb, fələk bu əməlindən heç utanıb qızarmırmı? Dünyanın möhnətartıran çəmənliyində su ilə külək Hüseyn üçün zövqverici və yararlı olmadığı üçün su heç vaxt bir yerdə duruş gətirə bilməyib yerin dibinə batsın, külək isə heç vaxt sakitlik beşiyində bir dinclik tapmasın! Dinin sultanı və hər kəsin diləyini verən Əli oğlu Hüseyn (ə) bu yalnız torpaq qabından ibarət olan dünyada bilmərrə sakitlik üzü görmədiyi üçün bu dünya özünün varlıq güzgüsünə yoxluq tozu salaraq, heç-puçluq yeli ilə məhvə uğrasa, tamamilə ədalətli olar! Ey qəlb, dünyanın idarəçiliyinə kim ümid bəsləyə bilər? Ey göz, o kimdir ki zəmanənin ləyaqətinə inansın? Əgər ruzigarın, zəmanənin sözündə kəsər olsaydı, Peyğəmbər soyu ilə bağladığı əhd-peymanın üstündə möhkəm durardı. Hərgah dövranın xislətində vəfa olsaydı, mütləq Əhli-beytin*

..................................

302 *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 337-338*





*qulluğunda durardı! Hirsin, hikkənin razılığını qazansın deyə qılınc və ox şəhidlər şahının bədən üzvlərini parça-parça, tikə-tikə kəsib doğradığı vaxtdan bəri sərtxasiyyətli ox təəssüf və peşmançılıq üçün ağzını açıq saxlamış, iti qılınc isə üzrxahlıq üçün dil çıxarmışdır. Ya Rəbb, kaş ki, qılınc həmişə qınının içində həbsdə qalsın, ox isə harada olsa heç vaxt torpağın əsarətindən qurtulmasın!").*





# "HƏDİQƏ"NİN "XATİMƏ"Sİ

Füzuli son dərəcə səliqəli sənətkar olmuşdur. Belə ki, o, təkcə əsər yazmaqla məşğul olmamış, yazıb-yaratdıqlarını dövrünün ədəbi qaydalarına uyğun biçimdə seçib sonalamış, konkret ünvan və mündəricə üzrə toplayaraq bir araya gətirmişdir. Yalnız bunu demək kifayətdir ki, ədib üç divan bağlamış, Azərbaycan türkcəsində və fars dilində olan müəmmalarını bir məcmuəyə yığmış, "Leyli–Məcnun", "Mətləü-l-etiqad" kimi böyük əsərlərini kitab tərtibatı baxımından ayrıca gözdən keçirmiş, ən nəhayət, bunların çoxuna "Dibaçə" və "Xatimə" də, "Ön söz" və "Son söz" də yazmışdır. Ötəri deyildir ki, qaynaqlarda şairin külliyyatına düşməmiş bir dübeyti qalıb. Həmin dübeytidə Füzuli əsərlərini yanlış nəşr edən naşirləri qarğıyır:

Əskik olsun aradan naqis yazan divanımı,
Bulmasın şirazeyi-tumari-ömrü intizam.
Nəsx olunsun nüsxeyi-amali ol tabe'lərin
Kim, basarlar dəftəri-şe'rim, Füzuli, natamam[303].

*(Mənim şeir toplularımın üzünü yanlış köçürən katiblər, görüm ki, yoxa çıxsınlar. Qoy onların ömür kitablarının yapışqanlı sapları heç vaxt qaydasında olmasın. Füzuli, şeir kitabımı yarımçıq çap edən mətbəəçilərin əməl dəftərləri qoy birdəfəlik silinsin).*

..................................

[303] *Seyidov Y., Əlizadə S. Klassik Azərbaycan şairləri söz haqqında, Bakı: Gənclik, 1977, səh. 89*





Göründüyü kimi, bu nifrin məşhur "Qələm olsun əli ol katibi-bədtəhririn" misralı qarğışın əlyazma mərhələsindən çap işi səviyyəsinə qaldırılmasıdır. "Hədiqətü-s-süəda" kimi faciəvi bir əsərin sonluğu ilə bağlı belə təfsilata varmaq bəlkə də mətləbdən uzaq düşmək sayılardı. Ancaq "Hədiqə"nin "Xatimə"sinin struktur və kompozisiya xüsusiyyətlərini, janr və forma cizgilərini, müəllif-oxucu münasibətləri baxımından qazandığı özəllikləri nəzərə aldıqda, əslində, mətləbdən bir elə də uzaq düşmədiyimiz anlaşılar.

"Xatimə" Allah-bəndə münasibətlərinə dair, kainat, insan, mənəviyyat haqqında, insanın cəmiyyətdəki yeri ilə bağlı fəlsəfi düşüncələr, psixoloji müşahidələr, sosial-ictimai mülahizələr və etik-estetik dəyərləndirmələrlə başlanır ki, "Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri" fəslində həmin başlanğıc hissə üzərində ayrıca dayandığımızdan burada ondan danışmırıq.

Əsərin başqa bölümləri kimi, "Xatimə"nin də mütaliəsi aydın göstərir ki, "Hədiqətü-s-süəda"nı işlərkən Füzulinin əlində olduqca çox hədis, xəbər və mənqəbə olmuşdur. Əgər belə olmasaydı, o, "Dibaçə"dən tutmuş ta "Xatimə"yədək bunlardan bol-bol və tez-tez istifadə etməzdi. Hətta sayıq oxucu dərhal hiss edəcəkdir ki, şair əlindəki bu qəbilli xammalın heç də hamısını dövriyyəyə buraxmağa fürsət tapmamış və bunun üçün də ürəyini sonadək boşalda bilməmişdir. Əlbəttə, bu, bir yandan ədibin İmam Hüseyn (ə) eşqindən doğursa, o biri yandan Kərbəla şəhidləri qarşısında son dərəcə böyük məsuliyyət hiss etməsindən soraq verir. Çünki bu qədər hədis, xəbər və mənqəbə yalnız illər uzunu çəkən ardıcıl, dərin mütaliə və axtarış aparma işi ilə əldə edilə bilərdi. Bu isə mənbəşünaslıq baxımından da maraqlı olub, "Xatimə"nin bir başqa orijinal və novator xüsusiyyəti kimi ortaya çıxır. Gəlin biz də "Hədiqə" müəllifinin yolu ilə gedib, yorulub-usanmadan İmam Hüseyn (ə) haqqında, onun Tanrı qatındakı əlçatmaz-ünyetməz məqamı barəsində Əhli-beytin



və Kərbəla şəhidlərinin ucadan-uca, yüksəkdən-yüksək olan keyfiyyətlərinə dair əsərin “Xatimə”sində əksini tapmış bir-birindən cəlbedici və çəkici, bir-birindən dolğun və tutumlu, bir-birindən həssas və yanıqlı hədis, xəbər və mənqəbələrə göz gəzdirək.

1. “Nəqldir ki, ruzi-cəza zümreyi-şühədaya cəmi’i-əsnafi-məvahib və cümleyi-ənvai-mətalib kəramət olunduqdan sonra canibi-Həqdən nida gələ ki, ey təriqi-məhəbbətdə nəqdi-can nisar qılanlar və ey bəzmi-bəlada həlahili-məhəbbətimi şəhdi-şəfa bilənlər, dəxi muradınız var isə, bəyan edin, hasil olsun və dəxi məqsudiniz nə isə, əyan edin, icabət bulsun. Firqeyi-şühəda bu cəvaba mülhəm olalar ki: Ya Rəbb, səadəti-şəhadət nəticəsin görüb iradətimiz ziyadə olmağın muradımız dünyaya müraciət qılub təkrarla səadəti-şəhadət bulmaqdır və əgər müyəssər olsa, bu iqbalın idrakinə müdavi olmaqdır. Şe’r:

Şəhidi-xəncəri-bidada ruzi-Həşr feyzi-Həqq,
Əyan etdikdə sərfi-nəqdi-can əcrinin asarın,
Kəmali-zövq bundan qeyr qoymaz anda həsrət kim,
Dönüb dünyaya hasil eyləyə ol zövq təkrarın”[304].

*(Nəql edirlər ki, Qiyamət günü şəhidlər zümrəsinə hər cür bəxşişlər və növbənöv mətləblər kəramət olunduqdan sonra Həqqin tərəfindən nida gələr ki, “ey məhəbbətimin yolunda can fəda edənlər və bəla bəzmində Mənə olan məhəbbətin acısını şəfa şəhdi bilənlər, nə muradınız varsa, bəyan edin, hasil olsun”. O zaman şəhidlər zümrəsi bu cavabı verər ki: “Ya Rəbb, şəhadətin səadətli nəticəsini görüb iradəmiz möhkəmləndi. Muradımız yenidən dünyaya gəlib bir də şəhid olmaqdır”.*

*“İlahi lütf Qiyamət günündə zülmkarların qan tökən xəncərilə qətlə yetirilən şəhidlərə Allah yolunda hər şeyindən*

..................................

[304] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 341*





*keçməyin mükafatının nişanələrini göstərdikdə şəhidlərin əldə etdiyi və bu dünyadakıların bilə bilməyəcəyi hər cür qüsurdan və nöqsandan uzaq olan yetkin zövq onlarda yenidən həyata qayıdaraq həmin zövqü dadmaq istəyindən başqa özgə arzu, kam, dilək qoymaz").*

Füzuli bu xəbəri "Həddi-meysiri" (İmam Cəfəri-Sadiqin (ə) buyurduğu Qurani-Kərimdən gündə azı əlli ayə oxumaq) göstərişinə əməl edən dinli-imanlı imamhüseynsevər oxucusu üçün yazmışdır. Hər işə bir "əmma" qoşan müasirlərimizin əksəriyyəti bu xəbərin məğzinə varmamış onun səhih olub-olmaması, ravilərin kimliyi, rical elminin həmin hədisə münasibəti kimi dar ixtisas məsələləri ilə maraqlanacaq, onu məzhəb və təriqətlərin, ekol və cərəyanların dəyirmanında üyüdəcəkdir. Birmənalı surətdə bildiririk ki, klassikaya belə yanaşmaq futbol topu ilə şahmat oynamaq qədər gülüncdür.

Bəs Füzulinin nəzərdə tutduğu əsl oxucu bu xəbərə hansı gözlə baxardı? Yəqin ki, o, Qurani-Kərimdən yaxşı bildiyi ayələri yada salardı və bir daha əmin olardı ki, "Allah yolunda öldürülənlərə qətiyyən "ölü" demək olmaz, çünki əsl diri onlardır, sadəcə olaraq, biz başa düşmürük" *("Bəqərə", 154)* və özünə də, ətrafındakılara da aşılardı ki, "Allah yolunda öldürülənləri ölü zənn etmə. Xeyr, onlar öz Rəbbinin yanında diri olub ruzi yeyirlər. Onlar Allahın öz mərhəmətindən onlara verdiyi nemətə sevinir, arxalarınca gəlib hələ özlərinə çatmamış kimsələrin qorxusu olmayacağına və onların qəm-qüssə görməyəcəklərinə görə şadlanırlar*" ("Ali-İmran", 169-170).*

Füzulinin arzuladığı əsl imamhüseynsevər oxucu sonra hədisdə Allah-taalanın şəhidlərə xitab etməklə onlara öz dərgahında son dərəcə böyük dəyər verməsindən zövq alar və mühəqqiq (araşdırıcı), müfəssir (açıqlayıcı) Füzulinin hədisə qoşduğu şeir parçasını yüksək əhvali-ruhiyyə ilə zümzümə edə-edə könlünə təsəlli və təskinlik verər, ruhunu dincliyə qovuşdurar, ən nəhayət, bütün bunlarla özünə vətənpərvərlik, vətəndaşlıq şüuru aşılayardı. Çünki Füzuli özü də belə etmişdir.





Şeirin birnəfəsə deyilməsi onun hər sözündən bilinir. Gör Füzuli şeiri necə birnəfəsə demişdir ki, adam qiraət zamanı misralar arasında nəfəs almağa macal tapa bilmir və bilmirsən hansı misradan sonra hansı durğu işarəsini qoyasan.

Üçüncü tərəfdən, nəzərə alınmalıdır ki, bu mənqəbə əsərin sonunda verilmişdir. Bu isə az söz demir. Bu, məsələn, Füzulinin dili ilə onu deyir ki, sən ey mənim səriştəli oxucum, “Dibaçə”dən burayadək olan bölümləri, o bölümlərdəki hadisə və əhvalatları gəl bir anlığa gözlərin önündə canlandır və gör ki, hər bir Kərbəla şəhidinin Tanrı qatındakı uca yeri nədir.

Son olaraq həm imamhüseynsevər, həm də füzulisevər oxucu burada mütləq şairin “Müxtəsər türki-divan”ındakı (“Türkcə yığcam şeirlər toplusu”):

Kim versə can yolunda, bulur xaki-məqdəmin,
Guya ki, xaki-rahinədir nəqdi-can bəha! –

*(Yolunda canından keçən sənin dərgahına aparan torpağa qədəm basmış olur. Sanki canından keçmək sənin yolunun, torpağının qiymətidir)* beytini xatırlayacaq və özünün dünyagörüşü, dünyaduyumu daxilində həmin beytə məna verməyə çalışacaqdır. Yəni oxucu bütün bunlarla öz üzərində işləmiş və özünü daxilən, mənən zənginləşdirmiş olacaqdır.

Bu sətirləri yaza-yaza 1988-1992-ci illərdə həmin beytə müdafiə etməyə hazırlaşdığım dissertasiyanın qaralamasında verdiyim mənalar yadıma düşür. Yadıma düşür ki, məşhur türk füzulişünası Ə.N.Tərlanın “Füzuli divanının şərhi” kitabının sorağına düşmüşdümsə də, hələ onu əldə edə bilməmişdim. Bir gün utana-utana elmi rəhbərim prof. Q.Kəndlidən həmin kitabı mənim üçün tapmasını xahiş etdim. O, bir müəllim qayğıkeşliyi və alim səriştəsi ilə niyyətimi duyduğundan mənə tələsməməyi, beytlərə öncə özümün məna verib, sonra onları müvafiq mənbələrlə tutuşdurmağımı tövsiyə etdi. Bu söz qulağımda sırğa oldu. Odur, budur, mən ayəyə, hədisə,



beytə özüm başa düşdüyüm qədər az-çox məna verməmiş başqa mənbəyə üz tutmuram.

2. Kitabi-“Rəbiül-Əbrar”da Bəxtəri məstur etmiş bir əzizdən nəql edüb ki, bir gün Həzrəti-Rəsulullah bənim mənzilimdə mübarək əllərin yuyub və məzməzə edüb iste’mal olunan suyu bir mövze’də tökdü. Sabah olduqda ol mövze’də bir dirəxti-barvər peyda olub bir xoş meyvə gətürdi. Bir müddət xəlq ana “Şəcəreyi-mübarəkə” ləqəb qoyub meyvəsindən mütəmətte’ olurlardı. Bir gün gördük meyvəsi tökülüb, bərgləri pəjmürdə olmuş. Təəccüb etdik ki, aya, nə afət vaqe’ oldu ola? Nagah xəbəri-vəfati-Rəsul istima’ olundu. Andan sonra dəxi meyvə verürdi, əmma nihayət qillətdə. Bir gün gördük ki, cəmi’i-meyvəsi tökülüb, yerinə tikən bitmiş. Nagah Həzrəti-Mürtəza vəfatından xəbər verdilər. Andan sonra dəxi övraqın iste’mal edüb bimarlar şəfa bulurlardı. Bir gün gördük təmamiyi-qüsunü övraqı xüşk olub həman saqi-dirəxt qalmış. Nagah xəbəri-vəfati-İmam Həsən şiya’ buldu. Bir gün gördük ol saqi-dirəxtdən dəxi əsər qalmayıb xakla yeksan olmuş. Nagah vaqeəyi-Kərbəladan xəbər yetürdilər. Şe’r:

Hər qafilin ki, çeşmi bu matəmdə tər degil,
Mütləq nihali-ömrü anın barvər degil.
Hər didə kim, degil bu müsibətdə əşkbar,
Məqbuli-təb’i-mərdümi-sahibnəzər degil”[305].

*(“Doğruçuların baharı” kitabında Bəxtəri qeyd edir ki, bir nəfər nəql edib: “Bir gün Həzrət Rəsulullah (s) mənim mənzilimdə mübarək əllərini yudu və məzməzə etdiyi suyu bir yerə tökdü. Səhər açılanda həmin yerdən gözəl meyvə gətirmiş bir ağacın ucaldığını gördüm. Bir müddət camaat o ağaca “bərəkətli ağac” deyib barından faydalanırdı. Günlərin birində gördük ki, həmin ağacın meyvələri tökülüb, yarpaqları büzüşmüşdür. Təəccübləndik ki, görəsən, nə bəla*

[305] *Yenə orada, səh. 342-343*





*üz vermişdir? Birdən eşitdik ki, Həzrət Rəsul (s) vəfat edib. Ondan sonra da həmin ağac meyvə gətirirdi, amma çox az.*

*Yenə bir gün gördük ki, tamam meyvələr tökülüb, yerində tikanlar bitibdir. Bu dəfə xəbər gəldi ki, Həzrət Mürtəza (ə) dünyadan köçüb. Ondan sonra isə həmin ağacın yarpaqlarını yığıb, dərman düzəldib və xəstələr ondan şəfa tapırdılar. Bir də gördük ki, ağacın bütün yarpaqları qurumuş və çılpaq qalmışdır. Bu da İmam Həsənin (ə) vəfatına işarə idi.*

*Ağacın gövdəsi quruyub yerlə yeksan olanda eşitdik ki, Kərbəla vaqeəsi baş verib.*

*Kərbəla şəhidlərinin müsibətində gözü yaşarmayan qafilin – haradan gəlib, haraya getməsindən xəbərsiz olan cahil və nadan kimsənin ömür şitili heç vaxt bara gəlib məhsul verə bilməz, yəni beləsi ömür boyu yaxşı işlər görüb savab qazana bilməz. Bu müsibətdə yaşla dolmayan gözün ariflər yanında heç bir dəyəri yoxdur”).*

İslam tarixindən yaxşı bəllidir ki, səhabələr Peyğəmbərə (s) çox diqqətcil olmuşlar. Onlar vəfatı zamanı Həzrət Muhəmmədin (s) saqqalında cəmi on-on beş ağ tükün olduğunu saymışlar. Bu gün dünyanın qabaqcıl muzeylərində İslam rəhbəri ilə bağlı bir neçə əşyanın əziz eksponat kimi qorunması buna əyani sübutdur. Axı heç bir tanınmış simanın tərcümeyi-halı, həyat və fəaliyyəti, gətirdiyi məfkurənin yayılma arealı Həzrət Muhəmmədinki (s) qədər aydın və dəqiq yazılmamışdır. Belə ki, mənqəbədə beş kimsənənin dördünün vəfatına aid əlamət mövcud olub, onlar bu din böyüklərinin vəfatlarının müsəlman cəmiyyətində doğurduğu acı təəssüratları, həzin notları kifayət qədər təsirli ifadə edir.

Mənqəbənin diqqətəşayan ikinci cəhəti mətnin ağac üzərində qurulmasıdır. İstər-istəməz Qurani-Kərimdəki ağac motivlərini xatırladan bu struktur *(“İbrahim”, 24-27)* assosiativ olaraq İslamın yaşayış, dirilik, həyat qaynağı kimi dərkinə yol açır və əsərin sonuna ayrıca bir təravət gətirmiş olur.





Mənqəbədə ağacın bütün əlamətlərinin beş kimsənə üzərinə keçirilməsi isə özlüyündə xüsusi bir bədiilik örnəyidir. "Meyvələrin tökülüb, yarpaqların büzüşməsi, meyvələrin azalması, meyvələrin yerində tikanların bitməsi, yarpaqlardan dərman düzəldilməsi və xəstələrin onlardan şəfa tapması, yarpaqların quruyub ağacın çılpaq qalması, gövdənin quruyaraq ağacın kökündən yerə yıxılması"nın xronoloji ardıcıllıqla İslam rəhbəri, Həzrət Əli (ə), İmam Həsən (ə), İmam Hüseynlə (ə) əlaqələndirilməsi əgər bir tərəfdən hazır mənbə bədiiliyidirsə, Füzulinin onu əsərinin sonuna salması və verdiyi şeirlə ideya səviyyəsinə qaldırması artıq estetik həzzin, etik düşüncənin, didaktik münasibətin poetik təzahürüdür. "Qafil-sahibnəzər" təzadı hazır mətndə olmayan ictimai eybəcərliyi bədii sözün işığında üzə çıxarır, ənənəvi "ağlar göz" motivinə də sosial-ictimal məzmun qazandırır. Belədə "tər çeşm" və "əşkbar didə" deyimləri ənənəvi yas-matəm ab-havasına bir özünüdərk meyli, bir təfəkkür elementi gətirir. Yenə belədə "göz yaşı"nın həyat nişanəsi olan su yerinə keçirilməklə "ömür şitili" obrazına səbəb-nəticə baxımından bağlanması da başqa bir parlaq bədii uyarlıqdan soraq verdiyi üçün təbii maraq doğurur.

3. "Kənzü-l-Ğərayib"də məsturdur ki, bir yəhudinin bir cəmilə qızı olub bə'zi bəlalara mübtəla idi. Ol cümlədən biri ol ki, ə'ma idi və yəhudi xarici-şəhrdə anınçün bir bustan mürəttəb edüb mənzil müəyyən etmişdi. Bir gün ol yəhudi qayib olub, ol zəifə qaldıqda Hüseyni-məzlumin qanıyla rəngin olan kəbutər ol bustana güzar edüb, bir şaxsar üzrə qonub fəğan elərdi. Ol zəifə anın sədasına mütəvəccih olub ol şaxsara yetdikdə, baş qaldırub yuxaru təvəccöh qıldıqda kəbutər pərü balından bir qətrə qan dideyi-nabinasina damub bina oldu. Göz açub ol kəbutəri gördükdə pərü balından axdığı qandan sayir ə'zasına dəxi sürüb səhhəti-təmam buldu. Səhihül-mizac və bina seyr edərkən yəhudi şəhrdən gəlüb bustana girdikdə ol bimarını səhhət üzrə görüb, təəccüb edüb



səbəb sual etdikdə ol zəifə surəti-halın bəyan etdi. Yəhudi mütəəccüb olub, ol şaxsara mütəvəccih olduqda ol kəbutəri görüb nişatla ayıtdı: “Əyyuhə’t-təyru ma-həqiqətu halikə vəma fibalikə”. Hikməti-İlahidən yəhudiyə səbəbi-İslam olmaq məsləhəti üçün ol heyvan natiq olub göftara gəldi ki: “Ey yəhudi, bu gün bə’zi kəbutərlər ilə aşiyanəmizdən pərvaz edüb seyr edərkən güzarımız Kərbəlaya düşdü. Hüseyni-məzlumu gördük, aludeyi-xakü xun şəhid olmuş. Pərü balımızı anın qanına sürüb, hər birimiz bir canibə təvəccöh qılub, hala bən bu büq’əyə düşüb növhəyə məşğul ikən sənin fərzəndin hazır olub təvəccöh etdikdə əmrazinə şəfa verən pərü balımdan axan qandır və bu gün vühuşü tüyur matəmi-övlad tutub pərişandır”. Yəhudi bu hala müttəle’ olduqda hidayəti-İslam bulub səadəti-imana yetdi və səbəb sual edənlərə şərhü bəstlə bəyani-hal edüb çoxları dəxi müsəlman etdi. Şe’r:

Məhrəmi-bargahi-İzzətdən  
Nə əcəb gər kəramət etsə zühur.  
Qürbi-dərgahi-Həqq bulanlardan  
Mö’cüzatü kəramət olmaz dur”[306].

*(“Qəribəliklər xəzinəsi” kitabında yazırlar ki, bir yəhudinin bir gözəl qızı vardı. Qız bəzi bəlalara giriftar olmuşdu. Bu bəlalardan biri o idi ki, qız kor idi. Yəhudi şəhərin kənarında onun üçün bir bağ düzəldib mənzil qurmuşdu. Günlərin birində yəhudi səfərə çıxdı və qız kimsəsiz qaldı. Qanadlarını imamın qanına batırmış bir göyərçin yəhudinin qızı olan bağa uçub gəldi və bir budağa qonub fəğan etməyə başladı. O zəif qız quşun sədasını eşidib ona tərəf getdi. Başını yuxarı, quşa tərəf qaldıranda onun qanadından bir damla qan qızın gözünə düşdü. Dərhal qızın gözlərinə işıq gəldi və göyərçin qanadlarından axan qandan digər əzasına da sürtüb şəfa tapdı.*

.................................

306 *Yenə orada, səh.342-343*







*Xanım Zeynəb (s.ə.)-nın müqəddəs məzarı. Suriya. Şam şəhəri*

*Yəhudi səfərdən qayıdarkən qızını tamamən sağalmış görəndə təəccübləndi. Qız əhvalatı atasına danışdı. Atası bağa girib göyərçini budaq üstə görəndə sevinclə sual eylədi: "Ey quş, bu nə sirdir və qanadındakı qan nədir?" Yəhudi müsəlman olsun deyə İlahi hikməti ilə quş dilə gəldi: "Ey yəhudi, bu gün bəzi göyərçinlərlə uçarkən güzarımız Kərbəlaya düşdü, gördük ki, Hüseyni-məzlum qanına qəltan edilərək şəhid olmuşdur. Dərhal enib qanadlarımızı onun qanı ilə boyadıq və hərəmiz bir səmtə uçduq. Mənim də güzarım bu bağa düşdü. Budaq üstündə oturub nalə edirdim ki, sənin qızın gəlib başını qaldıranda qanadımdan axan qan ona şəfa verdi. Bu gün bütün quşlar və vəhşilər matəm içindədir".*

*Yəhudi bunu eşidib İslamı qəbul etdi və müsəlman olmasının səbəbini soruşanlara da həmin vaqeəni danışdı. Onun sözlərini eşidənlərin çoxu dönüb müsəlman oldu.*

*Əgər Şanlı Tanrı qatının yaxınlarından kəramət görünsə, burada heç bir qəribəlik yoxdur. Özlərinin sarsılmaz imanı və möhkəm əməli, həmçinin xalis niyyəti və faydalı fəaliyyəti ilə Allah dərgahına yaxın olma kimi böyük səadətə qovuşanlardan heç vaxt möcüzə və kəramət uzaq düşməz").*



Bu mənqəbə də bir neçə özünəməxsus cəhətə malikdir. İudaizm, gözəl, ancaq xəstə qız, İmam Hüseynin (ə) qanı, göyərçin, yəhudi qızının İmam Hüseynin (ə) qanı ilə sağalması, ilahi hikmətlə quşun danışması, nalə etməsi və bütün quşların və vəhşilərin matəm içində olduqlarını bildirməsi bu qəbildəndir. Mənqəbənin ən təsirli cəhəti İmam Hüseynin (ə) qanının motivləşdirilməsidir. Belə ki, burada xəstə yəhudi qızına şəfa verən İmam Hüseynin (ə) qanı “Xatimə”nin başqa yerində Ömər Sədin ayağında çox pis iy verən sağalmaz yara açır. Bu yara onun iştirak etdiyi hər məclisdə olanları narahat edirmiş və o İmam Hüseyn düşməninin murdar cəsədi də həmin yara ilə tanınıbmış.

Füzuli burada:

Tökmək övladi-Rəsulin qanın asan degil,
Ol səbəbdən kim, bu qan hər qanə bənzər qan degil! –

şəklində çox yığcam ifadə edtiyi möhtəşəm fikri yüyrək və çevik nəsrlə, aydın və işlək təhkiyə ilə vermişdir. Bunun üçün o, İslamın “nemət-niqmət” üsulundan yararlanmışdır. Həmin üsulun məğzi bundan ibarətdir ki, eyni predmet ona bəslənilən subyektiv münasibət nəticəsində qurtuluş yolu da ola bilər, həlakedici vasitə də. Dənizdə açılmış on iki qolun Musa və iman gətirənləri xilas etdiyi halda Fironu və tərəfdarlarını boğub məhv etməsi *(“Bəqərə”, 50)* buna misaldır. Burada Mövlanə Cəlaləddin Ruminin belə bir fikri yada düşür ki, “gəlin su olaq, ancaq gəminin kənarında olan su olaq, gəminin içində olan su yox. Çünki kənarda nə qədər su çox olarsa, gəmi bir o qədər yaxşı üzər. Gəminin içərisində azacıq su olduqda isə, bu, yalnız fəlakət əlamətinə çevrilər”.

4. “Cümleyi-kəramətdən biri dəxi oldur ki, Mosul diyarına yetdikdə Şimri-Zilçövşən e’lam etdi ki, əmiri-Mosul şəhrə ayin bağlayub əhli-şəhrlə istiqbala çıxalar. İmadüddövlə ki,





əmiri-Mosuldu, əhli-şəhri cəm' edüb ol əmrə iqdam etməyüb cavab göndərdi ki, bu şəhrdə təvayifi-müxtəlifə çoxdur, fəsad ehtimalı var. Səlah oldur ki, dışrada qonub nüzul [edələr və sayir ləvazim] xidmətlərinizə irsal oluna. Şimri-məl'un dəxi qayəti-vəhmdən bu səlahı qəbul edüb, şəhrə girməyüb dışrada nüzul edüb, həzrəti-imamın səri-mübarəkin bir daş üzərinə qoymuşlardı. Bir qətrə qan damub ol səhrayi-mübarəki mə'dəni-yaquti-kəramət qıldı. Müqərrər oldu ki, hər mahi-məhərrəm ol qan cuşa gəlüb mücəddəd ola və xəvasü əvami-şəhr ətrafında cəm' olub əzaya məşğul olalar, ta Əbdülməlik məsnədi-hökumətdə vali olduqda həsəddən ol daşı götürüb andan əsər qalmadı, əmma yerinə "Məşhədi-nöqtə" deyüb hənuz ziyarət edərlər. Şe'r:

Girdin, ey əhli-sitəm, bir qana kim, hər qətrəsi
Daşa damsa, ta əbəd daşdan çıxar yaquti-tər.
Könlünü daşdan betər dersəm rəvadır, nişə kim,
Daşa tə'sir eylər ol qan, könlünə qılmaz əsər"[307].

*(Mosul diyarına yaxınlaşanda Şimri-Zilcövşən xəbər göndərdi ki, diyarın əmiri şəhər əhlini toplayıb bizi qarşılasın. Mosulun əmiri İmadüddövlə şəhər əhlini toplamadı və Şimrin əmrinə əməl etməyib cavab göndərdi ki, bu şəhərdə müxtəlif tayfalar yaşayır, ola bilsin ki, bir fəsad törəyə bilər, məsləhət budur ki, şəhərdən bir az aralı xidmətinizə bir qədər adam göndərim. Şimri-məlun bu xəbəri eşidib qorxuya düşdü və şəhərdən aralı bir yerdə dayandı. Həzrət imamın (ə) mübarək başını bir daşın üstünə qoydu. Başdan bir damla qan damaraq o mübarək səhranı kəramət yaqutuna mədən elədi. Qərara alındı ki, hər il məhərrəm ayında o qan cuşa gəlib təzələnsin və şəhərin bütün əhalisi onun ətrafına cəm olub əza saxlasın.*

*Bu adət Əbdülməlik Mərvanın xilafətinədək mövcud idi.*

.................................

[307] *Yenə orada, səh. 350-351*





*Lənətə gəlmiş Mərvan hakimiyyətdə olarkən həsəd ona güc gəldi və daşı oradan götürdü. Amma həmin daşın yerinə "Məşhədi-nöqtə" deyib hələ də ziyarət edirlər.*

*Ey zülmkar, hər qətrəsi daşın üzərinə damdığı təqdirdə qiyamətədək daşdan təzə yaqut çıxara biləcəyi bir şəxsiyyətin qanının günahını, vəbalını boynuna götürdün. Odur ki, sənin ürəyinin daşdan da bərk, sərt və qatı olduğunu bildirsəm, yeri vardır, çünki o böyük şəxsiyyətin qanı daşa belə təsir göstərdiyi halda sənin o qəsavət bağlamış ürəyinə əsər etməz").*

Mənqəbənin özəlliyi qanın bioloji mərhələdən çıxarılaraq ilahi iksir səviyyəsinə qaldırılmasıdır. Belə ki, özünə qarşı hörmətsizliyə yol verilən müqəddəs Əhli-beyt qanı buna cavab olaraq bütöv bir səhranı yaqut qaynağına çevirir, ancaq bu kəramət burada mücərrəd məfhum kimi yox, müxtəlif bilgi və anlayışların əhatəsində olan mürəkkəb motiv kimi təqdim edilir. Mosul diyarı, Şimri-Zilcövşənin xəbər göndərməsi, diyarın əmiri İmaddüdövlə, şəhər əhalisinin müxtəlif tayfalardan ibarət olması, İmam Hüseynin (ə) mübarək başı, kəramət yaqutu, İmam Hüseynin (ə) qanının hər ilin məhərrəm ayında cuşa gəlib təzələnməsi, əzadarlıq, Əbdülməlik Mərvan, həsəd, ziyarət kimi ən müxtəlif dini, tarixi, əxlaqi və mənəvi, həmçinin sosial-ictimai ad, bilgi və anlayışlar mənqəbədə danışılanları konkret situasiyaya çevirə biləcək qədər şərtləndirir.

* * *

"Hədiqə"nin "Xatimə"si hədis, xəbər, mənqəbə nəqli ilə bitmir. Adı "sonluq" olsa da, əslində, "Xatimə" bir bab həcmində olub, bir neçə xətli süjetə malikdir. Ayrı-ayrı fabulalardan ibarət olan bu süjet xətləri mövzu və məzmunca Müslüm ibn Əqilin haqqında olan babla müqayisə edilə biləcək qədər genişdir. Belə ki, burada şair "Əhvalat içərisində əhvalat" üsulundan da istifadə etmişdir.

Ancaq "Xatimə"ni daha orijinal edən cəhət Kərbəla əsirlərinin Kufəyə və Şama aparılma hadisəsinin və bu hadisə



zəminində İmam Zeynəlabidinlə (ə) xanım Zeynəbin (s.ə) Kərbəla həqiqətlərini qəhrəmancasına car çəkməsi ilə bağlı hissələrdir. Bu hissələrdə ədib Qurani-Kərimdən tutmuş ta Yezid sarayına gəlmiş xarici diplomatlaradək gümanı gələn hər şeyi Kərbəla həqiqətlərinin dilə gətirilməsi üçün vasitəyə çevirmiş, ilhamını və təxəyyülünü var gücü ilə bu ali məqsədə xidmət etməyə yönəltmişdir; məs.: "Və Ömər Sə'd Kərbəladan rəvan olub Kufəyə yetdikdə şühəda başların nizələr üzrə tə'biyə qılub və müxəddərati-xanədani-ismət əmarilərin tərtiblə rəvan edüb, ələmlər açdırub, nəqarələr çaldırub şəhrə mütəvəccih oldular. Şe'r:

Amaci-navəki-nəzəri-mərdüm olmağa
Başlar dizildi nizəyə zərrin qəbəq misal.
Təqdirdən zəmanəyə hökm oldu qaliba
Kim, sərbülənd qıl buları, qılma paymal.

Übeydullahi-Ziyad Ömər Sə'din gəldigindən vaqif olub, bargahi-həşmətin ənvai-zibü ziynətlə arayiş qılub bin müsəlləh mübariz tə'yin etdi ki, dərvazələri və məhəllələri zəbt edüb fitnədən ehtiyat edələr və münadi nida yetürdi ki, cəm'i-xəvasü əvam istiqbala çıxalar. Təmamiyi-şəhr bə'zi təhniyə təriqiylə və bə'zi tə'ziyə iste'dadiylə istiqbal edüb, ol gün bir qovğavü izdiham oldu ki, kəsrəti-xəlidən ləşkəri-Ömər Sə'd sabah dərvazədən girib vəqti-əsr qəsri-əmarəyə yetdilər. Rəvayətdir ki, əhli-Kufə məhfəl ətrafında qülüvv qılub, təəssüflər çəküb fəğan edərlərdi. Zeynəb binti-Əli müttəle' olub, hövdəcdən zəbani-tə'n açub ayıtdı: "Ey əhli-Kufə, siz peyğamlar və məktublar irsal edüb Hüseyni bu diyara gətirdiniz və siz nəqzi-əhd edüb, Müslimi öldürüb, bizi bu məqama yetirdiniz. Yenə siz təəssüf edüb növhə qılırsuz?!" Şe'r:

Ey əhli-Kufə, adətiniz məkr imiş müdam,
Ey əhli-Şam, hiylə imiş rəsminiz təmam.





Gəh sə’y edərsiz Ali-Rəsulun qitalinə,
Gəh matəmin dutub ana eylərsiz ehtiram.

Əhli-Kufə arasında bir piri-kühənsal ayıtdı: “Ey Xatuni-Qiyamət, bu kəlimatində sadiqsən: “Yəqulunə bi-əlsinətihim maleysə fi qulubihim”. Həqqa ki, bu bədnamlıq Kufə əhlindən Qiyamətədək mərfu’ olmaz”[308].

*(Ömər Səd şühəda başlarını nizələrə keçirib, təbil çaldıra-çaldıra Kufəyə daxil oldu. “Camaatın oxtək baxışlarının hədəfinə çevrilsin deyə tabağa qızıl-zinət əşyaları düzüldüyü kimi, şəhidlərin də başları nizəyə vuruldu. Yəqin ki, bu, qəzavü qədərin zəmanəyə olan hökmü idi: “Ey zəmanə, bu yolla sən şəhid başlarını başıuca et. Qoyma ki, onlar ayaqlar altına düşərək tapdalansınlar”.*

*İbn Ziyad Ömər Sədin gəldiyini eşidib sarayını növbənöv zinətlərlə bəzədi və min nəfər silahlı döyüşçü təyin etdi ki, darvazaları və məhəllələri hər cür fitnədən qorusunlar, göstəriş verdi ki, bütün camaat istiqbala çıxsın. Şəhərin bütün əhalisi cəm oldu. Onların bəzisi təhliyə, bəzisi isə təziyə təriqi ilə gəlmişdi. Nəticədə o qədər adam toplandı ki, Ömər Sədin dəstəsi səhər şəhərin darvazasından daxil oldu və yalnız günorta çağı saraya yetişə bildi.*

*Rəvayətdir ki, Kufə əhli təəssüflər çəkib fəğan edirdi. Xanım Zeynəb onları görüb buyurdu: “Ey Kufə əhli, siz məktubla xəbər göndərib Hüseyni bu diyara dəvət etdiniz və siz əhdi pozub, Müslümü öldürüb, bizi bu hala saldınız. İndi isə təəssüflənib növhə deyirsiniz?!”*

*“Siz ey kufəlilər, artıq hiyləgərliyi özünüz üçün bir adət-ənənə şəklinə salmısınız. Siz şamlılar isə dünyada bu sifətlə tanınırsınız. Axı bu necə olur ki, hərdən Peyğəmbər soyunun kökünü kəsmək uğrunda səfərbər olursunuz, hərdən də onlar üçün yas saxlayaraq onlara hörmət-izzət göstərirsiniz?!”*

.................................

[308] *Yenə orada, səh. 346-347*





*Kərbəla camaatının içərisindən bir qoca dilləndi: "Ey xatuni-Qiyamət, bu sözlərin doğrudur. "Qəlblərində olmayan şeyi dilləri ilə söylərlər. Bu bədnamlıq Kufə əhlindən qiyamətədək getməz").*

Kərbəla vaqeəsindən dərhal sonra baş verən hadisə və əhvalatların isti izlərlə təsviri olan bu hissədə hər personaj öz yerindədir. Belə ki, əgər Ömər Səd "qalibiyyətini" özündən bir pillə yuxarı idarəediciyə – Übeydullah ibn Ziyada çatdırmaq halında və Übeydullah ibn Ziyad da bunu cəmiyyətə həzm etdirərək ictimai rəyi öz lehinə çevirmək üçün çalışırsa, xanım Zeynəb (s.ə) bir an belə vaxt itirmədən ictimai obyektin rəyi olan əhaliyə üz tutur, onlarla təsirli bir dillə danışır və beləliklə də İmam Hüseyn hərəkatının məğzini çatdırmaq məqsədinə qulluq edən möhtəşəm təbliğinə, ardıcıl təbliğat işinə başlamış olur. Bu uca məqsəd az sonra küçə və məhəllələrdən saraylara keçir. Biz xanım Zeynəbi (s.ə), İmam Zeynəlabidini (ə) Übeydullahın və Yezidin saraylarında danışan, nitq söyləyən, mübahisə edən, mükalimə aparan və bu yolla da mübarizəyə qalxan görürük. Görürük ki, hər iki Kərbəla qəhrəmanı bu murdar və idbar idarəedicilərin hansı pillədə durmasından asılı olmayaraq, Quran ayələri və Peyğəmbər hədisləri ilə onların əhdini kəsir, ortaya qoyduqları məntiqi dəlillərlə Ömər Səddən Yezidədək hər birinin eybəcərliyini bütün aydınlığı və genişliyi ilə açıb göstərir. Məsələn, "Əlqissə, Übeydullahın məclisinə Əhli-beyt hazır olduqda Zeynəb cümlədən müqəddəm məclisə qədəm dutdu. Übeydullah anın istiğnasından qəzəbnak olub ayıtdı: "Bu kimdir ki, hənuz əsəri-tüğyan surəti-əhvalında məlhuz olunur?" Dedilər: "Bu, Zeynəbdir, həmşireyi-Hüseyn". Übeydullah ayıtdı: "Ey xatun, şükrü sipas ol Mə'buda ki, sizi xassü amm içində rüsva qılub bütlanınızı zahir etdi və seyqəli-ianətilə mir'ati-mülkümüzdən zəngi-küdurət getdi". Zeynəb ayıtdı: "Kəzəbtə ya əduvə'llah". Ey kəzzab, sipasi-biqiyas ol Vacibülvücuda ki, bizim xanədanımızı şərəfi-



nübüvvətlə müəzzəzü mükərrəm qılub. "İnnəma yuridullahu li-yuzhibə ənkumu'r-ricsə əhlə'l-beyti" işarətiylə səadəti-"Və yutəhhirəkum təthirən" kəramət qıldı və bədxahımızın dideyi-bəsirətlərin ə'ma qılub, "Və ləhum əyminun la-yubsirunə biha və ləhum azanun la-yəsmə'unə biha" badiyəsində heyran edüb daireyi-heyrətə saldı". Übeydullahi-Ziyad ayıtdı: "Ey fərzəndi-Əli ibn Əbi Talib, nə e'tiqadun var bizim qalib və sizin məğlub olduğunuz xüsusunda?" Zeynəb ayıtdı: "Ey zalim, bizə vaqe' olan əhvaldan cəddimüz xəbər vermişdir, vüquinə müntəzir idik. Əl-minnətu lillah ki, cəddimizin sidqi-qövlinə surəti-əhvalımız məzhər [vaqe'] olub, dərəceyi-iqbali-"İnnə'llahə mə'ə'ssabirin" müyəssər oldu. Ənqərib sizə dəxi hər kimin sərəncamı nə olduğu mə'lum olacaqdır və hər kim cəzayi-əməlin kargahi-Ədldən bulacaqdır: "Və bəşşiri'l-munafiqinə bi-ənnə ləhum əzabən əlimən". Übeydullah ayıtdı: "Ey binti Əbu Turab, hala bu bir səadətdir ki, zəmirimiz sizin tüğyanınızdan fariğ oldu və istilayi-qürurunuz təskin buldu". Zeynəb ayıtdı: "Ey ibn Mərcanə, qüruri-əsbabi-dünyayla sərməst olub bir padişah qəsdin etmişsən ki, cəmi'i-əfradi-afəriniş təhti-livayi-imamətində və rizayi-Xuda və Rəsul şərəfi-itaətində idi". Şe'r:

Hüseyn ibn Əli ibn Talib kim, andandır,
Binayi-şər'ə istehkamü dini-Həqqə iste'la.
Müəzzəm cəddi-valası, nəbiyyi-ümmiyi-Məkki,
Mükərrəm babi-ilqasi Əliyyi-aliyi-ə'la.

Übeydullahi-bədbəxt ol kəlimatdan mütə'əzzi olub qətlinə əmr etdi. Ömər bin Hüreysi-Məxzumi hazır idi, fəryada gəlüb ayıtdı: "Ey zalim, bir qəribin ki əkabiri məqtul olub, əsağiri-yetim və əsir olmuş ola, əgər hərqəti-qəlb və hərarəti-cigərdən diliranə təkəllüm qıla, əcəb olmaz?" Şe'r:

Sən nə agəhsən ki, suzi-atəşi-möhnət nədir?
Məsnədi-rahətdə mülkü mal ilə məğrursan.





Dərd əhli halını aləmdə dərd əhli bilür,
Səndə yoxdur dərd, ey bidərd, sən mə'zursan.

Übeydullah Zeynəbdən inhiraf edüb, Əliyyi-Zeynəlabidinə təvəccöh qılub ayıtdı: "Bu kimdir?" Dedilər: "Əli bin Hüseyn". Dedi: "Əli bin Hüseyn məqtul olduğu istima' olundu". Dedilər: "O, Əliyyi-Əkbər idi". Həzrəti-İmam Zeynəlabidin mütəhəmmil olmayub ayıtdı: "Vəllahu innə ləhu mutalibən yövmə'l-qiyaməti". "Ey Übeydullah, ol bənim bəradəri-büzürgvarım idi, ol bənim ümidgahım və istizharım idi. Həqqa ki, axirətdən müqəddəm dünyada anın intiqamın alanlar ənqərib peyda olur". Übeydullah qəzəbnak olub buyurdu ki, ol məzlumu qətl edələr. Zeynəb dəsti-mübarək həzrəti-imamın daməni-şərifinə möhkəm edüb bünyadi-növhə qıldı ki: "Ey bədbəxt, əgər hənuz atəşi-tüğyanun seyli-xuni-şühədayi-Əhli-beyti-Mustəfadan təskin bulmadıysa və hərarəti-isyanın şəhidlər qanın içməkdən sakin olmadıysa, bu məzlum yerinə bəni şəhid et ki, buna mütəərriz olma, zira bundan qeyri xanədani-nübüvvətdə və dudmani-risalətdə məhrəm qalmamışdır". Həzrəti-İmam Zeynəlabidin əmmeyi-möhtərəməsindən inani-təkəllüm alub, meydani-fəsahətə rəxşi-ibarət salub göftara gəldi ki: "Ey ibn Mərcanə, bana qətldən təvəhhüm verürsən. Bilməzmisən ki, bizə qətlü qital sərmayeyi-feyzi-şəhadətdir və həmişə cəza qılub şəhid olmaq adətdir. Peyvəstə nihali-həyatımız zülali-şəmşiri-abdarla səbzü xürrəmdir və həmvarə riza qəzaya verməк və məsayibə səbr eyləmək bizə müsəlləmdir". Şe'r:

Qətldən xövf verən əhli-Həqə, bilməz kim,
Dam olur əhli-Həqə daireyi-qeydi-həyat.
Dəhr bir mənzili-möhnətdirü qəm, ey qafil,
Və'deyi-qətldədir müjdeyi-tövfiqi-nəcat.





Übeydullahi-Ziyad gördü ki, məsduqeyi-"Və ma-yəntiqu əni'lhəva" vaqe' olan qövmlə münazirə faidə qılmaz və mütəəllimi-məktəbi-"Və ələm-hu şədidü'l-quva"ya mübahisədə qalib olmaq olmaz, naçar sakit olub mülazimlərinə əmr etdi ki, ol məzlumlara qəsrdən dışra came'i-Kufəyə [qərib] bir mənzil tə'yin edüb əhli-şəhri ixtilatlarından mən' edələr. Bir neçə gündən sonra təhiyyeyi-əsbabi-səfər edüb Zübeyr bin Qeys və Həsin bin Müğeyrə və Şimri-Zilcövşənə beş bin müsəlləh namərd qoşub Əhli-beyti şühəda başlarıyla canibi-Şama rəvan etdi"[309].

*(Xülasə, Əhli-beyt ibn Ziyadın məclisinə gətirilərkən xanım Zeynəb (s.ə) hamıdan əvvəl içəri daxil oldu, salam vermədən bir guşədə dayandı. İbn Ziyad bundan qəzəblənib dedi: "Bu kimdir ki, surətində hələ də üsyan əsəri var?" Dedilər: "Bu, Hüseynin bacısı Zeynəbdir". İbn Ziyad dedi: "Ey xatun, Allaha çox şükürlər olsun ki, sizi camaat içində rüsvay edib aləmə tanıtdı, sizi qəhr etməklə bizim mülkümüzdən küdurəti götürdü". Xanım Zeynəb dedi: "Yalan dedin, ey Allahın düşməni. Ey kəzzab, çox şükürlər olsun o Vacibülvarlığa ki, bizim xanədanımızı nübüvvət şərəfi ilə əziz və mükərrəm edib, "Ey Əhli-beyt, Tanrı sizdən pisliyi yox etmək istəyir" işarəsi ilə "Sizi pak və tər-təmiz etmək istəyir" ("Əhzab", 33) səadətini lütf etdi və bədxahlarımızın bəsirət gözünü kor edib "Gözləri var, görməz, qulaqları var, eşitməz" ("Əraf", 179) səhrasında avara qoyaraq mat-məəttəl elədi". İbn Ziyad dedi: "Ey Əbu Talib övladı, bizim qalib, sizin məğlub olmağınız barəsində nə sözünüz var?" Zeynəb həzrətləri buyurdu: "Ey zülmkar, bizim başımıza gələn bu müsibəti cəddimiz Peyğəmbər xəbər vermişdi. Biz onu gözləyirdik. Allaha çox şükürlər olsun ki, biz cəddimizin sözünün doğruluğunu sübuta yetirdik və "Allah səbir edənlərlə bərabərdir" ("Bəqərə", 153) iqbalının dərəcəsi bizə müyəssər oldu. Tezliklə sizə də hər kimin sərəncamı nə olduğu məlum olacaqdır və hər kəs*

.................................

[309] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, səh. 347-350*





*əməlinə görə cəza alacaqdır. "Özləri üçün acıqlı bir əzab olduğunu münafiqlərə müjdə ver!" ("Nisa", 138) İbn Ziyad dedi: "Ey Əbu Talibin qızı, indi bu bir səadətdir ki, ürəyimiz sizin tüğyanınızdan azad oldu və qürurunuz yatdı". Zeynəb buyurdu: "Ey Mərcanənin oğlu, dünyanın qürur verən cəhətləri ilə sərxoş olub, bir padişaha qıymısan ki, yaranışdan üzü bəri hər kəs onun imamlıq bayrağı altında Allah və Peyğəmbərinin itaət şərəfinə nail olmuşdu.*

*Sənin haqsız yerə və zülmlə qətlə yetirdiyin şəxsiyyət şəriət tikilisinin özülü və haqq dininin sütunu olan Əbu Talib oğlu Əli oğlu Hüseyndir. Bəs sən bilmirdinmi ki, onun uca babası Qurani-Kərimdə "Ümmi" və "Məkki" kimi yüksək sifətlərlə səciyyələndirilən sonuncu Peyğəmbər, adı çəkildikdə "Allah həmişə üzünün nurunu artıq eləsin!" deyə salam-salavat göndərilən kəramətli atası isə ucalar ucası olan Əli (ə) həzrətləridir?!"*

*İbn Ziyad məlun bu mükalimədən qəzəblənib Zeynəbin qətlinə fərman verdi. Orada olan Ömər ibn Hüreysi Məxzumi fəryada gəlib dedi: "Ey zalım, böyükləri qətlə yetirilib, kiçikləri yetim və əsir olan bir qəribin canı odlu olar, hər nə desə, fikir verməzlər".*

*"Kədər odunun yanğısını sən haradan bilə bilərsən? Axı sən özün rahat hakimiyyət taxtında malına-mülkünə güvənərək lovğa-lovğa ömür sürmüsən. Dünyada dərdlilərin nə çəkdiyini yalnız dərdlilər bilər. Ey dərdsiz, sənin heç bir dərdin olmadığına görə sən bu barədə üzrlüsən".*

*İbn Ziyad xanım Zeynəbdən qurtarıb İmam Zeynəlabidinə tərəf dönüb soruşdu ki, bu kimdir? Dedilər: "Əli ibn Hüseyn". Dedi: "Əli ibn Hüseynin qətlə yetirildiyini eşitmişəm". Dedilər: "O, Əliyyi-Əkbər idi".*

*Zeynəlabidin həzrətləri dözməyib buyurdu: "O, mənim böyük qardaşım idi. O, mənim ümidgahım və havadarım idi. Axirətdən əvvəl dünyada onun intiqamını alanlar tapılacaq!"*

*İbn Ziyad özündən çıxıb əmr etdi ki, o məzlumu qətlə yetirsinlər. Xanım Zeynəb mübarək əliylə imam həzrətlərinin*



*ətəyindən yapışıb növhə ilə fəryad qopardı ki, "ey bədbəxt, əgər Əhli-beyti-Mustafa şühədasının qanını axıtmaqla ürəyin soyumayıbsa və şəhidlərin qanını içməkdən doymamısansa, bu məzlumun əvəzinə məni şəhid et, ancaq buna toxunma! Çünki nübuvvət xanimanında və vilayət dudimanında bundan başqa heç bir məhrəm qalmamışdır!"*

*İmam Zeynəlabidin həzrətləri möhtərəm bibisindən icazə alıb fəsahətli bir dillə danışmağa başlayıb buyurdu: "Ey ibn Mərcanə, məni öldürməklə qorxudursan, bilmirsənmi bizə qətl fəzilət sərmayəsi olaraq şəhadətdir və həmişə bəla çəkib şəhid olmaq bizə adətdir?! Kövrək ömür ağacımız qılınc qanı ilə suvarılaraq göyərir. Qəzaya riza verib müsibətlərə səbir eləmək bizim şanimizə aiddir.*

*Haqq-həqiqət yolçularını ölümlə qorxudan kimsə həyata yersiz bağlanmağın belə uca amallar uğrunda çarpışanlar üçün tələdən, tordan başqa bir şey olduğunu axı haradan bilsin? Bu dünya yalnız bir qəm-kədər evidir. Ey nadan, qurtuluş uğurunun muştuluğu yalnız qətlə yetirilmək yəqinliyindədir".*

*İbn Ziyad Peyğəmbər övladı ilə mübahisə etməyin yersiz olduğunu görüb istər-istəməz sakitləşdi və adamlarına əmr etdi ki, o məzlumlara qəsrdən kənarda bir mənzil versinlər, camaatı da onlarla danışmağa qoymasınlar.*

*Bir neçə gündən sonra o, Zübeyr ibn Qeys Həsin bin Müğeyrə və Şimri-Zilcövşənə beş min silahlı adam qoşub Əhli-beyti şühədanın başları ilə birlikdə Şama tərəf yola saldı).*

Göründüyü kimi, Übeydullah ibn Ziyad Kərbəla vaqeəsinin şərəfli nəticəsini özü və təmsil etdiyi iqtidar üçün başıucalıq, İmam Hüseyn və tərəfdarları üçün isə ictimai rüsvayçılıq və ilahi qəzəb hesab edir. Xanım Zeynəb cavab nitqini büsbütün Quran ayələri üzərində qurmaqla onun olub-qalan zahiri məntiqini islami əsaslarla darmadağın edir. Ancaq Übeydullah çox həyasızlaşdığından Əli qızının səlis məntiqi ilə susmur, yenidən murdar və idbar iç üzünü açıb göstərərək



danışır. Xanım Zeynəb bu dəfə gətirdiyi ayələri daha dərindən açıqlayır. Amma bu da düşmənin qəsavətli qəlbinə, durğun beyninə təsir göstərmir və o, "Bu bir səadətdir ki, ürəyimiz sizin tüğyanınızdan azad oldu" deyə öz məhdud ağlı ilə nəticə çıxarmağa can atır. Xanım Zeynəb bu dəfə son öldürücü zərbəni vuraraq Übeydullah ibn Ziyadı açıq-aşkar "qatil" adlandırdıqda tamamilə məntiqsiz qalan düşmən yeganə silahı olan zora, hədəyə əl atır.

İmam Zeynəlabidinin bu ölüm təhdidi ilə bağlı cavabı istəkli bibisinin nitqinin ardı kimi daha dəqiq dəlil-sübuta əsaslanır, daha kəskin və kəsərli səslənir. Belə ki, onun şəhidliklə bağlı sözləri "Xatimə"nin başlanğıcında bu haqda verilmiş mənqəbənin əyani təsdiqi, təzahürü və tətbiqi səciyyəsini alır.

* * *

Bu deyilənlər danılmaz biçimdə göstərir ki, Füzuli "Hədiqə"nin "Xatimə"sini, sözün gerçək anlamında, əsərinin təkcə ədəbi-bədii yekunu kimi yox, qaldırdığı, qoyub həllinə çalışdığı məsələlərin, toxunduğu mətləblərin, irəli sürdüyü ideyaların dini-tarixi və ictimai-mədəni nəticəsi kimi də nəzərdə tutmuş, qarşısına qoyduğu bu uca məqsədə nail olmuşdur.





# FÜZULİNİN “İMAM HÜSEYN” MƏRSİYƏSİ

Mərsiyələr başlanğıcını əski dünyanın sakral duyğu və düşüncələrindən götürən ağıların klassik-kitab üslublu davamıdır. Mərsiyələr orta əsrlər Şərq ədəbiyyatında da ümummüsəlman mədəniyyətinin ortaq dəyəri kimi həmişəişlək və çevik olmuş, qohum-əqrəbalarının, ustad və müəllimlərinin, el ağsaqqallarının, tanınmış və xeyirxah dövlət xadimlərinin, nüfuzlu ruhanilərin, hökmdarların, eləcə də öz sənət yoldaşlarının vəfatı ilə bağlı təəssüratlarını əlvan və rəngarəng boyalarla tərənnüm etmək üçün şairlərin qarşısında geniş yaradıcılıq üfüqləri açmışdır. Tədricən qəsidənin bir növünə çevrilən mərsiyələr vaxt ötdükcə mövzu-məzmun və üslub baxımından genişlənmiş, daha yaşarı, daha cəlbedici bir yön almışdır. Özlüyündə bütöv bir “İmam Hüseyn” elegiyası olan “Hədiqətü-s-süəda”nın iri bir mərsiyə ilə bitməsi ulu Füzulinin də bu şeir növünə yüksək dəyər verdiyini, onun fundamental bir əsəri bitirmək üçün ən əlverişli bir ədəbi yekun saydığını göstərir.

Maraqlıdır ki, Füzuli “Hədiqətü-s-süəda”da “mərsiyə” sözünü həm sadə bir leksem kimi, həm də ədəbi bir istilah olaraq işlətmişdir. Aşağıdakı parça bu işlənmə məqamlarının islami çərçivədə olmasından soraq verir: “Üyunir-r-riza”da qeyd olunur: “Dəil Xüzainin övladı rəvayət etmiş ki, atam vəfat edərkən onun rüxsarını qara görüb xeyli heyrətləndim.





Bir gecə yuxumda gördüm ki, atam əynində faxir bir libas şad və gülər üzlə cənnət içində seyr edir. Dedim: "Ey ata, vəfat etdiyin zaman əhvalın belə deyildi. İndi isə surəti-halında saleh adamların nişanəsi var. Bunun hikməti nədir?" Dedi: "Ey əziz övladım, üsyankar şəkildə dünyadan köçdüm. Amma Həzrət Rəsul məndən soruşdu ki, Kərbəla şəhidlərinin mərsiyəsində nə demisən, onu təkrar et! Mən də həmin mərsiyəni söylədim. Bu beyt də həmin mərsiyədəndir: Şe'r:

La əzhəküllahi səqrə'd dəhri in zəkikət,
Və ali-Əhməd məzluminə qəhrən.
*(Allah fələyi əsla güldürməsin, çünki*
*Əhmədin övladları məzlumcasına qəhr oldular!)*

Mən oxuduqca Həzrət Rəsul (s) riqqət edib ağlayırdı. Tamam olduqda əynindəki libası mənə hədiyyə verdi və günahlarıma şəfi' oldu". Şe'r:

Əhli-beytin sənavü mərsiyəsi
Əhsəni-əfzəli-fəzayildür.
Kim ki bir beyt ol xüsusda deyər,
Ol dəxi Əhli-beytə daxildür[310].

Göründüyü kimi, "Üyunir-r-riza" kitabı *vəfat zamanı, cənnət seyri, saleh adamların nişanəsi, hikmət, Həzrət Muhəmməd (s), Əhmədin övladları, məzlumiyyət, günahkarlıq, şəfaət, Əhli-beyt* məfhumları parçanın sırf islami məzmun daşıdığını bildirir. Deməli, belə zəngin islami məzmun daxilində işlənən "mərsiyə" sözü, hətta haqqında danışılan şeirdən beyt verilməsi istər-istəməz parçanı Füzulinin ədəbi-nəzəri görüşləri yönündə dəyərləndirməyə sövq edir. Bu dəyərləndirmə ilə bağlı ən önəmli cəhətlər bunlardır:

.................................

[315] *Füzuli. Kərbəla vaqiəsi, sadələşdirəni: Hafiz Abıyev, Bakı, 1996, səh.174-175*



1. Bir şeir növü kimi mərsiyə ilk növbədə ilahiyyat aləmi ilə bağlıdır. Bəllidir ki, Füzulinin gözündə söz, hər şeydən öncə, ulu Tanrının yaranmışların əşrəfi olan insana ən gözəl bəxşişidir:

Behəqarət nə təvan kərd nəzər suye-soxən!
Soxən anəst ke, əzərşe-bərin aməde əst!
Dele-ma meyli-soxən çun nə konəd, kan qovhər
Xas əz bəhre-dele-ma bezəmin aməde əst![311]

*Sözə xor baxmaq olmaz, hər bir söz*
*Ərşdəndir, gəlib hədiyyə bizə.*
*Qəlbimiz meyil edir həmişə ona,*
*Çünki söz nazil oldu qəlbimizə![312]*

Soxən gəncineye-feyze-ilahist!
Nəmikərdət kəm əz sərfe-dəmadəm.
Nə gənce-padişahane-məcazist
Kəz u gər Həbbeyi giri, şəvəd kəm![313]

*İlahi feyzdən bir xəzinədir söz,*
*Tükənməz sərf qıldıqca dəmadəm.*
*Məcazi şahların gənci deyil bu*
*Ki, bir Həbbə götürdükdə olarkən![314]*

Farsca divanındakı bu poetik qeydlərini "Hədiqətü-s-süəda"dan gətirilmiş yuxarıdakı parçanın ümumi məzmununa qovuşdursaq, şairin belə bir qənaəti aydınlıq qazanar ki, Allahın bəşəriyyətə bəxş etdiyi ən kamil şəxsiyyətlər sırasında yer alan İmam Hüseyn (ə) haqqında yalnız ilahi bəxşiş olan sözlə danışılmalıdır. Ona görə ki, Ulu Yaradanın qüdrət və hikmət

.................................

[311] *Füzuli. Farsca divan, hazırlayanı:Hasibə Mazıoğlu, Ankara, 1962, səh. 2*

[312] *Füzuli. Əsərləri, 5 cilddə, III cild, Bakı, 1958, səh. 14*

[313] *Füzuli. Farsca divan, səh.2*

[314] *Füzuli. Əsərləri, III cild, səh. 14*





təzahürü olan o ulu din böyüyünə məhz Tanrı xəzinəsindən gələn söz yaraşır.

2. Bir şeir növü kimi mərsiyə ən dəruni duyğu və hisslərin məhrəm ifadəsidir. Bu məhrəmlik laylalar qədər doğmadır; "Müxtəsər türki-divan"ının "Dibaçə"sində – "Türkcə yığcam şeirlər toplusu"nun "Ön söz"ündə əksini tapmış mülahizə və müddəalar da bunu təsdiq edir:

Zəhi, Sani ki lövhi-canə kirki-hüsni-töfiqi
Əzəldən iqtizayi-nəzmi-canpərvər rəqəm qılmış![315]

*(Nə gözəldir ki, Ulu Yaradan başlanğıcdan özünün uğurlu gözəllik gələmilə insanın ruh lövhəsinə canlandırıcı poeziyanın qaçılmazlığını həkk etmişdir!).*

Kəmali-şe'r kəsbi mümkün olmaz bimədəd Ondan,
Ona minnət ki, təb᾿i-nəzm lütf etmiş, kərəm qılmış![316]

*(Əgər Onun daimi yardımı olmazsa, poeziya ilə bağlı dolğun və tutumlu bilgi qazanmaq imkan xaricində olar. Məhz O, boynumuza minnət qoyaraq şeir yazmaq üçün bizə ilham vermiş və mərhəmət göstərmişdir).*

Göründüyü kimi, *lövhi-can, əzəldən, iqtiza, rəqəm qılmış* ifadələri poeziyanı və onun ayrılmaz hissəsinə çevrilən mərsiyələri şairin insan təbiətinin bir parçası saydığını göstərir. Əgər belə olmasaydı, Füzuli "O yerin-göyün Qurucusuna hədsiz sənalar olsun ki, nəzmin "Bismillah"ını Quranın başına tac eləyib, irfan əhlinin könül tarlasına mövzun kəlam sevgisi fidanı əkibdir"[317] deməzdi və "Bəsmələ" kimi, Quran kimi mötəbər islami anlayışları "nəzm" kimi, "kəlam" kimi nisbətən aşağı səviyyəli ədəbi anlayışlarla yanaşı qoymazdı.

..................................

[315] *Füzuli. Əsərləri, 5 cilddə, I cild, səh. 39*

[316] *Yenə orada*

[317] *Yenə orada*





3. Ən nəhayət, hər bəndənin kiçik qiyaməti sayılan ölüm aktı ilə birbaşa bağlı olduğundan mərsiyələr, əslində, ömrün mənası, həyatın dəyəri, hadisələrin gedişatı, bəndə-Allah münasibətləri yönündə geniş ictimai-fəlsəfi məzmun qazanan şeir növüdür. Ötəri deyildir ki, fəlsəfi traktat olan “Mətlə’ü-l-e’tiqad”da Füzuli dünyanın dərkindən danışarkən poeziyanı da onun ahəngdarlıq və harmoniyasınıda səciyyəvi misala çevirir; məs.: “Fəaliyyətsizlik və laqeydlikdən çəkinərək, ömrümü qəflətdə korlamaqdan saqındım və işlərdən birini seçdim ki, onunla qismətim, bacarığım qədər bilik kəsb edim. Məni bu işə təşviq edən “Elmləri, hətta sehri də öyrənin!” hədisi olub. Həm də Allah “Biz Ona (Məhəmmədə) şeir öyrətmədik” *(“Yasin”, 69)* deməklə məni öyrətmişdir. Beləliklə, mən sözləri nəzmə çəkmək yoluna düşdüm və bu yolda kainatın nizamını, hikmətini dərk etdim. Mənim nəzmim mənə göstərdi ki, əşyadakı ahəngdarlıq üçün bir nizamlayıcı, hissi və əqli rəqəmlər üçün də bir hesablayıcı olmalıdır. Buna görə də Onun tam mərhəmətindən yardım istəyərək, Onu tanımaq yolunu axtardım. Arzum budur ki, mən düz yola doğru istiqamət alım və O, mənə müvəffəqiyyət verməklə yardım etsin. Beləliklə, müxtəlif əqidə sahiblərinin təriqətləri ilə tanış oldum və onların faydalısını mənimsədim”[318].

Göründüyü kimi, sırf fəlsəfi bir mühakimə üzərində qurulmuş bu mətndə qəflətdən qaçmağa, elm-bilik qazanmağa, şeirin, sənətin yerini bilib, onları ilahi dəyərlərə tay tutmaqdan çəkinməyə toxunulur. Bütün bunları “Hədiqətü-s-süəda”dan gətirilmiş parçanın məfkurəvi qaynağı və ideya istiqaməti ilə qırılmaz bağlılıqda götürdükdə, aydın olur ki, Füzulinin gözündə mərsiyə görülmüş işlərin bədii hesabatı yerindədir. Şairin İmam Hüseyn üçün yazdığı mərsiyəni əsərinin sonuna salması da bundan soraq verir.

4. Parçada həm mərsiyədən nümunə verilməsi, həm də “mərsiyə” sözünün ədəbi termin kimi işlədilməsi Füzulinin

[318] *Füzuli. Əsərləri, V cild, Bakı, 1985, səh. 87*





ədəbi-nəzəri görüşləri baxımından bir xeyli dəyər qazanır. "Allah fələyi əsla güldürməsin! Çünki Əhmədin övladları məzlumcasına qəhr oldular" şəklindəki nümunə, müəllifinin kimliyindən asılı olmayaraq, bir daha şairin Yezid idarə üsuluna açıq etirazı kimi önəm qazanır ki, bunun özü də mərsiyə-şeir növünə dəlalət edir.

Parçadakı poetik örnəyə gəldikdə isə, göstərmək gərəkdir ki, "Əhli-beytin sənavü mərsiyəsi" misrası bu şeir növünə Füzulinin bir alqış, bir dua kimi də baxdığını sübuta yetirir. Bu isə birmənalı surətdə dünyagörüş məsələsi olub, estetik səciyyə daşıyır. Deməli, Füzulinin gözündə mərsiyə ilk növbədə din böyüklərimizin əlçatmaz-ünyetməz məziyyətlərinin bədii ifadəsinə qulluq etməli olan bir şeir növüdür və yalnız bu yolda işlədilməlidir. "Əhsəni-əfzəli-fəzail" – *Əhli-beytin ən yüksək məziyyətləri* olan bir şeir növünə başqa cür yanaşıla da bilməz!

"Kim ki bir beyt ol xüsusda deyər, Ol dəxi Əhli-beytə daxildir!" beytini isə "Hədisi-ərbə'in"in "tərcümə"sinin sonundakı bəndin ideya istiqamətində qavraya bilərik:

Əsəri-ərbə'ini əhli-süluk
Qürbi-Həqq rütbəsin qılır hasil.
Umarız kim, Füzuliyi-miskin
Ola bu ərbə'in ilə vasil![319]

*(Din böyüklərindən nəql olunan "Qırx hədis"in mənəvi təsiri (ədibi) Tanrıya yaxınlıq rütbəsinə yüksəldər. Miskin Füzulinin də bu yolda qələm çalmaqla həmin dərəcəyə çatmasını gözləyirik).*

Şair burada üstüörtülü biçimdə söylədiyi fikri tərcüməyə yazdığı yığcam ön sözdə Peyğəmbərin (s) hədisi ilə açıq ifadə edir.

.................................

[319] *Füzuli. Əsərləri, II cild, səh.295*





Göründüyü kimi:

Kim ki bir beyt ol xüsusda deyər,
Ol dəxi Əhli-beytə daxildir! –

deyən Füzuli bir qədər ərköyünlük etmiş, qail olduğu Peyğəmbərinə (s) ürəkdən ərk edərək, onun sadiq ardıcılları sırasında yer almaq diləyini mübaliğəli şəkildə bildirmişdir. Nümunələrdəki *Əsəri-ərbə῾ini əhli-süluk* və *bir beyt, Qürbi-Həqq rütbəsi* və *Əhli-beyt* tərkibləri məna və məzmunca üst-üstə düşməklə bu deyilənləri əyani surətdə təsdiq edir.

Beləliklə, aydın olur ki, ədəbi-nəzəri yöndə gözdən keçirdiyimiz bu dağınıq qeydlər belə Füzulinin mərsiyəyə yaşarı və canlı həyat həqiqəti, çevik və işlək bədiiyyat faktı, dərin və tutumlu estetik stimul kimi baxdığını, bu şeir növünün incəliklərindən bütün aydınlığı və genişliyi ilə barınmaq istədiyini, ən müxtəlif yaradıcılıq istəkləri yönündə ondan ustalıqla yararlandığını göstərir.

* * *

Sovet quruluşu dağılar-dağılmaz mərsiyə ədəbiyyatşünaslarımızın diqqətini çəkmişdir. Məsələn, Milli Elmlər Akademiyasının Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu hələ 1990-cı ildə "Dahilərin göz yaşı: mərsiyələr" (tərtibçilər M.Əliyev və A.Ramazanovdur) başlıqlı toplunu çox doğru olaraq bu şeirlə başlamışdır. Şeir kitabda "Mərsiyə dər Həqqi-Xamisi-ali-əba Həzrəti-Seyyidü-ş-şühəda" başlığı ilə verilmişdir.

Mərsiyə ikinci dəfə "Karvan" jurnalının 4-cü sayında "Hədiqətü-s-süəda" ozamankı ictimaiyyətə çatdırılarkən nəşr olunmuşdur (tərtibçi Oqtay Salamzadədir). Prof. Əliyar Səfərli ilə filologiya elmləri doktorları Möhsün Nağısoylu və Nəsib Göyüşov 1993-cü ildə "Hədiqətü-s-süəda"nı ayrıca kitab şəklində buraxdıqda mərsiyə özünün üçüncü nəşrinə qovuşmuşdur.





1994-1996-cı illərdə ölməz şairimizin anadan olmasının 500-cü ildönümü dünya miqyasında təntənəli surətdə keçirildi. Bu zaman sənətkarın ötən əsrin 50-ci illərində başlanıb 1980-ci illərində bitən beşcildliyi "Hədiqətü-s-süəda" da daxil olmaqla, altı cilddə yenidən işıq üzü gördü. Şeir külliyyatın altıncı cildində "Mərsiyeyi-həzrəti-İmam Hüseyn əleyhi-s-salam" başlığı ilə verilmişdir.

Bundan başqa, İran filoloqu Əmin Sadiqi, öz iddiasınca, "kamil tənqidi mətn" olan şairin "Türkcə divan"ını 1996-cı ildə Tehranda çap etdirmişdir. Əslində, Füzuli divanında olmayan mərsiyəni filoloq, yəqin ki, xoş niyyətlə nəşrə salmış, ona kitabın başında yer vermişdir. Lakin nədənsə mərsiyə kitabda "kamil tənqidi mətn"lə bir araya sığmayan yanlışlıqlarla getmişdir; məs.:

Əsmən bir misrasına hörmət var ikən,
Pamali-Xəsmi-bisərü pa qıldın, ey fələk![320]

Göründüyü kimi, birinci misra bütünlüklə anlaşılmır. Halbuki mərsiyənin o biri nəşrlərində misra, doğru olaraq, "İsmət hərəmsərasinə hörmət rəva ikən" kimi getmişdir.

Yaxud:

Olduqca əmrü rahət dili-kamiyab dəmi,
Olmuş həmişə həmdəmi-ğəm Şahi-Kərbəla![321]

Yenə də birinci misra anlaşılmır. Halbuki akademik nəşrdə oxuyuruq:

Olduqca ömrü, rahəti-dil görməyib, dəmi.

"Dahilərin göz yaşı"nda isə "dəmi" yerinə "dəxi" gedib ki, bu, olduqca təbii əlyazma fərqidir.

[320] *Füzuli. Türkcə divan, tərtibçi Əmin Sadiqi, Tehran, 1996*

[321] *Yenə orada*





Bu qeydlər göstərir ki, Azərbaycan türkləri sovet rejiminin əzici və boğucu mühitində də İmam Hüseyn (ə) adına, İmam Hüseyn əqidəsinə dəruni tələbat duymuş, bu yöndəki mənəvi boşluğu doldurmaq üçün fürsət gözləmişlər.

* * *

"Hədiqətü-s-süəda" 10 babdan, bir "Dibaçə" ilə bir "Xatimə"dən ibarətdir. "Xatimə" özü isə üç bölümə ayrılır ki, mərsiyə də onlardan biridir. Tərkibbənd şəklində yazılan bu şeir beş bənddir. Bəndlər istər mövzu və məzmun, istərsə də ideya-üslub baxımından ardıcıl olub, bir-birini tamamlayır.

Digər tərəfdən, mərsiyə 7-10-cu bablarda geniş təsvir olunmuş faciəvi hadisə və əhvalatların təbii sonluğu yerində çıxış edir. Bu deyilənləri, eləcə də mərsiyənin fikri axarını və bədii tutumunu ümumiləşdirməkdən ötrü bir şeiri hissə-hissə gözdən keçirməyi lazım bilirik:

Mahi-məhərrəm oldu, şəfəqdən çıxıb hilal,
Tökmüş, əza dutub qədi-xəm birlə, əşki-al!

*(Məhərrəm ayı gəldi, ay hilal şəklində şəfəqdən görünməklə (qəm-qüssədən) əyilmiş qəd-qaməti ilə İmam Hüseynə yas saxlayıb, qırmızı göz yaşları axıtmışdır).*

Mətnşünaslıq naminə mütləq deməliyik ki, bizə bəlli olan nəşrlərin heç birində beyt belə yazılmamışdır. Beytin bəlli yazılışları belədir:

Mahi-məhərrəm oldu, şəfəqdən çıxıb hilal,
Qılmış əza, töküb üzə xun birlə əşki-al![322]

Mahi-məhərrəm oldu, şəfəqdən çıxıb hilal,
Qılmış əza, töküb qədi-xəm birlə, əşki-al!

Mahi-məhərrəm oldu, şəfəqdən çıxıb hilal,
Qılmış əza, dutub qədi-xəm birlə, əşki-al!

.................................

[322] *Dahilərin göz yaşı, səh. 5*





Bu mətnlərin heç biri bədiilik və üslubiyyat baxımından elementar məntiqin tələblərinə cavab vermədiyinə görə biz məcbur olub, onların əsasında yuxarıdakı variantı müəyyənləşdirdik. Zənnimizcə, həmin variant mərsiyənin orijinalına yaxın olub, onun ideya-bədii təbiətinə daha çox uyğundur.

Övladi-Müstəfayə mədəd qılmamış Fərat,
Keçirməsinmi yerlərə ani bu infial!

*(Fərat çayı seçilmiş axırzaman Peyğəmbərin (s) balalarının dadına yetməmişdir. Bəs bu xəcalət hissi onu yerin dibinə soxmasınmı?).*

Çoxdur hekayəti-ələmi-Şahi-Kərbəla,
Əlbəttə, çox hekayət olur mövcibi-məlal!

*(İmam Hüseynin qəm-qüssəli sərgüzəştləri çoxdur. Heç şübhəsiz, sərgüzəştin çoxluğu dərd və kədəri də çoxaldar).*

Fəhm eyləsən qəmi-şühəda şərhin etməgə,
Hər səbzə Kərbəladə çəkibdir zəbani-hal!

*(Əgər insan qavraya bilsə (bütün aydınlığı ilə görər ki), Kərbəlada bitmiş hər bir kol-kos şəhidlərin qəmini açıqlamaq üçün öz təbiətlərinə uyğun olaraq dil açıb, dilə gəlib).*

Təcdidi-matəmi-şühəda qıldı ruzigar!
Zar ağla, ey könül, bu gün olduqca ehtimal!

*(Zəmanə Kərbəla şəhidlərinin matəmini təzələdi, odur ki, ey könül, nə qədər əlindən gəlir, bu gün onlar üçün hönkür-hönkür ağla!).*





Meydani-çərxi cilvəgəhi-dudi-ah qıl!
Gərduni-duni kəsvəti-matəmsiyah qıl!

*(Göy üzünü öz ahının tüstüsü ilə doldur, alçaq fələyi qara matəm libasına bürü!).*

Göründüyü kimi, mərsiyənin ilk bəndi mövzunun əlvan və rəngarəng boyalarla açımı yönündə bir çox mətləbləri əhatə edir. Məhərrəm ayı, ayın hilal vəziyyəti, yassaxlama, göz yaşı, Əhli-beytə sayğı, yardımlaşma, Fərat çayı, peşmançılıq duyğusu və vicdan əzabı, Kərbəla vaqeəsi ilə bağlı mənqəbələrin genişliyi və bunların doğurduğu bəşəri kədərin tərbiyəvi təsiri və mənəvi-əxlaqi çəkisi, İmam Hüseyn hərəkatının ictimai dərki, Kərbəlanın məxsusi ab-havası, hadisənin hər il qeyd olunmasının tarixi önəmi və bunun ruhi təmizliyə yol açması, ən nəhayət, mənfur Yezid idarə üsulunun ifşası bu sıradandır.

Əlbəttə, bu mətləblər hər biri üzərində ayrıca dayanıla biləcək qədər genişdir. Ancaq biz burada monoqrafiyanın o biri bölümlərində az toxunulmuş cəhətləri önə çəkəcəyik.

**1. "Hilal".** Bəllidir ki, Ay Yer kürəsinin peykidir. Ayla Yerin məsafəsi 360000-420000 km arasında dəyişir, ancaq bu məsafənin orta həddi 384000 kilometrdrdir.

Ayın Yer kürəsi ətrafındakı dövretmə müddəti 29,562 sutkadır. Bir sutka isə 23 saat 56 dəqiqə 4 saniyədir. Hilal ayın bu müddət ərzində aldığı dörd vəziyyətdən birincisidir.

Füzuli bu astronomik və təqvimi bilgiləri ustalıqla bədii motivə çevirərək, Kərbəla vaqeəsi və İmam Hüseyn hərəkatı haqqında dolğun anlayış yarada bilmişdir. Belə ki, təqvimin məhərrəm ayı ilə başlanması kimi bəlli fakt mətlədə göy cisminin şəxsləndirilməsi yolu ilə verilir. Hilalın şəfəqdən çıxması, günəşin qızartısı arxasından görünməsi, Ayın belini əyməsi, göz yaşı tökməsi bu ifadə vasitəsini hərtərəfli surətdə əsaslandırmaqdadır. Aya aid edilən bu hərəkətlər gözlənilmədən müsibətə uğramış bir şəxsin keçirdiyi dəruni





halları, etdiyi kədərli hərəkətləri andırır. Sanki əziz bir adamının bəd xəbərini almış bir kimsə gözlənilmədən peyda olur, dərddən, kədərdən beli bükülür və o, durmadan ağlayıb-sızlayır.

İlk beytin ideya-bədii keyfiyyətlərindən biri də Kərbəla faciəsinin kainat səviyyəsinə qaldırılmasıdır. Belə ki, klassik şeirin ayrılmaz parçası olan miqyas genişliyi üsulundan ustalıqla yararlanan Füzuli Hicrətin 61-ci ilinin adi günlərinin birində törədilən müsibətin, əslində, bütün kainatı doldura biləcək qədər böyük olduğunu bildirmək istəmişdir.

**2. "Övladi-Mustəfa".** Bəllidir ki, İslam Rəhbərinin dörd adı çəkildikdə salavat çevrilməsi dini fərzdir. Həmin adlar bunlardır: Muhəmməd (s), Əhməd (s), Mahmud (s), Mustafa (s).

Lüğəvi anlamı *seçilmiş, saflaşdırılmış, ayrıcalıq verilmiş, müstəsna səlahiyyəti tanınmış* olan bu söz dini leksikonda işlək olduğu kimi, bədii ədəbiyyatda da çevik və sürəkli işlənmə məqamları qazanmışdır. Elə Füzulidən misal çəkək:

Ya Mustafa, Füzuliyi-möhtacə rəhm edib,
İzhari-iltifat ilə qıl hacətin rəva![323]

Söz "Övladi-Mustəfa" deyiminin içində "Əhli-beyt" anlamı alaraq məzmunca bir qədər də genişlənir. Belə ki, ifadə beş kimsənənin daşıyıcısı yerində çıxış edir, Peyğəmbər xanədanının Qurani-Kərimdəki müstəsna yeri ilə bağlı müddəanın ("Şura", 23) danılmaz və pozulmaz göstəricisinə çevrilir. Ötəri deyildir ki, "Mustəfa" sözü mərsiyə boyu yenə də gözə dəyir; məs.:

Təxfif qədri şərʾdən əndişə qılmayub,
Övladi-Mustəfayə cəfa qıldın, ey fələk!

.................................

[323] *Füzuli. Əsərləri, II cild, səh. 49*





Mərsiyə boyu işlənən *Zikri-Al, Əhli-beyt, ismət hərəm-sərası, ali-əba* kimi deyimlər də ifadəyə aydınlıq gətirib, onu parlaq bir obraza çevirir.

**3. Fərat.** Dünyanın ən böyük çayları sırasında yer alan Fərat çayı başlanğıcını Türkiyə ərazisində yerləşən Cudi dağından götürür. Füzuli ayın hilal vəziyyəti kimi, Fərat çayını da Kərbəla vaqeəsi yönündə mənalandırır. Susuzluq faktorunun Kərbəla vaqeəsindəki aparıcı yerini göz önünə gətirdikdə, bu təşxisin (şəxsləndirmənin) ekspressivlik və emosionallığı birə-on qat artır. Ötəri deyildir ki, əsərin bir yerində şair:

Ruzi-rəzmi-Kərbəla rahi-xəta tutmuş Fərat,
Qılmamış ali-Muhəmməd dərdinin dərmanını!
Ol səbəbdəndir bu kim, üzrilə dutmuş müttəsil
Eyləyib fəryad xaki-Kərbəla damanını, –

deyərək iki coğrafi faktı, Fərat çayının Kərbəla düzündən aşağıda yerləşməsini və axarkən təbii olaraq səs çıxarmasını iki şəxsdən birinin o birindən üzr istəyib əvf diləməsi kimi mənalandırır. Əsərin "Cənabi-Qasım" və "Həzrəti-Abbas" fəsillərində su motivinə dair deyilənlər bütünlüklə mərsiyənin ikinci beytinə aiddir.

**4. "Əşki-al", "zar ağla, ey könül".** Bütövlükdə klassik Şərq poeziyası müsəlman mədəniyyəti göz yaşına mənəvi-əxlaqi və ruhi-psixoloji amil kimi baxmış, onu yaşarı və canlı bir motivə çevirərək həyatın bütün sahələri üzərində mənalandırmışdır. Bu motiv:

Göz yaşımdan suzi-pünhanım edər arif qiyas,
Bixəbər tə'siri-əncimdən, degil əxtərşünas! –

*(Arif könlümdəki gizli yanğını yalnız göz yaşıma dərindən diqqət yetirməklə müəyyənləşdirə bilər. Axı ulduzların Yer kürəsindəki hadisələrin gedişinə və şəxslərin əhvali-ruhiyyəsinə göstərdiyi təsirdən xəbərsiz olanlara ulduzşünas*





*deyilməz)* deyən Füzuli lirikasında da olduqca işlək və çevikdir. Bəs belə əhatəli motivin nə kimi islami əsasları var?

"Onlar əlləri ilə qazandıqlarına görə çox ağlayıb, az gülməlidirlər!" *("Tövbə", 82),* "Siz mənim bildiklərimi bilseydiniz, çox ağlayıb, az gülərdiniz*! (Həzrəti Muhəmməd)* Qurani-Kərimin insanlığa aşıladığı dərin ruhi-psixoloji saflaşma (katarsis) düsturudur. Əlbəttə, deməyə ehtiyac yoxdur ki, bu düstur İslamın həyata sönük və ölgün münasibət bəslədiyi deməkdeyildir. Əksinə, şadlıq və sevinc hallarına üstünlük verən, ömrü-günü bacardıqca şən və mənalı keçirməyə çağıran İslam dini bununla pozulmaz bir psixi tarazlıq yaradır, çətinliklər qarşısında insana dözüm və dəyanət hissləri aşılayır.

Bilavasitə Kərbəla vaqeəsi kimi fəci hadisəyə gəlincə, əski qaynaqlarda yer alan çoxsaylı və çoxqatlı hədis, mənqəbə və əsatirlər göz yaşına dəruni mənəviyyat məsələsi kimi təsirli ictimai yön də vermişdir. Odur ki, bu motivlə bağlı İslamda geniş və dolğun göstəriş və tövsiyələr mövcuddur.

**1.** "Əsma binti Ümeys belə nəql edir: Mən Fatimənin oğlanları Həsənlə Hüseynin dayəsi idim... Həzrət Hüseyn dünyaya gələndə Peyğəmbər yanıma gələrək buyurdu: "Ey Əsma, uşağımı yanıma gətir!" Mən Hüseyni ağ parçaya bələyib Peyğəmbərə verdim. Rəsuli-Əkrəm onun sağ qulağına əzan, sol qulağına iqamə oxuduqdan sonra Hüseyni mənə verdi və ağlamağa başladı. "Atam-anam sənə fəda olsun, ey Tanrının Elçisi, ağlamağına səbəb nədir?" deyə soruşdum. Aləmlərə rəhmət olaraq göndərilən Peyğəmbər buyurdu: "Bu övladıma ağlayıram". Mən dedim: "Təzə doğulan bu körpəyəmi?" Həzrət Peyğəmbər buyurdu: "Ey Əsma, bu balamı zalım və azğın bir dəstə öldürəcəkdir. Allah-taala mənim şəfaətimi onlara nəsib etməsin!" Sonra buyurdu: "Ey Əsma, bu xəbəri qızım Fatiməyə demə, çünki o, bu uşağı dünyaya yenicə gətirmişdir"[324].

.................................

[324] *"Məqtəlu-l-Xarəzmi", I cild, səh. 87-88; "Zəxariu-l-uqba", səh.119*





**2**. “İbni Əbi Ziyad belə rəvayət edir: Bir gün Rəsuli-Əkrəm zövcəsi Ayişənin evindən çıxıb Fatimənin evinin qarşısından keçərkən övladı İmam Hüseynin ağlamaq səsini eşitdi. O, Fatiməyə: “Bilmirsənmi Hüseynin ağlamağı məni incidir!” deyə buyurdu”[325].

**3.** “İbni Səd Ayişədən rəvayət edərək deyir: Peyğəmbər yatan zaman Hüseyn içəri girib Rəsuli-Əkrəmə tərəf qaçdı. Mən onu Rəsulullahdan uzaqlaşdırdım və yenə öz işimə davam etdim. Hüseyn yenidən Peyğəmbərin yanına getdi. Həzrət Mühəmməd ağlayaraq yuxudan oyandı. Ondan: “Ağlamağına səbəb nə oldu?” deyə soruşdum, buyurdu: “Cəbrayıl mənə Hüseynin şəhid olacağı yeri göstərdi. Allahın qəzəbi onun qanını tökənlərə çox şiddətlidir!”

Sonra Rəsulullah (s) əlini açdı, əlindəki torpağı mənə göstərdi və buyurdu: “Ey Ayişə, canım əlində olan Allaha and olsun, bu, məni hüznləndirir. Məndən sonra ümmətimdən Hüseyni qətlə yetirməyə kim cəsarət edəcək?”[326]

**4.** “Həzrət Sadiq buyurur: “Ey Zirarə, həqiqətən, asiman İmam Hüseyn üçün qırx gün qan ağladı. Yer üzü qırx gün qaralmaqla ağladı. Günəş qırx gün tutulmaqla və qızarmaqla İmam Hüseynə ağladı. Dağlar yarılmaqla, dənizlər təlatümə gəlib coşmaqla ağladı. Və mələklər də o həzrətə qırx gün ağladılar”[327].

Göründüyü kimi, hədislərdəki “zalım və azğın bir dəstə”, “Allah-taala mənim şəfaətimi onlara nəsib etməsin!”, “Allahın qəzəbi İmam Hüseynin qanını tökənlərə çox şiddətlidir!”, “Məndən sonra ümmətimdən Hüseyni qətlə yetirməyə kim

.................................

[325] *“Məcməu-z-zəvaid”, IX cild, səh.201; “Zəxariu-l-uqba”, səh.143; “Yənabiu-l-Məvəddə”, II cild, səh. 214*

[326] *Əhməd ibn Həmbəl Musnəd, VI cild, səh. 294; “Xəsaisu-l-Kubra”, II cild, səh.125; “Məcmə’u-z-zəvaid”, IX cild, səh.187; “Səva’’iqu-l-Muhriqə”, səh. 115 – Fərhad Mədədov. Kərbəla şəhidlərinə ağlamaq, “Hikmət” jurnalı, №1, 2004*

[327] *“Təfsirətu-l-Mu’minin”, səh. 121 – Möhsün Aştiyani. 40 ədədinin sirli rəmzləri, səh. 40*



cəsarət edəcək?" kimi sərrast ifadələr Rəsulullahın (s) İmam Hüseyn (ə) şəxsiyyətinə və Kərbəla vaqeəsinə münasibətinin dəqiq və aydın nəqli və əqli dəlilləridir. Bu dəlillərin hamısı istər ayrı-ayrılıqda, istərsə də küll halında təsirli ictimai faktor çəkisindədir.

İmam Cəfəri-Sadiqin sözlərindəki təbii-fiziki və astronomik miqyas genişliyi də bu yöndə olub, tarixin dönüm nöqtələrindən birini təşkil edən hadisə haqqında imamət səviyyəsində fikir bildirməkdir.

Beləliklə, aydın olur ki, mərsiyənin ilk bəndindəki "əşki-al" – *qırmızı göz yaşları* və "zar ağla, ey könül" qətiyyən bəsit poetik vasitə olmayıb, ən azı, bədii deyim və xüsusi obrazlılıq örnəyidir. Lirik "mən"in sırf mənəvi anlayış olan könülə üz tutması isə onlara ayrıca bir ruhi həssaslıq və estetik yön verir, onları İmam Hüseyn (ə) matəminin canlı və diri daşıyıcılarına çevirir.

Dərinə getdikdə aydın olur ki, şairin gözündə xəcalət çəkən Fərat çayı yox, əslində, İmam Hüseyn (ə) kimi pak bir şəxsiyyəti ayaqlar altına salan mənfur ictimai quruluşdur, Yezid idarə üsuludur. Yaxud "Qəmi-şühəda şərhin etməgə Kərbəladə zəbani-hal çəkən hər səbzə"nin "fəhm etdirmək" istədiyi və "çox hekayət olan" cəhətlərin yuxarı dairələr üçün də "Mövcibi-məlal" (başağrısı) olmasının qaçılmazlığı fikri diqqəti cəlb edir.

Və ya "ruzigarın" (hicri-qəməri təqvimdə Aşuranın bütün fəsillərə düşməsinin) "Təcdidi-matəmi-şühəda"nı (Kərbəla şəhidlərinə saxlanılan yası hər il təzələməsi) daha çox ömrü-günü mənalı edəcək ictimai çağırış yerində çıxış edir. Bu isə Ulu Yaradanın bəndədən tələb etdiyi ləyaqətli ömürsürmə kriteriyasına qulluq edir. Başqa sözlə, şair demək istəyir ki, imamhüseynsevərlər ancaq ağlayıb-sızlamaqla qalmamalı, hər ilin məhərrəm və səfər aylarında təzələnən İmam Hüseyn təziyəsinə özlərinin fərdi və ictimai töhfələrini verməlidirlər. "Təcdidi-matəmi-şühəda qıldı ruzigar! Zar ağla, ey könül,



bu gün olduqca ehtimal!” beytinin əsl qayəsi də, zənnimizcə, budur.

Burayadək deyilənlər istər-istəməz bəndin məqtəsinə də ayrıca münasibət formalaşdırır. Ona görə ki, o, yuxarıdakı beytlərdə irəli sürülən fikirlərin və çəkilən bədii-estetik mənzərənin təkcə yekunu olmaqla qalmır, sonrakı bəndlərə keçid kimi də mühüm ədəbi funksiyanı icra edir.

“Meydani-çərx” və “Gərduni-dun” bir yandan Kərbəla vaqeəsini ümumbəşəri səviyyəyə qaldırırsa, o biri yandan Yezidin özünün qeyri-legitim hakimiyyətinin murdar və idbar simasını açıb göstərir. Qurani-Kərimin afaqi ayələri birinci tərəfi, ənfusi ayələri də ikinci tərəfi möhkəm surətdə əsaslandırır. Belə ilahi bəyanatlardan bir-iki örnək verək: “Və de ki, həmd olsun Allaha! O öz ayələrini (qüdrət nişanələrini) bizə mütləq göstərəcək, siz də onları görüb tanıyacaqsınız! Rəbbim etdiyiniz əməllərdən (məsələn, Yezid iqtidarının törətdiyi cinayətlərdən – **V.A.**) əsla xəbərsiz deyildir!” *(“Nəml”, 93).*

“(Quranın) haqq olduğu (müşriklərə) bəlli olsun deyə biz öz qüdrət nişanələrimizi onlara həm xarici aləmdə (kainatda, göylərin və yerin ətrafında), həm də onların öz daxilində mütləq göstərəcəyik! (Ya Peyğəmbər!) məgər Rəbbinin hər şeyə şahid olması (sənin dediklərinin doğruluğuna) kifayət deyilmi?” *(“Fussilət”, 53).*

“Yerdə (Allaha) tam yəqinliklə inananlar üçün (Onun Əzəmət və Qüdrətinə, Vəhdaniyyətinə dəlalət edən) əlamətlər vardır. Sizin özünüzdə də (sizi Yaradanın birliyini sübut edən) əlamətlər vardır” *(“Zariyat”, 20-21).*

Göründüyü kimi, bu ilahi bəyanatlar kamil insanın böyüklüyünü, insan mənəviyyatının zənginliyini müxtəlif məsələlərlə üzvi uyarlıqda əks etdirməkdə, Kərbəla vaqeəsi kimi əzəmətli hadisələr və İmam Hüseyn kimi nəhəng şəxsiyyətlər üçün məfkurəvi özül təşkil etməkdədir. “Meydani-çərxin cilvəgəhi-dudi-ah, gərduni-dunin kəsvəti-matəmsiyah” edilməsi çağırışı məhz belə miqyas genişliyinə



və məna-məzmun dərinliyinə söykənməli idi. Əks təqdirdə bu çağırış bəsit ritorikadan o yana keçə bilməzdi.

Ən nəhayət, deyilməmiş qalmasın ki, bəndin məqtəsindəki ah və matəm sonrakı bölümdə iki müstəqil obraza çevrilir. Bu isə əsərin ümumi məzmunu içində çeşidli bədii situasiyalar doğurmaqla mərsiyəyə ayrıca bir həssaslıq gətirib, onun Füzuli dühasının İmam Hüseyn matəmi üzərində köklənmiş sınıq sazı tək qavranır.

* * *

Bu motivlər ikinci bənddə daha bir neçə yeni motivin qoşulması ilə bir az da genişlənir və daha dərin qatlara gedib çıxır:

Mahi-məhərrəm oldu, məsərrət həramdır!
Matəm bu gün şəriətə bir ehtiramdır!
Təcdidi-matəmi-şühəda nəf'siz degil,
Qəflətsərayi-dəhrdə tənbihi-amdır!
Qovğayi-Kərbəla xəbərin səhl sanma kim,
Nəqsi-vəfayi-dəhrə dəlili-təmamdır!
Hər dürri-əşk kim saçılur zikri-al ilə
Səyyareyi-sipehri-ülüvvi məqamdır!
Hər məddi-ah kim çəkilür Əhli-beyt içün
Miftahi-babi-rövzeyi-Darüssəlamdır!
Şad olmasın bu vaqeədən şad olan könül!
Bir dəm məlalü qüssədən azad olan könül![328]

*(Məhərrəm ayı gəldi, artıq şadlıq haram hökmündədir. Əksinə, Kərbəla şəhidlərinə yas saxlamaq isə şəriətə dərin ehtiram hissidir. Kərbəla şəhidlərinin matəminin hər il təzələnməsi faydasız deyil. Bu, dünyanın qəflət sarayında yatanlar üçün ümumi bir tənbihdir. Kərbəla qovğası ilə bağlı bilgiləri yüngül, bəsit və dəyərsiz hesab etmə. Çünki*

[328] *Füzuli. Əsərləri, VI cild, səh. 374-375*





*onlar zəmanənin vəfa baxımından naqisliyini sübuta yetirən möhkəm dəlillərdir. Peyğəmbər nəsli üçün axıdılan hər bir göz yaşı incisi uca məqam sahibi olan göylərin bir ulduzudur. Əhli-beyt üçün çəkilən hər bir dərin ah salamatlıq evinin, cənnətin qapısına bir açardır. Bu vaqeəni eşitməklə sevinib bir anlığa olsa belə qəm-kədərdən uzaqlaşan könüllər qoy heç vaxt şadlıq üzü görməsinlər!)*.

Bəndin fikri axarını və bədii tutumunu lazımınca qavramaqdan ötrü bir neçə cəhətin üzərində ayrıca dayanmaq gərəkdir. Belə cəhətlərdən biri İslam dininin sevinc anlayışına münasibətidir.

Müsəlman nəyə və niyə sevinməlidir? İslam dini həyatın bütün sahələrini əhatə edir. Yaşayışın elə bir məhrəmanə nöqtəsi yoxdur ki, müsəlman şəriətinin ona dair müəyyən bir göstərişi olmasın. Belə olan surətdə Allahı tanıması ilə yüksək psixikası, ali şüuru, mürəkkəb duyğu və hiss sistemi ilə bütün canlıların fövqündə duran insan nə zaman, nə üçün, harada və necə sevinməli, öz daxili həyəcanını nə dərəcədə və hansı yöndə büruzə verməlidir?

Hər hansı bir məsələnin islami mahiyyətinə vara bilmək üçün dinimizin özülünü təşkil edən Qurani-Kərimə üz tutmaq gərəkdir. Ulu Yaradan Şanlı Kitabında ən müxtəlif məsələlərdən bəhs edərkən öz bəndələrinin mürəkkəb əhvali-ruhiyyəsini istər maddi, istərsə də mənəvi baxımdan təmin edə biləcək elə həssas müddəa və qənaətlər bəyan buyurmuşdur ki, sözün gerçək anlamında müsəlman həyat tərzi keçirən hər bir şəxs nə ailə-məişət zəminində, nə də ictimai mühitdə öz duyğu və hisslərinin sərbəst və doyumlu ifadəsi üçün heç vaxt sıxılmaz, heç bir ruhi sarsıntı keçirməz.

Ulu Yaradan Yunus Peyğəmbərin mübarək ismi ilə adlandırdığı 10-cu surənin 58-ci ayəsində İslam rəhbərinə belə bir tapşırıq verir: "(Ya Rəsulum!) De: "Allahın neməti və mərhəməti ilə – ancaq onunla sevinsinlər. Bu, onların yığdıqlarından (fani dünya malından) daha xeyirlidir!"





Ayədən əldə edilə biləcək başlıca qənaət sevinc və şadlıq hisslərinin özünü müsəlman olaraq dərk edən bir fərdə, bir cəmiyyətə yad və yabançı olması yox, əksinə, bu sevinc və şadlığın ilahi rəhmət və fəzilətdən maya tutmaqla həyata keçirilməsidir. Deməli, əsasında Allahın lütfü və mərhəməti dayanan sevinc hissi ötərilikdən çıxıb ömrün bütün mərhələ və məqamlarına yayılar. Bununla belə, bu cür şadlıq duyğusu əsl müsəlman üçün heç vaxt həyatın məqsədinə çevrilməz, əksinə, həmişə Tanrının tükənməz lütfünün parlaq cilvələrindən biri tək başa düşülər.

Ayənin sonundakı "Bu, onların topladıqlarından daha xeyirlidir" cümləsi ilahi fəzilət və rəhmətin burada ayrıca bir məna-məzmun şəbəkəsi əmələ gətirdiyini göstərir. Bu, o deməkdir ki, daha burada "fəzilət" və "rəhmət" sözlərinə dair uzun-uzadı bəhs açmağa lüzum yoxdur. Ona görə ki, bu sonuncu cümlə Ulu Yaradanın nəzərdə tutduğu fəzilət və rəhmətin həqiqi dəyərini bütün aydınlığı və genişliyi ilə açıb göstərir. Həmin həqiqi dəyər budur ki, "O gün ki nə mal-dövlət, nə də övlad bir fayda verər! Ancaq sağlam (təmiz, daxilində şəkk-şübhəyə, küfrə, şirkə və nifaqa yer olmayan) bir qəlblə Allahın hüzuruna gələn kimsədən (möminlərdən) başqa!" *("Əş-Şüəra", 88-89).*

İlahi fəzilət və rəhməti bu yöndə başa düşməyə əsas verən nəqli dəlil Qarunun əhvalatında öz əksini tapmışdır. Belə ki, Ulu Yaradan Musa Peyğəmbərin qövmündən olan Qaruna açarlarını bir dəstə güclü adamın zorla daşıya biləcəyi xəzinələr vermiş, o isə İsrail oğullarına qarşı özünü yuxarı tutmaqla zülmə yol vermişdir. Bunu görən camaat ona belə demişdir: "Sevinmə, çünki sənin sevincin Allahın fəzilət və rəhmətinə yox, müvəqqəti olaraq əlinə keçmiş mal-dövlətə güvəndiyinə görədir. Odur ki, keçirdiyin bu fərəh hissi, əslində, zülmünün əlamətidir. Ona görə də Allaha xoş getməz. Şübhəsiz ki, Allah belə sevinənləri sevməz" *("Qəsas", 76).*





*"Rə'd"* surəsinin 26-cı ayəsi göstərir ki, bu Qarunvari fərəhlənmə Həzrət Muhəmmədin (s) zamanında da mövcud olmuşdur. Belə ki, ayənin əvvəlində Allahın hansı bəndənin ruzisini genişləndirəcəyi, hansı bəndəsininkini isə müəyyən bir ölçü daxilində saxlayacağı sonsuz Tanrı iradəsinə bağlandıqdan sonra Məkkə müşriklərinin ötəri dünya həyatı ilə sevinmələri bildirilir və bu, pislənilir.

*"Rum"* surəsinin 14-16-cı ayələrində iman gətirənlərlə kafirlərin, cənnətliklərlə cəhənnəmliklərin ayrılmasından danışılarkən birincilərin bariz əlamətlərindən biri kimi sevincin qeyd edilməsi, zahirən kiçik görünməsinə baxmayaraq, keçirdiyimiz hər bir duyğu və hissin də aqibətimizin təyinində böyük rol oynaya biləcəyini göstərir: "Qiyamət qopacağı gün – məhz o gün (möminlərlə kafirlər bir-birindən) ayrılacaqlar. İman gətirib yaxşı işlər görənlər cənnət bağçalarının birində sevinc içində qalacaqlar. Kafir olub ayələrimizi və axirətə qovuşacaqlarını (Qiyamət günü dirilib haqq-hesab üçün hüzurumuzda duracaqlarını) inkar edənlər isə əzab verilmək üçün hazırlanacaqlar (gətiriləcəklər)".

Ayələrdə "sevinc" anlamında işlənmiş "habəra" sözünün istər lüğəvi, istərsə də islami məna-məzmun şəbəkəsinin geniş və əlvan olması yuxarıdakı fikri təsdiq etmək üçün kifayətdir. Belə ki, həmin söz ərəb dilinin bütün linqvistik və üslubi imkanları çərçivəsində həyatın bir çox sahələrini təmsil etməkdədir; məs.: *sevindirmək, nemət vermək* (bu məna Quranın başra yerlərində də mövcuddur: "Sevinc və şadlıq içərisində olduğunuz halda siz və zövcələriniz cənnətə girin!" *("Zuxruf", 70)); paltarı və s. gözəlləşdirmək; içkisi çox olan yer; təsir etmək; bəzənmək; şənlik məclisi; alim; xaxam.*

Azacıq diqqət yetirilsə, görmək çətin olmaz ki, bu məna-məzmun genişliyi ayədə irəli sürülən iman gətirmək və saleh əməllər etmək şərtinə bağlanmışdır. Yəni iman nə qədər təkdirsə, saleh əməl bir o qədər çoxsavablı və çoxşaxəlidir. Başqa sözlə, həyatın bütün sahələrində Allah dərgahında dəyər veriləcək işlər mümkündür.





Bəllidir ki, 614-cü ildə atəşpərəst iranlılar xristian bizanslıların əlində olan Qüds şəhərini mühasirəyə alıb istila etmişdilər. Bu, Məkkə müşriklərini sevindirmiş və onlar onsuz da çətin vəziyyətdə olan müsəlmanların üstünə bir qədər də ayaq almışdılar. Ulu Yaradan Şanlı Kitabının *"Rum"* adlı 30-cu surəsinin başlanğıcında hadisələrin bitmədiyini və Məkkə müşriklərinin bu sevincinin yersiz olduğunu buyurmuşdur. Bu ilahi müjdənin tərkib hissələrindən biri də müsəlmanların yaxın illərdə böyük sevinc hissi keçirəcəklərinin qabaqcadan bildirilməsidir: "Rumluların qalib gələcəyi gün möminlər sevinəcəklər" *("Rum", 4)*.

Göründüyü kimi, buradakı sevinc fərdi təəssüratdan qat-qat yüksəkdə duran ictimai bir məzmuna malikdir. Bu ictimai məzmun cəmiyyətin həm dini əhvali-ruhiyyəsi, həm də siyasi inkişafı ilə üzvi qovuşuqluq içindədir. Deməli, müsəlman cəmiyyətin fəal bir üzvü olaraq yalnız şəxsi işlərinə görə sevinməklə kifayətlənməməli, ancaq həyatın ailə-məişət qatına qapanıb qalmamalı, əksinə, mənsub olduğu xalqın və dövlətin ali vəzifə və məqsədləri uğrunda can-başla qulluq etməkdən daxili fərəh hissi keçirməli və bu hiss onu mənən zənginləşdirməlidir.

Beləliklə, bu yığcam qeydlər özünü müsəlman olaraq dərk edən hər bir fərdin və cəmiyyətin dünyanı duyub qavramaqda hissiyyatla dərrakəni vəhdətdə götürməli olduğunu sübuta yetirir və göstərir ki, o, qarşılaşdığı hadisə və əhvalatların həqiqi mahiyyətini üzə çıxarmağa çalışmalı, ən nəhayət, müsəlman həyat tərzi keçirməklə Allahın razılığını qazanmalıdır. Məhz bu təqdirdə biz nəyə və niyə sevinəcəyimizi bilə bilərik.

* * *

Bu geniş açıqlama danılmaz biçimdə göstərir ki, yeri gəldi-gəlmədi ibadətin yalnız sevinc halı olduğunu nümayişkaranə surətdə elan edənlərdən (məsələn, Nəriman Qasımoğludan) fərqli olaraq, İslamın gözündə sevinc hissləri büsbütün şüurlu





bir nəzarət mexanizmi ilə həyata keçirilən və hər addımda insanı Allaha yaxınlaşdıran dəruni ruhi-psixoloji inkişaf prosesi olub, yaşayışın ən məhrəmanə nöqtələrini belə əhatə edən yaşarı və gerçək estetik ölçüdür. Füzuli də məhərrəm ayının gəlişi ilə məsərrətin (sevincin, şadlığın) haram olmasından danışarkən belə ali duyğu və düşüncə sisteminə söykənmişdir.

Bəndin ideya-bədii cizgilərinin daha yaxşı qavranışı üçün oxunulması lazım gələn ikinci cəhət şəriət anlayışıdır.

Şəriət anlayışı açıq-aydın Qurani-Kərimdə iki yerdə işlənmişdir: "Alə şəriətin" təbiri ilə *"Casiyə"* surəsinin 18-ci ayəsində ("Sonra səni də dində şəriət sahibi etdik, sən ona tabe ol və (haqqı) bilməyənlərin nəfslərindən gələn istəklərə uyma!") "Şirəti" təbiri ilə də *"Maidə"* surəsinin 48-ci ayəsində ("...Sizin hər biriniz üçün bir şəriət və bir yol təyin etdik").

"Şəriət" anlayışının müsəlman mədəniyyəti zəminində kəsb etdiyi əxlaqi-fəlsəfi və ruhi-mənəvi zənginliklərə dair azacıq da olsa təsəvvür oyatmaqdan ötrü kütləvi təfsirlərin birindən məfhumla bağlı xülasəyə göz gəzdirək: "...Ərəbcədə "şəriət" insanların irmaqlardan və buna bənzər yerlərdən su gətirmək üçün getdikləri yerdir. Din şəriəti də bu anlamdadır. Çünki insanlar onun vasitəsilə Allahın əmrlərinə, rəhmətinə və yaxınlığına qovuşurlar".

Raqib isə belə demişdir ki, "şər", əslində, məsdərdir, sonra açıq və geniş yolu özündə birləşdirən bu kəlmə "şira" və "şəriət" şəklini alaraq dində ilahi yol üçün istiarətək (bənzətmə) işlədilmişdir.

Bəziləri dini qayda-qanunlara "şəriət" deyilməsinin su yolu üzərində qurulan bir bənzətmədən irəli gəldiyini söyləmişlər. Belə ki, bu yolda həqiqət və doğruluq üzrə gedən şəxs həm doyar, həm də təmizlənər. "Doymaq"dan məqsəd bir çox filosofların "içərdim, ancaq doymazdım; Allahı tanıdığım zaman isə içmədən də doydum" şəklindəki səciyyələndirməsidir. "Təmizlənmək"dən məqsəd isə "evlərinizdə vüqarla oturun



(yəni evlərinizi şəriətin, şəri hökmlərin alınmaz qalasına çevirin). İlkin cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın. Namaz qılın, zəkat verin, Allaha və Rəsuluna itaət edin, siz ey (Peyğəmbərin) ev əhli! Allah sizdən çirkinliyi yox etmək və sizi tər-təmiz, pak etmək istər!" *("Əhzab", 33)* ayəsindəki mənadır"[329].

Bu qeydlərdən aydın olur ki, Füzulinin gözündə İmam Hüseyn (ə) üçün yas saxlamaq zahiri qayda-qanunla yox, batini mərifətlə yerinə yetirilməsi lazım gələn mənəvi-əxlaqi tələbatdır.

Bənddə toxunulacaq başqa bir cəhət İmam Hüseyn matəminin hər il geniş miqyasda qeyd edilməsinin ayrıca vurğulanılmasıdır. Belə ki, şair "Təcdidi-matəmi-şühəda"nın "nəf´"ini ilk növbədə onun "Qəflətsərayi-dəhrdə tənbihi-an" olmasında görür. Gör bu fikir sənətkarın dünyagörüşündə necə möhkəm yer etmişdir ki, o, "Hədiqətü-s-süəda"nın bir neçə yerində nəinki bədii şəkildə, hətta sırf nəzəri surətdə və publisistik üslubda belə dönə-dönə bu mülahizənin üzərinə qayıtmış, hər dəfə onu başqa bir aspektdə işıqlandırmışdır. Monoqrafiyanın "Füzulinin İmam Hüseyn hərəkatına dair görüşləri" fəslində bu barədə ətraflı danışdığımızdan daha burada əsərdən iqtibaslar gətirmirik.

Beytin ikinci misrasında əksini tapmış fikrin əsərdə nəzəri qarşılığı var: "Xalisliyə və iman kamilliyinə səbəb olduğu üçün şəhid Hüseynin şəhid əhvalatının anılması, doğrudan da, ibadət üzrə önəmlidir. Digər tərəfdən, bu, qafil adamlar üçün oyadıcı bir danlağa çevrildiyinə görə Kərbəla məzlumunun müsibətli sərgüzəştlərinin təkrar-təkrar deyilib danışılması özlüyündə həm fərdi, həm də ictimai bir xoşbəxtlikdir, uğur və inkişaf amilidir" (mətn sadələşdirilmişdir).

İqtibasdakı bir neçə leksemin araşdırılan beytin leksikonunu xatırlatması (tutuşdur: Hüseyni-şəhid, məzlumi-

.................................

[329] *Elmalılım Həmdi. Haqq dini Quran dili, 9 cilddə, VI cild, Ankara, 1995, səh. 416*



Kərbəla matəmi-şühəda; yaxud: mövcibi-təcdid, təkrari-vaqeə/təcdid; və ya: əhli-qəflət/qəflətsərayi-dəhr; və yaxud: baisi-tənbih/tənbihi-amm) sənətkarın eyni fikri nəsr və nəzm yolu ilə çatdırmasındakı uyarlığı, habelə həmin fikrin onun dünyagörüşündəki yerinin möhkəmliyini əyani surətdə nümayiş etdirməkdədir.

Bənddə əksini tapmış növbəti cəhət Kərbəla vaqeəsinin bütün göstəricilər üzrə diqqətdən qıraqda qalmasının fərdi və ictimai ziyanı ilə bağlıdır. Odur ki, “Qovğayi-Kərbəla xəbəri”nin “səhl sanılması”nı vəfasızlıqla əlaqələndirmək sənətə Füzuli baxışına yaraşmayan hal olardı. Çünki fərdi vəfalılığın özlüyündə həlledici amil olmasına baxmayaraq, Füzulinin belə böyük məsələdə problemin kiçicik tərəfi ilə kifayətlənib məsələni geniş miqyasda qoyub həll etməməsini gözləmək ədibə qarşı hörmətsizlik olardı. Əksinə, şair burada:

Səhl sanman Kərbəla qovğasın, ey əhli-xirəd,
Ərseyi-bidadü meydani-bəladır Kərbəla.
Sorsalar kim, qansı mənzildir məsaib-məcmə΄i?
Ün verir qəsri-fələk kim, Kərbəladır, Kərbəla![330] –

səpkili bir məna-məzmun axını əmələ gətirmiş və onu idraki səmtə yönəltmişdir. Odur ki, “nəqşi-vəfayi-dəhr” tərkibi beytin məzmununda sıravi adamların bəsit səhlənkarlığı, adi tənbəlliyi kimi yox, bütövlükdə cəmiyyəti bürümüş ictimai laqeydlik, siyasi savadsızlıq, dini məsuliyyətsizlik və mənəvi-əxlaqi ətalət kimi başa düşülür.

Belədə Kərbəla vaqeəsini “ənənəvi ərəb döyüşlərindən biri” kimi qələmə vermək cəhdi (Nəriman Qasımoğlu) dəlil-sübuta ehtiyac duymadan məhvə məhkum olmurmu?

Bədiilik baxımından görməmək olmaz ki, ilk bənddə toxunulan “göz yaşı” motivi burada bir qədər də genişləndirilir. Belə ki, metaforik olaraq inciyə oxşadılan göz yaşının

[330] *Füzuli. Kərbəla vaqiəsi, səh. 51*





yalnız Peyğəmbər nəsli, o sıradan da Kərbəla şəhidləri üçün axıdıldığı zaman əlçatmaz göylərin ulduzlarına çevrildiyi önə çəkilir. Bu, eyni predmetin dəfələrlə mənalandırılması olmaqla yanaşı, təmsil etdiyi mətləbin estetik yükünü də artırır. Deməli, növbəti beytdəki "ah"la birlikdə göz yaşı da müstəqil obraza çevrilmiş olur.

"Hər məddi-ah kim çəkilür Əhli-beyt içün, Miftahi-babi-rövzeyi-Darüssəlamdır!" beyti, zənnimizcə, nəinki bəndin, bütövlükdə mərsiyənin də ən dolğun hissəsidir. Çünki Füzuli burada Əhli-beyt üçün çəkilən hər bir ahı sözlərin başında gələn məddəli əlif hərfinə bənzətməklə parlaq bir istiarə yaratmışdır. Şair ərəb əlifbasının bu qaydasını bədii fiqura çevirməyi çox sevirmiş. Məs.:

Məddi ke, bər səri-əlife-"Adəm"əsd tac
Məzmunə-"mim" o mə´niye-"dal"-Muhammadəsd.

*("Adəm" sözünün əvvəlində gələn məddəli əlif hərfinin məddəsinin məzmunu "Muhəmməd" sözündəki "mim" hərfi, "dal"ının mənası da "Muhəmməd" sözündəki "dal" hərfidir).*

Bəzən müəmmada farsca olan sözün ərəbcəsi götürülür. Füzulinin aşağıdakı müəmması bu əsasda qurulmuşdur:

Möhnətsərayi-sinəmə gəldikcə müttəsil,
Bəzl eylərəm xədənginə hər ləhcə xuni-dil.

Beytin mənası belədir: *"Sinəmin möhnət sarayına oxların arası kəsilmədən gəldikcə hər ləhzə ürək qanını ondan əsirgəmərəm".*

Müəmma nöqteyi-nəzərindən isə xədəngdən xuni-dil əsirgənilmir. "Xun"un ərəbcəsi "dəm"dir; "xədəng" isə ərəb əlifbasının əlif – A hərfinə bənzəyir; bu zaman müəmmada "Adəm" kəlməsinin ifadə olunduğu aydın olur"[331].

.................................

[331] *Araslı H. Böyük Azərbaycan şairi Füzuli, Bakı, 1958, səh.257*





Beytdə Əhli-beyt üçün dərindən çəkilən ah yenə də metaforik biçimdə kilidə bənzədilir. Salamatlıq yurdu olan cənnətin qapısının kilidi bu bədiiliyi bitkinləşdirməklə yanaşı, şeirin ideya istiqamətini də itiləşdirir. Çünki misra İmam Hüseyn hərəkatına bəslənilən münasibət yönündə, əzəli-əbədi axirət həyatının təminatçısına çevrilir.

Füzuli bəndi nifrinlə bitirir. Bunun xəlqi-milli qaynağı folklordan bəllidir. Belə ki, başlanğıcı insanlığın dansöküləninə gedib çıxan qarğışlar nifrinetməni folklor danışıq üslubunun komponenti kimi tamamilə doğma bir obyektivliklə əsaslandırır. "Şad olmasın bu vaqeədən şad olan könül! Bir dəm məlali-qüssədən azad olan könül!" nifrini islami baxımdan da əsaslıdır. Belə ki, Ulu Yaradan Şanlı Kitabında xeyirin gəlməsi ilə yanaşı, şərin gəlməsi üçün də duaetmənin insan təbiətinə uyğun olduğunu bildirir *("İsra", 11).* Bəzi məqamlarda Allahın və mələklərin lənət dedikləri də görünür: "Kitabda aşkar etdiyimiz dəlillərdən sonra göndərdiyimiz nişanələri doğru yol göstərən ayələrimizi gizlədənlər Allahın lənətinə düçar olar və bütün lənət edə bilənlər də onlara lənət oxuyar" *("Bəqərə", 159).*

"Mübahilə" – qarşılıqlı lənətləşmə adı ilə bilinən tarixi əhvalat isə *("Ali-İmran", 61)* nifrinləşməni daha möhkəm islami özülə bağlayır: "(İsanın Allahın qulu və Peyğəmbəri olması barədə) sənə göndərilən elmdən (məlumatdan) sonra buna (İsanın əhvalatına) dair səninlə mübahisə edənlərə de: "Gəlin biz də oğlanlarımızı, siz də oğlanlarınızı, biz də qadınlarımızı, siz də qadınlarınızı, biz də özümüzü, siz də özünüzü (bura) çağıraq! Sonra (Allaha) dua edib yalançılara Allahın lənət etməsini diləyək!"

Göründüyü kimi, "nəbtəhi" sözü İslamda nifrinin yerinə görə ictimai funksiya da daşıya biləcəyini göstərir. Lakin bu, qətiyyən o demək deyildir ki, dinimiz söyüş söyməyə icazə verir. Rəbbimiz söyüş söyməyi qəti qadağan edərək onun insani münasibətlərə vuracağı zərəri və inam-inanc sistemini sarsıdacağını aydınca göstərmişdir: "Allahdan başqalarına



tapınanları söyməyin. Yoxsa onlar da (Allaha qarşı hörmət və ehtiram) bilmədikləri üzündən Allahı düşməncəsinə söyərlər" *("Əl-Ənam", 108).*

* * *

3-cü bənddə şair mərsiyənin ənənəvi qaydalarını gözləməklə üslubu sərtləşdirir, sanki səsini qaldırır. Bu bəndin müxatəbi "fələk"dir. Bəs Füzuli "fələk" dedikdə hansı qüvvələri nəzərdə tutur?

Tədbiri-qətli-Ali-Əba, qıldun, ey fələk,
Fikri-qələt, xəyali-xəta qıldun, ey fələk!
Bərqi-səhabi-hadisədən tiğlər çəküb,
Bir-bir həvaleyi-şühəda qıldun, ey fələk!
İsmət hərəmsərasinə hörmət rəva ikən
Pamali-xəsmi-bisərü pa qıldın, ey fələk!
Səhrayi-Kərbəlada olan təşnələblərə
Rigi-rəvani-seyli-bəla qıldın, ey fələk!
Təxfifi-qədri-şər´dən əndişə qılmayub,
Övladi-Mustəfaya cəfa qıldun, ey fələk!
Bir rəhm qılmadun cigəri qan olanlara,
Qürbətdə ruzigari pərişan olanlara![332]

*(Peyğəmbər nəslinin məhvi üçün tədbir tökdün, ey fələk! Ey fələk, sən bununla necə də səhv düşünüb, təhlükəli oyunlar oynadın. Məsələn, sən hadisələri bulud kimi toqquşduraraq, əmələ gətirdiyin ildırımları qılınca döndərməklə Kərbəla şəhidlərinin qətlini onlara tapşırdın. Yaxud məsumluq evi ən dərin ehtirama layiq olduğu halda, sən o evin sakinlərini başdan-ayağadək acığın, hirsin, hikkənin ağır çəkmələrinə əzdirdin! Ey fələk, Kərbəla düzündə dodağı susuzluqdan cadar-cadar olanların damarlarındakı qanı onlar üçün bəla selinə, əzab-əziyyət, müsibət və fəlakət axınına çevirdin.*

.................................

[332] *Füzuli. Əsərləri, VI cild, səh. 375*





*Ey fələk, sən müsəlman şəriətindən, İslam dinindən zərrə qədər qorxub çəkinmədən Peyğəmbər balalarına etmədiyin cövrü cəfa qoymadın axı! Ciyərləri təkcə susuzluqdan yox, həm də gözgörəsi zülmdən qan olanlara, qərib yerdə halları pəjmürdə, həyatları puç, yedikləri, içdikləri zəhər olanlara zərrəcə mərhəmət göstərmədin).*

Bənddə işlədilən kəskin və kəsərli ifadələr (məs.: *tədbiri-qətl, fikri-ğələt, pamal qıldın* və s.) eyni qayə ətrafında və vahid müstəvidə olduğundan "fələk" deyərkən şairin burada Yezid iqtidarını, bu iqtidarın bütün pillələrini, idarəetmə orqanlarını, irili-xırdalı hər bir məmurunu nəzərdə tutduğu, onların murdar və idbar təbiətini özünün bütün bəndəlik və vətəndaşlıq nifrəti ilə "bəndə" rədifinə sığışdırdığı aydın olur. Əsərin ayrı-ayrı bölümləri onun ideoloji-publisistik əsası sayıla bilər. Məs.: "Bu tanınmış nüsxə və bu əziz əsər həm də qafillik məclisində nəfsin özbaşınalıq istəkləri ilə İmam Hüseyn kimi bir ilahi səadət və uğur çırağını söndürən və dünyanın Nil çayı kimi gur axan və aşıb-daşan maddiyyat seli ilə özünün iman və İslam özülünü xaraba qoyan, cəfaları, zülmü saya-hesaba gəlməyən Yezidin törətdiyi müsibətlərin toplusudur" (mətn sadələşdirilmişdir).

Zəhi, nadan ki qədrin bilməyüb tövfiqi-İslamın
Məta'i-faniyi dünyaya vermiş nəqdi-imanın.
Təvəccöh həşr divaninə qılmış mülki-dünyadan,
Tirazi-nameyi-ə'mal edüb məzlumlar qanın.[333]

*(Sən bir nadanlığın çoxluğunu gör ki, İslamın gətirdiyi uğurun qədir-qiymətini qanmayıb, olub-qalan imanını da puç dünyanın keçici, ötəri malına-mülkünə vermişdir. Məzlumlar qanını axıtmağı əməl dəftərinə yazdırmaqla dünya evini həşr divanından – ilahi ədalət məhkəməsindən üstün tutmuşdur).*

..................................

[333] *Füzuli. Əsərləri, VI cild, səh. 192*





“Doğrudan da bədənlərindən ayrılmış ruhlara dünya hadisələrini müşahidə imkanı verilsə və insanın mənəvi qatları bədən çürüdükdən sonra proseslərin gedişatından xəbər tutsa, ortaya çıxar ki, Əli oğlu Hüseyn həzrətləri çəkdiyi cəfalardan əldə etdiyi səadətlə zaman-zaman həzz alaraq qəbrinin günü-gündən şan-şöhrət qazanması, övladlarının hörmətinin durmadan artması, haqqındakı xatirə və tərifin anbaan çoxalması nəticəsində qiyamatədək bir gör nə qədər savaba çatar. Ancaq murdar və idbar Yezid əməllərinin cəzasını görüb, hər an özünə oxunan lənətlərin təzələnməsi, ünvanına yönəldilən cürbəcür nifrət hisslərinin yenilənməsi və danlaq zəhərinin sürəkli axını nəticəsində necə ağır ilahi əzab-əziyyətə düçar olar” (mətn sadələşdirilmişdir).

Dari-dünyada bu yetər olara,
Əsəri-cənnətü nişani-cəhim!
Məhşər olduqda xud müqərrərdir
Ne’məti-baqivü əzabi-əzim.

*(Hüseynlə Yezidə dünya evində bu bəsdir ki, onlar cənnətlə cəhənnəmin aydın göstəriciləridir. Ancaq əzəli-əbədi Diriliş günündə daimi nemətlərlə şiddətli əzabın kimin halına şamil olacağı özlüyündə bəllidir)*.

Göründüyü kimi, mətn özünün bütün leksik-semantik tutumu ilə istər şəxsən Yezidin özünün, istərsə də onun qeyri-qanuni hakimiyyətinin iç üzünü açıb göstərməkdə, bu iqtidarın İslamdan, Qurandan, imandan, Peyğəmbərdən nə qədər uzaq olduğunu əks etdirməkdədir. Odur ki, mətndə işlənmiş *Yezidi-pürcəfa, nadan, məzlumlar qanı, Yezidi-pəlid* sözləri bilavasitə Kərbəla vaqeəsindən danışan 7-10-cu bablar üçün açardır.

* * *

Bəndin orijinal cəhətlərindən biri kimi belə bir xüsusiyyət diqqəti çəkir ki, Füzuli əsla ucuz və yüngül yolla getməyərək





Kərbəla vaqeəsinin kəskin ictimai-siyasi proseslərdən qaynaqlandığını oxucuya çatdırır. “Bərqi-səhabi-hadisədən tiğlər çəkib, Bir-bir həvaleyi-şühəda qıldın, ey fələk!” deyərkən şairin təkcə düşmən ordusunun sıra nəfərlərinin etdiyi qəddarlıqları nəzərdə tutduğunu söyləmək, əlbəttə, sadəlöhvlük olardı. Zənnimizcə, Füzuli burada Rəsulullahın (s) vəfatı ilə Kərbəla vaqeəsi arasındakı 50 illik zaman fasiləsində baş verən və daha çox islami dəyərlərin korlanmasına yol açan elə ictimai-siyasi proseslərə işarə vurmuşdur ki, onlar üzdə dini müstəvidə görünməsinə baxmayaraq, əslində, ibtidai qəbilə-tayfa mənafelərinə xidmət edirdi. *Hadisə, bərq, tiğ, həvalə* sözlərinin beytin məzmunu içərisində kəskin səciyyə alması sübuta yetirir ki, şair bir filosof kimi səbəb-imkan-nəticə (illət-məlul-illiyyət) prizmasından çıxış edərək dini və ictimai müstəvidə önə çıxan şəxsləri və baş verən hadisələri İmam Hüseyn–Yezid müqayisəsi üzərində mənalandırır. Odur ki, bu yerdə mərsiyənin, istərsə də bütövlükdə əsərin ideya-bədii mahiyyətinin daha yaxşı qavranılması üçün hər hansı bir analitik təhlilə göz gəzdirmək yerinə düşər.

* * *

Bənddə toxunulmasına ehtiyac duyulan “İsmət hərəmsərasinə hörmət rəva ikən Pamali-xəsmi-bisərü pa qıldın, ey fələk!” beytində əksini tapmış eyhamlardır. Ona görə ki, bu eyhamlar saf və seçkin Peyğəmbər nəslinə, duru və parlaq İslama uzadılan qara əllər kimidir. Ayrıca açıqlama olmadan da bəllidir ki, “İsmət hərəmsərasi” dedikdə Füzuli beş kimsənəni, İmam Hüseynin də daxil olduğu pənc təni – ali-əbanı nəzərdə tutur. Ötəri deyildir ki, Füzuli ədəbi məktəbinin ən layiqli davamçısı olan Seyid Əzim Şirvani “Qərəz” rədifli qəzəlinin sonunda bu motivi böyük ustalıqla qələmə almışdır:

Bir vücudi-kamilin olmuş tüfeyli kainat,
Xəlqi-aləmdən nə Musəvü nə İsadır qərəz.





Pənctənlər adını zikr et ki, Seyyid, bilmişəm
Adəmə tə'limi-əsmadən bu mə'nadir qərəz!

"İsmət" sözü məsumluğun birbaşa daşıyıcısıdır. "Hərəmsəra" isə *toxunulmazlıq* demək olub, Əhli-beyti təmsil edir. Belədə "İsmət hərəmsərasinə rəva olan hörmət"in məşhur "Məvəddət" ayəsinin *("Şura", 23)* bədii əksi olduğu anlaşılır.

Digər tərəfdən, Əhli-beytin, Peyğəmbər balalarının hakim dairələrin əli ilə "Pamali-xəsmi-bisərü pa" edilməsi onların amansızlıqla, qansızlıqla hər cür fiziki və mənəvi işgəncəyə məruz qoyulması deməkdir. Bu isə Yezid məmurlarının, məs.: Ömər Sədin, Şimri-Zilcövşənin, Übeydullah Ziyadın Hüseyn övladlarına qarşı Kərbəla, Kufə və Şamda yol verdikləri ədəbsizliklərə, təhqiramiz ifadə və davranışlara, böhtan və iftiralara endirilmiş söz qılıncıdır. Yəqin, elə buna görədir ki, şair əsərini belə mənfur halları kəskin və kəsərli surətdə təsvir etməmiş bitirmir. Belə ki, adətən, kiçik həcmli olmalı olan sonluqda Füzulinin "Müxəddərati-Əhli-beytin Şamə getdigin bəyan edər" başlıqlı ayrıca bir iri hissə verməsi bir daha onun bu məsələyə necə həssas yanaşdığını göstərir. Həmin hissə hörmətin rəva olduğu ismət hərəmsərasının Yezid idarə üsulunun əli ilə necə "pamali-xəsmi-bisərü pa" edilməsinə dair aydın anlayış oyada bilər.

* * *

"Rəvayətdir ki, Əhli-beyt xatunları yola düşərkən güzarları qətl meydanından düşdü. Cənab Zeynəb Hüseyni-məzlumun mübarək cismini qana və torpağa bulaşmış görəndə fəryada gəldi ki: "Ya cəddah, ya Mühəmmədah! Bu həmin Hüseyndir ki, sinəsi və rüxsarını həmişə sən busə edərdin və bu o səadətli övladdır ki, sən onu hamıdan çox istəyirdin! İndi isə başı bədənindən ayrılmış, bədəni üryan qalmışdır. Gör ruzigar ona necə zülmlər etmişdir".[334]

.................................

[334] *Füzuli, Kərbəla vaqiəsi, səh. 148*





* * *

Çox böyük zəhmət çəkərək "Hədiqətü-s-süəda"nın 7-10-cu bablarını və sonluğunu sadələşdirmiş Hafiz Abıyev burada nədənsə böyük diqqətsizlik edərək, çox kobud bir səhvə yol vermişdir. Belə ki, o, xanım Zeynəbin ibn Ziyada söylədiyi sözləri tamamilə yanlış sadələşdirmişdir.

Xanım Zeynəb ibn Ziyada başqa söz deyir. O deyir ki, dünya malı sənin gözünü tutduğuna görə sən İmam Hüseyn kimi bir padşahı qətlə yetirmisən. O, elə bir padşah idi ki, yaranmışların hamısı ona itaət edirdi.

Füzulinin xanım Zeynəbin dilindən verdiyi şeir də Hafiz Abıyevin mətni düzgün sadələşdirmədiyini inkarolunmaz surətdə sübuta yetirir. Həmin şeir belədir:

Hüseyn ibn Əli ibn Əbu Talib kim, andandır
Binayi-şər'ə istehkamü dini-Həqqə istila.
Müəzzəm cəddi-valası nəbiyyi-ümmiyi-Məkki,
Mükərrəm babi-ilqası, Əliyyi-aliyi-əla[335].

*(Əbu Talib oğlu Əli oğlu Hüseyn elə bir böyük şəxsiyyətdir ki, şəriətin özülünün möhkəmliyi və Allah-taalanın dininin yayılması bilavasitə ona bağlıdlır və əzəmətli və uca babası Ümmi və Məkkəli Peyğəmbər, kəramətli görüş qapısı isə ucalar ucası olan İmam Əlidir!).*

* * *

"Hədiqətü-s-süəda"nın sonunda əhvalatların sürəkli inkişafına ayrılmış geniş təsvirlər Əhli-beytin də, Əhli-beyt düşmənlərinin də simasını göz önündə aydın canlandırır. Bu isə şeirin burayadək olan bölümündə lirik "mən"in dilindən səslənən tərənnümə parlaq və dolğun bir təhkiyə üslubu verir.

Bənddə diqqəti çəkən bir başqa cəhət "Təxfif qədri şər'dən əndişə etməyüb, Övladi-Müstəfaya cəfa qıldın, ey fələk!" beytində hakimiyyətin islami dəyərləri qorumalı və müsəlman

335 *Füzuli. Kərbəla vaqiəsi, səh.153*





həyat tərzinə rəvac verməli olduğu halda, əksinə, bunlara arxa çevirməsinə və tam məsuliyyətsizliklə din böyüklərinə qarşı olmazın ləyaqətsiz hərəkətlər etməsinə işarə olunmasıdır. Bu isə cəzasızlıq şəraitində nəinki sıravi adamların, hətta böyük nüfuz sahiblərinin də haqq və hüquqlarının tapdanmasının çox adi bir hala çevrilə biləcəyinə edilmiş etirazdır.

* * *

Belə ictimai-siyasi mühakimədən sonra Füzuli yenidən İmam Hüseyn şəxsiyyətinə qayıdıb, bu ulu din böyüyünün duyğu və düşüncələrini, iztirablarını, ruhi həyəcanlarını, valideynlik, sərkərdəlik, rəhbərlik qayğılarını və nəhayət, mərdanə təbiətini tərənnüm edir:

Basdıqda Kərbəlaya qədəm Şahi-Kərbəla,
Oldu nişani-tiri-sitəm Şahi-Kərbəla!
Düşmən oxuna qeyr sipər görməyib rəva,
Yaxmışdı cana daği-ələm Şahi-Kərbəla!
Ə’da müqabilində çəkəndə səfi-sipah
Qılmışdı mədi-ah ələm Şahi-Kərbəla!
Dudi-dili-püratəşi əhli-nəzarədən
Etmişdi pərdədari-hərəm Şahi-Kərbəla!
Olduqca ömrü rahəti-dil görməyib dəmi,
Olmuş həmişə həmdəmi-qəm Şahi-Kərbəla!
Ya Şahi-Kərbəla, nə rəva bunca qəm sana,
Dərdi-dəmadəmü ələmi-dəmbədəm sana![336]

*(Kərbəla şahı Kərbəla torpağına ayaq qoyar-qoymaz zülm oxunun hədəfinə çevrildi. O, düşmən cəbhəsindən atılan oxların qarşısında başqa bir şeyi sipər etməyi rəva görməyərək, bədənini ağrı-acı yaraları ilə bürümüşdü. Düşmən onun qarşısında dikbaşlıqla sıra-sıra ordu cərgələri düzəndə o ulu din böyüyü dərindən çəkdiyi çarəsizlik ahlarını*

..................................

[336] *Füzuli. Əsərləri, VI cild, səh. 375*





*bayrağa çevirmişdi. Əhli-beytin qız-gəlinini xain və yad baxışlardan qorumaq üçün Kərbəla şahı özünün odla, yanğı ilə dolu qəlbinin tüstüsünü pərdə etmişdi (Qoy heç kəs elə düşünməsin ki, İmam Hüseyn yalnız Kərbəlada əzab-əziyyət çəkmişdir, əslində, Kərbəla şahının bütün ömrü qəm-kədərə yoldaş olmaqla keçmiş, o, bircə an belə ürək rahatlığı tapa bilməmişdir. Ey Kərbəla şahı, bu qədər qəmi, belə mütəmadi dərd və kədəri kimlər və necə sənə rəva görə bildilər axı?!).*

Belə bir məlumat vardır ki, Ömər Səd fəxrlə qoşun böyüklərinə sarı çevrilərək deyir ki, Übeydullah Ziyadın yanında şahid olarsınız ki, Hüseynə tərəf ilk oxu mən atdım. Çox güman ki, bəndin ilk beyti bu məlumat üzərində qurulmuşdur.

İkinci beyt İmam Hüseynin fədakarlığı haqqındadır. Belə ki, burada onun qayğıkeş bir valideyn və sərkərdə kimi ətrafındakı gənc döyüşçüləri var gücü ilə qoruyub yersiz tələfatdan, ucuz ölümdən uzaq tutmağa çalışması və bununla da onları tədricən şəhidliyin yüksək mərtəbələrinə hazırlaması tərənnüm olunur.

Bəllidir ki, hər bir döyüş meydanının bəzəyi və güvənc yeri bayraqdır, bayraqdardır. Üçüncü beytdə seltək dalğalanan on minlərlə düşmən qoşununun önündə tək-tənha dayanıb, özünün bütün mərdanə və şahanə təbiəti ilə boy göstərən bir övliyanın portret-obrazı yaradılmışdır. Heç nəyə gümanı gəlməyən bu şəhid oğlu şəhid bağrından qopan ahı belə son anda döyüş sursatına, silaha çevirməyi bacarır.

Kərbəla düzündə Peyğəmbər xanədanının qız-gəlininin Ömər Səd qoşunu tərəfindən qarət edilib-edilməməsi bəlkə də tarixi planda mübahisəli ola bilər. Ancaq yaşı min ili keçmiş məqtəl ədəbiyyatının imamhüseynsevər müəlliflərini buna inandırmaq əbəsdir.

Doğrudur, Füzuli var gücünü toplayaraq Əhli-beytdən olduqlarına görə Peyğəmbər xanədanının qız-gəlininə Kərbəla düzündə toxunulmadığını yazır. Ancaq müvəqqəti olaraq



söylədiyi bu fikir şairin yazdıqları ilə uyğun gəlmir. Ona görə ki, Əhli-beytin faciəsini öz faciəsi bilən Füzuli bir anlığa söylədiyi fikrə heç özü də inanmır və inana da bilməzdi. Bunu onun Əhli-beytin başına gətirilən müsibətlərin təsviri zamanı işlətdiyi ağrılı-acılı ifadələr sübuta yetirir.

Beşinci beytdə şair məqtəl və mərsiyələrdə çox az toxunulan Kərbəladan öncəki illəri şeirə gətirir. Bu isə o deməkdir ki, İmam Hüseyn ömrü Füzulinin gözündə bütöv, bölünməz bir tam olub Rəsulullah, Əliyyən Vəliyullah, xanım Fatimeyi-Zəhra və İmam Həsən mübarizəsinin təbii, qanunauyğun davamı və təzahürü idi. Odur ki, bəndin sonunda lirik “mən”in ömrü qəm-kədər timsalına çevrilən İmam Hüseyn şəxsiyyəti ilə bağlı yanğısı tamamilə yerinə düşür və milyonlarla Əhli-beyt aşiqinin Kərbəla müsibəti ilə yanan odlu ürəklərinə su səpir.

* * *

Şair mərsiyənin sonuncu bəndində bütün varlığı ilə qail olduğu imamının şirin adını olduqca həzin bir biçimdə rədifə çevirir. Bu isə qətiyyən bəsit bir bədiilik elementi deyildir. Çünki yüzilliklər boyu formalaşan Kərbəla şəhidləri matəmində bu ulu din böyüyünün adı ilə bağlı çoxsaylı və çoxqatlı bir məna-məzmun şəbəkəsi və rəmzlər sistemi əmələ gəlmişdir. “Ya Hüseyn, Hüseyn vay, can Hüseyn, Hüseyn can, şaxsey-vaxsey!” səpkili xitablar artıq yüz minlərlə imamhüseynsevərin dilinin əzbərinə çevrilmiş, onların inam və güvənc yeri olmuş, Rəbləri ilə etdikləri gizli razü niyazda sanki bir simvol kimi çıxış etmişdir. Bəndi oxuyaq:

Ey dərdpərvəri-ələmi-Kərbəla Hüseyn!
Vey Kərbəla bəlalarına mübtəla Hüseyn!
Qəm parə-parə bağrını yandırdı dağ ilə,
Ey laleyi-hədiqeyi-ali-əba Hüseyn!
Tiği-cəfa ilə bədənin oldu çak-çak,





Ey bustani-səbzeyi-tiği-cəfa, Hüseyn!
Yaxdı vücudunu qəmi-zülmətsərayi-dəhr,
Ey şəm'i-bəzmi-bargəhi-kibriya, Hüseyn!
Dövri-fələk içirdi sənə kasə-kasə qan,
Ey təşneyi-hərarəti-bərqi-bəla Hüseyn!
Yad et, Füzuli, ali-əba halın, eylə ah
Kim, bərqi-ah ilən yaxılur xirməni-günah![337]

*(Sən ey Kərbəla kədərinin yetişdiricisi ola-ola özü cürbəcür Kərbəla bəlalarına tuş gələn Hüseyn! Hüseyn, sən axı beş kimsənə çəmənliyində bitmiş ən gözəl lalə idin. Bəs niyə qəm-kədər sənin onsuz da didilib-parçalanmş sinənə saysız-hesabsız yanıq yaraları vurdu, zülm qılıncı ilə bədənin tikə-tikə doğrandı və sən gözgörəsi bağbanə zülm qılıncı olan bir bağa çevrildin. Hüseyn, sən ən uca dərgahın – Tanrı qatının məclisi işıqlandıran şamı ola-ola dünyanın və zəmanənin zülmət və qaranlıq mühiti sənin o şama bənzər lətif cismini adi və gərəksiz şam yerinə yandırıb heç-puç elədi! Hüseyn, sən onsuz da bəla ildırımının od-alovuna təşnə idin, üstəlik fələyin dövrü sənə kasa-kasa qan da içirtdi. Füzuli, "beş kimsənə"nin çəkdiyi əzab-əziyyətləri, tuş gəldiyi müsibət və fəlakətləri anıb durmadan ah çək, aman et! Axı yığın-yığın suçlar, bir-birindən ağır olan günah tayaları yalnız odlu ah qığılcımları ilə yandırılıb paklana, safa çıxarıla bilər!).*

Bənd başdan-ayağa bir bəla ab-havası üzərində qurulduğundan burada İmam Hüseynin bu barədəki bəzi fikirlərini xatırlamamaq olmaz. Çünki həmin fikirlər şeirin ideya-bədii keyfiyyətlərinin yaxşı açılması üçün qaçılmazdır.

Əsərin 7-ci babının başlanğıcında oxuyuruq: "Həqiqətən də dünya fəna vadisidir və bütün əhvalı keçib gedəndir. Dünyada bəla çəkən dünyadan çıxdıqda xilas olduğunu idrak etsə, şükr etməzmi və rahətdə olan şəxs dünyanı tərk edərkən əldən gedən rahatlığına təəssüflənməzmi?

[337] *Füzuli. Əsərləri, VI cild, səh. 376*



Mənsur ibn Arifdən rəvayətdir ki, Hüseyn bir gün münacatında deyirdi: "İlahi həqiqətə and olsun, bəla xəzinəsinin qapılarını açıb nə bəla varsa, mənə ruzi et və məni bütün bəlalarda imtahan elə! Əgər sənə məhəbbət yolunda iradəmi zərrəcə zəif görsən, məni sadiqlər silsiləsindən xaric qıl. Haqqa and olsun ki, əgər əzab qayçısı ilə bədən üzvlərimi zərrə-zərrə kəssələr, kamali-iradətimdə nöqsan olmaz, sədaqətimdə dəyişiklik baş verməz!"[338]

Füzuli İmam Hüseynin bu sözlərini Həzrət Muhəmmədin (s) aşağıdakı kəlamı ilə əsaslandırır: "Bəndə bir mövqeyə öz əməli ilə çata bilməzsə, Allah onun vücuduna xəstəlik verərək, ya mallarına zərər verərək, ya övladını qeyb etdirərək sınayır. Sonra bu imtahanlara dözdürtdürür ki, haqq etdiyi yerə çatsın".[339]

7-ci babdakı şeir parçaları da Rəsulullahın (s) və İmam Hüseynin (ə) kəlamlarının bədii təsdiqi olaraq və araşdırdığımız mərsiyənin fikri axarı və bədii tutumu baxımından olduqca dəyərlidir; məs.:

Hər təmənna qılsan, ey arif, bəladan istə kim,
Hər bəla zimnində min rahət müqərrərdir sana.
Etmək olmaz bibəla idraki-neyli hər murad
Gər bəla çəksən, muradi-dil müyəssərdir sana.[340]

*(Ey arif kimsə, hansı diləyinə çatmaq istəyirsənsə, onu "bəla"dan dilə, yəni əzab-əziyyətlərə qatlaşmağa hazır ol. Çünki qarşılaşacağın hər bəlanın içərisində hələ sənə gizli qalan minlərlə rahatlıq qərarlaşdırılıb. Heç bir məqsədə bəlasız çatmaq olmur. Odur ki, əzab-əziyyətlərə dözməklə ürəyinin mətləbi məzhər olar).*

.................................

[338] *Füzuli. Kərbəla vaqiəsi, səh. 27-28*

[339] *Yenə orada, səh. 28*

[340] *Yenə orada*





Yaxud:

Aşiq oldur kim, cəfa tiğindən ikrah etməyə
Zərrə-zərrə qılsalar ə'zasını, ah etməyə.
Qan içə, səbr eyləyə, hər dəm fəğanü ah edib,
Dərdi-eşqi-yardan əğyarı agah etməyə![341]

*(Əsl aşiq zülm qılıncından qorxub çəkinməyən kimsədir. Belə ki, əgər onun bədən üzvlərini tikə-tikə kəsib doğrasalar belə, o gərək heç ah da çəkməsin. O gərək qan içsin, səbir etsin, əksinə, anbaan ah-nalə edərək düşməni yarının eşq dərdindən, sirrindən xəbərdar etməsin!).*

Və ya:

Aşiq oldur kim, bəla zövqünü idrak eyləyə,
Eşq dərdi dəmbədəm könlün fərahnak eyləyə![342]

*(Əsl aşiq gərək əzab-əziyyətdən sözün gerçək anlamında zövq alsın və eşq dərdi durmadan ona bir könül xoşluğu versin).*

Füzuli bu beytin mənqəbəvi özülü olaraq "Ruhu-l-ərvah" ("Ruhlar ruhu") kitabına istinad edərək yazır ki, bir gün bir əziz (xristian keşişi) bir bimar dərvişin ibadətinə şahid olub, onu cürbəcür bəlalara mübtəla görüb, təskinlik vermək üçün deyir: "Ey dərviş, aşiq məşuqun cəfalarına səbir etməsə, məhəbbətində sadiq deyil". Dərviş dedi: "Ey əziz, qələt dedin, aşiq məşuqun bəlalarından zövq bulmasa aşiq deyil!"[343]

İstər Həzrət Muhəmmədin (s) və İmam Hüseyn (ə) ağanın kəlamının, istərsə də həmin kəlamların bədii ifadəsi olan nümunələrin əsasında Qurani-Kərimin "İman gətirənlərin

..................................

[341] *Yenə orada*

[342] *Füzuli. Kərbəla vaqiəsi, səh. 28*

[343] *Yenə orada*





Allaha məhəbbəti böyük olar" *("Bəqərə", 165)* ayəsi dayanır. Ötəri deyildir ki, bu ilahi bəyanat əsrlər boyu müqəddəsləri dərindən-dərinə düşündürmüş və onlar bu yöndə bir sıra saf mülahizələr söyləmişlər. Məsələn, beşinci imamımız Məhəmməd Baqir "Məgər din məhəbbətdən başqa bir şeydirmi?" deyə soruşmuş və bütün bəşəriyyətə ünvanlanmış bu sualı ilə də təriqət və məzhəb rəhbərlərini heyrətdə qoymuşdur. Altıncı imamımız Cəfəri-Sadiq ağa ilahi məhəbbəti kamilləşdirici oda bənzədərək buyurmuşdur: "Məhəbbət elə bir oddur ki, məhbubdan – sevgilidən başqa hər bir şeyi yandırıb-yaxar". Həmin din böyüyünün başqa bir kəlamı isə belədir: "Allah məhəbbəti bəndənin "sirr" adlanan ən dərin yerinə düşdükdə, o, qəlbi bütün başqa məşğuliyyətlərdən təmizləyər". Səkkizinci imamımız Əli ibn Musa Rza da inci sözlərinin birini ilahi eşq məsələsinə həsr etmişdir: "İnsanla onun Rəbbi arasında həvavü həvəsdən, nəfsdən başqa bir örtük, bir maneə yoxdur". Qurani-Kərimin "Bilin ki, Allah kişi ilə onun qəlbi arasına girən Allahdır" *("Ənfal", 24)* ayəsindən ilham alınaraq buyurulan bu kəlam sonralar ədib və filosofların təfəkkür predmetinə çevrilmişdir. Məsələn, Füzulinin özü bu barədə belə bir beyt demişdir:

Səni canan sayıram, çıx bədənimdən, ey can,
Mənü Cananım arasında çox olma hail!

Əgər mərsiyənin sonuncu bəndinin leksikonunu gözümüzün qabağına gətirsək, *Dərdpərvəri-ələmi-Kərbəla, Kərbəla bəlalarinə mübtəla, kasə-kasə qan* kimi söz və deyimlərin yuxarıdakı nəsr və nəzm parçalarında əksini tapmış mülahizə müddəalarla qırılmaz bağlılıq içində olduğunu görərik. Ümumiyyətlə, "bəla" anlayışı çevik və işlək bir motiv kimi "Hədiqətü-s-süəda"da özünün bütün aydınlığı və genişliyi ilə boy göstərir. Odur ki, bu motivin əsərdəki yeri və bədii ifadə yolları ayrıca araşdırılmalıdır.





* * *

Mərsiyənin başlıca keyfiyyətlərindən biri Füzulinin İmam Hüseyni "Kərbəla kədərinin yetişdiricisi" adlandırmasıdır. Çünki bu səciyyələndirmə o ulu din böyüyünün bütün həyat və fəaliyyətini əhatə edir. Axı "Kərbəla kədəri" bir meydan müharibəsində baş verən tayfa-qəbilə, xalq-millət faciəsi deyildi. Bu, ilk növbədə bütövlükdə bəşəriyyətin ovaxtadək keçdiyi tarixi inkişaf yolunda çatmalı olduğu, ancaq çata bilmədiyi kamillik, mənəvi-əxlaqi yetkinlik üçün duyulan bir övliyanın bəşəri kədəri idi.

Ümumiyyətlə, klassiklərimiz dərdə ictimai-bəşəri məzmun yüklədikləri qədər də, nümunəvi dərdpərvər ustadının da parlaq obrazını yaratmağa meyilli olmuşlar. Xaqaninin "Tələb" rədifli qəzəlindən aşağıdakı beytlər buna örnəkdir:

Ruye-zəmin xeyle-şəyaten gereft
Şəm' bər əfruz ol Soleyman tələb[344].

*(Yer üzü şeytanın atlı dəstələri ilə doludur. Buna görə də sən Süleyman Peyğəmbəri çağırmamışdan qabaq gərək şam yandırasan, yəni öz qəlbindəki insanlıq və bəndəlik nurunu oyadasan, üzə çıxarasan).*

Zəhre-səfər nuş kon əvvəl, ço Xezr
Pəs berəvo çeşmeyi-heyvan tələb![345]

*(Öncə Xızır Peyğəmbər kimi səfər zəhərini ürəklə başına çək, daha sonra gedib dirilik bulağını axtar!).*

Yusof didi kie ze exvə çe did,
Poşt bər exvəd kono exvan tələb![346]

..................................

[344] *Xaqani. Divan, 2 clilddə, I cild, səh. 178-179*

[345] *Yenə orada*

[346] *Yenə orada*





*(Axı sən Yusifin qardaşlarından nə gördüyünü, əllərindən nə çəkdiyini özün öz gözünlə gördün. Odur ki, gəl süni, yalançı qardaşlığa arxa çevirib, əsl, həqiqi, mənəvi qardaşlar sorağına düş!).*

Məqsəde-amal be amel şenas
Yusofe-qomkərde be qorqan tələb![347]

*(Arzuların məqsədini dilək diləyənə uyğun tanı və itirilmiş Yusifi qurdların izinə düşərək axtar).*

Məsələnin anadilli ədəbiyyatımızdakı əksinə dair isə Rəhmətullah Həbibinin "İstəyən" rədifli qəzəli səciyyəvi misal sayıla bilər. Şeir belədir:

Xabi-qəflətdən oyansın eşqi-dildar istəyən,
Bülbüli-şuridə olsun vəsli-gülzar istəyən!
Ney kimi bağrın dəlib, hər dəmdə nalə eyləsin,
Dərd ilə yansın-yaxılsın vüsləti-yar istəyən!
Aşiqin yanmaqdan özgə dərdinə dərmanı yox,
Yanmağa pərvanə bolsun şəm'i-ruxsar istəyən!
Aşiq oldur, canü dildən dərdi qıldı ixtiyar,
Dərdinə dərman buldu dərdi-təkrar istəyən!
Can verib bir can üçün yansa Həbibi, qəm degil,
Masivadən fariğ oldu vəslü didar istəyən!

*(Sevgilisi ilə görüşmək istəyən gərək qəflət yuxusundan oyanıb azad bir çəmənlik bülbülü olmağa can atsın. Yarına qovuşmağı uman hər bir kəsin ney kimi bağrını dələrək anbaan ah-nalə çəkməsi və dərdlə yanıb-yaxılması qaçılmazdır. Aşiqin dərdinin yeganə dərmanı yanmaqdır. Sevgilinin üzünün şamı ilə nurlanmağı diləyən gərək yanmaqda pərvanədən geri qalmasın. Əsl aşiq özünün bütün səmimiliyi ilə tuş gəldiyi dərdi könüllü olaraq özü seçmişcəsinə qəbul etsin. Yalnız dərd*

[347] *Yenə orada*



*üstündən dərd istəyənlər dərdlərinə dərman tapa biliblər. Əgər Həbibi cismindən keçərək ruhani bir varlıq üçün özünü yandırsa, burada qətiyyən heç bir qəm-kədərə yer yoxdur. Çünki Tanrısına qovuşmaq istəyən bütün həqiqi aşiqlər həmişə ötəri, keçici və öləri aləmdən uzaq durmuş, hər cür utilitar maddi maraqlardan ucada dayanmışlar).*

* * *

Mərsiyənin sonuncu bəndində diqqəti çəkən ikinci cəhət ümumbəşəri faciəsinə yas saxlanılan şəxsiyyətin kamillik keyfiyyətləridir. "Laleyi-hədiqeyi-ali-əba" – *beş kimsənə çəmənliyinin laləsi,* "Bustani-səbzeyi-tiği-cəfa" – *zülm qılıncının qanla suvardığı yamyaşıl çəmənlik,* yaxud *bu diriliyin təptəzə bitkilər becərdən ustad bağbanı,* "Şəm'i-bəzmi-barigahi-kibriya" – *Uca Tanrı qatında qurulan ali məclisi işıqlandıran şam,* "təşneyi-hərarəti-bərqi-bəla" – *ağır sınaqların qorxunc toqquşmalarından ibarət olan hadisələrə doğru qızğın ehtirasla can atan mübariz* tərkibləri özlüyündə misilsiz epitetlərdir. Ancaq bu epitetlərin hər birinin alt qatında dərin və incə məna-məzmun şəbəkəsi yatır. Əli dühasının "Nəhcül-bəlağə" zirvəsinə boylanmadan isə bu şəbəkəyə yol-iz tapmaq çətindir.

* * *

Bəndin daha çox bədiiliklə bağlanan, ancaq daha çox sarsılmaz gerçəklik, danılmaz həyat həqiqəti üzərində qurulan ikinci, beşinci beytlərinin üzvi uyarlığı, aralarındakı məntiqi əlaqə də ayıq-sayıq oxucunun gözündən yayına bilməz. Çünki bu parçada misralar bir-birini tamamladığı kimi, beytlər də eyni ideyanı vahid mövzu üzrə canlandırmaqla əlvan və rəngarəng məzmun incəlikləri, dolğun və tutumlu üslub cizgiləri, ən nəhayət, kəskin və kəsərli sözaltı mətləb axarı göstərir, bununla da nəinki mərsiyəni, bütövlükdə "Hədiqətü-s-süəda" kimi köklü əsəri layiqli yekun olaraq bir



daha nəzərdə tutulan nəticəyə çatdırır. Bunu əyani surətdə müşahidə etməkdən ötrü:

Yaxdı vücudini ğəmi-zülmətsərayi-dəhr,
Ey şəm'i-bəzmi-barigəhi-kibriya Hüseyn! –

beytinə baxaq.

Oradan başlayaq ki, beyt başdan-ayağa bir şam obrazı üzərində qurulmuşdur. Şair öz məmduhunun əziz varlığını ilahi həqiqətdən od alıb nur saçan bir şama oxşadır. Heç şübhəsiz, burada Musa Peyğəmbərin həyat yoldaşı, Şüeyb Peyğəmbərin qızı Səfurə ilə Zəbir dağının sağ tərəfində gecəyə düşərkən soyuqdan əziyyət çəkdikləri bir anda od görməsi əhvalatı *("Taha", 9-13)* "nar-nur" (od-işıq) uyarlığı fonunda beytin köklü bir ənənəyə söykəndiyini göstərir. Məsələn, Nəsimi bu əhvalata belə işarə etmişdir:

Gərçi həqdən vahid oldu nur ilə "anəstü nar",
Ey Nəsimi, çün ulaşdun nurinə, nar istəmə![348]

XIX əsrin böyük arifi Seyid Əzim Şirvani isə bu motivi belə qələmə alır:

Təcəllayi-xudavəndi-əhəd yarında peydadır,
Hanı Musa ki, Seyyid, fərq qılsın nurdən nari?!

Əlbəttə, şamın verə biləcəyi ən böyük fayda onun yanaraq ətrafına işıq saçmasıdır. Ancaq Füzulinin ustalığı ondadır ki, o, İmam Hüseynin bu işıqsaçmasını bir neçə baxımdan mənalandırır. Belə ki, biz "Yaxdı vücudini qəmi-zülmətsərayi dəhr" misrasını Yezid idarə üsulunun əzici və boğucu qatı

.................................

[348] *Nəsimi İmadəddin. Mən bu cahana sığmazam... Seçilmiş əsərləri, Bakı: Gənclik, 1991, səh.63-64*





*Xanım Zeynəb (s.ə.)-nın müqəddəs məzarı. Suriya. Şam şəhəri*

düşmən mühitinə dərin nifrət hissi ilə oxuyuruqsa, "Ey şəm'i-bəzmi-bargəhi-Kibriya, Hüseyn" misrasını tam əksinə, dəruni bir sızıltı ilə pıçıldayırıq. Halbuki hər iki misrada şamın yanmasından danışılır. Ancaq birinci misradakı yanma qaragüruhun İmam Hüseyn kimi müqəddəs bir şəxsiyyətin qədir-qiymətini bilməməsindən duyulan ağrı-acını ifadə etdiyi halda, ikinci misradakı yanma o ulu din böyüyünün fədakarlığını, valideynlik, rəhbərlik və sərkərdəlik simasını, əlçatmaz-ünyetməz, mənəvi-əxlaqi məziyyətlərini önə çəkir. Belədə "ğəmi-zülmətsərayi-dəhr" və "şəm'i-bəzmi-bargəhi-kibriya" tərkiblərinin ustalıqla yaradılmış təzad olması sadəcə olaraq unudulur, bunun yerinə isə duyğu və düşüncə karvanı o təzadın arxasında duran dərin həyat ziddiyyətlərinə, kəskin, ictimai-tarixi hadisələrin, proseslərin mahiyyətinə doğru yön alır. Burada istər-istəməz məşhur misralar yada düşür: "Mən yanmasam, sən yanmasan, biz yanmasaq, necə çıxar qaranlıqlar aydınlığa?!" *(Nazim Hikmət)*.

* * *





Beləliklə, aydın olur ki, özlüyündə lirik poema, ballada təsiri bağışlayan bu şeir malik olduğu ideya-bədii xüsusiyyətləri ilə məqtəl və mərsiyə ədəbiyyatının başlıca tələblərinə cavab verən, haqqında danışılan dini-tarixi simanın parlaq portretini gözlər önündə aydın canlandıran, Füzuli dünyagörüşünün tutarlı göstəricisi sayılan, şairin estetik amallarını əks etdirən, ən nəhayət, müəllifinin qail olduğu islami dəyərlərin birmənalı inikasına çevrilən təravətli bir sənət əsəridir. Ona görə də hazırlıqlı oxucu bu şeiri təkcə mərsiyə kimi yox, bütövlükdə "Hədiqətü-s-süəda"nın qanunauyğun yekunu kimi də qavrayacaqdır. Məsələn:

Övladi-Müstəfayə mədəd qılmamış Fərat,
Keçirməsinmi yerlərə anı bu infial? –

beytinə çatdıqda Tasuadan Aşuraya keçən gecə baş vermiş aşağıdakı əhvalatı xatırlayacaqdır: Cə´də Qərani qabağa çıxıb qışqırdı ki, Fərat çayı gözünüzün qabağında dəniz kimi dalğalanmaqdadır. Ancaq sizə ondan bir qətrə su verilməyəcək və siz də susuzluqdan həlak olacaqsınız.

Bunu eşidən imam dərhal dua etdi: "Əllahüm mə əmithu ətşanən" – *Ey Rəbbim, onu susuz öldür!*

Hər iki qoşunun gözü önündə atı həmin şəxsi yerə çırpdı. O da "əl-ətəş, əl-ətəş" – "susadım, susadım" deyə-deyə oyan-buyana qaçmağa başladı. Hər nə qədər su verdilərsə də, içə bilmədi, axırda cəhənnəmə vasil oldu.

Mərsiyənin hər beytinə uyğun belə əhvalatlar tapmaq mümkündür. Deməli, bu şeir, doğrudan da, özünün ideya-bədii xüsusiyyətləri ilə "Mərsiyeyi-Həzrəti-İmam Hüseyn əleyhissalam"dır.



# FÜZULİ KƏRBƏLA ZƏVVARLARININ TƏRƏNNÜMÇÜSÜ KİMİ

İmam Hüseyn (ə) aşiqi olan Füzulinin zəngin yaradıcılığında Kərbəla zəvvarlarının da bədii portreti, onlanın ruhi-psixoloji əhvali-ruhiyyəsi, bir həyat həqiqəti kimi zəvvarlığın ictimai-mədəni və etik-estetik mahiyyəti əksini tapmışdır. Bunu əyani surətdə müşahidə etməkdən ötrü şairin bir rübaisinə nəzər salmaq kifayətdir:

Qad şərrəfəkə-l-lahu bitovfi-l-Hərəmeyn,
Min ru`yəti Məşhədeyni qarrət ləkə eyn!
Tuba limən əlqakə li ən ət-təhqiq,
Mən zarəkə, qad zarə Əliyyən və Hüseyn![349]

*(Allah səni iki hərəmin təvafı ilə şərəfləndirdi, iki qəbri görməklə sənin gözün işıqlandı. Sənə qovuşanlara müjdə olsun ki, doğrudan da, səni ziyarət edən Əlini və Hüseyni ziyarət etmiş olur).*

Göründüyü kimi, *Hərəmeyn* və *Məşhədeyn* sözləri bilavasitə, *təvaf* və *ru'yət* sözləri nisbətən alt qatda, *Şərrəfəkə-l-lah, qarrət ləkə eyn, tuba limən əlqakə, Əli, Hüseyn* ifadələri isə dolayısı ilə Kərbəla zəvvarının mənəviyyatına dəlalət etməkdə, zəvvarlığın çeşidli qatlarından xəbər verməkdə, ən

..................................

[349] *Füzuli. Əsərləri, 5 cilddə, I cild, Bakı, 1958, səh. 397*



nəhayət, orta əsr azərbaycanlısının dünyagörüşünün bariz ictimai-mədəni təzahürü olaraq ortaya çıxmaqdadır. Odur ki, bu söz və ifadələrin hər birinə bir rəmz kimi yanaşılmalı, onların istər ayrılıqda, istərsə də küll halında əhatə etdiyi mətləbləri birər-birər araşdırmalı, həmin mətləblərin dini-ictimai və bədii-estetik semiotikasının, işarələr düzümünün alt qatına enərək özündə birləşdirdiyi mülahizə və müddəaları üzə çıxarmalıyıq.

**1. "Bitovfi-l-Hərəmeyn" (iki hərəmin təvafı).** *Qorunan, özündə bu və ya başqa ölçüdə müqəddəslik nişanəsi olan yer; çoxsaylı insanların güvənc yerinə çevrilən dini məkan* anlamlarına gələn "hərəm" sözü Kəbə evindən tutmuş Məşhəd, Kərbəla, Nəcəf və başqa şəhərlərdəki müqəddəslərin türbə və məqbərələrinə deyilir. İslami mənbələr, tarixi dövrləşmələr və çağdaş münasibət belə ünvanlarla bağlı dərindən mühakimə yürütməyə imkan verir. Ancaq məzhəb və təriqət mənafelərinin güdazına getməmək şərtilə düşündükdə, bu ünvanların, əslində, mənəviyyat məkanından, ruh halətindən və əxlaq aurasından başqa özgə heç bir əlavə, qurama məqsədə qulluq etmədiyi, yalnız döruni saflıq, insani paklıq aşıladığı aydın olur. Odur ki, "basına, ətrafına dönüb-fırlanmaq, dolanmaq" kimi lüğəvi və "Kəbə evinin məxsusi ibadət növü" kimi istilahi anlamlara gələn "təvaf" sözü ilə vəhdətdə, eləcə də rübainin ümimi məzmunu daxilində ifadə "Həzrət Əlinin Nəcəfdəki məqbərəsi" anlamını verir.

Bu qeydlər "iki şəhidin dəfn edildiyi yer" mənasına gələn "Məşhədeyn" sözünə də aiddir. Bəllidir ki, köhnə Tus şəhərinin vaxt ötdükcə Məşhəd adlanmasının başlıca səbəbi də məhz bu həyat həqiqətində – İmam Rzanın orada dəfn edilməsindədir. Ötəri deyildir ki, Bətha Məkkəyə, Yəsrib Mədinəyə çevrildikdən sonra qat-qat çox ehtiram qazandığı kimi, Tus da Məşhəd olduqdan sonra ədiblərin sevimlisinə çevrilmiş, bədii ədəbiyyatda ən müxtəlif epitetlərlə vəsf edilmişdir. Əbü-l-Qasim Nəbatinin məşhur "Əlimə" rədifli qəzəlindən aşağıdakı beyti yada salmaq kifayətdir:



Gedərəm dadə əlindən sənin, ey düşməni-can,
Düşsə gər barigəhi-Şahi-Xorasan əlimə.

Nəbati kimi bir klassikin Məşhəd şəhərini belə güvənc yerinə çevirməsinin mütləq möhkəm dini əsasları olmalı idi. Aşağıdakı hədislər məhz belə nəqli dəlillər sırasındadır.

İslam rəhbəri buyurmuşdur: "Çox çəkməz ki, qəlbimin bir parası Xorasan torpağında dəfn edilər. Hər bir qəm-qüssəli şəxs onu ziyarət etsə, hökmən Allah onu sevindirib, qəm-qüssəsini dağıdar. Hər bir günahkar şəxs onu ziyarət etsə, hökmən günahları bağışlanar".

Həzrət Əli (ə) buyurmuşdur: "Çox çəkməz ki, Xorasan torpağında mənim övladlarımdan biri zəhərləndirilib zülmlə qətlə yetirilər. Adı mənim adımla eynidir. Atasının adı İmran oğlu Musanın adı ilə eynidir. Agah olun ki, hər kəs onu olduğu qürbət ölkədə ziyarət etsə, Allah onun keçmiş və gələcəkdəki günahlarını bağışlayar; hətta əgər ulduzların, yağış damcılarının, yarpaqların sayı qədər olsa da!"

İmam Cəfəri-Sadiq buyurmuşdur: "Mənim nəvəm Xorasan torpağında bir şəhərdə qətlə yetiriləcək. O şəhərə Tus deyilir. Hər kəs onun haqqına arif olan halda onu ziyarət etsə, Qiyamət günü öz əlimlə onu cənnətə daxil edəcəyəm; hətta kəbirə günah əhli olsa belə!"

Soruşdular ki, onun haqqını necə tanımaq olar? Ağa belə cavab verdi: "Belə ki, ona itaət etməyin vacibliyini, onun qərib və şəhid olduğunu yəqin etsin. Hər kəs onu haqqına agah olaraq ziyarət etsə, Allah ona Rəsulullahın önündə şəhadətə çatan yetmiş şəhidin savabını verər".

Ötəri deyildir ki, İmam Rza ilə bağlı ziyarətnamələrin birində olduqca parlaq ifadələr vardır; məs.: "Salam olsun sənə, Ey Allahın bəndələrə Höccəti! Salam olsun sənə, Ey Allahın Nuru! Salam olsun sənə, Ey Allah Evinin xəzinəsi! Salam olsun sənə, Ey Allah Hikmətinin mədəni! Salam olsun sənə, Ey Allah Kitabının hamili! Salam olsun sənə, ey Allah sirrini qoruyan".







*İmam Rza (ə)-ın müqəddəs məzarı. İran. Məşhəd şəhəri*

Hər iki sözün islami mahiyyətini dərindən qavramaqdan ötrü Qurani-Kərimin Kəbə ilə bağlı başlıca bilgilərinə göz gəzdirmək yerinə düşərdi. Müqəddəs Kitabımızda oxuyuruq: "Onu da yadına sal ki, İbrahim və İsmail Kəbənin bünövrəsini ucaltdıqları zaman "Ey Rəbbimiz, (bu xeyirli işi) bizdən qəbul



*İmam Rza (ə)-ın müqəddəs məzarı. İran. Məşhəd şəhəri*



et, Sən doğrudan da, (hər şeyi) eşidən və bilənsən!" – deyə dua etdilər" *("Bəqərə", 127).*

Ayə ilə bağlı ənənəvi açıqlama belədir: "Kəbənin tikilməsinə dair rəvayətlərə əsasən, Adəm və Həvva cənnətdən çıxardıldıqda yer üzərində Ərəfatda görüşürlər. Onlar birlikdə qərbə sarı gedirlər. Kəbənin olduğu yerə gəlirlər. Bu zaman Adəm bu görüşə şükür olmaq üçün Rəbbinə ibadət etmək istəyir. O, cənnətdə olarkən ətrafında təvaf edərək ibadət etdiyi Nurdan olan sütunun yenidən özünə verilməsini diləyir. Həmin Nurlu sütun orada təcəlli edir. Amma o, Şitin (yaxud Şeysin, Şisin) dövründə itir. Onun yerində isə qara daş qalır. Bundan sonra Şit onun yerində daşdan onun kimi dördguşəli ev tikir və qara daşı da həmin evin bir küncünə qoyur. "Həcərü-l-əsvəd" həmin daşdır.

Nuh tufanında bu ev qumlar altında uzun müddət gizli qalır. İbrahim Peyğəmbər Allahın buyuruğu ilə Kəbənin olduğu yerə gedir, İsmayılı anası ilə birlikdə orada yerləşdirir. Sonra İsmayılla birlikdə Kəbənin olduğu yeri qazıyır və Şitin tikdiyi evin özülünü üzə çıxarır, o özülün üzərində indiki Kəbəni tikir.

Ayədəki "yərfəu" *(ucaldır)* sözü məhz bunu bildirir"[350].

Yaxud: "Həqiqətən, insanlar üçün ilk bina olunan ev (məbəd) Kəbədəki evdir ki, o, şübhəsiz, bütün aləmlərdən ötrü bərəkət və doğru yol qaynağıdır. Orada aydın nişanələr – İbrahimin məqamı var. Oraya daxil olan şəxs əmin-amanlıqdadır (təhlükədən kənardadır). Onun yoluna (ərzaq, minik və sağlamlıq baxımından) gücü çatan hər bir kəsin həccə gedib o evi ziyarət etməsi insanların Allah qarşısında borcudur. Kim bunu (bu borcu) inkar edərsə, (özünə zülm etmiş olar). Əlbəttə, Allah aləmlərə (heç kəsə) möhtac deyildir" *("Ali-İmran", 96-97).*

2. "Şərrəfəkə-l-lah" *(ilahi şərəfə nail olmuş).* Qurani-Kərimdə bir neçə ayə oxuyar-oxumaz Allahına bəndə olan hər bir kimsənin necə böyük izzət və əzəmət yiyəsi ola bildiyi dərhal ortaya çıxır; məs.: "Hər kəs (dünyada) izzət-qüdrət,

.................................

[350] *Qurani-Kərim və türkcə açıqlamalı məalı, səh. 19*





şərəf-şan istəsə, (bilsin ki, dünya və axirətdə) bütün izzət-qüdrət, şərəf-şan yalnız Allaha məxsusdur (buna yalnız Allaha itaət-ibadət etməklə nail olmaq mümkündür)" *("Fatir", 10)*.

Yaxud: "Həqiqətən, sizə (Qüreyş əhlinə) elə bir Kitab nazil etdik ki, o, sizdən ötrü bir şərəfdir (o, sizin qədir-qiymətinizi yüksəldər, dini və dünyəvi ehtiyaclarınızı aradan qaldırar, ürəkdən inananlara Behişt yolunu göstərər)" *("Ənbiya", 10)* və s.

Beləliklə, rübainin birinci misrasından belə bir qənaət hasil olur: "Həzrət Əlinin türbəsini, İmam Hüseynin (ə) məqbərəsini ziyarət etmək, birincisi, Tanrı təqdirindən doğan qismətdir, ikincisi, misilsiz bəndəlik şərəfidir, üçüncüsü, bəndə-Allah və ümmət-Rəhbər münasibətlərinin tarazlığı üçün olduqca gərəkli amildir, dördüncüsü, Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının dərki yönündə son dərəcə önəmli addımdır".

Bu qənaətlər "Min ru`yəti Məşhədeyni-qarrət ləkə eyn!" şəklindəki ikinci misraya da aiddir. Ancaq "qarrət ləkə eyn" *(sənin gözün işıqlandı)* tərkibi birbaşa, "rö`yət" *(görmək)* sözü isə nisbətən alt qatda bir neçə başqa çaları da əhatə edir.

"Qarrət ləkə eyn" tərkibi Qurani-Şərifdəki "qurrətu-l-eyn" *(göz işığı)* motivini xatırladır. Yada salaq. Ulu Yaradan Şanlı Kitabında Musa Peyğəmbərə Nil çayından tapılıb Fironun sarayına gətirildiyini, böyükdən-kiçiyə hamının ona vurulduğunu, ancaq onun heç kəsin döşünü götürmədiyini xatırlatdıqdan sonra belə buyurur: "O zaman bacın (sənin ardınca guya yad bir adam kimi saraya) gedib (oradakılara) deyirdi: "Sizə ona baxa biləcək (süd verəcək) bir adam göstərimmi?" (Onlar razılıq verdilər, anan saraya gəldi). Artıq (salamat qalmağına görə) gözü aydın olsun və kədərlənməsin deyə səni anana qaytardıq..." *("Taha", 40)*.

Göründüyü kimi, ayədəki "təqərrə `aynuhə" ifadəsi "qarrət ləkə eyn" tərkibinin islami söykənəcəyi yerindədir.

Yaxud: "Etdikləri əməllərin mükafatı olaraq (Allah dərgahında) möminlər üçün göz oxşayan (onları sevindirəcək)



nə cür nemətlər gizlənib saxlandığını heç kəs bilməz!" *("Səcdə", 17).*

Bu ayədə də "min qurrəti ə`yunin" anlayışı rübaidəki "qarrət ləkə eyn" tərkibinə qan verən islami motivdir.

Rübai ilə Quran arasındakı bu leksik-semantik bağlılıq zahirən müsəlman mədəniyyətinin üstqurum-bazis əlaqələrini göstərirsə də, batinən orta əsr azərbaycanlısının mənəvi keyfiyyəti kimi üzə çıxıb, ozamankı insanımızın daxili zənginliyindən, əxlaqi yetkinliyindən və əqidə bitkinliyindən soraq verir.

"Rö'yət" sözü isə bütün bunların islami-irfani dərki kimi çıxış edir. Bu dərk Füzuli qələminə əsla yad deyildir. Çünki Füzuli bu sözü artıq Həzrət Muhəmmədin "batini şühud məqamı" anlamında işlətmişdi.

Şeirin rübai şəklində olması, əlbəttə, onun yığcam sözlərlə çox məna ifadə etməsini qaçılmaz etmişdir. Unutmayaq ki, "elmli şeir" konsepsiyası əsaslı surətdə Füzulinin adı ilə bağlıdır. Üçüncü misrada modal vasitə yerində duran "ət-təhqiq" *(doğrudan da, həqiqətən də)* sözü, əslində, özünün bəsit və ənənəvi qrammatik funksiyasını aşaraq daha dərin qatlara gedib çıxır. Sözün Füzuli "Leyli–Məcnun"undakı işlənmə məqamlarından birini ansaq, bunu daha yaxşı başa düşərik:

Etmək gərək əhli-feyzi-biniş,
Təhqiqi vücudi-afərinuş!

Bu bədii-fəlsəfi qeydləri rübainin ümumi məzmunundakı elmi-informatik yükə qovuşdurduqda şairin "ət-təhqiq" sözü ilə bir araşdırıcı, tədqiqatçı kimi çıxış etdiyi, islami bilgiləri nəqli dəlil və nəzəriyyə çərçivəsindən çıxararaq, əqli dəlilə və təcrübi gercəkliyə çevirdiyini görərik. Əgər məntiqi ardıcıllığı davam etdirsək, bütün aydınlığı və genişliyi ilə ortaya çıxar ki, Füzuli "ət-təhqiq"i burada bir az da dərinə gedərək Kərbəla vaqeəsinin və İmam Hüseyn hərəkatının həqiqi mahiyyətini qavramaqdan ötrü gərgin və yorucu zehni əmək, sistemli



mütaliə prosesi, möhkəm arxetip – güclü ruhi-pisxoloji və mənəvi əxlaqi, həmçinin məfkurəvi-etiqadi, ibadi və didaktik-pedaqoji hazırlıq mənasında işlətmişdir.

"Sənə qovuşanlara müjdə olsun ki, doğrudan da, səni ziyarət edən Əlini və Hüseyni ziyarət etmiş olur" mənasına gələn ikinci beytdən açıq aşkar-görünür ki, rübai Nəcəfdə və Kərbəlada dəfn edilən Həzrət Əli (ə) və İmam Hüseyn (ə) başda olmaqla, İslam şəhidlərinin ziyarətindən yenicə qayıtmış mötəbər bir şəxsə həsr olunmuşdur. Yeri gəlmişkən deyilməmiş qalmasın ki, Füzuli bir sıra qəsidələrində müqəddəs məkanlara işarə edir, həmin məkanların təmiri, təchizi və təmini ilə məşğul olan dövlət və din xadimlərini alqışlayır, beləliklə də ziyarətgahların ruhi-mənəvi təsirini önə çəkməklə bunun insanların dünyagörüşünün formalaşmasındakı önəmini vurğulayır.

Şah Təhmasibin Bağdaddakı son valisi (1530-1534) Məhəmməd bəyə həsr etdiyi bir qəsidəsində şair həmin şəxsi Kərbəlaya su çəkdiyi üçün öyür:

Şəhidi-Kərbəlayə su yetirmək qəsdin etmişsən,
Səni, əlbəttə, aləmdə bu niyyət paydar eylər![351]

Başqa bir misal:

Bunda qılmış sirri-Həqq zahir şəhidi-Kərbəla,
Bundadır təhqiqi-sidqü kizb üçün darü-l-iyar![352]

Belə bədii nümunələr inkarolunmaz surətdə sübuta yetirir ki, Füzulinin gözündə müqəddəs məkanlar islami ideologiya ilə yanaşı, din böyüklərinin əziz xatirəsini hər zaman dərin sayğı və sevgi ilə anmaq üçün "göydəndüşmə" fürsətdir və o bu fürsəti heç vaxt fövtə verməmişdir. Əksinə, şair zərurət duyulmadıqda belə bu barədə söz açmış, belə məsələlərin müxtəlif tərəflərini bədii predmetə çevirmişdir.

..................................

[351] *Feyzullayeva V. Füzulinin qəsidələri, Bakı, 1985, səh.116*

[352] *Füzuli. Əsərləri, IV cild, səh.68*





“Tuba – xoş halına, nə gözəldir, necə də xoşdur!” nidasının şaqraq intonasiyası ilə başlanan beyt büstbütün bir ziyarət, bir zəvvarlıq ab-havasına bürünmüşdür. Odur ki, istər bayaqdan deyilənləri, istərsə də bütövlükdə şeirin fikri axarı və bədii tutumu zəvvarlıq anlayışı haqqında, zəvvarın dini-mənəvi kimliyinə dair, oxşar məsələlərin ilkin qaynaqlardakı qoyuluşu və həlli barəsində, ziyarət yerlərinin və zəvvarların Füzuli dövründəki qarşılıqlı münasibətləri ilə bağlı, habelə Nəcəf və Kərbəla şəhərlərinin salınmasında burada dəfn edilmiş İslam şəhidlərinin yerindən ətraflı danışmağa sövq edir. Odur ki, biz də bu yolla gedərək təfərruata varmalı, təfsilata enməli oluruq.

* * *

Nəcəf – (ərəbcə النجف ən-Nəcəf və ya Məşhədi-Əli) – İraqda Kufədən on kilometr qərb tərəfdə şəhərdir, şiələrin ziyarət yeridir. Nəcəf şəhəri dəniz səviyyəsindən 35 metr hündürlükdə yerləşir.

Rəvayətə görə, Əli ibn Əbu Talib Kufə həndəvərində, bu şəhəri Fərat çayının daşqınlarından qoruyan bəndin yaxınlığında dəfn edilmişdir. Sonralar bu yerdə Nəcəf (ərəbcə *təpə* deməkdir) şəhəri meydana gəlmişdir. Əməvilər dövründə həzrət Əlinin dəfn edildiyi yer gizli saxlanılırdı, buna görə də sonralar onun dəqiq yerini müəyyənləşdirmək mümkün olmamış və bir neçə fərziyyə meydana gəlmişdir. Yalnız X əsrin birinci rübündə Həmədanilər dövründə həzrət Əlinin güman edilən məzarının yerində böyük günbəz tikilmiş və qala (Məşhədi-Əli) ucaldılmışdır.

Nəcəf şiələrin böyük fəaliyyət mərkəzidir. Şəhərdə məşhur müctəhidlərin dərs dedikləri çoxlu məktəb vardır, orada dini-siyasi ədəbiyyat geniş nəşr edilir. Nəcəf şəhəri 2012-ci ildə İslam mədəniyyətinin paytaxtı elan edilib.

* * *

Kərbəla şəhəri Fərat çayının qərb sahilində yerləşir. Onun Bağdadla arasındakı məsafə 108 kilometrdir. Kərbəlanın tarixi Babillilər zamanından götürülür. Bəzi dilçilərə görə,





“Kərbəla” sözünün kökü qədim babil dilinə məxsus قرب اله– “qorbe iləh” sözündən əmələ gəlmişdir. Başqa bir dilçi dəstəsi isə belə iddia edir ki, “Kərbəla” “qədim Babil kəndlərinin toplusu” mənasını verən كوربابل – “Kurebabel” sözündən yaranmışdır. “Neynəva” نینوی və “Ğaziriyyə” غاضريه adları da bu qəbildəndir.

Hicri-qəməri təqvimlə 61-ci ilədək Kərbəla şəhəri boş səhralıqdan başqa bir şey olmamışdır. Amma Kərbəla vaqeəsindən və şəhidlər üçün məqbərə tikildikdən sonra İraqın ən çox ziyarət olunan şəhərlərindən birinə çevrilmişdir.

Başqa bir dilçi dəstəsi isə belə düşünür ki, Kərbəlanın tarixi İkiçayarası mədəniyyətdən başlanğıc götürür. Kərbəla “hərəm” mənasında olan “كرب – “Kərb” və “Allah” mənasında olan ايل – “Əyl” kəlmələrinin birləşməsindən əmələ gəlmişdir. Bütün bunları nəzərə alaraq demək olar ki, “Kərbəla” sözü “Allahın hərəmi” mənasını daşıyır.

Lakin İmam Hüseyn özü həmin əraziyə yetişdiyi və oranın necə adlandırıldığını soruşduğu zaman cavab olaraq “Kərbəla” adını eşitdi və buyurdu:

اللهم انی اعوذ بک من الکرب و البلاء

“Allahummə inni əuzu bikə minəl kərbi vəl bəla”.

Tərcüməsi: *Allahım, bu yerin çətinlik və bəlalarından Sənə pənah aparıram.*

طف – Tiff – Kərbəlanın başqa adlarından biridir.

Bu gün Hair – حائر kimi bilinən Hirə حيره Kərbəlanın bir başqa adıdır. Abbasi xəlifəsi Mütəvəkkil (l.ə) mübarək Hərəmin dağıdılmasına göstəriş verdikdən sonra Fərat çayının qollarından birini İmam Hüseynin (ə) məqbərəsinə tərəf yönəltdilər. Su o həzrətin mübarək qəbrinin yaxınlığına çatsa da, müqəddəs məzara daxil olmayıb yalnız onu əhatə etdi.

* * *

İraqın cənubunda yerləşən Kərbəla şəhəri hicri-qəməri təqvimlə 61-ci ilin məhərrəm ayının 10-dək Neynəva adlı bir səhra olub. Kərbəla döyüşündən sonra qeyri-yaşayış





məskəni olan bu səhra şiə müsəlmanların diqqət mərkəzinə gəldi. Orada Kərbəla şəhidləri üçün məqbərə ucaldıqdan sonra İraqın ən çox ziyarət edilən ziyarətgahlarından birinə çevrildi. Bizə gəlib çatan bəzi məlumatlara əsasən, Hüseyn ibn Əlinin (ə) və digər Kərbəla şəhidlərinin dəfn edildiyi sahə 36 kvadratkilometrdir.

Kərbəla İraqın ən sərvətli şəhərlərindən biridir. Bu sərvətin başlıca mənbələri zəvvarların sərf etdikləri vəsait və əkinçilikdir. Əkinçilik, xüsusilə xurma təsərrüfatıdır. Bu şəhər Məzhəbi bölgə və Yeni Kərbəla adlı iki hissədən ibarətdir. İmam Hüseynin (ə) türbəsinin bərəkətindəndir ki, Kərbəlada yüz məscid və iyirmi üç mədrəsə fəaliyyət göstərir .

* * *

Füzuli dəryasının ən dərin yeri və Füzuli dənizinin ən parlaq incisi olan "Leyli–Məcnun" məsnəvisi də ziyarət motivləri ilə zəngindir. Əsərin "Bu, Leylinin anasına vəsiyyətidir və Dust yadı ilə dünyadan getdiyidir" fəslində oxuyuruq:

Çün razi-dərunin etdi təqrir,
Rə`yinə müvafiq oldu təqdir.
İmdad qılıb inayəti-Həqq,
Qıldı anı məksudinə mülhəq!
Gül dərdi hədiqeyi-əməldən,
Mey içdi sürahiyi-əcəldən.
... Əhvalinə ağlayıb sərasər,
Dəfn etməyin etdilər müqərrər.
Ğüsl eyləyibən təni-nizarin
Dildarinin açdılar məzarin,
Qoydular anı həm ol məzarə.
Ğəmnak yetişdi ğəmküsarə.
... Tövfündə qılıb murad hasil,
Ol qəbrə xəlayiq oldu mail.
Keçdikcə zaman mükərrəm oldu,
Hacətgəhi-əhli-aləm oldu![353]

[353] *Füzuli. Əsərləri, 5 cilddə, II cild, Bakı, 1958, səh. 226-227*





*(Ürəyindəki gizli mətləbini dilə gətirdiyindən qəzavü qədər onun istəyincə oldu. Belə ki, Tanrının tükənməz şəfqəti yardımına gəlib, onu diləyinə qovuşdurdu. Leyli əməl bağçasından gül dərdi, əcəl sürahisindən ölüm şərbəti içdi. Ata-anası, qohum-əqrəbası gecə-gündüz onun üçün ağladılar və nəhayət, onu dəfn etmək qərarına gəldilər. İncik bədəninə qüsl verib, sevgilisinin qəbrini açaraq, onu da o qəbrə qoydular. Beləliklə də qəmli qəmliyə qovuşdu. Gəlib ətrafına dolanmaqla diləklərinin yerini aldığını görən camaat o qəbrə meyil göstərməyə başladı. Belə ki, zaman keçdikcə həmin məzara el rəğbəti daha da artaraq, o məzar uzaq-yaxın qəbilələrin diləkdiləmə yerinə çevrildi).*

Göründüyü kimi, *razi-dərun, dəfn, ğüsl, məzar, tövf, murad, ol qəbr, xəlayiq oldu mail, mükərrəm, hacətgəhi-əhli-aləm* ifadələri şəkk-şübhəyə yer qoymayacaq bir aydınlıqla Leyli ilə Məcnunun birgə uyuduqları məzarın minlərlə dinli-imanlı adamın diləkdiləmə, nəzretmə yerinə çevrilməsi prosesini mərhələ-mərhələ əks etdirir, bunun İslama zidd olmayan bir hal olduğunu sübuta yetirir. Əgər biz əsərin “Bu, Zeydin Leyli ilə Məcnunu rö`yasində gördüyüdür” fəslinə diqqət yetirsək, bu cəhətlərin poemada necə dərindən kök saldığını, Füzulinin gözündə mövzunun ayrılmaz bir parçasına çevrildiyini görərik:

Ol Məşhədə Zeyd olub mücavir,
Asari-sədaqət oldu zahir.
Təmir üçün etdi çox ətalər,
Təcrid ilə qıldı çox binalər.
Peyvəstə hərarəti-gərdən
Qəndili-məzarin etdi rövşən.
Carub ilə ab olanda mətlub,
Müjgan ilə əşki-abi carub!
Hər ləhzə qılırdı tazə matəm,
Qılmazdı fəğanü naləsin kəm!
Ol munisü müşfiqü müvafiq
Bir gecə qərini-sübhi-sadiq





Bimar tənində qalmayıb tab
Qılmışdı, məzarə yastanıb, xab[354].

Öncəki parçadan fərqli olaraq, burada ziyarət məfhumları daha çoxdur. *Məşhəd, mücavir, asari-sədaqət, təmir çox ətalər, təcrid ilə qıldı çox binalər (Leyli ilə Məcnunun qəbrinin ətrafında yeni-yeni köməkçi tikililər ucaltdı)*, *qəndili məzar, tazə matəm* ifadələri bu sıradandır. Qəhrəmanların xoşbəxt cənnət həyatının geniş təsviri ilə davam edən bölüm ötəri deyildir ki:

Xəlqin olub e'tiqadi əfzun,
Ol qəbrə ziyarət oldu qanun! –

beyti ilə bitir.

Beləliklə, aydın olur ki, Füzuli irsinin şah əsəri olan "Leyli–Məcnun" məsnəvisi yüzlərlə önəmli milli-mənəvi kimlik göstəriciləri ilə yanaşı, "ziyarət" məfhumu haqqında da dolğun və tutumlu bilgilərə malikdir. Bu bilgilər isə anlayışın "Həqiqətü-s-süəda"dakı işlənmə məqamlarına da bir xeyli işıq tutur.

* * *

Füzulinin Kərbəla şəhidlərinin tərənnümçüsü kimi ustalığına dair aydın anlayış almaqdan ötrü həmin müqəddəs məkanla bağlı zəvvarlıq prosesinin yaranma tarixçəsi üzərində də ayrıca dayanmaq qaçılmazdır. Bəs İmam Hüseynin (ə) və digər Kərbəla şəhidlərinin ilk zəvvarları kimlər olmuşlar?

"Ətiyyə Kufi deyir: Seyyidü-ş-şühədanın ilk ərbəinində mən Cabir ibn Abdullah ilə birlikdə İmam Hüseynin ziyarətinə getdim. Kərbəlaya çatdıqda Cabir Fərat çayının qırağına gəlib qüsl aldı. O, bir qətfəni belinə bağlayıb, o birini çiyninə saldı. Sonra yanında olan bir kisəni açdı, ondan Kufənin xoş ətirli bir otunun kökünün tozunu (buna "sudə" deyirlər) çıxartdı,

[354] *Füzuli. Əsərləri, 5 cilddə, II cild, Bakı, 1958, səh. 228*







*İmam Museyi Kazım (ə) və İmam Muhəmməd Təqi (ə)-ın müqəddəs məzarları. İraq. Kazimeyn şəhəri*

bədəninə səpdi, sonra imamın pak qəbrinə sarı irəlilədi. O, Allahı zikr edərək addım atırdı. Qəbirlərin yanına çatdıqda mənə dedi: "Məni İmam Hüseynin məzarının lap yaxınlığına apar ki, əlim qəbrə çatsın" (Cabirin bu zaman 75 yaşı vardı və gözləri də tutulmuşdu). Mən əlindən yapışıb onu qəbrə sarı apardım. O, əli məzara toxunduqda qəm-qüssənin şiddətindən huşunu itirdi və qəbrin üstünə yıxıldı. Mən onun üzünə su çilədim. O özünə gəlib üç dəfə dedi: "Ya Hüseyn! Ya Hüseyn! Ya Hüseyn!" Sonra dedi: "Məgər dost da dosta cavab verməz?!" Daha sonra belə söylədi: "Sən necə cavab verəsən, axı qan boğazından sinənə, çiynınə axıb və başın bədənindən ayrılıb!" Cabirin məqsədi müsibət zikri idi"[355].

Bəzi mənbələrdə əhvalat daha təfərrüatla verilir; məs.: "Ətiyyə deyir: Cabiri İmam Hüseynin qəbrinin kənarına gətirdim. O, əlini məzara toxundurdu. Ağlamağın və kədərin şiddətindən huşunu itirdi. Mən onun üzünə su səpdim. O, huşa gəlib, "Ya Hüseyn!" deyə üç dəfə fəryad etdi. Sonra bitkin xüzu ilə ziyarətnamə oxumağa başladı.

[355] *Suqnameyi-Ali-Muhəmməd, səh. 503*



Bu zaman gördüm ki, Şam yolu tərəfdən bir qaraltı peyda oldu. Bunu Cabirə bildirdim. O öz qulamına tapşırdı. "Qaraltıya sarı get. Əgər bu gələnlər Ömər Sədin qoşunundandırlarsa, mənə xəbər ver ki, gizlənim və onlardan bizə bir xətər yetməsin. Yox, hərgah İmam Səccad və Əhli-beytdəndirsə, bu müjdəyə görə səni Allaha xatir azad edərəm" .

Qulam o qaraltıya sarı getdi, yaxınlaşanda gördü ki, gələnlər Əhli-beyt karvanıdır. Odur ki, tez Cabirin yanına qayıdıb, Əhli-beytin gəlişi müjdəsini ona verdi.

Cabir başıaçıq, ayaqyalın olaraq Əhli-beyti qarşılamağa getdi. Əhli-beytə yaxınlaşdıqda ah-nalə göyə ucaldı, o ki var ağladılar. İmam Səccad Cabirə belə buyurdu: "Ey Cabir, Allaha and olsun, həmin bu yerdə kişilərimizi öldürdülər, cavanlarımızın başını kəsdilər, qadınlarımızı əsir götürdülər və xeymələrimizi yandırdılar"[356].

Əlbəttə, yüzilliklərin qalın toz qatı altında qalmış əlyazmalarda belə bilgilər çoxdur. Bu bilgilərin ictimai-tarixi və məfkurəvi-fəlsəfi yönümü haqqında, məzhəb və təriqətlər, cərəyan və axınlar baxımından kəsb etdiyi oxşar və fərqli cəhətlər barəsində çox danışmaq olar. Ancaq ümdə məsələ həmin bilgilərin saflıq dərəcəsi, duru və yaşarı İslamla bağlılıq ölçüsüdür. Bu yöndə götürdükdə yuxarıdakı bilgilər əsasında aşağıdakı cəhətləri ayırd etmək olar:

**1.** Hər şeydən öncə belə bir cəhət diqqəti cəlb edir ki, ziyarət əhvalatı büsbütün Cabirlə bağlıdır. Cabir isə Həzrət Muhəmmədlə İmam Muhəmməd Baqir arasında bir körpüdür və əsri-səadətdən üzü bəri baş vermiş bütün aparıcı hadisələrin yaxından şahididir.

Cabir ibn Abdullah Xəzrəc qəbiləsindən Abdullah ibn Əmr ibn Hirman Ənsarinin oğludur. Uşaq ikən atası ilə birlikdə ikinci Əqəbə beyətində Məkkədə 70 nəfərdən ibarət bir dəstənin tərkibində Həzrət Muhəmmədin hüzurunda beyət etmişdir.

..................................

[356] *Yenə orada, səh. 506 – Möhsün Aştiyani. 40 ədədinin sirli rəmzləri, səh. 110*





Zəhəbinin verdiyi məlumata əsasən, Cabir Bədr və Uhud müharibələri daxil olmaqla, 18 döyüşdə iştirak etmiş və 94 yaşında vəfat etmişdir.

O, Peyğəmbər vəfat etdikdən sonra Həzrət Əlinin qızğın tərəfdarlarından biri olmuşdur. Belə ki, Siffeyn döyüşündə Həzrət Əlinin qoşununda olmuş və Müaviyə ordusu ilə döyüşmüşdür.

Bu səhabənin ən böyük xidməti isə İslam Rəhbərinin salamını beşinci imamımız Muhəmməd Baqirə çatdırmasıdır. İmam Hüseynin (ə) şəhadətindən sonra Kərbəlada onun məzarını ilk ziyarət edən şəxs də Cabir ibn Abdullah Ənsaridir.

**2.** Əhvalatda ziyarətə hazırlıq işi üzərində ayrıca dayanılır. Qüsl almaq, ətirlənmək, ziyarətnamə oxumaq kimi təfərrüatlar önə çəkilir. Bu isə belə cəhətlərin heç də sonradan qondarılmadığına, bəzi bədxahların iddia etdikləri kimi, bidət olmadığına, əksinə, şəhidliklə bağlı xalis niyyətdən irəli gəldiyinə dəlalət edir.

**3.** Əhvalatdan anlaşıldığına görə, qəm-qüssəni büruzə vermək, ürəklə ağlamaq Kərbəla şəhidlərini ziyarətin ayrılmaz tərkib hissəsidir. Bu isə belə halların İslama yad olmasına dair irəli sürülən saxta iddiaları birdəfəlik çürütmək üçün kifayət qədər möhkəm dəlildir.

**4.** Kərbəla şəhidlərinə saxlanılan matəmlə bağlı üzdə olan cəhətlərdən biri də zikri-müsibətdir. Cabirin huşa gəldikdən sonra “Ya Hüseyn!” deyə fəryad etməsi bir yandan bu ulu din böyüyünün rəhbərlik məqamının sarsılmaz ideoloji əsasa çevrilməsinin mümkünlüyünə dəlalət edirsə, o biri yandan “Məgər dost da dosta cavab verməzmi?! Sən necə cavab verəsən, axı qan boğazından sinənə, çiyninə axıb və başın bədənindən ayrılıb!” deyə İmam Hüseynlə (ə) tam bir məhrəmiyyət içində danışması, kədərini, ürək sözlərini bölüşməsi Kərbəla şəhidlərinin müsibətinin yaşarı və canlı bir həyat həqiqəti olmasının, bunun dilə gətirilməsinin imamhüseynsevərlər üçün dəruni mənəvi tələbata çevrilməsinin başqa bir dəlil-sübutu hesab edilə bilər.





**5.** Son dərəcə böyük kədərə batmasına baxmayaraq, Cabirin dərhal özünü ələ alıb, "bitkin xüzu ilə ziyarətnamə oxuması" qəm-qüssənin, matəmin, müsibət zikrinin həqiqi dindarları həyatdan geri qoymasına dair iyrənc fikirləri də birdəfəlik təkzib edir və danılmaz biçimdə göstərir ki, əksinə, belə dəruni ruhi-psixoloji hallar insanı mənən zənginləşdirir, həyat eşqini artırır və çətinliklərlə mübarizədə böyük fəallıq hissi oyadır.

**6.** Bu bilgilərdə işlənən ziyarətnamənin haradan qaynaqlanması, ilk dəfə hansı din böyüyünün dilindən söylənməsi, əlbəttə, mübahisə doğura bilər. Ancaq burada mühüm olan odur ki, mütəxəssislərin çoxu indi əlimizdə olan ziyarətnamələrin çoxunun İmam Muhəmməd Baqirdən gəldiyi qənaətindədir. Cabir isə Həzrət Muhəmmədin (s) salamını İmam Muhəmməd Baqirə yetirmiş bir səhabədir. Deməli, danışılan əhvalatda Cabirin ziyarətnamə oxumasında heç bir qəribə cəhət yoxdur .

**7.** Əhvalatdan anlaşıldığına görə, Kərbəla şəhidlərinin qatilləri tayı-bərabəri olmayan cinayətləri ilə yanaşı, imamhüseynsevərlərin Kərbəlanı ziyarət etmələrinə də bacardıqca əngəl törətmiş, özlərinin murdar və idbar xislətlərini belə səmimi mənəviyyat məsələlərində bütün dəhşət və vəhşəti ilə göstərmişlər. Çünki onlar Kərbəla ziyarətinin daşıdığı dərin ictimai-siyasi mahiyyətin öz əleyhlərinə olduğunu çox yaxşı bilirdilər. Bu isə onların bir zümrə kimi bütünlüklə puç və çürük qurum olduqlarını bir daha təsdiq edir.

**8.** Ən nəhayət, əhvalatdan çıxan bir başqa nəticə budur ki, bilavasitə Peyğəmbər xanədanı – İmam Zeynəlabidin (ə), xanım Zeynəb və digərləri dərhal Kərbəla şəhidlərinin ziyarətinə gəlmiş, onların ilk zəvvarları olmuş, başqa zəvvarlarla yanaşı, İmam Hüseynə (ə) və tərəfdarlarına ürəkdən yas saxlamışlar. Odur ki, Cabirin Əhli-beytlə görüşündə ah-nalənin göyə ucalması, İmam Zeynəlabidinin Yezid ordusunun zülmündən gileylənməsi həm Kərbəla şəhidləri üçün müsibət zikri danışmağın, həm ziyarətnamə oxumağın, həm də bu zaman



həddi aşmamaqla ağlayıb-sızlamağın daha bir islami-tarixi təsdiqi sayılmalıdır.

Əlbəttə, kiçik mətndən bu qədər təfərrüat almaq kiməsə qəribə görünə bilər. Ancaq qətiyyən unudulmamalıdır ki, burada siravi şəxslərdən yox, din böyüklərindən söhbət gedir; o din böyüklərindən söhbət gedir ki, onlar həyat və fəaliyyətləri ilə tarixin dönüm nöqtəsini dəyişdirmiş, ölməkdə olan saf və duru İslama yenidən can vermiş, onu dirçəltmiş və bəşəriyyətə olduğu kimi təqdim etmişlər. Özü də onlar bunu yalnız fövqəladə keyfiyyətləri ilə deyil, ilk növbədə malik olduqları insan ehtiyatları hesabına etmişlər. Deməli, onlar həm də ən kamil şəxsiyyətlər kimi bütün bəşəriyyətin say-seçmə rəhbərləridir.

* * *

Belə dərin məzmuna malik olduğuna görə Füzuli "ziyarət" anlayışını "Hədiqətü-s-süəda"da çox geniş şəkildə qələmə almışdır. Belə ki, şair əsri-səadətdən və Həzrət Muhəmməddən (s) tutmuş müxtəlif dövrlərdə yaşamış ayrı-ayrı tanınmış simalar və siravi şəxslərədək olduqca geniş obrazlar qalereyasını bu yöndə əsərə gətirərək onları çeşidli yaradıcılıq istəklərinin parlaq ifadəçisinə çevirmişdir.

Bunlardan bir neçəsini ayrıca gözdən keçirsək, "ziyarət" anlayışının işlənmə məqamları ilə yanaşı, əsərin ideya-məzmun xüsusiyyətləri və bədii-üslubi cizgiləri barəsində də aydın bir fikir sahibi olarıq.

1. "Rəvayətdir ki, Həzrəti-Hüseyn Mədinədən əziməti-Kufə qıldıqda yeddi yaşında bir mə`suməsi olub, mürafiqətinə qüdrət bulmamağın Ümmü-s-Sələmə xidmətində qalmışdı və vaqieyi-Kərbəlada həzrəti-imam şəhid olduqda bir qürabi-mişkinbal pərü balın qanla rəngin edüb mütəvəccihi-Mədinə olub Ümmü-s-Sələmənin divari-sarayinə qonub, bal əfşanlıq edirdi. Ol mə`sumə görüb fərasətlə Hüseynin şəhadətin mə`lum edüb fəğan qıldı. Ümmü-s-Sələmə ayıtdı: "Ey məxdumə, nə vaqe` oldu?" Ol mə`sumə ayıtdı: "Ey əziz, qürab



müxbiri-əhvali-Səfineyi-Nuhdur, qaliba bu gün səfineyi-Əhli-beyt tufani-bəlayi-dünyadan nəcat buldu və mühərriki-həvayi-qürbi-İlahi anları vərteyi-haildən vasili-sahili-nəcat qıldı. Və bu qürab andan gəlür və anlardan xəbər verür". Ümmü-s-Sələmə ayıtdı: "Bu vaqeənin bir nişanəsi var". Ol mə`sumə ayıtdı: "Nişanə nədir?" Ümmü-s-Sələmə ayıtdı: "Bir gün Həzrəti-Rəsul xəlvətdən dışrə çıxub, bir müddət məks edib, müraciət etdi julidəmuy və qubaraludəruy. Dedim: "Ya Rəsulullah, bu küdurətə bais nədir?" Buyurdu ki, ey Ümmü-s-Sələmə, bu gecə bana İraqda bir məqam göstərdilər ki, ana Kərbəla derlər və ol mənzildə Hüseynin və bə`zi övladinin qətlgahını ziyarət etdirdilər və bən ol mənzildən bir miqdar xak alub gəlmişəm". Və mübarək əllərin açub ol toprağı bana təslim etdi və buyurdu ki: "Bu toprağı bir şişədə hifz et! Ol gün ki və`deyi-şəhadət yetər, bu şişədəki əczayi-türab övraqi-gül kibi qan rəngin dutar!" Və bən ol toprağı hifz etmişəm"[357].

*(Rəvayət edildiyinə görə, Hüseyn (ə) həzrətləri Mədinəni Kufə niyyəti ilə tərk etdikdə yeddi yaşlı bir qız övladı səfərə çıxa bilməyəcək qədər zəif olduğundan Ümmü-s-Sələmənin yanında qalmışdı. Kərbəla hadisəsi zamanı imam həzrətləri şəhid olduqda mişk qoxulu bir qarğa qanadlarını qızıl qana boyayıb Mədinəyə qayıdaraq Ümmü-s-Sələmənin evinin divarına qonmuş və canfəşanlıq etmişdir. Bunu görən o zəif qızcığaz fəhmlə Hüseynin şəhid olduğunu bilərək, ucadan ağlamışdır. Ümmü-s-Sələmə ondan soruşmuşdur: "Ay xanım, nə baş verdi, sənə nə oldu?" O qızcığaz ona belə cavab vermişdir: "Ey əziz xanım, qarğanın gəlişi (qətiyyən əbəs deyildir), bu gəliş Nuh gəmisinin vəziyyətindən xəbər verən əlamətdir. Çox güman ki, bu gün Əhli-beyt gəmisi dünyanın bəla tufanından qurtuldu və Allaha yaxınlıq eşqinin hərəkətəgətiricisi onları pərdəarxasından nicat sahilinə çıxartdı. Bu qarğa oradan gəlir və onlardan xəbər gətirir".*

.................................

[357] *Füzuli. Əsərləri, 6 cilddə, VI cild, Bakı, 2005, səh. 42-43*





*Ümmü-s-Sələmə dedi: "Bir gün Rəsul həzrətləri yatağından qalxaraq bayıra çıxdı və bir qədər fikirli-fikirli gəzişdikdən sonra saçları dağılmış və üz-gözü toz-torpağa bulaşmış halda geri qayıtdı. Mən ondan soruşdum: "Ey Tanrının Elçisi, bu kədərin səbəbi nədir?" Buyurdu ki, ey Ümmü-s-Sələmə, mənə bu gecə İraqda bir yer göstərdilər, ora Kərbəla deyərlər və orada Hüseynin özünün və övladlarından bəzilərinin qətlgahını ziyarət edərlər. Mən oradan bir qədər torpaq götürüb gətirmişəm.*

*O, bu sözləri buyurduqdan sonra mübarək əllərini açıb bu torpağı mənə verdi və tapşırdı ki, bu torpağı bir şüşə qabın içərisində qoruyub saxla. Şəhidlik vədəsinin yetişdiyi gün bu şüşə qabdakı torpaq zərrələri gül yarpaqlarıtək qan rəngini alar.*

*Mən də həmin torpağı bugünədək qoruyub saxlamışam").*

Göründüyü kimi, mətn ziyarət anlayışı baxımından dəqiq bilgilərə malikdir. Parçanın "Rəvayətdir" deyə başlaması, İmam Hüseynin qızının yaşının göstərilməsi, Mədinədə qalmasının səbəbinin vurğulanması, İslam rəhbərinin etibarlı zövcələri sırasında yer alan Ümmü-s-Sələmənin üzərinə ağırlıq salınması, usaq və qadın təfəkkürünə uyğun olan qarğadan danışılması, İmam Hüseynin qızının Əhli-beytə xas itifəhmliyinin nəzərə çarpdırılması, Nuh gəmisinin reallıq faktı olaraq Əhli-beyt örnəyi üzərində məcazlaşdırılması, "Tanrı təqdiri" məfhumunun önə çəkilməsi, Ümmü-s-Sələmənin geniş əhvalat söyləməsi və Rəsulullahla aralarındakı dialoqa yer verməsi, ən nəhayət, Həzrət Muhəmmədin (s) İraqda, Kərbəlada İmam Hüseynin (ə) və bəzi övladlarının qətlə yetirildiyi yerlərin ziyarətgaha çevrildiyini bildirməsi və oradan bir qədər torpaq nümunəsi gətirərək, onun ayrıca nişanə kimi qorunub saxlanılmasını təkidlə tapşırması, son nəticədə həmin nişanənin gerçəkləşməsi bu dəqiqliyi təmin etməkdədir. Bütün bunlar isə inkarolunmaz surətdə ziyarət anlayışının mətndəki çəkisinin ağırlığını sübuta yetirir. Başqa sözlə, Füzuli burada zamanı qabaqlamış, gələcəyin milyonlarla zəvvarının parlaq və işıqlı obrazını yaratmışdır.



"Və ol mənzildə Hüseynin və bəzi övladının qətlgahını ziyarət edərlər" şəklindəki xəbər Müqəddəsat – Peyğəmbər dilindən çıxdığı üçün xüsusi mötəbərlik qazanaraq, zəvvarlığın İslamiyyətdəki önəminin bariz dəlil-sübutuna çevrilir və zəvvarların el-oba içindəki böyük ehtiramını dini baxımdan əsaslandırmış olur. Ötəri deyildir ki, araşdırdığımız rübainin ikinci beyti büsbütün zəvvarlara bəslənilən sayğı və sevginin tərənnümünə ayrılmışdır: "Mən zarəkə, qad zarə Əliyyən və Hüseyn!" *(Səni ziyarət edən Əlini və Hüseyni ziyarət etmiş olur)*.

Hər ehtimala qarşı deyilməmiş qalmasın ki, birdən kimsə Əli adına etiraz etsə, bilsin ki, Hüseyn övladı elə həm də Əli övladıdır.

2. "Məsabihu-l-qülub"da rəvayət olunur ki, bir gün Cəbrail əleyhissəlam behiştdən bir nar, bir heyva, bir alma gətirib Həsənlə Hüseynə verdi. Həzrət Rəsul buyurdu: "Ey ciyərguşələr, bu meyvələri ata-ananızın yanına aparın və yeyin, amma hər birindən bir az azuqə saxlayın!" Rəvayət edirlər ki, hər gün o meyvələrdən yeyib bir az saxlayırdılar və görürdülər ki, meyvələr səhər yenə bütövləşir. Fatimə dünyadan köçəndə nar qeyb oldu. Mürtəza dünyaya vida edəndə heyva da yox oldu. Amma alma Həzrət Hüseyndə qalmışdı və Kərbəlada onunla susuzluğunu yatırırdı. O həzrət şəhid olarkən alma da qeyb oldu.

Həzrət İmam Zeynəlabidindən (ə) rəvayətdir ki, kim sidq-ürəklə və ixlasla Həzrət Hüseyn əleyhissəlamın türbəsini ziyarət edərsə, o almanın ətrini duyar. Şe'r:

Ey xoş ol dərgahi-ərşasayi-aliqədr kim,
Xaki-payindən məşami-can alır buyi-behişt!
Həbbəza, ol mərqədi-əşrəf ki xaki-pakinin
Təşneyi-cüllabi-vəslidir ləbcuyi-behişt!"[358]

................................

[358] *Füzuli. Kərbəla vaqiəsi, səh. 13*





*(Ərş qədər yüksək qədir-qiymətə malik olan o qapının xoş halına ki, cənnətin qoxusu məxsusi ruhi ətrini ayağının altındakı torpaqdan alır. O şərəfli məzara afərinlər olsun ki, cənnətin dodaqları daima onun pak torpağının görüş şirəsinə təşnədir)*.

Hədis bir neçə baxımdan tutumludur. Mənbə göstərilməsi, Cəbrayıl, nemətləri ilə birlikdə cənnət, eləcə də Peyğəmbər və imamların iştirakı, İslamda da, elmdə də ən gərəkli meyvələrin sadalanması, xüsusən almanın susuzluğu yatırmasının vurğulanması kimi qeyri-adi cəhətlər hədisi bir qədər də orijinallaşdırır. Ancaq hədisi daha orijinal edən cəhət almanın ətirlilik baxımından İmam Hüseyn (ə) ziyarəti ilə bağlanmasıdır.

Alma–İmam Hüseyn (ə) ziyarəti əlaqəsi hədisdə İmam Zeynəlabidin tərəfindən "ixlas və sidq" şərtinə bağlanır. "Bil ki, xalis din (sırf ibadət, təmiz itaət) ancaq Allaha məxsusdur" *("Zümər", 2), "*De ki, mənə dini (itaəti) məhz Allaha məxsus edərək, yalnız ona ibadət etmək əmr olunub" *("Zümər", 11)* səpkili ilahi bəyanatlar ixlas və sidqin dinimizdəki yerinin, o sıradan da Kərbəla ziyarətindəki önəminin möhkəmliyinə dəlalət edir.

Ancaq "kim sidq-ürəklə və ixlasla Həzrət Hüseyn əleyhissəlamın türbəsini ziyarət edərsə, o almanın ətrini duyar" şəklindəki müqəddəsat kəlamı qətiyyən quru məfkurəvi göstəriş və təlqinlərlə məhdudlaşmır. Əslində, burada imamətin miqyas genişliyindən, imamın kainata, təbii-fiziki qanunauyğunluqlara təsir gücündən danışılır. Almanın "həyat ağacı" sayılması bu fikri bir az da gücləndirir. Füzulinin hədisi parlaq bir şeirlə müşayiət etməsi də buradan qaynaqlanır. Ona görə ki, şeir şairə fikirlərini daha sərrast və sərbəst ifadə etmək üçün qol-qanad verir, onun önündə elə müqəddəsatın özü qədər geniş və tükənməz yaradıcılıq üfüqləri açır. Bəs nədir o üfüqlər?

Oradan başlayaq ki, Füzuli poeziyanın özünəməxsus dilindən, məcazlar sistemindən, şair ərköyünlüyündən istifadə



edərək, bunların arxasında gizlənərək İmam Hüseynin dəfn olunduğu yeri İslamın ən böyük dəyəri sayılan ərşə bənzədə bilir: "Ey xoş ol dərgahi-ərşasayi-aliqədr kim".

İkinci belə ştrix budur ki, o, haqqında 246 ayə gəlmiş mötəbər bir islami anlayışı – cənnəti mənən İmam Hüseynə möhtac bir varlıq olaraq şeirə gətirir: "Xaki-payindən məşami-can alır buyi-behişt!"

Dərinə getdikdə, əslində, burada bir elə də mübaliğə olmadığını görürsən. Məgər İmam Hüseyn canlı bir cənnət deyilmi?

Üçüncüsü, şəhidlərin ölməzliyi prinsipindən *("Bəqərə", 154; "Ali-İmran", 169-170)* ustalıqla yararlanan Füzuli məmduhunun (öydüyü din böyüyünün) məzarının torpağını cənnətə dirilik və canlılıq bəxş edən bir həyat bulağı kimi tərənnüm edir. İkinci beytdə cənnətin İmam Hüseynin məzar torpağındakı quta – yaşarı və həyatverici qüvvəyə tamarzı qalmasının vurğulanması məhz belə ali-estetik kredoya xidmətə yönəlmişdir. Bu isə o deməkdir ki, hər şey kamil insan üçündür, kamil insana bağlıdır.

Bütün bu incəliklər İmam Hüseyn türbəsini ziyarət etməyin Füzulinin gözündə qətiyyən ənənəvi dini mərasim elementi olmaqla qalmayıb, bütünlüklə yaşarı, diri, canlı və sulu bir həyat həqiqəti, gerçəklik olduğunu, onun dünyagörüşünün, dünyaduyumunun cövhərini, mayasını təşkil etdiyini göstərir.

3. "Rəvayətdir ki, Şəhi-Kərbəla anadan olanda Cəbraili-Əmin mübarəkbadlıq üçün Həzrət Rəsul xidmətinə gələrkən yolda Fətrəs adlı pərişanhal və qanadları sınmış bir mələk gördü. Cəbrail əleyhissəlam bu zillətin səbəbini sual etdikdə Fətrəs dedi: "Ya Cəbrail, mənim bir xidmətdə səhlənkarlığım olub. Ona görə də İlahinin qəzəb atəşi qol-qanadımı yandırıb məni bu hala saldı. Bu vaqeənin bir çarəsi varmı?" Cəbrail buyurdu: "Mən Həzrət Rəsulun xidmətinə getməliyəm. Sən də mənimlə gəl, bəlkə şəfaətə yetişəsən!" Fətrəs Cəbraillə birgə Rəsuli-Əkrəmin xidmətinə gəlib, ərzi-hal etdikdə Hüseyni-məzlum həzrətin qucağında idi. O həzrət buyurdu ki, ey Fətrəs, özünü mənim Hüseynimə yetir və yaralarını



ayağına sürt. Fətrəs fərmana əməl edib yaralarını sürtdü və qol-qanadı sağaldı və Məbuduna ibadətlə məşğul oldu. Həzrət Hüseyn ibn Əli şəhadət şərbəti içdikdə o mələk xəbər tutub münacat etdi ki, ya Rəbb, nolaydı mənə əmr olaydı, xidmətimdə olan yetmiş min mələklə Hüseynin xidmətində hazır olaydım. Həzrət Xudadan nida gəldi ki, ey Fətrəs, əgər o dövlət müyəssər olmadısa, indi qərar verdim ki, xidmətində olan mələklərlə Kərbəlaya gedib o məzlumun məzarı üstə Qiyamətədək təziyə tutasan, ağlayıb göz yaşı qətrələrinin savabını orada təziyə tutanlara nəzir edəsən. Şe’r:

Gəl ey rəsmi-vəfadən dəm uran, əşki-rəvan göstər,
Mücərrəd qövlə qane olma, isbat et, nişan göstər.
Dili-pürxuni-suzanın misali-qönçeyi-lalə,
Məlamət xəncərilə çak qıl, daği-nihan göstər!”[359]

*(Sən ey vəfalılıqdan ağızdolusu danışan kimsə, gəl durmadan axan göz yaşlarını göstər. Dağınıq, qeyri-müəyyən sözlər deməklə işini bitmiş sayma. Sadiqliyini, səmimiliyini sübuta yetir, bunun üçün dəlil-sübut ortaya qoy. Əgər sən doğrudan da İmam Hüseyni sevirsənsə, sənin qanla dolu yanğılı ürəyin lalənin qönçə vaxtı kimi olmalıdır. Ona görə də gəl onu danlaq xəncəri ilə yırtıb, içərisindəki gizli yanıq yarasını büruzə ver).*

Doğrudur, hədisdə “ziyarət” sözü işlənmir, ancaq hədisin ümumi məzmunu bir ziyarət ab-havasında qurulmuşdur. Cəbrayılın təbrik üçün gəlməsi, Həzrət Muhəmmədin Fətrəsə “Yaralarını Hüseynin ayaqlarına sürt!” buyurması, sonda əksini tapan ilahi tapşırıq bunu göstərir.

Ziyarət anlayışının işlənmə məqamları baxımından şeirin emosionallığı ayrıca diqqəti çəkir. Əgər onu Allahın kəlamının poetik əksi kimi götürsək, onda gərək sözlə işin bir-birini tamamlaması zərurətinin vurğulanması cəhətini önə çəkək. Bu isə İslamın aparıcı tələblərindən biridir. *Rəsmi-vəfa, mücərrəd qövl, daği-nihan* ifadələri bu yöndə ayrıca dini yük daşıyaraq,

.................................

[359] *Füzuli. Kərbəla vaqiəsi, səh. 52-53*





"Ey iman gətirənlər, etməyəcəyiniz bir şeyi niyə deyirsiniz? Etməyəcəyiniz bir şeyi demək Allah yanında böyük qəzəbə səbəb olar!" *("Səff", 2-3)* səpkili ilahi bəyanatların bədii inikası olaraq qavranılır.

Şair ikinci beytdə ideyanı obrazlılıqla verir. Belə ki, o, bir lalə surəti yaratmaqla onun keçdiyi inkişaf yolunu göz önündə canlandırır. Beləliklə, lalə son dərəcə təbiiliklə "Dili pürxuni-suzan"a çevrilir və istər-istəməz konkret əməli fəaliyyət, İmam Hüseyn (ə) yolunda birmənalı əməli iş mənasına gəlir. Bu mənanın şeirdəki daşıyıcısı "məlamət xəncəri" ifadəsidir. Beləliklə, qabaqkı örnəklərdən fərqli olaraq, burada ziyarət anlayışı mələklərin timsalında verilir ki, bu da sənətkarın ülvi yaradıcılıq istəyindən irəli gəlir.

4. "Mosul diyarına yaxınlaşanda Şimri-Zilcövşən xəbər göndərdi ki, diyarın əmiri şəhər əhlini toplayıb bizi qarşılasın. Mosulun əmiri İmadüddövlə şəhər əhlini toplamadı və Şimrin əmrinə əməl etməyib, cavab göndərdi ki, bu şəhərdə müxtəlif tayfalar yaşayır. Ola bilsin ki, bir fəsad törəyə bilər. Məsləhət budur ki, şəhərdən bir az aralı xidmətinizə bir qədər adam göndərim. Şimri-məl`un bu xəbəri eşidib qorxuya düşdü və şəhərdən aralı bir yerdə dayandı. Həzrət imamın mübarək başını bir daşın üstünə qoydu. Başdan bir qətrə qan damaraq o mübarək səhranı kəramət yaqutuna mə`dən elədi. Qərara alındı ki, hər il məhərrəm ayında o qan cuşə gəlib təzələnsin və şəhərin bütün əhalisi onun ətrafına cəm olub əza saxlasın. Bu adət Əbdülməlik Mərvanın xilafətinədək mövcud idi. Mərvani-lə`in hakimiyyətdə olarkən həsəd ona güc gəldi və daşı oradan götürdü. Amma həmin daşın yerinə "Məşhədi-nöqtə" deyib hələ də ziyarət edirlər. Şe'r:

Girdin, ey əhli-sitəm, bir qanə kim, hər qətrəsi
Daşə damsa, ta əbəd daşdan çıxar yaquti-tər.
Könlünü daşdan betər dersəm, rəvadır, nişə kim,
Daşə tə`sir eylər ol qan, könlünə qılmaz əsər"[360].

.................................

[360] *Füzuli. Kərbəla vaqiəsi, səh. 155-156*





*(Ey zülmkar, sən əlini elə bir şəxsiyyətin qanına batırdın ki, əgər bir qətrəsi daşın üstünə tökülsə, əbədi olaraq o daş bir yaqut qaynağına çevrilər. Buna görə də ürəyinə daşdan da bərkdir desəm, tamamilə yerinə düşər, çünki İmam Hüseyn qanı daşa təsir etdiyi halda, sənin o daş qəlbində heç bir iz buraxmaz!).*

Bu hekayə özünün dinamikliyi ilə seçilir. İlk baxışda sadə bir əhvalat kimi görünən hekayədə, əslində, ziyarət anlayışının çoxqatlı və çoxşaxəli şəbəkəsi var. Məsələn, Şimri-Zilcövşənin İmam Hüseynin (ə) mübarək başını bir daşın üzərinə qoyması özlüyündə adi bir hərəkət sayıla bilər. Ancaq daşın səhranın bir parçası olduğunu nəzərə aldıqda, qafilin bu sadə hərəkəti nəticəsində imamın mübarək başından bir damla qan damaraq o səhranı kəramət yaqutuna mədən eləməsi kimi imamlıq kəraməti və ilahi ülviyyət təzahürü ortaya çıxır. Odur ki, hər il məhərrəm ayında o qanın cuşa gəlib təzələnməsi və şəhər əhlinin onun çevrəsində əza saxlamasına qərar verilir. Bu isə Kərbəla şəhidləri üçün təkcə matəm keçirmək olmayıb, onların qurban getdikləri dəyərlərin dərki üçün də əməli addım atmaq deməkdir.

Füzuli tarixə göz gəzdirərək lənətlədiyi Əbdülməlik Mərvan dövrünü də ziyarət anlayışının bədii əksi yönündə əsərə gətirməklə, əslində, proseslərin durğun olmadığına, hər dövrün öz ictimai-siyasi şərtlərinə görə irəliləmə və geriləmə, inkişaf və tənəzzül keçirdiyinə işarə edir. Bu zaman şairin həsəddən danışması məsələnin ictimai-siyasi tərəfini qətiyyən bəsitləşdirmir, əksinə, xəbisliyin mənəvi eybəcərlik olaraq təsir gücünü də göstərmiş olur.

Anlayışın hekayədəki başqa bir incə işlənmə məqamı murdar və idbar xislətli xəlifələrin mənfur əməllərinin nəticəsiz qalmasının önə çəkilməsidir. Həmin daşın yerinə "Məşhədi-nöqtə", yəni bir damla qanın göründüyü yer, daha doğrusu, özünün bircə damla qanı ilə böyük ictimai-mənəvi





*İmam Museyi Kazım (ə) və İmam Muhəmməd Təqi (ə)-ın müqəddəs məzarları. İraq. Kazimeyn şəhəri*

təsir yaradan şəhid nişanəsi deyib hələ də ziyarət edilməsinin bildirilməsi Kərbəla vaqeəsinin yaşarılığının təntənəsi kimi dərk olunur. Hekayədən sonra verilən şeirin açıq ifşaçılıq tonunda olması da buradan irəli gəlir.

Yeri gəlmişkən deyilməmiş qalmasın ki, açıq ifşaçılıq tonu Füzulinin nəinki nəsrində, hətta lirikasında belə aparıcı yer tutur. "Füzulinin tənqidində satirik qüvvə, ifşa ünsürü vardır ki, bu da şairin XVI əsr şeirinə gətirdiyi yeni keyfiyyətdir"[361].

Prof. Fuad Qasımzadə "Şikayətnamə"nin təhlilini doğru olaraq belə yekunlaşdırır: "Deməк, tənqid və satira atəşinə tutulan yalnız məmurlar, Övqaf idarəsinin işçiləri deyil, ümumiyyətlə, feodal üsuli-idarəsi, feodal ictimai-siyasi quruluşu, ...bütün hakim dairələr, hakim təbəqələrdir"[362].

Göründüyü kimi, bu köklü filoloji qeydlər şeirin "əhli-sitəm"ə zülmkarlara xitabən başlamasının elmi-nəzəri təsdiqi yerində başa düşülür.

................................

[361] *Quluzadə M. "Ənisü-l-qəlb" və onun ədəbi ənənələrlə əlaqəsi, Azərbaycan ədəbiyyatı məsələləri, Bakı, 1964, səh. 210*

[362] *Qasımzadə F. Qəm karvanı, yaxud zülmətdə nur, Bakı, 1968, səh. 200*



Anlayışın şeirdəki bədii əksi baxımından nəsrlə nəzmin vahid motivlər üzərində qurulması diqqəti çəkir. Şeirdəki "yaquti-tər" *(təptəzə yaqut yatağı)* ifadəsi İmam Hüseyn qanının əmələ gətirdiyi kəramətin nəsrlə təqdiminə bir şirinlik verir. Bu isə sözün, sənətin ecazından, sirrindən, sehrindən başqa bir şey deyildir.

Digər tərəfdən, belə bir cəhət də diqqəti çəkir ki, İmam Hüseynlə (ə) bağlı "Sarə-l-lah" – *Allah qanı* ifadəsində əksini tapan intiqam anlayışı şeirdə "əhli-sitəm"in törətdiyi faciənin misilsiz tarixi cinayət olmasının parlaq bədii ifadəsidir. Belədə "könlünü daşdan betər dersəm" deyən şairin, əslində, zülmkarlara qarşı sərt olmadığı, əksinə, onlara bir insan kimi yanaşdığı və onların vicdanını oyatmaq istədiyi aydın olur.

5. "Rəvayətdir ki, yol boyu gedərkən hər mənzildə bir kəramət zahir olurdu. Onlardan biri budur ki, onlar Hərran adlı bir yerə çatarkən Yəhya adlı bir yəhudi camaatla birgə şühəda başlarına tamaşa etməyə çıxmışdı və Həzrət Hüseynin başına yaxından baxanda gördü ki, dodaqları tərpənir. Diqqətlə dinləyib şahid oldu ki, Həzrət Hüseyn bu ayəni tilavət edir: "Va səy ləmul-ləzinə zələmu əyyə munqəlibin yənqəlibun" – "Zalımlar nələrə düçar olduqlarını lap tezliklə anlayacaqlar" *("Şüəra", 227)*. Yəhya, heyrətlənib sual etdi ki, bu kimin başıdır? Dedilər: "Hüseyn ibn Əlinin başıdır ki, cəddi Mustafa, anası Fatimeyi-Zəhradır". O kəramət Yəhyaya dərin təsir elədi və dərhal imana gəldi. Mənzilinə gəlib, Əhli-beyt xanımları və İmam Zeynəlabidin üçün libasdan, yeməkdən hazırladı. Min dirhəm də nəzir əlavə edib gətirərkən müvəkkil mane oldu və dedi ki, padşahın düşməninə məhəbbət yetirmək fəsaddır. Odur ki, onlar Yəhyanı öldürməyə qəsd elədilər. Yəhya da qorxmayıb, bəzi yardımçıları ilə birlikdə müqabil dayandı və axırda şəhid oldu. Rəhmətullahi-əleyh. İndi də qəbri Hərrandadır və məzarına "Yəhyayi-şəhid məzarı" deyirlər. Şe'r:





Kəraməti-nəsəbi-Mustəfa degil məxfi,
Nə bak həsəd əhli əgər nəzər qılmaz.
Nə tirədir dili-əhli-həsəd ki, mö`cizi-al
Yahudə eylər əsər, anlara əsər qılmaz[363].

*(Peyğəmbər nəslinin kəraməti heç kəsdən gizli deyil. Əgər paxıl adamlar bunu görmürlərsə, bu, qətiyyən təəccüb doğurmamalıdır. Paxıl adamların qəlbi gör necə qaradır ki, Əhli-beytin möcüzəsi yəhudiyə təsir edib onu İslama gətirdiyi halda, onların vicdanlarını oyatmaz!).*

Parçanın ziyarət anlayışının işlənmə məqamları baxımından qazandığı başlıca cizgi danışılan əhvalatın isti-isti nəql edilməsidir. Yer və şəxs adlarınn dəqiqliyi ilə göstərilməsi, dialoqun olması, müvəkkilin – iş icraçısının maneçilik törətməsi, vuruşma səhnəsi buradakı təsvirin görümlü və çevikli olmasını təmin edir.

Anlayışın bədii əksi baxımından İmam Hüseynin mübarək kəsik başının Quran oxuması epizodu ayrıca önəmə malikdir. Çünki ad çəkilməməsinə baxmayaraq, əslində, bunun özü də aydın bir ziyarət motividir. Belə ki, sənətkar burada prozaik metafor etmiş, yəhudi Yəhyanın İslam rəhbərinin kəsik başının Quran oxumasından aldığı təsiri olduqca orijinal şəkildə qələmə almışdır.

Digər tərəfdən, İmam Hüseynin (ə) kəsik başının oxuduğu ayə də çox dəqiq seçilmişdir, çünki həmin ilahi bəyanat Kərbəla şəhidlərinin qatillərinə oxunan tarixi ittiham aktı kimi səslənir.

Üçüncü bir cəhət kimi diqqəti bu çəkir ki, Yəhyanın məzarına "Yəhyayi-şəhid məzarı" deyilməsi, indi də qəbrinin Hərranda olmasının ayrıca vurğulanması da ziyarət anlayışının yaşarı və canlı təbiətindən doğan parlaq və tutumlu bir bədiilik örnəyidir.

Şeir Tasuada verilmiş əhvalatların təsvirini tamamlayan poetik parça ilə yaxından səsləşir:

.................................

[363] *Füzuli. Kərbəla vaqiəsi, səh. 155*





Pak etməklə ərbabi-xəta səfheyi-qəlbin
İzhari-kəramət qılır əhli-nəzər, əmma
Zalimlərə izhari-kəramət əsər etməz,
Qılmaz dili-Fironu münəvvər Yədi-Beyza![364]

*(Arif kimsələr suçlu insanların qəlb səhifəsini, könül dünyasını saflaşdırmaqdan ötrü durmadan müxtəlif kəramətlər göstərirlər. Ancaq bu kəramətlər zalımlara qətiyyən təsir göstərmir. Axı Musa Peyğəmbərin boynundan, qoltuğundan parlaq olaraq çıxartdığı əli nə qədər böyük möcüzə olsa, əsla Fironun ürəyinə iman nuru çata bilməz!).*

Göründüyü kimi, hər iki şeirdəki "həsəd əhli" və "ərbabi-xəta", "kəraməti-nəsəbi Müstəfa" və "yədi-beyza", "yəhud" və "dili-Firon" deyimləri parlaq bir obrazılılıq örnəyi kimi üst-üstə düşərək, şairin bir fikri müxtəlif baxış bucaqlarından ustalıqla işıqlandırımasının dəlil-sübutudur.

5. "Rəvayətdir ki, ol sərvərin (Həbib bin Müzahirin – **V.A.**) səri-mübarəkin bir sərkəş qət' edüb, yanında saxlayub, vaqieyi-Kərbəladan sonra Məkkəyə müraciət qılub, mərkəbinin boynuna asub, şəhrə girüb mübahat edərkən Həbibi-Müzahirin oğlu uğrayub, "Bu kimin başıdır?" deyə sual etdikdə ol bixəbər təfaxür qılub ayıtdı: "Bu, Həbib bin Müzahir başıdır!" Ol xələfi-qabil (ol) müxalifi bir zərblə qətl edüb, Həbibi-Müzahirin səri-mübarəkin bir büq`ədə dəfn etdi və "Rə'su-l-Həbib" deməklə mə`ruf bir məzari-müqərrərdür"[365].

Göründüyü kimi, Kərbəla məktəbinin ən qocaman yetirməsi olan Həbib bin Müzahirin bədənindən ayrılmış başı "mübarək" – *bərəkətli* adlandırılır. Zənnimizcə, bu, təkcə ənənəvi epitet olmayıb, həm də İmam Hüseyn hərəkatının ictimai-coğrafi təsir dairəsinin genişliyinin görstəricisidir. Bu

................................

[364] *Füzuli. Kərbəla vaqiəsi, səh. 76*

[365] *Füzuli. Əsərləri, VI cild, səh. 295*





isə o deməkdir ki, saf bir müsəlman kimi Füzuli qəbirləri heç də bəsit ölüm aktı saymır. Əksinə, qəbirlər Füzulinin gözündə yaşarı və diri əqidə mübarizlərinin hal-hazırda həyatda olan adamlara əzmkarlıq aşılayan, döyüş ruhu verən dini-tarixi stimuldur. Bütünlükdə parça bu yüksək estetik kredoya qulluq edir.

Ziyarət anlayışının birbaşa bədii ifadəsi baxımından isə diqqəti bu çəkir ki, "Rəsul-Həbib" deyimi həmin yerin artıq bəlli və aydın bir ziyarətgaha çevrildiyinə dəlalət edir. "Tanınan" və "üzərinə tez-tez gəlib-gedəni olan qəbir" ifadələri də bu yöndədir.

Yəqin, elə buna görədir ki, şair bu parçanı da şeirsiz qoymur və qocaman Kərbəla igidinin şəninə daha bir şərqi söyləyir:

Təni-paki-şühəda sətri yetər pərdeyi-xun,
Nolə gər olsa dəmi-dəfn kəfəndən ayru!
Şəfəqamiz günəşdir, səri-xunini şəhid,
Nolə yerdən-yerə gər getsə bədəndən ayru![366]

*(Şəhidlərin pak bədənlərinin örtülməsi üçün qan pərdəsi kifayətdir. Dəfn zamanı kəfənsiz olmaları qətiyyən buna maneə törətmir. Bədənləri ilə birlikdə olmamalarına və tez-tez yer dəyişmələrinə baxmayaraq, qanlı şəhid başları şəfəq saçan bir günəşdir!).*

Göründüyü kimi, dəqiq islami bilgilər üzərində qurulan bu mətnin poetik semiotikası qətiyyən şəriət informasiyası ilə məhdudlaşmır, əksinə, həmin məlumatların estetik və fəlsəfi təqdiminə çevrilir. Məsələn, ilk baxışdan qorxunc səhnə təsiri bağışlayan *cəsəd, qan, dəfn mərasimi, kəfən, qana bələnmiş baş, dəfn yerinin yez-tez dəyişdirilməsi* kimi reallıqlar poetik

..................................

[366] *Yenə orada*





təfəkkürün fonunda sanki öz nominativ anlamlarından uzaqlaşaraq, uca, yüksək və dönməz dəyərlərin simvoluna çevrilir, gözəllik sərgisi kimi səslənir. Həm də bütün bunlar islami-cihad və şəhidlik konsepsiyalarının özülü üzərində ucaldılan bədii üstqurum təsiri bağışlayır.

6. "Əbu-l-Məfaxirdən nəqldir ki, Kəbəni təvaf edərkən gördüm bir şəxs niqabdadır, yalvarır ki, ya Rəbb, günahımı bağışla. Onsuz da bilirəm məni əfv etməyin mümkün deyil.

Kufə əşrafları dedilər: "Ey fəqir, naümidlik küfrdür". Dedi: "Ey camaat, mən o güruhdanam ki, şühədanın başları Şama göndərildikdə mən onların mühafizəçilərindən idim. O bədbəxtlər hər mənzildə başlar qoyulmuş sandığı araya alıb, ətrafında eyş-işrət məclisi qurub əylənərdilər. Mən isə onlara qoşulmazdım və kənardan müşahidə edərdim. Bir gecə hamı məst olub yatmışdı və təkcə mən oyaq qalmışdım. Bir də gördüm ki, göydən bir nur xeyməsi endi. Xeymədən üç nəfər nurani şəxs çıxdı və sandıqdan başları çıxarıb ziyarət elədilər. Mən tamam qorxu və vahimə içində ikən onların arasında bir qoca nurani şəxs görüb soruşdum ki, bunlar kimlərdir ? Dedi: "Bunlar Allah dərgahının müqərribləri olan Cəbrail, Mikail və İsrafildir". Bir az sonra gördüm ki, Cəbrail xeyməyə daxil olub dedi: "Ey Allahın seçilmişi!"

Gördüm ki, Adəm, Şis və İdris çıxıb o başları ziyarət etdilər. Ondan sonra dedi: "Ey Allahın nicatvərəni!" Gördüm ki, Nuh və Sam çıxıb o başları ziyarət etdilər. Sonra dedi: "Ey Allahın sevimlisi!" Gördüm İbrahim, İsmail və İshaq çıxıb onları ziyarət elədilər. Sonra dedi: "Ey Allahı ilə danışan!" Musa və Harun çıxıb ziyarət etdilər. Sonra dedi: "Ey Allahın ruhu!" Gördüm İsa çıxıb ziyarət etdi. Axırda dedi: "Ey Allahın dostu!" Gördüm ki, Həzrət Muhəmməd təşrif gətirdi. Hüseynin mübarək başı yetmiş qədəmə qədər irəli gəlib, üzünü Rəsulullahın qədəmlərinə sürtüb, kədərlə avaza gəldi:





“Ya cəddah, gör bivəfa ümmətdən mənə necə bəlalar yetişdi!”

Həzrət Rəsul üzünü onun üzünə sürtdü və bütün peyğəmbərlər birlikdə əzaya məşğul oldular”[367].

İlk baxışdan nəzərə çarpmamasına baxmayaraq, əhvalatı danışan şəxsin Kəbəni təvaf halında olması Məkkə və Kərbəla ziyarətlərinin vəhdətinə vurulan işarə kimi olduqca mənalıdır. Bu məna o qədər güclüdür ki, oxucu istər-istəməz İmam Hüseynin (ə) sonuncu Kəbə ziyarətini xatırlayır. Axı o ulu din böyüyü hətta həccin vacib əməlləri zamanı da özünün rəhbərlik vəzifəsini yerinə yetirmiş, Yezid idarə üsuluna qarşı mübarizəsini davam etdirmişdi.

Ancaq hekayənin ziyarət anlayışının bədii ifadəsi baxımından qazandığı başlıca xüsusiyyət mələklərin və peyğəmbərlərin İmam Hüseynin (ə) kəsik başına göstərdikləri böyük rəğbət və ehtiramdır. Füzuli burada özünün təxəyyül gücünün bütün imkanlarını işə salaraq, hissiyyatla idrakı, duyğu ilə düşüncəni, xəyal ilə gerçəkliyi birləşdirmiş və çağdaş nəslin hələ indi gəlib çıxdığı “qarışıq zamanlar” priyomundan yararlanaraq olduqca əlvan və geniş bədiyyat sistemi qurmuşdur. Əhvalatı izləyən geniş şeir isə prozaik imkana sığışmayan poetik tərcümanı yerində çıxış etməklə ayrıca önəm qazanmaqdadır:

Səhldir ol kim, həmin Həvvadən Adəm oldu dur,
Olmadı məcmui-ətbavu əyalindən cüda.
Səhldir ol qəm ki, düşdü bəhrə Nuhun zövrəqi,
Görmədi girdabi-xunab içrə girdabi-fəna.
Səhldir kim, yetdi İbrahimə Nəmrud atəşi,
Yetmədi bərqi-cahansuzi-firaqi-əqrəba.
Səhldir kim, çəkdi bidadını Fir`onun Kəlim,

.................................

[367] *Füzuli. Kərbəla vaqiəsi, səh. 176-177*





Olmadı düşmən ana bir kafiri-möminnüma.
Bitəkəllüf əql mizaniylə təhqiq etsələr,
Cümleyi-ənduhi-məcmui-güruhi-ənbiya.
Gəlməz ol miqdar möhnətlərcə kim, səbr eyləyib,
Çəkdi əhli-zülmdən Məzlumi-dəşti Kərbəla.[368]

*(Adəmin müvəqqəti olaraq Həvvadan ayrı düşməsi yüngül işdir, çünki bu zaman o, ailə üzvlərinin heç də hamısından ayrı düşməmişdi. Nuhun gəmisinin də arabir dalğalar qoynunda atılıb-düşməsi nəticəsində yaranan qəm-kədər də elə bir çətinlik törətməmişdir. Çünki bu gəmi qan burulğanı içində heçlik burulğanına sürüklənmədi. Nəmrudun qaladığı fəsad tonqalına atılmaq da İbrahim üçün asan idi. Axı qohum-əqraba ayrılığının dünyanı yandıran od-alovunun qığılcımları onu incitməmişdi. Doğrudur, Musa Firondan çox əzab-əziyyət gördü. Ancaq üzdə mömin kimi görünüb, əslində kafir olanlar onun düşmənləri sırasında yer almadığından, bu, Peyğəmbər üçün bir elə də ağır deyildi. Ağıl tərəzisində çəkərək obiyektiv araşdırmalar aparsalar, bütün aydınlığı və genişliyi ilə ortaya çıxar ki, peyğəmbərlər dəstəsinin hamısının kədərinin cəmi Kərbəla çölü məzlumunun, İmam Hüseynin misilsiz səbirlə zalımların əlindən çəkdiyi tayı-bərabəri olmayan və heç bir faciə ilə müqayisəyə gəlməyən böyük bəşəri kədərlə tən gələ bilməz!).*

Göründüyü kimi, şeirdə sadalanan peyğəmbərlər İmam Hüseynin kəsik başının ziyarətinə gəlmiş müqəddəsatın sırasına tam uyğundur. Füzuli bununla nəsr hissəsində deməyi ədəbsizlik saydığı mətləbləri, fürsətdən istifadə edərək, poeziyanın yüyrək və çevik dili ilə birər-birər dilə gətirir. Bu isə bir neçə baxımdan dəyərləndirilə bilər.

[368] *Füzuli. Kərbəla vaqiəsi, səh. 177*





Bəllidir ki, "Hədiqətü-s-süəda"nın 1-ci babında əsas peyğəmbərlərin həyat və fəaliyyətinə toxunulur. Ancaq bu şeiri oxuduqda aydın olur ki, Füzuli bunu qətiyyən ənənə xatirinə etməmiş, əksinə, bununla əsərin bu bölümü üçün sarsılmaz ədəbi zəmin yaratmışdır.

Digər tərəfdən, bu priyom Füzulinin məsələyə islami baxışı əsərə gətirdiyini göstərir. Ötəri deyildir ki, "Hədiqətü-s-süəda"nın bir yerində oxuyuruq: "Rəvayətdir ki, Hüseynin qatili yanar bir tabut içərisində və boğazı zəncirlidir. Bu, Qiyamətədək davam edəcək.

"Sühufi-şərif"də Rizaiyyəyə istinadən nəql olunur ki, Həzrət Rəsul buyurmuşdur: "Musa ibn İmran Harunun vəfatından sonra yalvarışla üzünü Allah dərgahına tutub Harun üçün rəhmət dilədi. Allah dərgahından vəhy gəldi ki: "Ya Musa, əgər Məndən bütün insanlar üçün rəhmət diləsən, qəbul edərəm. Ancaq Hüseynin qatilinin günahından keçmək mümkün deyil. Onun intiqamını Özüm alacağam!" Şe`r:

Gər əzabi əhli-duzəx cürm miqdarincadır,
Vay ona kim, eyləmiş qətli-şəhidi-Kərbəla.
Ol səbəbdən kim şəhidi-Kərbəlanın qədrini
Eyləmiş ə`la cəmiyi-xəlqdən Rəbbül-üla.[369]

*(Cəhənnəmliklərin görəcəkləri əzab onların suçu qədər olmasına baxmayaraq, Kərbəla şəhidini, İmam Hüseyni (ə) qətlə yetirmiş kimsənin halına vay olsun! Çünki onun alacağı cəza bu qanuna tabe olmayıb istisna hal təşkil etməkdədir. Ulu Yaradanın Kərbəla şəhidinin qədir-qiymətini bütün yaranmışlardan uca tutmasının başlıca səbəbi də elə burada axtarılmalıdır).*

.................................

[369] *Füzuli. Kərbəla vaqiəsi, səh. 175*





Göründüyü kimi, bu nümunə araşdırdığımız parçanın alt qatında yatan islami göstərişin nisbətən açıq ifadəsidir. Heç şübhəsiz, Allah-taalanın bir Peyğəmbərinə buyurduğu sözlər o biri peyğəmbərləri üçün də qüvvədədir.

* * *

Nəzər saldığımız bu örnəklər danılmaz biçimdə sübuta yetirir ki, ziyarət anlayışı "Hədiqətü-s-süəda"nın aparıcı motivləri sırasında olub, Füzuli dünyagörüşünün komponenti kimi əsərin mühüm ideya-bədii keyfiyyətlərindən biridir və ən müxtəlif anlayış, ad, bilgi və müddəalarla qırılmaz bağlılıqda motivləşdirilmişdir. Bütün bunlar isə təhlilə çəkdiyimiz rübainin fikri axarını və bədii tutumunu lazımınca qavramaqdan ötrü çox önəmlidir. Belə ki, yuxarıdakı hədis və hekayələrə bələd oxucular üçün rübaidəki açar ifadələri işlətmək çətin olmayacaqdır. Məsələn, "Allah səni iki Hərəmin təvafı ilə şərəfləndirdi" misrası yuxarıdakı hədis və hekayələrlə bağlılıqda götürülməyəcəyi təqdirdə havadan asılı qalar, sırf mücərrəd, bəlkə də quru mədhiyyədən başqa bir şey olmazdı.

Yaxud "iki qəbri görməklə sənin gözün işıqlandı" misrası belə geniş ziyarət təsvirləri fonundan təcrid edilmiş halda oxunsa, heç şübhəsiz, malik olduğu estetik gözəlliyi sona kimi bəxş etməyəcəkdir. Deməli, hər hansı bir mötəbər kimsənin Nəcəf və Kərbəla ziyarətindən gəlməsi münasibətilə yazılmasına baxmayaraq, rübai, əslində, Füzuli irsinin bu mövzudakı ən yaxşı əsərlərindən olub, orta əsr azərbaycanlısının milli-mənəvi kimliyinin parlaq bədii ifadəsinə xidmət edir.

Ötəri deyildir ki, Nəcəf və Kərbəla şəhərlərindəki müqəddəs məkanları ziyarət etmək bu gün də xalqımızın göz bəbəyi kimi qoruyub saxladığı adət-ənənədir. Əgər Füzuli babamızın



400 il qabaqdan söylədiyi "Sənə çatanlara müjdə olsun ki, doğrudan da, səni ziyarət edən Əlini və Hüseyni ziyarət etmiş olar" sözləri bu gün də Həzrət Əli və İmam Hüseyn zəvvarının özü ilə o ulu din böyüklərindən, Nəcəf və Kərbəladan bir uca dəyər götürüb gətirməsi, nümunəvi dindar və vətəndaş olması anlamına gəlirsə, deməli, rübaidə əksini tapmış milli mənəvi kimlik hələ ki pozulmamış, hələ ki ləkələnməmişdir.





# NƏTİCƏ

Rəsulullahdan (s) və Həzrət Əlidən (ə) sonra bəşəriyyətin üçüncü ən kamil şəxsiyyəti olan İmam Hüseynin (ə) dini-mənəvi kimliyi, həyat və fəaliyyətinin yekunu olan Kərbəla vaqeəsi dünya ədəbiyyatının qabaqcıl simaları sırasında yer alan Məhəmməd Füzulinin irsində mühüm yer tutur. Bəs bu yerin müəyyənləşdirilməsinə, onun ideya-bədii istiqamətinin öyrənilməsinə, İmam Hüseynin, Kərbəla döyüşündə iştirak etmiş Əhli-beyt nümayəndələrinin, həmçinin digər Kərbəla şəhidlərinin "Hədiqətü-s-süəda" başda olmaqla Füzuli yaradıcılığındakı tərənnüm və təsvirinin tədqiqinə və bütün bunların dini-tarixi bilgi və anlayış olaraq ədibin irsində qazandığı əlvan və rəngarəng dolğun və tutumlu mövzu, məzmun, məfkurə və üslub incəliklərinin araşdırılmasına həsr edilmiş bu monoqrafiya əsasında hansı elmi qənaətlərə gəlmək və nə kimi nəzəri nəticələr çıxarmaq mümkündür?

1. Monoqrafik tədqiqatdan ilk növbədə bu qənaət ələ gəlir ki, Füzuli son dərəcə böyük bir şair olmasına baxmayaraq, olduqca çətin və ağır bir iş olan tərcümə və təbdil sahəsinə müraciət etmişdir. Onu bu işə sövq edən başlıca amil isə İmam Hüseynə (ə) və tərəfdarlarına duyduğu sonsuz sayğı və sevgi olmuşdur. Bu işdə Füzuliyə İslam dininin cihad və şəhidlik konsepsiyalarının da yön verdiyi göz qabağındadır. Bu, yaxud başqa faktorlar Füzulini ömrünün-gününün ahıl və xəstə çağlarında belə ağır və çətin bir işə girməyə vadar etmiş,



o, fars ədibi Hüseyn Vaiz Kaşifinin "Rövzətü-ş-şühəda" *("Şəhidlər bağçası")* əsərini orijinala 90 faiz sadiq qalmaqla ana dilinə qazandırmışdır.

2. Ataəmi Mirzəyevin bəlli araşdırmalarına əlavə olaraq bu monoqrafiya da əsaslı surətdə göstərir ki, "Hədiqətü-s-süəda"dakı hər bir mülahizə və müddəanın əsl müəllifi məhz Hüseyn Vaiz Kaşifidir. Füzulinin xidməti isə ondan ibarətdir ki, o, "Rövzətü-ş-şühəda"ya olduqca yaradıcı yanaşmış, tərcümə prosesində özünün ilhamını işə salaraq oradakı mülahizə və müddəaları əngin təxəyyülünün süzgəcindən keçirmiş, onları bir xalı naxışı kimi söz-söz, ifadə-ifadə işləmiş, onlara incədən-incə anlam çalarları vermişdir.

3. Monoqrafiya inkarolunmaz surətdə sübuta yetirir ki, Füzuli "Rövzətü-ş-şühəda"nı həm də Azərbaycan türklərinin dini-mənəvi tələbatını ödəmək üçün dosdoğma dilində səsləndirmişdir. Odur ki, "Hədiqətü-s-süəda" ənənəvi tərcümə, yaxud təbdil faktı olaraq qalmamış, əksinə, Azərbaycan türklərinin orta əsrlərdə milli mənəvi kimliyini formalaşdıran aparıcı amilləri özündə birləşdirən ədəbi-bədii bir abidəyə çevrilmişdir.

4. "Hədiqətü-s-süəda"nın tərcümə dilinin ağırlığı, hər şeydən öncə, ədibin İmam Hüseyn hərəkatı və Kərbəla vaqeəsi ilə bağlı ictimai-tarixi həqiqətləri, eləcə də öz duyğu və düşüncələrini ozamankı siyasilərə, dövlət xadimlərinə çatdırmaq kimi son dərəcə mütərəqqi bir məqsəddən irəli gəlmişdir. Bu isə Füzulinin mənsəb sahiblərindən din böyüklərinə layiq haqq-ədalət umduğunu, bunu onların sadə adamlarla davranış və rəftarında hər gün görmək istədiyini göstərir. Zənnimizcə, bu, Füzuli şəxsiyyətinin əlçatmaz-ünyetməz İmam Hüseyn (ə) şəxsiyyətindən götürdüyü əyani ibrət dərsi kimi də qiymətləndirilməlidir.

5. Şairin "Müxtəsər türki-divan"ındakı "Ucaldın qəbrim, ey bidərdlər, səngi-məlamətdən" misralı qəzəl özünün ideya-bədii istiqaməti, dil-üslub xüsusiyyətləri, sözaltı və sətiraltı məna-məzmun incəlikləri, illah da ilk iki beytin Füzulinin



Kərbəla sakini kimi İmam Hüseynin (ə) müqəddəs türbəsindəki gündəlik xidməti ilə bağlı tərcümeyi-hal xarakteri kəsb etməsi qəzəlin məhz Füzulinin vəsiyyəti kimi İmam Hüseynin (ə) eşqində yazıldığını düşünməyə yol açır, bu ehtimalı zənn, güman mərhələsindən çıxarıb, fərziyyə, hipotez səviyyəsinə qaldırmağa imkan verir.

6. Monoqrafiyada "Hədiqətü-s-süəda"ya daxil olmayan Füzuli lirikasının bir başqa nümunəsi də araşdırılır. Divanın "Rübailər" qismində yer alan bu nümunə ilk növbədə İmam Hüseynin (ə) və Kərbəla şəhidlərinin zəvvarları haqqında olub, onların zəngin daxili dünyasının lakonik bədii ifadəsidir. Tədqiqat göstərir ki, ziyarət anlayışı, bu anlayışla bağlı çoxsaylı mifik və etnoqrafik bilgilər orta əsrlərdə sosial məzmun alaraq geniş ailə-məişət aktına çevrilibmiş. Bu, ən azı, adət-ənənələrimizin bədii ədəbiyyatımızdakı tarixi təzahürü olaraq qiymətlidir.

7. Digər tərəfdən, həmin rübainin ideya-bədii istiqaməti İmam Hüseynin (ə) və tərəfdarlarının həyat və fəaliyyətindən şəxsi nümunə götürmək meylini önə çəkməklə bunu dönməz bir əzmkarlıq kimi cəmiyyətin fəal təbəqələrinə aşılamağın da şairin yaradıcılıq istəkləri sırasında yer aldığını düşünməyə kifayət qədər əsas verir.

8. Tərcümə və təbdil olmasına baxmayaraq, "Hədiqətü-s-süəda" həm də əlvan və rəngarəng poeziya çələngidir. Təsviri verilən hadisə və əhvalatların, yüyrək təhkiyənin, çevik dialoqların təbii davamı olaraq ortaya çıxan və müəllifin həssas duyğularından və dərin düşüncələrindən soraq verən əsərin şeir məhsulu yerinə görə lirik ricət, yerinə görə qəhrəmanın sözləri, yerinə görə lirik "mən"in qabarıq təəssüratları, yerinə görə də sırf müəllif mövqeyi olaraq meydana çıxmışdır. Monoqrafiya A.Mirzəyevin bu qənaətini də təsdiq edir ki, Füzuli əsərin "Dibaçə"sində "sair kütubda olan nükteyi-qəribələri mümkün olduqca ana əlavə qılan" sözləri məhz tərcüməni belə əlvan şeir parçaları ilə bəzəməsi, poetik cəhətdən naxışa çəkməsi mənasında söyləmişdir.



Monoqrafiya onu da göstərir ki, İmam Hüseyn (ə) hərəkatı Rəsulullahın (s) haqq İslam məfkurəsi üzərində qurduğu və Həzrət Əlinin (ə) möhkəmləndirdiyi müsəlman cəmiyyətini və dövlətini ləyaqətlə hifz edib qorumaq və inkişaf etdirib artırmaq kimi ali məqsəddən doğmuşdur. Bu, Füzuli irsində də özünün hərtərəfli bədii əksini tapmış, uyarlı estetik dərkinə qovuşmuşdur.

9. Bu mənada "Peyğəmbər aşiqi Füzuli" və "Həzrəti-Əli aşiqi Füzuli" monoqrafiyaları bu kitabın qanuni sələfləri yerində çıxış edir. Belədə bu monoqrafiya da istər-istəməz həmin kitabların təbii ardı, ardıcılı və ideya, əqidə silahdaşı təsiri bağışlayır.

10. Monoqrafiyada Füzuli irsinin mühtəva və mündəricəsindən irəli gələn hal olaraq onlarla problemə toxunulmuşdur. Doğrudur, onların əksəriyyətinə köklü şəkildə münasibət bildirmək mümkün olmamışdır, ancaq kitabın həcmi nəzərə alınmaqla həmin problemlərlə bağlı ilkin müəllif təəssüratları dilə gətirilmiş, bunların gələcək araşdırılma konturları cızılmışdır.

11. Füzuli qələmi nəzmdə olduğu kimi, nəsrdə də ecazkardır, xariqələr yaratmağa qadirdir. Odur ki, kitabda təhlilə çəkilən nümunələr bədii ifadə vasitələri ilə zəngindir. Biri o birindən sanballı mübaliğələr, epitetlər, metaforlar, paralellər, hüsni-təvillər və s. göz oxşayır, könül sevindirir. Ancaq biz yerində bunları hərtərəfli araşdırdığımızda burada onların hər birinə aid konkret misal vermirik. Qoy diqqətcil imamhüseynsevər oxucumuz belə parlaq bədiilik örnəkləri və obrazlılıq nümunələri ilə özü təmas qursun. Zənnimizcə, belədə son illərdə əmələ gəlmiş süni oxucu tənbəlliyinin də qarşısı alınar.

Beləliklə, aydın olur ki, İmam Hüseyn (ə) mübarizliyinin, İmam Hüseyn (ə) mərdliyinin, şəhidlərin əziz xatirəsinin, habelə Kərbəla vaqeəsinin obyektiv dərkinin və fəci mündəricəsinin Füzuli irsindəki bədii əksini yüksək nəzəri səviyyədə öyrənib, elmi-kütləvi üslubda ictimaiyyətə



çatdırmaq sahəsindəki boşluğu doldurmaq məqsədindən doğan bu kitab özünün faktoloji və filoloji sanbalı, dərin təhlil yükü, dini-tarixi qaynaqlara sadiqliyi, hadisələrə və proseslərə sərbəst yanaşma biçimi ilə köklü monoqrafik tədqiqat olub, Füzuli sözünün, Füzuli sənətinin İmam Hüseyn (ə) və Kərbəla vaqeəsi soraqlı başlıca və aparıcı keyfiyyətlərinin estetik açımının, vüsətli təsvirinin, parlaq tərənnümünün, şirin təhkiyəsinin, çevik və əlvan işlənmə məqamlarının, yüyrək və aydın dil-üslub cizgilərinin, ən nəhayət, səlis bədii məntiqinin üzə çıxarılmasına xidmət edir. Odur ki, onun imamhüseynsevərlərin Əhli-beyt eşqi ilə döyünən yanar ürəklərinin həzin tellərini hələ bir müddət titrədəcəyinə inanırıq. İnanırıq ki, dininə, müqəddəslərinə, vətəninə, ölkəsinə, dövlətinə sahib çıxan, bir-birindən şərəfli və əziz milli-mənəvi atributlarını var gücü ilə qoruyan Həzrət Abbas (ə) qeyrətli və xanım Zeynəb (s.ə) ismətli imamhüseynsevər oxucularımız Kərbəla şəhidlərinin xatirinə bu kitaba, deməli, həm də Əhli-beytə, haqq-ədalət mübarizəsinə, şəhidlərin fədakarlığına diqqətsiz qalmayacaq, özlərinin təklif və iradlarını bildirməklə obyektiv və subyektiv səbəblərə görə yol verdiyimiz nöqsan və qüsurları düzəltməkdə bizə yaxından kömək edəcəklər.



## QAYNAQLAR


1. Abbasov Yaqub. İslam alimləri, Bakı, 2007
2. Ağayev Ceyhun Şakir oğlu. Məhəmməd Füzulinin “Hədiqətü-s-süəda” əsərində iman və əqidə uğrunda mübarizə, f.e.ü.f.d. alimlik dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı, Bakı, 2012, 25 səh.
3. Ağırakça A. Əməvilər dönəmində qiyamlar, İstanbul, 1994
4. Akar Metin. Türk edebiyatında menzum miracnameler, Ankara, 1987
5. Akar Metin. Su kasidesinin şerhi, Ankara, 1994
6. Akseki, A.Hendi. İslam dini/etikad ibadet ve ahlak, Ankara, 1969
7. Almasov V. Füzuli yaradıcılığında dini-mənqəbəvi anlayışların yeri və bədii ifadə yolları (Türkcə divan və “Leyli–Məcnun” məsnəvisi üzrə), Azərbaycan Milli Elmlər Akademiyasının əsaslı kitabxanası, Bakı, 1994
8. Almasov V. Füzuli “Leyli–Məcnun”unun islami mahiyyəti, Bakı, 2006
9. Almasov V. Peyğəmbər aşiqi Füzuli, Bakı, 2007
10. Almasov V. Həzrəti-Əli aşiqi Füzuli, Bakı, 2010
11. Araslı Həmid. Böyük Azərbaycan şairi Füzuli, Bakı: Uşaqgəncnəşr, 1958, 312 s.
12. Atalar sözü, Bakı, 1985
13. Ateş Süleyman. İşari tefsir okulu, Ankara, 1974
14. Ayatullah Həsanzadə Amuli. İnsane-kamil əz didqahe-Nehco-l-Belağe, Qum, h.-ş.1372
15. Ayəti Muhammed İbrahim. Bərrəsiye-tarixe-Aşura, Qum, h.-ş. 1381, 336 s.
16. Ayətullah Cavadi Amuli. Kövseri-Kerbela, Qum, h.-ş. 1391, 375 s.
17. Ayətullah Cavadi Amuli. Şükufehaye-əql dər pərtövi-Hoseyni, Qum, h.-ş. 1391, 291s.
18. Ayətullah Hüseyn Əndəlib Həmədani. Sarəllah, xune-Huseyn der reghaye-İslam, Qum, h.-ş. 1392, 519 s.

19. Ayətullah Məhəmməd İbrahim Kolbasi-Nəcəfi. Xasaisu-l-Əbbasiyyə, tərc. Məhəmməd İsgəndəri, Tehran, h.-ş. 1384, 190 s.
20. Azərbaycan ədəbiyyatı tarixi, 3 cilddə, I cild, Bakı, 1960
21. Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, I cild, Bakı, 2004
22. Azərbaycan ədəbiyyatı tarixi, 6 cilddə, II cild, Bakı, 2007
23. Azərbaycan ədəbiyyatı tarixi, Yaqub Babayev, Bakı, 2014, 756 s.
24. Azərbaycan filologiyası məsələləri, Bakı, 1983
25. Azərbaycan filologiyası məsələləri, II buraxılış, Bakı, 1984
26. Azərbaycan klassik ədəbiyyatı kitabxanası, 20 cilddə, III cild, Bakı, 1984
27. Bayramlı Zəkulla. Füzuli və çağdaş ədəbi-nəzəri fikir. Bakı, 2010, 144 s.
28. Buzovnalı Rəhimağa İmaməliyev. İslam ensiklopediyası, Bakı, 1997
29. Büyük dinler ve meshebler ensiklopedisi, İstanbul, 1964
30. Daməğani. Qamusu-l-Quran, Beyrut, 1976
31. Dilaver Selvi. Kur'an ve tasavvuf. Tefsirlerin tasavvufa bakışı, İstanbul, 1997
32. Divan. Həzrəti-Əli ibn Əbi Talib, Bakı, 2001
33. Ehsan Əliaçıq. Etiqad üzərinə, Ankara, 1992
34. Elmalılı M. Hamdi Yazır. Hak Dini Kuran dili, 9 cilddə, Ankara, 1985
35. Əbdürrəhman Şərəf. Übdətü-l-qisas, İstanbul, h.-q. 1315
36. Əbu Davud Süleyman ibni əz-Sicistani. Sünəni Əbu Davud, 4 cilddə, Beyrut, h.-q. 1414
37. Əbu Həmid əl-Qəzali. İlahi biliklər, Bakı, 2006
38. Əbu Zəkkəriye Muhyiddin. Yehya ibni Şeref en-Nevevi. Riyazüs-Salehin, 3 cilddə, tərc.: Saleh Ucan, İstanbul, 1979
39. Əbulhəsən Əli ibn Hüseyn ibn Əli əl-Məsudi. Müruc-üz-zəhəb və Məadin əl-Cəvahir, III cild
40. Lətif Hüseynzadə. Nəimi haqqında bəzi qeydlər, Ədəbi Ermənistan (məcmuə), III kitab, Yerevan, 1960

**41.** Əhməd ibni Muhəmməd. Hədiqətu əş-şiə. III nəşr, məkansız, tarixsiz, 792 s.
**42.** Əli İsa Muhammed, ibni İsa ibni Səurə. Sinənmud Tirmizi, 5 cilddə, Beyrut, h.-q. 1414
**43.** Əli Nəzireyi-Münfərid. Qisseyi-Kərbəla (Qisseyi-intiqam). Qum, h.-ş. 1383, 701 s.
**44.** Əliyev Sabir. Füzulinin poetikası, Bakı, 1986
**45.** Əllamə Məclisi. Biharül-Ənvar, II nəşr, 110 cilddə, 66-cı cild, Beyrut, 1983
**46.** Əllamə Məhəmmədtəqi Cəfəri Təbrizi. Aşuranın təhlili, 2004
**47.** Fatimə Əhməd Xələf əl-Üteybə. Məhəmmədin şəxsiyyəti gözəl nümunə kimi, avtoreferat, Bakı, 1997
**48.** Feyzullayeva V. Füzulinin qəsidələri, Bakı, 1985
**49.** Fuzuli. Erenler bahçesi (Hədiqətü-s-süəda), hazırlayan: Sərvət Bəyoğlu, 2 cilddə, I cild, Ankara, 1986, 203 s.
**50.** Fuzuli. Erenler bahçesi (Hədiqətü-s-süəda), hazırlayan: Sərvət Bəyoğlu, 2 cilddə, II cild, Ankara, 1990, 220 s.
**51.** Füzuli. Divan. Fotosurət, Bakı, 1958
**52.** Füzuli. Əsərləri, 5 cilddə, Bakı, 1958-1985
**53.** Füzuli. Farsca divan, hazırlayan: Hasibe Mazıoğlu, Ankara, 1962
**54.** Füzuli. Kırk hadis tercümesi, hazırlayan: Kamal Edib Kürkçüöğlu, İstanbul, 1951
**55.** Gölpınarlı Abdülbakır.Tarih boyunca islam mezhepleri ve şielik, İstanbul, 1979
**56.** Hacı Fuad Nurullah. İmam Hüseyn şəhidlik məktəbinin ustadı, Bakı, 2014, 424 s.
**57.** Həzrət İmam Əli ibn Əbi Talib. Nəhcül-bəlağə, Bakı, 2005
**58.** Hüseynov Həsən. Xuda Hüseynin aşiqi, Bakı, 2007
**59.** Xosrov Təqəddüsi Niya. İmam Hüseynin (ə) hərəkatı haqqında 72 sual, İran, Qum, 1998
**60.** İbn əl-Əsir. Əl-Kamil fit-tarix. Darul-kutubil-ilmiyyə, Beyrut, 1407/1987; təhqiq: Əbul-Fida Abdullah əl-Qazi
**61.** İbn Ərəbi. İslam ensiklopedisi, cüz 51, İstanbul, 1951
**62.** İbn Fariz. Mucəmu'-l-məqayisi-l-lüğət, III cild, Qahirə, 1368

**63.** İbn Macə. Nikah
**64.** İmam Əli Əmirəlmöminin Əli bin Əbu Talibin fəzilətlərinə dair hədislər. İmam Nisai, tərc.: Adil, Bakı, 2009
**65.** İmam Qəzali. İhyau Ulumiddin, 4 clddə, II cild, tərc. Əhməd Sərdaroğlu, İstanbul, tarixsiz
**66.** İmam Rebbani. İslamda nubuvvet, İstanbul, 1978
**67.** İslamov Rövşən. Riza və təslim, "Hikmət" jurnalı, №2, 2009
**68.** İsmailiye-Yəzidi Əbbas. Səhabi-rəhmət. III nəşr, Qum, h.-ş. 1380, 868 s.
**69.** İzzəddin İbn əl-Əsir. Əl-kamil fi-t-tarix (Mükəmməl tarix), Azərbaycanın və qonşu ölkələrin tarixinə dair iqtibaslar (ərəbcədən yoxlanılmış tərcümə, ön söz, qeydlər və şərhlər akademik Ziya Bünyadovundur), Bakı, 1996
**70.** Karagöz İsmail. Kurana göre insana verilən deyer ve görev, İstanbul, 1996
**71.** Karagöz İsmail. Kurana göre zülm açısından Allah ve insan, İstanbul, 1996
**72.** Karagöz İsmail. Kurana göre müsibetler açısından insan ve toplum, II neşr, İstanbul, 1996
**73.** Kaşğari Mahmud. Divani lüğət-it-türk, 4 cild, Bakı, 2006
**74.** Kitabəl-bəyan fi təfsirəl-Quran, 2 cilddə, I cild, Bakı, 1990
**75.** Kitabəl-bəyan fi təfsirəl-Quran, 2 cilddə, II cild, Bakı, 1991
**76.** Kitabi-müqəddəs, Leypsiq, 1893
**77.** Köprülü M.Fuad. İslam medeniyeti tarihi, Ankara, 1963
**78.** Köprülüzadə M.Fuad. Azəri ədəbiyyatına aid tədqiqlər, Bakı, 1996
**79.** Kurani-Kerim və türkçe anlamı, Ankara, 1985
**80.** Kurani-Kerim meal ve tefsiri, 2 cilddə, Ankara, 1990
**81.** Kurani-Kerim ve açıklamalı meali, İstanbul, 1990
**82.** Kuran-i Kerim ve türkçe açıklamalı meali, Medinei-Münevvere, 1992
**83.** Külliyyate-divani-Füzuli. İstanbul, h.-q. 1308

**84.** Qasımova Aidə. Füzuli yaradıcılığında Quran rəvayətləri, Bakı, 1995

**85.** Qasımzadə Fuad. “Qəm karvanı”, yaxud zülmətdə nur, Bakı, 1968

**86.** Qısa İslam Ensiklopediyası. İslama dair 1001 termin və xüsusi ad, 2 clddə, I cild, Bakı: Elm və Təhsil, 2012

**87.** Qısa İslam Ensiklopediyası. İslama dair 1001 termin və xüsusi ad, II cild, Bakı: Avropa, 2013

**88.** Quluzadə Mirzağa. “Ənisü-l-qəlb” və onun ədəbi ənənələrlə əlaqəsi, Azərbaycan ədəbiyyatı məsələləri, Bakı, 1964

**89.** Quluzadə Mirzağa. Füzulinin lirikası, Bakı, 1965

**90.** Qurani-Kərim və sözbəsöz tərcüməsi. Bakı: Şərq-Qərb, 2012

**91.** Mahmud Şəriətzadə Xorasani. Dər sayeyi-övliyayi-Xuda, 2 cilddə, I cild, Qum, h.-ş. 1378

**92.** Mahmut S.P. İslam Tarihi, ingiliscədən çeviren A.Kevenohlu, A.Sümer, İstanbul, 1973

**93.** Mehdiyev Niyazi. Orta əsrlər Azərbaycan estetik mədəniyyəti, Bakı, 1986

**94.** Məcid Heydərifər. Mənşure-Neynəva, ikinci nəşri, Qum, h.-ş. 1381, 535 s.

**95.** Mədədov Fərhad. Kərbəla şəhidlərinə ağlamaq, “Hikmət” jurnalı, №1, 2004

**96.** Məhəmməd Dəşti. Ferhengi-Soxenani-imami-Huseyn, XII cild, Qum, h.-ş. 1381, 640 s.

**97.** Məhəmmədi Reyşəhri. Əhli-Beyt (ə). Quranda və hədisdə. 2 cilddə, I cild, Bakı: İİR Mədəniyyət Mərkəzi, 2009

**98.** Məhəmmədi Reyşəhri. Əhli-Beyt (ə). Quranda və hədisdə. 2 cilddə, II cild, Bakı: İİR Mədəniyyət Mərkəzi, 2009

**99.** Məhəmməd Füzuli. Mətləül-etiqad və ərəbcə qəsidələri, Bakı, 1958

**100.** Məhəmməd Füzuli. Əsərləri, 6 cilddə, VI cild, Bakı, 2005

**101.** Məhəmməd Füzuli – 500. Beynəlxalq Füzuli simpoziumunun materialları (7-8 noyabr 1996), Bakı: Sabah, 1997, 295 s.
**102.** Məhəmməd Füzuli – 500. Azərbaycan Respublikası EA-nın müxbir üzvü, professor Əliyar Səfərlinin redaktəsi ilə, Bakı: Bakı Universiteti Nəşriyyatı, 2000, 380 s.
**103.** Məhəmməd Füzuli. Kərbəla vaqiəsi ("Hədiqətüs-süəda"dan parçalar), sadələşdirəni: Hafiz Abıyev, Bakı: Sabah, 1994, 180 s.
**104.** Məhəmməd Mehdiyi-Babapur. Cilvehaye-sabz ve sorxe-aşura. Qum, h.-ş. 1381, 328s.
**105.** Məhəmməd Saleh Musəviyi-Xoyi. Kərbəla şəhidləri, Bakı, 2014, tərc.: Bəxtiyar Hüseynov, 252 s.
**106.** Məkarim Şirazi. Pəyami-Quran, 10 cilddə, VII cild, Tehran, h.-ş. 1377
**107.** Məkarim Şirazi, Cəfər Sübhani. Məzhəbi suallara cavab, Qum, h.-ş. 1383
**108.** Məkarim Şirazi. İmamət haqqın dili ilə, tərc.: Rza Şükürov, Bakı, 2010
**109.** Məmmədli Nəzakət. Şeyx Nəcməddin Razinin "Eşq və əql risaləsi" və onun "Məntiqüt-teyr"lə əlaqəsi, Filologiya məsələləri, №4, Bakı, 1999
**110.** Məmmədli Nəzakət. Füzulinin "Leyli və Məcnun" əsərində təsəvvüf və bədii ifadə sistemi, avtoreferat, Bakı, 2000
**111.** Məmmədov Zakir. Orta əsr Azərbaycan filosofları və mütəfəkkirləri, Bakı, 1986
**112.** Mircəlal. Füzuli sənətkarlığı, Bakı, 1958
**113.** Mircəlal, Xəlilov Pənah. Ədəbiyyatşünaslığın əsasları, Bakı, 1988
**114.** Mirəhmədov Əziz. Yazıçılar, talelər, əsərlər, Bakı, 1978
**115.** Mirsaleh Hüseyni. Hədiqətü-s-süəda (Əsəri-Məhəmməd Füzuli), ərəb qrafikası ilə Azərbaycan dilində, Tehran, h.-ş. 1373, 390 s.
**116.** Mirzəyev Ataəmi Baba oğlu. Klassik Azərbaycan-türk ədəbiyyatında "Yusif və Züleyxa" mövzusu, avtoreferat, Bakı, 1994

117. Mirzəyev Ataəmi Baba oğlu. Azərbaycan bədii tərcümə tarixində Füzuli mərhələsi, filologiya üzrə elmlər doktoru elmi dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı, Bakı, 2012
118. Mövlud Sarı. Əl-Məvalid, ərəbcə-türkcə lüğət, İstanbul, 1982
119. Molla Məhəmməd Füzuli. Hədiqətü-s-süəda. Redaktoru: Seyyid Əli Əkbər Ocaqnejad, Qum: Əmir, h.-ş. 1374/m. 1995, 648 s.
120. Muhammed b. Süleyman el-Bağdadi Füzuli. Hadikatü's-Suada. Saadete ermişlerin bahçesi, hazırlayan Salahaddin Güngör, Kerbela, İstanbul, 2012
121. Muhamməd Cəfər ət-Təbəsi. Mə'ər-r-rəkbi-l-Huseyni minə-l-mədinəti ilə-l-mədinəti, 6 cilddə, Qum, h.-q.1425, h.-ş.1383
122. Muhəmməd ibn İsmail Buxari. Səhih Buxari, 5/77, Beyrut, nəşr Ihyaut Turas
123. Muhemmed el-Arabi el-Azzuzi. Mevzularına göre hazırlanmış Kurani-Kerim Fehristi, İstanbul, 1971
124. Muhemmed ibni Yəqub əl-Kuleyni. Üsülul-Kafi, 2 cilddə, Tehran, h.-ş. 1376
125. Muhəmməd bin Cərir ət-Təbəri (vəfatı 310 h), Tarix ət-Təbəri, c.3, Dar əl-kutub əl-İlmiyyə, Beyrut, 1415/1995; təhqiq: Abdullah Qazi
126. Musa Günəş və Cəfər Vəndidərya. Kərbəla şəhidlərinə ağlamaq, İran, 1999
127. Muslim ibn Həccac. Səhih Muslim, 3/1380 Misir çapı
128. Nağısoylu Möhsün. Füzulinin "Hədiqətü-s-süəda" əsəri, Bakı, 2002
129. Nəhcül-bəlağə. İmam Əli Əleyhissəlamın xütbə, məktub və kəlamları, Bakı: İİR Mədəniyyət Mərkəzi, 2009
130. Nəsimi. Əsərləri, 3 cilddə, III cild, Bakı, 1973
131. Nəsimi İmadəddin. Mən bu cahana sığmazam... Seçilmiş əsərləri, Bakı: Gənclik, 1991, 384 s.
132. Nəsirəddin Tusi. Əxlaqi-nasiri, Bakı, 1989
133. Nizami. Hikmət və nəsihətlər, Bakı, 1982
134. Nurbaki Haluk. Surei Yusufun yorumu, İstanbul, 1985

**135.** Osman Nuri Topbaş. Rəhmət əsintiləri, İstanbul, 1997

**136.** Özem Mustafa Nihad. Edebiyat ve tengit sözlüyü, İstanbul, 1954

**137.** Öztürk Yaşar Nuri. Əhli-beytin anası həzrəti-Fatimə, İstanbul, 1997

**138.** Pişvayi Mehdi. Məsum imamların (əleyhissəlam) tarixi, Bakı, 2011

**139.** Porseş və pasuxhaye-danişcuyi (Rizeyi-mühərrəm), XIII cild, Qum, h.-ş. 1382, 352 s.

**140.** Pürnamdar Təqi. Dastan-e Peyəmbəran, Tehran, h.-ş. 1369

**141.** Rizvani Əliəsğər. Vaqieyi-Aşura və pasox beşobehat. Qum, h.-ş. 1383, 344 s.

**142.** Rüstəmova Azadə. Məhəmməd Füzuli, Bakı, 1994

**143.** Seçme hadisler, tashihi: Binali Örnek, Abdil Aktaş, Ankara, 1999

**144.** Seyid Cəfər Şəhidi. İmam Hüseyn qiyamı (ərəb qrafikası ilə Azərbaycan dilində), Tehran, h.-ş. 1373, 267 s.

**145.** Seyid Əzim Şirvani. Əsərləri, 3 cilddə, I cild, Bakı, 1967

**146.** Seyid Əzim Şirvani. Qəzəllər, Bakı, 1960

**147.** Seyidov Mirəli. Azərbaycan mifik təfəkkürünün qaynaqları, Bakı, 1983

**148.** Seyidov Yusif, Əlizadə Samət. Klassik Azərbaycan şairləri söz haqqında, Bakı: Gənclik, 1977

**149.** Seyid Məhəmmədkazım Qəzvini. Həzrət Zeynəbi-Kübranın (ə) həyatı, Bakı, 2010

**150.** Seyid Məhəmməd Şəfii. Pərvərişi-ruh, 2 cilddə, II cild, II nəşr, Qum, h.-ş. 1374, 584 s.

**151.** Seyid Şərif Rəzi. Nəhcül-bəlağə, mütərcim: Zabit Əhmədov, tarixsiz

**152.** Səduq Hüseyn Məhəmmədzadə. Şərhe-qəzəlhaye-Saib Təbrizi, Tehran, I cild, 1370

**153.** Səffar Həsən. "Nəhcül-bəlağə"də həyata baxış, Bakı, 2005

**154.** Səffar Həsən. Əzəmətli qadın. Həzrət Zeynəb (ə)-in həyatı və ictimai-siyasi fəaliyyəti, Bakı, 2006

**155.** Səfərli Əliyar, Yusifov Xəlil. Qədim və orta əsrlər Azərbaycan ədəbiyyatı, Bakı, 1982

**156.** Subhi as-Salih. Hadis ilimleri və hadis istilahları, Ankara, 1973
**157.** Şeyx Fəridəddin Əttar. Əsrarnamə, Tehran, h.-ş. 1298
**158.** Şeyx Hürr Amili. Vəsailu-ş-şiə.
**159.** Şəhid Mürtəza Mütəhərri. İmam Hüseynin (ə) qiyamına analitik bir baxış
**160.** Şərq filologiyası məsələləri, Məqalələr toplusu, Bakı, 2005
**161.** Şərq filologiyası məsələləri, Məqalələr toplusu, ikinci buraxılış, Bakı, 2006
**162.** Şükürov Ağayar. Şərq fəlsəfəsi və filosofları, Bakı, 2005
**163.** Tahirova M.N. Müqəddəs adlar, Filologiya məsələləri, 1999, №4
**164.** Tarlan A. Nihad. Füzuli divanının şerhi, 3 cilddə, Ankara, 1985
**165.** Tavaslı Yusuf. Dualı namaz hocası, İstanbul, 1993
**166.** Təbatəbai Məhəmməd Hüseyn. Təfsirə-l-mizan, 20 cilddə, I cild, Tehran, h.-ş. 1363
**167.** Tərbiyət Məhəmmədəli. Danişməndani-Azərbaycan, tərc.: İ.Şəms və Q.Kəndli, Bakı, 1987
**168.** Turqut Əhməd. Eşqin elçisi, İstanbul, 1911
**169.** Turqut Əhməd. Eşqin səcdəsi, İstanbul, 1912
**170.** Turqut Əhməd. Eşqin şəhidi, İstanbul, 1913
**171.** Türk dili ve edebiyatı ensiklopedisi, 6 cilddə, VI cild, İstanbul, 1986
**172.** Y.Doç, Dr. Nuri Ünlü. Marmara Umiversitesi İlahiyat Fakültesi Öğretim Üyesi. İslam Tarihi, I, İstanbul, 1997
**173.** Yıldırım Suat. Fatihe ve Enam surelerinin tefsiri, İzmir, 1993
**174.** 170 sual-cavab, tərtib edən: Məhəmməd Azəri, Bakı, tarixsiz

## MÜNDƏRİCAT





